# ZƏHİRƏDDİN MƏHƏMMƏD BABUR



# BABURNAMƏ

**ZƏHİRƏDDİN MƏHƏMMƏD BABUR**



# BABURNAMƏ

**BAKI – 2011**

**TürkSOY kitabxanası seriyası: 12**

Azərbaycn Milli Elmlər Akademiyası Folklor İnstitutu
Elmi Şurasının qərarı ilə çap olunur

Çağatayca, türkcə və rusca
nəşrlərindən çevirən,
ön sözün, qeydlərin və izahların müəllifi:
**Ramiz ƏSKƏR**

Redaktoru:
**Prof. Dr. Hüseyn İSMAYILOV**

**Zəhirəddin Məhəmməd BABUR. BABURNAMƏ.**
**Bakı, BXQR, 2011, 432 s. + 32 rəngli c.**

Böyük türk hökmdarı və dövlət xadimi, ümumtürk ədəbiyyatının görkəmli nümayəndəsi Qazi Zəhirəddin Məhəmməd Baburun (1482-1530) «Baburnamə» əsəri türk və islam ədəbiyyatında memuar janrında yazılmış ilk əsərdir. Müəllif burada öz keşməkeşli həyatını qələmə almış, Mərkəzi Asiyanın, Əfqanıstanın və Hindistanın tarixinə, mədəniyyətinə, etnoqrafiyasına, flora və faunasına dair qiymətli məlumatlar vermişdir. Kitab 31 mart - 4 aprel 2009-cu ildə İstanbulda TürkSOY tərəfindən təşkil olunan «Türk Ləhcələri Arasında Uyğunlaşdırma Çalışmalarının Bugünkü Durumu və Qarşılaşılan Problemlər» mövzusunda Beynəlxalq simpoziumun tövsiyələrinə və yekun bəyannaməsinə uyğun olaraq nəşr edilir.

**İSBN: 978-9952-29-041-7**

# QAZİ ZƏHİRƏDDİN MƏHƏMMƏD BABUR: HƏYATI, ŞƏXSİYYƏTİ VƏ ƏSƏRLƏRİ[1]

«Bütün Şərq fatehlərindən fərqli olaraq o çox-çox insanpərvər idi... Adamlar onun barəsində başqa mənada nə düşünürlərsə düşünsünlər, biz bu böyük qəlbli və ünsiyyətcil nəhəngə dərin rəğbətlə yanaşmaqdan başqa onun haqqında heç nə düşünə bilmərik».

B.N.Morlend.
«Müsəlman Hindistanının aqrar sistemi» kitabından.

Məlum olduğu kimi, dünyanın ən zəngin, köklü dillərindən biri olan türk dili üç böyük qrupa – oğuz, qıpçaq və qarluq qruplarına ayrılır. Hər qrup da öz tarixi inkişaf mərhələsindən asılı olaraq özlüyündə bir neçə qola bölünür. Məsələn, qarluq qrupuna hazırda özbək, uyğur, sarı uyğur, salar və sair dillər daxildir. Vaxtilə mövcud olmuş qaraxani və çağatay dilləri isə qarluq türkcəsinin tarixi etaplarıdır. Üstəlik, bu dillərdə zəngin ədəbiyyat yaranmışdır. Qaraxani dönəmində Mahmud Kaşğari «Divanü lüğat-it-türk»ü, Yusif Balasağunlu isə «Qutadğu bilig»i yazmışdır. Bunlar ortaq türk ədəbiyyatının və türk dünyasının təməl əsərləridir. Çağataycada da türklük üçün böyük önəm daşıyan əsərlər qələmə alınmışdır.

XX əsrdə qardaş Türkiyənin humanitar elmlər sahəsində yetirdiyi ən böyük şəxsiyyət olan ordinarius professor Məhmət Fuad Köprülü çağatay türkcəsini «Monqol istilasından sonra Çingizin övladları tərəfindən qurulan çağatay, elxani və Altın Ordu imperatorluqlarının mədəni mərkəzlərində XIII-XIV əsrlərdə inkişaf edən və teymurilər dövründə, bilxassə XV əsrdə, klassik bir mahiyyət alaraq zəngin bir ədəbiyyat yaradan ədəbi Orta Asiya ləhcəsi» kimi səciyyələndirmişdir. Türkcənin bu qolunda Şəkkaki, Lütfi, Ətai, Xocəndi, Sarayi, Xarəzmi, Hüseyn Bayqara, Qütbi, Əlişir Nəvai, Bayram xan, Əbülqazi Bahadır xan və onlarca qələm sahibi ölməz əsərlər yaratmışlar. Bunların arasında şanlı türk hökmdarı və dövlət xadimi, baburilər dövlətinin və ya Böyük Moğol imperiyasının banisi, şair, nasir, tarixçi, coğrafiyaçı, etnoqraf, ensiklopedik zəka sahibi Qazi Zəhirəddin Məhəmməd Babur şahın xüsusi yeri var.

---

[1] Bu ön söz bizim Zəhirəddin Məhəmməd Babur. Seçilmiş əsərləri. Bakı, MBM, 2011, 328 s. kitabına yazdığımız ön sözün genişləndirilmiş variantıdır. Burada Baburun poetik yaradıcılığından bəhs edən qismlər çıxarılmış, yerinə «Baburnamə» əsərinin məziyyətləri haqqında düşüncələr və təhlillər əlavə edilmişdir.

Babur 14 fevral 1483-cü ildə Əndicanda anadan olmuşdur. Onun atası, Fərqanə hakimi Ömər Şeyx Mirzə böyük Əmir Teymurun nəticəsi, anası Qutlu(ğ) Nigar xanım isə Çingiz xanın on dördüncü nəsildən törəməsi idi. Babur anadan olanda Ömər Şeyx Mirzə Səmərqəndə məşhur sufi şair Xoca Nəsrəddin Übeydullah Əhrarın yanına gələrək körpəyə ad qoymasını xahiş etmişdir. O, əvvəlcə «Zəhirəddin Məhəmməd» adını təklif etmiş, sonra bir az düşünərək «Bu ad tələffüz baxımında avam dili üçün ağırdır, qoy onlar «Babur Mirzə» desinlər» demişdir. Babur sözü əski türkcədə bəbir, pələng mənasına gəlir.

Baburun anası Qutlu Nigar xanım Sultan Mahmudun böyük bacısı, Monqolustan xanı Yunusun qızı idi. Babur ana nənəsi İsən Dövlət bəyimin yanında böyümüş, ondan tərbiyə almışdır. Bu qadın bütün Orta Asiyada qeyrətli, ağıllı bir şəxs kimi məşhur idi. Bir dəfə əri ilə birlikdə düşmənə əsir düşəndə şahzadələrdən biri ona təcavüz etmək istəmiş, İsən Dövlət bəyim kənizlərinin köməyi ilə harın şahzadəni öldürərək meyidini sarayın həyətinə tullamışdı. Səhər məsələ məlum olanda o, hamının hüzurunda belə demişdi: «Bu adam şəriəti pozaraq mənim namusuma toxunmaq istədi, mən də onu öldürdüm. Buna görə bir suçum varsa, çəkməyə hazıram». Öldürülən şahzadənin atası dərin xəcalət hissi keçirərək bəyimin günahkar olmadığını bildirmiş və bütün əsirləri azad etmişdi.

Dövlət idarəçiliyini öyrənməsi üçün atası Baburu hələ on yaşında ikən Əndicana vali təyin edir. Bundan iki il sonra bir qəza nəticəsində, daha doğrusu, Axsi qalasında uçurumun üstündə göyərçinləri seyr edərkən müvazinətini itirərək uçuruma yuvarlanan Ömər Şeyx Mirzə həlak olur və Babur 12 iyun 1494-cü ildə 12 yaşında Fərqanə taxtına çıxır.

Həmin dövrdə Orta Asiyada və civarında siyasi mənzərə belə idi: Səmərqənddə Baburun əmisi Sultan Əhməd Mirzə, Hisarda və Bədəxşanda dayısı Sultan Mahmud Mirzə, Monqolustanda babası Yunus xan, Kabildə II Uluğ bəy Mirzə, Heratda Hüseyn Bayqara hökm sürürdü. Qızılbaşların başında Şah İsmayıl Xətai, özbəklərin başında Şeybani xan dururdu. Hindistanda isə hər vilayətdə, hətta hər şəhərdə bir mirzə (bu söz *əmirzadə* sözünün qısaldılmış variantı olub, əsasən, Əmir Teymurun törəmələrinə şamil edilirdi), xan və ya bir racə hakim idi.

Babur hökmdar olduqdan qısa bir müddət sonra taxtını əmisindən və dayısından qorumaq məcburiyyətində qalır. Ağlı-fərasəti və ətrafındakı yaxın adamlarının köməyi sayəsində əmisi ilə dil tapır, Kasan bölgəsini dayısına güzəştə getməklə təhlükəni sovuşdurur. Yavaş-yavaş güclənən Babur 1497-ci ildə Səmərqəndi alır. Ancaq ağır xəstələndiyi üçün uzun müddət burada fəaliyyətsiz qalır, ətrafındakı bəylər onu tərk edirlər. Bu yetməzmiş kimi, Baburun ən inandığı bəylərindən biri, Axsi qalasının komendantı Uzun Həsən (Ağqoyunlu Uzun Həsənlə qarışdırmamalı) başqa bəylərlə əlbir

olub «Babur, ağır xəstədir, dili tutulub, ağzına pambıqla su damızdırırlar» deyə şayiələr yayaraq Əndicanı mühasirəyə alır. Bunu eşidən Babur əmrindəki 250 nəfərlik dəstə ilə Əndicana üz tutur, lakin şəhərin ələ keçdiyini öyrənərək Xocəndə gəlib dayısına sığınır. Onun köməyi ilə Axsi və Əndicanı geri almağa çalışsa da, bundan bir şey çıxmır. Yalnız 15 ay sonra Əndicanı qurtarmağa müvəffəq olur. Bu arada 12 yaşından bəri nişanlı olduğu, lakin bacı gözü ilə baxdığı əmisi qızı (Sultan Əhməd Mirzənin qızı) Ayşə bəyimlə evlənməli olur. Bu evlilik uzun sürmür, Ayşə bəyim bir il sonra onu tərk edir.

Taxta çıxdığı vaxtdan bəri Hüseyn Bayqaranın bəyləri ilə savaşan Babur bu dəfə rəqiblərin ən təhlükəlisi olan Şeybani xanla üz-üzə gəlir. 1501-ci ilin yayında Səripul müharibəsində ona məğlub olub Səmərqəndə qaçır. Şeybani xan bu dəfə Səmərqəndi mühasirəyə alır və tutur. Babur şəhəri tərk edir, ancaq bacısı Xanzadə bəyim Şeybaninin əlinə düşür, xan onunla evlənir. Bəxti gətirməyən və hər şeyini itirən gənc Babur yanındakı bir neçə nəfərlə ac-susuz vəziyyətdə dağlarda, düzlərdə dolaşır, axırda payi-piyada Daşkəndə gələrək yenə dayısı Sultan Mahmud Mirzəyə sığınır. Bu sıralarda onun digər dayısı Əhməd xan Monqolustandan Daşkəndə gəlir. İki qardaş Fərqanəni tutmaq üçün ona dəstək verir. Babur bəzi yerləri ələ keçirərək Əndicana yaxınlaşır, qoşunla dincəldiyi zaman qəfildən basqına uğrayır, çoxlu itkiyə məruz qalır, özü isə Əndican bəyi Əhməd Tənbəlin qılınc zərbəsilə başından ağır yaralanır, səkkiz yaxın adamı ilə birlikdə qaçıb qurtulur. Sonra onlardan ayrılaraq, yolboyu xarabalıqlarda gizlənə-gizlənə bir təhər dayılarının yanına qayıda bilir.

Şeybani xan Babura və dayılarına qarşı mübarizəni davam etdirir, onları ağır məğlubiyyətə uğradır. Babur bu dəfə Fərqanənin cənubundakı dağlara qaçır. Uzun müddət burada ağır şəraitdə ac-yalavac qalır, nəhayət, Xorasana Hüseyn Bayqaranın yanına getmək üçün əksəriyyəti qadınlardan və uşaqlardan ibarət olan 250 nəfərlik qafilə ilə 1504-cü ilin iyun ayında yola çıxır.

Qunduz hökmdarı Xosrov şahın ərazisindən keçərkən xalq iki ulu xaqanın törəməsini böyük sevgi ilə qarşılayır, şahın qardaşı Baqi Çağanyani başda olmaqla bir çox adam ona qoşulur. Qısa müddətdə Baburun ətrafında böyük bir ordu toplanır. Babur istiqaməti dəyişdirərək bu dəfə Xorasana deyil, Hindiquş dağlarını keçib Kabilə üz tutur. Qan tökmədən Müqim Arğundan şəhəri alır və 1506-cı ildə özünü Kabil şahı elan edir. Həmin il Heratda çox sevdiyi Mahım bəyimlə evlənir.

Şah İsmayıl Xətai 1510-cu ildə Şeybani xanı öldürür. Ən əsas düşmənlərindən birinin aradan çıxması ilə Babur şah əski torpaqlarını, yəni ata mülkü Mavəraünnəhri yenidən ələ keçirmək fikrinə düşür. Ona görə Şah İsmayılla müqavilə bağlayır, onun adına xütbə oxutdurur və sikkə kəsdirir.

Lakin sünni əhali Baburun bu hərəkətini bəyənmir. Xətainin hərbi qüvvələrinin yardımı ilə Hisarı, Buxaranı və Səmərqəndi ələ keçirən Babur osmanlı-səfəvi savaşı ilə əlaqədar Şah İsmayılın öz qoşununu geri çağırması üzündən tutduğu torpaqları yenidən itirir. Xətainin Çaldıran savaşında osmanlılara məğlub olması Baburun bütün ümidlərini puça çıxarır. Çarəsiz qalan Babur dörd illik fasilədən sonra Kabilə geri qayıdır və bütün diqqətini bu coğrafiyaya yönəldir. 1519-cu ildə siyasi məqsədlərlə Şah Mənsurun qızı Bibi Mübarəkə-Əfqani Ağaçə ilə evlənir.

Babur şah 1519-26-ci illərdə Hindistana beş dəfə yürüş edir. Pəncabı (1519/20), Qəndahar (1522), Lahor (1523), Dehli və Aqra (1526) şəhərlərini ələ keçirir. Nəticədə Əfqanıstanı, Bəlucistanı və şimali Hindistanı öz hökmranlığı altına alaraq Böyük moğollar imperiyasının təməlini qoyur.

Hindistanda iki əsas rəqibindən biri olan İbrahim Ludini Panipat yaxınlığında məğlub edərək 5 may 1526-cı ildə Dehlini tutan Babur raçputların başçısı Rana Sanka ilə vuruşur və 16 may 1527-ci ildə onun qoşunlarını Kanvanda darmadağın edir. Bu savaşdan sonra «Qazi» ünvanını alır. Babur 1527-29-cu illərdə öz nəzarətindəki yerlərdə üsyanları yatıraraq, müstəqil knyazlıqların çoxunu məhv edir, axırda Qanq çayını keçərək benqal hökmdarını yenir və 24 iyun 1529-cu ildə Aqra şəhərinə qayıdır.

Uşaqlığından bəri ağır xəstələliklər keçirən, xüsusilə də bataqlıq qızdırmasından əziyyət çəkən Baburun səhhəti ciddi şəkildə pozulur. Onu bir dəfə zəhərləyirlər. İbrahim Ludinin anası tərəfindən aşpaz Əhmədin əli ilə verilən ağının təsiri nəticəsində Baburun vəziyyəti gündən-günə ağırlaşır.

Baburun qızı Gülbədən bəyim özünün «Hümayunnamə» adlı kitabında atasının həyatının son aylarını müfəssəl şəkildə təsvir etmişdir. Onun yazdığına görə, şahzadə Hümayunun çox ağır şəkildə xəstələnməsi Babura öz dərdini unutdurur. O, xüsusi bir ayinə əməl edərək oğlunun yatağı başına üç dəfə dolanır, Hümayunun xəstəliyini öz üzərinə götürdüyünü bildirir, bunu gerçəkləşdirməyi sidq-ürəklə Allahdan niyaz edir. Tezliklə Hümayunun vəziyyəti yaxşılaşır və o, tamamilə sağalır. Əvəzində Baburun xəstəliyi getdikcə şiddətlənir. Bu dünyadan köçəcəyini anlayan Babur övladlarını (oğulları Hümayun, Kamran, Əskəri və Hindal mirzələri, qızları Gülrəng, Gülçöhrə və Gülbədən bəyimləri), bəylərini və sərkərdələrini yanına çağırır. Hamının hüzurunda böyük oğlu Hümayunu padşah təyin edir, elə həmin gün – 26 dekabr 1530-cu ildə 48 yaşında əbədiyyətə qovuşur. Aqrada dəfn olunur, sonralar vəsiyyətinə uyğun olaraq qəbri Kabilə köçürülür. 1646-cı ildə baburilər sülaləsinin üzvlərindən biri olan Cahan şah onun Baği-Babur adlı bağda yerləşən qəbri üzərində bir məqbərə tikdirir.

Burada Babur tərəfindən qurulan, tarixi ədəbiyyatda Baburilər, Böyük moğollar və ya Gürganilər dövləti adlandırılan imperiyanın sonrakı tarixi haqqında da qısa məlumat vermək istəyirik. Baburdan sonra onun böyük

oğlu 22 yaşlı Hümayun 1530-cu ildə taxta çıxmış, lakin 1540-cı ildə qardaşları ilə girişdiyi iqtidar mübarizəsində məğlub olaraq Səfəvilərə sığınmış, yalnız 1555-ci ildə onların köməyi ilə Dehlini alaraq hökmdar olmuşdur. Onun yerinə keçən Əkbər şah 50 il hakimiyyətdə qalmış (1556-1605), Hindistan yarımadasının böyük bir qismini istila etmiş, ölkəsinin mədəni və iqtisadi yüksəlişinə nail olmuş, Osmanlılar, Səfəvilər, özbəklər və portuqaliyalılarla siyasi əlaqələr qurmuşdur. Onun oğlu Səlim Cahangir şah dönəmində (1605-27) ingilislər Hindistana ayaq açmışlar. Cahan şahın hakimiyyəti illərində (1628-58) ölkədə mədəniyyət, xüsusilə memarlıq sahəsində böyük uğurlar qazanılmış, dünyanın yeddi möcüzəsindən biri olan Tac-Mahal məqbərəsi tikilmişdir. Övrəngzib Aləmgir şah dövründə (1658-1707) imperiya inkişaf etsə də, ondan sonra tənəzzül, daxili çəkişmə, taxt qovğaları və üsyanlar başlamışdır. Şahi-Aləm Bahadır şah (1707-12), Cahangir İskəndər şah (1712-13) və Fərrux şahın dövrü (1713-19) də sakit ötməmişdir. 1719-cu ildə taxt üç dəfə əldən-ələ keçmiş, Rəfiütdərəcat şah və II Cahan şah qısa müddətə hökmdar olmuş, Məhəmməd şahın dövründə (1719-47) nisbi sakitlik bərpa edilsə də, Nadir şah Əfşarın 1739-cu ildə Dehlini tutması ilə ölkə yenidən xaosa sürüklənmişdir. Əhməd Bahadır şah (1747-53), II Aləmgir şah (1753-59) və III Aləm Şah (1759-1806) zamanı ingilislər çox fəallaşmış və 1766-cı ildə imzalanan Allahabad müqaviləsi ilə ölkənin idarəsini öz əllərinə keçirmişlər. II Əkbər şahın (1806-37) və II Bahadır şahın (1837-58) hakimiyyəti formal xarakter daşımışdır. 1858-ci ildə Baburilər səltənətinə son qoyulmuş, Hindistan rəsmən İngiltərənin müstəmləkəsi, 1877-ci ildə isə Viktoriya Hindistanın kraliçəsi elan edilmişdir.

* * *

Baburun bir hökmdar kimi möhtəşəm uğurlar qazanması bir sıra amillərlə bağlıdır. Hər şeydən əvvəl, ulu tanrının inayəti ilə hökmdara xas olan bütün sifətlər onun şəxsində cəmləşmişdir. Bunlardan birincisi türk törəsinə uyğun olan ilahi mənşəli xarizmadır. Onun Çingiz xan və Əmir Teymur nəslinə mənsub olması türklərdə hökmdara bağlılıq duyğusu ilə birləşərək xalqda Babura, Baburda isə özünə sarsılmaz bir inam aşılamışdır. On yaşından etibarən dövlət idarəçiliyi ilə məşğul olması, on iki yaşından taxt-tac sahibi olması onun bütöv şəxsiyyət kimi yetişməsində, xarakterinin formalaşmasında mühüm rol oynamışdır. Buna fitrətdən sahib olduğu iti zəka, analitik ağıl, parlaq istedad da əlavə edilincə, ortaya düha səviyyəsində mükəmməl bir şəxsiyyət çıxmışdır. Uşaq ikən xüsusi saray tərbiyəsi dışında heç bir təhsil almağa vaxtı olmayan bir insanın elmin müxtəlif sahələrində bu qədər dərin bilik qazana bilməsi yalnız öz üzərində inadla və mütəmadi olaraq çalışması ilə mümkün idi. Babur yürüşlər zamanı at üstündə, dincəldiyi zaman çadırında, arxayın vaxtlarda saraydakı kitabxanasında daima kitab oxumuş, yazı yazmışdır. Özünün qeydlərinə görə, bir dəfə çadırında yazı yazmaqla

məşğul olarkən qəfildən gur yağmur yağmış və qopan fırtına çadırı sovurmuş, onun əlyazmaları və kitabları islanmışdır. Babur sabaha qədər yatmayaraq islaq səhifələri şam alovu ilə tək-tək qurutmuşdur.

Hərb sənətində görkəmli sərkərdə, mahir taktik və strateq, qılınc oynatmaqda, ox atmaqda, minicilikdə tayı-bərabəri olmayan cəngavər, memarlıq və peyzaj memarlığı sahəsində gözəl mütəxəssis, botanika, zoologiya, coğrafiya, astronomiya üzrə heyrətli dərəcədə dərin bilik sahibi, eyni zamanda gözəl şair, nasir, ədəbiyyatşünas, əruz nəzəriyyəçisi, tərcüməçi, musiqişünas, bəstəkar, tarixçi və etnoqraf kimi şöhrət qazanmaq tarixdə çox az adama nəsib olmuşdur.

Polad iradəli Babur qorxu nə olduğunu bilməmiş, gözünü budaqdan əsirgəməmiş, prinsiplərindən əsla vaz keçməmişdir. Düşmənin adı-sanı, hərbi qüdrəti qarşısında titrəməmiş, zəiflik göstərməmişdir. Mülkü, vilayətləri, torpaqları bir neçə dəfə əlindən çıxsa da, onları geri qaytarmaq uğrunda əzmlə mübarizə aparmışdır. Üstəlik, bütün savaşlarda komandan olmaqla yanaşı bir əsgər kimi şəxsən iştirak etmiş, dəfələrlə yaralanmışdır. Bu hərəkət ordunu ruhlandırmış, onun şəxsiyyəti ətrafında bir əsrar haləsi yaratmışdır. Hətta bir yürüşdə şiddətli qar fırtınasına yaxalananda yaxındakı mağaraya sığınmaq barədə israrlı təklifləri qəbul etməmiş, hamı kimi çuxur qazaraq qar altında gizlənmişdir. Səfərlərdə əsgərlərlə bərabər yemək yemiş, bütün məhrumiyyət və məşəqqətlərə onlarla birlikdə qatlanmışdır.

Baburun xalq və ordu tərəfindən səmimi şəkildə sevilməsinin bir səbəbi də bütün zəfərləri özünün deyil, əvvəl Allahın lütfü ilə, sonra da sərkərdələrin və əsgərlərin adı ilə bağlamasıdır. Babur ətrafındakı insanların könlünü fəth etməyi bacarmış, hər kəsin məziyyətlərini, xidmətlərini layiqincə qiymətləndirmiş, bəzi silahdaşlarına şeirlər həsr etmiş, onları öymüşdür.

Babur ədalətli bir şah kimi haqsızlığa qarşı həmişə barışmaz olmuş, yağmaçılığı, talançılığı, çapovulçuluğu ölümlə cəzalandırmış, xalqın taxılını, mal-qarasını zorla əlindən alan əsgərləri dar ağacından asdırmışdır. Bir yerli təbəənin bir küpə yağını zəbt etdiyi üçün öz əsgərini ölüncəyə qədər şallaqlatmışdır. Baburun bu xasiyyətindən xəbərsiz olan Şah İsmayıl Xətainin əsgərləri də eyni aqibətə uğramışlar.

Babur öz ölkəsinin abadlığı üçün var qüvvəsi ilə çalışmışdır. Fəth etdiyi ölkələrdə yeni yollar, su anbarları, bəndlər, körpülər, dini ibadət yerləri, hamamlar, saraylar, ictimai binalar inşa etdirmiş, bu qurğuların bir qismini şəxsən özü layihələndirmiş, memarların və mühəndislərin çalışmalarına daim nəzarət etmiş, layihələri yoxlayaraq öz dəyərli məsləhət və göstərişlərini vermiş, bunların qısa müddətdə və keyfiyyətlə yerinə yetirilməsinə çalışmış, interyer ve eksteryerlərin tərtibatına qədər hər şeylə maraqlanmışdır.

Ticarət yolları üzərində karvansaralar, düşərgələr tikdirmiş, çeşmələr çəkdirmiş, quyular qazdırmış, yolçular üçün iaşə mərkəzləri, heyvanlar üçün

yem anbarları, asayişi və təhlükəsizliyi təmin etmək məqsədilə indiki mənada polis məntəqələri yaratmış, məsafələri göstərməklə yol işarələri qoydurmuşdur. Onun əmri ilə Kabildən Aqraya qədər olan məsafə dəqiq ölçülmüşdür. Baburun sayəsində Hindistanda memarlıqda və incəsənətdə ortaq hind-türk (Orta Asiya) üslubu yaranmış, qarşılıqlı mədəni mübadilə baş vermişdir.

Babur şah yaşıllığa da xüsusi diqqət yetirmişdir. Gördüyü ekzotik bitkilərin və güllərin əkildiyi parkların və bağların planlaşdırılması zamanı Orta Asiyadakı çarbağ sistemini tətbiq etmış, gözəl hovuzlar və fəvvarələr düzəltdirmişdir. Məsələn, İbrahim Lodinin üzərində qələbə şərəfinə Kabil-bəxt adlanan nəhəng bir park saldırmışdır. Onun Zərəfşan, Baği-vəfa, Bağı-səfa, Həşt-behişt adı verdiyi bağlar da öz qeyri-adi gülləri və ağacları ilə seçilmişdir. Bunların əksəriyyəti əsrlərlə qorunaraq bugünə qədər gəlib çatmışdır. Baburun əmri ilə Orta Asiyadakı bəzi meyvələr, özəlliklə ən yaxşı qovun və üzüm növləri Hindistanda da becərilməyə başlanmışdır. Bu ölkədə indi də ənquri-səmərqəndi adlı üzüm növü çox məşhurdur.

Böyük siyasi xadim və alim Cəvahirləl Nehru Baburun bu fəaliyyətinə yüksək qiymət verərək yazmışdır: «Baburun Hindistana gəlməsi ilə böyük tərəqqi yarandı, yeni stimullar həyata, incəsənətə və memarlığa nəfəs verdi, mədəniyyətin digər sahələri isə qarşılıqlı təmasa keçdi. Babur valehedici şəxsiyyət idi, İntibah dövrünün tipik hökmdarı, cəsur, bacarıqlı insan idi, o, incəsənəti, ədəbiyyatı sevirdi, həyatdan zövq almağı xoşlayırdı». Bu fikri elə həmin dövrlərdə Orta Asiyada və Hindistanda qələmə alınmış «Tarixi-Rəşidi», «Hümayunnamə», «Tarixi-Hümayun şah», «Əkbərnamə», «Təbəqəti-Əkbəri», «Tarixi-Fəriştə», «Cahangirnamə» kimi tarixi qaynaqlarda göstərilən faktlar da təsdiq edir.

Zəhirəddin Məhəmməd Babur cəmiyyətin bütün təbəqələri ilə daim əlaqədə olmuşdur. Xüsusilə alimlərlə, şairlərlə, din adamları ilə tez-tez görüşmüşdür. O, Əlişir Nəvai və digər şairlər haqqında xoş sözlər söyləmiş, bir çox sevdiyi şairin və müasirinin müəmmalarını və beytlərini öz divanına daxil etmişdir. Babur eyni zamanda alimlərlə yaxınlıq etmiş, böyük astronom Uluğ bəyin rəsədxanasına getmiş, orada aparılan tədqiqatlarla yaxından tanış olmuşdur. O həmçinin Nəsirəddin Tusinin elmi yaradıcılığı, Marağa rəsədxanası, eləcə də hind və yunan astronomları barədə çox dərin məlumat sahibi olduğunu göstərmişdir. Ömrünün son dövründə sufiliklə ciddi maraqlanmış, bu sahəyə aid ədəbi-bədii əsərləri mütaliə etmişdir.

Baburun bədii yaradıcılığı onun şəxsiyyətinin, humanizminin və xarakterinin başqa bir tərəfidir. Bu barədə irəlidə geniş söhbət açılacaq. Təbii ki, o, şair və hökmdar olaraq içki və əyləncə məclisləri də qurmuşdur. Bunun üçün kifayət qədər çox səbəb olmuşdur: hərbi zəfərlərin qeyd edilməsi, ova getmək, ovdan qayıtmaq, müxtəlif idman yarışları keçirilməsi, yüksək

rütbəli qonaqların, səfirlərin gəlişi, bayramlar, seyranlar, dövlət ərkanı ilə məsləhətləşmələr, yəni divan toplantıları, dostlarla görüşmək ehtiyacı, nəhayət, həyatdan zövq almaq arzusu. İncə ruhlu Babur musiqi alətlərində çalmağı bacarmış, musiqi bəstələmiş, hətta oxumuşdur. Bu cür məclislər içkisiz ötüşə bilməzdi. Babur arada içkiyə meyl etmiş, hətta mübtəla olmuşdur. 28 yaşından etibarən getdikcə artan dozada içki içmiş, intensiv olmamaqla birlikdə tiryəkdən də istifadə etmişdir. Yalnız 1528-ci ildə, ölümündən iki il əvvəl tövbə edərək bu iki pis alışqanlığından vaz keçmişdir.

Baburun şəxsiyyətindən danışarkən onun bəxtini və şansını da qeyd etmək lazımdır. O, ilk gənclik illərində dəfələrlə hər şeyini itirmiş, köməksiz və arxasız qalmışdır. Hər dəfə bir möcüzə sayəsində yenidən dirçəlmiş, əvvəlkindən də qüvvətli olmuşdur. Bu işdə bəxtinin yavər getməsi ilə yanaşı dərin zəkası və mahir diplomat olması onu xilas etmişdir. O, döyüş meydanlarında dəfələrlə ölümlə üzləşsə də, hətta ağır şəkildə yaralansa da, müxtəlif xəstəliklər keçirsə də, həyatda qalmış, nəhayət, bəxti və bacarığı sayəsində dünyanın ən möhtəşəm imperiyalarından birini qura bilmişdir. Yaşadığı tam olmayan qırx səkkiz il ərzində neçə uzun ömrə sığmayacaq qədər böyük işlər görmüşdür. Az yaşamasına gəlincə, «Allah sevdiyi qullarını öz yanına tez aparır» deyə bir ifadə vardır. Bəlkə bu fani dünyanı erkən tərk etmək özü də bir şansdır.

* * *

Babur özünün bəzi həmkarları – Qazi Bürhanəddin, Şah İsmayıl Xətai, Cahan Şah Həqiqi, Şeybani xan, Hüseyn Bayqara, Sultan Səlim, Qanuni Sultan Süleyman və başqaları kimi həm hökmdar, həm də şairdir, əlavə olaraq, parlaq istedadlı nasir və mahir tərcüməçi, poetikaya, islam hüququna (fiqhə), musiqiyə və hərb sənətinə dair dərin məzmunlu risalələr müəllifidir. O, «xətti-baburi» adı verdiyi xüsusi bir əlifba da kəşf etmişdir.

Babur çağatay ədəbiyyatının Əlişir Nəvaidən sonra poeziyada ən uca zirvəsidir. O, poeziyanın bütün janrlarında qələmini sınamış, qəzəllər, məsnəvilər, rübailər, tüyuğlar, mətlələr, müəmmalar, qitələr yazmışdır.

Babur iki divan müəllifidir. Bunlardan birincisi 1519-ci ildə tərtib edilmiş «Kabil divanı», ikincisi 1528-29-cu ildə Aqrada tərtib olunmuş «Hind divanı»dır. Hazırda müxtəlif yerlərdə bu iki divanın bir sıra əlyazmaları qorunur. Bir-birindən həcm və ehtiva etdiyi əsərlərin sayı etibarilə fərqlənən əlyazmaların ən mükəmməli İstanbul Universitetinin (kataloq nömrəsi 3743) kitabxanasındakı nüsxədir. «Divani-Babur şahi-çağatayi» adlı bu nüsxə 105 vərəqdir. 119 qəzəli, başqa janrlarda yazılmış əsərləri və Xoca Übeydullah Əhrarın «Risaleyi-validiyyə»sini əhatə edir.

İkinci əlyazma Parisdə Milli Kitabxananın türkcə əlyazmalar kolleksiyasında (kataloq nömrəsi 1230) saxlanır. Cəmisi 50 vərəqdir, haşiyələrdə türkcə və farsca xeyli qeydlər var. Buradakı şeirlərin sayı universitet əlyaz-

masındakından xeyli azdır: cəmi 87 qəzəl və digər janrlarda qələmə alınmış əsərlər var.

Topqapı sarayındakı əlyazma da (nömrəsi R.741) həcmcə kiçikdir (55 vərəq). Sərlövhədə əsərin adı «Divani-sultanül-əzəm Babur Mirzə əleyhir-rəhmətü vəl-ğürfan» şəklində yazılmışdır. Burada şairin 111 qəzəli və başqa şeirləri toplanmışdır.

Digər bir nüsxə İstanbulda 100-cü il Atatürk bələdiyyə kitabxanasında qorunur. Müəllim Cövdət (əl)yazmaları kataloqunda K. 332 nömrəsi ilə qeydə alınan bu nüsxə «Divani-Babur Mirzə» adlanır. 74 vərəqdir. Həcminə və burada verilmiş əsərlərin (82 qəzəl və başqa şeirlər) sayına baxaraq bu nüsxənin Topqapı nüsxəsindən köçürülmüş olduğu ehtimal edilir.

Hindistanın Rampur şəhərindəki Nəvvab kitabxanasında saxlanan nüsxə cəmisi 20 səhifədir. Burada Xoca Übeydüllah Əhrarın «Risaleyi-validiyyə»sinin tərcüməsi və Baburun özünün bir qəzəli, bir neçə məsnəvisi, rübaisi və mətləsi, «Əruz risaləsi»ndən bir parça, farsca bir neçə rübai, qitə və mətləsi verilmişdir. Bu nüsxənin yeganə özəlliyi odur ki, buradakı bir rübai Baburun öz xəttilə yazılmışdır. Bu barədə Cahan şahın haşiyədə xüsusi qeydi var.

Tehranda Səltənət kitabxanasında qorunan nüsxə isə, əslində, bir külliyyatdır. Bu külliyyat 5 bölümdən ibarətdir. Birinci bölümdə (s. 1-186) şairin tövhid, nət və dini şeirləri yer alır. İkinci bölümdə (s. 187-377) vəzn və bəhrlər haqqında mənzum və mənsur qismlər, üçüncü bölümdə (s. 379-455) şeir vəznləri haqqında mənsur hissə, beşinci bölümdə (s. 457-1012) Baburun xatirələri (farsca tərcüməsi ilə birlikdə) verilmişdir. Son bölümdə isə (s. 1013-1036) şairin bəzi qəsidələri və bir risaləsi var.

Məşhur baburşünas Dr. Bilal Yücəl «Babur divanı» kitabında (Ankara, 1995) bütün nüsxələri ətraflı təsvir etmişdir. Türk aliminin bu kitabı dərin elmi məzmununa və faktların dəqiqliyinə görə seçilir. Türkmən alimi Rəhimməmməd Kürənov «Babur divanı»nı (Aşqabad, 2005) məhz Bilal Yücəlin kitabı əsasında hazırlamışdır. Biz bu iki kitabla yanaşı şairin Özbəkistanda nəşr olunmuş «Seçilmiş əsərləri»ndən də (Daşkənd, 2008) faydalandıq. Ədalət naminə deməк lazımdır ki, Bilal Yücəlin kitabı baburşünaslıqda ən mötəbər mənbədir.

Bilal Yücəl bütün nüsxələri tutuşdurmaqla Baburun divanında 122 qəzəl olduğunu ortaya çıxarmışdır ki, onlardan biri çarpaz qəzəldir. Şairin bu anda elm aləminə 18 məsnəvisi, 216 rübaisi, 1 müamması, 19 qitəsi, 15 tüyuğu, 79 mətləsi, 7 məsnu şeiri, 16 natamam qəzəli, 3 nəzmi, 16 müsərrə beyti, 11 müfrədi, 4 kiçik mənsur parçası məlumdur. Divana daxil edilən bu mənsur parçalar şairin başqa əsərlərindən alınmışdır. Bunlardan başqa, onun farsca yazdığı 2 qəzəl, 12 rübai, 8 qitə, 17 mətlə və 1 mənsur parça var. Beləliklə, Baburun divanında 600-dən artıq əsər vardır. Biz Baburun «Seçilmiş

əsərləri» kitabına farsca yazıları daxil etmədik, türkcə şeirlərdən 56-sı başqa şairlərə aid olan müəmmaları, 4 kiçik mənsur parçanı və bəzi beytləri çıxmaqla 500-dən çox əsəri müasir dilimizə uyğunlaşdıraraq verdik. Əlavə olaraq, Baburun «Etiqadiyyə» risaləsini və şairin tərcümə etdiyi «Risaleyi-validiyyə»ni də həmin kitaba saldıq.

Burada Babur divanının bir özəlliyini də qeyd etməliyik: əvvəla, divanda dibaçə yoxdur. İkincisi, qəzəllər, məsnəvilər, rübailər, tüyuğlar və digər janrdakı əsərlər ərəb əlifbasına uyğun olaraq alfabetik ardıcıllıqla deyil, gəlişigözəl düzülmüşdür, hətta çox zaman bir-birinə qarışmışdır.

Biz həmin kitabı hazırlayarkən orijinala imkan daxilində sədaqət göstərdik, şeirlərin azərbaycanca yaxşı səslənməsi və rahat anlaşılması üçün «köp» və «ana» tipli sözləri qafiyə kimi işləndikləri məqamlar xaricində assosiasiya yaratmamaları üçün «çox» və «ona» şəklində verdik, bəzi yerlərdə isə -ay, -əy tipli şəkilçiləri anlaşıldığı üçün olduğu kimi saxladıq. Qəzəl, qismən də qəsidə, rübai və tüyuğlar bölməsində səhifə altında qəliz ərəb-fars sözləri lüğətini yerləşdirdik, çünki mütaliəni yarımçıq kəsib bu və ya digər sözün mənasını kitabın sonundakı lüğətdə axtarmağın nə qədər xoşagəlməz iş olduğu hamımıza məlumdur. Hər ehtimala qarşı sonda böyük bir lüğət verməyi də lazım bildik.

Baburun poeziyası mövzu baxımından çox əlvandır. Onun ən əsas mövzusu, təbii ki, eşq və məhəbbət, həsrət və hicrandır. Lakin bununla yanaşı şairin bir çox lirik əsəri avtobioqrafik məzmun daşıyır. Burada hərbi yürüşlərə, içki məclislərinə, dostlarına, məmurlarına və yaxın adamlarına, zövcələrinə, özünün şəxsi qüsurlarına həsr etdiyi şeirlər də az deyil. Baburun şeirləri sanki tənha bir guşədə düşünülərək yazılmamış, söhbət əsnasında, hamının yanında bədahətən söylənmişdir. Onlarda sonsuz bir sadəlik və təbiilik müşahidə olunur.

Baburun şux və oynaq qəzəlləri, ictimai-fəlsəfi məzmunlu rübailəri, tüyuğları, məsnəviləri, qitələri, mətləələri barədə «Seçilmiş əsərləri»nə yazdığımız ön sözdə geniş məlumat verilmiş, onlar müxtəlif ədəbi yönlərdən yetərincə təhlil edilmişdir. Burada yalnız bir qəzəlini vermək istərdik:

Xəttin ara üzarın – səbzə içində lalə,
Ol çeşmi-pürxumarın – lalədəki qəzalə.

Bütün pərilər, ey can, gərdində zarü heyran,
Guya ərər nümayan ay dövrəsində halə.

Mehrü vəfanı əğyar çox gördü səndən, ey yar,
Cövrü cəfanı bisyar qıldın mana həvalə.

Hicrində, ey pəriru, gözümdən uçdu uyğu,
Hər gecə dana doğru işimdir ahü nalə.

Üzümə baxsan, ey yar, görərsən yüz qüssə var,
Eşqində Babur yazar bu növ yüz risalə.

Zəhirəddin Məhəmməd Baburun yaradıcılığında risalələr çox mühüm yer tutur. Bunlardan «Əruz risaləsi» (1523-25), adından da göründüyü kimi, ədəbiyyat nəzəriyyəsinə həsr olunmuşdur. Risalə əruz vəzni haqqında türkcə və farsca yazılmış əsərlərdən fərqlidir. Müəllif əsas diqqətini türk əruzuna yönəltmiş, bizə xas olan şeir şəkillərindən tüyuğ, qoşuğ, tarxani, öləng və digər janrları ətraflı təhlil etmişdir. Babur əruzun 21 bəhri və 272 vəzni haqqında geniş məlumatla yanaşı türkcə və farsca nümunələr vermişdir.

Şairin digər bir risaləsi «Mübəyyəni-zəkat»dır (1521). Burada islamın hənəfilik təriqəti ilə əlaqədar bəzi məsələlər (zəkat, xüms, əşar, xərac və s.) haqqında məsnəvi tərzində məlumat verilir. «Kitab nəzminin səbəbi» qismindən anlaşıldığına görə, Babur bu əsəri övladları Hümayuna və Kamrana öyüd-nəsihət vermək məqsədilə qələmə almışdır.

Şairin «Etiqadiyyə» risaləsi də dini mövzudadır. Babur bu əsərində dinin əsaslarını və fiqhi bir ilahiyyatçı müsəlman alimi səviyyəsində bildiyini nümayiş etdirmişdir.

Mütəfəkkir şair 1504-cü ildə «xətti-baburi» adlı xüsusi bir əlifba kəşf etmiş, türk dilinin fonetikasını daha dolğun əks etdirən həmin əlifba ilə Qurani-kərim yazdırmışdır.

Bunlardan başqa, Babur tarixi mənbələrdə qeyd olunan iki risalə də qələmə almışdır. «Musiqi elmi» və «Hərb işi» adlanan bu əsərlər, təəssüf ki, indiyə qədər tapılmamışdır.

Babur eyni zamanda türk ədəbiyyatında ilk tərcüməçilərdən biridir. Ağır xəstə olduğu zaman əgər bu xəstəlikdən qurtulsam, o zaman mənə Babur adını qoyan Xoca Übeydullah Əhrarın «Risaleyi-validiyyə»sini farscadan türk dilinə tərcümə edəcəyəm deyə əhd edən Babur 1528-ci ilin 6 noyabrında tərcüməyə başlamış, «Baburnamə»də yazdığına görə, tək bir gün ara verməklə əsəri iki həftə ərzində tamamlamışdır. Babur bu risalənin müəllifinə dərin hörmət və sonsuz ehtiram bəslədiyi üçün həmin əsər Baburun divanının əvvəlinə qoyulmuşdur. Baburun tərcüməçilik fəaliyyətinin örnəyi olan «Risaleyi-validiyyə» onun «Seçilmiş əsərləri»nə daxil edilmişdir.

***

Qazi Zəhirəddin Məhəmməd Baburun yaradıcılığında «Baburnamə» (digər adları: «Vəqaye» və «Baburun xatirələri») əsəri mühüm yer tutur, ona görə də bu əsər haqqında xüsusi danışmaq lazımdır. Türk və islam ədəbiyyatında memuar janrında yazılmış ilk əsər olan «Baburnamə» 1494-1529-cu

illər arasında Orta Asiyada, Əfqanıstanda və Hindistanda baş verən bütün hadisələri, müəllifin öz həyatını, o dövrün bütün siyasi xadimlərini, elm və ədəbiyyat nümayəndələrini əhatə edir. Kitabda o regionun flora və faunası, coğrafiyası, etnoqrafik özəllikləri barədə geniş məlumat var. Əsərin ondan artıq əlyazma nüsxəsi mövcuddur.

«Baburnamə» hələ müəllifin öz sağlığında böyük əks-səda doğurmuşdur. Təkcə Əkbər şahın sarayında üç dəfə farscaya tərcümə edilmişdir. Yekdil rəyə görə, ən yaxşı tərcümə Əbdürrəhim xani-xanana məxsusdur (1586). O, Baburun yaxın silahdaşı, məşhur türkmən sərkərdəsi, çağatay, türkmən, eləcə də bizim ədəbiyyatın klassiki Bayram xanın oğludur. Baharlı boyuna mənsub olan Bayram xan əvvəlcə bir müddət Şah İsmayıl Xətainin yanında qulluq etmişdir.

«Baburnamə»nin şöhrəti qısa müddət ərzində Avropaya da yayılmış, Vitsen onun haqqında holland dilində (1705), C.Leyden və V.Erksin ingilis dilində (1826), Pave de Kurteyl fransız dilində (1871) yazılar yazmış, bəzi hissələrini tərcümə etmişlər. Əsər ilk dəfə 1857-ci ildə məşhur rus türkoloqu N.İ.İlminski tərəfindən Kazanda çapdan buraxılmışdır. A.N.Samoyloviç isə 1917-ci ildə Sankt-Peterburqda «İmperator Baburun şeirləri» adlı kitabı rus dilində nəşr etdirmişdir.

«Baburnamə»nin ilk tam tərcüməsi tanınmış ingilis alimi Annet Susanna Beveric tərəfindən 1905-ci ildə həyata keçirilmişdir. O, əsərin Heydərabad nüsxəsinin faksimilesini sinkoqrafiya üsulu ilə çap etmiş, tərcüməsini vermiş, on səhifəlik önsöz yazmış, kitabın axırına şəxs, qəbilə, tayfa, boy adları və coğrafi adlar göstəricisi əlavə etmişdir. Annet xanım Baburun xatirələrini Gibbonun və Nyutonun memuarları ilə müqayisə etmişdir. Daha sonra böyük özbək alimi Əbdürrauf Fitrət 1928-ci ildə «Baburnamə»dən bəzi fraqmentləri çap etdirmişdir. Əsər ordinarius professor Rəşid Rəhməti Arat tərəfindən türk dilinə (1940), Bevericin ingiliscə tərcüməsinin əsasında Mixail Salye tərəfindən rus dilinə çevrilmiş, 1943-cü ildə Daşkənddə, 1958-ci ildə isə Moskvada çapdan buraxılmışdır. «Baburnamə» ümumən dörd dəfə ingilis (1826, 1905, 1921, 1922), üç dəfə fransız (1879, 1980, 1985), bir dəfə alman (1878), bir dəfə ispan (2005) dilinə çevrilmişdir.

Baburun irsinin öyrənilməsinə özbək alimləri də mühüm töhfələr vermişlər. «Baburnamə» 1948-ci ildə Daşkənddə iki cild halında məşr edilmiş, 1959-cu ildə isə Baburun seçilmiş əsərləri işıq üzü görmüş, 1956-66-cı illərdə üçcildliyi çap olunmuşdur. Tanınmış baburşünas Parsa Şəmsiyev 1960-cı ildə bir neçə nüsxə əsasında «Baburnamə»nin elmi-tənqidi mətnini hazırlamışdır. 1982-ci ildə M.Salyenin rusca tərcüməsi yenidən oxuculara təqdim edilmişdir.

1980 və 1985-ci illərdə «Baburnamə» UNESCO xətti ilə S.Əzimcanovanın (Özbəkistan), Əbdülhey Həbibi (Əfqanıstan) və Mühibül Həsənin

(Hindistan) redaktorluğu, tanınmış fransız türkoloqu Lui Bazenin ön sözü ilə fransız dilində iki dəfə nəşr olunmuşdur. 1994-cü ildə yapon şərqşünası İ.Mano əsərin elmi-tənqidi mətnini çap etdirmişdir.

Baburun macəralarla dolu əfsanəvi həyatı yazıçıları da yaxından maraqlandırmışdır. Fransız yazıçıları F.Qrenard (Paris, 1930) və F.A.Stil (Paris, 1940), ABŞ yazıçısı V.Qaksoni (Nyu-York, 1980) Babur haqqında romanlar yazmışlar. Təbii ki, bu əsərlərin əsasında «Baburnamə»dəki faktlar dayanmışdır. Məşhur ədib Munilalə isə Baburun həyatından bəhs edən 6 roman qələmə almışdır. Bu əsərlər arasında ən populyarı amerikalı yazıçı Harold Lambın 1961-ci ildə Nyu-Yorkda çapdan çıxan «Babur the Tiger. First of the Great Mogols» kitabıdır. Həmin kitab müxtəlif ölkələrdə dəfələrlə nəşr edilmiş, 2000-ci ildə Moskvada rus dilində «Бабур-тигр. Великий завоеватель Востока» adı ilə çap olunmuşdur.

Özbək ədibləri də Babura bir sıra əsərlər həsr etmişlər. Aybək, B.Baykabulov və Xurşid Dövran qələmə aldıqları poemalarında, Pirimqul Qədirov «Ulduzlu səma» romanında, Xeyrəddin Sultanov isə «Baburinamə» povestində Baburun ölməz surətini canlandırmışlar.

Baburun yadacılığı, xüsusilə «Baburnamə» əsəri ilə bir çox ölkələrin alim və mütəxəssisləri məşğul olmuşlar Onlardan U.Erksin, L.M.Pull, S.M. Edvards, A.S.Beveric, P.M.Kaldekot, Ç.Stori, E.Holden, L.U.Kinq, F.J.Talbot, İ.Mano, D.Ross, M.F.Köprülü, R.R.Arat, H.Bayur, Z.Mansuri, P.Şarma, A.K.Sinqh, N.Veselovski, M.Salye, İ.V.Stebleva və başqaları Baburun ədəbi irsinin tədqiqində mühüm işlər görmüşlər.

Özbəkistanda Beynəlxalq Babur Fondu və Babur yaradıcılığını öyrənmək üzrə beynəlxalq elmi ekspedisiya təşkil edilmişdir. Toplanan minə yaxın kitab və sənəd «Babur və dünya sivilizasiyasında onun yeri» adlı xatirə muzeyində qorunur. Bu kitablar arasında Baburun müxtəlif dillərə çevrilmiş əsərləri ilə yanaşı «Baburnamə»nin tərcümələri, Böyük moğol imperiyasının tarixi haqqında qələmə alınmış tədqiqatlar xüsusi yer tutur. U.Erksinin özbəkcəyə çevrilmiş «Hindistanda Baburi dövləti» (Daşkənd, 1997) və P.Şarmanın «Baburilər səltənəti» (Daşkənd, 1999) kimi fundamental araşdırmalar xüsusilə diqqətəlayiqdir. Əndicanda salınmış Babur parkında onun rəmzi qəbri qoyulmuş, «Ərk içi» adlanan xatirə kompleksi ucaldılmışdır.

***

«Baburnamə» üç hissədən ibarətdir. «Fərqanə» adlanan birinci hissədə Baburun taxta çıxdığı 10 iyun 1494-cü ildən 14 iyun 1504-cü ilə qədər baş verən hadisələr öz əksini tapır. Bu on il ərzində Babur taleyin bir sıra ağır sınaqlarına məriz qalmış, ata mülkünü dəfələrlə itirmiş və qazanmış, axırda yenə itirərək çarəsizlik içində Xorasana getmək üzrə vətənini tərk etmişdir.

«Baburnamə»nin ikinci hissəsi «Kabil» adlanır. 14 iyun 1504-cü ildən 12 dekabr 1520-ci ilə qədərki 15 il yarımlıq dövrü əhatə edən bu hissədə bö-

yük dövlət xadimi və sərkərdə saysız-hesabsız vuruşlarda iştirak etmiş, nəhayət, bəlli bir coğrafiya üzərində öz səltənətini qura bilmişdir. Maraqlıdır ki, Babur 1494-cü ildən 1510-ci ilə qədər o dövrdə Mərkəzi Asiyada və ətraf coğrafiyada ən müqtədir hökmdar olan Şeybani xanla mütəmadi olaraq çarpışmışdır. Şeybani xan onu addım-addım izləmiş, hətta Kabilə qədər qəlmişdir. 1510-cu ildə Şeybani xanın Şah İsmayıl tərəfindən öldürülməsi ilə Babur Kabili əlində saxlamaqla əski torpaqları uğrunda mübarizə aparmışdır. Bundan da bir şey çıxmayınca Hindistana yönəlmişdir.

«Baburnamə»nin «Hindistan» adlanan hissəsi 8 oktyabr 1526-cı ildən 1529-cu ilin 5 sentyabrınadək olan dövrün hadisələrini əhatə edir. Əslində, Baburun Hindistan macərası hələ 1519-cu ildə başlamışdır. O, həmin vaxtdan sonra Hindistana beş dəfə yürüş etmiş, Pəncabı (1519/20), Qəndaharı (1522), Lahoru (1523), Dehlini və Aqranı (1526) ələ keçirmiş, Əfqanıstanı, Bəlucistanı və şimali Hindistanı öz hökmranlığı altına alaraq Böyük moğollar imperiyasının təməlini qoymuşdur. Əsərin «Hindistan» qismində Baburun yerli hökmdarlardan İbrahim Ludi ilə Panipat savaşı, hind raçputların başçısı Rana Sanka ilə Kanva savaşı, əfqan tayfaları və benqallarla savaşı öz əksini tapmışdır.

Baburun xatirələri beş yerdə qırılır. Xorasana getmək üzrə vətənini tərk etdiyi ilin, yəni 908-ci ilin (1503-04) hadisələri başa çatmadan kəsilir, 909-cu ilin (1504-05) hadisələri isə bütünlüklə yoxdur.

Xatirələr ikinci dəfə 914-cü ilin əvvəllərində kəsilir, on il 7 aylıq fasilədən sonra 925-ci ildə təkrar başlayır. Yəni kitabda 1508-ci ilin mayından 1519-cu ilin 3 yanvarınadək olan dövrün hadisələri yoxdur.

Baburun xatirələrinin 926-cı ilin əvvəllərindən (12 dekabr 1520-ci ildən) 932-ci ilə (18 oktyabr 1525-ci ilə) qədər olan hissəsi də yoxdur.

Xatirələrdə 1528-ci ilin 2 aprelindən 15 sentyabrınadək beş ay yarımı əhatə edən və açıqlanmayan bir kəsinti də var.

Baburun xatirələri 936-cı il məhərrəm ayının 3-də (3 sentyabr 1529-cu il) sonuncu dəfə kəsilir. Ondan sonra yaşadığı on beş ay yarım boyunca ya bir şey yazmamış, ya da yazdıqları itmişdir. Babur 937-ci ilin 5 cümadüyüləvvəl günü (25 dekabr 1530-cu il) vəfat etmişdir. Biz bu boşluqlarda baş verən hadisələrin qısa icmalını mətnaltı haşiyələrdə verərək mənzərəni qaba şəkildə tamamlamağa, xatirələri bir növ bərpa etməyə çalışmışıq.

Baburun bu xatirələri necə və nə zaman yazdığı haqqında dəqiq məlumat yoxdur. Dəqiq bilinən bir şey varsa, o da həmin dövrdə saray tarixçisi, münşi və ya xronistin olmadığıdır. Elə isə Babur bütün hadisələri özü qeydə almış, xüsusi gündəlik tutmuşdur. Lakin əsərdə bunu təsdiq edən ciddi bir işarə yoxdur. Bütün hallarda ehtimal etmək olar ki, Babur müntəzəm və ya ara-sıra gündəlik tutmuş, bu materiallar əsasında xatirələrini Hindistanda yazıb bitirmişdir. Xatirələrin son dövrünü əhatə edən illərdə Babur hadisələri

günbəgün təsvir edir, hətta səhər, günorta, ikindi, axşam, gecə baş verən hadisələri də müfəssəl nəql edir. Bəzi məqamlarda bu və ya digər hadisə və ya şəxs haqqında təhkiyəni kəsən müəllif bu barədə sonra məlumat verəcəyini bildirir. Tək bir yerdə isə (3 mart 1529-cu ildə) bunu qeyd edir: «Xoca Yəhyanın nəvəsi Xoca Kəlan isə məndən yazmaqda olduğum *Vəqaye*ni istəmişdi. Surətini çıxartdırmışdım, onu da Şəhrək vasitəsilə göndərdim».

«Baburnamə»də faktiki materail, bir-birinə qarışan hadisələr, alışmadığımız adlar hədsiz dərəcədə çoxdur, lakin buna baxmayaraq əsər sonsuz maraqla, bir macəra ədəbiyyatı nümunəsi kimi zövqlə oxunur. Baburun dilinin sadəliyi, obrazlılığı, müşahidələrinin zərifliyi, qeyri-adiliyi, dəbdəbədən uzaq təhkiyə tərzi, səmimiyyəti insanı heyran edir.

Babur hər şey haqqında obyektiv və dəqiq yazmışdır. Müasiri olduğu və ya özündən əvvəl yaşamış hökmdarlar, onların nəsəbi, həyatı, xasiyyəti, savaşları və meydan müharibələri, adbaad göstərməklə arvadları və cariyələri, oğulları və qızları, əmirləri və bəyləri, saraylarında yaşayan alimlər, şairlər, rəssamlar, müsiqiçilər, xəttatlar və başqa sənətkarlar haqqında geniş və maraqlı məlumatlar vermişdir. Gəzib gördüyü yerlərdəki tarixi abidələr, ayrı-ayrı xalqlara, tayfa və qəbilələrə xas olan etnoqrafik özəlliklər, adət-ənənələr, yeməklər, geyimlər onun nəzərindən yayınmamışdır. Babur təbiətin gözəlliklərini, fərqli coğrafi ərazilərdə bitən ağac və gülləri, meyvə və bitkiləri, heyvanları, quşları, balıqları da eyni həssaslıq və diqqətlə təsvir etmişdir. O, musiqi, xüsusən də muğamlar haqqında dərin məlumat sahibi olduğunu göstərmişdir. Bu mənada «Baburnamə» o dövrün bir ensiklopediyası sayıla bilər.

Babur hətta öz şəxsi qüsurlarını göstərməkdən, özünə tənqidi yanaşmaqdan, bəzən də istehza etməkdən çəkinməmişdir. Onun içki məclisləri, məcun, kəmali, tiryək qəbul etməsi də xatirələrdə öz əksini tapmışdır. Babur öz tabeliyindəkilərə və qohumlarına da obyektiv qiymət vermişdir. Hətta öz əmisi uşaqları ona qarşı xəyanət edəndə, dövlət çevrilişi təşkil edib taxtı onun əlindən almaq istəyəndə belə Babur onları bağışlamışdır.

Babur bir çox yerdə əmilərinin, dayılarının, xalalarının ona və anasına qarşı haqsızlıq etdiklərini vurğulamış, onlardan etibar və şəfqət qörmədiklərini qeyd etmişdir: «Bunları yazmaqdan məqsədim şikayət deyil, gerçəkləri söyləməkdir, bu söylənənlərdən məqsəd özümü tərif deyil, gerçəkləşmiş olanları bəyan etməkdir. Burada hər sözün doğrusunu və hər işi olduğu kimi yazmağı gərəkli saydığım üçün, şübhəsiz ki, ata və böyük qardaşdan yaxşı və pis nə eşidilib görülmüşsə onları söylədim, qohumlardan və yadlardan da nə qüsur və ya məziyyət görülmüşsə, onları yazdım. Oxuyan məzur görsün, eşidənlər də qınamasın».

«Baburnamə»də yüzə yaxın şeir parçası var. Bunların bir qismi şairin öz əsərləri, bir qismi başqa şairlərin, əsasən də Sədi Şirazinin şeirləridir. Ye-

ri və məqamı gəldikcə Qurandan alıntılar, farsca və türkcə bir neçə atalar sözü var. Farsca şeirlərin və atalar sözlərinin orijinalını sətri tərcümələri ilə birlikdə verməyi məqsədəuyğun saydıq.

Bu mötəşəm əsəri ana dilimizə çevirərkən onun türkcə (Rəşid Rəhməti Arat), rusca (Mixail Salye) tərcümələri ilə yanaşı Parsa Şəmsiyev tərəfindən hazırlanmış özbəkcə-çağatayca nəşrindən istifadə etdik. Baburun dili, xüsusən də mürəkkəb cümlələr sintaktik baxımdan farscanın təsiri altındadır. Misal üçün: «Sabahı divanda Qulubəy kim, Kaşğarğa Sultan Səid xan qaşına elçilikkə barıb idi, kəlib mülazimət qıldı». Sadə cümlələr isə tam tükcədir. Ona görə də bəzi cümlələri daha dəqiq anlamaq üçün onları türkcə və rusca mətnləri ilə tutuşdurmaq lazım gəlirdi. Bundan başqa, həmin dövrdə həyatın müxtəlif sahələrində işlənmiş çoxsaylı termin və təbirlərin qarşılığını tapmaq asan deyildi. Bu baxımdan türkcə və rusca tərcümələr bizə müstəsna dərəcədə kömək etdi. Əsərin koloritini qorumaq üçün bəzi termin və deyimləri olduğu kimi saxladıq və kitabın sonunda verilən qeydlər və izahlar qismində onların mənasını açıqladıq.

Şübhəsiz ki, bu böyük həcmli mürəkkəb əsərin tərcüməsi nöqsan və qüsurlardan da xali deyildir. Bizim arzumuz bu tərcümədən sonra daha mükəmməl tərcümələrin meydana çıxmasıdır. Yoxsa ki, ucuz şöhrətə və birincilik palmasına sahib olmaq kimi bir istəyimiz, əlhəmdülillah, yoxdur və ola da bilməz. Bizim türklüyə təmənnasız xidmətdən başqa bir qayəmiz yoxdur.

Mötərizə içində qara şriftlə a-b ilə verilən rəqəmlər Heydərabad nüsxəsinin səhifələrini göstərir.

Yekun olaraq demək olar ki, ortaq türk ədəbiyyatının ən parlaq simalarından biri olan Zəhirəddin Məhəmməd Babur çağatay ədəbiyyatında poeziyada Əlişir Nəvaidən sonra ikinci ən uca zirvə, nəsr sahəsində isə birinci, fəth olunmamış zirvədir. Babur bütün qanı, canı, dili və xarakteri ilə türkdür, həmişə də bununla fəxr etmişdir. Türklüklə və Baburla fəxr etmə növbəsi indi bizdədir. Baburun şəxsiyyətinin və əsərlərinin tanıdılması və təbliği türk ziyalılarının birinci dərəcəli vəzifələrindəndir. Zira gənc nəslə türk ulularını tanıtmadan, onun tarixi yaddaşını təzələmədən keçmişlə bugün, bugünlə gələcək arasında sağlam körpü qurmaq mümkün deyil. Halbuki müasir dövrdə, qloballaşan dünyamızda buna böyük ehtiyac var.

Dünya tarixinə türk adını öz kəskin qılıncı və zərif qələmi ilə qızıl hərflərlə yazmış Zəhirəddin Məhəmməd Baburun bugünə qədər ölkəmizdə yalnız bir kitabı nəşr edilmişdir. Mütəxəssislər xaricində onun sənəti ilə çox az adam tanışdır. Bu acı gerçəklə üzləşmək mümkündür, ancaq onunla barışmaq olmaz. Ona görə də biz Baburun «Seçilmiş əsərləri»ndən sonra onun məşhur «Baburnamə»sini də ana dilimizə tərcümə və nəşr etməyi qərara aldıq. Ürəkdən inanırıq ki, Azərbaycan oxucuları və ədəbi ictimaiyyət Baburun bu kitabını da böyük rəğbətlə qarşılayacaq, bu azman şair-hökm-

darla bağlı ədəbiyyat, ədəbiyyatşünaslıq və tədris sahəsində uzun müddətdən bəri mövcud olan boşluq, gec də olsa, doldurulacaqdır.

Biz öz ənənəmizə sadiq qalaraq, bu kitabı da TürkSOY kitabxanası seriyası silsiləsindən nəşr edirik. Bununla da türk dünyasının UNESCO-su sayılan TürkSOY-un türk xalqlarının bir-birinə yaxınlaşması, ümumi inkişafı və qarşılıqlı zənginləşməsi uğrunda apardığı coşğun və nəcib fəaliyyətə kiçik bir töhfə verdiyimizə inanırıq.

Burada bir məsələni növbəti (on ikinci!) dəfə vurğulamaq istəyirik: TürkSOY kitabxanası seriyası layihəsi bütünlüklə könüllülük əsasında həyata keçirilir. Layihədə iştirak edən hər kəs, o cümlədən kitabı türkcə və rusca tərcümələrindən istifadə etməklə orijinalından ana dilimizə çevirən, ön sözün, qeyd və izahların müəllifi bəndəniz Ramiz Əskər, redaktoru hörmətli Prof. Dr. Hüseyn İsmayılov bu işi türklüyə bir xidmət olsun deyə heç bir məvacib və honorar almadan təmənnasız yerinə yetirmişlər. Tərcümə zamanı mənə Ankaradan müxtəlif elmi ədəbiyyat göndərən, bir sıra texniki məsələlərin həllində kömək edən əziz dostum, Avrasiya Yazarlar Birliyinin orqanı «Qardaş qələmlər» jurnalının redaktoru Ömər Məhmətoğluna və bu kitabdakı farsca şeirlərin sətri tərcüməsinin hazırlanmaslnda əməyi keçən dostum İlqar ƏIfioğluna, xüsusilə tərcümə üzərində işlədiyim zaman mənə hər cür şərait yaradan, mənəvi cəhətdən dəstək olan həyat yoldaşım Solmaz xanıma sonsuz təşəkkürümü bildirirəm.

**Ramiz ƏSKƏR.**
*Bakı, 24 mart 2011-ci il.*

# I. FƏRQANƏ

FƏRQANƏ - 899 (12 OKTYABR 1493 - 2 OKTYABR 1494)

## SƏKKİZ YÜZ DOXSAN DOQQUZUNCU İLİN HADİSƏLƏRİ

**(1 b)** Tanrı-təalanın inayəti, həzrəti-sərvəri-kainatın şəfaəti və çahar-yari-basəfaların himməti ilə[1] 899-cu il ramazan ayının 5-də[2] (=10 iyun 1494**)** çərşənbə axşamı on iki yaşında Fərqanə vilayətində padşah oldum.

## FƏRQANƏ VİLAYƏTİNİN TƏSVİRİ

F ə r q a n ə vilayəti[3] beşinci iqlimdədir[4] və məmurənin kənarındadır. Şərqi Kaşğar, qərbi Səmərqənd, cənubu isə Bədəxşanın sərhəddi olan dağlardır. Şimalında əvvəllər Almalıq, Almatu və Yengi (kitablarda Otrar kimi yazılır) kimi şəhərlər varmış, lakin onlar moğol və özbəklər tərəfindən xarab edilmiş və bugün artıq heç bir abadlığı qalmamışdır. Kiçık bir vilayətdir. Taxılı və meyvəsi boldur.

Ətrafı dağlıqdır, yalnız Səmərqənd və Xocəndin yerləşdiyi qərb tərəfində dağ yoxdur. Qışda o tərəfdən başqa heç bir yerdən düşmən gələ bilməz. Xocənd çayı adı ilə də bilinən Seyhun çayı **(2 a)** bu ölkənin şimal-şərqindən gəlir və içindən keçərək qərbə tərəf axır; Xocəndin şimalından və bugün Şahruxiyyə[5] adı ilə bilinən Fənakətin cənubundan keçib təkrar şimala dönərək Türküstana doğru gedir. Türküstandan xeyli aşağıda bu çay heç bir çaya qarışmadan qumlar arasında tamamilə itir.

Fərqanə vilayətinin beşi Seyhun çayının cənubunda, ikisi də şimalında olmaqla yeddi şəhəri vardır.

Ə n d i c a n güney tərəfdəki şəhərlərdən biri olub mərkəzdədir. Bu şəhər Fərqanə vilayətinin paytaxtıdır. Taxılı çoxdur, meyvəsi boldur, qovunu və üzümü yaxşıdır. Qovun yetişən mövsümdə bostandan qovun satmaq adəti yoxdur. Əndican naşpatisindən daha yaxşı naşpati[6] tapılmaz.

Bütün Mavəraünnəhr bölgəsində Səmərqənd və Keş kurqanlarını çıx-

---

[1] Cümlənin bu qismi türkcə və rusca nəşrlərdə yoxdur, özbəkcə nəşrindən aldıq.

[2] Babur olayları müsəlman hicri təqvimi ilə verir. 899-cu il miladi tarixlə 1493/94-cü ilə uyğun gəlir (bundan sonra miladi tarixlər bərabərlik işarəsi ilə mötərizədə göstəriləcək).

[3] Hazırda beş vilayətdən ibarət olan tarixi Fərqanə (təxminən 20 000 kv km) üç qonşu dövlətin tərkibindədir: Fərqanə, Əndican və Nəmənqan Özbəkistana, Xocənd Tacikistana, Oş isə Qırğızıstana daxildir.

[4] Ptolomeyin coğrafiyasına görə, dünya cənubdan şimala doğru yeddi iqlimə ayrılır və üçüncüdən beşinciyə qədər olan iqlimlər yaşamağa əlverişlidir.

[5] Şahruxiyyə: əskidən Finakət və ya Bənəkət adlanan bu şəhər monqol hücumu zamanı xarabaya çevrilmişdi. Əmir Teymur onu bərpa etdirərək oğlu Şahruxun şərəfinə Şahruxiyyə adlandırmışdı. Hazırda xarabalıqları qalır.

[6] *Naşpati:* Əndicanda yetişən və ən gözəl olduğu söylənən qovun və ya armud növü.

maqla Əndican kurqanından daha böyük kurqan[1] yoxdur. Üç qapısı vardır. Ərki[2] güney tərəfindədir. Maraqlıdır ki, buraya doqquz tarnovdan[3] su girdiyi halda heç bir yerdən çıxmır. Qalanın ətrafındakı xəndəyin kənarında daş döşənmiş böyük bir yol var. Qalanın ətrafı məhəllələrlə çevrilmişdir. Bu məhəllələr qaladan bu xəndək və onun yanından keçən böyük yolla ayrılır.

Ov quşu çoxdur. Qırqovulu **(2 b)** hədsiz ətli olur. Rəvayət edirlər ki, bir qırqovulu dörd adam yeyib qurtara bilmirmiş.

Əhalisi türkdür. Şəhərdə və bazarda türkcə bilməyən yoxdur. Xalqın danışıq dili yazı dilinə uyğundur. Bu səbəblə Mir Əlişir Nəvai Heratda nəşvü nüma tapdığı halda, əsərlərini bu dillə yazmışdır. Camaatın dili poetikdir. Əhalisi arasında gözəllər çoxdur. Musiqidə məşhur olan Xoca Yusif əndicanlıdır. Havası rütubətli olduğu üçün səhhətə zərərlidir, payızda qızdırmaya tutulanlar çox olur.

O ş şəhəri Əndicanın cənub-şərqindədir. Şərqə doğru Əndicandan dörd ağac[4] məsafədədir. Havası gözəl və suyu boldur. Baharı çox gözəl olur. Oşun gözəlliyinə dair bir çox rəvayət vardır.

Kurqanının cənub-şərqində təbiətlə ahəng içində olan bir dağ vardır. Bərakuh adlı bu dağın təpəsində [Baburun dayısı, moğol xanı] Sultan Mahmud xan bir köşk tikdirmişdir. Bu köşkdən bir az aşağıda, dağın çıxıntılı, dik bir yerində 902-ci ildə (=1496/97) mən də eyvanlı bir köşk tikdirdim. Onun köşkü mənimkindən daha yüksəkdə olsa da, mənimki daha gözəl bir yerdədir; bütün şəhər və məhəllələr ayaq altındadır **(3 a)**.

Əndican çayı Oş məhəllələrinin içindən keçərək Əndicana axır. Bu çayın iki tərəfi boyu bağlar uzanıb gedir. Buranın bənövşəsi çox lətafətlidir. Axar suları vardır. Baharı çox gözəl olur; bir çox lalə və gül açır.

Bərakuh dağının ətəyində, çay ilə bağların arasında Cövza adlı kiçık bir cami var. Caminin dağ tərəfindən böyük bir çay axır. Bu caminin lətif yoncalarla örtülü bayır həyəti bir az meylli, hər tərəfi kölgəli və səfalı bir meydandır. Hər gələn qonaq və yolçu burada istirahət edir. Oş camaatının qəribə bir adəti var: əgər bir adam burada yatıb qalsa, o çaydan su alıb üstünə tökürlər.

[Teymur bəyin oğlu] Ömər Şeyx Mirzənin son zamanlarında bu dağda qırmızı və ağ dalğalı bir daş tapılmışdı. Bıçaq sapı, kəmər toqqası və digər bəzi şeylərin emalı üçün istifadə olunan çox gözəl bir daşdır. Fərqanə vilayətində Oş qədər səfalı və havalı bir şəhər yoxdur.

M ə r g i n a n Əndicanın qərbində və ondan yeddi ağac məsafədə gözəl bir şəhərdir. Neməti çox, narı və əriyi fövqəladə gözəldir. Danəkəlan

---

[1] *Kurqan*: qala deməkdir. Orijinal mətndə bu sözlə verildiyi üçün saxladıq.
[2] *Ərk*: içqala, bürc, qala içində qala.
[3] *Arx,* yaxud *tarnav: s*u kanalı.
[4] *Ağac:* dövrə və bölgəyə görə dəyişən, təxminən 6 km olan bir uzunluq ölçüsüdür.

dedikləri bir növ narı vardır ki, şirinlikdə və meyxoşluqda Səmnan narlarına **(3 b)** tərcih edilə bilər. Çəkirdəyini çıxardıqdan sonra içinə badam qoyub qurutduqları və sübhani dedikləri bir əriyi də çox ləzzətlidir.

Ovu və quşu çoxdur; civarında ağ geyiklər olur. Əhalisi sartdır[1]. Bunlar yumruq yarışında mahir və davakar insanlardır. Yumruq yarışı Mavəraünnəhrdə çox bilinən bir adətdir. Səmərqənd və Buxarada bu sahədə şöhrət qazananların çoxu mərginanlıdır. *Hidayə* adlı əsərin müəllifi Şeyx Bürhanəddin Əli Mərginanın Rəşdan kəndindəndir.

İ s f ə r a dağ ətəyində salınmış, axar suları və şaftalı bağları olan bir şəhərdir. Mərginanın cənub-qərbində və ondan doqquz ağac uzaqlıqda yerləşir. Meyvə ağacları hədsiz çoxdur; lakin bağlarında badam ağacı üstünlük təşkil edir. Əhalisi tamamən sart və dağlıdır.

Cənubundakı təpələrin arasında daş-ayna dedikləri bir daş parçası var, uzunluğu təxminən on karidir[2]. Yüksəkliyi bəzi yerlərində insan boyu qədərdir, alçaq qismi isə bəzi yerlərində insan belinə çatır. Ayna kimi hər şeyi əks etdirir.

İsfəra vilayəti İsfəra, Varux, Sux və Huşyar olmaq üzrə dörd dağ ətəyindən ibarətdir. Məhəmməd Şeybani xan [Baburun dayıları] Sultan Mahmud xan ilə Alaca xanı məğlub edərək Daşkənd və Şahruxiyyəni alanda mən də bu Sux **(4 a)** və Huşyar dağlarının ətəklərinə gəlmiş və sıxıntı içində orada bir ilə yaxın qaldıqdan sonra Kabilə getmişdim.

X o c ə n d Əndicandan qərbə doğru iyirmi beş ağac məsafədə bir şəhərdir. Xocənd ilə Səmərqəndin arası da iyirmi beş ağacdır. Qədim şəhərlərdəndir. Şeyx Məsləhət (Müslihəddin) və Xoca Kamal xocəndlidir.

Meyvəsi bol və çox gözəl olur. Narı xüsusilə məşhurdur; sibi-Səmərqənd (Səmərqənd alması) və ənari-Xocənd (Xocənd narı) adla deyilir. Ancaq indilərdə Mərginanın narı daha yaxşıdır.

Kurqanı yüksək bir yerdədir. Seyhun çayı cənubdan axır və kurqandan təxminən bir ox atımı məsafədən keçir. Kurqan ilə çayın şimalındakı Mutugil adlı dağda firuzə mədənləri və digər yataqlar var. Bu dağda ilan yaman çoxdur.

Xocəndin ovlaq və quşlaqları çox yaxşıdır. Ağ geyik, geyik, qırqovul və dovşanı çoxdur. Havası sağlamlıq üçün çox zərərlidir və payızda qızdırmaya tutulan çox olur. Rəvayətə görə, burada sərçəni də qızdırma tuturmuş. Havasının pisliyinə şimaldakı bağların səbəb olduğu söylənir.

Xocəndə tabe olan K ə n d i – B a d a m bir şəhər olmasa da, kiçık və

---

[1] *Sart:* türklər və moğollar tərəfindən bəzi gövmlərin ortaq adı olaraq işlədilən termin. Sart adı Türküstanda moğol hakimiyyəti zamanı türk olmayan qövmlər üçün işlənmişdir. Buxara və Xokandda şəhərli və əkinçi xalqın dışındaki köçəri qırğızlara da sart deyilirdi. Qazaxlar isə türkcə və ya farsca danışmalarına baxmadan oturaq əhaliyə sart deyirdilər. Rəsmi yazı dilində taciklər dışındakı türkləşmiş xalq bu adla anılırdı.

[2] *Kari:* 6 tutam uzunluğunda, yəni 144 arpa boyunda bir uzunluq ölçüsü.

gözəl bir şəhərcikdir. Badamı yaxşı olduğundan **(4 b)** bu ad verilmişdir. Hürmüzə və Hindistana oranın badamı gedir. Xocənddən beş-altı ağac şərqdədir.

Xocənd ilə Kəndi-Badam arasında Ha-Dərviş adlı bir çöl var. Bu çöl daim küləklidir, orada tez-tez qasırğalar olur. Çölün şərqində yerləşən Mərginanla qərbində olan Xocəndə buradan sürəkli küləklər əsir. Rəvayətə görə, bir neçə dərviş bu çöldə qasırğaya tutulmuş və bir-birlərini tapa bilmədən «ha, dərviş, ha, dərviş!» deyərək ölmüşlər. O zamandan bəri bu çölə Ha-Dərviş deyirlər.

A x s i Seyhun çayının şimal tərəfindəki şəhərlərdən biridir. Kitablarda Axsi-kət deyə yazılır. Şair Əsirəddinə də Əsirəddin Axsikəti deyirlər. Fərqanədə Əndicandan sonra ondan böyük şəhər yoxdur. Əndicanın qərbində və doqquz ağac məsafədədir. Ömər Şeyx Mirzə buranı paytaxt eləmişdi.

Seyhun çayı kurqanın altından axır. Kurqan yüksək bir uçurumun üzərindədir və xəndək yerinə bu dərin uçurum vardır. Buranı mərkəz edən Ömər Şeyx Mirzə bir-iki qədəmə kənardan təkrar çuxurlar qazdırmışdır. Fərqanədə onun qədər möhkəm başqa bir kurqan yoxdur **(5 a)**. Şəhərin məhəllələri isə kurqandan bir şeri[1] uzaqdadır. «Deh koca və dərəxtan koca»[2] məsəlini, deyəsən, Axsi üçün söyləmişlər.

Qovunu yaxşı olur. Mir-teymuri dedikləri bir qovun növü var ki, belə qovun bütün dünyada yoxdur. Buxara qovunu da məşhurdur. Səmərqənd alınan zaman Axsidən və Buxaradan qovun gətirdib bir məclisdə kəsdirmişdim. Lakin Axsi qovunu ilə heç müqayisəyə gələ bilməz. Ov heyvanı və quşu çoxdur. Seyhun çayının Axsi tərəfi çöldür. Buralarda ağ geyik olduqca çoxdur. Əndican tərəfi isə meşəlikdir. Geyiyi, qırqovulu və dovşanı bol və çox kök olur.

K a s a n Axsinin şimalında yerləşir və olduqca kiçık bir şəhərdir. Əndican çayı Oşdan axdığı kimi, Axsi çayı da Kasandan axır. Gözəl və havalı bir yerdir. Səfalı bağları var və bunların hamısı dərə kənarında olduğu üçün buraya «quzu dərisindən kürk» deyirlər. Oşun və Kasanın əhalisi səfa və hava baxımından öz şəhərlərinin daha gözəl olduğunu iddia edirlər.

Fərqanə vilayətinin ətrafındakı dağlarda gözəl yaylalar vardır. Qızıl söyüd (tubulğu) ağacı yalnız bu dağlarda bitir, başqa yerlərdə bitmir. Tubulğu qabığı qırmızı bir ağacdır. Ondan əsa, **(5 b)** qamçı sapı və quş qəfəsi düzəldirlər, yonub ox da qayırırlar. Olduqca yaxşı bir ağacdır. Hədiyyə olaraq uzaq yerlərə də aparırlar.

Bəzi kitablarda yəbrüh üs-sənəmin[3] bu dağlarda bitdiyi yazılıdır. Lakin bu dövrdə belə bir şey heç eşitmədim. Yalnız Yeddi-kəndin dağlarında

---

[1] *Seri:* təxminən 2 milə uyğun gələn bir uzunluq ölçüsü. Bax: Qeydlər və izahlar.
[2] Kənd harada, ağaclar harada.
[3] *Yəbrüh üs-sənəm:* insan kökü adlanan bir bitki, adamotu, qanqurudan.

xalqın ayı otu dediyi və mehri-giyahın özəlliklərinə sahib bir ot olduğu məlumdur. Bu ot, deyəsən, mehri-giyahdır və oranın əhalisi ona bu adı vermişdir. Bu dağlarda firuzə və dəmir mədənləri də vardır.

Adil bir şəkildə idarə edildiyi təqdirdə Fərqanə vilayətinin gəliri ilə üç-dörd min əsgər bəsləmək mümkündür.

## ÖMƏR ŞEYX MİRZƏ

[Baburun atası] Ömər Şeyx Mirzə yüksək düşüncəli və böyük iddialı bir padşah olduğu üçün daima ölkəsini genişləndirmək barədə fikirləşirdi. Dəfələrlə Səmərqəndə qoşun çəkdi. Bəzən məğlub oldu, bəzən də məqsədinə çatmadan geri qayıtdı.

Qaynatası Yunus xan Çingiz xanın ikinci oğlu Çağatay xanın nəslindəndir. Mənim də babam olan Yunus xan o günlərdə Çağatay xanın yurdunda moğol ulusunun xanı idi. Ömər Şeyx Mirzə onu dəfələrlə xahiş-minnətlə dəvət edir və hər gəlişində ona vilayətlər verirdi. Ancaq işlər Ömər Şeyx **(6 a)** Mirzənin istədiyi kimi olmurdu. Gah Ömər Şeyx Mirzənin pis hərəkətlərindən, gah moğol ulusunun müqaviməti üzündən Yunus xan vilayətdə qala bilməyib təkrar Moğolistana gedirdi. Ən son dəvətində Ömər Şeyx Mirzə o zamanlar öz idarəsində olan Daşkənd vilayətini ona verdi. Bunu kitablarda Şaş, bəzən də Çaç deyə yazırlar ki, çaç yayı oradan gəlir. O tarixdən 908-ci ilə (=l503) qədər Daşkənd və Şahruxiyyə vilayəti çağatay xanlarının idarəsində qaldı. Bu dövrdə moğol ulusunun xanlığı Yunus xanın böyük oğlu və mənim anamın böyük qardaşı olan Sultan Mahmud xanda idi.

Ömər Şeyx Mirzənin böyük qardaşı Səmərqənd padşahı Sultan Əhməd Mirzə və moğol ulusunun xanı Sultan Mahmud xan Ömər Şeyx Mirzənin pis hərəkətlərindən rəncidə olduqları üçün bir-birləri ilə ittifaq etdilər. Sultan Əhməd Mirzə Sultan Mahmud xanı özünə kürəkən edərək həmin tarixdə Sultan Əhməd Mirzə Xocənd çayının cənubundan, Sultan Mahmud xan isə şimalından Ömər Şeyx Mirzənin üstünə qoşun çəkdilər. Bu zaman qəribə bir hadisə oldu. Əvvəlcə də bəhs etdiyimiz kimi, **(6 b)** Axsi qalası yüksək bir uçurum üzərində qurulmuşdur və onun binaları da bu uçurumun kənarında yerləşir. Bu tarixdə ramazan ayının dördüncü bazar ertəsi günü (=9 iyun 1494**)** Ömər Şeyx Mirzə bu uçurumdan göyərçin və göyərçinxana ilə düşərək öldü. Otuz doqquz yaşında idi.

**Doğumu və nəsəbi:** Ömər Şeyx Mirzə 860-cı ildə (=1456) Səmərqənddə doğulmuşdu. Sultan Əbu Səid Mirzənin dördüncü oğluydu. Qardaşları Sultan Əhməd Mirzə, Sultan Məhəmməd Mirzə və Sultan Mahmud Mirzədən kiçıkdir. Sultan Əbu Səid Mirzə isə Sultan Məhəmməd Mirzənin oğlu, Sultan Məhəmməd Mirzə Miranşah Mirzənin oğlu, Miranşah Mirzə isə Teymur bəyin üçüncü oğluydu. Miranşah Mirzə Ömər Şeyx ilə Cahangir

Mirzədən kiçık, Şahrux Mirzədən isə böyükdü.

Sultan Əbu Səid Mirzə Ömər Şeyx Mirzəyə ilk öncə Kabili vermiş və Baba Kabilini ona bəy-atəkə[1] təyin edib oraya göndərmişdi. Lakin mirzələrin sünnət düyünü səbəbilə Dəreyi-Gəzdən qaytarıb Səmərqəndə gətirtdi. Düyündən sonra -Teymur bəy böyük Ömər Şeyx Mirzəyə Fərqanə vilayətini verdiyi üçün- o da öz oğlu Ömər Şeyx Mirzəyə Əndican vilayətini verib Xudaverdi Tuğçu Timurdaşı bəy-atəkə təyin edərək oraya göndərdi.

**Xarici görkəmi:** qısa boylu, topsaqqal, şişman üzlü, tombul bir adam idi **(7 a)**. Çox dar paltar geyirdi. Qurşaq bağladarkən qarnını içəri çəkir və bağlandıqdan sonra özünü buraxanda çox zaman qurşaq qopurdu. Geyimə və yeməyə çox əhəmiyyət vermirdi. Çalmasını dəstar-piç sarıyırdı. Çalmalar o zaman çar-piç[2] idi və sadə sarılıb quyruq buraxılırdı. Yazda divan xaricində başına əksərən moğol biçimi börk qoyurdu.

**Əxlaqı və xasiyyəti:** hənəfi məzhəbindən olub təmiz etiqadlı bir adam idi. Beş rükət namazını buraxmazdı. Qəzaya qalanları da həyatda ikən tamamən qılmışdır. Çox zaman yüksək səslə *Quran* oxuyurdu. Xoca Übeydullah həzrətlərinin müridi idi və dəfələrlə onun söhbətləri ilə şərəfləndirilmişdir. Xoca həzrətləri ona «oğlum» deyə xitab edirdi. Oxuyub yazmağı yaxşı bilirdi. *Xəmsəteyn*i, tarix kitablarını və *Məsnəvi*ni oxuyub incələmişdi, tez-tez *Şahnamə* oxuyurdu. Şeirə istedadı vardı, lakin buna əhəmiyyət vermirdi.

Ədalətinin nə qədər yüksək olduğu bu əhvalatdan da məlumdur: min adamlıq bir Xıtay karvanı yolda gedərkən Əndican tərəfindəki dağların ətəyində qar altında qalmış və ancaq iki adam xilas olmuşdu. Bunu eşidən kimi məmurlar göndərib karvanın bütün malını **(7 b)** zəbt etdirdi. Orada varislər olmadığı və özünün də ehtiyacı olduğu halda bu malları qorudu. Bir-iki il sonra varisləri Səmərqənd və Xorasandan axtarıb tapdıraraq mallarını əskiksiz olaraq təslim etdi.

Çox cömərd və cömərd olduğu qədər da xoşxasiyyət idi; yaxşı təbiətli, gözəl və şirindil bir adamdı. Cəsur və mərddi. Bir dəfə Axsi qapısında və bir dəfə də Şahruxiyyə qapısında olmaq üzrə iki dəfə bütün igidlərdən[3] daha yaxşı qılınc çaldı. Oxu orta dərəcədə atırdı. Yumruğu çox qüvvətli idi, onun yumruğundan yıxılmayan yoxdu. Ölkəsini genişləndirmək ehtirası üzündən bir çox sülh müqaviləsi savaşa, dostluqlar isə düşmənçiliyə çevrildi.

Əvvəllər çox içirdi. Sonralar yalnızca həftədə bir-iki dəfə məclis qurdu. Xoşsöhbət bir adamdı, yerində və gözəl beytlər oxuyurdu. Sonralar daha

---

[1] *Bəy-atəkə:* əslində *ata* və *əkə* "böyük qardaş" sözlərindən ibarət bir sözdür. Gənc şahzadələrin tərbiyə edilməsi və şahzadələr üçün ayrılmış vilayətlərin idarəsi ilə ilgili mühüm bir məmuriyyətə bəy-atəkəlik deyilirdi. Bizdəki atabəy və lələ tituluna uyğundur. Baburda bəy-atəkə ilə birlikdə eşik ixtiyarı termini də işlənir.

[2] *Çar-piç* və *dəstar-piç:* çalma sarılarkən sarığın dolaşma, bükülmə və ya qıvrılmalarına görə işlənən terminlər.

[3] *İgid:* hökümdarın və ya bir bəyin yanında şəxsi tapşırıqlar məmuru; zabit.

ziyadə məcun atmağa başlamışdı, məcun atanda özündən gedirdi. Zəngin olmaqla birlikdə təvazökardı. Həmişə nərd, bəzən də qumar oynayırdı.

**Meydan müharibələri:** üç meydan müharibəsi elədi. Birincisi [öz qaynatası] Yunus xan ilə Əndicanın şimal **(8 a)** tərəfində və Seyhun çayı sahilindəki Təkə-Səkritgü adlı yerdə elədiyi müharibədir. Bu çay dağ ətəyində çox dardır, rəvayətə görə, buradan bir təkə atlamış və bu ad da bunun üçün verilmişdir. Bu müharibədə yenildi və yaxalandı, ancaq Yunus xan yaxşılıq edib onu buraxdı. Müharibə burada olduğu üçün Təkə-Səkritgü müharibəsi bu vilayətdə bir tarix olmuşdur.

İkincisi Türküstanda, Araş (Urs) çayının sahilində Səmərqənd ətrafını yağmalayan özbəklərlə elədiyi müharibədir. Araş çayını buz üzərindən keçərək onları möhkəm əzişdirdi, əsirlərini və mallarını geri alıb hamısını sahiblərinə qaytardı. Özü heç bir şeyə tamah salmadı.

Üçüncüsü isə [böyük qardaşı] Sultan Əhməd Mirzə ilə Şahruxiyyə və Ura-Təpə arasındakı Xas adlı kənddə etdiyi və yenildiyi müharibədir.

**Torpaqları**: atası ona Fərqanə vilayətini vermişdi. Bir müddət Daşkənd və Sayram da onun əlində idi. Buraları ona böyük qardaşı Sultan Əhməd Mirzə vermişdi. Şahruxiyyəni də hiylə ilə alaraq bir müddət əlində saxladı. Son zamanlarında Daşkənd və Şahruxiyyə əlindən çıxmışdı. Fərqanə vilayəti, Xocənd və Ura-Təpə -əsil adı Usruşnadır, amma Usruş da deyirlər- əlində idi. Xocəndi bəziləri Fərqanə **(8 b)** hesab etmir. Sultan Əhməd Mirzə Daşkəndə moğol üzərinə qoşun çəkib Çir çayının sahilində məğlub olmuşdu və Ura-Təpədə Hafiz [Məhəmməd] bəy Dulday vardı, buranı Ömər Şeyx Mirzəyə verdi və o zamandan bəri Usruşna onun idarəsində idi.

**Uşaqları:** üç oğlu və beş qızı qalmışdı. Bütün oğullarının ən böyüyü mən Zəhirəddin Məhəmməd Baburam. Anam Qutlu(ğ) Nigar xanımdır.

Digər bir oğlu, məndən iki yaş kiçık olan Cahangir Mirzədir, amma onun anası moğolların tümən bəylərindən Fatma Sultan [ağa]dır.

Digər bir oğlu da məndən dörd yaş kiçık olan Nasir Mirzədir, anası əndicanlı Ümid adlı bir cariyədir.

Qızlarının ən böyüyü mənim doğma bacım olan Xanzadə bəyimdir. Məndən beş yaş böyükdür. Səmərqəndi ikinci dəfə aldığım zaman [=1501] Sərpüldə yenilməyimə baxmayaraq gəlib qalanı beş ay müdafiə elədim. Ancaq ətrafdakı padşah və bəylərdən heç bir kömək gəlmədiyi üçün çarəsiz qalıb çıxdım. O fətrətdə Xanzadə bəyim Məhəmməd Şeybani xanın əlinə düşmüşdü. Ondan Xürrəm şah adlı bir oğlu oldu. Yaxşı oğlan idi. Atası Məhəmməd Şeybani xan Bəlx vilayətini ona vermişdi. **(9 a)** Atası öldükdən biriki il sonra o da Allahın rəhmətinə qovuşdu. Şah İsmayıl özbəkləri Mərvdə yenəndə Xanzadə bəyim də oradaydı. Mənim sayəmdə xoş rəftar edib göndərdilər və Qunduzda gəlib mənə qoşuldu. Bir-birimizi görməyəli on il olmuşdu. Onları görməyə mən və Məhəmməd Göyəldaş getdik. [Xanzadə] bə-

yim və yanındakılar məni tanımadılar, ancaq adımı söylədikdən sonra tanıya bildilər. Ömər Şeyx Mirzənin qızlarının ikincisi Nasir Mirzənin doğma bacısı və məndən iki yaş böyük olan Mehribanu bəyimdir.

Şəhribanu bəyim də Nasir Mirzənin doğma bacısıdır və məndən səkkiz yaş kiçıkdir. Digər bir qızı Yadigar Sultan bəyimdi, onun anası Ağa Sultan adlı bir cariyədir. Digəri isə Qaragöz bəyim deyilən Ruqiyyə Sultan bəyimdir, onun anası Məxdumə Sultan bəyimdir. Hər ikisi Mirzənin ölümündən sonra dünyaya gəlmişlər. Yadigar Sultan bəyimi nənəm İsən Dövlət bəyim böyütmüşdü. Şeybani xan Əndican və Axsini alanda Yadigar Sultan bəyim Həmzə Sultanın Əbdüllətif Sultan adlı oğlunun əlinə düşmüşdü. Mən Həmzə Sultan komandanlığındakı sultanları Xutlan vilayətində yenərək Hisarı alanda [=1511/12] mənə qoşuldu. Fətrət dövründə isə Ruqiyyə Sultan bəyim Canibəy Sultanın əlinə düşdü. **(9 b)** Bir-iki oğlu oldu, amma yaşamadılar. İndi özünün isə Allahın rəhmətinə qovuşduğu xəbəri gəldi.

**Qadınları və cariyələri:** Qutlu Nigar xanım Yunus xanın ikinci qızı və Sultan Mahmud xanla Sultan Əhməd xanın böyük bacısıydı. Yunus xan isə Çingiz xanın ikinci oğlu Çağatay xanın nəslindəndir: Yunus xan, Veys xan, Şirəli Oğlan, Məhəmməd xan, Xızır Xoca xan, Tuğlu Teymur xan, İsən Buğa xan, Duva xan, Baraq xan, Yisün Təvə, Mötügən, Çağatay xan, Çingiz xan. Yeri gəlmişkən, xanların əhvalından da qısaca bəhs edək.

## ÇAĞATAY XANLARI HAQQINDA QISA MƏLUMAT

Yunus xan və İsən Buğa xan Veys xanın oğulları idi. Yunus xanın anası Türküstanlı qıpçaq bəylərindən olan və Teymur bəyin qoruduğu Şeyx Nurəddin bəyin qızı və ya nəvəsidir. Veys xanın ölümündən sonra moğol ulusu bir qismi Yunus xan, əksəriyyəti İsən Buğa xan tərəfində olmaq üzrə ikiyə ayrıldı.

Daha öncə [Teymur bəyin oğlu Şahrux Mirzənin oğlu] Uluğ bəy Mirzə Yunus xanın böyük bacısını [oğlu] Əbdüləziz Mirzəyə almışdı. Bu səbəblə barin tüməninin bəylərindən İrzen və Çıras (Hırmas) **(10 a)** tüməninin bəylərindən Mirək Türkmən üç-dörd min ailəlik moğol ulusuyla birlikdə Yunus xanı Uluğ bəy Mirzənin yanına gətirdilər; məqsədləri ondan kömək alıb moğol ulusunu təkrar ələ keçirmək idi. Amma Mirzə qəddarlıq göstərdi, onların bir qismini əsir etdi, digərlərini isə başqa vilayətlərə dağıtdı. İrzen iğtişaşı moğol ulusunda bir tarix olmuşdur.

Yunus xanı İraq tərəfinə göndərdilər, xan oraya gedib bir ildən artıq Təbrizdə qaldı. O zamanlar Təbriz padşahı Qaraqoyunlu Cahan Şah Barani idi. Sonra Yunus xan oradan Şiraza keçdi. Şirazda Şahrux Mirzənin ikinci oğlu İbrahim Sultan Mirzə hakim idi. Beş-altı ay sonra İbrahim Sultan Mirzə vəfat edincə yerinə [oğlu] Abdullah Mirzə keçdi. Abdullah Mirzənin

xidmətinə girən Yunus xan on yeddi-on səkkiz il Şirazda və o tərəfdəki vilayətlərdə qaldı.

Uluğ bəy Mirzə və oğullarının arasındakı qovğa zamanı İsən Buğa xan fürsət taparaq Fərqanə vilayətinə hücum etdi, Kənd-Badama qədər gəldi və Əndicanı alıb əhalisini tamamən əsir etdi. Amma qovğaların ardından [Baburun babası] Sultan Əbu Səid Mirzə taxta keçdikdən sonra qoşun çəkərək Yenginin o tərəfində olan İsfərada və Moğolistanda **(10 b)** İsən Buğa xanı tar-mar etdi. Bundan sonra bu qarışıqlığı ortadan qaldırmaq üçün Sultan Əbu Səid Mirzə əvvəlcə Əbdüləziz Mirzə ilə evli olan [Yunus xanın] böyük bacısı Xanım ilə evlənməsi münasibətilə Yunus xanı İraq və Xorasandan gətirtdi. Düyünlər edib dost oldular və Yunus xanı moğol ulusuna xan təyin edib göndərdi.

Tam bu əsnada Sağarıçı tüməninin bəyləri İsən Buğa xandan şikayətlə Moğolistana gəlmişdilər. O zamanlar Sağarıçı bəylərinin böyüyü Şir Hacı bəy idi. Yunus xan bunların arasına getdi və Şir Hacı Bəyin qızı İsən Dövlət bəyimlə evləndi. Moğol adətincə Yunus xan ilə İsən Dövlət bəyimi ağ keçə üzərində yuxarı qaldırıb xan elan etdilər.

Yunus xanın İsən Dövlət bəyimdən üç qızı oldu; bunların ən böyüyü Mehrinigar xanımdır. Sultan Əbu Səid Mirzə onu ən böyük oğlu Sultan Əhməd Mirzəyə almışdı. Mirzədən heç uşağı olmadı. Sonra fətrət dövründə Şeybani xanın əlinə düşmüşdü. Mən Kabilə gəldiyim zaman Şah bəyimlə birlikdə o da Səmərqənddən Xorasana, oradan da Kabilə gəldi. Şeybani xan Qəndəharda [Baburun kiçık qardaşı] Nasir Mirzəni mühasirəyə alanda mən də Ləmğana getdim. Xan Mirzə [Sultan Veys Mirzə] də Şah bəyim və Mehrinigar xanımla birlikdə Bədəxşana getdi. Mübarək şah **(11 a)** Xan Mirzəni Qaleyi-Zəfərə çağıranda Əba Bəkr Kaşğarinin axınçılarına rast gəldilər. Şah bəyim, Mehrinigar və onlarla birlikdə olanların ailələri əsir düşərək o mərhəmətsizin əsarətində fani dünyaya vida etdilər.

[Yunus xan və İsən Dövlət bəyimin] ikinci qızı mənim anam Qutlu Nigar xanımdı. Qazaxlıq və fətrət zamanlarında əsasən mənimlə birlikdə idi. Kabili aldıqdan beş-altı ay sonra, 911-ci ildə [=1505] Allahın rəhmətinə qovuşdu.

Üçüncü qızları Xub Nigar xanımdı, onu Məhəmməd Hüseyn Gürgan Duğlata vermişdilər. Ondan bir qızı və bir oğlu olmuşdu. Qızını Übeyd xan almışdı, sonra mən Buxara və Səmərqəndi alanda o qız bir yerə gedə bilməyib orada qalmışdı. Sultan Səid xanın əmisi Seyid Məhəmməd Mirzə Sultan Səid xan adından Səmərqəndə mənə elçi olaraq gəldiyi zaman onunla birlikdə Kaşğara getdi və orada Sultan Səid xanla evləndi. Oğlu Heydər Mirzə idi. Atası özbəklər tərəfindən öldürüldükdən sonra gəlib üç-dörd il mənim xidmətimdə oldu. Sonra izin istəyərək Kaşğara xanın yanına getdi.

Baz gərdəd be əsli xud həmə çiz,

Zəri-safiyu nüqreyi-ərziz.
*Hər şey, istər saf altın, istər gümüş,*
*istər qalay olsun, axırda öz əslinə dönər.*

Deyilənə görə, indi tövbə etmiş və yaxşı yola girmişdir. Əlindən yazı yazmaq, rəsm çəkmək, ox, mizraq və yay atmaq kimi hər şey gəlir. Şeir yazmaq qabiliyyəti **(11 b)** də var. Mənə bir ərizəsi gəlmişdi, inşası da pis deyil.

[Yunus] xanın qadınlarından biri də Şah bəyimdi. Başqa qadınları olsa da, uşaqlarının anaları bu ikisi idi. Şah bəyim Bədəxşan şahı Şah Sultan Məhəmmədin qızı idi. Dediklərinə görə, bu Bədəxşan şahlarının soyları İskəndər Filkusa [Makedoniyalı İskəndər] çatırmış. Bu şahın digər bir qızını -ki, Şah bəyimin böyük bacısıdır- Sultan Əbu Səid Mirzə almış və ondan Əba Bəkr Mirzə doğulmuşdur.

[Yunus] xanın Şah bəyimdən iki oğlu və iki qızı olmuşdu: Sultan Mahmud xan, digər üçündən böyük və daha əvvəl haqqında danışılan [İsən Dövlət bəyimdən olan] üç qızdan kiçıkdir. Səmərqənd və o ətrafda ona bəzən Xanikə xan deyirlər. Digər oğlu olan və Alaca xan adıyla şöhrət qazanan Sultan Əhməd xan isə Sultan Mahmud xandan kiçıkdir. Alaca adının verilməsinə səbəb budur: kalmık və moğol dilində qatilə *alaçı* deyirlər. Kalmıkları bir neçə dəfə məğlub edib bir çox adamlarını öldürdüyü üçün *alaçı* demişlər və çox işlənə-işlənə *alaca* olmuşdur. İrəlidə bu xanlardan sıra ilə təkrar bəhs ediləcək, başlarına gələnlər haqqında danışılacaq.

[Yunus xanın Şah bəyimdən olan qızı] Sultan Nigar xanım digərlərindən kiçık və bir qızından böyükdü. **(12 a)** Onu [Baburun əmisi] Sultan Mahmud Mirzəyə vermişlər və ondan Sultan Veys adlı bir oğlu olmuşdu və [bu Mirzədən] yeri gələndə bəhs ediləcəkdir. Sultan Mahmud Mirzə öldükdən sonra [Sultan Nigar xanım] oğlunu da alıb heç kimə xəbər vermədən Daşkəndə, böyük qardaşının yanına getmişdi. Bir neçə il sonra onu Çingiz xanın böyük oğlu Çuçinin nəslindən və qazax sultanlarından olan Ədik Sultana verdilər. Şeybani xan xanları məğlub edib Daşkənd və Şahruxiyyəni alanda isə Sultan Nigar xanım xidmətində çalışan on iki moğoluyla birlikdə qaçıb Ədik Sultanın yanına getmişdi. Ədik Sultandan iki qızı oldu, birini Şeyban sultanlarından birinə, digərini isə Sultan Səid xanın oğlu Rəşid Sultana verdilər. Ədik Sultandan sonra Sultan Nigar xanımı qazax ulusunun xanı Qasım xanın aldığını söyləyirlər. Qazax xanların və sultanlarının arasında heç kim o ulusu Qasım xan kimi hakimiyyəti altına ala bilməmişdir. Əsgərinin sayını üç yüz min olaraq təxmin edirdilər. Qasım xan öldükdən sonra Sultan Nigar xanım da Kaşğara, Sultan Səid xanın yanına gəldi.

[Yunus xanın Şah bəyimdən olan digər qızı] Dövlət Sultan xanım hamısından kiçıkdi. Daşkənd savaşında Şeybani xanın oğlu Teymur Sultanın **(12 b)** əlinə düşmüş və ondan bir qızı olmuşdu. Səmərqənddən mənimlə birlikdə çıxmışdı. Üç-dörd il Bədəxşan vilayətində qaldı. Sonra isə Kaşğara

Sultan Səid xanın yanına getdi.

## YENƏ ÖMƏR ŞEYX MİRZƏNİN QADINLARI VƏ CARİYƏLƏRİ HAQQINDA

Ömər Şeyx Mirzənin hərəmlərindən biri də Xoca Hüseyn bəyin qızı Ulus ağa idi. Ondan bir qızı oldu, ancaq kiçık yaşda öldü. İl-il yarım sonra Ulus ağanı hərəmdən çıxardılar.

Arvadlarından biri də moğol tümən bəylərindən [birinin qızı olan] Fatma Sultan ağa idi. Mirzə hamısından əvvəl bu Fatma Sultan ağanı almışdı.

Daha sonra aldığı Qaragöz bəyim isə çox sevimliydi. Mirzəyə xoş görünmək üçün nəsəbini Sultan Əbu Səid Mirzənin böyük qardaşı Mənuçöhr Mirzəyə qədər çıxartmışdılar.

Onun cariyələri də çox idi. Bunlardan biri Ümid ağaçə idi və Mirzədən əvvəl ölmüşdü. Mirzənin son günlərində aldığı iki cariyədən biri moğollardan Tün (Tərsün) Sultan, digəri isə Ağa Sultan idi.

**Əmirləri: Xudaverdi Timurdaş,** Herat hakimi Ağ Buğa bəyin böyük qardaşının nəslindəndir. Sultan Əbu Səid Mirzə Şahruxiyyədə Cuki Mirzəni mühasirə edəndə Fərqanə vilayətini Ömər Şeyx Mirzəyə vermiş və eşik ağası[1] olaraq da bu Xudaverdi **(13 a)** Timurdaşı təyin edib göndərmişdi. Həmin dövrdə o, iyirmi beş yaşlarında idi. Yaşca cavan olsa da, idarəçilik qabiliyyəti çox yaxşı idi. Bir-iki il sonra İbrahim Bəycik [Tağayi] Oş tərəflərə hücum edəndə Xudaverdi Timurdaş onu arxadan təqib edərək döyüşdü, ancaq həm yenildi, həm də şəhid oldu.

O əsnada Sultan Əhməd Mirzə Ura-Təpənin Ağ-Qaçğay adlı yaylasında idi. Bu yayla Səmərqəndin on səkkiz ağac şərqindədir. Sultan Əbu Səid Mirzə isə Heratın on iki ağac şərqində yerləşən Baba-Xakidəydi. Bu xəbəri Əbdülvahab Şiğavul vasitəsilə Mirzəyə göndərdilər, buna görə yüz iyirmi altı ağaclıq məsafə dörd günə qət edildi.

**Hafiz Məhəmməd bəy Dulday** Sultan Məlik Kaşğarinin oğlu Əhməd Hacı bəyin kiçık qardaşıdır. Xudaverdi bəyin ölümündən sonra eşik ixtiyarı[2] olaraq onu göndərmişdilər. Sultan Əbu Səid Mirzənin ölümündən sonra Əndican bəyləri ilə dil tapa bilmədiyi üçün Səmərqəndə gedərək [Sultan Əbu Səid Mirzənin oğlu] Sultan Əhməd Mirzənin xidmətinə girdi. Sultan Əhməd Mirzə Çirdə məğlub olduğu zaman [Hafiz Məhəmməd bəy Dulday] Ura-Təpədə idi. **(13 b)** Ömər Şeyx Mirzə Səmərqəndə getmək niyyətilə Ura-Təpə üzərinə gələndə Ura-Təpəni Mirzənin adamlarına təslim edib özü də onun xidmətinə girdi. Ömər Şeyx Mirzə də Əndicanın idarəsini ona tapşırdı. Sonra Sultan Mahmud xanın yanına getdi, o da [Sultan Veys] Mirzə xanın tərbi-

---

[1] *Eşik ağası:* bu titul haqqında bax: Qeydlər və izahlar.

[2] *Eşik ixtiyarı:* bu titulun səlahiyyət dairəsini dəqiq müəyyən etmək çətindir.

yəsini ona etibar edərək Dizakı da mülk olaraq verdi. Mən Kabili almazdan bir az əvvəl Məkkəyə getmək üçün Hindistan yoluyla səfərə çıxmış və yolda Allahın rəhmətinə qovuşmuşdur. Cah-cəlalı sevməyən, qaradinməz və sadə bir adamdı.

Başqa bir əmiri də **Xoca Hüseyn bəy** idi. O, şən, ancaq təmtəraq sevməyən bir adam idi. O zamanın adəti üzrə içki məclislərində yaxşı qoşma (qoşuq) söyləyirmiş.

Başqa bir əmiri **Şeyx Məzid bəy** idi, əvvəlcə mənə bəy-atəkə təyin edilmişdi. Onun vaxtında üsul-idarə və nizam-intizam çox yüksək idi. (Əbülqasım) Babur Mirzəyə də xidmət etmişdi. Ömər Şeyx Mirzənin yanında ondan böyük bəy yox idi. Fasiq bir adam və uşaqbaz idi.

Başqa bir əmiri olan **Əli Məzid bəy** koçinlərdən[1] idi. Bir dəfə Axsidə və bir dəfə də Daşkənddə üsyan qaldırmışdı. Münafiq, fasiq, nankor və yaramaz bir adam idi.

Başqa bir əmiri **Həsən Yaqub bəy** isə təvazökar, xoş təbiətli, zirək və dəyərli bir adamdı. Bu beyt onundur:

Bazay, ey hüma ki, betutiyi-xətət,
Nəzdik şod ki, zağ bərəd üstüxani-mən.
*Ey dövlət quşu, qayıt gəl, sənin tuti xəttin olmasa,*
*Qarğa mənim sümüyümü aparacaq.*

Cəsur adam idi. Yaxşı ox atır, yaxşı çovqan **(14 a)** oynayır və eşşəkbeli sındırdıda yaxşı sıçrayırdı. Ömər Şeyx Mirzənin ölümündən sonra mənim qapımda sahibi-ixtiyar o idi. Dar görüşlü, kəmhövsələ və fitnəçi bir adam idi.

Başqa bir əmiri olan **Qasım bəy** də koçin idi, Əndicanın əski koçin bəylərindən idi. Həsən bəydən sonra mənim qapımda sahibi-ixtiyar o idi. Ömrünün sonuna qədər qüdrət və etibarı artdı, azalmadı. Cəsur bir adam idi. Bir dəfə Kasan tərəflərini çapıb talayan özbəkləri təqib edərək onları möhkəm əzdi. Ömər Şeyx Mirzənin məiyyətində qılınc çalmışdı. Yastı keçid müharibəsində də yaxşı vuruşmuşdu.

Qazaxlıq zamanımda Məsiha dağlarında ikən Sultan Mahmud xanın yanına getməyə qərar verdiyim zaman bizdən ayrılaraq Xosrov şahın yanına getdi. 910-cu ildə [=1504] Xosrov şahı ələ keçirib Kabildə Müqimi [Məhəmməd Müqim Arğun] mühasirəyə aldığım zaman Qasım bəy təkrar yanıma gəldi. Əvvəllər olduğu kimi ona yenə də diqqət və iltifat göstərdim.

Dəreyi-Xoşda türkmən xəzərləri[2] üzərinə hücum etdiyimiz zaman [=1505] Qasım bəy qocalığına baxmayaraq cavanlardan daha yaxşı yürüdü.

---

[1] *Koçin:* Teymur zamanında xanədanı qoruyan saray qvardiyasına verilən addır. Bu ad zamanla atadan oğula keçmişdir. Koçinlər hər hansı bir bölgəyə deyil, hökmdara bağlı idilər.

[2] *Xəzərilər:* mənşəcə monqol olan, tacikcə danışan Əfqanıstan əhalisi. Adları Xəzər sözündən deyil, farsca həzar (min) sözündəndir.

Buna görə də ona culdu [mükafat] olaraq Bəngiş vilayətini verdim. Sonra **(14 b)** Kabilə gəlincə, onu Hümayuna bəy-atəkə təyin etdim. Zəmindavər alındığı zaman [=1522] Allahın rəhmətinə qovuşdu.

Müsəlman, dindar, günahdan və haramdan qorxan bir adamdı. Şübhəli yeməkləri yeməzdi. Düşüncəli və tədbirli idi. Çox zarafatcıl idi. Savadsız olduğu halda çox xoş nüktələr söyləyirdi.

Başqa bir əmiri **Babaqulu bəy Babaəli bəy oğlu** idi. O, Şeyx Əli Bahadırın nəslindəndir. Şeyx Məzid bəy öləndən sonra onu mənə bəy-atəkə təyin etdilər. [Baburun əmisi] Sultan Əhməd Mirzə Əndicana qoşun çəkəndə Ura-Təpəni ona təslim edərək Əhməd Mirzəyə qoşuldu. [Baburun digər bir əmisi] Sultan Mahmud Mirzənin ölümündən sonra Səmərqənddən qaçıb gələrkən qarşısına Ura-Təpədən [Sultan Mahmud Mirzənin oğlu] Sultan Əli Mirzə çıxdı və müharibədə məğlub olaraq öldürüldü. İdarəsi və yarağı yaxşı idi. Əsgərinə yaxşı baxırdı. Namaz qılmaz, oruc tutmazdı. Zalım və kafirsayaq bir adamdı.

Başqa bir əmiri olan **Əli Dost Tağayi** sağarıçı tümən bəylərindən idi. Mənim anamın anası İsən Dövlət bəyimlə qohum idi. Ona Ömər Şeyx Mirzə zamanındakından daha çox iltifat etdim. Dedilər ki, bacarıqlı adamdır, ancaq neçə illər yanımda qaldığı halda əməlli-başlı bir işini görmədim desəm, **(15 a)** doğrudur. Sultan Əbu Səid Mirzənin xidmətində olduğu zamanlarda yada daşı[1] ilə yağış yağdırdığını iddia edirdi. Quşbazdı. Əxlaqı və xasiyyəti pis idi. Paxıl, fitnəkar, namussuz, münafıq, özündən razı, sərt sözlü, soyuq üzlü bir adam idi.

**Veys Lağari** Səmərqəndin toxçu tayfasından idi. Ömər Şeyx Mirzənin son dövrlərində ən yaxın adamlarından olmuşdu. Mənimlə birlikdə qazaxlıqlarda oldu. Fikri və tədbiri çox yaxşı idi, ancaq bir az fitnəkar idi.

**Mir Qiyas Tağayi** Əli Dostun kiçik qardaşı idi. Moğolun soylu ailələri arasında Sultan Əbu Səid Mirzənin qapısında ondan daha irəli adam yox idi. Sultan Əbu Səid Mirzənin böyük möhürü onda idi. Ömər Şeyx Mirzənin son dövrlərində ən yaxın adamlarından biri olmuşdu. Veys Lağarinin çox yaxın dostu idi. Kasan Sultan Mahmud xana veriləndən sonra ömrünün sonuna qədər xanın xidmətində oldu. Xan da ona çox iltifat etmişdi. Gülərüz və zarafatçı bir adamdı. Fisqdən çəkinməzdi.

Başqa bir əmiri **Əli Dərviş** xorasanlıydı. Sultan Əbu Səid Mirzənin yanında Xorasan gənclər bölüyündə xidmət edirdi. Xorasan və Səmərqənd Sultan Əbu Səid Mirzənin idarəsinə **(15 b)** keçəndə bu iki paytaxtın işə yarayan igidlərini xassə bölüklərinə ayıraraq bunlara Xorasan çöhrə bölüyü və

---

[1] *Yadaçılıq:* yağış, qar yağdırmaq, külək qoparmaq üçün yada daşından istifadə edilməsi. Mahmud Kaşğari bu barədə geniş məlumat vermişdir (bax: Divanü lüğat-it-türk. Tərcümə edən və nəşrə hazırlayan: Ramiz Əskər. Bakı, Ozan, 2006, III cild, s. 11; 159; 276).

Səmərqənd çöhrə bölüyü adlarını vermişdi.

Mənim yanımda Səmərqənd önündə yaxşı çarpışdı. Cəsur bir adam idi. Nəstəliq yazısını əla yazırdı. Məddahlıq edirdi, təbiətcə həsədçi idi.

Başqa bir əmiri **Qənbər Əli** moğoldu və axtaçılardan idi[1]. Atası vilayətə girib bir neçə dəfə sallaxlıq etdiyi üçün Qənbər Əli Sallax da deyirdilər. Yunus xanın yanında əvvəlcə avtafaçı, sonra da bəy olmuşdu.

Ona mənim hüzurumda da çox iltifat göstərilmişdi. İşə başlayana qədər çox inamlı idi, ancaq işə başladığı vaxt yersiz qorxulara qapılırdı. Gəvəzə idi, dağınıq danışırdı. Məlumdur ki, gəvəzələr hətərən-pətərən danışırlar. Kəmhövsələ və beyinsiz bir adam idi.

Ömər Şeyx Mirzə vəfat etəndə mən Əndicanda, çarbağda[2] idim. Bu xəbər Əndicana ramazan ayının beşində, çərşənbə axşamı günü [=10 iyun 1494] mənə çatdı. Çox mütəəssir oldum. Ata minib yanımdakı adamlarımla kurqana hərəkət etdim. Mirzə qapısına çatanda Şirim Tağayi atımın cilovunu tutub namazgah[311] tərəfinə çəkdi. Hər halda belə düşünmüş olmalı idi: «Sultan Əhməd Mirzə böyük **(16 a)** bir padşahdır. Əgər çox əsgərlə gəlsə, bəylər məni və vilayəti ona təslim edərlər. Bu görə də onu [məni] Özgənd və Ala-Tağ ətəyinə doğru götürüm. Əgər vilayəti təslim etsələr, barı o, ələ keçmədən dayılarının yanına, Alaca xanın və ya Sultan Mahmud xanın yanına getsin».

Xoca Mövlana qazı (o, Sultan Əhməd qazının oğlu olub Şeyx Bürhanəddin Qılınc nəslindəndir; ana tərəfi isə Sultan İlig Maziyə gedib çıxır. Bunlar nəsillikcə o vilayətə müfti və şeyxülislam olmuşlar və daha sonra onlardan yenə bəhs ediləcək) və kurqanın içindəki bəylər bu xəbəri alınca, Ömər Şeyx Mirzənin yaxın adamı və bir qızının tərbiyəçisi olan Xoca Məhəmməd Dərzini yanımıza göndərdilər. Biz namazgaha yaxınlaşanda gəldi, könüllərdəki vəsvəsəni aldı və məni geri apardı. Ərkə endim. Xoca Mövlana qazı və bəylər gəlib vəziyyəti müzakirə etdilər. Kurqanın bürc və divarlarının gücləndirilməsiylə məşğul oldular. Mərginana və ətraf yerlərə göndərilmiş olan Həsən Yaqub, Qasım Koçin və digər bəzi bəylər bir-iki gün sonra gələrək bizə qoşuldular. Hamısı birlikdə qalanın mühafizəsi üçün böyük qeyrət **(16 b)** və enerji ilə çalışdılar.

Sultan Əhməd Mirzə Ura-Təpə, Xocənd və Mərginanı aldıqdan sonra Əndicandan dörd ağac məsafədə olan Kubaya gəldi. Bu zaman Əndicanın məşhur adamlarından Dərviş Gav adlı biri münasibətsiz sözlər söylədiyi üçün öldürüldü. Bu şiddətli hərəkətdən sonra bütün əhali yatışdırıldı.

---

[1] *Axtaçı:* hökmdarın atları ilə məşğul olanlar üçün işlənən bir termindir.

[2] *Çarbağ:* "çahar bağ, dörd bağça". Bu sözlə bir qismi park, bir qismi üzümlük, bir qismi meyvə ağacı, bir qismi də bostan olan hovuzlu bağlar nəzərdə tutulur. Babur öz hakimiyyəti dövründə çoxlu bağ saldırmışdır.

[3] *Namazgah:* əskidən şəhər kənarında düzəldilən və xalqın toplu halda namaz qıla bildiyi açıq bir meydan.

Xoca [Mövlana] qazı və Xoca Hüseynin qardaşı Uzun Həsən elçi olaraq [Sultan Əhməd Mirzəyə] göndərildi. Söyləyəcəkləri söz bu idi: «Bu vilayətə onsuz da onun adamlarından biri təyin ediləcək. Mən onun həm öz adamı, həm də övladıyım. Bu iş mənə verilsə, məsələ daha yaxşı və daha asan həll edilmiş olar».

Sultan Əhməd Mirzə az danışan, sadə və həlim adam idi. Hər hansı bir sözü, ya da işi bəylərinin fikrini öyrənmədən həll etməzdi. Bəyləri mənim bu sözlərimi dinləmədilər və qaba bir şəkildə qarşılıq verərək üstümə gəlməyə davam etdilər. Tanrı təala öz kamil qüdrətilə hər işimi hər zaman, kimsəyə minnət etmədən və layiq olduğu şəkildə həll etdiyi üçün bu dəfə də onların önünə bir neçə maneə çıxardı. Onlar da bundan usandılar, peşman olub arzularına çatmadan geri qayıtdılar.

Bu maneələrdən biri budur: Kubanın bataqlı bir qara çayı var və onu körpü dışında başqa yerdən keçmək mümkün deyil. Çoxlu əsgər **(l7 a)** bir yerə gəlib bu körpüdə yığışdığı üçün bir çox at və dəvə bu qara çaya düşərək boğuldu. Bunlar üç-dörd il əvvəl Çir çayının keçidində də belə bir məğlubiyyətə uğramışdılar. Bu dəfə də o məğlubiyyəti xatırlayan əsgərlər vahiməyə düşdülər. Bir də o zaman elə bir at epidemiyası oldu ki, atlar ilxılarla qırılmağa başladı. Bir də bizim əsgərimizi və xalqı bir-birinə çox bağlı və əzmli gördülər, son nəfəslərinə və qüvvələrinə qədər mübarizə aparacaqlarını başa düşdülər. Axırda məcbur qalıb Əndicana bir ağac məsafədən Dərviş Məhəmməd Tarxanı göndərdilər. İçəridən Həsən Yaqub çıxdı, namazgah civarında sülhə bənzər bir şey bağlayıb çəkildilər.

Xocənd çayının şimal tərəfindən gələn Sultan Mahmud xan Axsini mühasirəyə aldı. [Baburun kiçık qardaşı] Cahangir Mirzə, eşik ağası Şeyx Abdullah və bəylərdən Əli Dərviş bəy, Mirzəqulu Göyəldaş, Məhəmməd Bakir bəy Axsidəydi. Veys Lağari və Mir Qiyas Tağayi də orada idi, lakin onlar digər bəylərdən şübhələnərək Veys Lağarinin vilayəti olan Kasana getdilər. Veys Lağari Nasir Mirzənin bəy-atəkəsiydi və bu buna görə də Nasir Mirzə Kasanda idi. [Sultan Mahmud] xan Axsi civarına gələndə bu bəylər xanın tərəfinə **(17 b)** keçərək Kasanı təslim etdilər. Mir Qiyas xanın xidmətində qaldı. Veys Lağari isə Nasir Mirzəni Sultan Əhməd Mirzəyə apardı və Məhəmməd Məzid Tarxana təhvil verdi.

Sultan Mahmud xan Axsi yaxınlarına gəlib bir neçə dəfə müharibə etsə də, heç bir şey əldə edə bilmədi. Axsidəki bəylər və igidlər böyük cəsarət göstərdilər. O əsnada Sultan Mahmud xan xəstələndi, zatən müharibədən də bezmişdi, odur ki, öz vilayətinə qayıtdı.

Əba Bəkr Duğlat Kaşğari heç kimə boyun əymədən neçə illərdi ki Kaşğarın və Xotənin hakimi idi. O da vilayət almaq həvəsinə düşdü, Özgənd yaxınlarına gəlib kurqan qurdu və vilayətdə qarışıqlıq çıxarmağa başladı. Xoca [Mövlana] qazıya və bütün bəylərə Kaşğarini dəf etmək tapşırıldı. On-

lar yaxınlaşanda Kaşğari bu qoşunun qabağıda dura bilməyəcəyini başa düşdü və araya Xoca qazını vasitəçi kimi qoyaraq min bir hiylə ilə qurtuldu.

Belə böyük hadisələr baş verən zaman Ömər Şeyx Mirzədən qalan bəylər və igidlər hər şeyə qatlanaraq cəsarətlə hərəkət elədilər. Ömər Şeyx Mirzənin anası [Şah] Sultan bəyim, Cahangir Mirzə, hərəmdəkilər və bəylər Axsidən Əndicana gəldilər. Matəm mərasimini yerinə yetirərək kasıb-kusuba və miskinlərə sədəqə payladılar. **(18 a)**

Bu ağır və önəmli işlərdən sonra qoşunun və vilayətin qaydaya salınması, idarəsi və nizamı ilə məşğul olduq. Əndicanın idarəsinə və eşik ixtiyarlığına Həsən Yaqubun təyin edilməsi qərara alındı. Oşa Qasım Koçin, Axsiyə və Mərginana Uzun Həsən və Əli Dost Tağayi təyin edildi. Ömər Şeyx Mirzənin digər bəy və igidlərinin hər birinin mövqeyinə uyğun bir vilayət, yer, müçə və çərgə[1] verildi, vəzifələri müəyyənləşdirildi.

## SULTAN ƏHMƏD MİRZƏ

Sultan Əhməd Mirzə geri qayıdanda iki-üç mənzildən sonra xəstələnib qızıl qızdırmaya tutuldu. Ura-Təpə tərəflərində, Ağ-Suya gəldiyi əsnada, 899-cu ilin şəvval ayının ortalarında (=1494 iyul) qırx dörd yaşında bu fani dünyaya vida etdi.

**Doğumu və nəsəbi:** Sultan Əbu Səid Mirzənin taxta çıxdığı il, yəni 855-ci ildə (=1451/2) doğuldu. Sultan Əbu Səid Mirzənin oğullarının ən böyüyü idi. Anası Orda Buğa Tarxanın qızı və Dərviş Məhəmməd Tarxanın böyük bacısı və Mirzənin mötəbər arvadı idi.

**Xarici görkəmi:** uzun boylu, qalın saqqallı, qırmızı üzlü və kök bir adamdı. Saqqalı yalnız çənəsində vardı, iki yanağı tüksüz idi. **(18 b)** Söhbəti çox xoşdu. Sarığını zamanın adətinə görə çar-piç sarıyır və ucunu da bir azca qabağa, qaşının üstünə sallayırdı.

**Əxlaqı və xasiyyəti:** hənəfi məzhəbindən, təmiz etiqadlı bir adam idi. Beş rükət namazını qılır və içdiyi zamanlarda da namazını buraxmazdı. Xoca Übeydullah həzrətlərinin müridi idi. Hər zaman, xüsusilə xocanın söhbətlərində fövqəladə tərbiyəli idi. Dediklərinə görə, xocanın məclisində heç bir zaman dizini diziylə dəyişdirməmişdir. Bir dəfə xoca həzrətlərinin söhbətində, adətinin tərsinə, ayağını dəyişdirərək oturmuşdu. Mirzə qalxdıqdan sonra xoca həzrətlərinin əmriylə oturduğu yerə baxmışlar, orada bir sümük varmış.

Təhsil almamışdı, ümmi idi. Şəhərdə böyüdüyü halda, sadə və bəsit geyinirdi. Şeirdən nəsibi yox idi. Adildi. Xoca həzrətlərinin də hər işdə əli vardı, önəmli məsələlər əksər hallarda şəriət yoluyla həll edilirdi. Heç bir zaman verdiyi sözün və dediyinin tərsinə hərəkət etməzdi. Cəsur idi. Hər-

---

[1] *Müçə* "rütbə" və *çərgə* "dərəcə" sözlərinin açıqlaması üçün bax: Qeydlər və izahlar.

çənd ki, öz əliylə bir iş görməyə fürsəti olmadı, ancaq bəzi müharibələrdə cəsarət göstərdiyi söylənir.

Fövqəladə **(19 a)** dərəsədə gözəl ox atırdı. İlbasuna[1] atdığı oxu və tirgəzi az hallarda yan keçirdi. Balqabağı[2] meydanın o biri ucundan rahatca vururdu. Sonralar kökələndə qırqovul və bildirçini piyazi[3] ilə vurmağa başlamışdı və yenə çox azı hədəfə dəymirdi. Quşbaz bir adamdı, quşları çox və yaxşı ovlayırdı. Uluğ bəy Mirzədən sonra onun qədər quşbaz bir padşah yoxdur.

Fövqəladə dərəcədə həyalı idi. Deyilənə görə, tək olanda da, yaxın qohumlarının və adamlarının yanında da ayağını örtürmüş.

Möhkən içən idi. İçməyə başladığı zaman iyirmi-otuz gün dalbadal içir, içmədiyi zaman da iyirmi-otuz gün içmirdi. Bəzən içki məclislərində heç qalxmadan gecə-gündüz otururdu. Şərab içmədiyi günlərdə kefsiz olurdu. Təbiətində xəsislik vardı. Az danışan və yumşaq bir adamdı. İradəsi bəylərinin əlində idi.

**Meydan müharibələri**: Sultan Əhməd Mirzə dörd meydan müharibəsinə girdi. Bir dəfə Şeyx Camal Arğunun kiçık qardaşı Nemət Arğun ilə döyüşdü və Zamin ətrafındakı Azar-Düzündə qalib gəldi.

Bir dəfə də [qardaşı] Ömər Şeyx Mirzəyə Havasda qalib gəldi.

Bir dəfə Daşkənd civarındakı Çir çayının sahilində Sultan Mahmud xanla çarpışdı. Düzdür, bu meydan müharibəsi deyildi. **(19 b)** Moğol axınçılarının bir neçəsi onun qoşununun arxasından gəlib əsgərlərin xırda-xuruş əşyasını ələ keçirmişdi, bu qədər çox əsgər heç bir çarpışma olmadığı və düşmənlə qarşılaşmadığı halda vahiməyə qapıldı. Əsgərlərin çoxu Çir çayında boğuldu.

Bir dəfə də Heydər Göyəldaşla Yar-yaylaq ətrafında savaşdı və qalib gəldi.

**Torpaqları:** torpaqları Səmərqənd və Buxara idi. Buraları ona atası vermişdi. Şeyx Camalın Əbdülqüddüs tərəfindən öldürülməsindən sonra Daşkəndi, Şahruxiyyəni və Sayramı da almışdı. Bu yerləri bir müddət öz əlində saxladı, sonra Daşkəndi və Sayramı kiçık qardaşı Ömər Şeyx Mirzəyə vermişdi. Xocənd və Ura-Təpə də bir müddət Sultan Əhməd Mirzənin idarəsində qaldı.

**Uşaqları:** iki oğlu olmuş, ancaq kiçık ikən ölmüşdü. Beş qızı vardı, bunların dördü Qutuq bəyimdən idi. Onların ən böyüyü Qaragöz bəyim dedikləri Rəbiə Sultan bəyimdi və onu özü sağkən Sultan Mahmud xana ver-

---

[1] *İlbasun:* bu söz yırtıcı quşlar və sərçə kimi kiçik quşlar xaricində bütün ovlanan quşlara verilən ümumi addır.

[2] *Balqabaq* və *Balqabaq meydanı:* təlim atışları üçün hədəf olaraq balqabağa ox atılan meydan olmalıdır. İstanbulda da "Ox meydanı" adlı bir meydan mövcuddur.

[3] *Piyazi:* bir silah növü.

mişdi. Rəbiə bəyimin xandan Baba xan adlı çox yaxşı bir oğlu olmuşdu. Özbəklər Xocənddə Sultan Mahmud xanı şəhid edəndə onu və onun kimi bir neçə uşağı da öldürdülər. Sultan Mahmud xanın ölümündən sonra Rəbiə Sultan bəyim Cani bəy **(20 a)** Sultana ərə getdi.

İkinci qızı Ağ bəyim dedikləri Səlihə Sultan bəyim idi. Sultan Əhməd Mirzənin ölümündən sonra [qardaşı] Sultan Mahmud Mirzə toy edərək onu böyük oğlu Sultan Məsud Mirzəyə aldı. Sonra Şah bəyim və Mehrinigar xanımla birlikdə Kaşğara getdi.

Üçüncü qızı Ayşə Sultan bəyim idi. Mən beş yaşında ikən Səmərqəndə gələndə mənimlə nişanlamışdı. Sonra qazaxlıq zamanımda Xocəndə gəlmiş və orada evlənmişdim. Səmərqəndi ikinci dəfə alanda bir qızımız oldu, amma uşaq bir neçə gün sonra tələf oldu. Daşkənd məğlubiyyətindən bir az əvvəl böyük bacısının təhriki ilə məndən ayrıldı.

Dördüncü qızı Sultanım bəyimdi. Onu əvvəlcə Sultan Əli Mirzə, sonra Teymur Sultan, daha sonra isə Mehdi Sultan almışdı.

Qızlarının ən kiçiyi Məsumə Sultan bəyim idi. Anası arğunlardan Sultan Arğunun əmisi qızı Həbibə Sultan bəyim idi. Mən Xorasana gedəndə görmüş və xoşlandığım üçün elçi göndərmişdim, sonra Kabilə gətirdib evləndim. Bir qızımız oldu, amma onu doğanda Allahın rəhmətinə qovuşdu. Qıza anasının adı qoyuldu.

**Qadınları və cariyələri:** qadınlarının biri ilkin Sultan Əbu Səid Mirzənin istəmiş olduğu Mehrinigar xanımdı. Mehrinigar xanım Yunus xanın böyük qızı və anamın doğma bacısı idi. **(20 b)**

Biri də tarxanlardan idi və buna görə ona Tarxan bəyim deyirdilər.

Digəri isə Qutuq bəyimdi və Tarxan bəyimin südbacısı idi. Sultan Əhməd Mirzə onu sevərək almışdı. Fövqəladə sevimli, ancaq çox hökmlü bir qadın idi. Şərab içirdi. O sağ ikən Sultan Əhməd Mirzə başqa qadınların yanına getməzdi. Sonra onu öldürərək bədnamlıqdan qurtuldu.

Qadınlarından biri də Termiz xanzadələrindən Xanzadə bəyimdi. Mən beş yaşında Səmərqəndə Sultan Əhməd Mirzənin hüzuruna gələndə evlənmişdi. Hələ duvağı açılmamışdı. Türk adətincə, açmağımı buyurdular, mən də duvağı açdım.

Bir digəri də Əhməd Hacı bəyin nəvəsi Lətifə bəyim idi. Mirzədən sonra Həmzə Sultana ərə getmiş və ondan üç oğlu olmuşdu. Mən Həmzə Sultanın və Teymur Sultanın komandanlığındakı sultanları məğlub edib Hisarı alanda bu sultanzadələrlə birlikdə daha bir neçə sultanzadə əlimə keçmişdi. Hamısını azad elədim.

Qadınlarından biri də Sultan Arğunun əmisi qızı Həbibə Sultan bəyim idi.

**Əmirləri: Cani bəy Dulday** Sultan Məlik Kaşğarinin kiçık qardaşı idi. Sultan Əbu Səid Mirzə Səmərqəndin idarəsini və Sultan Əhməd Mirzə isə

öz eşik ixtiyarlığını **(21 a)** ona vermişdi. Əxlaqı və xasiyyəti qəribə bir adammış. Haqqında qəribə rəvayətlər var. Məsələn, Səmərqənd hakimi ikən özbəklərdən bir elçi gəlibmiş. Bu elçi özbək ulusunda gücü-qüvvəti ilə məşhur imiş. Özbəklər qüvvətli adama *bükə* deyirlər. Cani bəy ona «Bükəsən? Əgər bükəsənsə, gəl güləşək» deyibmiş. Elçi nə qədər eləsə də, Cani bəy əl çəkməyibmiş. Nəhayət, güləşiblərmiş və Cani bəy onu yıxıbmış. Cəsur bir adam idi.

Başqa bir əmiri **Əhməd Hacı bəy** idi. O, Sultan Məlik Kaşğarinin oğlu idi. Sultan Əbu Səid Mirzə Heratın idarəsini bir müddət ona vermişdi. Əmisi Cani bəy öldükdən sonra onun payəsini də verib Səmərqəndə göndərdi. Xoş təbiətli və cəsur bir adam idı. Təxəllüsü Vəfai idi. Divanı var, şeirləri pis deyil. Bu beyt onundur:

Məstəm, ey möhtəsib[1], imruz zi mən dəst bidar,
Ehtisabəm biqun an ruz ki, yabi huşyar.
*Ey möhtəsib, sərxoşam, bugün məndən əl çək,*
*Məni ayıq vaxtımda sorğuya çək.*

Mir Əlişir Nəvai Heratdan Səmərqəndə gələndə Əhməd Hacı bəylə bərabər olurdu. Sultan Hüseyn [Bayqara] Mirzə padşah olduqdan sonra o, Herata getdi və orada böyük iltifat gördü. Əhməd Hacı bəy gözəl cins atlar bəsləyir **(21 b)** və minirdi. Bu atlar əsasən özünün yetişdirdiyi atlar idi. Cəsur bir adamdı, ancaq komandanlığı cəsarəti kimi deyildi. Qayğısızdı. İşini-gücünü adamları idarə edirdi. Baysunqur Mirzə Buxarada Sultan Əli Mirzə ilə vuruşub məğlub olanda Əhməd Hacı bəy də əsir düşdü və Dərviş Məhəmməd Tarxanı öldürməkdə ittiham edilərək şərəfsiz bir şəkildə qətlə yetirildu.

Başqa bir əmiri **Dərviş Məhəmməd Tarxan** Orda Buğa Tarxanın oğlu və Sultan Əhməd Mirzə ilə Sultan Mahmud Mirzənin doğmaca dayısı idi. Mirzənin hüzurunda bütün bəylərin ən böyüyü və etibarlısı o idi. Müsəlman, həlim və dərviş bir adam idi. Daima *Quran* yazırdı, şahmatı çox və yaxşı oynayırdı. Quşçuluq elmini gözəl bilir və yaxşı quş ovlayırdı. Axırda Baysunqur Mirzə ilə Sultan Əli Mirzənin qovğasında qoca yaşında bədnamlıqla öldü.

Başqa bir əmiri **Əbdüləli Tarxan** idi. O, Dərviş Məhəmməd Tarxanın yaxın qohumlarından idi. Baqi Tarxanın anası olan Dərviş Məhəmməd Tarxanın kiçık bacısı onun arvadı idi. Dərviş Məhəmməd Tarxan törə və rütbə baxımından ondan böyük olsa da, bu firon onu nəzərə almırdı. Buxaranın idarəsi bir neçə il **(22 a)** onun əlində qaldı. Adamlarının sayı üç minə çat-

[1] *Möhtəsib:* o dövrün əxlaq polisi, yaxud bələdiyyə işlərinə baxan məmur. O, köməkçiləri ilə birlikdə küçədə-bazarda gəzərək tacirlərin alıcıları aldatmamasına diqqət edir, özünü yaxşı aparmayan adamları yerindəcə şallaqla cəzalandırırdı.

mışdı. Onları yaxşı saxlayır, qayğı göstərirdi. Bəxşişi, hədiyyələri, divan və iş yerləri, ziyafətləri və məclisləri padşahlarınkı kimiydi, idarədə müqtədir, ancaq zalım, fasiq və kibrli bir adam idi. Şeybani xan onun adamı deyildi, ancaq çox zaman onunla oturub-dururdu. Kiçık sultanzadələrin çoxu onun adamı olmuşdu. Şeybani xanın bu dərəcədə inkişafına və əski sülalələrin batmasına Əbdüləli Tarxan səbəb oldu.

Başqa bir əmiri **Seyid Yusif Oğlaqçı** idi. Babası moğoldan gəlmə idi. Atasını Uluğ bəy Mirzə yüksəltmişdi. Fikir və tədbiri olduqça yaxşı idi. Cəsarəti də vardı. Yaxşı qopuz çalırdı. Mən Kabilə gələndə, o mənim yanımdaydı. Ona iltifat göstərmişdim, gerçəkdən də buna layiq idi. Hindistan səfərinə çıxdığım ilk il Seyid Yusif bəyi Kabildə qoymuşdum. O zaman Allahın rəhmətinə qovuşdu.

Bir əmiri də **Dərviş bəy** idi. Teymur bəyin iltifat göstərdiyi İgü Teymur bəyin nəslindəndir. Xoca [Übeydullah] həzrətlərinin müridi idi. Musiqi elmini bilir, saz çalır və şeir **(22 b)** yazırdı. Sultan Əhməd Mirzə Çir çayı sahilində məğlub olanda Çir çayında boğuldu.

Başqa bir əmiri **Məhəmməd Məzid Tarxan** idi. O, Dərviş Məhəmməd Tarxanın doğma və kiçık qardaşı idi. Bir neçə il Türküstan [şəhərinin] hakimi oldu. Şeybani xan Türküstanı ondan aldı. Fikir və tədbiri yaxşı idi. Heç bir şeydən qorxmayan, fasiq bir adamdı. Səmərqəndi ikinci və üçüncü dəfə alanda mənim yanıma gəlmişdi. Mən də ona çox iltifat göstərmişdim. Göl-Məlik müharibəsində öldü.

Bir əmiri də **Baqi Tarxan** idi. Əbdüləli Tarxanın oğlu və Sultan Əhməd Mirzənin əmisi oğlu idi. Atasından sonra Buxaranı ona vermişdilər. Sultan Əli Mirzə zamanında çox yüksəlmiş, adamlarının sayı beş-altı minə çatmışdı. Sultan Əli Mirzəyə o qədər bağlı deyildi. Şeybani xan ilə Qaleyi-Dəbusidə vuruşaraq yenildi və Şeybani xan bu qələbədən sonra Buxara üzərinə hücuma keçərək oranı tutdu.

Quş ovuna çox müştaq idi. Yeddi yüz ov quşu olduğu söylənir. Diqqətəlayiq bir əxlaqı və xasiyyəti yoxdu. Bir zadəgan olaraq nemət içində böyümüşdü. Atasının Şeybani xana çox yaxşılığı dəymişdi, buna güvənərək onun hüzuruna getmişdi. Ancaq o haqq itirən və mürvətsiz adam bu yaxşılıqların əvəzində **(23 a)** ona heç nə etmədi, hörmət və iltifat göstərmədi. Həqir və etibarsız bir vəziyyətdə Axsi vilayətində vəfat etdi.

Başqa bir əmiri olan **Sultan Hüseyn Arğun** bir neçə dəfə Qaragöl hakimi olduğu üçün Sultan Hüseyn Qaragöli deyə anılırdı. Fikir və tədbiri çox yaxşı idi. Mənim yanımda da uzun müddət olmuşdu.

**Qul Məhəmməd Buğda** koçin idi, cəsarətli bir adamdı.

Başqa bir əmiri olan **Əbdülkərim Eşrit** uyğur idi. Sultan Əhməd Mirzənin yanında eşik ağası idi. Cömərd və cəsur bir adam idi.

Sultan Əhməd Mirzənin ölümündən sonra bəyləri ittifaq edərək dağ

yolundan Sultan Mahmud Mirzəyə adam göndərdilər və onu dəvət etdilər. Sultan Əbu Səid Mirzənin böyük qardaşı Mənuçöhr Mirzənin oğlu Məlik Məhəmməd Mirzə səltənət iddiası ilə bir neçə sərsərini başına yığıb ordudan ayrıldı. Səmərqəndə gəldi, ancaq heç nə əldə edə bilmədi, yalnız özünün və bir neçə günahsız şahzadənin ölümünə səbəb oldu.

## SULTAN MAHMUD MİRZƏNİN SƏMƏRQƏND TAXTINA ÇIXMASI

Sultan Mahmud Mirzə bu xəbəri alan kimi dərhal Səmərqəndə gələrək heç bir əziyyət və zəhmət çəkmədən taxta oturdu.

Aşağı və yüksək təbəqəyə mənsub əsgərin və xalqın çoxu elədiyi bir çox işdən dolayı Sultan Mahmud Mirzəyə nifrət etdilər və qaçıb dağıldılar. Bu işlərdən biri budur: əvvəlcə bəhs edilən Məlik Məhəmməd Mirzə **(23 b)** onun əmisinin oğlu, özünün də kürəkəni idi. Sultan Mahmud Mirzə onu digər dörd mirzə ilə birlikdə Göy saraya çıxarmışdı. İkisinin həyatını bağışlayıb Məlik Məhəmməd Mirzə ilə digər bir mirzəni asdı. Bunların bəziləri zatən padşah olacaq adamlar deyildi və belə bir iddiaya da heç zaman düşməmişdilər. Düzdür, Məlik Məhəmməd Mirzədə bir az qəbahət vardı, ancaq digərlərinin heç bir suçu və xətası yox idi.

Sultan Mahmud Mirzənin nizam-intizamı və idarəçiliyi çox yaxşı idi. Ədalətli idi. Siyaq elmini [maliyyə-hesab işi] bilirdi. Ancaq zülm və fisqə mail idi. Səmərqəndə girəndə yeni qayda və nizamlar, mükəlləfiyyət və vergilər qoymağa başladı. Əvvəllər kasıblar və dilənçilər Xoca Übeydullah həzrətlərinin adamlarının himayəsinə sığınaraq zülm və təcavüzdən qurtulurdu. İndi isə sığınanlar bir yana, şəxsən onlara qarşı da təcavüz və təzyiq göstərməyə başladılar; hətta bu təcavüz və şiddət Xocanın öz övladlarından da yan keçmədi.

Özü zalım və fasiq olduğu kimi, bəyləri və adamları da zalım və fasiq idi. Hisar xalqı, özəlliklə də Xosrov şaha mənsub olanlar daima içməklə və zina ilə məşğul olurdular. O dərəcədə ki, bir gün Xosrov şahın adamlarından biri bir kişinin arvadını alıb götürmüş və qadının **(24 a)** əri Xosrov şahın yanına gəlib şikayət edərək ədalət tələb etmişdi. Xosrov şah da ona bu cavabı vermişdi: «Neçə ildir bu qadın səninlə bərabər idi, qoy bir neçə gün də onunla bərabər olsun».

Şəhər əhalisinin, əsnafın və əsgərlərin uşaqları zorla çöhrə[1] edilmək qorxusu altında evdən bayıra çıxmazdı. Səmərqənd əhalisi Sultan Əhməd Mirzənin iyirmi-iyirmi beş il sürən səltənəti zamanında bolluq içində və ra-

---

[1] *Çöhrə:* əslində, "üz, gözəl üz" anlamına gələn deyim burada "oğlan" mənası daşıyır.

* Şeir Sədi Şirazinin *Gülüstan* adlı əsərindən alınmışdır.

hat yaşamışdı. İşlərin çoxu Xoca [Übeydullah] həzrətləri tərəfindən doğruluqla və şəriətə uyğun olaraq həll edilirdi. Bu zülm və fəsad üzündən əhalinin canı və könlü rəncidə oldu. Böyük və kiçık, fəqir və miskin hamı lənət və bəddua üçün əl götürüb ağız açdı.

Həzər kon zərdi dər onhayi-rəş,
Ki rüşti dər an aqibət sər künəd.
Bəhəm bər məzan to təvani-dili
Ki ahi-cənahi bəhəm bər zənəd*.

*Yaralı könüllərin dərdindən qorx,*
*Çünki könlünün yarası nəhayət zühur edər;*
*Əlindən gəldiyi qədər bir könülü incitmə,*
*Çünki bir ah bir dünyanı alt-üst edər.*

Sultan Mahmud Mirzə bu zülm və fəsad üzündən Səmərqənddə beş-altı aydan artıq hökm sürmədi.

FƏRQANƏ - 900 (2 OKTYABR 1494 - 21 SENTYABR 1495)

## DOQQUZ YÜZÜNCÜ İLİN HADİSƏLƏRİ

Mənim yanıma [Baburun əmisi] Sultan Mahmud Mirzədən Əbdülqüddüs bəy adlı bir elçi gəldi. Sultan Mahmud Mirzənin böyük oğlu Sultan Məsud Mirzə ilə böyük qardaşı Sultan Əhməd Mirzənin Ağ bəyim [Səlihə Sultan bəyim] adlı ikinci qızının mərasimlə keçirilən toy hədiyyəsini gətirdi. Altın və gümüşdən badam və fıstıqlar düzəltmişdilər.

Bu gələn elçinin Həsən Yaqubla qohumluğu varmış və bəzi şeylər vəd edərək onu [Sultan Mahmud] Mirzənin tərəfinə keçirmək istəyirmiş. **(24 b)** Həsən Yaqub qeyri-müəyyən cavab verdi, hətta bu işə könlü varmış kimi görünüb elçini yola saldı. Beş-altı ay sonra Həsən Yaqubun rəftarı dəyişdi, ətrafındakılara və digər adamlara qarşı pis münasibət göstərməyə başladı. İşi o dərəcə irərli götürdü ki, məni uzaqlaşdıraraq yerimə [Baburun kiçık qardaşı] Cahangir Mirzəni padşah etmək istədi. Həsən Yaqubun digər əmirlər və sipahilərlə[1] də arası yaxşı deyildi. Onun bu fikrini hamı başa düşmüşdü. Xoca [Mövlana] qazı, Qasım Koçin, Əli Dost Tağayi, Uzun Həsən və mənim tərəfimi tutan digər adamlar nənəm İsən Dövlət bəyimin yanında toplaşdılar və onun yaratdığı qarışıqlığa son vermək üçün Həsən Yaqubu vəzifələrindən çıxarmağı qərara aldılar.

Qadınlar arasında fikir və tədbir xüsusunda nənəm İsən Dövlət bəyim kimi bir qadın az tapılardı. Fövqəladə ağıllı və tədbirli idi. İşlərin çoxu onunla məsləhətləşdikdən sonra görülürdü.

Həsən Yaqub ərkdə idi. Anam və nənəm İsən Dövlət bəyim dış kurqanda, bürcdə idi. Qərarın yerinə yetirilməsi üçün ərkə getdim. Həsən Yaqub quş ovuna çıxmışdı, amma vəziyyəti xəbər aldı və geri dönmədən Səmərqənd **(25 a)** tərəfinə getdi. Onunla birlikdə hərəkət edən bütün adamlar və bəylər yaxalandı. Bunlar arasında Məhəmməd Bakir bəy, Sultan Məhəmməd Duldayın atası Sultan Mahmud Dulday və bir neçə kişi daha vardı, onlardan bəzilərinin Səmərqəndə getməsinə izin verildi. Eşik ixtiyarlığı və Əndicanın idarəsinin Qasım Kuçinə tapşırılması qərara alındı.

Həsən Yaqub Səmərqənd yolunda Kəndi-Badama qədər varmışdı. Bir neçə gün sonra pis niyyətlərlə Axsiyə hərəkət edərək Hukan civarına gəldi. Bunu xəbər alınca bəzi bəylər və igidlər onun üzərinə axınçı olaraq göndərildi. Bu axınçı bəylər də özlərindən əvvəl bir dəstə igidi öncü olaraq göndərdilər. Həsən Yaqub bunu xəbər alınca, gecə öncü olaraq göndərilmiş bu igidlərin üstünə yürüyüb onları ox yağmuruna tutdu. Ancaq qaranlıqda öz

[1] *Sipahi* və *sipahilik:* atlı əsgər və bu hərbi qrupa mənsub olanlar və onların gördükləri işi ifadə etmək üçün işlənən termin.

adamlarının oxu Həsən Yaqubun kürəyinə saplandı və qaça bilmədən əməlinin cəzasını çəkdi.

Çü bəd kərdi məbaş əmin zi afat
Ki vacib şod təbiətra mükafat.
*Pislik edəndə bəladan qurtulacağını sanma,*
*Çünki təbiətdə qarşılıq vacibdir.*

Bu il şübhəli yeməklərdən özümü qorumağa başladım. Bıçaqdan, qaşıqdan masa örtüsünə qədər hər şeyə qarşı tədbirli davranırdım. Gecə namazlarını da daha az **(25 b)** buraxırdım.

Rəbiülaxır ayında [=30 dekabr 1494-27 yanvar 1495] Sultan Mahmud Mirzə ağır bir xəstəliyə tutularaq altı gün içində vəfat etdi, qırx üç yaşında idi.

## SULTAN MAHMUD MİRZƏ

**Doğumu və nəsəbi:** 857-ci ildə [=1453] doğulmuşdu. Sultan Əbu Səid Mirzənin üçüncü oğlu və Sultan Əhməd Mirzənin doğma qardaşı idi.

**Xarici görkəmi:** qısa boylu, seyrək saqqallı, şişman və bir az da yöndəmsiz bir adam idi.

**Əxlaqı və xasiyyəti:** əxlaqı və xasiyyəti yaxşı idi. Namazını boş keçirməzdi. İdarəsi və intizamı fövqəladə dərəcədə yaxşı idi. Maliyyə hesablarını çox əla bilirdi. Vilayətində onun xəbəri olmadan bir dirhəm və ya bir dinar belə sərf edilə bilməzdi. Adamlarının iaşəsi heç bir zaman əskik olmazdı. Məclisi, bəxşişi, ziyafət və süfrəsi fövqəladə yaxşı idi. Hamısı da qaydalı və nizamlı olurdu. Tərtib və düzəni o qədər gözəl təmin eləmişdi ki, nə əsgəri, nə də təbəəsi buna heç bir zaman təcavüz edə bilməzdi.

Əvvəlcə quş ovuyla çox məşğul olurmuş. Sonralar da şahınla çox ov edirdi. Zülm və fəsada çox düşkün idi, durmadan şərab içir və çoxlu çöhrə saxlayırdı. Hökmü altındakı yerlərdə gözəl və üzü tüksüz bir oğlan olsa, necə olursa-olsun, gətirdib özünə çöhrə edirdi. Bəylərinin oğullarını və oğullarının **(26 a)** bəylərini, hətta süd qardaşlarını özünə çöhrə eləmişdi. Bu işdə öz süd qardaşının xidmətçisindən də istifadə edirdi. Bu uğursuz adət onun zamanında o qədər yayılmışdı ki, çöhrəsi olmayan adam bəlkə də heç yoxdu. Çöhrə bəsləməyi bir hünər sayır və çöhrəsi olmayanı qınayırdılar. Bu zülm və fəsadın uğursuzluğundan bütün uşaqları gənc yaşda öldülər.

Şeir söyləyir, divan tərtib edirdi, ancaq şeiri çox zəif və dadsızdı. Elə şeir söyləməkdənsə, söyləməmək daha yaxşıdır.

Zəif etiqadlı bir adamdı. Xoca Übeydullah həzrətlərinə ehtiram bəsləmirdi. Ürəksiz və həyasız bir adamdı. Ətrafında bir neçə masqara və üzsüz vardı, divan başında və xalq önündə çirkin və alçaq hərəkətlər edirdilər.

Nitqi aydın deyildi və sözünü dərhal anlamaq qeyri-mümkündü.

**Meydan müharibələri:** hər ikisi Sultan Hüseyn [Bayqara] Mirzə ilə olmaq üzrə iki meydan müharibəsi elədi. Birincisi Əstərabadda, ikincisi Əndəxud civarında Çikmən deyilən yerdə oldu. İkisində də məğlubiyyətə uğradı. İki kərə də Bədəxşanın cənubunda Kafiristana gedərək savaşdı, ona görə də **(26 b)** fərmanlarının tuğrasında «Sultan Mahmud Qazi»[1] yazırdı.

**Torpaqları:** [atası] Sultan Əbu Səid Mirzə ona Əstərabadı vermişdi. İraq hadisəsində[2] Xorasana gəldi. O zaman Hisar hakimi Qənbər Əli bəy Sultan Əbu Səid Mirzənin əmrilə Hindistan əsgərini alaraq Mirzənin arxasından İraqa getməkdə idi və Xorasana gələndə Sultan Mahmud Mirzəyə qoşuldu. Sultan Hüseyn [Bayqara] Mirzənin yaxınlaşdığını eşidən Xorasan əhalisi hücuma keçərək Sultan Mahmud Mirzəni Xorasandan çıxardı. Sultan Mahmud Mirzə də bu üzdən Səmərqəndə Sultan Əhməd Mirzənin yanına getdi.

Bir neçə ay sonra isə Əhməd Müştaq komandanlığında Seyid Bədr, Xosrov şah və digər bəzi igidlər Sultan Mahmud Mirzə ilə birlikdə qaçaraq Qənbər Əli bəyin yanına Hisara gəldilər. O gündən sonra da Kuhqa və Kuhtən dağlarının cənubundakı Termiz, Çağanyan, Hisar, Xutlan, Qunduz və Bədəxşan kimi vilayətlər Hinduquş dağına qədər Sultan Mahmud Mirzənin idarəsində idi. Böyük qardaşı Sultan Əhməd Mirzə öldükdən sonra onun vilayəti də Mahmud Mirzənin əlinə keçmişdi.

**Uşaqları:** Sultan Mahmud Mirzənin beş oğlu və on bir qızı vardı. Oğullarının ən böyüyü Sultan Məsud Mirzə idi, anası **(27 a)** Mir Büzürg Termizinin qızı idi.

İkinci oğlu Baysunqur Mirzənin anası Pəşşə bəyim di.

Üçüncü oğlu Sultan Əli Mirzənin anası Zəhra Bikə ağa adlı özbək bir cariyə idi.

Dördüncü oğlu Sultan Hüseyn Mirzənin anası Mir Büzürgün nəvəsi Xanzadə bəyim idi. O, on üç yaşında, atası həyatda ikən Allahın rəhmətinə qovuşdu.

Sultan Veys Mirzənin anası Yunus xanın qızı və mənim anamın kiçık bacısı olan Sultan Nigar xanımdı.

Bu dörd mirzənin vəqayeləri bu kitabda müvafiq illərin olayları içində nəql ediləcək.

Üç qızı Baysunqur Mirzənin doğma bacısı idi və bunların ən böyüyü Sultan Mahmud Mirzənin əmisi Mənuçöhr Mirzənin oğlu Məlik Məhəm-

---

[1] O dövrdə müsəlman olmayan şəxslərin idarə etdiyi torpaqlara hərbi səfərlərdə və savaşlarda iştirak edən hökmdarlara "qazi" ünvanı verilirdi.

[2] Qaraqoyunlu Cahan şahın ölümündən sonra Ağqoyunlu Uzun Həsən İraqda və Azərbaycanda güclənmiş, Cahan şahın oğlu Hüseynəli Əbu Səiddən kömək istəmişdi. Əbu Səid Azərbaycana girdikdən sonra ordusuyla Qarabağda qışlarkən qıtlıq baş vermiş, Uzun Həsən onu yaxalayıb öldürmüşdü (rəcəb 873=1469-un əvvəli).

məd Mirzəyə ərə verilmişdi.

Digər beş qızı Mir Büzürgün [Termizi] nəvəsi Xanzadə bəyimdən idi. Böyüyünü Sultan Mahmud Mirzənin ölümündən sonra Əba Bəkr Kaşğariyə **(27 b)** verdilər.

İkinci qızı Bikə bəyim idi. Sultan Hüseyn [Bayqara] Mirzə Hisarı mühasirə edəndə bu qızı Sultan Əbu Səid Mirzənin qızı Payəndə Sultan bəyimdən olan Heydər Mirzə adlı oğluna almış və sülh bağlayaraq Hisardan çəkilmişdi.

Üçüncü qızı Ağ bəyim idi.

Dördüncü qızı Ay bəyim idi; Sultan Hüseyn [Bayqara] Mirzə Qunduz üzərinə gəldiyi və Ömər Şeyx Mirzənin də kömək üçün Əndican əsgərilə birlikdə oğlu [Baburun kiçık qardaşı] Cahangir Mirzəni göndərdiyi zaman Cahangir Mirzə ilə nişanlanmışdı. [Xosrov şahın kiçık qardaşı] Baqi Çağanyani 910-cu ildə [1504/5] Amu-Dərya sahilində gəlib mənə qoşulanda bu bəyimlər də anaları ilə birlikdə Termizdə idilər və onlar da Baqi Çağanyaninin köçü ilə gəldilər. Biz Gahmərdə çatanda da Ay bəyim Cahangir Mirzə ilə ailə qurdu və ondan yalnızca bir qızı oldu. İndi nənəsi Xanzadə bəyimlə birlikdə Bədəxşan vilayətində yaşayırlar.

Beşinci qızı Zeynəb Sultan bəyim idi. Kabili aldığım zaman anam Qutlu Nigar xanımın israrı ilə onunla evlənmişdim, yaxşı keçinə bilmədik, iki-üç il sonra çiçək xəstəliyindən vəfat etdi.

Qızlarından biri də Məxdumə (Məxdum) Sultan bəyimdir, Sultan Əli Mirzənin doğma böyük bacısıdır, hazırda Bədəxşan vilayətində olur.

Cariyələrindən də iki qızı olmuşdu. Birinin **(28 a)** adı Rəcəb Sultan, digərinin adı Mühib Sultan xanımdır.

**Qadınları:** böyük arvadı Mir Büzürg Termizinin qızı olan Xanzadə bəyim idi. Mirzə onu dəlicəsinə sevirdi. Sultan Məsud Mirzənin anasıydı. O öləndə Mirzə çox matəm tutdu.

Bundan sonra Mir Büzürgün nəvəsi və Xanzadə bəyimin əmisi qızını aldı. Ona da Xanzadə bəyim deyirdilər. Beş qızının və bir oğlunun anasıydı.

[Digər arvadı olan] Pəşşə bəyim qaraqoyunlunun baharlı oymağı türkmən bəylərindən Əli Şir (Şükür) bəyin qızıydı. Əvvəlcə baranlı qaraqoyunlularından Cahan Şah Mirzənin oğlu Məhəmməd (Məhəmmədi) Mirzəyə ərə getmişdi. Ağqoyunlu Uzun Həsən Azərbaycanı və İraqı Cahan Şah oğullarının əlindən alanda Əli Şir (Şükür) bəyin oğulları da beş-altı min qaraqoyunlu türkmən ailəsi ilə birlikdə gəlib Sultan Əbu Səid Mirzəyə bağlanmışdılar. Sultan Əbu Səid Mirzənin məğlub olmasından sonra bir müddət də bu vilayətlərdə qaldılar, sonra Sultan Mahmud Mirzə Səmərqənddən Hisara gələndə gedib onun xidmətinə girdilər. Sultan Mahmud Mirzə Pəşşə bəyimi elə o vaxt almışdı, Bu qadın onun bir oğlunun və üç qızının anasıydı.

Digər arvadı olan Sultan Nigar xanımın nəsəbi xanlar sırasında açıq-

lanmış və ondan bəhs edilmişdir.

Xeyli məşuqəsi **(28 b)** və cariyəsi də vardı. Ancaq ən mötəbəri özbəklərdən Zöhrə Bikə ağa idi və onu Sultan Əbu Səid Mirzə həyatda ikən gəncliyində almışdı. Bir oğlunun və bir qızının anasıydı.

Digər cariyələri də çoxdu. Onların ikisindən, yuxarıda adı çəkilən iki qızı olmuşdu.

**Əmirləri: Xosrov şah** türküstanlı qıpçaqlardandı. Gəncliyində tarxan bəylərinə yaxın xidmətlərdə olmuşdu. Bəlkə də çöhrə idi. Sonra Məzid bəy Arğunun xidmətinə girdi, o da ümumən ona iltifat göstərmişdi. İraq məğlubiyyətində Sultan Mahmud Mirzəyə qoşulub yolda gələrkən şücaət göstərdiyi üçün Sultan Mahmud Mirzə də ona iltifat etmişdi. Sonralar fövqəladə böyümüş və Sultan Mahmud Mirzə həyatda ikən əsgəri hardasa beş-altı minə çatmışdı. Bədəxşanı çıxmaqla, Amu-Dəryadan Hindıquş dağına qədər olan vilayətlər bütünlüklə ona aid idi.

Ziyafətləri və cömərdliyi yaxşı idi. Əlində olanı yeməkdən çəkinməzdi. Mala qiymət verib onu əldə etməyi bacardığı kimi bol-bol da sərf edirdi. Sultan Mahmud Mirzədən sonra, onun oğullarının zamanında da çox yüksəlmiş və əsgəri iyirmi minə yaxınlaşmışdı.

Namaz qılması və haram yeməməsi ilə birlikdə batil və fasiq, axmaq, anlayışsız **(29 a)** və nankor bir adamdı. Beş günlük fani dünya üçün özünün böyütdüyü, vəlinemətinin oğullarından birini kor elədi, digərini isə öldürdü. Allah nəzdində asi və xalqın gözündə rədd edilmiş oldu, qiyamətə qədər lənətlənməyə və nifrətə layiq biri oldu. Bu müvəqqəti dünya üçün belə pis işlər gördü.

Bu qədər abad vilayətə, bu qədər çox və silahlı əsgərə sahib olduğu halda bir toyuğa qarşı belə müharibə eləmədi. Bu kitabda yeri gəldikcə ondan təkrar bəhs ediləcəkdir.

Başqa bir əmiri **Məhəmməd Elçi-Buğa:** koçindi. Sultan Əbu Səid Mirzənin bir davası zamanı, Bəlx qapısında həzarə müharibəsində, qovğaya qarışmış və yumruq atmışdı. Cəsur bir adamdı. Mirzəyə hər zaman xidmət edirdi və Mirzə də onun fikrinə görə hərəkət edirdi. Sultan Hüseyn [Bayqara] Mirzə Qunduzu mühasirə edəndə, Xosrov şaha paxıllığı üzündən az əsgərlə və zirehsiz olduğu halda bir gecə basqına getdi, ancaq heç bir şey edə bilmədi. O qədər çox əsgərə qarşı nə edə bilərdi ki? Arxasından təqibçi göndərildi, axırda özünü çaya atdı və boğuldu.

Başqa bir əmiri **Əyyub [Bəyçik]** Sultan Əbu Səid Mirzənin yanında, Xorasan çöhrə bölüyündə xidmət edirdi. Cəsur bir adamdı. [Sultan Mahmud Mirzənin oğlu] Baysunqur Mirzənin bəy-atəkəsiydi. Yeməyi və geyinməsi qəribə idi. Lağlağıydı. Sultan Mahmud Mirzə **(29 b)** ona *bihəya* (utanmaz) deyə xitab edirmiş.

Başqa bir əmiri **Vəli** Xosrov şahın kiçık qardaşıydı. Adamlarına yaxşı

baxırdı. [Sultan Mahmud Mirzənin oğulları olan] Sultan Məsud Mirzənin gözünə mil çəkilməsinə və Baysunqur Mirzənin öldürülməsinə səbəb oldu. Hamının qiybətini edirdi. Pis və əxlaqsız, özündən bədgüman, bəd fikirli və alçaq bir adam idi. Özündən başqa heç kimi heç bir işdə bəyənməzdi. Mən Qunduz vilayətindən gələrək Duşi civarında Xosrov şahı adamlarından ayıranda, özünə də getməsi üçün izin verəndə Vəli də özbək təhlükəsindən qaçmaq üçün Əndərab və Siraba gəlmişdi. O civardakı aymaqlara hücum edib yağmaladıqdan sonra bizə qoşulmaq üzrə Kabilə gəldi. Daha sonra Məhəmməd Şeybani xanın yanına getdi və Səmərqənd şəhərində başı kəsildi.

Başqa bir əmiri **Şeyx Abdullah Barlas** idi. Əba Bəkr Mirzə ilə Sultan Mahmud xanın bibisi olan Şah Sultan Məhəmmədin qızıyla evli idi. Çox dar paltar geyinirdi. Həlim və əsalətli bir adamdı.

Başqa bir əmiri **Mahmud Barlas** Nundaqlı barləslardandı. Sultan Əbu Səid Mirzənin yanında bəy idi. Sultan Əbu Səid Mirzə İraq vilayətini ələ keçirdikdən sonra [=1468] Kirmanı Mahmud Barlasa vermişdi. [Sultan Mahmud Mirzənin kiçik qardaşlarından və eynı zamanda Baburun əmilərindən biri olan] Əba Bəkr Mirzə **(30 a)** Məzid bəy Arğun və qaraqoyunlu türkmən bəylərilə birləşərək Sultan Mahmud Mirzənin üzərinə Hisara hücuma keçəndə Sultan Mahmud Mirzə Səmərqəndə böyük qardaşının yanına getdi [=1469], ancaq Mahmud Barlas Hisarı təslim etməyərək yaxşı müdafiə etdi. Şairdi və divan tərtib etmişdi.

## BAYSUNQUR MİRZƏNİN SƏMƏRQƏND TAXTINA ÇIXMASI

Sultan Mahmud Mirzənin ölümündən sonra Xosrov şah bu hadisəni əhalidən gizləyərək xəzinəyə əl uzatdı. Belə bir xəbər heç gizli qalarmı? Dərhal bütün şəhər xalqına yayıldı. Səmərqənd əhalisi üçün o gün böyük bir bayramdı. Əsgər və xalq Xosrov şaha hücum etmək istədi. Əhməd Hacı bəy və tarxan bəyləri qovğanı yatışdıraraq Xosrov şahı şəhərdən çıxarıb Hisara göndərdilər.

Sultan Mahmud Mirzə həyatda ikən Hisarı böyük oğlu Sultan Məsud Mirzəyə, Buxarayı isə Baysunqur Mirzəyə vermiş və oğullarını oralara göndərmişdi. Buna görə də öldüyü zaman heç biri yanında deyildi.

Xosrov şahı çıxardıqdan sonra Səmərqənd və Hisar bəyləri birləşib ortaq qərara gəldilər: adam göndərərək Buxarada olan Baysunqur Mirzəni gətirdib Səmərqənd taxtına oturtdular. Baysunqur Mirzə padşah olanda on səkkiz yaşında idi.

Bu əsnada [Baburun dayısı] Sultan Mahmud xan Sultan Cüneydin, **(30 b)** Barlasın və digər bəzi Səmərqənd böyüklərinin sözünə uyub əsgərini topladı və Səmərqənd taxtını istəyərək Kənbay civarına gəldi.

Səmərqənddəki Baysunqur Mirzə də çox qüvvətli və təchizatlı qoşunla

onun qarşısına çıxdı. Kənbay civarında meydan müharibəsi oldu. Moğol əsgərinin ən mühüm bölümünü idarə edən Heydər Göyəldaş öncü idi və əsgərinin hamısı atdan enərək ox atırdı. Ancaq adlı-sanlı və qeyrətli Səmərqənd və Hisar igidləri qrubu atlarını onların üstünə sürəndə Heydər bəyin komandanlığında olanların hamısı atların ayaqları altında qaldı. Bunlar yenildiyinə görə digərləri də savaşmayaraq yenildilər. Moğolların çoxu tələf oldu və Baysunqur Mirzənin hüzurunda bir çoxunun başı kəsildi. Ölülərin çoxluğundan üç dəfə onun çadırının yerini dəyişdirmək məcburiyyətində qaldılar.

## BABURUN İSFƏRANI MÜHASİRƏYƏ ALMASI

Manlıq elindən olan İbrahim Saru kiçikliyindən bəri atamın xidmətində çalışaraq bəylik rütbəsinə qədər yüksəlmiş, sonra bir qəbahəti üzündən qovulmuşdu. O bu əsnada İsfəra kurqanına girib Baysunqur Mirzə adına xütbə oxudaraq mənə müxalifət etdi.

Şaban ayında [=1495 aprel-may] İbrahim Sarunun fitnəsini dəf etmək niyyətilə **(31 a)** qoşuna hərəkət əmri verildi. Həmin ayın sonlarında İsfəranı mühasirəyə almağa başladıq. O gün igidlər öz başlarına hərəkət etdilər və oraya çatar-çatmaz kurqanın bayır tərəfində hələ tamamlanmamış bir istehkamı ələ keçirdilər.

Seyid Qasım eşik-ağa o gün hamıdan daha yaxşı hərəkət edərək qılınc çalmaqda başqalarını geridə qoydu. Orada Sultan Əhməd Tənbəl və Məhəmməd Dost Əli Tağayi də qılınc çaldı, ancaq bahadırlıq payəsini[1] Seyid Qasım aldı. Bahadırlıq payəsi moğollarda əski bir adətdir. Hər bayram və ziyafətdə daha yaxşı qılınc işlədən adama bahadırlıq payəsi verilir. Şahruxiyyəyə dayım Sultan Mahmud xanı görməyə gedəndə bahadırlıq payəsini yenə Seyid Qasım almışdı.

Müharibənin ilk günündə ata-əkəm Xudaverdi bəyə zəmbərək[2] oxu dəyib öldürdü. Zirehsiz savaşdığı üçün bəzi igidlər öldü, bir çoxu da yaralandı, İbrahim Sarunun yanında zəmbərək atan bir adam vardı, fövqəladə dərəcədə yaxşı atırdı. Onun kimi yaxşı zəmbərək atan görünməmişdir. Xalqın çoxunu yaralayan o idi. Kurqanı alandan sonra mənim xidmətimə girdi.

Mühasirə uzanınca üç-dörd yerdə divarlar ucaldılması, lağımlar qazılması **(31 b)** və qalanın alınması üçün lazımi işlərlə ciddi şəkildə məşğul olmağa dair əmrlər verildi. Mühasirə qırx gün qədər sürdü. Nəhayət, İbrahim Saru aciz qaldı. Xoca Mövlana qazının vasitəçiliyi ilə qulluğu qəbul edərək,

---

[1] *Bahadırlıq payəsi: çuldu,* yaxud *bahadurluq ülüşü:* savaşda göstərilən şücaətə görə hökmdarın hüzurunda verilən maddi mükafat üçün işlənən termin.

[2] *Zəmbərək:* holuqlu taxtaya bağlı qurma yaydan və dörd guşəli, baş barmaq qalınlığında, ucu dəmirli, arxasında düz uçmağı təmin edən lələyi olan oxdan meydana gələn atəşsiz silah növü. Əsgərin zirehlərini dələcək gücdədir.

şəvval ayında [=1495 iyun] qılınc və oxdanını boynuna asaraq gəlib xidmətimizə girdi və kurqanı təhvil verdi.

## BABURUN XOCƏNDİ GERİ ALIB SULTAN MAHMUD XANLA GÖRÜŞMƏSİ

Xocənd uzun müddətdən bəri Ömər Şeyx Mirzənin idarəsində idi. Ancaq bu xaos zamanı və orada iş başındakıların maymaqlığı üzündən [Ömər Şeyx Mirzənin böyük qardaşı, Baburun ən böyük əmisi] Sultan Əhməd Mirzəyə keçmişdi. Bu qədər yaxınında olduğumuz üçün onun üstünə də yürüdük. Xocənddə Mir Moğulun atası Əbdülvəhhab Şiğavul vardı. Yaxlaşan kimi şəhəri problemsiz təhvil verdi.

Bu zaman Sultan Mahmud xan Şahruxiyyəyə gəlmişdi. Bundan bir müddət öncə Sultan Əhməd Mirzə Əndican civarına gələndə, yuxarıda bəhs edildiyi üzrə, xan da gəlib Axsini mühasirəyə almışdı. «Madam aradakı məsafə bu qədər yaxındır, xan da atamın və böyük qardaşımın yerindədir, gedib ziyarət edərək ehtiram göstərsəm, bu surətlə həm keçmişdəki inciklikləri ortadan qalxar, həm də uzaqda və yaxında bunu eşidən və görənlər üçün də yaxşı olar» deyə düşündüm.

Beləcə gedib Şahruxiyyənin kənarında Heydər bəyin [Göyəldaş] saldırdığı bağda onu ziyarət etdim. Bağın ortasına qurulmuş **(32 a)** böyük bir çadırda oturmuşdu. Çadıra girincə üç dəfə yükündüm. Xan da saygı göstərərək yerindən qalxdı. Salamlaşıb dönərək təkrar yükündükdən sonra məni yanına çağırdı, çox şəfqət və mehribanlıq göstərdi.

Bir-iki gün sonra Kəndirli keçidi üzərindən Axsi və Əndican tərəfə hərəkət etdim. Axsiyə gəlib atamın məzarını ziyarət etdim. Axsidən cümə namazı vaxtı çıxdım və Bəndi-Salar yolu üzərindən axşam namazıyla yatsı namazı arasında Əndicana gəldim. Bu Bəndi-Salar yolu doqquz ağacdır.

Əndican vilayətinin köçərilərindən olan çuğraq çox iri, beş-altı min ailəlik bir eldir. Fərqanə ilə Kaşğar arasındakı dağlarda yaşayırlar. At və qoyunları çoxdur. O dağlarda öküz yerinə kutas[1] bəsləyirlər. Kutasları da çoxdur. Dağları sarp və sınırda olduğu üçün vergi verməyə çox da istəkli görünmürlər. Əsgərin komandasını Qasım bəyə [Koçin] verərək oralardan mal alıb əsgərə bəzi şeylər gətirməsi üçün çuğraqların üstünə göndərdim. İyirmi minə yaxın qoyun, min-min beş yüz də at alıb əsgərə payladı.

Əsgər çuğraq sərəfindən qayıdan kimi Ura-Təpə üzərinə yürüdük. **(32 b)** Bura bir müddət Ömər Şeyx Mirzənin idarəsində olmuş, Mirzənin öləcəyi il əlindən çıxmışdı. İndi isə orada Baysunqur Mirzə adından onun kiçık qardaşı Sultan Əli Mirzə vardı. Sultan Əli Mirzə gəlişimizi xəbər alınca Pelqar və Məsiha dağlarına çıxmış, Ura-Təpədə ata-əkəsi Şeyx Zünnunu [Ar-

---

[1] *Kutas:* bir dağ öküzü növü.

ğun] qoymuşdu.

Xocənddən keçib yarı yola gələndə Xəlifə [Nizaməddin Əli Barlas] elçi olaraq Şeyx Zünnunun yanına göndərildi. O axmaq və alçaq adam müsbət bir cavab vermək bir yana, Xəlifəni həbsə ataraq öldürülməsini əmr etdi. Əcəli gəlmədiyi üçün Xəlifə qurtularaq, min cür məşəqqət və əzab çəkərək piyada və çılpaq bir halda iki-üç gün sonra yanımıza gəldi.

Ura-Təpə civarına çatdıq. Qış yaxınlaşdığı üçün əhali çöldəki məhsullarını tamam yığmışdı. Bu üzdən bir neçə gün sonra Əndicana qayıtdıq.

Bizim geri qayıtmağımızın ardından [Sultan Mahmud] xanın adamları Ura-Təpənin üstünə yürüdülər. Ura-Təpəlilər müqavimət göstərə bilmədən şəhəri buraxıb çıxdılar. Xan da Ura-Təpəni [Baburun xalası oğlu] Məhəmməd Hüseyn Gürgana [Duğlat] verdi. Ura-Təpə o gündən etibarən 908-ci ilə [=1502/3] qədər Məhəmməd Hüseyn Gürganın idarəsində qaldı.

FƏRQANƏ - 901 (21 SENTYABR 1495 – 9 SENTYABR 1496)

## DOQQUZ YÜZ BİRİNCİ İLİN HADİSƏLƏRİ

## SULTAN HÜSEYN MİRZƏNİN HİSARI MÜHASİRƏ ETMƏSİ VƏ GERİ ÇƏKİLMƏSİ

Sultan Hüseyn [Bayqara] Mirzə qışda Xorasandan Hisara **(33 a)** qoşun çəkərək Termiz [çayının] qarşı sahilinə gəldi. Sultan Məsud Mirzə də əsgərini toplayaraq Termizin digər sahilinə gəlib yerləşdi. Xosrov şah Qunduz kurqanının müdafiəsini qüvvətləndirdi və kiçık qardaşı Vəlini qoşuna başçı qoyaraq Sultan Məsud Mirzənin yanına göndərdi. [Hər iki ordu] qışın xeyli hissəsini çay kənarında keçirdi və sudan keçə bilmədi.

Sultan Hüseyn Mirzə iş bilən və təcrübəli bir padşah idi. Qunduza doğru, çayın yuxarı tərəfinə getdi. Qarşısındakı əsgərin diqqətini yayındırıb Əbdüllətif Bəxşi komandanlığında beş-altı yüz seçmə adamını Kilif keçidinə göndərdi. Qarşı tərəfdəki əsgərlər bu işdən hali olana qədər Əbdüllətif Bəxşi adamlarıyla birlikdə Kilif keçidini keçərək çayın qarşı kənarını zəbt etdi. Bu barədə Sultan Məsud Mirzəyə xəbər çatanda Xosrov şahla Vəli dərhal onların üstünə hücum çəkməyi israrla təklif etdilər. Ancaq Sultan Məsud Mirzənin cəsarətsizliyindən və ya Vəlinin müxalifi olan Baqi Çağanyaninin fikrinə uymasından çayı keçən bu adamların üstünə getməyərək məğlub kimi Hisar tərəfinə qayıtdılar.

Sultan Hüseyn Mirzə çayı keçərək [oğulları] Bədiüzzaman Mirzə, İbrahim Hüseyn [Mirzə], Məhəmməd Vəli bəy və Zünnun bəy Arğunu Xosrov şahın üstünə ilqar[1] olaraq göndərdi, Müzəffər [Hüseyn] Mirzə **(33 b)** ilə Məhəmməd Burunduq Barlası Xutlan üzərinə yolladı, özü isə Hisar üzərinə gəldi. Hisara yaxınlaşanda Hisardakılar bundan xəbərdar oldular.

Sultan Məsud Mirzə Hisarda qalmağa imkan tapa bilmədi və Kəmrud çayını yuxarı tərəfindəki Siprə-Tağ yolu ilə Səmərqəndə, kiçık qardaşı Baysunqur Mirzənin yanına getdi. Vəli də Xutlana doğru çəkildi. Hisar kurqanını isə Baqi Çağanyani, Mahmud Barlas və Qoç Bəyin babası Sultan Əhməd bəy gücləndirdi. Bir neçə il bundan əvvəl Şeybani xandan ayrılıb Sultan Mahmud Mirzənin xidmətinə girən Həmzə Sultan ilə Mehdi Sultan bütün özbəkləri ilə birlikdə, Məhəmməd Duğlat ilə Sultan Hüseyn Duğlat isə Hisar vilayətindəki moğollarla birlikdə bu qarışıqlıq zamanı Qara-Təkinə doğru çəkildilər. Sultan Hüseyn Mirzə bu xəbərləri eşidən kimi [oğlu] Əbülmöhsün Mirzə ilə bəzi igidlərini Sultan Məsud Mirzənin arxasından Kəmrud dərəsinin yuxarısına göndərdi. Dərəyə girdikləri vaxt arxadan çatdılar, ancaq heç bir şey eləyə bilmədilər. Mirzə bəy Frəngibaz [orada] qəhrəmancasına qılınc çaldı.

Sultan Hüseyn Mirzə əlavə olaraq İbrahim Tarxanı və Yaqub Əyyubu

---

[1] *İlqar/ilgər:* bu terminlə çox sürətli hərəkət edən yüngül silahlı bölük, yaxud kiçik hərbi dəstə və ya hissə nəzərdə tutulmuş olmalıdır. Bax: Qeydlər və izahlar.

da bir qədər əsgərlə birlikdə Həmzə Sultanın və moğollarm üstünə Qara-Təkinə göndərmişdi. Bunlar da [onların] arxalarından yetişərək Qara-Təkində vuruşdular, Sultan Hüseyn Mirzənin **(34 a)** axınçılarını məğlub edərək bəylərin çoxunu ələ keçirdilər, ancaq təkrar azad elədilər.

Belə olduqda Həmzə Sultan, Mehdi Sultan, Həmzə Sultanın oğlu Mamaq Sultan, sonralar Məhəmməd Duğlat Hisari adıyla tanınacaq Məhəmməd Duğlat, Sultan Hüseyn Duğlat və bu sultanların idarəsindəki özbəklər ilə Hisar vilayətində yaşayan və Sultan Mahmud Mirzənin adamları olan moğollar bizim xidmətimizə girmək istəyərək ramazan ayında [=1946 may-iyun] Əndicana gəldilər. O zaman teymurilərin adətinə uyğun olaraq döşək üstündə otururdum. Həmzə Sultan, Mehdi Sultan və Mamaq Sultan gəlincə bunlara hörmət əlaməti olaraq ayağa qalxıb döşəkdən endim və onlarla görüşdüm. Sultanlara sağ tərəfimdə bağdaş qurdurdum. Məhəmməd Duğlat Hisarinin komandanlığındakı bütün moğollar gəldilər və xidmətimə girmək istədilər.

Sultan Hüseyn Mirzə gəlib Hisar kurqanını mühasirəyə aldı. Lağım açmaq, kurqana hücum etmək, daş atmaq və qazan[1] qurmaq işləriylə gecə-gündüz durmadan uğraşırdı. Dörd-beş yerdə lağım açıldı. Şəhər tərəfindəki qapıda açılan lağım xeyli irəliləmişdi. Kurqan içində olanlar da öz lağımlarını açıb bu lağımı tapdılar və **(34 b)** yuxarıdan buraya tüstü buraxdılar. Amma Mirzənin adamları öz lağımlarını bağlayanda tüstü yuxarı, kurqanı qoruyanların özünə qayıtdı. Kurqanı qoruyanlar can hövlünə düşərək qaçdılar. Axırda su gətirib tökərək bayırdan girənləri lağımla qaçmağa məcbur etdilər. Bir dəfə də bir neçə ürəkli igid yuxarı çıxıb lağımın yanındakıları qaçırtdı.

Bir dəfə isə Mirzənin olduğu şimal tərəfdən qazan qurub çoxlu daş ataraq qalanın bir bürcünü zədələmişdilər. Yatsı namazı vaxtı bürc yıxıldı. Bəzi igidlər dərhal hücum etmək istədilər. Ancaq Mirzə gecə olduğu üçün izin vermədi. Kurqandakılar isə sabaha qədər bürcü tamamilə təmir etmişdilər. Ertəsi gün də müharibə olmadı. Bu iki-iki ay yarımda bütün iş lağım açmaq, qalacıqlar qurmaq və daş atmaqdan oyana keçmədi. Əsaslı bir savaş olmadı.

Bədiüzzaman Mirzənin idarəsində Xosrov şahın üstünə göndərilən qafilə Qunduzdan üç-dörd ağac qədər aşağıda bir yerə gələndə Xosrov şah bütün adamlarını döyüş qaydasında düzərək Qunduzdan çıxdı və ertəsi gün Bədiüzzaman Mirzənin əsgərinin üstünə yürüdü. O qədər mirzənin və sərdar bəyin **(35 a)** adamları Xosrov şahın adamlarının iki misli qədər olmasa da, bir yarım misli olduğu halda ehtiyat edərək səngərdən çıxmadılar. Xosrov şahın əsgəri yaxşı-pis, böyük-kiçık dörd-beş min qədər idi. Xosrov şah bu fani dünya üçün və bivəfa nökər-naibi üçün bunca zülm və ədalətsizliyi özünə adət etmiş, bunca böyük vilayətlər almış və bu qədər çox adam saxlamaq

---

[1] *Qazan:* əslində böyük tava mənasına gələn bu söz böyük top anlamında da işlənir.

yolunu seçmiş (ömrünün sonuna doğru adamlarının sayı təqribən iyirmi-otuz minə çıxmışdı, torpaqları isə öz padşahının və mirzələrin torpağından daha çox idi) bir adam idi. Bu iş onun həyatında gördüyü yeganə iş oldu. Xosrov şah və onun tabeliyindəkilər bu iş sayəsində sərdarlıq və cəsarətdə nam qazandılar, səngərdən çıxmayanlar isə öz qorxaqlığı və cəsarətsizliyi ilə bədnam oldular.

Bədiüzzaman Mirzə oradan çəkilərək çox çətinliklə Taliqanın böyük bağına gəldi. Xosrov şah özü Qunduz kurqanında idi, kiçık qardaşı Vəlini isə Mirzəni narahat edəcək bəzi qarışıqlıqlar çıxarmaq üçün bir dəstə seçmə igidlə birlikdə İşkəmiş, Fülula və ətraf dağların ətəklərinə göndərmişdi. Mühib Əli Qurçu da bir dəstə yaxşı igidlə birlikdə gəlmişdi və Xutlan çayının **(35 b)** sahilində Bədiüzzaman Mirzənin adamlarının bir qismilə qarşılaşdı, onların bəzilərini atdan saldı, bir neçəsinin də başını kəsdi.

Sonra bu məğlubiyyətin qisasını almaq üçün Şeydim Əli Dərban, onun kiçık qardaşı [Sultan Baba] Qulu bəy və Bəhlul Əyyub bir dəstə yaxşı igidlə birlikdə gələrək Əmbər dağının ətəyindəki Xoca-Çəngəl civarında, Xorasan əsgərlərinin köçdüyü yerdə çarpışdılar; amma o biri tərəfdən bir çox adam yetişib Şeydim Əli, Qul Baba [Sultan Baba Qulu bəy] və bir dəstə yaxşı igidlərin hamısını ələ keçirdi.

Bu xəbər Sultan Hüseyn [Bayqara] Mirzəyə çatdı. Hisarın bahar yağmurları üzündən ordu da təhlükədə idi. Uzlaşma yolunu tutaraq içəridən Mahmud Barlas, dışarıdan isə Hacı Pir Bəkavul ilə böyük ağalar[1] görüşdülər. Sultan Hüseyn Mirzə nə qədər sazəndə və xanəndə varsa hamısını yığıb Sultan Mahmud Mirzənin Xanzadə bəyimdən olan böyük qızını, yəni Sultan Əbu Səid Mirzənin qız nəvəsini [Bikə bəyimi] Payəndə Sultan bəyimdən olan [oğlu] Heydər Mirzə ilə evləndirərək Hisardan çəkildi və Qunduza doğru hərəkət etdi. Qunduza gəlincə bir az siyasət işlədərək buranı mühasirəyə almağa çalışdı. Axırda [oğlu] Bədiüzzaman Mirzənin araya girməsi ilə barışdılar. Hər iki tərəf əsir düşənləri qarşılıqlı dəyişdirərək **(36 a)** öz yerinə-yurduna qayıtdı.

Xosrov şahın bu qədər böyüməsinin və başından yekə işlərə girişməsinin səbəbi Sultan Hüseyn Mirzənin iki dəfə gəlib Hisarı ala bilmədən geri qayıtması idi.

Sultan Hüseyn Mirzə Bəlxə gələndə Mavəraünnəhr vilayətinin asayişi üçün Bəlxi [oğlu] Bədiüzzaman Mirzəyə, onun vilayəti Əstərabadı isə [digər oğlu] Müzəffər Hüseyn Mirzəyə verdi. Hər ikisini də Bəlx və Əstərabad

---

[1] *Ağa,* yaxud *ağaca:* yaşca böyük anlamına gələn ağa termini sonradan hansısa bir qurumun başında duranlara məxsus ünvan olmuşdur.

üçün bir məclisdə yükündürdü[1] və bu üzdən Bədiüzzaman Mirzə incidi. Neçə illərdən bəri davam edən düşmənçilik və fitnələrin səbəbi bu idi.

## TARXANLARIN ÜSYANI

Həmin ramazan ayında Səmərqənddə tarxanların üsyanı vardı. Səbəbi də bu idi: Baysunqur Mirzə Hisar bəyləri və sipahiləri ilə o qədər səmimi və bərabər olduğu halda, Səmərqənd bəyləri və sipahiləri ilə belə deyildi. Şeyx Abdullah Barlas böyük və ixtiyar sahibi bir bəydi, oğulları Baysunqur Mirzə ilə o dərəcə yaxın və səmimi arxadaş idi ki, bunlan aşiq-məşuqa bənzədirdilər. Tarxan bəyləri ilə bəzi Səmərqənd bəyləri bu üzdən gücəndilər.

Dərviş Məhəmməd Tarxan Buxaradan gəldi və [Sultan Mahmud Mirzənin oğlu] Sultan Əli Mirzəni Qarşıdan gətirdib padşah elan edərək Baği-Nova gəldilər. Orada [Sultan Əlinin böyük qardaşı] Baysunqur Mirzə olurdu. Ona əsir kimi davranaraq **(36 b)** adamlarından və xilmətçilərindən ayırıb ərkə gətirdilər. Orada hər iki Mirzəni eyni yerdə oturtdular. İkindi namazına doğru Baysunqur Mirzəni Göy saraya çıxarmaq fikrində idilər.

Baysunqur Mirzə abdəst almaq bəhanəsi ilə Bostan-Sarayin şimal tərəfindəki imarətlərdən birinə girdi. Tarxanlar qapıda gözlədilər, o, Məhəmmədqulu Koçin və Həsən Şərbətçi Mirzə ilə birlikdə içəri girdi. Qismətdən, Mirzənin abdəst üçün girdiyi evin arxa tərəfində kərpiclə hörülmüş bir qapı varmış və həyətdən dışarı çıxırmış. Mirzə dərhal bu qapını yıxdı, ərkin Qatfər tərəfində qalanın içindən su kəməri yolu ilə keçdi, qala divarından aşağı atılaraq Xocakə Xocanın Xoca-Kəfşirdəki evinə gəldi. Abdəstxananın qapısında duranlar bir müddət sonra içəri girib Mirzənin qaçdığını gördülər. Ertəsi sabah tarxanlar toplanıb Xocakə Xocanın qapısına gəldilər, ancaq Xoca burada olmadığını söyləyərək Mirzəni təhvil vermədi. Bunlar da zorla ala bilmədilər. Xocaların mövqeyi o qədər yüksək idi ki, zorla almaq mümkün deyildi.

Bir-iki gün keçəndən sonra Xoca Əbülməkarim, Əhməd Hacı bəy, digər bəzi igidlər, sipahilər və bütün şəhər əhalisi hamısı birdən tarxanların üzərinə hücum çəkdilər. **(37 a)** Baysunqur Mirzəni Xocanın evindən gətirdilər və Sultan Əli Mirzə ilə tarxanları ərkdə mühasirəyə aldılar. İçəridəkilər ərki bir gün belə müdafiə edə bilmədilər. Məhəmməd Məzid Tarxan Dördyol qapısından çıxaraq Buxaraya getdi. Sultan Əli Mirzə ilə Dərviş Məhəmməd Tarxan yaxalandılar.

Baysunqur Mirzə Əhməd Hacı bəyin evindəydi. Dərviş Məhəmməd Tarxanı da oraya gətirdilər. Baysunqur Mirzə ona bir-iki sual verdi, ancaq

---

[1] *Yükündürmək:* Baburda hökümdarın oğullarına və ya bəylərinə hər hansı bir rütbə və ya mövqe verərkən keçirilən bir töräni göstərir. Digər bir mənası hökmdar önündə sayğı ilə diz çökməkdir. Bax: Qeydlər və izahlar.

Dərviş Məhəmməd Tarxan cavab verə bilmədi. Elə iş tutmamışdı ki, cavab verə bilsin. Edam edilməsini əmr etdi. Dərviş Məhəmməd Tarxan taqətsizliyindən dirəyə yapışdı. Ancaq dirəyə yapışmaqla onu buraxardılarmı? Edam etdilər. [Baysunqur Mirzə] Sultan Əli Mirzənin də Göy saraya çıxarılıb gözlərinə mil çəkilməsini əmr etdi.Teymur bəyin tikdirdiyi böyük imarətlərdən biri Göy saraydır. Səmərqəndin ərkindədir. Bu imarətin qəribə bir özəlliyi var. Teymur bəyin övladlarından biri üsyan edərək taxta çıxsa, taxta burada oturur. Taxt qovğası üzündən başını itirsə, yenə burada itirir. Hətta «filan şahzadəni Göy saraya çıxardılar» ifadəsi onun öldürüldüyü mənasına gəlir.

Sultan Əli Mirzəni Göy saraya çıxarıb gözlərinə mil çəkdilər. Lakin gözlərinə çəkilən milin Sultan Əli Mirzəyə zərəri toxunmadı. Cərrah bunu **(37 b)** bilə-bilə və ya istəməyərək etmişdi. Ancaq Sultan Əli Mirzə bunu dərhal bəlli etmədi və [Xoca Übeydullahın oğullarından] Xoca Yəhyanın evinə gəldi. İki-üç gün sonra isə qaçıb Buxaraya tarxanların yanına getdi. Bu üzdən də Xoca Übeydullahın övladları arasında təəssübkeşlik yarandı. Böyüyü böyüyünə yol göstərici olarkən kiçiyi də kiçiyinə qol-qanad gərdi. Bir neçə gün sonra Xoca Yəhya da Buxaraya getdi.

Baysunqur Mirzə Buxaraya qoşun çəkərək Sultan Əli Mirzənin üstünə yürüş etdi. Buxaraya yaxınlaşanda Sultan Əli Mirzə və tarxan bəyləri onun qarşısına çıxdılar. Yüngül bir çarpışma oldu. Üstünlük Sultan Əli Mirzə tərəfində qaldı, Baysunqur Mirzə məğlub oldu. Əhməd Hacı bəy və bir neçə yaxşı igid daha ələ keçirildi, çoxu öldürüldü. Əhməd Hacı bəyi Dərviş Məhəmməd Tarxanın qətl edilməsində ittiham edərək şərəfsizcəsinə öldürdülər. Sultan Əli Mirzə də Baysunqur Mirzənin arxasınca Səmərqəndə yürüdü.

## BABURUN SƏMƏRQƏNDİ MÜHASİRƏYƏ ALMASI

Bu xəbər bizə şəvval ayında [=1496 iyun-iyul] Əndicanda çatdı. Həmin ay biz də Səmərqəndi ələ keçirmək üçün qoşuna hərəkət əmri verdik. Sultan Hüseyn [Bayqara] Mirzə Hisardan və Qunduzdan çəkilmişdi, Sultan Məsud Mirzə ilə Xosrov şahın ürəyi yerinə gəlmişdi. Bundan istifadə edən Sultan **(38 a)** Məsud Mirzə də Səmərqəndi almaq məqsədilə Şəhrisəbz üzərinə gəldi. Xosrov şah kiçık qardaşı Vəlini də Mirzə ilə birlikdə göndərdi. Üç-dörd ay boyunca Səmərqəndi bu şəkildə üç tərəfdən mühasirəyə aldıq.

Sultan Əli Mirzənin elçisi kimi Xoca Yəhya mənim yanıma gəldi və ittifaq quraraq vahid cəbhə yatarmağı təklif etdi. Görüşməyi qərara aldıq. Mən əsgərimlə Səmərqənddən iki-üç ağac daha aşağıda olan Soğd tərəfdən görüş yerinə getdim; o tərəfdən də Sultan Əli Mirzə əsgəriylə gəldi. Oradan dörd-beş adamla Sultan Əli Mirzə, buradan da dörd-beş adamla birlikdə mən Kuhək çayının ortasına gedərək at üstündə görüşüb danışdıqdan sonra onlar o tərəfə döndülər, mən də bu tərəfə gəldim. Molla Bənnai ilə Məhəm-

məd Salihi orada, Xoca Yəhyanın xidmətində gördüm. Məhəmməd Salihi yalnız bir dəfə orada ikən görmüşdüm. Ancaq Molla Bənnai sonralar mənim xidmətimdə də bir xeyli çalışdı. Sultan Əli Mirzə ilə görüşdükdən sonra qış yaxınlaşdığı və Səmərqənd əhalisi də ciddi sıxıntı çəkmədiyi üçün mən Əndicana qayıtdım, Sultan Əli Mirzə də Buxaraya getdi.

Sultan Məsud Mirzə Şeyx Abdullah Barlasın qızına möhkəm aşiq idi. Onunla evləndi və torpaq davasından vaz keçərək Hisara **(38 b)** döndü. Bəlkə də buraya gəlməsinin səbəbi o qız idi.

Mehdi Sultan Şiraz və Kənbay civarından qaçaraq Səmərqəndə getdi. Həmzə Sultan da izin alaraq Zamindən Səmərqəndə getdi.

FƏRQANƏ - 902 (9 SENTYABR 1496 – 30 AVQUST 1497)

## DOQQUZ YÜZ İKİNCİ İLİN HADİSƏLƏRİ

Bu qış Baysunqur Mirzənin işləri hər yöndən yaxşı getdi. Əbdülkərim Eşrit Sultan Əli Mirzə tərəfindən Kufin civarına göndərilmişdi, Mehdi Sultan isə Baysunqur Mirzənin axınçılarına başçılıq edərək Səmərqənddən oraya gəldi və üstlərinə yürüdü. Əbdülkərim Eşrit ilə Mehdi Sultan qarşılaşdılar. Mehdi Sultan özünün çərkəz qılıncıyla Əbdülkərimin atını vurunca at yıxıldı. Əbdülkərim yerdən qalxmaq üzrə ikən Mehdi Sultan onun əlini biləyindən kəsib saldı. Onu əsir aldı və axınçılarını da möhkəm məğlub etdi.

Bu [Özbək] sultanlar Səmərqənddə işlərin pis və mirzələrin vəziyyətinin qarışıq olduğunu görüncə, ertəsi yaz Şeybani xanın yanına getdilər. Səmərqəndlilər isə bu durumdan cəsarət alaraq Sultan Əli Mirzəyə qarşı qoşun çəkdilər. Baysunqur Mirzə Sərpülə, Sultan Əli Mirzə də Xoca-Kardzənə gəldi. Bu əsnada Xoca Münir Uşinin təşviqi ilə Xoca Əbülməkarim, Əndican bəylərindən **(39 a)** Veys Lağari, Məhəmməd Bakir və digər bəzi igidləri, Mir Qasım Dulday və Baysunqur Mirzənin bir dəstə yaxınlarından ibarət axınçılarla birlikdə Buxara üzərinə göndərildi. Lakin Buxaradakılar onların gəldiyindən xəbərdar olunca heç bir şey elə bilmədən geri qayıtdılar.

## BABURUN SƏMƏRQƏNDİ İKİNCİ DƏFƏ MÜHASİRƏ ETMƏSİ

Sultan Əli Mirzə ilə görüşəndə yazda onların Buxaradan, mənim isə Əndicandan gələrək Səmərqəndi mühasirəyə alacağımız qərarlaşdırılmışdı. Biz bu qərara uyğun olaraq ramazan ayında [=1497 may] Əndicandan hərəkət edərək Yar-yaylaq civarına gəldik və mirzələrin qarşıda olduqları xəbərini aldıq. Tolun Xoca Moğulu iki-üç yüz qazax[1] igidlə birlikdə axınçı olaraq göndərdik. Bunlar yaxınlaşanda Baysunqur Mirzə gəlişimizi xəbər alaraq intizamsız şəkildə geri çəkildi. Bu igidlər o gecə onların ordugahına girərək bir çox adamını oxla vurdular və çoxlu qənimət gətirdilər.

İki gün sonra Şiraz kurqanına vardıq. Şiraz Qasım Duldayda idi. Darğa Şiraz kurqanını döyüşsüz təhvil verdi. Şiraz kurqanının idarəsi İbrahim Saruya tapşırıldı.

Ertəsi gün ramazan bayramı namazını orada qıldıqdan sonra Səmərqəndə yürüş edərək Abyar qoruğuna gəldik. O gün Qasım Dulday, Veys Lağari, Həsən Nəbirə, Sultan Məhəmməd Seyfəl (Dərviş) **(39 b)** və Sultan Məhəmməd Veys üç-dörd yüz adamla gəldilər və mənimlə görüşüb ehtiramla «Baysunqur Mirzə geri çəkiləndə biz də ondan ayrılıb padşahın xidmətinə gəldik» dedilər. Lakin sonra anlaşıldı ki, bunlar Şirazı müdafiə məqsədilə

[1] *Qazax:* bu söz həm "mərd, cəsur", həm də «köçəri» mənasında işlənir.

Baysunqur Mirzədən ayrılmışlar və Şiraz işi belə olunca çarəsiz qalıb bizim yanımıza gəlmişlər.

Qara-Bulaqda dayananda bizim tərəfə keçən və bəzi kəndlərdə sərkəşlik edən moğolları tutub gətirdilər. Qasım bəy ibrət üçün bunlardan iki-üç adamı parçalatdı. Dörd-beş il sonra, qazaxlıq günlərində Məsihadan [moğol xanı Sultan Mahmud] xanın hüzuruna gedərkən Qasım bəy bu üzdən bizdən ayrılaraq Hisara getdi.

Qara-Bulaqdan qalxıb çayı keçərək Yam qarşısında durduq. O gün bəzi içki[1] bəylər xiyaban başında Baysunqur Mirzənin adamlarıyla çarpışdılar. Sultan Əhməd Tənbəlin boğazına nizə ilə vurdular, lakin atdan düşmədi. Xoca Kəlanın böyük qardaşı olan Hacəgi Molla Sədrin boynuna ox isabət etdi və yerindəcə Allahın rəhmətinə qovuşdu. Çox yaxşı bir igid idi. Atam da ona böyük iltifat göstərərək özünə möhürdar[2] təyin eləmişdi. Elmlə **(40 a)** məşğul olurdu. Nəsri də gözəl idi. Quşçuluq və yadaçılıqdan da başı çıxırdı.

Biz Yam civarında ikən şəhərdən bir çox tüccar və tüccar olmayanlar çıxıb ordu bazarında ticarət edirdi. Bir gün ikindi namazı vaxtında ümumi bir qarışıqlıq çıxdı və bu müsəlmanların malları yağmalandı. Lakin qoşunda intizam çox güclü idi. Dərhal əhalinin malını, heç kimin tək bir şeyi belə gizləmədən geri verməsi əmr edildi. Ertəsi gün daha bir pəhər[3] belə olmamışdı, qoşunda yağmanın ən kiçık parçası da qalmadı, kiçık bir ip parçasına, ya da iynə qırığına qədər hamısı sahiblərinə geri verildi.

Oradan qalxıb Səmərqənddən üç küruh[4] məsafədə olan Xan Yurdunda dayandıq. Qırx-əlli gün bu yurdda oturduq. Burada olduğumuz müddət ərzində hər iki tərəfdən könüllü igidlər xiyabanda bir neçə dəfə yaxşıca çarpışdılar. Bir dəfə İbrahim Bəycik də [Tağayi] bu çarpışmalarda iştirak etdi və üzündən yaralandı. Bundan sonra ona İbrahim Çapıq deməyə başladılar.

Bir dəfə də xiyabanda, Məğaq körpüsündə Əbülqasım Kuhbər toppuz işlətdi. Bir dəfə də xiyabanda arx civarında bir çarpışma oldu və **(40 b)** Mirşah Koçin toppuzla vuruşdu. Ona elə vurdular ki, boynu yarısına qədər kəsildi və yalnızca böyük şahdamarı qaldı.

Xan Yurdunda olduğumuz zaman kurqandakılar adam göndərdilər və «Gecə Gari-Aşiqanə gəlin, kurqanı təslim edək» deyə hiylə qurdular. Buna inanaraq gecə hərəkət edib Məğaq körpüsünə gəldim. Qərarlaşdırılmış olan yerə bir dəstə yaxşı igid və piyada göndərildi. Məsələni anladıqları vaxt içəridəkilər bizim piyadalardan dörd-beşini əsir almışdılar. Bunlar çox qüvvətli

[1] *İçki:* içə aid, səmimi dost, xas adam, qvardiya deməkdir.

[2] *Möhürdar. Tamğa, nişan* və daha sonra işlənən *möhür* termimi yazılan rəsmi məktubların başqaları tərəfindən açılmaması üçün qoyulan işarəyə deyilir.

[3] *Pəhər:* Hindistanda günün səkkizdə birinə (3 saat) verilən ad.

[4] *Küruh:* Hindistanda 4.000 qədəm uzunluqdakı məsafə ölçüsünə verilən ad.

piyadalar idi. Birinin adı Hacıydı və kiçıkliyindən bəri mənim xidmətimdə idi. Birinə də Mahmud Kundursəngək deyirdilər. Hamısını öldürdülər.

Bu yurdda olduğumuz zaman Səmərqəndin şəhər əhalisindən və əsnafdan o qədər çox adam dışarı çıxmışdı ki, ordugah artıq bir şəhər halına gəlmişdi. Şəhərlərdə nə axtarsan ordugahda tapardın.

Bu müddət ərzində Səmərqənd istisna olmaqla digər bütün kurqanların, dağların və ovaların hamısı bizə itaət etmişdi. Şavdar dağının ətəyindəki Örkət adlı bir kurqanı bəzi adamlar gücləndirmişdilər. Bu üzdən bu yurddan qalxıb Örkətə yürüş etmək lazım gəldi. Axırda bizə qarşı dayana bilməyəcəklərini anladıqları zaman da Xoca [Mövlana] qazını **(41 a)** minnətçi salıb itaət etdilər. Biz də onların xətalarını bağışlayaraq yenidən Səmərqəndin mühasirəsi ilə məşğul olduq.

## SULTAN HÜSEYİN MİRZƏ İLƏ BƏDİÜZZAMAN MİRZƏ ARASINDA ÇARPIŞMA

Bu il Sultan Hüseyn [Bayqara] Mirzə ilə [oğlu] Bədiüzzaman Mirzə arasındakı anlaşmazlıqlar bunları savaşa sürüklədi. Məsələ belə idi: keçən il Sultan Hüseyn Mirzənin Bəlxi Bədiüzzaman Mirzəyə, Əstərabadı isə Müzəffər Mirzəyə verərək onları yükündürdüyünü nəql etmişdik. O zamandan bugünə qədər bir çox elçilər gəlib getdi. Axırda Əlişir bəy [Nəvai] də elçi olaraq gəldi. Nə qədər çalışsalar da Bədiüzzaman Əstərabadı kiçık qardaşına verməyə razı olmadı və «Mənim oğlum Məhəmməd Mömin Mirzə sünnət olunanda, [babası] Sultan Hüseyn Mirzə oranı ona hədiyyə etmişdi» dedi.

Bir gün Əlişir bəylə Mirzə arasında bir söhbət oldu ki, bu, Mirzənin sürətli fəhminə, Əlişir bəyin də həssasiyyətinə bir dəlildir. Əlişir bəy bir çox məhrəm sözü Mirzəyə pıçıltıyla söylədi və «Bu sözləri unudun» dedi. Mirzə də dərhal «hansı sözləri?» deyə soruşanda, Əlişir bəy çox mütəəssir oldu və uzun-uzun ağladı.

Ata ilə oğul arasındakı bu dedi-qodular axırda belə nəticələndi: atası oğlu, oğlu da atası üzərinə Bəlx və Əstərabada qoşun yeritdi. Gürzüvan ətəyində yerləşən **(41 b)** Yekçıraq çayırına aşağıdan Sultan Hüseyn Mirzə yuxarıdan da [oğlu] Bədiüzzaman Mirzə gəldi. Ramazan başlanğıcında çərşənbə axşamı günü [=3 may 1497] Sultan Hüseyn Mirzənin bir neçə bəyi və bir dəstə süvarisi ilə birlikdə [digər oğlu] Əbülmöhsün Mirzə irəlilədi. Ciddi bir vuruşma olmadan Bədiüzzaman Mirzə məğlub oldu. Bir çox yaxşı igid əsir düşdü. Sultan Hüseyn Mirzə hamısının başını kəsdirdi. Yalnız burada deyil, hansı oğlu düşmən olaraq qarşısına çıxsa, məğlub etdi və əsir düşən adamlarının hamısının başlarını kəsdirdi. Nə eləsin, haqq onun tərəfində idi.

Bu mirzələr zövq və səfahətə o dərəcədə düşkün idilər ki, ataları kimi təcrübəli və ağıllı bir padşah onlara yarım günlük məsafəyə qədər yaxınlaş-

dığı və digər tərəfdən də ramazan kimi mübarək və əziz bir aya girməyə yalnızca bir gecə qaldığı halda, onlar atalarından çəkinmədən, Allahdan qorxmadan yalnızca şərab içib zövq və səfa sürməklə məşğul idilər. Şübhəsiz, belə hərəkət edən adamlar belə yenilgilərə uğrayar və belə insanların öhdəsindən hər kəs gələr.

Əstərabadın idarəsi neçə ildir Bədiüzzaman Mirzənin əlində idi. Ətrafındakılar və igidləri fövqəladə zövqə və süsə düşkün idilər. Altın və gümüş qab-qaşıqları və əşyaları hədsiz dərəcədə çoxalmışdı. Süslü geydirilmiş igidlərinin **(42 a)** və cins atlarının sayı-hesabı yox idi. Orada hamısını itirdi. Dağ yollarından qaçarkən, qayalıqlardan və uçurumlardan böyük çətinliklərlə endi, amma bir çox adamı bu uçurumlarda tələf oldu.

Sultan Hüseyn Mirzə oğlunu yendikdən sonra Bəlxə gəldi. Bədiüzzaman Mirzə Bəlxdə Şeyx Əli Tağayini qoymuşdu. O da çarəsiz qaldı və Sultan Hüseyn Mirzəyə itaət edərək Bəlxi təslim etdi. Sultan Hüseyn Mirzə Bəlxi [digər oğlu] İbrahim Hüseyn Mirzəyə verib Məhəmməd Vəli bəylə Şah Hüseyn Çöhrəni də onunla birlikdə qoydu və özü Xorasana geri qayıtdı.

Məğlub olan, malı-mülkü yağmalanan Bədiüzzaman Mirzə ətrafındakı igidləri, piyada və çılpaq adamlarıyla birlikdə Qunduza, Xosrov şahın yanına getdi. Xosrov şah ona yaxşı üz göstərdi. At və dəvələrlə birlikdə kiçık və böyük çadırlar, sipahilərə gərəkən təchizatı verərək, həm Mirzənin özünə, həm də başının adamlarına o qədər yaxşı rəftar və insaniyyət göstərdi ki, görənlər Mirzənin öncəki və bugünkü təchizatı arasındakı fərqin yalnızca süslü və yaldızlı alətlərin olmaması olduğunu söylədilər.

## SULTAN MƏSUD MİRZƏ İLƏ XOSROV ŞAH ARASINDAKI UYUŞMAZLIQ

Sultan Məsud Mirzə ilə Xosrov şah arasında birinin ölçüsüzlüyü, digərinin isə özünü böyük görməsindən uyuşmazlıq yarandı. Xosrov şah Vəli və Baqini [Çağanyanı] **(42 b)** Bədiüzzaman Mirzə ilə birlikdə Hisara Sultan Məsud Mirzənin üzərinə göndərdi. Lakin kurqana yaxınlaşa bilmədilər. Civardakı bölgədə hər iki tərəf bir-iki dəfə qılınc işlətdi. Bir dəfə də Mühib Əli Qurçu qafilədən ayrılaraq Hisarın şimal tərəfində yerləşən Quşxanaya gəlib yaxşı çarpışdı. Atdan yıxılıb ələ keçiriləcəyi zaman arxadaşları gəlib onu qurtardılar. Bir neçə gün sonra sülhə bənzər bir şey bağlayıb geri qayıtdılar.

Bundan bir neçə gün sonra Bədiüzzaman Mirzə dağ yolundan Qəndəhara və Zəmindavərə, Zünnun bəy Arğun ilə oğlu Şah Şüca Arğuna getdi. Zünnun bəy Arğun xəsis olduğu halda yaxşı münasibət göstərdi və bir dəfə də qırx min qoyun hədiyyə etdi. Qəribə bir təsadüfdür ki, Sultan Hüseyn Mirzənin [oğlu] Bədiüzzaman Mirzəni məğlub etdiyi eyni çərşənbə axşamı

günündə [digər oğlu] Müzəffər Mirzə də [Bədiüzzamanın oğlu] Məhəmməd Mömin Mirzəni Əstərabadda məğlub etmişdi. Daha da qəribəsi budur ki, Çərşənbə adlı bir adam Məhəmməd Mömin Mirzəni əsir edərək gətirmişdi.

FƏRQANƏ - 903 (30 AVQUST 1497 – 19 AVQUST 1498)

## DOQQUZ YÜZ ÜÇÜNCÜ İLİN HADİSƏLƏRİ

Baği-meydanın arxasındakı Külbə çayırında dayandıq. Səmərqəndin sipahilərindən və şəhər əhalisindən lap çox adam Məhəmməd Çəb körpüsünün civarında qarşımıza çıxdı. Bizim əsgər müharibəyə hazır deyildi. **(43 a)** İgidlər hazırlaşana qədər Sultanqulunu və Babaqulunu ələ keçirərək hisara götürdülər.

Bir neçə gün sonra qalxıb Kuhəkin arxasındakı Külbənin kənarında durduq. Seyid Yusif Bəyi o gün Səmərqənddən çıxardılar, o da oraya gəlib bizə xidmət etməyə hazır olduğunu bildirdi.

Buraya gəldiyimizi görən səmərqənddəkilər elə zənn etdilər ki, biz geri çəkilmişik. Köməkçilər, sipahilər və şəhərlilər Mirzə körpüsünə və Şeyxzadə darvazasından Məhəmməd Çəb körpüsünə qədər çıxdılar. İgidlərə silahlanıb atlara minməyi əmr etdik. Onlar iki tərəfdən – Mirzə körpüsü ilə Məhəmməd Çəb körpüsündən düşməni sıxışdırdılar. Allahın köməyilə düşmən yenildi. Onların ləyaqətli bəylərini və yaxşı igidlərini əsir edib gətirdilər. Bunlardan biri Məhəmməd Miskin Hafiz Dulday idi, onun şəhadət barmağını kəsmişdilər. Ondan başqa, Məhəmməd Qasım Nəbirə, onun kiçık qardaşı Həsən Nəbirə və daha bunlar kimi sipahilər və əhali tərəfindən tanınan igidlərdən xeyli vardı.

Şəhərin yetimlərindən Divanə Caməbəf ilə Kəlqaşığı da gətirdilər; bunlar küçə qovğasında və oğurluqda alt təbəqə **(43 b)** arasında məşhur idilər. Gari-Aşiqanda ölən piyadaların intiqamının alınması üçün işkəncə ilə öldürülmələri əmr edildi. Bu, Səmərqənd əhalisi üçün qəti bir məğlubiyyət idi. Bundan sonra kurqandan çıxmaları dayandı. İş o dərəcəyə vardı ki, bizimkilər xəndək kənarına qədər gedib əsirlər gətirirdilər.

Günəş tərəzi bürcünə girdi. Soyuqlar başladı. Məsləhət toplantısına qatıla biləcək bəyləri çağıraraq vəziyyəti müzakirə etdik. Bunlara qərar verildi: şəhər əhalisi o qədər aciz qalmışdır ki, Allahın inayətilə şəhəri bugün də, sabah da ala bilərik. Burada soyuqdan əziyyət çəkməkdənsə şəhərin yaxınından qalxıb bir kurqanda qışlaq düzəltmək lazımdır. Əgər getmək lazım gəlsə, oradan daha az tərəddüdlə getmək mümkündür.

Qışlaq üçün Xoca-Didar kurqanı uyğun görüldü. Oradan qalxıb Xoca-Didarın önündəki çayıra getdik. Kurqana girib ev və koma yerlərini müəyyən etdik. Bunları düzəldəcək adamlar ilə təhsildarlar qoyaraq yurda döndük. Qışlaq hazır olana qədər bir neçə gün çayırda qaldıq.

Bu zaman Baysunqur Mirzə Türküstana, Şeybani xana ard-arda adamlar göndərərək kömək istəmiş. Qışlaq hazır oldu və biz kurqana **(44 a)** girdik. Şeybani xan Türküstandan hücum edərək o gecə bizim yurdumuzun

üzərinə doğru gəldi. Bizim əsgərimiz yanımızda deyildi. Qışlak üzündən bəziləri Ribati-Xocaya, bəziləri Qəbilə, bəziləri də Şiraza getmişdi. Buna baxmayaraq əlimizdəki qoşunu toplayıb qarşı çıxdıq. Lakin Şeybani xan müharibəyə girmədən Səmərqəndə doğru geri çəkildi. Şeybani xanla Baysunqur Mirzənin istəkləri üst-üstə düşmədiyi üçün anlaşa bilməmişdilər. Şeybani xan bir neçə gün sonra heç bir şey edə bilmədi və dilxor halda Türküstana qayıtdı.

Baysunqur Mirzə yeddi ay mühasirə altında qaldı. Şeybani xandan kömək ummuş, lakin bu ümidi də boşa çıxmışdı. Axırda iki-üç yüzə qədər ac adamı ilə birlikdə Qunduza, Xosrov şahın yanına getdi. İyulda Amu-Dəryadan keçdiyi zaman Sultan Məsud Mirzənin qohumlarından və etibarlı adamlarından olan Termiz hakimi Seyid Hüseyn Əkbər bunu xəbər alıb Baysunqur Mirzənin üstünə yürüdü. Mirzə çayı keçmişdi, amma Mirim Tarxanı orada su götürdü. Seyid Hüseyn də geridə qalan adamlarını və əşyasını ələ keçirdi. Baysunqur Mirzənin Tahir Məhəmməd adlı çöhrəsi də ələ keçmişdi. Xosrov şah Baysunqur Mirzəni yaxşı qarşıladı **(44 b)**.

Baysunqur Səmərqənddən çıxanda bizə xəbər gəldi. Xoca-Didardan hərəkət edərək Səmərqənd üzərinə yürüdük. Yolda Səmərqəndin böyükləri, bəylər və igidlər birər-birər bizi qarşılayıb təbrik etməyə gəldilər. Rəbiyül-əvvəl ayının sonlarına doğru [=1497 noyabr] ərkə girib Bostan-Saraya endim. Tanrı təalanın inayəti ilə Səmərqənd şəhəri və vilayəti zəbt edilib ələ keçirildi.

## SƏMƏRQƏNDİN QISA TƏSVİRİ

Səmərqənd qədər gözəl bir şəhər dünyada az tapılar. Beşinci iqlimdədir. Koordinatları 99 dərəcə 56 dəqiqə uzunluq və 30 dərəcə 30 dəqiqə en dairəsidir[1]. Şəhəri Səmərqənddir, vilayətinə Mavəraünnəhr deyirlər. Heç bir düşmən onu güc və üstünlüklə ələ keçirə bimədiyi üçün «Bəldeyi-məhfuzə[2] deyirlər. Səmərqənd əmirəlmömininin həzrəti Osman zamanında islamiyyəti qəbul etmişdir. Səhabədən Qusəm bin Abbas buraya gəlmişdir. Onun məzarı Ahən darvazasının bayırındadır və bugün də Məzari-Şah adıyla məşhurdur.

Səmərqəndi İskəndər [Filkus] qurmuşdur. Moğol və türk ulusları Səmizkənd deyirlər. Teymur bəy buranı paytaxt eləmişdi. Teymur bəydən əvvəl onun kimi böyük bir padşah Səmərqəndi paytaxt eləməmişdi. Qala divarları üzərindən kurqanın uzunluğunun ölçülməsini əmr etdim; ölçdülər, on min altı yüz qədəm çıxdı.

Əhalisi bütünlüklə sünni, pak məzhəb, şəriətə bağlı və dindardır. Həz-

---

[1] Bu koordinatlar ortaçağ hesablarına görədir. Modern standartlara görə, Səmərqənd 67° uzunluq və 39° 40' en dairəsindədir.

[2] *Bəldeyi-məhfuzə:* (Allahın) hifz etdiyi yer, hifz olunan şəhər deməkdir.

rəti peyğəmbər zamanından bəri Mavəraünnəhrdə o qədər çox islam imamı yetişmişdir ki, başqa heç bir vilayətdən **(45 a)** bu qədər çox imam çıxmamışdır. Kəlam imamlarından biri olan Şeyx Əbu Mənsur Səmərqəndin Maturid adlı məhəlləsindəndir.

Kəlam imamları iki qrupa bölünür; birinə maturidiyyə, digərinə əşariyyə deyirlər. Maturidiyyə Şeyx Əbu Mənsur tərəfindən qurulmuşdur. *Səhihi-Buxari* adlı əsərin müəllifi Xoca İsmayıl da Mavəraünnəhrdəndir. *Hidayə* adlı əsərin yazarı da Fərqanənin Mərginan adlı vilayətindəndir. İmam Əbu Hənifə məzhəbində *Hidayə*dən daha sayğın bir fiqh kitabı yoxdur. Fərqanə də Mavəraünnəhrə daxil olub məmurənin kənarında yerləşir.

Səmərqəndin şərqində Fərqanə və Kaşğar, qərbində Buxara və Xarəzm, şimalında Daşkənd və Şahruxiyyə (kitablarda Şaş və Bənakət deyə yazılır), cənubunda Bəlx və Termiz yerləşir.

Kuhək çayı Səmərqəndin şimalından axır və ondan iki küruh məsafədədir. Bu çayla Səmərqənd arasında Kuhək deyilən bir təpə vardır və çay bunun ətəyindən axdığı üçün Kuhək çayı deyirlər. Bu sudan böyük bir qol ayrılmışdır. Dərya qədər geniş olan bu qola Dərğəm çayı deyirlər. Səmərqənddən bir şəri məsafədədir və şəhərin cənubundan axır. Səmərqəndin bağları, məhəllələri və bir neçə qəzası bu su sayəsində abad olmuşdur. Buxara və Qara gölə qədər otuz-qırx ağaca yaxın bir bölgənin əkin-biçini və abadlığı Kuhək çayıyla təmin edilir. Bu qədər böyük **(45 b)** bir çay olduğu halda suyu ziraət və abadlıq üçün ancaq yetir, hətta yayda Buxara üç-dörd ay susuz qalır.

Üzümü, qovunu, alması, narı və digər bütün meyvələri çox yaxşıdır. Lakin Səmərqəndin iki meyvəsi məşhurdur: sibi-Səmərqənd (alma) və sahibi-Səmərqənd (üzüm).

Qar Kabildə olduğu qədər çox yağmasa da, qışı çox soyuqdur. Yayda havası xoşdur, lakin Kabil qədər deyil.

Səmərqənddə və onun məhəllələrində Teymur bəyin və Uluğ bəyin imarət və bağları çoxdur. Teymur bəy Səmərqənd ərkində Göy saray deyə məşhur olan dörd qatlı, fövqəladə böyük bir köşk tikdirmişdir.

Bundan başqa, Ahənin darvazasına yaxın, qalanın içində bir cami də tikdirmişdir. Bu caminin daşlarını əksəriyyəti Hindistandan gətirtilən daşçılar işləmişdir. Caminin kitabəsindəki «Və əz yərfəu İbrahim əl-qəvaidə...»[1] ayəsini elə böyük hərflərlə yazmışlar ki, bir küruh məsafədən oxumaq mümkündür. Bu da çox böyük bir binadır.

[Teymur bəy] Səmərqəndin şərqində iki bağ saldırmışdır. Daha uzaqda olan Baği-boldu, digəri isə daha yaxında olan Baği-dilgüşadır. Bağidilgüşadan Firuzə darvazasına qədər bir yol çəkdirib iki tərəfinə qovaq ağacı əkdirmişdir. Dilgüşada da böyük bir köşk tikdirmişdir. Bu köşkdə **(46 a)**

[1] *Quran,* Bəqərə surəsi: "İbrahim İsmayıl ilə bərabər Evin təməllərini yüksəldir" (2:127).

Teymur bəyin Hindistan müharibələri təsvir edilmişdir. Kuhək təpəsinin ətəyində, Kani-Gilin -abi-rəhmət də deyilən Qara suyun- üst tərəfində Nəqşi-cahan adında bir bağ saldırmışdır. Mən görən zaman bu bağ artıq xarab olmuş və diqqətədəyər bir şeyi qalmamışdı. Səmərqəndin cənubunda, qalaya yaxın yerdə Baği-çinar, Səmərqəndin aşağı tərəfində Baği-şimal və Bağibehişt vardır.

Teymur bəyin nəvəsi, Cihangir Mirzənin oğlu olan Məhəmməd Sultan Mirzə də Səmərqəndin dış kurqanında – Çəkərdə bir mədrəsə tikdirmişdir. Teymur bəyin və Səmərqənddə padşahlıq edən övladlarının hamısının qəbri buradadır.

Uluğbəy Mirzənin imarətlərindən olan mədrəsə və xanəgah isə Səmərqənd qalasının iç tərəfindədir. Xanəgahın qübbəsi fövqəladə böyükdür, onun qədər böyük bir qübbənin dünyada olmadığını söyləyirlər. Bu mədrəsənin və xanəgahın yanında Mirzə hamamı deyə bilinən gözəl bir hamam tikdirmişdi. Döşəməsi müxtəlif daşlardandır. Xorasanda və Səmərqənddə onun kimi başqa bir hamam yoxdur **(46 b).**

Bir də mədrəsənin cənubunda Məscidi-Müqətta dedikləri bir məscid tikdirmişdir. Müqətta [kəsilmiş, ayrı] deyilməsinin səbəbi parça-parça ağacların yonulub islami və Çin üsulu naxışlarla işlənməsindəndir. Bütün divarları və damı bu tərzdədir. Bu məscidin qibləsi ilə mədrəsənin qibləsi arasında çox böyük fərq vardır. Hər halda bu məscidin qiblə yönünü ulduzlara görə təyin etmişlər.

Tikdirdiyi digər böyük binalardan biri də Kuhək təpəsinin ətəyində yerləşən və içərisində zic[1] yazma aləti olan üç qatlı rəsədxanadır. Uluğ bəy Mirzə bu rəsədxana ilə zici-Gürganini tərtib etmişdir ki, dünyada bu zic digərlərindən daha artıq istifadə olunur. Bundan əvvəl Xoca Nəsir[əddin] Tusinin elxani hakimi Hülakü xan zamanında Marağada tərtib etdiyi zici-Elxani istifadə olunmuşdu. Deyəsən, dünyada yeddi-səkkizdən artıq rəsədxana olmamışdır. Bunlardan birini xəlifə Məmun tikdirmişdir və zici-Məmuni burada tərtib edilmişdir. Bitlimus da bir rəsədxana tikdirmişdir. Hindistanda racə Bikerməcit Hindu zamanında bugün Mandu adıyla tanınan Malva dövlətindəki Ücceyn və Deharda bir rəsədxana var. Hindlərin Hindistanda bugün də istifadə etdikləri zic budur. Bu rəsədxananın tikilməsindən bəri **(47 a)** 1584 il keçmişdir və bu zic digər ziclərə görə daha naqisdir.

[Uluğ bəy] Kuhək təpəsinin qərb tərəfindəki ətəyində Baği-meydan adlı bir bağ və bu bağın ortasında Çihil sütun dedikləri böyük bir bina tikdirmişdir. İki qatlı və sütunları tamamilə daşdan olan bu binanın dörd küncündə minarəyə bənzər dörd bürc tikilmişdir. Üst qata bu qüllələrdən çıxılır. Digər yerlərdə daş sütunlar vardır. Bunların bəziləri büklümlü, bəziləri ho-

---

[1] *Zic:* yaxud *zeyr:* əskidən ulduzların yerlərini və hərəkətlərini göstərmək üçün hazırlanmış cədvəl, kataloq.

luqludur. Üst mərtəbənin dörd tərəfi eyvanlı olub sütunları daşdır və ortasında dörd qapılı bir otaq vardır. Binanın kürsüsünü başdan-başa daşlarla döşəmişlər.

Binadan Kuhək təpəsinə doğru getdikdə təpənin ətəyində bir bağ da saldırmışdır. Orada da böyük bir saray inşa etdirmiş və onun içinə taxt olaraq böyük bir daş qoydurmuşdur, uzunluğu təxminən on dörd-on beş, eni yeddi-səkkiz, yüksəkliyi isə bir karidir. Bu böyük daşı xeyli uzaq bir yerdən gətirmişlər. Ortasında bir çat vardır və deyilənə görə, bu çat daş buraya gətirildikdən sonra yaranmışdır. Bu bağda dörd qapılı otaq da **(47 b)** tikilmişdir. Divarları tamamən çini olduğundan ona çinixana deyirlər. Xüsusi adamlar göndərərək bunları Çindən gətirtmişdir.

Səmərqənd qalasının içində Məscidi-ləkləkə deyilən qədim bir bina var. Bunun ortasında yerə ayaqla vuduqda «lək-lək» deyə əks-səda gəlir. Bu, qəribə bir şeydir və sirrini heç kim bilmir.

Sultan Əhməd Mirzə zamanında da bəylər çox bağ və bağça saldılar. Bunlardan Dərviş Məhəmməd Tarxanın çarbağı qədər səfalı, havalı və geniş mənzərəli yer az tapılar. Baği-meydanın bir az aşağısındakı bir yüksəkliyin üstündə Külbə çayırına baxan bir çarbağ daha salınmışdır ki, bütün çayır ayaq altındadır. Burada torpağı qat-qat düzəldərək gözəl qaraağaclar, bəyaz sərvlər və söyüdlər əkmişlər. Çox gözəl bir yerdir. Yeganə qüsuru böyük bir çayının olmamasıdır.

Səmərqənd şəhəri fövqəladə dərəcədə abad şəhərdir. Bu şəhərin digər şəhərlərdə olmayan bir özəlliyi də vardır. Burada hər əsnafın ayrı birər bazarı vardır və beləcə, bir-birləri ilə qarışmırlar. Buna daim əməl edirlər. Yaxşı çörəkçiləri və aşxanaları vardır. Dünyada ən yaxşı kağız Səmərqənddə istehsal olunur, cüvaz kağızı deyilən bu növ kağızın bütün materialı Kani-Gildən gəlir. Kani-Gil isə Qara su kənarındadır. **(48 a)** bu Qara suya abi-rəhmət də deyirlər. Səmərqəndin qırmızı qədifə qumaşı hər tərəfə ixraç edilir. Ətrafında gözəl çayır-çəmənlər vardır. Ünlü çayırlarından biri Səmərqənd şəhərinin şərqində və bir az cənuba doğru bir ağac məsafədəki Kani-Gil çayırıdır. Abi-rəhmət də dedikləri Qara su Kani-Gilin ortasından axır. Yeddi-səkkiz dəyirman işlədəcək qədər suyu vardır[1]. Çayın ətrafı tamamilə bataqlıqdır. Bu çayırın əsl adı Kani-Abgirinişdir, lakin tarixlərdə daim Kani-Gil deyə yazırlar. Çox gözəl bir çayırdır. Səmərqənd sultanları bu çayırı iqamətgah edir və hər il buraya çıxıb bir-iki ay yaşayırlar.

Bu çayırın bir az yuxarısında, cənub-şərqə doğru Xan Yurdu adında bir çayır da vardır. Səmərqəndin şərqində şəhərdən bir ağac məsafədədir. Qara Su bu çayırın içindən keçərək Kani-Gilə gedir. Bu Qara Su Xan Yurdunda elə bir şəkildə qıvrılır ki, meydana gətirdiyi çıxıntı (toqqay[2]) içində

---

[1] *Dəyirman suyu:* axan suların miqdarını ölçmək üçün işlənən bir təbir.
[2] *Toqqay:* çayın qıvrılması nəticəsində yaranan çıxıntıya verilən ad.

bir ordu enəcək qədər yer var. Buranın çıxış ağzı çox dardır və bu yerin əlverişli olduğunu görərərək Səmərqənd mühasirəsi zamanı bir neçə dəfə burada oturmuşdum. Digər çayırlardan biri olan **(48 b)** Bödənə (bildirçin) qoruğu da Dilgüşa bağı ilə Səmərqənd arasındadır. Göli-Məğaq çayırı isə Səmərqəndin bir az şimalına doğru və iki ağac qədər qərb tərəfindədir. Bura da gözəl bir çayırdır və bir tərəfində böyük bir göl olduğu üçün oraya Göli-Məğaq çayırı da deyilir. Səmərqəndi mühasirə edəndə mən Xan Yurdunda oturduğum zaman bu çayıra da Sultan Əli Mirzə yerləşmişdi.

Çayırlarından biri də Külbə çayırıdır. Bu çayır digərlərinə nəzərən daha kiçıkdir. Şimalında Külbə kəndi və Kuhək çayı, cənubunda Baği-Meydan və Dərviş Tarxanın çarbağı, şərqində isə Kuhək təpəsi yerləşir.

Səmərqəndin gözəl vilayətləri və tümənləri vardır. Ən geniş vilayəti Səmərqəndin tayı olan Buxaradır. Səmərqəndin qərbində və ona iyirmi beş ağac məsafədə yerləşir.

Buxaranın da bir neçə tüməni[1] vardır. Şəhər çox gözəldir. Meyvəsi bol və gözəl olur. Qovunu fövqəladə yaxşı olur. Mavəraünnəhrin heç harasında Buxarada olduğu qədər bol və yaxşı qovun tapılmaz. Gərçi Fərqanə vilayətində Axsinin mir-teymuri adlanan qovunu buranınkından daha ləzzətli və daha gözəldir, lakin Buxarada hər növ qovun bol və yaxşıdır. Buxaranm əriyi də məşhurdur. Buxara əriyi kimi ərik heç bir yerdə tapımaz. Qabığını soyub qurudur və nadir mal kimi vilayətdən **(49 a)** vilayətə göndərirlər. Mülayimət [bağırsaq yumşaqlığı] üçün fövqəladə yaxşı bir dərmandır. Quşu, toyuğu və qazı çoxdur. Mavəraünnəhrdə Buxara şərablarından daha qüvvətli şərab tapılmaz. Mən Səmərqənddə işki içdiyim ilk vaxtlarda Buxara şərablarını içirdim.

Keş vilayəti Səmərqəndin cənubunda, doqquz ağac məsafədədir. Səmərqənd ilə Keş arasında İtmək Dabanı adlı bir dağ vardır. Yontma üçün işlənən daşları bu dağdan gətirirlər. Baharda ova və şəhərin hər yeri çox gözəl bir yaşıllığa büründügü üçün oraya Şəhrisəbz [Yaşil Şəhər] də deyirlər.

Teymur bəy Keşdə doğulduğuna görə bu şəhəri paytaxt etməyə çalışırdı. Keşdə böyük binalar tikdirdi. Divan qurmaq üçün özünə böyük bir qalereya, sağ və sol tərəfinə tavaçı[2] bəyləri ilə divan bəylərinin oturması üçün bir az kiçık iki qalereya da tikdirmişdir. Bir də ərizəçilərin oturması üçün bu divanxananın bir tərəfinə kiçık otaqlar inşa etdirmişdir. Bu qədər böyük qalereya dünyada az tapılar və Kisri qalereyasından daha böyük olduğu söylənir.

Bundan başqa, Keşə bir mədrəsə və bir də mavzoley tikdirmişdir. Cahangir Mirzənin və digər bəzi övladlarının qəbrləri **(49 b)** oradadır. Amma Keşin şəhər kimi inkişaf qabiliyyəti Səmərqənd qədər olmadığı üçün Tey-

---

[1] *Tümən:* bir neçə mənası vardır: qəza (rayon), bölgə, on min, pul vahidi.

[2] *Tavaçı:* qoşunda intizamı təmin edən, komandanın əmrlərini çatdıran subay.

mur bəy paytaxt olaraq Səmərqəndi seçmişdir.

Qarşı vilayətinə Nəsəf və Nəxşəb də deyirlər. Qarşı moğolca bir söz olub məzar deməkdir. Ehtimal ki, bu ad buraya Çingiz xan istilasından sonra verilmişdir. Suyu azdır, baharı yaxşı keçir, əkini və qovunu yaxşı olur. Səmərqəndin cənubunda və bir qədər də qərbə doğru on səkkiz ağac məsafədədir. Yalnız qılquyruq[1] dedikləri və bağrı-qaraya[2] bənzər bir quş vardır ki, Qarşı vilayətində lap çoxdur, o tərəflərdə ona mürğaki-Qarşı [Qarşı quşu] deyirlər.

Vilayətlərindən biri də Xüzar, digəri isə Kərminə olub Səmərqəndlə Buxara arasındadırlar. Digər vilayətlərlə müqayisədə suyu ən bol vilayət olan Qara göl isə Buxaranın şimal-qərbində və yeddi ağac məsafədədir.

Səmərqəndin gözəl tümənləri də vardır, eynən Soğd və ona yaxın digər tümənlər kimi. Yar-yaylaqdan başlayaraq Buxaraya qədər kənd və məmurə olmayan tək bir ağaçlıq məsafə belə yoxdur. Bura elə məşhurdur ki, Teymur bəy: «Mənim bir bağım var ki, uzunluğu otuz ağacdır» demiş və bunu deyərkən də bu tümənləri nəzərdə tutmuşdur.

Bu tümənlərdən biri olan Şavdar Səmərqənd şəhərinə və onun dış məhəllələrinə bitişikdir. Çox yaxşı bir tüməndir. Bir tərəfində Səmərqənd ilə Şəhrisəbz arasındakı dağ **(50 a)** yerləşir. Kəndlərinin çoxu bu dağın ətəyindədir. Bir tərəfində də Kuhək çayı vardır. Havası xoş, səfalı, suyu bol, meyvəsi çox və fövqəladə gözəl bir tüməndir. Misiri və Şamı görən səyyahlar buraya bənzəyən başqa bir yer görmədiklərini söyləyirlər.

Səmərqəndin bunlardan başqa tümənləri də vardır, lakin onlar yuxarıda bəhs edilənlər qədər [diqqətəlayiq] deyildir. Bu qədərlə kifayətləndik.

Teymur bəy Səmərqəndin idarəsini [ən böyük oğlu] Cahangir Mirzəyə vermişdi və Cahangir Mirzənin ölümündən sonra onun böyük oğlu Məhəmməd Sultan Mirzəyə verdi. [Daha sonra isə Teymur bəyin oğlu] Şahrux Mirzə bütün Mavəraünnəhr vilayətini böyük oğlu Uluğ bəy Mirzəyə vermişdi.

Uluğ bəy Mirzədən isə oğlu Əbdüllətif Mirzə aldı. Bu beş günlük fani dünya üçün elə danişmənd və ixtiyar atasını şəhid etdi.

Uluğ bəy Mirzənin ölüm tarixi bu şəkildə zəbt edilmişdir:

Uluğ bəy ki, bəhri-ülumi-xirəd
Ki, dünyə vü dinra əzu bud poşt,
Zi Abbas şəhdi-şəhadət çəşid,
Şodəş hərfi-tarix «Abbas koşt»[3].

*Uluğ bəy elmin və ağlın dənizi,*
*Dünya və dinin dəstəyi idi,*

---

[1] *Qılquyruq:* çox incə quyruqlu bir cins ördək, yabani toyuq, qır kəkliyi, fazan.
[2] *Bağrı-qara:* quşun rənginə görə verilən bir sıfət olub sonra quşun adı yerinə keçmişdir.
[3] «Abbas kuşt» sözlərinin əbcəd hesabı ilə cəmi hicri tarixlə 853-cü il (=1449/50) edir.

*Abbasdan şəhadət balını daddı,*
*(Abbas tərəfindən öldürüldü).*
*Tarixi «Abbas öldürdü» oldu.*

Gərçi Əbdüllətif Mirzə də beş-altı-aydan artıq səltənət sürmədi. Necə ki bu məşhur beytdə söylənmişdir:

Pədərküş padşahira nəşayəd,
Əgər şayəd bə şeş mahəş nəpayəd.
*Atasını öldürən padşahlığa yaraşmaz,*
*Əgər olsa belə, altı aydan çox səltənət sürməz.*

Onun ölüm tarixi də bu şəkildə zəbt edilmişdir:

Əblüllətif kisrəvi-Cəmşid fər ki bud,
Dər silki-bəndəqanəş Fəridun ü Zərdixuşt,
Baba Hüseyn kuşt şəbi-cüməəş bə tir,
Tarixəş in nəvis ki «Baba Hüseyn kuşt»[1].

*Əbdüllətif Cəmşid kimi həşmətli bir padşahdı,* **(50 b)**
*Firidun və Zərdüşd onun bəndələri arasındaydı.*
*Baba Hüseyn cümə gecəsi onu oxla öldürdü.*
*Tarixini belə yaz: «Baba Hüseyn öldürdü».*

Əbdüllətif Mirzədən sonra Səmərqənd taxtına Şahrux Mirzənin nəvəsi, İbrahim Sultan Mirzənin oğlu və Uluğ bəy Mirzənin kürəkəni olan Abdullah Mirzə keçdi. Bir il yarım-iki il qədər padşahlıq etdi.

Ondan sonra iqdidarı [Şahruxun böyük qardaşı Miranşahın böyük oğlu] Sultan Əbu Səid Mirzə ələ aldı və özü hələ sağ ikən böyük oğlu Sultan Əhməd Mirzəyə verdi. Beləliklə, Sultan Əbu Səid Mirzənin ölümündən sonra Sultan Əhməd Mirzə padşahlıq etdi.

Sultan Əhməd Mirzənin ölümündən sonra Səmərqənd taxtına [qardaşı] Sultan Mahmud Mirzə oturdu. Sultan Mahmud Mirzədən sonra isə [oğlu] Baysunqur Mirzəni padşah etdilər. Tarxanlar üsyanları zamanı Baysunqur Mirzəni həbs edərək, kiçık qardaşı Sultan Əli Mirzəni bir-iki gün üçün taxta keçirdilər. Bu kitabda göstərildiyi kimi, Baysunqur Mirzə taxtı təkrar əldə etdi və Baysunqur Mirzədən də mən aldım. Digər keyfiyyətlər isə bundan sonrakı vəqayede bildiriləcəkdir.

## BABURUN SƏMƏRQƏND TAXTINA ÇIXMASINDAN SONRA YARANAN QARIŞIQLIQ

Səmərqənd taxtına oturduqdan sonra, Səmərqənd bəylərinə əvvəllər olduğu kimi yenə də inayət elədim. Bizimlə olan bəylərə də mövqe vələya-

[1] «Baba Hüseyn kuşt» sözlərinin əbcəd hesabı ilə cəmi hicri tarixlə 854-cü il (=1450/51) edir.

qətlərinə görə **(51 a)** ehsan və iltifat göstərdim. Sultan Əhməd Tənbələ isə digərlərindən daha artıq iltifat edildi, içki bəyləri zümrəsində ikən böyük bəylər cərgəsinə keçirildi.

Səmərqəndi yeddi ay mühasirə edib böyük çətinliklərlə almışdıq və Tənbəl bizə qoşulan zaman əsgərin əlinə bəzi qənimətər keçmişdi. Bu arada Səmərqənd dışında bütün digər vilayətlər də mənim, ya da Sultan Əli Mirzənin idarəsinə öz istəkləri ilə girmişdilər. Bu üzdən də zatən bizə tabe olmuş vilayətlər yağmalana bilməzdi. Üstəlik, o günə qədər çox ağır bir yağmaya uğramış bu vilayətlərdən hər hansı bir şey almaq mümkün də deyildi. Əsgərin qəniməti tükəndi. Səmərqəndi alarkən şəhər o qədər xarab bir vəziyyətdə idi ki, hələ bir müddət yardıma, toxuma və özünə gəlməyə möhtac idi, insan oradan necə bir şey ala bilərdi. Bu üzdən əsgər çox sıxıntı çəkdi. Biz də onlara bir şey verə bilmədik. Evləri üçün də darıxdılar və beləliklə, tək-tək, iki-iki qaçmağa başladılar, ilk qaçan adam Xanqulu Bəyanqulu, ardından İbrahim Bəycik [Tağayi] oldu. Moğollar tamamən qaçdılar. Sonra isə Sultan Əhməd Tənbəl belə qaçdı.

Bu iğtişaşın yatışdırılması üçün Xoca [Mövlana] qazını göndərdik. Uzun Həsən **(51 b)** xoca ilə olduqca səmimiydi və ona güvənirdi. Xoca [Mövlana] qazı Uzun Həsənlə birlikdə bu qaçanların bir qismini cəzalandıracaq və bir qismini də bizim yanımıza göndərəcəkdi. Lakin bu iğtişaşa səbəbiyyət verən və buradan qaçıb gedənləri pisliyə sövq edən adam, sən demə, nankor Uzun Həsənin elə özü imiş. Sultan Əhməd Tənbəlin oraya getməsi ilə hamısının yamanlıqları üzə çıxdı.

Səmərqəndi ələ keçirmək üçün neçə ildir durmadan qoşun çəkirdik. Gərçi [moğol xanı və Baburun dayısı] Sultan Mahmud xanın, hər zaman olduğu kimi, yenə heç bir köməyi dəyməmişdi, amma buna baxmayaraq Səmərqəndin fəthindən sonra Əndicanı istəyirdi. Bu əsnada qoşunun böyük bir qismi və moğollarm hamısı qaçıb Əndicana və Axsiyə getmişdi. Uzun Həsən ilə Tənbəl isə o vilayətlərin [Baburun qardaşı] Cahangir Mirzəyə verilməsini istədilər. Lakin bu vilayətlərin ona verilməsi bir çox səbəbdən mümkün deyildi. Səbəblərdən biri bu idi ki, bu haqda daha əvvəl verilmiş bir söz olmamasına baxmayaraq həmin vilayətləri xan istəyirdi. İndi xan istədiyi halda, bu vilayətləri qalxıb Cahangir Mirzəyə versək, xan ilə bütün münasibətlərimiz pozulardı. İkinci səbəb də o idi ki, bunlar oraları əsgərin qaçaraq o vilayətə getdiyi əsnada və təzyiq yolu ilə istəyirdilər. Əgər daha öncə **(52 a)** arada belə bir şey qərarlaşdırılmış olsaydı, bəlkə də ola bilərdi. Amma onların təzyiqinə kim boyun əyər ki?

Moğollar və Əndican əsgərləri, bəylərin və içkilərin bir bölümü də Əndicana getmiş, Səmərqənddə mənimlə birlikdə yaxşı-pis minə yaxın adam qalmışdı. İstədiklərini ala bilməyən Uzun Həsən və Tənbəl qaçıb gedən və yersiz qorxulara qapılan adamları da özlərinə qoşdular ki, bu qor-

xaqlar onsuz da Allahdan belə bir şey istəyirdilər. Beləliklə, Uzun Həsən və Tənbəl Axsi üzərindən Əndicana qoşun çəkərək öz pislik və düşmənliklərini açıq şəkildə biruzə verdilər.

Tulun Xoca barin [əşirətinin] ən cəsur və qazax igidlərindən biri idi. Atam Ömər Şeyx Mirzə ona həmişə diqqət və qayğı göstərmişdi, mən də yetişdirib bəy eləmişdim. Fövqəladə cəsur və qazax bir igid idi, hər cür iltifata layiq idi. Moğollar arasında hörmət və etimad edilən adamımız o idi. Moğol ulusu Səmərqənddən qaçmağa başlayanda əsgərlərə nəsihət edib yersiz qorxuları onların ürəklərindən çıxarmasrı və onları təhlükədən qoruması üçün Tulun Xocanı göndərmişdik. **(52 b)** Lakin bu fitnəçi və nankor adamlar əsgərləri o hala gətirmişdilər ki, vəd, nəsihət və təhdid heç bir fayda vermirdi.

Tulun Xocanın köçü Ribatək-Örçünü deyilən iki su arasında idi. Uzun Həsən ilə Sultan Əhməd Tənbəl Tulun Xocanın üzərinə bir dəstə axınçı göndərdilər və onu qəfil ovlayaraq ələ keçirib öldürdülər. Sonra da Uzun Həsən və Tənbəl Cahangiri də yanlarına alaraq gəlib Əndicanı mühasirə etdilər.

## UZUN HƏSƏN VƏ ƏHMƏD TƏNBƏLİN ƏNDİCANI MÜHASİRƏYƏ ALMASI

[Səmərqəndi mühasirə üçün] hərəkətə keçdiyimiz zaman Əndicanda Əli Dost Tağayini, Axsidə isə Uzun Həsəni qoymuşdum. Daha sonra Xoca [Mövlana] qazı da [Əndicana] getmişdi. Səmərqənddən gedən əsgərdən də xeyli igid vardı. Xoca [Mövlana] qazı mühasirənin başlanğıc günlərində mənə olan hörmət və ilgisi dolayısıyla on səkkiz min qoyununu kurqandakı igidlərə və bizimlə olan igidlərin köçlərinə payladı.

Mühasirənin davam etdiyi günlərdə anamdan, Xoca qazıdan və oradakı camaatdan sürəkli olaraq bu məzmunda məktublar gəlirdi: «Bizi elə bir mühasirə etmişlər ki, gəlib qurtarmasanız, axırımız pis olacaq. Səmərqənd Əndicanın qüvvəsiylə alınmışdır. **(53 a)** Əgər Əndican əldə qalsa və Allah da rast gətirsə, Səmərqəndi ələ keçirmək hər zaman mümkün olar». Bu kimi məktublar bir-birini təqib etdi.

O vaxtlar bir dəfə xəstələnmiş və təkrar yaxşılaşmışdım. Lakin özümə baxmadığım üçün xəstəliyim təkrarlandı. Özü də bu dəfə çox fəna xəstələndim və elə oldu ki, dörd gün qədər dilim tutuldu. Ağzıma pambıqla su damızdırırdılar. Mənimlə birlikdə qalan bəylər və igidlər sağalmağımdan ümidlərini kəsərək öz əndişələri ilə uğraşmaya başladılar. Belə bir zamanda bəylər yanlış hərəkət etdilər və elçi sifətilə gəlib fəsad sözlər gətirən Uzun Həsənin adamına məni göstərib sonra da getməsinə izin verdilər. Dörd-beş gün sonra bir az yaxşılaşdım, lakin dilimdə hələ bir ağırlıq qalmışdı. Bir neçə gün sonra tamamən özümə gəldim.

Anamgilin, yəni anam və nənəm İsən Dövlət bəyimin, eləcə də usta-

dım və pirim olan Xoca Mövlana qazı da belə məktublar yazıb bu qədər israr edincə, insan buna qarşı dura bilərmi? Rəcəb ayının [=1498 mart] şənbə günü Əndicana getmək üzrə Səmərqənddən çıxdıq. Bu dəfə **(53 b)** Səmərqənd şəhərində yüz gün padşahlıq etmişdim.

Yenə bir şənbə günü Xocəndə çatdım. Kimsə o gün mənə Əndicandan gələn xəbərləri çatdırarkən Əli Dost Tağayinin Əndican qalasını tam yeddi gün öncə, yəni bizim Səmərqənddən çıxdığımız şənbə günü müxaliflərə təslim etdiyini söylədi.

Təfsilat belədir: xəstə yatdığım günlərdə Uzun Həsənin adamına məni göstərmiş, sonra isə getməsinə izin vermişdilər. Müxaliflər də Əndican kurqanının mühasirəsi zamanı gedib «Padşahın dili tutulmuşdur; ağzına pambıqla su damızdırırlar» demiş və bunu Əli Dostun hüzurunda and içərək təkrarlamışlar. Əli Dost o əsnada Xaqan qapısında imiş, bunu eşidincə iradəsi pozulmuş, müxalifləri dəvət edib qarşılıqlı müqavilə ilə qalanı onlara təslim etmişdir. Halbuki kurqanda ərzaq və döyüşçü kifayət qədərdi. Bu, yalnızca o münafiq, nankor və səfil adamın cəsarətsizliyi idi, ona söylənən sözləri bəhanə etmişdi.

Əndicanı aldıqdan sonra mənim Xocəndə gəldiyimi eşidərək Mövlana qazını ərk qapısında və şərəfsiz bir şəkildə asıb şəhid etdilər.

Xoca **(54 a)** Mövlana qazı əsl adı Abdullah olmasına baxmayaraq bu adla tanınmışdır. Nəsəbi ata tərəfdən Şeyx Bürhanəddin Qılınca, ana tərəfdən isə Sultan İlig Maziyə çatır. Fərqanə vilayətində bu ailədən olanlar imam, şeyxülislam və qazı olaraq gəlmişlər. Xoca qazı isə Xoca Übeydullah həzrətlərinin müridi idi və onu o yetişdirmişdi. Xoca qazının vəli olmasına heç bir şübhəm yoxdur. Çünki onun canına qıyanlardan çox qısa bir müddət içində heç bir əsər və əlamət qalmadı. Onun vəliliyinə bundan daha yaxşı bir dəlil olaraq nə göstərilə bilər ki? Xoca qazı qəribə bir adam idi, əsla qorxmazdı. Onun qədər cəsur adam görünməmişdir. Bu özəllik də bir vəlilik dəlilidir. Başqa biri nə qədər cəsur olsa, da bir az təlaşa və yersiz qorxuya qapıla bilər. Xocada nə təlaş, nə də yersiz qorxular əsla yox idi.

Xocanın ölümündən sonra onun nökər və çakərini, aymaq və adamlarının hamısını ələ keçirib mallarını yağmaladılar.

Əndican qurtarmaq istərkən Səmərqəndi əldən çıxarmışdım və Əndican da əldən getmişdi. Biz «Qafil əz inca randə və əz anca mandə» («Qafil buradan sürülmüş, oradan da məhrum olmuş») deyilənə bənzədik. Bu mənə çox ağır gəldi, çünki padşah olduğumdan bəri adamlarımdan və vilayətdən **(54 b)** bu cürə ayrılmamışdım. Özümü biləndən bəri bu qədər iztirab və məşəqqət çəkməmişdim.

Xocəndə çatanda bəzi münafiqlər Xəlifəni [Nizaməddin Əli Barlas] mənim yanımda görmək istəmədilər. Məhəmməd Hüseyn Mirzə və bəziləri o qədər cəhd elədilər ki, axırda Xəlifənin Daşkəndə getməsinə izin verdim.

Qasım bəyi də Daşkəndə [Sultan Mahmud] xanın hüzuruna göndərib ondan Əndican üzərinə qoşun çəkməyi xahiş etdim. Xan da qoşun çəkərək Ahəngəran vadisindən gəlib Kəndirli keçidinin dibinə çatan vaxt mən də Xocənddən gəlib xan dayımı gördüm. Kəndirli keçidini aşaraq Axsi tərəfə endik. O tərəfdən müxaliflər də mövcud qüvvələrini toplayıb Axsi üzərinə gəldilər.

Bu arada Bab kurqanındakılar mənim tərəfimi tutaraq kurqanı qapatdılar, lakin xanın bir az ləng tərpənməsi üzündən müxaliflər Bab kurqanını zorlayıb aldılar. Xanın əxlaqı və xasiyyəti yaxşı idi, lakin sipahilik və sərkərdəlik işindən heç başı çıxmırdı. Vəziyyət bu dərəcəyə gəldiyi əsnada ən çoxu bir mənzil daha yürüsəydi müharibə belə etmədən vilayət bizim olacaqdı. Amma xan belə bir zamanda müxaliflərin hiyləli sözlərinə və sülh haqqında nağılına qulaq verib **(55 a)** Xoca Əbülməkarim ilə birlikdə o zaman xanın eşik ağası və Tənbəlin böyük qardaşı olan Bəy Tilbəni elçi olaraq göndərdi. Müxaliflər də özərini qurtarmaq üçün bir neçə doğru və yalan sözlər söyləyib xana və aradakılara pul və rüşvət qəbul etdirdilər. Xan da beləcə geri döndü.

Bəylər, içkilər və igidlərdən mənimlə qalanların çoxunun köçləri Əndicanda idi. Əndicanı almaqdan ümidlərini kəsdikləri üçün bəylərdən və igidlərdən yeddi-səkkiz yüz adam məndən tamamən ayrıldılar. Ayrılan bəylər Əli Dərviş Bəy, Əli Məzid Koçin, Məhəmməd Bakir bəy, Şeyx Abdullah eşik-ağa və Mirim Lağari idi. Mənimlə birlikdə qalıb qürbəti və möhnəti seçənlər isə təxminən iki yüzdən bir az artıq və üç yüzdən bir az əskikdi. Qalan bəylər Qasım Koçin, Veys Lağari bəy, İbrahim Saru Minqli bəy, Şirim (Mirim) Tağayi və Seydi (Seyid) Qara bəylər; içkilərdən Mirşah Koçin, Seyid Qasım eşik-aga Cəlayir, Qasım Əcəb, Məhəmməd Dost Əli Dost Tağayi, Məhəmməd Əli Mübəşşir (münşi), Xudaverdi Tuğçu Moğol, Yarək Tağayi, Sultanqulu Babaqulu, Mir Veys, Şeyx Veys, **(55 b)** Yar Əli Bilal, Qasım Miraxur və Heydər riqabdar idi. Bu halət mənə çox ağır gəldi və əlimdə olmadan ağladım.

Oradan Xocəndə gəldim. Mənimlə qalanların bir qisminin köçləri ilə birlikdə anamı və nənəmi də Xocəndə mənim yanıma göndərdilər.

O il ramazanı [=1498 aprel-may] Xocənddə keçirdik. Sonra da Sultan Mahmud xana adam göndərib kömək istəyərək Səmərqənd üzərinə hərəkət etdim. Oğlu Sultan Məhəmməd Xanikə ilə Əhməd bəyi dörd-beş min əsgərlə Səmərqənd üstünə göndərən xanın özü də hərəkət edərək Ura-Təpəyə qədər gəldi. Orada xan ilə görüşdükdən sonra Yar-yaylaq yoluyla Səmərqənd üzərinə hərəkət etdim. Sultan Məhəmməd Sultan və Əhməd bəy isə başqa bir yoldan gələrək Yar-yaylağa məndən əvvəl çatmışdılar. Bürkə yaylağı üzərindən keçərək buranın darğasının mərkəzi Səngzara gəldim. Amma Sultan Məhəmməd Sultan ilə Əhməd bəy Şeybani xanın Şiraza və ətrafına hücum etdiyini

eşidib geri dönmüşlər. Bu üzdən mən də Xocəndə qayıtmağa məcbur oldum.

Madam ki səltənət davası və mülk əldə etmək məqsədi vardı, bir-iki dəfə iş uğursuz alındı deyə bundan vaz keçib qarşıdan baxmaq olmazdı. Əndican üzərinə xan ilə birlikdə yürüməyi düşünərək, ondan kömək istəmək üçün Daşkəndə **(56 a)** getdim. Şah bəyimi və qohumları görməyəli səkkiz il olmuşdu. Bu münasibətlə onları da görmüş oldum. Bir neçə gün sonra yeddi-səkkiz yüzə qədər əsgərlə birlikdə Seyid Məhəmməd Mirzə Duğlat, Əyyüb Bəycik və Can Həsən Barinə bizə kömək etmək tapşırıldı. Bu köməkçi qüvvəni alıb Xocənddə durmadan sürətli bir yürüşlə Kəndi-Badamın sağından keçib Xocənddən on, Kəndi-Badamdan üç ağac məsafədə olan Nəsux kurqanına gəldik. Gecə nərdivan qoyub basqınla kurqanı aldıq.

Qovun mövsümü idi. Nəsuxda İsmail şeyxi deyilən bir qovun növü yetişir ki, qabığı sarı, çəkirdəyi az və mükəmməl bir qovundur. Çəkirdəyi alma çəkirdəyi qədər olur. İçi dörd barmaq qədərdir və qayət ləzzətlidir. O civarda başqa bir yerdə buna bənzər bir qovun yoxdur. Amma ertəsi sabah moğol bəyləri adamlarının az olduğunu və bir kurqanı ələ keçirməklə işin yürüməyəcəyini söylədilər. Gerçəkdən də elə idi. Orada qalıb kurqanı gücləndirmə imkanı olmadığı üçün təkrar Xocəndə gəldik.

## XOSROV ŞAH VƏ BAYSUNQUR MİRZƏNİN HİSARI SULTAN MƏSUD MİRZƏDƏN ALMASI

Bu il Xosrov şahla Baysunqur Mirzə birlikdə qoşun çəkərək Çağanyana gəldilər və oranı hiylə ilə ələ keçirdilər. Sonra da Sultan Məsud Mirzəyə elçi göndərərək **(56 b)** «Birlikdə Səmərqənd hücum edək, Səmərqəndi ala bilsək, qoy bir mirzə Səmərqənddə, digər mirzə isə Hisarda otursun» deyə təklif etdilər.

Sultan Məsud Mirzənin bəyləri, içkiləri və igidləri arasında məmnuniyyətsizlik vardı. Bunun səbəbi bu idi: Şeyx Abdullah Barlas Baysunqur Mirzənin yanından ayrılaraq Sultan Məsud Mirzənin yanına gedəndə Mirzənin qaynatası olduğu üçün çox böyük inayət görmüşdü. Hisar kiçık bir vilayət olsa da, min tümən fülus[1] ülufə təyin edib Xutlan vilayətini ona vermişdi. Xutlan vilayətində Sultan Məsud Mirzənin bir çox bəylərinin və içkilərinin əraziləri vardı. Şeyx Abdullah bunların hamısını əlinə keçirdi, bütün eşik ixtiyarlığını özü və oğulları əllərinə aldılar. İnciyənlər də qaçıb Baysunqur Mirzənin yanına gəlməyə başlamışdı.

Bu hiyləgər təkliflə Sultan Məsud Mirzəni aldadan Xosrov şah və Baysunqur Çağanyandan yürüyərək irəliləyib sübh çağı Hisar kurqanını mühasirəyə aldılar. Sultan Məsud Mirzə kurqanın dış məhəllələrində, atasının tikdirdiyi Dövlət Saray adlı bir sarayda idi. Kurqana girə bilməyərək qaçdı

[1] *Fülus:* mis pul, bir təngənin dörddə biri. Maaşlar və bəxşişlər fülusla ifadə edilirdi.

və Şeyx Abdullah Barlas ilə birlikdə Xutlan tərəfinə çəkildi. Yarı yolda Şeyx Abdullah Barlastan ayrılaraq Uyaç keçidindən keçib Sultan Hüseyn Mirzənin yanına getdi. **(57 a)**

Hisar vilayəti alındıqdan sonra Xosrov şah Baysunqur Mirzəni Hisarda qoyub Xutlanı da kiçık qardaşı Vəliyə verdi. Özü də bir neçə gün sonra mühasirə niyyəti ilə Bəlx üzərinə yürüdü. Hərəkətindən bir az öncə Nəzər Bahadır adlı böyük bir adamını üç-dörd min əsgərlə birlikdə Bəlx civarına göndərmişdi və üç-dörd gün sonra Baysunqur Mirzəni də yanına alaraq Bəlxi mühasirə etdi. Bəlxdə [Sultan Hüseyn Mirzənin oğlu] İbrahim Hüseyn Mirzə və Sultan Hüseyn Mirzənin bəylərindən də xeyli adam vardı.

Xosrov şah kiçık qardaşı Vəlini də xeyli əsgərlə birlikdə Şaburqanı mühasirə edib o tərəfləri yağmalaması üçün göndərmişdi. Amma Vəli Şaburqanı yaxından mühasirə etmədi və əlindəki qüvvələri Zərdək çölündəki əhaliyə axın etməyə göndərdi. Bunlar Zərdək çölünə axın edib yüz mindən artıq qoyun və üç minə yaxın dəvə gətirdilər. Vəli ondan sonra Sançarıq vilayətinə hücum edib bölgəni yağmalayaraq dağdakı bəzi bərkidilmiş yerləri ələ keçirdi, sonra gəlib Bəlxdə böyük qardaşına qoşuldu.

Bəlxi mühasirədə saxlayan Xosrov şah bir gün yuxarıda bəhs edilən Nəzər Bahadır adlı adamını Bəlxin su yollarını kəsmək üçün göndərdi. Amma Sultan Hüseyn [Bayqara] Mirzənin sevimli bəylərindən Tanrıverdi **(57 b)** Samançı bəy yetmiş-səksən igidlə içəridən çıxıb Nəzər Bahadırla qarşılaşdı və başını kəsib qalaya qayıtdı, fövqəladə cəsuranə hərəkət edərək böyük bir iş gördü.

## SULTAN HÜSEYN MİRZƏYƏ QARŞI ÜSYANLAR

Həmin il Sultan Hüseyn Mirzə də Zünnun bəy Arğun və oğlu Şah Şücanın dəf edilməsi üçün qoşun çəkib Büstə getmişdi. Çünki Zünnun bəy Arğun Bədiüzzaman Mirzənin xidmətinə girib ona qızını vermiş və oğlu Şah Şüca ilə fitnə və fəsadla uğraşmağa başlamışdılar. Büstü mühasirə edən Sultan Hüseyn Mirzə qoşuna heç bir yerdən ərzaq təmin edə bilmədi, amma aclıqdan çox sıxıntı çəkməyə başladıqları zaman Büst valisi kurqanı təslim etdi və Büstdəki mövcud ərzala Xorasana qayıda bildi.

Sultan Hüseyn Mirzə kimi böyük bir padşah, bu qədər sursat və təmtəraqla Qunduz, Hisar və Qəndəhar üzərinə bir neçə dəfə qoşun çəkdiyi halda zəbt edə bilmədən geri döndüyü üçün oğulları və bəyləri bundan cəsarət alaraq düşmənçilik yaratmağa və fitnə çıxarmağa başladılar.

O yaz Sultan Hüseyn Mirzə Əstərabada müsəllət olaraq şər işlərlə məşğul olan oğlu Məhəmməd Hüseyn Mirzənin dəf edilməsi üçün Məhəmməd Vəli komandanlığı altında bəzi bəyləri xeyli əsgərlə birlikdə axınçı olaraq göndərmiş və özü də Nişin çayırında qalmışdı. Bədiüzzaman Mirzə ilə Zünnunun [bəy

Arğun] oğlu Şah İŞüca] bəy **(58 a)** qəfildən qoşun çəkərək Sultan Hüseyn Mirzənin üzərinə gəldilər. Bu arada Sultan Məsud Mirzə də Hisarı müdafiə edə bilməyərək təslim etmək məcburiyyətində qalmışdı və Sultan Hüseyn Mirzənin yanına gəlirdi, xoş bir təsadüf əsəri olaraq, tam o gün yetişdi. Eyni zamanda Əstərabada gedən əsgər də gəlib eyni gün Mirzəyə qoşuldu. Qarşı-qarşıya gələndə Bədiüzzaman Mirzə ilə Şah bəy savaşmadan qaçıb getdilər.

Sultan Hüseyn Mirzə Sultan Məsud Mirzəni yaxşı qəbul etdi, onu özünə kürəkən edərək inayət və şəfqət göstərdi. Bu arada Xosrov şahın kiçık qardaşı Baqi Çağanyani də bu hadisədən bir az öncə gəlib Sultan Hüseyn Mirzənin xidmətinə girmişdi. Onun fitnələri üzündən Sultan Məsud Mirzə Xorasanda durmadı, Sultan Hüseyn Mirzədən izin belə almadan bir bəhanə ilə Xosrov şahın yanına getdi.

Xosrov şah Baysunqur Mirzəni də Hisardan çağırıb gətirdi. Bu əsnada Miranşah Mirzə də atası Uluğ bəy Mirzə ilə düşmən olub Həzarəyə girmiş, lakin pis hərəkətləri üzündən orada qala bilməmiş və o da Xosrov şahın yanına gəlmişdi.

Bəzi dargörüşlülər bu şahzadələrin hər üçünü də öldürərək Xosrov şah adına xütbə oxutmaq fikrində idi. Lakin Xosrov şah bunu uyğun görmədi. Bu səfil və nankor adam kiçıkliyindən bəri böyüdüb bəy-atəkəsi olduğu Sultan Məsud **(58 b)** Mirzəni tutub bu beş günlük dünya üçün -ki, ona vəfa qılmadığı kimi, heç kimə də vəfası olmayacaqdır- gözlərinə mil çəkərək kor elədi.

Bir neçə südqardaşı, arxadaşı və sınanmış adamı Sultan Məsud Mirzəni alıb Səmərqəndə, Sultan Əli Mirzənin yanına götürmək niyyətilə Keşə getdilər. Amma oradakıların da pis niyyətdə olduqlarını gördülər, Keşdən qaçaraq Çarcu keçidindən aşıb Sultan Hüseyn Mirzənin yanına gəldilər.

Belə çirkin hərəkət edənlərə və bu cür işlərlə uğraşanlara qiyamətə qədər yüz min dəfə lənət olsun. Xosrov şahın bu hərəkətindən xəbərdar olanlar ona lənət oxusunlar və bunu duyub da lənət oxumayanlar da lənətə tuş olsunlar.

Xosrov şah bu çirkin hərəkətindən sonra Baysunqur Mirzəni padşah edib Hisara getməsinə izin verdi. Seyid Kamili Miranşah Mirzəyə köməkçi qoşub onu da Bamyan tərəfinə göndərdi.

## FƏRQANƏ - 904 (19 AVQUST 1498 – 8 AVQUST 1499)

## DOQQUZ YÜZ DÖRDÜNCÜ İLİN HADİSƏLƏRİ

Səmərqəndə və Əndicana dəfələrlə yürüş etsək də, bundan heç bir nəticə hasil olmadı. Təkrar Xocəndə qayıtdıq. Xocənd kiçık bir yerdir, yüz-iki yüz əsgəri olan bir adamın vaxtı burada sıxıntı **(59 a)** içində keçər. Lakin iddiası olan bir adam necə sakit dura bilər?

## BABURUN XOCƏNDDƏN PƏŞAĞARA GETMƏSİ

Məhəmməd Hüseyn Gürgan Duğlat Ura-Təpədə idi. Səmərqənd üzərinə yürümək niyyətilə onun yanına adamlar göndərib sözləşdik. Yar-yaylaq kəndlərindən olan Pəşağarı bu qışı orada qalmaq və Səmərqənd vilayətinə mümkün olduğu qədər hücum edə bilmək üçün müvəqqəti olaraq bizə verməsini Məhəmməd Hüseyndən istədik. Bu kənd Xoca həzrətlərinə aid olan kəndlərdən idi, amma bu qarışıqlıqda ona keçmişdi. Məhəmməd Hüseyn Duğlat buna razı oldu.

Xocənddən Pəşağara hərəkət etdim. Zaminə yaxınlaşanda qızdırmaya tutuldum. Buna baxmayaraq Zamindən hərəkət edib sürətlə dağ yolundan Ribati-Xoca üzərinə gəldim. Niyyətim qəfil basqın edərək nərdivanlarla çıxıb Şavdar tüməninin mərkəzi olan Ribati-Xoca kurqanını ələ keçirmək idi. Sübh çağı oraya gəldik. Lakin əhalisi xəbərdar oldu, biz də təkrar dönüb heç bir yerdə dayanmadan birbaş Pəşağara gəldik. Qızdırmalı olduğum halda on üç-on dörd ağac yolu güclə və məşəqqətlə qət etdim.

Bir neçə gün sonra Yar-yaylaq kurqanlarını sözlə və ya zorla ələ keçirmək üçün bir neçə içki bəyləri və igidlərlə birlikdə İbrahim Saru, Veys Lağari və Şirim Tağayini axınçı təyin etdik. O zamanlarda **(59 b)** Yar-yaylaq Seyid Yusif bəydə idi. Mən Səmərqənddən çıxdığım zaman o orada qalmış və Sultan Əli Mirzə də ona inayət etmiş, nəticədə Seyid Yusif bəy [Oğlaqçı] Yar-yaylaq kurqanlarının ələ keçirilib idarə edilməsi üçün kiçık qardaşını və oğlunu göndərmişdi. Biz yenidən hərəkətə keçəndə Siyal-qutun idarəsini əlində tutan Əhməd Yusif də o kurqanlarda idi. Bizim bəylər və igidlər də gedib bütün qış uğraşaraq bəzi kurqanları sülh yolu ilə, bəzilərini də savaşaraq zəbt etdilər, bəzilərini isə hiylə və biclikl ələ keçirdilər. O vilayətlərdə moğollar və özbəklər üzündən kurqanı olmayan heç bir kənd yoxdur. O əsnada [Sultan Əli Mirzə] bizim üzümüzdən Seyid Yusif bəy ilə kiçık qardaşından və oğlundan şübhələnərək onların Xorasana getmələrinə izin verdi.

Qış belə təlaş və mücadilə ilə keçdi. Yaz gəlincə barışmaq üçün Xoca Yəhyanı göndərdilər. Özləri isə [Sultan Əli Mirzə] əsgərin təşviqiylə Şiraz və Kabüd civarına gəldi. Bizim mövcud sipahimiz iki yüzdən artıq, üç

yüzdən azdı və hər tərəfdə qüvvətli düşmənlər vardı. Əndican üzərinə səfərlərimizdə də tale bizə yar olmadı və Səmərqəndə əl uzatmaqdan da heç bir nəticə çıxmadı. Məcburən sülhə bənzər bir şey bağlandı və Pəşağardan **(60 a)** geri qayıtdıq.

Xocənd kiçık bir yerdir. Bir bəyin həyatı orada sıxıntıyla keçər. İl yarımdır adamlarımız və ailələrimizlə oradaydıq. Bu müddət ərzində oradakı müsəlmanlar imkan daxilində xərac verməkdə və xidmətdə qüsur etmədilər. Oraya təkrar nə üzlə getmək olar və oraya gedən insan nə edə bilərdi?

Varmağa nə məskən müyəssər,
Durmağa nə dövlət müqərrər.

Axırda belə tərəddüdlər içində Ura-Təpənin cənubundakı yaylalara getdik. Öz halımıza şaşmış bir vəziyyətdə gedəcək və qalacaq bir yer bilmədən bir neçə günü o civarda avara keçirdik. Orada ikən bir gün bizim kimi vətənindən sürülərək şaşqın bir halda olan Xoca Əbülməkarim məni görməyə gəldi. Haraya gedəcəyimizi və nə edəcəyimizi soruşdurub mütəəssir oldu və halımıza acıyaraq dua edib getdi. Bu mənə çox təsir etdi.

## BABURUN MƏRGİNANI YENİDƏN ƏLƏ KEÇİRMƏSİ

O gün ikindi namazı vaxtında dərənin aşağı tərəfindən bir atlı göründü. Əli Dost Tağayinin Yulçuq adlı adamı imiş və bu xəbərlə göndərilmişdi: «Gərçi mənim tərəfimdən çox böyük günahlar işləndi, lakin ümid etdiyim kimi inayət edib günahlarımı bağışlayaraq **(60 b)** buraya gəlsə, Mərginanı təslim edərək ona elə bir qulluq və xidmətkarlıq edəcəyəm ki, günahım təmizlənib utancım keçsin».

Bu qədər şaşqın bir halda olduğum əsnada belə bir xəbər gəldiyinə görə heç əndişələnmədən və dayanmadan gün batarkən iti bir yürüşlə dərhal Mərginana doğru hərəkət etdim. Ora ilə Mərginanın arası təxminən iyirmi dörd-iyirmi beş ağaclıq bir yoldur. O gecə sabaha və ertəsi gün günorta namazına qədər heç bir yerdə durmadan yürüdük. Günorta namazı vaxtında Xocəndin Tənük-ab adlı kəndinə endik. Atlar dincini alıb yemləndikdən sonra gecə yarısı nağara vaxtında Tənük-abdan hərəkət etdik. O gecə sabaha və ertəsi gün günəş batıncaya qədər və ondan sonra gələn gecə boyunca yol getdik.

Sabahdan bir az əvvəl Mərginandan bir ağac məsafəyə gələndə Veys bəy ilə bir neçə adam tərəddüd edərək dedi: «Əli Dost necə pisliklər etmiş bir adamdır. Arada bir-iki dəfə elçi gedib-gəlmədən, danışıq, əhd və şərt olmadan ona necə etimad edə bilərik?» Gerçəkdən də tərəddüdləri yersiz deyildi. Bir az durduq və vəziyyəti müzakirə etdik. Axırda buna qərar verdik: «Gərçi bu tərəddüdlər yerindədir, lakin **(6l a)** bunu daha əvvəl düşünmək gərəkdi. Üç gün-üç gecə durub-dincəlmədən iyirmi dörd-iyirmi beş ağac yol

yürüdük. Artıq nə adamlarda, nə də atlarda taqət qalmışdır. Buradan necə qayıdaq, qayıtsaq belə hara gedək. Bu qədər gəldikdən sonra gedəcəyimiz yerə varmaq lazımdır. Heç bir şey Tanrının təqdirindən başqa şəkildə ola bilməz». Belə qərar verib qədərimizə razı olaraq yolumuza davam etdik.

Sübh namazı vaxtında Mərginan kurqanının qapısına gəldim. Əli Dost Tağayi qapının arxasında duraraq qapını açmadan əhd istədi. Əhd və şərtdən sonra qapını açıb qapı arasında bağlılığını bildirdi. Əli Dostu gördükdən sonra kurqanın içində uyğun bir yerə endim. Mənimlə birlikdə olanlar böyük-kiçık iki yüz qırx adamdı.

Uzun Həsən və Sultan Əhməd Tənbəl vilayət əhalisinə çox zülm və pis rəftar etmişdilər. Vilayət əhalisinin hamısı məni istəyirdi. Mərginana gəlişimizdən iki-üç gün sonra Qasım bəy, pəşağarlılar, yeni nökər[1] olanlar və Əli Dost bəyin adamlarından yüz nəfər Əndicanın cənub tərəfindəki dağ qəbilələrindən **(61 b)** aşpariyan, turuq-şaran, çəgrək və bütün o civara bu camaatı xoşluqla və ya zorla itaətə gətirmələri üçün göndərildi. İbrahim Saru, Veys Lağari və Seydi Qara da yüz nəfərə yaxın bir qüvvə ilə Xocənd çayını keçərək o tərəfdəki kurqanlarla dağ xalqlarını, nə şəkildə olursa-olsun, bizə tabe etmək üçün Axsi tərəfinə göndərildi.

Bir neçə gün sonra yanlarına [Baburun kiçık qardaşı] Cahangir Mirzəni də alan Uzun Həsən ilə Sultan Əhməd Tənbəl əlindəki sipahiləri və moğolları toplayıb Əndican və Axsinin əsgər ola biləcək adamlarını yığaraq, Mərginanı mühasirə məqsədilə Mərginanın bir şəri şərqində yerləşən Sapan adlı kəndə endilər. Bir-iki gün sonra da qüvvələrini qaydaya salıb Mərginanın məhəllələrinə gəldilər.

Qasım bəy, İbrahim Saru və Veys Lağari komandanlığı altında olan qüvvələr iki tərəfə göndərilmiş olduğu üçün mənim yanımda çox az qüvvə qalmışdı. Buna baxmayaraq igidlər qüvvələrini qaydaya salaraq qarşı çıxdılar və düşməni məhəllələrdən daha irərli buraxmadılar. O gün Xəlil Çöhrə dəstar-piç cəsur hərəkət etdi və çox şücaət göstərdi. Düşmənlər gəlib heç bir şey edə bilmədilər və bir daha **(62 a)** da kurqana yaxınlaşmadılar.

Qasım bəy Əndicanın güney dağlarına getmişdi. Aşpariyan, turuq-şaran, çəgrək ilə o civarın dağlarında və ovalarında oturan əhali tamamən bizim hakimiyyətimiz altına girdi. [Düşmən tərəfindəki] sipahilər də bir-bir, iki-iki qaçıb bizə qoşulmağa başladılar. İbrahim Saru və Veys Lağarinin başçılığı altında olanlarsa Axsi tərəfinə gedib çayın qarşı sahilinə keçmişdilər. Bab kurqanı və daha bir-iki kurqan bizə keçdi.

Uzun Həsən ilə Tənbəl zalım, fasiq və kafir adamlardı. Vilayət əhalisi bunlardan çox zülm görmüşdü. Axsinin böyüklərindən olan Həsən Dikcə ilə adamları, oranın bəzi alt təbəqəsi də üsyan edərək şəhərin dış kurqanında

---

[1] *Nökər:* birinin əmri altına girərək onun xidmətində və məiyyətində olan, sıravi əsgərdən başlayaraq bəyə qədər çeşidli dərəcəli hərbi və mülki adamlar üçün işlənən termin.

olanları ərkə sığınmağa məcbur elədilər, sonra İbrahim Saru, Veys Lagarı, Seydi Qara başçılığı altıında olan qüvvələrimizi Axsinin dış kurqanına çağırdılar.

[Baburun dayısı] Sultan Mahmud (Məhəmməd) xan Heydər Göyəldaşın oğlu Bəndə Əli və bu sıralarda Şeybani xandan qaçıb xanın yanına gəlmiş olan Hacı Qazi Manqıtı barın tümən bəyləri ilə birlikdə bizə köməkçi təyin etmişdi. Onlar da tam bu əsnada gəldilər.

Uzun Həsən bundan xəbər tutub çox dilxor oldu və güvəndiyi (62 b) nökərləri ilə ən yaxşı igidlərini kömək üçün Axsi ərkinə göndərdi. Bunlar səhər vaxtı çay kənarına çatdılar. Bizim əsgərlə moğol əsgəri bunu xəbər alıb bir qisim adamları yalın atla sudan keçirdilər. Köməyəa gələnlər şaşıraraq, gəmini yuxarıya doğru çəkə bilməyib olduğu yerdə buraxdılar. Gəmilər kurqan tərəfinə keçmədən aşağı getdi. Bizim əsgərlə moğol əsgəri hər tərəfdən yalın atla suya girməyə başladı. Gəmidə olanlar vuruşa bilmədi. [Uzun Həsənin adamlarından] Qarluğaç Bəxşi moğolların bəy oğullarından birini çəkib əlindən tutaraq qılıncla öldürdü. Lakin artıq iş işdən keçmişdi. Gəmidəkilərin çoxunun ölümünə onun bu hərəkəti səbəb oldu və suda olanların hamısını yaxalayıb doğradılar. Qarluğaç Bəxşi, Xəlil Divanə və Qazı Qulam Uzun Həsənin seçkin adamlarından idi. Bunlardan yalnız Qazı Qulam qulluq bəhanəsi ilə qurtula bildi. Digər seçkin igidlərindən olan Heydərqulu, Qulikə Kaşğari və bugün mənim yanımda da etibarlı olan Seyid Əli [xan] qurtuldular. Yetmiş-səksən seçkin igiddən yalnızca beş-altısı **(63 a)** qurtula bildi.

Düşmən bu xəbəri eşidincə Mərginan civarında qala bilməyib nizamsız halda Əndicana doğru köç etdi. Bunlar Əndicanda Uzun Həsənin yeznəsi Nasir bəyi qoymuşdular. Nasir bəy onun adamları arasında ikinci olmasa da, mütləq üçüncü dərəcədə təcrübəli, cəsur bir adam idi. Bu işləri öyrənincə Əndican kurqanını bağladıb artıq onların məğlub olmağa üz tutduqlarını bildirərək mənə adam göndərdi.

Uzun Həsən Əndicana gələndə kurqanın bağlandığını öyrəndi və yeznəsi ilə dil taba bilməyib köçünün olduğu Axsi tərəfə çəkildi. Sultan Əhməd Tənbəl isə öz vilayəti olan Oşa getdi. Cahangir Mirzənin içkilərindən və igidlərindən bir neçəsi Uzun Həsənin yanından qaçdılar və Tənbəl Oşa çatmadan gedib ona qoşuldular.

## BABURUN ƏNDİCANI YENİDƏN ƏLƏ KEÇİRMƏSİ

Əndicanın düşmənin üzünə bağlandığı xəbəri gələndə Mərginandan günəş doğarkən dərhal hərəkət edərək günorta vaxtı Əndicana çatdım. Nasir bəyi, oğulları Dost bəy ilə Mirim [Nasir] bəyləri gördüm. Xatirlərini soruşdum, inayət və şəfqət göstərdim. İki il vardı ki, ata vilayəti əldən çıxmışdı

**(63 b)**, ancaq 904-cü ilin zilqədə ayında [=1499 iyun-iyul] tanrı təalanın inayəti ilə təkrar geri aldıq.

Sultan Əhməd Tənbəl isə Cahangir Mirzə ilə birlikdə Oşa doğru çəkilmişdi. Oşa girincə orada da xalq ona qarşı üsyan edərək onu Oşdan qovdu və kurqanı bizim üçün qoruyaraq bizə adam göndərdi. Cahangir Mirzə ilə Tənbəl öz tərəfdarlarından bir neçə adamla birlikdə şaşqın bir halda gedib Özgəndə girdilər.

Uzun Həsən də Əndicana girə bilməyincə Axsi tərəfinə getmişdi və Axsi ərkinə girdiyi xəbəri gəldi. Bütün bu fitnələrin başı Uzun Həsən olduğu üçün bu xəbər gələn kimi Əndicanda dörd-beş gündən artıq qalmayaraq Axsiyə hərəkət etdik. Oraya çatanda çarəsiz qalıb aman dilədi və əhd edib kurqanı təhvil verdi.

Bir neçə gün Axsidə qaldım. Axsi, Kasan və o yurdun işlərini sahmanlayıb köməyə gələn moğol bəylərinə izin verdikdən sonra Uzun Həsəni köçü və adamları ilə birlikdə alaraq Əndicana gəldik. Axsinin idarəsini müvəqqəti olaraq Qasım Əcəbə verdim. O, əvvəlcə içki dərəcəsində idi, sonra mənim yanımda bəylik dərəcəsinə yüksəlmişdi.

Uzun Həsənlə əhd bağlandığı üçün canına və malına zərər və ziyan vurulmadan Qara Təkin yoluyla Hisar tərəfinə **(64 a)** getməsinə izin verildi. Bir neçə adamıyla Hisara getdi. Qalan adamları isə ondan aynlaraq yanımızda qaldılar. O qarışıq günlərdə bizim və Xoca [Mövlana] qazının adamlarını ələ keçirib soyan şəxşlər bunlar idi. Bəzi bəylərlə görüşüldükdən sonra bunlar haqqında bu qərar verildi: «Bütün bu fəsad və fitnələri çıxaran, bizə tabe bunca mömini və müsəlmanı tutub soyanlar bunlardır. Öz bəylərinə nə vəfa etdilər ki, bizə nə sədaqət göstərsinlər. Bunları yaxalayıb mallarını zəbt etdirsək nə olar? Bunların gözümüzün önündə, bizim atlarımıza minib bizim paltarımızı geyib bizim yeməyimizi yemələrinə kim dözə bilər. Onları yaxalayıb mallarını əllərindən almaq yerinə onlara mərhəmət etsək, yalnızca qazaxlıqlarda və möhnətlərdə bizimlə birlikdə olanların mallarını geri almalarına izin versək, bu qədərlə qurtula bildiklərinə şükr etmələri lazımdır».

Nəticədə bu qərar çox məqbul göründü və bu adamların yalnızca özlərinə aid əşyaları almaları əmr edildi. Gərçi bu qərar məqbul və doğru olsa belə bir az tələsik verilmişdi. Cahangir Mirzə kimi bir düşmən yaxınımızda ikən bu adamları **(64 b)** bu şəkildə ürkütməyin heç bir mənası yoxdu. Məmləkətlər alıb idarə edərkən bəzi işlər görünüşdə məqbul və doğru görünə bilər, lakin qərarların üzərində yüz min dəfə diqqətlə düşünmək lazımdır, yaxşı düşünmədən verdiyimiz bu qərardan çox qarışıqlıq və fitnələr çıxar. Nəticədə Əndicandan ikinci dəfə çıxmamıza düşünmədən verdiyimiz bu qərar səbəb oldu. Bu üzdən də moğollar öz aralarında qarışıqlıq yaradıb qorxuya qapıldılar və iki su arası dedikləri Ribatək-Örçümdən Özgənd tərəflərinə köç edərək Tənbələ adam göndərdilər.

Anamın yanında min beş yüz-iki minə yaxın moğol vardı. Həmzə Sultan, Mehdi Sultan və Məhəmməd Duğlat ilə birlikdə yenə bu miqdarda moğol da Hisardan gəlmişdi. Pislik və xaos daim moğol ulusundan törəmişdir. İndəyə qədər mənimlə beş dəfə düşmən oldular. Düşmən olmalarının səbəbi mənimlə dil tapa bilməmələri deyildi. Öz xanlarına qarşı da bir neçə dəfə eyni şəkildə hərəkət etmişdilər.

Bu xəbəri mənə Sultanqulu Çanaq gətirdi. Bu yaxınlarda vəfat edən atası Xudaverdi Buqaqa **(65 a)** moğollar içində çox hörmət etmişdim. O, moğollarla birlikdə olurdu. Öz xalqından və ulusundan ayrılaraq mənə bu xəbəri gətirdi. Gərçi bu dəfə yaxşı hərəkət etdi, lakin sonra elə qəbahətlərə yol verdi ki, bunun kimi yüz min xidmət eləsə də onu ört-basdır edə bilməzdi. Bu barədə sonra danışacağam. Sonradan etdiyi qəbahətlər də moğol olmasından qaynaqlanırdı.

Xəbər gəlincə bəyləri toplayıb vəziyyəti müzakirə etdik. Bəylər bunun əhəmiyyətsiz bir məsələ olduğu, padşahın səfərə çıxmasına gərək olmadığı və bütün bəylərin Qasım bəy komandanlığında hərəkət etməsinin kifayət olacağı fikrində həmrəy oldular. Buna qərar verildi. Bunu asan sandılar, lakin bu fikir yanlış imiş. O gün Qasım bəy bəyləri və əsgəri alıb yola çıxdı. Bunlar gedincəyə qədər Tənbəl də gəlib moğollara qoşulubmuş. Ertəsi gün sabah tezdən Aylamış çayının Yastı keçid adlı keçidini aşınca birdən-birə onlarla qarşılaşır və yaxşıca vuruşurlar. Qasım bəy Sultan Məhəmməd Arğun ilə şəxsən qarşılaşaraq iki-üç dəfə qılıncla vuruşduğu halda başa çıxa bilmir. Bir çox igidimiz qılıncla vuruşur, lakin axırda məğlub olurlar. **(65 b)**

Qasım bəy, Əli Dost Tağayi, İbrahim Saru, Veys Lağari və Seydi Qara ilə bəylərdən və içkilərdən üç-dörd adam qurtuldu. Digər bəy və içkilərin çoxu ələ keçdi. Əli Dərviş bəy, Mirim Lağari, Tuka bəy və [atası] Şirim bəy Tağayi, Məhəmməd Dost, Əli Dost, Mirşah Koçin və Mirim Divan da onların arasındaydı.

Bu müharibədə iki igid qılıncla gözəl vuruşdu. Bizim tərəfdən İbrahim Sarunun kiçık qardaşlarından Səməd adlı biri ilə qarşı tərəfdən Hisar moğollarından Şahsuvar adlı biri qarşılaşır. Şahsuvar elə bir vuruş vurur ki, qılınc dəbilqəni yararaq Səmədin başına işləyir. Səməd yaralı olmasına baxmayaraq Şahsuvarın başına elə bir zərbə endirir ki, qılınc Şahsuvarın başından ovuc qədər bir sümük parçasını alıb götürür. Şahsuvarın dəbilqəsi yox imiş, başını sarıdılar və yaxşı oldu. Səmədin başını sarıyacaq adam yox idi, üç-dörd gün sonra bu yaradan öldü.

Qazaxlıq və fəlakətlərdən qurtularaq vilayəti yenicə aldığımız bir əsnada gerçəkləşən bu məğlubiyyət çox vaxtsız oldu. Mənə böyük bir dəstək olan Qənbər Əli Moğul [Səllah] Əndican alındığı zaman vilayətinə getmiş olduğundan **(66 a)** burada yox idi. Vəziyyət belə ikən [Sultan Əhməd] Tənbəl də Cahangiri yanına alaraq Əndicanın bir şəri məsafəsində yerləşən Eyş

təpəsinin önündəki çayıra gəldi. Bir-iki dəfə Çihil Doxtəran üzərindən əsgərini düzərək Eyş təpəsinin ətəyinə qədər irəlilədi, ancaq bizim igidlər qüvvələrini bir araya gətirib məhəllə və bağların arxasına qədər irəliləyərək onlara qarşı çıxdıqları üçün daha artıq irəli gedə bilmədilər və təpənin ətəyindən geri qayıtdılar.

Tənbəl bu tərəfə gələndə ələ keçirdiyi bəylərdən Mirim Lağari ilə Tukayı öldürdü. Bir aya yaxın bu ətrafda oturdu, lakin heç bir iş edə bilmədən Oş tərəfinə qayıtdı. Oş İbrahim Saruya verilmişdi və orada onun adamı vardı. Oşu Tənbələ qarşı bağladılar.

## FƏRQANƏ - 905 (8 AVQUST 1499 - 28 İYUL 1500)

## DOQQUZ YÜZ BEŞİNCİ İLİN HADİSƏLƏRİ

Vilayətlərin atlı və piyada əsgərlərinə təcili xəbərçilər və tədarükçülər göndərildi. Qənbər Əliyə və öz vilayətlərinə getmiş olan əsgərlərə də xəbərçilər yollayıb qalxan, qazma, balta və əsgərin silahlandırılmasına lazım olan digər şeylər üçün tədbirli tədarükçülər təyin edildilər. Vilayətdən əsgər ola biləcək atlıları, piyadaları və hər tərəfə işlə bağlı getmiş olan adamları və sipahiləri toplayaraq Tanrıya təvəkküllə məhərrəm ayının **(66 b)** on səkkizində [=25 avqust 1499] Hafiz bəyin [Məhəmməd Dulday] çarbağına hərəkət etdim. Bir-iki gün çarbagda qalıb çatışmayan paltar və sursatı hazırlayıb tamamladıqdan sonra atlı və piyada əsgərin sağ qol, sol qol, mərkəz və önçü hissələrini düzənləyib səf halında Oş tərəfə müxaliflərin üstünə yürüdük.

Oşa yaxınlaşanda müxaliflərin o civarda dura bilməyərək oranın şimalında yerləşən Ribati-Sərhəng tərəfinə getdikləri xəbəri gəldi. O gecə Latkənd kəndinə endik. Sabah tezdən hərbi bir nizamla Oşdan keçərkən müxaliflərin Əndican tərəfinə getdiyini xəbər aldıq. Biz də Özgənd üzərinə yürüdük və bizdən öncə o civarı yağmalaması üçün axınçı göndərdik.

Əndicana getmiş olan müxaliflər ora çatıb gecə ikən xəndəyə girərək divarlara nərdivan qoyarkən kurqandakılar bunu eşidir, müxaliflər də heç bir şey edə bilmədən geri qayıdırlar. Bizim axınçılarımız da Oş civarını yağmalamaqla birlikdə ciddi bir şey ələ keçirmə bildən dönüb gəldilər.

## MADU KURQANININ ALINMASI

Oş vilayətinin kurqanlarından olan Madu kurqanı o zaman öz möhkəmliyi ilə məşhur idi. [Sultan Əhməd] Tənbəl kiçık qardaşı Xəlili iki yüz-iki yüz əlli adamla orada qoymuş **(67 a)** və Xəlil kurqanı bağlamışdı. Biz gəlib savaşaraq Madu kurqanını almağa çalışdıq.

Madu kurqanı çox sağlam bir kurqandır. Şimal tərəfində bir çay var. Kurqan olduqca yüksəkdə yerləşir. Çaydan ox atılırsa, bəlkə də divarına çatmaz. Su yolu da o tərəfdədir. Bu yolu kurqandan aşağıya doğru küçə şəklində iki tərəfinə divar tikərək nəhrə qədər gətirmişlər. Təpə tərəfləri xəndəkdir.

Çay yaxın olduğu üçün buradakı daşlardan qazan qədər böyük olanları alıb kurqana çıxarmışlar. Madu kurqanından o qədər böyük daşlar atdılar ki, bu qədər kurqan müharibəsi olduğu halda heç bir kurqandan belə daşlar atılmamışdır. Katda bəyin böyük qardaşı Əbdülqüddüs Kuhbər divarın dibinə qədər çıxmışdı. Divardan üzərinə o qədər daş atdılar ki, Əbdülqüddüs heç bir yerə toxunmadan havadan birbaşa uçaraq bu qədər yüksək yerdən kurqan bayırının dibinə qədər yuvarlana-yuvarlana gəldi. Lakin heç bir şey olmadı, dərhal atına minib getdi. Su yolunda Yarəli Bilala bir daş ataraq

başını partlatdılar. Bir çox adam bu daşlardan **(67 b)** öldü.

Sabah tezdən təkrar müharibəyə başlandı və günortada əvvəl su yolu alındı. Savaş axşama qədər davam etdi. Artıq su yolu alındığı üçün bir şey edə bilmədilər və ertəsi sabah aman diləyib kurqandan çıxdılar. Tənbəlin kiçık qardaşı Xəlilin dəstəsindəki yetmiş-səksən və ya yüz adam əsir edilərək, yaxşı mühafizə edilmələri üçün Əndicana göndərildi. Bizim də bəylərimiz, içkilərimiz və yaxşı adamlarımız onların əlinə düşmüşdü. Bu iş yaxşı oldu.

Madu alındıqdan sonra Oş kəndlərindən olan Ünçü-Töbə adlı yerə endik. Digər tərəfdən Tənbəl də Əndicandan dönərək Ribati-Sərhəng kəndlərindən Abi-Xan deyilən yerə gəldi. Bu iki ordunun arasındakı məsafə bir ağac idi. Bu arada Qənbər Əli xəstələnərək Oşa getdi. Bir ay və ya qırx gün qədər orada qaldıq, lakin müharibə olmadı. Yalnız bizim ərzaqçılarla onların ərzaqçılan arasında kiçık çarpışmalar baş verirdi.

Bu müddət ərzində gecələr ordugahın ətrafında çox yaxşı ehtiyat tərtibatı alındı: xəndəklər qazılır və xəndək olmayan yerlərə ağac qazıqlardan əngəllər qoyulur, mövcud sipahilər də tam silahlı olaraq xəndək kənarına çıxarlardı. **(68 a)** Bu qədər ehtiyatlı davrandığımız halda, hər üç-dörd gündə bir gecələr əsgərlər silah başına çağırılırdı.

Bir gün ərzaqçıların başında Seydi bəy Tağayi getmişdi. Düşmənin adamları üstün qüvvələrlə gələrək ani bir vuruşma əsnasında Seydi bəyi əsir aldılar.

## BAYSUNQUR MİRZƏNİN XOSROV ŞAH TƏRƏFİNDƏN ÖLDÜRÜLMƏSİ

Xosrov şah bu il Bəlx üzərinə yürümək düşüncəsi ilə Baysunqur Mirzəni çağırıb Qunduza gətirtdi və Bəlx üzərinə yürüdü. Uyaca gəldiklərində xain və kafir Xosrov şah səltənət davasıyla -belə insaniyyətsiz, hünərsiz, dəyərsiz, qorxaq, insafsız və ədalətsiz bir adama səltənət nəsib olarmı?- Baysunqur Mirzəni bəyləri ilə birlikdə həbs etdi və onu kirişlə boğdurub məhərrəm ayının onunda [=17 avqust 1499] bu xoş təbiətli, çox fəzilətli, dəyərli və əsil şahzadəni şəhid etdi. Bəylərini və içkilərindən bəzilərini də öldürdü.

## BAYSUNQUR MİRZƏ

**Doğumu və nəsəbi:** Baysunqur Mirzə 882-ci [=1477] ildə Hisar vilayətində doğulmuşdur. [Teymur bəyin nəvəsi Əbu Səid Mirzənin oğlu] Sultan Mahmud Mirzənin ikinci oğludur. Sultan Məsud Mirzədən kiçık, Sultan Əli Mirzə və Sultan Hüseyn ilə Xan Mirzə adıyla bilinən Sultan Veys Mirzədən böyük idi. Anası Pəşşə bəyim idi. **(68 b)**

**Şəkil və görkəmi:** böyük gözlü, yuvarlaq üzlü, orta boylu, türkmən

çöhrəli və gözəl bir igiddi.

**Əxlaqı və xasiyyəti:** adil, insaniyyətli, xoş təbiətlı və fəzilətli bir şahzadə idi. Ustadı Seyid Mahmud şiə olduğu üçün Baysunqur Mirzə də şiəliklə ittiham edilirdi. Sonradan anlatdıqlarına görə, Səmərqənddə bu pis etiqadı buraxaraq, təmiz etiqadlı (sünni) olmuşdur. Şəraba çox düşkündü, şərab içmədiyi vaxtlarda namaz qılardı. Cömərdliyi və ehsanı orta dərəcədə idi. Nəstəliq yazısını çox yaxşı yazırdı. Nəqqaşlıq qabiliyyəti də fəna deyildi. Şeiri də yaxşı söylərdi, təxəllüsü Adil idi. Şeiri divan tərtib edəcək qədər deyildi. Bu mətlə onundur:

Sayəvar əz natəvani cabəca miəftəm,
Gər nəgirəm ruyi-divari zi pa miəftəm.
*Zəifliyimdən kölgə kimi oraya-buraya düşürəm,*
*Əgər bir divar tapmasam yıxılaram.*

Səmərqənddə Baysunqur Mirzənin qəzəlləri o qədər yayılmışdı ki, Mirzənin şeirləri olmayan ev çox az idi.

**Meydan müharibələri:** iki meydan müharibəsi elədi. Birincisi Sultan Mahmud xan ilə elədiyi savaşdır. Taxta çıxdığı zaman [moğol xanı] Sultan Mahmud xan Sultan Cüneyd Barlas və digərlərinin öyrətməsiylə Səmərqəndi almaq **(69 a)** üçün qoşun çəkərək Ağ Kötəldən keçib Ribati-Soğd və Kənbay civarına gəlmişdi. Baysunqur Mirzə də Səmərqənddən ona qarşı çıxdı və Kənbayda vuruşaraq onu möhkəm məğlub etdi. Üç-dörd min moğolun başını kəsdirdi. Xanın işlərini idarə edən Heydər Göyəldaş bu savaşda öldü. İkinci dəfə isə Buxarada [qardaşı] Sultan Əli Mirzə ilə savaşdı və yenildi.

**Torpaqları:** atası Sultan Mahmud Mirzə ona Buxaranı vermişdi. Atasının ölümündən sonra atasının bəyləri toplanaraq onu ittifaqla Səmərqənddə padşah elan elədilər. Buxara da bir müddət onun divanına daxil idi, ancaq tarxanlarm üsyanından sonra əlindən çıxdı. Mən Səmərqəndi alanda Xosrov şaha sığındı, Xosrov şah da Hisarı alıb ona verdi.

Heç uşağı qalmadı. Xosrov şahın yanına gedəndə əmisi Sultan Xəlil Mirzənin qızı ilə evləndi. Ondan başqa qadını və cariyəsi yox idi. Özü yalnız başına səltənət sürmədiyi üçün heç kimi öz əliylə yetişdirib böyüdərək mötəbər bir bəy edə bilmədi. Bəyləri atasının və əmisinin **(69 b)** bəyləri idi.

Baysunqur Mirzənin ölümündən sonra Qoç bəyin atası Sultan Əhməd Qaravul, böyük və kiçık qardaşları köçləri və əqrəbaları ilə birlikdə Qara-Təkin vilayətindən çıxaraq bizim yanımıza gəldilər. Oşda xəstə olan Qənbər Əli də xəstəlikdən qalxıb gəlmişdi. Belə bir əsnada gözlənilməyən bir yardım olaraq, Sultan Əhməd Qaravulun adamları ilə birlikdə gəlib bizə qoşulmalarını uğur sayaraq, ertəsi sabah qüvvələrimizi düzənlədik və dərhal düşmən üzərinə yürüdük. Tənbəl isə Abi-Xanda müharibə etmədən yurdundan qalxıb getdi. Çadır, kilim və araba kimi bəzi əşyaları əsgərimizin əlinə keçdi. Biz də gəlib onun yurduna endik.

O axşam Tənbəl [Baburun qardaşı] Cahangiri də yanına alıb sağ tərəfimizə yönələrək Əndican yönündə və bizdən üç ağac məsafədə olan Xuban adlı kəndə gedib girdi. Ertəsi gün biz də sağ qol, sol qol, mərkəz və öncülərimizi müəyyən edib, dava paltarımızı geyib, səflərimizi düzənləyib, qalxanlı piyadaları qabağa sürüb düşmənin üzərinə yürüdük.

Bizim sağ qolda adamlarıyla birlikdə Əli Dost Tağayi, sol qolda isə İbrahim Saru, Veys Lağari, Seydi Qara, Məhəmməd Əli Mübəşşir (Münşi), Xoca **(70 a)** Kəlan bəyin böyük qardaşı Kiçık bəy və digər bəzi içkilər dururdular. Sultan Əhməd Qaravul və Qoç bəy böyük və kiçık qardaşları ilə birlikdə sol qolda dayanmışdılar. Qasım bəy [Koçin] mərkəzdə mənim yanımda idi. Öncü olaraq da Qənbər Əli və digər bəzi içkilər vardı.

Xubanın cənub-şərqində və ondan bir şəri məsafədə yerləşən Saka adlı kəndə varmışdıq, düşmən də adamlarını nizamlayaraq Xuban kəndindən bizə qarşı çıxdı. Biz daha sürətli yürüdük. Hər ehtimala qarşı qalxanlı piyadalar da düzənlənmişdi, lakin düşmənlə qarşılaşanda onlar çox geridə qalmışdılar. Allahın inayəti ilə onlara heç bir ehtiyac qalmadı.

Ordular qarşılaşınca ilk öncə bizim sol qoldakı adamlarımız onların sağ qolundakılarla çarpışdılar. Xoca Kəlan bəyin böyük qardaşı Kiçık bəy orada yaxşı qılınc çaldı. Ondan sonra Məhəmməd Əli Mübəşşir (Münşi) çarpışdı. Düşmən bu qədərlə yetinərək müqavimət göstərmədən qaçdı. Sağ qol və öncü birliklərimizə üz-üzə savaşma sırası gəlmədi. Bir çox igidlərini əsir edərək gətirdilər. Başlarının kəsilməsi əmr edildi.

Bizim bəylərdən Qasım bəy ilə Əli Dost, bilxassə Əli Dost artıq ehtiyatlı davranaraq təqib qüvvələrinin **(70 b)** uzağa göndərilməsini uyğun görmədilər və bu üzdən də adamların çoxu ələ keçirilə bilmədi. Biz də Xuban kəndinə endik. Bu mənim elədiyim ilk meydan müharibəsi idi. Tanrı təala öz fəzli və kərəmi ilə bizə zəfər nəsib etdi, bunu uğur saydıq.

Ertəsi gün sabah olar-olmaz anamın nənəsi Şah Sultan bəyim Əndicana gəldi. Niyyəti əgər Cahangir ələ düşmüşsə, rica edib onu qurtarmaq idi.

## ORDUNUN İKİ SU ARASI DEYİLƏN YERDƏ QIŞLAMASI

Qış yaxınlaşdığı üçün ovada ərzaq qalmamışdı. Bu üzdən də Özgənd üzərinə yürüməyi uyğun görməyərək Əndicana döndük. Bir neçə gün sonra danışıb buna qərar verildi: Əndicanda qışlamağımızdan düşmənə heç bir zərər və ziyan gəlməz. Bəlkə də oğurluq və qazaxlıq edərək daha da güclənər. Elə bir yerdə qışlamaq lazımdır ki, həm əsgər ərzaqsızlıqdan sıxıntıya düşməsin, həm də düşmən özünü mühasirə olunmuş kimi hiss etsin. Beləcə, iki su arası da dedikləri Ribatək-Örçümdə Ərmiyan və Nuşab civarında **(7l a)** qışlamaq niyyətilə Əndicandan bu kəndlərin civarına gəlib qışlaq düzəltdik.

Oralarda yaxşı ov yerləri var. Aylamış çayının yaxınındakı sıx ormanlarda maral və qaban çoxdur. Kolluqlarda qırqovul və dovşan boldur. Təpəli yerlərdə tülkü çoxdur və deşiklərdə olurlar. Bunlar digər yerlərdəkilərə nəzərən daha sürətlidirlər. Bu qışlaqda ikən hər iki-üç gündə bir ova çıxırdım. Böyük kolluqlarda dolaşıb maral ovlayırdıq, kiçık kolluqlarda dairə yaradaraq hərəkət edir, quş və oxla qırqovul ovlayırdıq. Buranın qırqovulu çox kök olur. Bizim o qışlaqda olduğumuz dönəmdə qırqovul əti çox bol idi.

Bu qışlaqda olduğumuz günlərdə təzəcə bəy rütbəsi verdiyim Xudaverdi Tuğçu iki-üç dəfə hücum edib Tənbəlin çapulçularını yendi və başlarını kəsib gətirdi. Əndican və Oş civarında da bizim çapulçu igidlərimiz hiylə ilə durmadan hücum edib düşmənin atlarını sürüb gətirir, adamlarını öldürürdülər. Əgər bütün qışı o qışlaqda keçirsək **(71 b)** düşmənin yaza qədər heç bir savaşa girmədən məğlub olma ehtimalı çox yüksək idi.

Tam bu şəkildə düşmənin qüvvəsini qırıb aciz hala saldığımız zaman Qənbər Əli vilayətinə getmək üçün izin istədi. Vəziyyəti nəzərə alaraq nə qədər mane olmağa çalışsaq da daha ziyadə cəhalət göstərdi. Qəribə yüngül və düşüncəsiz bir adam idi. İzin verməyə məcbur olduq. Əvvəlcə vilayəti Xocənddi. Əndican son dəfə alınanda İsfəra ilə Kəndi-Badam da ona verilmişdi. Bizim bəylər arasında ən çox vilayəti və ən çox adamı olan adam Qənbər Əli idi, heç kimin vilayəti və adamı onunku qədər deyildi.

Qırx-əlli gündür o qışlaqda idik. Qənbər Əliyə izin verldiyimiz üçün digər bəzi əsgərlərə də izin verdik. Ən axırda özümüz də Əndicana qayıtdıq.

## SULTAN MAHMUD XANIN ƏHMƏD TƏNBƏLƏ YARDIM GÖNDƏRMƏSİ

Qışlaqda və Əndicanda olduğumuz zaman Tənbəlin adamları durmadan Daşkəndə xanın hüzuruna gedib gəlirdilər. Xanın oğlu Sultan Məhəmmədin [Xanikə] bəy-atakəsi və xanın ən sevimli bəylərindən olan Əhməd bəy Tənbəlin doğma əmisi idı. Xanın eşik ağası olan Bəy Tilbə isə Tənbəlin doğma böyük qardaşı idi. Axırda Tənbələ yardım göndərməsi üçün xanı dilə tutdular. Hələ yardım gəlmədən **(72 a)** Bəy Tilbə köçünü və ailəsini Daşkənddə qoyub kiçık qardaşı Tənbələ qoşuldu. Bəy Tilbə anadan olandan bəri Moğolistandaydı və moğollar arasında böyümüşdü. Vilayətlərə girmir və vilayətlərin padşahlarına xidmət etmırdı; yalnız xanlara xidmət etmişdi.

Bu zaman qəribə bir hadisə oldu. Qasım Əcəb müvəqqəti olaraq Axsidə idi. Bir dəstə yağmacını təqib edərək onların arxalarından çıxıb Biçrata (Bxirata) üzərindən Xocənd çayını keçərkən təsadüfən Tənbəlin çoxsaylı bir dəstəsinə rast gəldi və ələ keçirildi.

Tənbəl bizim əsgərin dağılmış olduğunu eşidən kimi -zatən böyük qardaşı da xan ilə qərarlaşdıraraq gəlmiş və köməyin gələcəyi də bəlli ol-

muşdu- Özgənddən hərəkət edib iki su arasına gəldi. Bu əsnada Kasandan gələn xəbərlərə görə, xanın Tənbələ kömək üçün Əhməd bəylə birlikdə Sultanım deyə bilinən oğlu Sultan Məhəmməd Xanikəni göndərdiyi və onlara beş-altı min əsgər verdiyi anlaşıldı. Bunlar Arça-Kənd yoluyla gələrək Kasanı mühasirə etmişdilər.

Biz də uzaqdakı adamlarımızı gözləmədən mövcud adamlarımızla və qışın şiddətli soyuğunda Allaha təvəkkül edərək Əndicandan **(72 b)** qalxdıq və Bənd-Salar yoluyla dərhal Sultanım ilə Əhməd bəyin üzərinə hərəkət etdik: Gecə boyunca heç bir yerdə durmadan yürüyərək sabah tezdən Axsiyə endik. O axşam elə şiddətli soyuq vardı ki, bəzi adamların əl-ayağı dondu, bir çoxlarının da qulaqları alma kimi qabarmışdı. Axsidə də durmadıq və Qasım Əcəbin yerinə müvəqqəti olaraq Yarək Tağayini qoyub Kasan üzərinə yürüdük. Kasana bir şəri məsafə qalanda Əhməd bəyin gəlişimizi xəbər alaraq Sultanım ilə birlikdə nizamsız şəkildə dərhal geri qayıtdığı barədə xəbər gəldi.

Bu zaman Tənbəl bizim hərəkət etdiyimizi eşitmiş və qardaşına yardım üçün sürətlə gəlirmiş. Axşama doğru Tənbəlin qaraltısı Nevkənd tərəfdən göründü. Qardaşının belə asanca getməsinə və bizim də bu qədər çabuq gəlməmizə şaşırıb qaldı.

Biz «Bunu Allah belə rast gətirdi. Atları çox rulmuşdur. İndi üstünə yürüsək və Allah rast gətirsə, heç biri qurtulmaz» dedik. Amma Veys Lağari və bəziləri «Artıq çox gecdir. Bugün olmasa belə sabah **(73 a)** haraya gedərlər ki. Sabah tezdən harada olsa taparıq» dedilər və hücum etməyi uyğun görmədilər. Beləcə, qapıya qədər gələn düşmən heç bir zərərə uğramadan qurtuldu. «Qapıdakını qapmasan, qarıyıncaya qədər qayğırarsan (peşman olarsan)» deyə bir atasözü vardır.

Karha ra bavəqti bayəd cust,
Kari bevəqt süst başəd, süst![1]
*İşləri vaxtında görmək lazımdır,*
*Vaxtsız görülən iş süst olar,süst.*

Düşmən də bu fürsəti qənimət bilib gecə heç bir yerdə dayanmadan çəkilib sabaha qədər Ərxiyan kurqanına girmişdi. Ertəsi gün onların üstünə yürüdük, amma tapa bilmədik, arxalarından gedib Ərxiyan kurqanını yaxından mühasirəyə almağı da uyğun görmədik. Gəlib bir şəri məsafədəki Qəznə-Nəmənqana endik. Beləcə, otuz-qırx gün biz o yurdda, Tənbəl isə Ərxiyan kurqanında qaldı.

Əsgərlər kiçık birliklər halında oraya gedib və ya oradan gəlib ara yolda ox atışaraq geri dönürdülər. Bir dəfə düşmən gecə basqını təşkil elədi və ordugahın dışından bir az ox atıb geri qayıtdı. Ordugah ətrafında xəndək qazıb ağac maneələr qoymaq surətilə ehtiyat tədbirləri alınmışdı. Heç nə edə

[1] Sədi Şirazidən.

bilmədilər.

Biz bu yurdda ikən Qənbər Əli iki-üç dəfə **(73 b)** inciyərək vilayətinə getmək istədi. Hətta bir dəfə özbaşına hərəkətə keçib yola belə çıxmışdı. Bəzi bəyləri göndərərək çətinliklə geri qaytardıq.

Bu əsnada Seyid Yusif Məcəmi Sultan Əhməd Tənbələ adam göndərib onun tərəfinə keçdi. Əndicanın dağ ətəklərində Uyğur və Məcəm deyilən iki dağ ətəyi vardır. Seyid Yusif Məcəmi bunların rəislərindən idi. Sonralar qapımda tanıman[1] olmuşdu. İşi rəislikdən keçmişdi, bəylik iddiasındaydı, lakin heç kim onu bəy eləmirdi. Çox münafiq və səbatsız bir hərif idi. Əndicanı alandan bu tarixə qədər iki- üç dəfə mənə qatılaraq Tənbələ düşmən olduğu kimi, iki-üç dəfə də Tənbəllə birləşərək mənə düşmən olmuşdu. Son düşmənliyi də bu idi. Yanında xeyli el, ulus və aymaq vardı. Tənbələ qoşulmasın deyə yolda yaxalamaq üçün hərəkətə keçdik.

Ertəsi gün Bişxaran civarına gəldik. Lakin Bişxaran kurqanına Tənbəlin adamları girmişmiş. Bizim axınçı (ilqar) bəyləri Əli Dərviş bəy ilə böyük və kiçık qardaşlarıyla birlikdə Qoç bəy Bişxaran qapısında onlarla yaxşı döyüşdülər. Bunlar arasında böyük və kiçık qardaşları ilə birlikdə Qoç bəy **(74 a)** xüsusilə yaxşı döyüşdü; bir çox önəmli işi onlar gördü. Bişxaranın bir şəri məsafəsində yüksək bir yerə endik. Tənbəl də yanına Cahangiri alaraq Bişxaran kurqanının arxasına endi.

Üç-dörd gün sonra bizə müxalif bəylər -Əli Dost, Qənbər Əli Sallax ilə onlara tabe və birlikdə olanlar- sülh barədə danışmağa başladılar. Mənim, nə də mənə candan bağlı adamların bu sülh haqqında nə bilgiləri, nə də xəbərləri vardı və biz buna heç razı deyildik. Amma bu iki hərif bizim iki böyük bəyimiz olduğu üçün bunların sözünə qulaq asmayaraq sülh bağlamayacağımız təqdirdə onlardan nə desən gözləmək mümkündü.

Məcburən belə bir sülh bağlandı: Xocənd çayının Axsi tərəfindəki vilayətlər Cahangirə, Əndican tərəfindəki vilayətlərsə mənə aid olacaq, köçlərini götürdükdən sonra Ozgəndi bizim divana təhvil verəcəklər. Vilayətlər haqqında uzlaşılıb mənimlə Cahangir Mirzə arasında ittifaq bağlandıqdan sonra birlikdə Səmərqənd üzərinə yürüyəcəyik və Səmərqənd taxtı əldə edilincə, Əndican Cahangir Mirzəyə **(74 b)** veriləcəkdi. Bunlara qərar verildi. Cahangir ilə Tənbəl ertəsi sabah rəcəb ayının [=1500 fevral] sonlarında gəlib mənə bağlılıqlarını bildirdilər. Bu qərar üzərinə əhd və şərtlər bağlandı. Cahangir Mirzənin Axsi tərəfinə getməsinə izin verərək mən də Əndicana qayıtdım.

Əndicana gəldikdən sonra Tənbəlin kiçık qardaşı Xəlil və digər əsirlərin hamısı sərbəst buraxılaraq xələt geydirilib getmələrinə izin verildi. Onlar da öz tərəflərində əsir olan bəy və içkiləri, Tağayi bəy, Məhəmməd Dost,

[1] *Tanıman/tanımal:* hökmdar və ya idarə amirinin yanında öz qəbiləsini təmsil edən və qəbiləsinə ait xüsuslarda məsləhətçi olan adama verilən bir ünvan ola bilər.

Mirşah Koçin, Seydi bəy, Qasım Əcəb, Mir Veys və Mirim Divan başda olmaq üzərə sərbəst buraxıb göndərdilər.

Əndicana gəldikdən sonra Əli Dostun xasiyyəti tamamilə dəyişdi. Mənimlə birlikdə qazaxlıqlarda və çətinliklərdə olan adamlara pis rəftar etməyə başladı. Öncə Xəlifəni [Nizaməddin Əli Barlas] qovdu. Ondan sonra İbrahim Sarunu və Veys Lağarini günahsız və səbəbsiz yerə tutdurub mallarını yağmalatdırdı və vilayətlərindən uzaqlaşdırdı. Qasım bəylə də öcəşdi. Görünüşdə buna səbəb olaraq İbrahim və Xəlifənin Xoca [Mövlana] qazının tərəfdarları olduğunu və ondan intiqam almaq ehtimalının olduğunu söyləyirdi. Oğlu Məhəmməd Dost da özünü padşah kimi **(75 a)** aparırdı, söhbət, ziyafət, divan və ehtişamda sultanlar kimi hərəkət etməyə başlamışdı. Bunlar Tənbələ arxalanaraq belə hərəkət etdilər. Məndə isə onların bu məqbul olmayan hərəkətlərinin qarşısını alacaq güc yox idi. Tənbəl kimi bir düşmən bunları himayə etdiyi üçün canları nə istəsə eləyirdilər. Çox həssas bir dövr idi, etiraz etmə imkanı yoxdu. O günlərdə bu ata-oğulun zorbalığından çox əziyyət çəkdik.

## EVLİLİK VƏ İLK EŞQ

[Baburun əmisi] Sultan Əhməd Mirzənin Ayşə Sultan bəyim adlı qızını atam və əmim sağ ikən mənimlə nişanlamışdılar. Ayşə Sultan şaban ayında [=1500 mart] Xocəndə gələndə onunla evləndim, ilk zamanlarda ona olan sevgim pis deyildi. Amma bu ilk evlənməmdi. Həya və xəcalətimdən hər on-on beş və ya iyirmi gündə bir yanına gedirdim. Sonralar bu sevgim də qalmadı, amma utanmam arttı. Ayda və ya qırx gündə bir anam xanım məni azarlayaraq zorla onun yanına göndərirdi. O sıralarda **(75 b)** ordu bazarına mənsub bir adamın Baburi adında gözəl bir oğlu vardı.

Mən anqa (ona) qərib meyl peyda qıldım,
Bəlkəm anqa özümni zarü şeyda qıldım.

Ondan əvvəl heç kimsəyə qarşı meylli deyildim. Bəlkə sevgi və məhəbbət haqqında söylənənləri belə dinləməz və o barədə danışmazdım. O zamanlar tək-tük farsca beyt də söylərdim. Bu beyti o zaman söylədim:

Hiç kəs çon məni-xərabü eşqü rüsva məbad,
Hiç məhbubi çü tu birəhmü bipərva məbad.
*Heç kim mənim tək xarab, aşiq və rüsva olmasın,*
*Heç bir məhbub sənin tək rəhmsiz və pərvasız olmasın.*

Baburi bəzən yanıma gəlirdi. Lakin mən utandığımdan üzünə baxa bilməzdim, harda qala ki, onunla danışıb görüşəydim. Nəşə və həycanımdan gəldiyi üçün təşəkkür edə bilməzdim, o ki qala uzaqlaşmasından şikayət edəm. Söhbət təklif edə biləcək güc nə gəzirdi.

Bir gün bu sevgi və məhəbbət anlarında məiyyətimlə birlikdə küçədən

keçirdim; birdən-birə Baburi qarşıma çıxdı. Duyğulanaraq üstümə elə bir hal çökdü ki, az qala əriyəm. Mənim üçün ona doğru baxmaq və ya ona səslənmək **(76 a)** mümkün deyildi. Min cür utanıb sıxılma və əzabla keçdim. Məhəmməd Salihin bu beyti xatirimə gəldi:

Şum şərməndə hər ki, yar xodra dər nəzər benəm,
Rəfiğan soy mən binənd və mən soy digər benəm.
*Sevgilimə hər baxanda xəcalətdən utanıram,*
*Dostlarım mənə baxır, mən başqa tərəfə baxıram.*

Bu beyt mənim vəziyyətimə çox uyurdu. Eşqin və məhəbbətin şiddətindən, gəncliyin və məcnunluğun qüvvətindən ətrafda, küçədə, bağda və bağçada başı açıq və ayayğı yalın gəzirdim. Nə dost-tanışa, nə də yadlara qoşulur, nə də özümdən və ya başqalarından çəkinirdim.

Aşiq olğac bihudü divanə boldum, bilmədim,
Kim, pəri rüxsarələr eşqinə bu ərmiş xəvas.

Bəzən məcnunlar kimi təkbaşıma dağlara və çöllərə gedir, bəzən də bağları və məhəllələri küçə-küçə dolaşırdım. Nə yürümə, nə də oturma iradəsinə sahib idim, nə getməyə, nə də qalmağa qərar verə bilirdim.

Nə barurğa qüvvətim bar, nə tururğa taqətim,
Bizni bu halətgə sən qıldın giriftar, ey könül.

## SULTAN ƏLİ MİRZƏNİN TARXANLARLA ARASININ DƏYMƏSİ

Bu il [Baburun əmisinın oğlu] Sultan Əli Mirzə ilə Məhəmməd Məzid Tarxanın arası dəydi. Səbəbi bu idi: tarxanlarm etibarı və gücü çox artmışdı. Baqi [Tarxan] Buxaranı **(76 b)** tamamən ələ keçirmişdi və Buxaranın gəlirindən başqasına bir təngə belə vermirdi. Məhəmməd Məzid Tarxan da Səmərqəndin tam hakimiydi və bütün vilayəti oğullarıyla öz adamlarının idarəsinə vermişdi. Şəhərdən nə qədər təxsisat təyin etmişlərsə, bundan başqa heç bir yerdən Sultan Əli Mirzəyə bir fels belə gəlmirdi.

Sultan Əli Mirzə artıq böyümüşdü və bunların belə hərəkətlərinə necə dözə bilərdi. Bir neçə içkisi ilə birlikdə Məhəmməd Məzid Tarxanın həyatına sui-qəsd təşəbbüsündə bulundu. Məhəmməd Məzid Tarxan bunu xəbər alınca yanında olan tüm adamları və bəyləri ilə birlikdə şəhərdən çıxdılar. Bunların arasında Sultan Hüseyn Arğun, Pir Əhməd, Uzun Həsənin qardaşı Xoca Hüseyn, Qara Barlas, Salih Məhəmməd ilə digər bəzi bəy və igidlər də vardı.

O əsnada [moğolların xanı] Sultan Mahmud xan Xan Mirzənin yanına bir çox moğol bəyləri ilə birlikdə Məhəmməd Hüseyn Gürgan Duğlat və Əhməd bəyi verib onu Səmərqənd üzərinə göndərmişdi. Hafız [Məhəmməd] bəy Dulday və oğlu Tahir bəy də Xan Mirzənin bəy-atəkələriydilər. Həsən

Nəbirə, Hindu bəy [Koçin] və digər bəzi igidlər isə Hafız bəylə və Tahir bəylə olan əlaqələri üzündən Sultan Əli Mirzədən qaçıb **(77 a)** Xan Mirzənin hüzuruna getmişdilər.

Məhəmməd Məzid Tarxan adamlar göndərib Xan Mirzəni və moğol əsgərini çağıraraq Şavdar civarına gəldi. Orada Mirzə Xan ilə görüşərək moğol bəyləri ilə danışdı. Moğol bəyləri Məhəmməd Məzid ilə tam anlaşa bilmədilər. Hətta Məhəmməd Məzid Tarxanı ələ keçirməyi belə düşündülər. Amma o bəylər bunu anlayınca bir bəhanə taparaq moğol əsgərindən ayrıldılar. Onlar gedincə moğol əsgəri də orada dura bilmədi və dönüb Yar-yaylağa gəldi. O zaman Sultan Əli Mirzə az əsgərlə Səmərqənddən sürətə gələrək Xan Mirzə [Sultan Veys Mirzə] ilə moğol əsgərinin üstünə cümənda onlar vuruşa bilməyərək qaçdılar. Bu, son zamanlarda Sultan Əli Mirzənin gördüyü ən yaxşı iş idi.

Məhəmməd Məzid Tarxan və adamları bu moğollardan və mirzələrdən əllərini üzüncə moğol Əbdülvəhhabı mənim yanıma göndərdi. Əbdülvəhhab əvvəlcə mənim yanımda olmuş və Əndicanın mühasirəsində Xoca [Mövlana] qazı ilə birlikdə yaxşı işlər görmüşdü. Biz isə belə fəna vəziyətdə idik. Onun üçün dərhal sülh bağlayıb Səmərqənd üzərinə yürüməyi qəti şəkildə qərara almışdıq. Ordunun toplanacağı yeri bildirmək üçün Mir Moğolu sürətlə Axsiyə Cahangir Mirzənin yanına **(77 b)** göndərərək Səmərqənd üzərinə səfərə hazırlaşdıq. Zilqədə ayında [=1500 may-iyun] Səmərqənd üzərinə yürüyüb üçüncü günü Qabaya gəldik.

İkindi namazı vaxtında Sultan Əhməd Tənbəlin kiçık qardaşı Xəlilin Oş kurqanını basaraq zəbt etdiyi xəbəri gəldi. Təfsilatı belədir: yuxarıda bəhs edildiyi kimi, aramızda sülh bağlananda başlarında Tənbəlin kiçık qardaşı Xəlil olmaq üzrə əsirlər sərbəst buraxılmış, Tənbəl də Xəlili Ozgənddəki köç və qohumlarını çıxarmaq üçün oraya göndərmişdi. Köçünü çıxarmaq bəhanəsi ilə Özgəndə girən Xəlil bugün-sabah deyə hiylə işlədərək oradan çıxmırdı. Biz səfərə çıxanda Oş müdafiəsiz qalınca da bunu fürsət bilərək gəlib Oş kurqanını bir basqınla ələ keçirmişdi.

Bu xəbər bizə gələndə qalıb bunlarla uğraşmağı bir neçə səbəbə görə lazım bilmədik və Səmərqəndə doğru hərəkətimizə davam etdik. Bu səbəblərdən biri budur: bizim sipahilərimizin hamısı öz təchizatlarını tamamlamaq üçün evlərinə getmişdilər. Biz sülh müqaviləsinə inanmışdıq, bunların bu hiyləsindən və xəyanətindən xəbərsizdik. Bir digər səbəb də Əli Dost **(78 a)** və Qənbər Əli kimi böyük bəylərimizdən də, bəhs etdiyimiz kimi, neçə dəfə belə hərəkətlər göründüyü üçün onlara da inamımız qalmamışdı. Ayrıca başlarında Məhəmməd Məzid Tarxan olduğu halda bütün Səmərqənd bəyləri məni çağırmaq üçün Mir Moğolu göndərmişdilər. Səmərqənd kimi bir paytaxt varkən, niyə Əndican kimi bir yer üçün adam və vaxt itirim ki?

Qabadan Mərginana gəldik. Mərginan Qoç bəyin atası Sultan Əhməd

bəyə verilmişdi. Bəzi işlər və əngəllər üzündən o mənimlə birlikdə hərəkət edə bilməyərək Mərginanda qalsa da, oğlu Qoç bəy bir neçə qohumuyla bərabər mənimlə gəldi. İsfəra yoluyla hərəkət edərək İsfəraya bağlı Maxan adlı bir kəndə gəldik. Xoş bir təsadüf əsəri olaraq adamlarıyla birlikdə Qasım bəy, Əli Dostla birlikdə bir çox igidi ilə Seyid Qasım [eşik-ağa] da əvvəlcədən qərarlaşdırılmış kimi o gecə gəlib bizə qoşuldular. Oradan hərəkət edib Dəşti-Həsban üzərindən ötərək Çoban körpüsündən keçib Ura-Təpəyə gəldim.

Qənbər Əli isə Tənbələ güvənərək öz vilayəti olan Xocənddən qalxıb hərbi məsələlər haqqında danışmaq üçün Axsiyə gəlir. Gəlincə də Tənbəl onu dərhal bağladıb yanına alaraq **(78 b)** vilayətlərinin üstünə cumur. Türkcədə bir ata sözü vardır: «*İnanma dostuna, saman təpər postuna» (dərinə).*

Yolda götürülərkən Qənbər Əli qaçıb piyada olaraq min bir zəhmətlə Ura-Təpəyə gəldi. Biz Ura-Təpədə ikən Şeybani xanın Dəbusi qalasında Baqi Tarxanı məğlub edib Buxara üzərinə yürüdüyü xəbəri gəldi. Ura-Təpədən hərəkət edib Bürkə yaylağı yoluyla Səngzara gəldik. Səngzar valisi kurqanı təslim etdi. Qənbər Əli hər şeyini itirərək gəldiyi üçün onu Səngzarda qoyub getdik.

Xan yurduna gəlib düşərgə salanda başlarında Məhəmməd Məzid Tarxan olmaqla Səmərqənd bəyləri gəlib sədaqətlərini bildirdilər. Səmərqəndin zəbti məsələsini onlarla müzakirə etdik. Onlar da «[Xoca Übeydullahın oğlu] Xoca Yəhya padşaha candan bağlıdır, əgər Xocanı öz tərəfimizə çəksək, Səmərqəndi savaşmadan və asanlıqla zəbt etmək mümkündür» dedilər. Bunun üçün bir neçə dəfə Xoca Yəhyaya adamlar göndərərək danışıq aparıldı. Xoca Yəhya bizə qəti söz verməməklə birlikdə məyus edəcək söz də söyləmədi.

Xan yurdundan qalxıb Dərğəm sahilinə gəldik. Dərğəm sahilindən Xoca Məhəmməd Əli Kitabdar Xoca Yəhyanın yanına göndərildi **(79 a)** və «Gəlsinlər, şəhəri təslim edərik» xəbərini gətirdi. Biz də axşama doğru Dərğəmdən qalxıb şəhərə doğru hərəkət etdik.

Amma Sultan Məhəmməd Duldayın atası Sultan Mahmud Dulday oradan qaçaraq getmiş və Səmərqənddə olanları bu ittifaqdan agah etmişdi. Xəbər aldıqları üçün nəzərdə tutduğumuz plan baş tutmadı və qayıdıb təkrar Dərğəm sahilinə gəldik.

İbrahim Saru Mınqlı inayət etdiyim bəylərimdən idi, Əli Dost [Tağayi] onu yaxaladıb sürmüşdü. Mən Yar-yaylağa gəldiyim zaman Yusif bəyin [Seyid Yusif Oğlaqçı] böyük oğlu Məhəmməd Yusif ilə birlikdə gəlib sədaqətini bildirdi. Əli Dost sadiq bəylərimizin və içkilərimizin bir uismini özünə müxalif olduqları üçün sürdürmüş, mallarını yağmalatmış, bəzilərini də yaxalatmışdı. Bunlar da birər-birər gəlib toplandılar.

Əli Dostun mövqeyi sarsılmışdı, çünki Tənbələ qüvənərək mənə və

mənim tərəfdarlarıma cəfa və əziyyət edirdi. Mən də bu alçaq adamdan heç xoşlanmırdım. Utandığından və qorxusundan yanımda qala bilməyərək getmək üçün izin istədi. Mən də bunu minnət bilərək izin verdim. Əli Dost və [oğlu] Məhəmməd Dost bu **(79 b)** izni alan kimi Tənbəlin yanına getdilər.

Tənbəlin yaxınlarından olan bu ata ilə oğuldan bir çox düşmənlik və pisliklər meydana gəldi. Bir-iki il sonra Əli Dostun əlində çiban çıxaraq vəfat etdi. Məhəmməd Dost isə özbəklərə qoşuldu. Vəziyyəti ümumən pis deyildi, lakin oradan da nankorluq edib qaçaraq Əndican dağının ətəklərinə getdi, düşmənlik və fitnə çıxardı. Axırda özbəklərin əlinə düşdü, onlar da bunun gözlərini kor etdilər. Gözlərini «duz tutdu»[1] ifadəsinin belə bir mənası varmış.

Bunların getmələrinə izin verdikdən sonra Guri Barlas da bir neçə igidlə birlikdə xəbər bilmək üçün Buxara tərəflərinə göndərilmişdi. Şeybani xanın Buxaranı zəbt edib Səmərqənd üzərinə doğru yürüdüyü xəbəri gəldi. O civarda olmağı uyğun görməyərək Keş tərəfinə getdik. Səmərqənd bəylərinin bir çoxunun köçləri Keşdə idi.

## SƏMƏRQƏNDİN ŞEYBANİ XANA TƏSLİM EDİLMƏSİ

Keşə gəlib bir-iki həftə keçirdikdən sonra Sultan Əli Mirzənin Səmərqəndi Şeybani xana təslim etdiyi xəbərini aldıq. Təfsilatı budur: Sultan Əli Mirzənin anası Zöhrə Bikə ağa cahilliyi və axmaqlığı üzündən Şeybani xana gizlicə bir adam göndərərək bu xəbəri çatdırır: «Əgər Şeybani xan **(80 a)** mənimlə evlənəcək olsa, oğlu Səmərqəndi Şeybani xana təslim edəcək; lakin Şeybani xan da şəhəri aldıqdan sonra atasının vilayətini təkrar Sultan Əli Mirzəyə verəcək».

Əbu Yusif Arğun bundan xəbərdar imiş. Bəlkə ona bu fikri verən elə o xainin özü olmuşdur.

## FƏRQANƏ - 906 (28 İYUL 1500 - 17 İYUL 1501)

[1] Gözlərini duz-çörək tutdu deməkdir.

## DOQQUZ YÜZ ALTINCI İLİN HADİSƏLƏRİ

Şeybani xan bu qadının vədi üzrə gəlib Bağİ-Meydana endi. Sultan Əli Mirzə də bəylərindən və igidlərindən heç kimə xəbər vermədən və heç kimlə məsləhətləşmədən yaxınlarından bir neçə kiçık zatla birlikdə günorta vaxtı Çarrah qapısından çıxıb Bağİ-Meydana Şeybani xanın yanına getdi. Şeybani xan onu elə də yaxşı qarşılamadı. Görüşdükdən sonra da özündən aşağı bir tərəfə oturtdu.

Xoca Yəhya Mirzənin şəhərdən çıxdığını duyunca üzüldü. Lakin heç bir çarə tapa bilmədiyi için o da çıxdı. Şeybani xan onu yerindən qalxmadan qarşılayıb bir neçə tənəli söz söylədi. Axırda Xoca Yəhya getmək üçün yerindən qalxanda Şeybani xan da sayğı göstərərək yerindən qalxdı.

Xoca Əli bayın oğlu Can Əli Ribati-Xocada olurdu. Mirzənin çıxdığını xəbər alınca o da Şeybani xanın hüzuruna gəldi.

Bu uğursuz qadının ağlı qıt olduğu üçün ərə getmək arzusu üzündən oğlunun xanimanını **(80 b)** bərbad elədi. Şeybani xan ona zərrə qədər əhəmiyyət vermədi və cariyəsi qədər belə saymadı.

Sultan Əli Mirzə tutduğu işə və şəhərdən çıxmağına çox peşman olmuşdu. Bəzi yaxınları vəziyyəti başa düşərək Mirzəni qaçırmaq istədilər. Lakin Sultan Əli Mirzə buna razı olmadı. Əcəli gəldiyi üçün qurtula bilmədi. O, [Şeybani xanın oğlu] Teymur Sultanla birlikdə qalırdı. Dörd-beş gün sonra Külbə çayırında onu öldürdülər. Bu beş günlük fani həyat üçün pis adla getdi. Qadın sözünə aldanıb özünü yaxşı ad sahibləri cərgəsindən çıxardı. Belə bir adamın əhvalatını bundan artıq yazmaq və belə alçaq hərəkətləri bundan artıq eşitmək doğru deyildir.

[Şeybani xan] Sultan Əli Mirzəni öldürdükdən sonra Can Əlini də öldürüb Mirzəsının yanına göndərdi. Xoca Yəhyaya etimad etmədiyi üçün də ona iki oğlu Xoca Məhəmməd Zəkəriyyə və Xoca Baqi ilə birlikdə Xorasan tərəfinə getməsinə izin verdi. Sonra da arxalarından bir neçə özbək gedib Xoca-Kardzən civarında Xoca həzrətlərini iki igid oğluyla birlikdə şəhid etdilər. Şeybani xan Xocanın öldürülməsi işində **(8l a)** əli olmadığını, qatıllərin Qənbər Bi ilə Köpək Bi olduğunu söyləmişdir. Əgər belədirsə, daha da pis. Bir atalar sözü vardır: «*üzrü qəbahətindən böyük*». Əgər bəylər belə işləri xanlarının və padşahlarının xəbəri olmadan özləri etməyə başlayırlarsa, daha xanlığın və padşahlığın nə etibarı var?

Özbəklər Səmərqəndi aldıqdan sonra biz də Keşdən Hisara doğru getdik. Məhəmməd Məzid Tarxan başda olmaqla Səmərqənd bəyləri öz köç və ailələri ilə birlikdə bizimlə hərəkət etdilər. Çağanyanın Çəltu çayırında dayananda Məhəmməd Məzid Tarxanın başçılıq etdiyi Səmərqənd bəyləri bizdən ayrılaraq gedib Xosrov şahın xidmətinə girdilər.

Biz şəhər və vilayətdən məhrum idik, gedəcək və qalacaq yerimiz bəlli deyildi. Xosrov şahın bizim xanədanımıza qarşı bəzi haqsızlıqlar etmiş olmasına baxmayaraq çarəsiz, onun vilayəti içindən keçmək məcburiyyətində qaldıq.

Qara-Təkin vilayətindən keçərək kiçik dayım Alaca xanın yanına [Sultan Əhməd xan] getmə düşüncəsi ağlımızdan keçmişdi, ancaq nəsib olmadı.

Kəmruddan yuxarıya doğru yürüyərək Sərv-Tağ təpəsindən aşmağa qərar verdik. Nəvəndak civarına çatanda Xosrov şahın adamı doqquz at və doqquz parça qumaş gətirdi[1].

Kəmrud ağzına enərkən Şir Əli **(81b)** Çöhrə qaçıb Xosrov şahın qardaşı Vəlinin yanına getdi. Ertəsi gün isə Qoç bəy ayrılaraq Hisara getdi. Kəmrud dərəsindən yuxarıya doğru yürüdük. Dar və uçurumlu yollarda, sarp keçidlərdə bir çox atımız və dəvəmiz qaldı.

Üç-dörd gün sonra Sərv-Tağ keçidinə vardıq. Keçid, amma necə bir keçid! Heç bir yerdə belə yüksək və dar bir keçid görünməmişdir və heç bir vaxt belə dar və uçurumlu yollardan keçilməmişdir. Çox zəhmət və çətinliklə təhlükəli boğazlar və uçurumlardan keçib bu təhlükəli, yüksək və dar keçidləri aşaraq axırda Fan civarına gəldik.

Fan dağlarının arasında böyük bir göl vardır. Çevrəsi təxminən bir şeri qədər olan gözəl bir göldür və o qədər cazibədardır ki, heç boş qalmaz.

Alınan xəbərlərə görə, Şiraz kurqanını İbrahim Tarxan, Yar-yaylaq kurqanlarını da Qənbər Əli gücləndirmişdilər. Əbülqasım Kuhbər isə Xoca-Didardaydı. Özbəklər Səmərqəndi aldıqdan sonra Xoca-Didarda qala bilməyib Yar-yaylağa gəlmiş və daha aşağıda olan kurqanları gücləndirmişdi.

Fanı sağ tərəfdə qoyaraq Kəşdud tərəfinə yürüdük. Fan hakimi cömərdliyi, əsaləti və əliaçıqlığı ilə məşhur idi. **(82 a)** Sultan Hüseyn Mirzə Hisar üzərinə gələndə Sultan Məsud Mirzə kiçık qardaşı Baysunqur Mirzənin yanına Səmərqəndə bu yoldan getmişdi. Fan hakimi ona yetmiş-səksən at bağışlamış və digər xidmətlərini də buna bənzər şəkildə eləmişdi. Mənə çox pis bir at göndərdi, özü isə gəlmədi.

Səxavəti ilə məşhur olan kimsələr bizə gəlincə xəsis olur, alicənablığı ilə tanınlan kimsələr alicənablığı unudurdu. Xosrov şah da cömərdlik və əsalətlə məruf və məşhurdu. Bədiüzzaman Mirzəyə nə kimi yardımlar etdiyini söyləmişdim. Daha sonra Baqi Tarxana və digər bəylərə çox insaniyyət və cömərdlik göstərmişdi. İki dəfə onun vilayətindən keçdik, həmcinsimiz demədi, ən aşağı nökərimizə elədiyi insaniyyəti bizə göstərmədi, hətta bizi nökər gözündə belə görmədi.

Kim görübdür, ey könül, əhli-cahandan yaxşılıq,
Kim ki, ondan yaxşı yox, göz tutma ondan yaxşılıq.

Fanı keçincə Kəşdud kurqanında özbəklərin adamı ola biləcəyini düşü-

[1] O dönəmin türk gələnəklərinə görə hədiyyələr doqquzlu qruplar halında verilirdi.

nərək, Kəşdud üzərinə axın etdik. Lakin Kəşdud kurqanı xarab vəziyyətdə idi, indi orada heç kim yaşamırdı. Oradan keçib **(82 b)** Kuhək çayının sahilinə gəldik. Yarının qarşısından Kuhək çayından körpüylə keçdik. Qasım bəyin başçılığı altında bəyləri Ribati-Xoca kurqanını basqınla ələ keçirmək üçün göndərdim.

Yandan keçib Şunqarxana dağını aşaraq Yar-yaylağa gəldik. Ribati-Xocaya gedən bəylər kurqana nərdivan qoyan zaman kurqandakılar bilmiş və geri qovmuşlar. Onlar da kurqanı ala bilmədən dönüb gəldilər.

Qənbər Əli Səngzarda idi, gəlib görüşdü. Əbülqasım Kuhbər və İbrahim Tarxan da yaxşı adamlarını mənimlə görüşməyə göndərib qulluq və sədaqətlərini bildirdilər. Yar-yaylaq kəndlərindən Əsfidək kurqanına gəldik.

## BABURUN ANİ BİR HÜCUMLA SƏMƏRQƏNDİ İKİNCİ DƏFƏ ALMASI

O vaxt Şeybani xan Xoca-Didar civarında otururdu. Üç-dörd min özbəyi vardı, yerli sipahidən də bir o qədər adam toplanmışdı. Səmərqənd valiliyini Can Vəfa Mirzəyə vermişdi və o da beş-altı yüz adamla birlikdə Səmərqənd kurqanının içində idi. Həmzə Sultanla Mehdi Sultan isə adamlarıyla birlikdə Səmərqənd yaxınlığındakı Bödənə qoruğuna yerləşmişdilər. Bizim adamlarımız yaxşı-pis iki yüz **(83 a)** qırx nəfər idi. Bütün bəylərimizlə danışıb məsləhətləşərək buna qərar verdik: «Şeybani xan Səmərqəndi alalı çox olmamışdır, əhali hələ ona, o da əhaliyə könüldən bağlanmamışdır. Bir iş eləmək istəyiriksə, indi eləməliyik. Səmərqənd kurqanını nərdivanlar qoyub basqınla alsaq, əhali bizimlə olacaq. Başqa nə edə bilər ki? Əgər bizə kömək etməsə belə özbəklər üçün vuruşmaq ehtimalı da yoxdur. Səmərqəndi ələ keçirdikdən sonra Allah nə dilərsə o, olacaqdır».

Bu qərara gəldik və günorta namazından sonra Yar-yaylaqdan hərəkət edib bütün gecə yürüyərək gecə yarısı Xan Yurduna çatdıq. O axşam əhali xəbərdar olmuşdur deyə kurqanın yaxınına getmədik və Xan Yurdundan geri döndük. Dan ağaranda Ribati-Xocanın bir az aşağısından Kuhək çayını keçib təkrar Yar-yaylağa gəldik.

Bir gün Əsfidək kurqanında Dost Nasir, Noyan Göyəldaş, Xanqulu, Kərimdad, Şeyx Dərviş, Xosrov Göyəldaş və Mirim Nasir kimi içkilərlə birlikdə oturmuşduq. Oradan-buradan danışırdıq. «Söyləyin görüm, **(83 b)** Allah rast gətirsə, Səmərqəndi nə zaman alarıq?» dedim.

Bəziləri «ilkbahara alarıq» dedi, o zaman sonbahardı. Bəziləri bir ay, bəziləri qırx gün, bəziləri də iyirmi gün sonra dedilər. Noyan Göyəldaş isə «On dörd gündə alarıq» dedi. Allah rast gətirdi və tam on dörd gündə Səmərqəndi aldıq.

O zaman qəribə bir röya görmüşdüm. Röyamda Xoca Übeydullah həzrətləri gəlmiş və mən də onu qarşılamağa çıxmışım. Xoca gəlib oturdu. Xo-

canın önünə, deyəsən, bir az diqqətsiz bir şəkildə dəstərxan sərmişdilər və bu üzdən həzrətin könlü bir az incimişdi. Molla Baba mənim tərəfimə baxıb işarət edirdi. Mən də ona işarətlə: «Mən neyləyim, qüsur dəstərxanı sərəndədir» dedim. Xoca anladı və bu üzrümü qəbul etdi. Sonra ayağa qalxdı, mən də onu uğurlamağa çıxdım. O, evin dalanında sağ və ya sol qolumdan tutub məni elə yuxarı qaldırdı ki, bir ayağım yerdən üzüldü. Mənə türkcə «Şeyx məsləhət verdi» dedi. Bir neçə gün içində Səmərqəndi aldım.

Bir-iki gün sonra Əsfidək kurqanından qalxıb Vəsmənd kurqanına gəldik. Bir dəfə Səmərqənd civarına gedib varlığımızı göstərərək geri qayıtdığımız halda **(84 a)** təkrar Allaha təvəkkül edib eyni niyyətlə günorta namazından sonra Vəsmənddən qalxıb Səmərqənd üzərinə sürətlə hərəkət etdik. Xoca Əbülməkarim də mənimlə bərabərdi.

Gecə yarısı xiyaban üzərindən Məğək körpüsünə gəlib yaxşı igidlərdən yetmiş-səksən nəfərlik bir dəstəni irəli göndərdik. Bunlar Qari-aşiqan qarşısından nərdivanla yuxarı çıxıb Firuzə darvazasındakıların üstünə cüməraq darvazanı ələ keçirəcək və bizə adam göndərəcəkdilər.

Bu igidlər gedib Qari-aşiqan qarşısından nərdivanla yuxarı çımışlar və heç kim xəbər tutmamışdır. Oradan da Firuzə darvazasına qədər gəlib Fazil Tarxanın üstünə cummuşlar. Fazil Tarxan bəy tarxanlardan olmayıb Türküstanın tüccar tarxanlarından idi. Türküstanda Şeybani xana xidmət edərək etibar görmüşdü. İgidlər Fazil Tarxanı bir neçə adamıyla birlikdə öldürüb qapının kilidini balta ilə qıraraq darvazanı açdılar.

O əsnada mən yetişərək dərhal Firuzə darvazasından içəri girdim. Əbülqasım Kuhbər özü gəlməmiş, kiçik qardaşı Əhməd Qasımı otuz-qırx qədər adamıyla göndərmişdi. İbrahim Tarxanın adamlarından isə heç biri yox idi. Mən şəhərə girib xanəgahda oturanda yalnızca Əhməd Tarxan adlı kiçik qardaşı **(84 b)** bir neçə adamı ilə birlikdə gəldi.

Şəhər əhalisi hələ yuxuda idi. Dükan sahibləri dükanlarından baxıb tanıyaraq mənə dua edirdilər. Qısa bir müddət sonra şəhər əhalisi vəziyyətdən xəbərdar oldu. Bizim adamları və şəhər əhalisini qəribə bir sevinc sarmışdı. Özbəkləri quduz köpəklər kimi küçələrdə daş və zopalarla öldürdülər. Bəlkə də dörd-beş yüzə qədər özbək bu şəkildə öldürüldü.

Şəhərin darğası Can Vəfa Xoca Yəhyanın evlərindən birində otururdu. Oradan çıxıb qaçaraq Şeybani xanın yanına getdi.

Qapıdan girincə birbaşa mədrəsə və xanəgah tərəfə yürüdüm və xanəgahın tağı üstündə oturdum. Sabaha qədər hər tərəfdə qovğa və gurultu davam etdi. Xəbərdar olan bəzi əsnaf və dükan sahibləri sevinc və nəşəylə gəldilər, əllərində nə varsa gətirib dua etdilər.

Sabah özbəklərin Ahənin darvazasında iki qapı arasını gücləndirərək vuruşmaqda olduqları xəbəri gəldi. Dərhal ata minib Ahənin darvazasına doğru getdim. Mənimlə birlikdə on-on beş və ya iyirmi qədər adam vardı.

Şəhər yeni ələ keçmişdi. Alt təbəqədən hər kəs bir şey tapmaq ümidi ilə sağı-solu eşələməklə **(85 a)** məşğul idi. Mən yetişincəyə qədər özbəkləri Ahənin darvazasından çıxarmışdılar.

Şeybani xan bunu eşidib fövqəladə təlaşlı bir şəkildə, günəş doğarkən yüz-yüz əlli qədər adamıyla Ahənin darvazasına gəlib yetişdi. Fürsət qapıya gəlmişdi. Lakin söylədiyim kimi, yanımda çox az adam vardı. Şeybani xan isə heç nə edə bilməyəcəyini görüncə orada durmadı və dərhal geri qayıdıb getdi.

Oradan dönüb ərkdə Bostan Saraya endim. Ağsaqqallar, əşrəf və şəhərin böyükləri gələrək məni görüb təbrik etdilər.

Yüz qırx ilə yaxın bir müddətdir paytaxt Səmərqənd bizim ailədəydi. Yad və düşmən özbəyin biri gəlib onu ələ keçirmişdi. Amma əldən çıxan mülkü Allah təkrar verdi. Yağmaya uğrayan vilayət təkrar əlimizə keçdi.

## SULTAN HÜSEYN MİRZƏNİN HERATI ALMASI İLƏ BABURUN SƏMƏRQƏNDİ ALMASININ MÜQAYİSƏ EDİLMƏSİ

Sultan Hüseyn [Bayqara] Mirzə də Heratı bu şəkildə basqınla almışdı. Lakin iş bilənlər gözündə, anlayan və tərəfsiz kimsələrin önündə o işlə bu fəth arasında böyük bir fərq olduğu aşikardır.

Birincisi, Sultan Hüseyn Mirzə çox işlər görmüş, çox təcrübə qazanmış yaşlı bir padşah idi.

İkincisi, onun düşməni on yeddi-on səkkiz yaşında və təcrübəsiz bir uşaq olan Yadigar Məhəmməd Nasir Mirzə idı. **(85 b)**

Üçüncüsü, [Sultan Hüseyn Mirzənin əmirlərindən] düşmənin içində olan və vəziyyəti bilən Mir Əli Miraxur Mirzəyə adamlar göndərib onu düşmənin üstünə qafil olduğu bir anda gətirmişdi.

Dördüncüsü, düşmən kurqanda deyil, Baği-Zağanda idi və Sultan Hüseyn Mirzə şəhəri alanda Yadigar Məhəmməd Mirzə ilə adamları özlərini içkiyə elə vermişdilər ki, o gecə Yadigar Məhəmməd Mirzənin qapısında duran üç adamın üçü də sərxoş imiş.

Beşincisi, Yadigar Məhəmməd Mirzənin bu dərəcə qafil olduğu bir anda Sultan Hüseyn Mirzə gəldi və şəhəri zəbt etdi.

Mən isə Səmərqəndi alanda on doqquz yaşındaydım. Nə çox işlər görmüş, nə də təcrübə qazanmışdım.

İkincisi, mənim düşmənim Şeybani xan kimi çox təcrübə sahibi və çox işlər görmüş, yaşlı bir adamdı.

Üçüncüsü, bizə Səmərqənddən heç kimsə gəlməmişdi. Şəhər əhalisi mənə nə qədər meylli olsa da, Şeybani xanın qorxusundan heç kim bir şey edə bilməzdi.

Dördüncüsü, mənim düşmənim kurqanda idi, kurqan alındı, düşmən

də qovuldu.

Beşincisi, bir dəfə Səmərqənd üzərinə gəlmişdik və düşmən bundan xəbərdar olmuşdu, ikinci dəfə gələndə Allah rast gətirdi və Səmərqənd zəbt edildi.

Bunları söyləməkdən məqsədim başqalarına daş atmaq deyil, **(86 a)** yuxarıda bəhs edildiyi kimi, gerçəkləşən hadisəni anlatmaqdır. Bunları yazmaqdan məqsədim isə özümü yüksəltmək deyildir. Yuxarıda yazıldığı kimi, doğrusu bu idi.

Bu fəth haqqında şairlər tarixlər söyləmişlər. Onların arasından bir beyt xatirimdə qalmışdır:

Baz gofte xirəd ki tarixəş
Fəthi-Babur bahadur əst bedan.
*Ağıl tarixini yenidən söylədi; bil ki*
*Onun tarixi budur: «Fəthi-Babur bahadur».*[1]

Səmərqənd alındıqdan sonra Şavdar, Soğd və yaxın tümənlərin kurqanları bir-bir gəlib mənə qatılmağa başladılar. Bəzi kurqanların özbək darğaları qorxudan qaçıb getdilər, bəzi kurqanlar özbəkləri qovub bizim idarəmizə girdilər, bəziləri isə darğaları yaxalayıb kurqanları qapatdılar.

Bu zaman Şeybani xanla özbəklərin köç və ailələri Türküstandan gəldi. Şeybani xan özü Xoca-Didar və Əliabad civarında olurdu. Kurqanların bu şəkildə bizə keçdiyini və əhalinin bizi dəstəklədiyini görüncə olduğu yerdən qalxıb Buxara tərəfinə getdi.

Allahın inayəti ilə Soğd və Miyanqal kurqanlarının çoxu üç-dörd ay ərzində təkrar bizə keçdi. Baqi Tarxan da fürsət taparaq Karşi kurqanına girdi. Hüzar və Karşi da özbəklərin əlindən çıxdı. Qaragölü isə Mərvdən Əbülmöhsün **(86 b)** Mirzənin adamları gəlib aldılar. İşimiz çox yaxşı gedirdi.

Anam, köçüm və uruğlarım mən Əndicandan çıxdıqdan sonra min bir çətinlik və sıxıntı ilə Ura-Təpəyə gəlmişdilər. Adam göndərərək onları da Səmərqəndə gətirtdik.

Həmin günlərdə Sultan Əhməd Mirzənin mənimlə evli olan qızı, ilk nigahlı arvadım Ayşə Sultan bəyimin bir qızı dünyaya gəldi. Fəxrünnisa adı verildi. Bu mənim ilk uşağım idi və mən o vaxt on doqquz yaşındaydım. Uşaq bir ay və ya qırx gün içində Allahın rəhmətinə qovuşdu.

Səmərqəndin fəthindən sonra dəfələrlə civardakı xanlara, sultanlara, əmirlərə və sərhəd boyunda yaşayanlara kömək və dəstək tələbi ilə arxa-arxaya elçilər və xəbərçilər gedib gəldi. Bu gələn elçilərin bəziləri təcrübəli olmalarına baxmayaraq diləklərimi ağılsızcasına rədd edirdilər. Bəziləri də bizə qarşı vaxtilə ədəbsizlik və pis hərəkətlər etmişdilər, ona görə qorxduqları üçün cavab vermirdilər. Bəziləri yardım göndərsələr də buna yardım demək olmazdı. Bunların hamısından növbə ilə bəhs ediləcəkdir.

---

[1] «Fəthi-Babur bahadur» sözlərinin əbcəd hesabı ilə cəmi 906 (=1500) deməkdir.

Səmərqəndi ikinci dəfə alanda Əli Şir [Nəvai] bəy **(87 a)** hələ həyatda idı. Bir dəfə mənə bir məktubu da gəlmişdi. Mən də arxasına türkcə beyt yazıb bir məktub göndərmişdim. Cavab gəlincəyə qədər ayrılıq və qovğa çıxdı.

Şeybani xan Səmərqəndi alanda Molla Bənnaini öz xidmətinə qəbul etmişdi, öz yanında saxlayırdı. Səmərqəndin fəthindən bir neçə gün sonra buraya gəldi. Qasım bəy ondan şübhələndiyi üçün Şəhrisəbz tərəfinə getməsinə izin verdi. Çox fəzilətli bir adam olduğu və heç bir günahı görülmədiyi üçün təkrar Səmərqəndə gətirtdik. Daim qəsidə və qəzəl yazırdı. Nəva fəslində bəstələnmiş bir qəzəli mənə ithaf etdi.

Yenə o zamanlarda bir rübai söylədi. Həmin rübai budur:

Nə ğəllə məra k-əzi təvanəm nuşid,
Nə möhmali ğəllə təvanəm puşid,
Anra ki, nə xordənəstü nə puşidan,
Dər elmü hünər koca təvanəd kəşid.

*Nə bir bəslənəcək yeyəcəyim var,*
*Nə də örtünəcək geyəcəyim var.*
*Yeməyi, paltarı olmayan adam*
*Elm, hünər üçün necə çalışar?*

O zamanlar mən də bir və ya iki beyt söyləyirdim, lakin qəzəl tamamlamırdım. Yalnız türkcə bir rübai söylədim:

İşlər varı könlündəki tək bolğusudur,
Ənamü vəzifə barı buyrulğusudur,
Ol ğəlleyü-mühməl ki, deb ərdin, berdim,
Mühməlgə buyu ğəllədən öy dolğusudur.

*İşlərinin hamısı könlünə görə olacaqdır,*
*Ənam və vəzifə, hamısı gələcəkdir,*
*O söylədiyin qailə və mühməli sənə verdim,*
*Mühmələ girəcək evin qailə ilə dolacaqdır.*

Molla Bənnai bu rübainin **(87 b)** sonuncu misrasının qafiyəsini rədif edərək başqa bir qafiyə ilə təkrar bir rübai söylədi:

Mirzəm ki şahi-bərhi-bər bolğusudur,
Aləmdə hünər birlə sər bolğusudur,
Bir mühməl üçün bunca inayət boldu,
Müstəməl əgər desəm nələr bolğusudur.

*Mirzəm qurunun və dənizin şahı olacaqdır,*
*Aləmdə hünəri ilə başı ucalacaqdır,*
*Bir mühməl üçün bunca inayət olsa,*
*Müstəməldir, əgər desəm nələr olacaqdır.*

O zaman Xoca Əbülbərəkə Firaqi Şəhrisəbzdən Səmərqəndə gəlmişdi. O da «bu qafiyə və rədifdə söyləmək lazımdır» dedi və bu rübaini söylədi:

Bu cövr ki gəldi dövr sorulğusudur,
Sultani-kərəm bu üzrnü qulğusudur,
Tökülgən əgərçı dolmaz, ey saqi,
Tökülgənimiz bu dövrdə dolğusudur.

*Dövrün etdiyi cəza ondan sorulacaqdır,*
*Kərəmli sultan bu üzrü bağışlayacaqdır.*
*Tökülən əgərçi dolmaz, ey saqi,*
*Tökülənimiz bu dövrdə dolacaqdır.*

Bu qış bizim işimiz çox tərəqqidə, Şeybani xanınkı isə tənəzzüldə idi. Amma bu arada gerçəkləşən bir-iki hadisə işimizi bir az pozdu. Mərvdən gələrək Qaragölü alanlar orada dayana bilmədilər və Qaragöl təkrar özbəklərin əlinə keçdi. Dəbusi qalasında İbrahim Tarxanın kiçık qardaşı Əhməd Tarxan dururdu. Şeybani xan gəlib oranı mühasirəyə aldı. Biz əsgər toplayıb hazırlıq görənə qədər zorla alıb əhalisini tamamilə qılıncdan keçirdi.

## SƏRPÜL MEYDAN MÜHARİBƏSİ

Mənim Səmərqəndi aldığım zaman yanımda iki yüz qırx təcrübəli adamım **(88 a)** vardı. Beş-altı ay içində böyük Allahın yardımıyla sayıları o qədər artdı ki, Şeybani xan kimi bir adamla, bir az sonra bəhs edəcəyim kimi, Sərpüldə bir meydan müharibəsi elədik.

Ətrafdakılardan və xandan [Baburun dayısı Sultan Mahmud xan] dörd və ya beş yüzə qədər adamla birlikdə Əyyub Bəycik, Qaşqa Mahmud və barinlər köməyə gəlmişdi. Cahangir Mirzədən yüz və ya iki yüz adamla birlikdə Tənbəlin kiçık qardaşı Xəlil də köməyə gəlmişdi.

Şeybani xanın etdiklərini və davranışlarını ən yaxşı bilən Sultan Hüseyn Mirzə kimi təcrübə sahibi bir padşahdan köməyimə heç kim gəlmədi. Bədiüzzaman Mirzədən də heç kim gəlmədi. Xosrov şah isə qorxudan adam göndərmədi, çünki yuxarıda bəhs edildiyi kimi, o, bu ailəyə çox pisliklər eləmişdi və bizdən möhkəmcə qorxurdu.

Şəvval ayında [=1501 aprel-may] Şeybani xan ilə savaşmaq niyyətilə hərəkət edərək Baği-nova çıxdım. Əsgər toplamaq və hazırlıq üçün burada beş-altı gün qaldım. Oradan hərəkət edib bir neçə dəfə dincəldikdən sonra Sərpüldən keçərək ordugah qurduq. Ordugahın çevrəsini başdan-başa paya **(88 b)** və xəndəklər vasitəsilə qorunaqlı bir hala gətirdik.

Şeybani xan da digər tərəfdən gəlib Xoca-Kardzən ətrafına endi. Aramız təxminən bir ağacdı. Dörd-beş gün burada oturduq. Bizim adamlarımız və düşmənin adamları hər gün qarşı-qarşıya gəlib oxla vuruşurlardı. Bir gün

düşmənin adamı bir az artıq izdihamla gəldi, xeyli müharibə oldu, lakin heç bir tərəf o birinə dov gələ bilmədi. Bizim bir alay qədər adamımız çabucaq qayıdıb xəndəyə girmişdi. Bəziləri bunun Seydi Qara bəyin alayı olduğunu söylədilər. Seyd Qara bəy sözünün əri olsa da, qılıncı bir az zəif idi.

O günlərdə Şeybani xan bir dəfə gəlib gecə basqıni elədi. Əsgərlərin ətrafı ağac maneələr və xəndəklə möhkəmləndirilib qorunaqlı hala gətirilmişdi. Ona görə də düşmən heç nə edə bilmədi. Yalnızca xəndəyin o üzündən qışqıraraq bir az ox atıb geri döndü.

Mən müharibənin sürətləndirilməsini istəyirdim. Qənbər Əli də qeyrət edirdi. Baqi Tarxan min-iki min silahlı adamla Keşə enmiş və bir-iki günə qədər bizə qoşulacaqdı. Seyid Məhəmməd Mirzə Duğlat da xan dayım tərəfindən köməyə gələrək min və ya min beş yüz adamla **(89 a)** Diyula enmişdi, bizdən dörd ağac məsafədə idi və sabahadək bizə qatılacaqdı. Belə bir durumda müharibəni sürətləndirdik və vuruşduq.

Be tündi səbk dəst bərdən be tiğ,
Be dəndan kəzd pəşt dəst diriğ[1].
*Hiddətlə əlini dərhal qılınca atan*
*Peşman olaraq əlinin arxasını dişləyər.*

Mənim tələsməyimin səbəbi bu idi: müharibə günündə Zöhrə ulduzu arada idi. O gün sovuşsa, Zöhrə ulduzu[2] on üç-on dörd gün qədər düşmənin arxasında olacaqdı. Lakin bu düşüncələr yersiz imiş və lüzumsuz tələskənlik edilmiş.

Bir sabah müharibə niyyətilə silahlanaraq atlarımıza zireh taxdıq, sağ və sol qolları, mərkəz və irəli qol səflərini nizamlayaraq hərəkətə keçdik. Sağ qolda İbrahim Saru, İbrahim Cani, Əbülqasım Kuhbər və digər bəzi bəylər; sol qolda Məhəmməd Məzid Tarxan, İbrahim Tarxan, Səmərqənd bəylərindən Sultan Hüseyn Arğun, Qara Barlas, Pir Əhməd və Xoca Hüseyn, mərkəzdə Qasım bəy və bəzi yaxın içkilər; irəli qolda isə Qənbər Əli Sallax, Bəndə Əli, Xoca Əli, Mirşah Koçin, Seyid Qasım eşik-ağa, Bəndə Əlinin kiçık qardaşı Haldar və Qasım bəyin oğlu Qoç Heydər durmuşdular. Digər mövcud yaxşı igidlərin və içkilərin hamısı də irəli qola daxil edilmişdi.

Bizim səf halında hərəkətə keçməmizlə birlikdə düşmən da qarşı tərəfdən **(89 b)** səf halında qabağımıza çıxdı. Düşmənin sağ qolunda [Şeybani xanın kiçık qardaşı] Mahmud Sultan, [Şeybani xanın bacısı oğlu] Cani bəy Sultan və [Şeybani xanın oğlu] Teymur Sultan, sol qolunda Həmzə Sultan, Mehdi Sultan və digər bəzi sultanlar dururdular.

Səflər bir-birinə yaxınlaşanda düşmənin sağ qolunun başı bizim arxamıza doğru yürüdü. Mən də üzümü onlara çevirdim. İrəli qolumuz isə -bütün təc-

---

[1] Sədi Şirazidən.
[2] İnama görə, Zöhrə ulduzu adama şans gətirirdi. Ona görə də daha şanslı ola bilmək üçün Zöhrənin öz tərəflərində olduğu zaman savaşa başlamağa çalışırdılar.

rübəli və yaxşı qılınc çalan igidlərimiz irəli qola daxil idi- sağ tərəfimizdə qaldı. Önümüzdə heç adam qalmadı. Buna baxmayaraq bizə doğru gələn adamları vurub çevirərək mərkəzə sıxışdırdıq, iş artıq o dərəcəyə gəldi ki, Şeybani xanın bəzi yaşlı və böyük adamları «yürümək lazımdır, durmaq zamanı keçdi» demişlər, lakin o olduğu yerdə qalmışdı. Düşmənin sağ qolu bizim sol qolumuzu yenərək arxamıza doğru yürüdü. İrəli qol da sağ tərəfimizdə qalınca önümüz açıq qaldı. Düşmən arxadan və öndən sıxışdıraraq ox atmağa başladı.

Köməyə gəlmiş moğol əsgərlərinin savaşmağa heç niyyətləri yoxdu. Savaşmaq bir yana, bizim öz əsgərimizi yağmalayıb atdan salmağa başladılar. Yalnız burada deyil, bədbəxt moğolun **(90 a)** adəti daima belədir. Qalib gəlsə də qənimət (olca) alır, məğlub da olsa öz elini yağmalayıb qənimət alır.

Önümüzdəkilər neçə dəfə şiddətli şəkildə hücum etsələr də, hər dəfə onları geri oturtduq. Önümüzdən bizi xeyli sıxışdırdılar. Arxamıza keçən adamlarsa gəlib bizim alaya ox atmağa başladılar. İrəlidən və arxadan sıxışdıraraq əsgərimizi bir az sarsdılar. Özbəklərin savaşdakı böyük hünəri bu çevirmə (tolğama) hərəkətidir. Onların heç bir savaşı tolğamasız olmaz. Başqa bir hünərləri də budur ki, irəlidə və arxada bəy və nəfərlərin hamısı ox ataraq dördnala gəlir və döndükləri zaman da toplu halda dördnala geri çəkilirlər.

Mənim yanımda on-on beş adam qalmışdı. Kuhək çayı yaxındı. Sağ qolun bir ucu çaya varmışdı. Biz də çaya doğru yürüdük. Çayın suyunun çəkildiyi günlər idi. Çaya çatınca zirehli bir halda suya girdik. Çayın yarısından çoxunu yürüyərək keçdik. Qalan qismi dərindi. Bir ox atımı qədər yeri atları zirehli halda üzdürərək keçdik. Suyu keçəndən sonra zirehləri atdıq.

Suyun şimal tərəfinə keçincə düşmənin **(90 b)** təqibindən qurtulduq, lakin burada da dağınıq adamlarımızı atdan salıb soyanlar bu uğursuz moğollardı. İbrahim Tarxanı və başqa bir çox igidi moğollar yağmalayıb, atdan salıb tələf etdilər.

Kuhək çayının şimal tərəfindən gəlib Külbə civarından keçdik, iki namaz arası Şeyxzadə darvazasından girərək ərkə gəldim.

Böyük bəylər, yaxşı igidlər və bir çox adam bu müharibədə tələf oldu. Burası qəribədir ki, bu savaşda İbrahim adlı üç böyük bəy, yəni İbrahim Tarxan, İbrahim Saru və İbrahim Cani həlak oldu. Qasım bəyin böyük oğlu Əbülqasım Kuhbər, Xudaverdi Tuğçu, əvvəlcə də haqqında bir neçə dəfə bəhs edilən Sultan Əhməd Tənbəlin kiçık qardaşı Xəlil də bu savaşda öldü.

Bəylərin bir qismi müxtəlif yönlərə qaçdılar. Bunların arasında Məhəmməd Məzid Tarxan Hisar və Qunduz tərəfinə Xosrov şahın yanına getdi. Qənbər Əli Sallax moğol da çox inayət etdiyimiz bəylərimizdən idi və bu qədər inayət gördüyü halda belə bir zamanda sadiq qalmayıb Səmərqənddən köçünü də alaraq Xosrov şahın yanına getdi. **(91 a)** İçki və igidlərdən bəziləri də, məsələn, Kərimdad Xudadad Türkmən, Canikə Göyəldaş və Molla Baba Pəşağari Ura-Təpə tərəfinə getdilər. O zamanlar Molla Baba xidmətdə

deyildi, yalnızca qonaq olaraq yanımızda idi. Bəziləri bizimlə birlikdə Səmərqəndə girdilər. Bunların arasında Şirim Tağayi və adamları da vardı.

Məsləhətləşərək həyatı və ölümü Səmərqənd kurqanının içində görüb kurqanı gücləndirməyə qərar verdik. Anamla birlikdə böyük və kiçık bacılarım da kurqanda olduqları halda Şirim Tağayi öz köçünü, ailəsini və adamlarını şəhərdən çıxarıb Ura-Təpəyə göndərdi. Özü kurqanda tək başına, yalnızca bir neçə adamıyla qaldı. O, təkcə bu dəfə deyil, belə çətin vəziyyətlərdə həmişə zəiflik və sədaqətsizlik göstərmişdir.

## BABURUN SƏMƏRQƏNDDƏ ŞEYBANİ XAN TƏRƏFİNDƏN MÜHASİRƏYƏ ALINMASI

Ertəsi sabah Xoca Əbülməkarimi, Qasım bəyi, bəyləri, içkiləri və divana çağrılacaq bütün igidləri dəvət etdik, məsləhətləşdik, kurqanı gücləndirməyə, həyatı və ölümü kurqanın içində görməyə qərar verdik. Mən, Qasım bəy, ətrafımdakı içki və igidlər ehtiyat qüvvətləri idik. Onun üçün şəhərin ortasında Uluğbəy Mirzənin mədrəsəsinin damının üstünə **(91 b)** ağ bir çadır qurduraraq oturdum. Digər bəylərə və igidlərə isə darvazalarda və ətrafdakı divarlarda postlar tapşırıldı.

İki-üç gün sonra Şeybani xan gələrək kurqanın bir az uzağına endi. Məhəllə və kəndlərin avam təbəqəsi bölük-bölük toplanaraq, salavat gətirib mədrəsə qapısına gəlir və çarpışmaya çıxırdılar. Şeybani xan bunlara qarşı hərəkətə keçir, lakin kurqanın yaxınına gələ bilmirdi. Bir neçə gün bu şəkildə keçdi. Ox və qılınc yarası görməyən, nizamlı bir meydan müharibəsinin və qarşılıqlı çarpeşmanın nə olduğunu bilməyən qara camaat bu durumdan cəsarət alaraq daha uzaqlara çıxmağa başladı. Təcrübəli igidlər onların belə faydasız çıxışlarının qabağını almaq istəyəndə onlara həqarət eləməyə başladılar.

Bir gün Şeybani xan Ahənin qapısı tərəfinə hücum etdi. Qara camaat cəsarət aldığı üçün hər zamanki kimi cürətkarlıq göstərərək ona qarşı uzağa çıxdı. Onların arxasından bəzi igidlərlə süvari bölüyü çıxardım. Üşdür-Gərdən tərəfinə göyəldaşlardan və yaxın içkilərdən Noyan Göyəldaş, Qul Nəzər Tağayi, Məzid [Tağayi] və digər bir çoxları da çıxmışdı. Orada bir-iki özbək **(92 a)** bunların üstünə at sürdü və Qul Nəzər ilə qılınc-qılınca gəldi. Özbəklər atdan endilər, şəhərin qara camaatını sıxşdırıb qovaraq Ahənin darvazasına tıxdılar.

Qoç bəy ilə Mirşah Koçin isə Xoca Xızır məscidinin yanında qaldılar. Piyadalar qovulduqdan sonra düşmənin irəlidəki atlıları Xoca Xızır məscidinə doğru toplu bir həmlə etdilər. Qoç bəy bu irəliləyən özbəklərə qarşı çıxaraq çox yaxşı çarpışdı və böyük şücaət göstərdi. Bütün xalq bunlara baxıb durur, qaçanlar da qaçmağa davam edirdilər. Artıq ox atıb müqavimət etməyin zamanı keçmiş kimiydi. Mən qapının üzərindən navək[1] atırdım və ya-

[1] *Navək:* bir yay növü.

nımdakıların bəziləri də ox atırdılar. Özbəklər yuxarıdan atılan oxlar üzündən Xoca Xızır məscidindən daha irəli gedə bilmədilər və geri qayıtdılar.

Mühasirə boyu kurqan divarı üzərində hər gecə gəzirdik. Bəzən mən, bəzən Qasım bəy, bəzən də bəylərdən və içkilərdən biri dolaşırdı. Firuzə darvazasından Şeyxzadə darvazasına qədər divar üzərində atla da gedilə bilirdi. Digər yerlərdə isə  ancaq piyada **(92 b)** getmək mümkün idi. Bəziləri piyada dolaşırdılar və bir dövrə vurana qədər sabah olurdu.

Bir gün Şeybani xan Ahənin darvazası ilə Şeyxzadə darvazası arasına hücum etdi. Mən ehtiyatdaydım və müharibə orada olduğu üçün oraya gəldim. Qazuristan darvazası ilə Suzəngəran darvazası tərəfindən qorxumuz yox idi. O gün Şeyxzadə darvazası üstündən bir yüz başının atını navək oxuyla dəqiq vurdum, dərhal öldü.

O ara düşmən bizi çox sıxşdırdı və Üşdür-Gərdən tərəfində divarın dibinə qədər gəldi. Biz burada savaşarkən, o tərəfdən tamamən qafil idik. Düşmən iyirmi beş- iyirmi altı nərdivan hazırlamış və hər nərdivanın eni iki-üç adamın yan-yana çıxa biləcəyi qədər imış. Yeddi və ya səkkiz yüz yaxşı igidi də bu nərdivanlarla Qazuristan darvazası ilə Suzəngəran darvazası qarşısında pusquda yerləşdirmiş və sonra da digər tərəfdən hücum etmişlər. Əsgərin hamısı bu tərəfdə çarpışmaqla uğraşarkən o postun boş qaldığı bir əsnada pusqudakılar gizləndikləri yerdən çıxıb **(93 a)** qaça-qaça bu nərdivanları iki darvaza arasında, Məhəmməd Məzid Tarxanın həyətinin qarşısına tuş gələn divara qoymuşlar. Ora Məhəmmədqulu Koçin ilə digər bəzi bəylərin postu idi və bu bəylər Məhəmməd Məzid Tarxanın həyətində idilər. Suzəngəran darvazası Qara Barlasın postu, Qazuristan darvazası isə Şirim Tağayi ilə böyük və kiçık qardaşlarının və Qutlu Xoca Göyəldaşın postu idi. Çarpışmalar başqa tərəfdə meydana gəldiyi və postdakılar bu işdən xəbərsiz olduqları üçün adamları da işlərini-güclərinə görmək üzrə evlərinə və ya bazara dağılmışdılar. Amma post bəyləri və qara camaatdan bir neçə adam öz yerlərində qalmışdı.

Qoç bəy, Məhəmmədqulu Koçin, Şah Sufi və digər bir igid onlara qarşı çıxıb şücaət göstərdilər. Düşmənlərin bəziləri artıq divar üstünə çıxmışdı, digərləri də çıxmaqdaydı. Bu dörd adam qoşaraq yetişdilər və vuruşaraq düşməni divardan aşağı düşürüb qaçırdılar. Aralarında ən yaxşı Qoç bəy çarpışdı. Qoç bəyin xoşa gələn işlərindən biri də bu idi. Bu mühasirədə onun iki yaxşı əməli göründü.

Qara Barlas da Suzəngəran darvazası qərargahında tək qalmışdı, ancaq möhkəm dayandı. Qutlu Xoca Göyəldaşla Qul Nəzər Mirzə Qazuristan darvazasının yanındakı postda durmuşdular. Onlar da adamlarının az olmasına baxmayaraq düşmənə qarşı yaxşı ox atdılar.

Bir dəfə Qasım bəy igidləri başına yığıb özbəkləri Suzəngəran darvazasından Xoca Kəfşirə qədər sürdü, onlardan bir neçəsini ələ keçirib başlarını kəsərək geri gəldi.

Taxıl yığımı zamanı idi, lakin heç kim yeni məhsulu toplaya bilmirdi. Mühasirə günləri uzandı. Əhali çox sıxıntı çəkdi. İş o həddə çatdı ki, kasıblar və miskinlər it və eşşək əti yeməyə başladılar. Atların yemi də qurtardı. Atlara ağac yarpağı verilirdi. O zaman qazanılan təcrübədən anlaşıldı ki, atlar üçün tut yarpağı ilə qaraağac yarpağı bütün yarpaqlardan daha yaxşıdır. Bəziləri isə quru ağacları rəndələyərək yonqarını suda isladıb atlara verirdilər.

Üç-dörd ay boyunca Şeybani xan kurqana yaxınlaşmadı, uzaqdan ətrafında dolaşıb durdu. Bir gecə heç gözlənməyən bir vaxtda gecə yarısına yaxın Firuzə darvazası tərəfinə gəlib davullar çalaraq savaş nərələri atdılar. Mən mədrəsədə **(94 a)** olurdum. Fövqəladə bir təlaş və qarışıqlıq oldu. Ondan sonra da hər gecə gəlib davullar çalaraq, savaş nərələri atıb gurultu qoparırdılar.

Mən ətrafa və civara nə qədər elçilər və adamlar göndərsəm də, heç kimdən kömək və yardım gəlmədi. Qüvvətli olduğumuz və heç bir ehtiyacımız olmadığı zamanlarda bizə yardım etməmiş olanlar belə bir zamanda heç köməyə gələrlərmi? Onlardan gələcək yardıma bel bağlayaraq qalanı qorumaq mümkün deyil. Bir atalar sözü vardır: bir kurqanı gücləndirmək üçün bir baş, iki qol və iki ayaq lazımdır. Baş sərkərdə, iki qol iki tərəfdən gələcək imdad və yardım, iki ayaq isə kurqanın suyu və ərzağıdır.

Biz ətrafdakılardan imdad və yardım gözləyirdik, onların hər biri başqa bir fikirdə idi. Sultan Hüseyn Mirzə kimi cəsur və təcrübə sahibi bir padşah belə bizə yardım etmədiyi, hətta mənəvi yardım olaraq tək bir elçi göndərmədiyi halda mühasirə zamanı Şeybani xana elçi olaraq Kəmaləddin Hüseyn Qazürgehini göndərdi.

Tənbəl Əndicandan Beşkənd civarına gəldi. [Sultan Mahmud] xan isə Əhməd bəyi və yanındakılalı Tənbələ qarşı qoydu. Bunlar Ləkləkan **(94 b)** və Türək çarbağı civarında qarşılaşdılar, lakin çarpışma olmadan ayrıldılar.

Sultan Mahmud xan savaş adamı deyildi. Sipahilikdən tamamən bixəbər idi. Tənbəl ilə qarşılaşdığı zaman xan qorxaq sözlərə və hərəkətlərə yol verir. Əhməd bəy qaba, lakin cəsur və sadiq bir adamdı. Çox sərt danışırdı. O deyir ki: «Bu Tənbəl necə bir adamdır ki, bu qədər təlaş və tərəddüd göstərirsiniz. Gözünüz qorxursa, gözünüzü bağlayıb yürüyək və qarşılaşaq».

FƏRQANƏ - 907 (17 İYUL 1501 - 7 İYUL 1502)

## DOQQUZ YÜZ YEDDİNCİ İLİN HADİSƏLƏRİ

Mühasirə uzandı. Heç bir tərəfdən nə ərzaq, nə də kömək gəlmədi. Əsgər və əhali ümidsizliyə düşərək bir-bir, iki-iki kurqanı qoyub qaçmağa başladı. Şeybani xan əhalinin acizliyini anlayaraq gəlib Qari-aşiqan civarında lövbər saldı. Mən də Şeybani xanın qarşısına, Quyi-Payəndə yerləşən Məlik Məhəmməd Mirzənin evinə gəldim.

O günlərdə Uzun Həsənin qardaşı Xoca Hüseyn [bəy] on-on beş adamı ilə birlikdə gəlib kurqana girdi. Daha öncə **(95 a)** bəhs edildiyi kimi, Cahangir Mirzənin bizə düşmən olmasına və bizim Səmərqənddən çıxmamıza o səbəb olmuşdu. Bu giriş çox cəsuranə bir giriş idi.

Əsgərin və şəhər əhalisinin darlığı və sıxıntısı arttı. Yaxın və mötəbər adamlarımız belə divardan atlılaraq qaçmağa başladılar. Bəylərimizdən, ünlü adamlarımızdan və əski silahdaşlarımızdan təkcə Şeyx Veys ilə Veys Lağari qalmışdı, onlar da qaçdılar. Mən və yanımdakılar ümidlərimizi itirdik. Heç bir tərəfdən ümid qalmadı. Ərzaq və taxıl da azdı, olanı da tükəndi. Heç bir tərəfdən nə ərzaq, nə də taxıl gəlmədi.

## BABURUN SƏMƏRQƏNDİ TƏRK ETMƏSİ

Bu sırada Şeybani xan ortaya barış sözünü atdı. Əgər hər hansı bir tərəfdən ümid olsa, ya da taxıl gəlsəydi, barış sözünə kim qulaq asardı. Zərurət hasil oldu və barışa bənzər bir şey bağlayıb gecə yarısı Şeyxzadə darvazasından çıxdıq.

Validəm xanımı yanımda götürdüm. Ondan başqa iki qadın çıxdı, biri Biçkə Xəlifə, digəri Minqli Göyəldaş idi. Böyük bacım Xanzadə bəyim bu çıxışda Şeybani xanın əlinə keçdi.

Qaranlıq gecədə, Soğdun böyük kanalları arasında dolaşaraq yolumuzu itirib min bir əziyyətlə sabah tezdən Xoca-Didardan keçib sübh namazına yaxın **(95 b)** Qarbuğ dağına dırmandıq. Qarbuğ dağının şimalından və Xudaq kəndinin aşağısından İlanotuna doğru hərəkət etdik.

Yolda gedərkən Qənbər Əli və Qasım bəylərlə at yarışdırdıq. Mənim atım onları keçdi. Onların nə qədər arxada qaldığını görmək üçün geriyə baxdım. Sən demə, tapqır boşalıbşmış. Yəhər çevrildi və başı üstə yerə düşdüm. Düzdür, dərhal qalxıb ata mindim, ancaq axşama qədər özümə gələ bilmədim. Bu dünya və baş verən hadisələr gözümə röya və xəyal kimi görünürdü.

Axşam, namazı vaxtında İlanotunda dayanıb bir at kəsdik və ətini şişə çəkib kabab elədik. Atlara bir az dinclik verib təkrar hərəkət etdik. Dan at-

mazdan bir az əvvəl Xəliliyyə kəndinə gəldik. Oradan Dizəkə keçdik. O zaman Dizəkdə Hafİz Məhəmməd bəy Duldayın oğlu Tahir Dulday olurdu. Yağlı ətlər, xas çörəklər, şirin qovunlar və yaxşı üzümlər bol idi. O qədər sıxıntıdan belə bolluğa və o qədər fəlakətdən belə rahatlığa qovuşduq.

Vəhmü üsrətdən əmanə tapdıq,
Yeni can, təzə cahanə tapdıq.

Ölüm vəhmi ürəkdən çıxdı, aclığın **(96 a)** şiddəti boğazımızdan dəf oldu. Həyatımızda heç bu qədər istirahət etməmişdik, rahatlığın və bolluğun dəyərini bu qədər bilməmişdik. Sıxıntılı bir həyatdan sonrakı istirahət və çətinliklərdən sonrakı hüzur daha şirin və daha yaxşı imiş. Daha sonra dörd-beş dəfə daha belə sıxıntıdan rahatlığa, çətinliklərdən hüzura qovuşmuşuq, bu, ilki idi. Beləcə, düşmən bəlasından və aclıq afətindən qurtularaq bolluq və istirahətə çatdıq. Üç-dörd gün Dizəkdə istirahət etdikdən sonra Ura-Təpə tərəfinə hərəkət etdik.

Pəşağar yoldan bir az qıraqda yerləşirdi. Bir müddət orada qaldığım üçün keçərkən gedib kəndi seyr etdim. Burada uzun müddət anam xanımın xidmətində olan Atuna rast gəldim. Biz oradan çıxanda yük heyvanı tapılmadığı üçün Səmərqənddə qalmışdı. Görüşüb hal-əhval tutdum. Səmərqənddən buraya piyada gəldiyini dedi. Anam xanımın kiçık bacısı Xubnigar xanım fani dünyaya vida etmişmiş. Bunu mənə və xanıma Ura-Təpədə xəbər verdilər. Atamın anası da Əndicanda vəfat **(96 b)** edibmiş, bunu da burada söylədilər. Xanım xan dayımın vəfatından bəri öz anasını, kiçık bacı və qardaşları olan Şah bəyim, Sultan Mahmud xan, Sultan Nigar xanım və Dövlət Sultan xanımları görməmişdi. Onlardan ayrılalı on-üç-on dörd il olmuşdu. Onlan görmək üçün Daşkəndə getdi.

Mən də Məhəmməd Hüseyn Mirzə ilə danışaraq Ura-Təpənin kəndlərindən Dihkət deyilən yerdə qışlamağa qərar verdim. Əşyaları Dihkətdə qoyub bir neçə gün sonra Şah bəyimi, xan dayımı və digər qohumlarımı görmək üçün mən də Daşkəndə yola düşdüm. Gedib Şah bəyim və xan dayımla görüşərək bir neçə gün orada qaldım. Anamın doğma böyük bacısı Mehrinigar xanım da Səmərqənddən gəldi. Anam xanım xəstələndi, çox ağır bir xəstəlikdi və çox böyük təhlükə atlatdı.

[Xoca Übeydullahin böyük oğlu] Xocakə Xoca həzrətləri də Səmərqənddən çıxmışdı və indi Fərkətdə yaşayırdı. Fərkətə gedib Xocanı gördüm.

Xan dayımın mənə diqqət və inayət edərək bir vilayət və ya bir tümən verəcəyini ümid edirdim. Ura-Təpəni vəd etdi, ancaq Məhəmməd Hüseyn Mirzə **(97 a)** vermədi. Özü vermədi, yoxsa yuxarıdan bir işarəmi oldu, onu anlamadım.

Bir neçə gün sonra Dihkətə gəldik. Dihkət Ura Təpənin dağ ətəklərindəki kəndlərindən biridir və böyük bir dağın ətəyindədir. Bu dağı keçincə Məsiha vilayəti başlayır. Əhalisi sartdır, kəndlərdə yaşayır və türklər kimi at

və qoyun sürüləri bəsləyirlər. Dihkətin qoyunlarının qırx min qədər olduğu təxmin edilir.

Bu kənddə kəndlilərin evlərinə yerləşdik. Mən kənd muxtarının evinə düşdüm. Altmış-yetmiş yaşında bir adamdı. Lakin anası hələ sağ idi. Çox yaşlı bir qadındı, yüz on bir yaşındaydı. Teymur bəy Hindistana girdiyi zaman bu qadının qohumlarından biri də o səfərə qatılmışdı, onları xatırlayır və anladırdı. Yalnız Dihkətdə bu qadının özündən doğulan oğlan və qızların, nəvə və nəvələrinin nəvələrindən doxsan altı adam hələ həyatda idi, ölənlərlə birlikdə iki yüz adam sayırdılar. Nəvəsinin nəvələrindən biri iyirmi beş-iyirmi altı yaşlarında şəvəsaqqal bir igid idi.

Dihkətdə olduğum günlərdə ətrafdakı dağları daima piyada gəzəərək seyr edirdim. Çox zaman yalın ayaq **(97 b)** gəzirdim. Yalın ayaq gəzməkdən ayaqlarım o hala gəlmişdi ki, dağı-daşı hiss eləmirdim. Belə bir gəzinti zamanı bir gün ikindi namazıyla axşam namazı arasında dar bir yoldan bir adam bir öküzlə gedirdi.

«Görəsən, bu yol hara gedir?» dedim.

«Öküzə baxın, yolun hara çıxacağı məlum olana qədər gözlərinizi ondan ayırmadan yürüyün» deyə adam cavab verdi.

Bu sözü eşidən Xoca Əsədullah «Gav güm şavəd, çe kar qunəm?»[1] deyə zarafat etdi.

Bu qış sipahilərdən bəziləri qazaxlıqlarda bizimlə ola bilmədilər, Əndicana getmək üçün izin istədilər. Qasım bəy də «Madam ki bu adamlar oraya gedirlər, Cahangir Mirzəyə özəlliklə öz paltarlarınızdan bir şey göndərin» deyə israr etdi. Bir samur sərpuşumu göndərdim. Qasım bəy «Tənbələ də bir şey göndərin, nə olar» deyə təkrar israr etdi. Gərçi buna razı deyildim, lakin Qasım bəyin israrı ilə Noyan Göyəldaşın Səmərqənddə özü üçün düzəltdirdiyi böyük yastı qılıncı alıb Tənbələ göndərdim. Mənim başıma dəyən qılınc bax bu qılıncdı. Gələn ilin hadisələrində bundan bəhs ediləcəkdir.

Bir neçə gün sonra nənəm İsən Dövlət **(98 a)** bəyim köçü, ailəsi və adamlarıyla birlikdə gəldi. Mən Səmərqənddən çıxanda onlar orada qalmışdılar.

Bu qış ortasında Şeybani xan Xocənd çayını buz üzərindən keçərək Şahruxiyyə və Beşkənd civarına axın etdi. Bunu xəbər alınca adamlarımızın azlığına baxmayaraq onlara qarşı hərəkətə keçdik. Xocəndin aşağısındakı kəndlərin və Həşt-Yəkin qarşısına doğru yürüdük. Şiddətli soyuq vardı. Bu civarda Ha-Dərviş rüzgarı əksik olmaz, daima şiddətli əsər. Soyuq o dərəcədə qüvvətli idi ki, bu iki-üç gün içində burada iki-üç adam soyuqdan ölmüşdü. Mənə qqsl zərurəti hasil oldu. Sahilləri tamamən buz tutmuş, lakin axıntının qüvvəsindən ortası buz tutmamış bir kanal suyu vardı. Bu suya girib qüsl etdim və on altı dəfə suya daldım. Suyun soyuqluğu mənə güclü təsir

---

[1] Öküz azsa, onda nə edərik (farsca). Gav+qum həm də qaranlıq deməkdir. Söz oyunu.

etdi.

Ertəsi sabah Xocənd çayını Xəslar qarşısında buz üzərindən keçib gecə yarısı Beşkəndə gəldik. Şeybani xan Şahruxiyyə civarına axın edib geri qayıtmışdı.

O vaxt Beşkənd Molla Heydərin oğlu Əbdülmənnanın əlində idi. [Molla Heydərin] ondan daha kiçık, Mömin adında bir oğlu da vardı, işə yaramaz və dərbədər bir adamdı. Mən Səmərqənddə ikən yanıma gəlmişdi və çox inayət etmişdim. Noyan Göyəldaş Səmərqənddə **(98 b)** ona qarşı necə pis rəftar etmişdisə, bu namussuz ona kin bağlamışdı.

Özbək axınçılarının geri qayıtdığı xəbəri gəlincə, xanın yanına adam göndərərək Beşkənddən qalxıb Ahəngəran kəndlərində üç-dörd gün qaldıq. Səmərqənddəki aşnalığa görə Molla Heydərin oğlu Mömin Noyan Göyəldaş, Əhməd Qasım [Kuhbər] və başqa bir neçə adamı ziyafətə dəvət etdi. Mən Beşkənddən gedəndə bunlar Beşkənddə qaldılar. Mömin bunlara bir uçurumun kənarında ziyafət vermişdi. Biz gəlib Ahəngəran kəndlərindən Sam-Sirək deyilən kənddə dayandıq. Sabah Noyan Göyəldaşın uçurumdan sərxoşluqla düşüb öldüyü xəbəri gəldi. Noyanın öz dayısı Haqnəzəri bir neçə adamla oraya göndərdim. Bunlar gedib Noyanı düşdüyü yerdə axtarıb tapdılar və Beşkənddə dəfn edib geri qayıtdılar. Noyanın ölüsünü ziyafət verilən yerdən bir ox atımı qədər yüksəkdə olan bir uçurumun dibində tapmışlar. Bəziləri Möminin Səmərqənddəki kinini unutmayaraq Noyana qəsd etdiyini düşündülər. Doğrusunu bilən olmadı. Bu mənə çox pis təsir elədi. Çox az adamın ölümünə belə yanmışam. Bir həftə-on gün qədər sürəkli **(99 a)** ağladım. Ölüm tarixi «Vəfat şod Noyan»[1] («Noyan vəfat etdi») şəklində təsbit edildi. Bir neçə gün sonra qayıdıb Dihkətə gəldim.

Yaz gələndə Şeybani xanın Ura-Təpə üzərinə hücum etməsi xəbəri alındı. Dihkət düz yerdə olduğu üçün Abbürdən keçidiylə Məsiha dağlarına çıxdıq. Məsihanın ən aşağıdakı kəndi Abbürdəndir. Bu kənddən bir az aşağıda bir çeşmə, onun da başında bir məzar vardır. Bu çeşmədən yuxarı tərəf Məsihaya, aşağı tərəf isə Pəlğərə aiddir. Bu çeşmənin başındakı və kənarındakı daşı qazaraq bu üç beyti yazdım:

Şenidəm ki, Cəmşidi-fərrux sirişt,
Ba sərçeşmə bər sənge nəvişt:

Bər in çeşmə çün ma bəsa dəm zədənd,
Birəftənd ta çeşm bərhəm zədənd.

Giriftəm aləm be mərdiyü zur,
Və leykən nəburdəm ba xud be gur[2].

---

[1] «Vəfat şod Noyan» sözlərindəki hərflərin cəmi əbcəd hesabı ilə 907 (=1501/02) edir.
[2] Sədi Şiraziyə aiddir. İlk beyt «Bustan»dan, iki beyt isə «Gülüstan»dan alınmışdır.

*Eşitdim ki, xoşxasiyyət Cəmşid*
*Bir çeşmənin başındakı bir daşa bunları yazmış:*

*«Bu çeşmədə bizdən əvvəl bir çoxları nəfəs aldılar;*
*Sonra göz açıb yumuncaya qədər köcüb getdilər.*

*İgidlik və qüvvətlə dünyayı zəbt etdik,*
*Lakin onu özümüzlə birlikdə gora apara bilmədik.*

O dağlıq bölgədə beytlərin və digər şeylərin daşa qazılması bir adətdir.

Biz Məsihada ikən şair Molla Hicri Hisar tərəfindən gəlib mənə sədaqətini bildirdi. Bu mətləni o günlərdə söyləmişdim:

Təkəllüf hər necə surət tutulsa, ondan artıqsan,
Səni can derlər, əmma bitəkəllüf candan artıqsan.
*Bir rəsim nə qədər zəhmətlə çəksələr də sən daha gözəlsən,*
*Sənə can deyirlər, lakin sən, şübhəsiz, candan artıqsan.*

Şeybani xan Ura-Təpə civarına gələrək bir az ortalığı qarışdırıb geri döndü. O, Ura-Təpə **(99 b)** üzərində ikən ailəmi Məsihada qoyub adamlarımızın az və silahsız olmasına baxmayaraq Abbürdən keçidindən aşdıq və sabah axşam yaxında olaq və fürsəti qaçırmayaq deyə Dihkət civarına gəldik. Şeybani xan tələsik geri qayıtdı. Biz də təkrar keçidi aşaraq Məsihaya gəldik.

«Belə dağdan-dağa, işsiz-gücsüz, vilayətsiz və yersiz gəzmək faydasızdır. Xanın yanına Daşkəndə gedəkmi» deyə düşündüm. Qasım bəy buna razı olmadı. O, yuxarıda bəhs etdiyim kimi, nizamı qorumaq və hamıya dərs vermək üçün Qarabulaqda üç-dörd moğolu öldürmüşdü. Ehtimal ki, bu üzdən oraya getməyə tərəddüd etdi. Bir az israr etdik, olmadı. O öz adamlarını, qardaşlarını, köçünü alıb Hisara yollandı.

Biz Abbürdən keçidindən aşaraq xanın yanına Daşkəndə yola düşdük. O sırada [Sultan Əhməd] Tənbəl qoşun çəkib Ahəngəran vadisinə gəldi. Əsgərlərinin arasında Məhəmməd Hisari adı ilə də tanınan Məhəmməd Duğlat kiçık qardaşı Sultan Hüseyn Duğlat və Qənbər Əli Sallax ilə ittifaq edib Tənbələ qəsd etmək fikrinə düşür. Tənbəl bu xəbər alınca orada qalmayaraq qaçıb xanın yanına getdi.

Biz Şahruxiyyəyə gələn gün qurban bayramıydı [=16 iyun 1502], lakin oralarda yubanmadan keçib xanın yanına Daşkəndə getdik.

Bir rübai söyləmişdim. Qafiyəsinə dair tərəddüdüm vardı. O zaman şeir **(100 a)** sənətini o qədər öyrənməmişdim. Xan təb sahibi bir adamdı, şeir söyləyirdi, gərçi uğurlu qəzəli çox deyildi. Bu rübaini xana söyləyib tərəddüdümü ərz etdim. Lakin könlümün arzu etdiyi biçimdə açıq bir cavab ala bilmədim. Hər halda o da şeir sənətiı az incələmişdi. O rübai budur:

Yad etməz imiş kişini qürbətdə kişi,
Şad etməz imiş könlünü möhnətdə kişi,
Könlüm bu qəriblikdə şad olmadı, ah,
Qürbətdə sevinməz ərmiş, əlbəttə, kişi.

Sonra öyrəndim ki, türk dilində bəzən t-d, ğ-k və q bir-birinin yerinə işlənir.

## MOĞOLLARIN TUĞ AÇMA MƏRASİMİ

Bir neçə gün sonra Tənbəl Ura-Təpəyə gəldi. Bu xəbəri alınca [Sultan Mahmud] xan Daşkənddən qoşun yeritdi. Beşkənd ilə Sam-Sirək arasında sağ və sol qol səflərini nizamlayıb parad keçirtdi.

Moğol adəti üzrə tuğ açdılar. Xan atdan endi. Bir moğol doqquz tuğu xanın önündə sancıb bir öküzün qabaq ayaq sümüyünə uzun bir ağ bez bağlayaraq əlində tutdu və üç parça uzun bezi üç tuğun quyruğundan az aşağı bağlayıb tuğ dirəyinin altından keçirdi. Bir bezin ucuna xan, bir tuğa bağlanan bezin ucuna mən, bir bezin ucuna da [xanın oğlu] Sultan Məhəmməd Xanikə **(100 b)** basdı. O moğol öküzün bez bağlanan qabaq ayaq sümüyünü əlinə alıb moğolca nəsə dedi və tuğa baxıb işarə verdi. Xan və ətrafda duranların hamısı tuğa qımız səpməyə başladılar, Bütün nəfirlər və davullar eyni anda birdən çaldı, səfdə düzülən əsgərlər hamısı birdən savaş nərəsi çəkdilər. Bunu üç dəfə təkrar elədilər, sonra atlarına minib nərə çəkə-çəkə düşərgənin ətrafında çapdılar.

Moğollar arasında Çingiz xanın yasası [tüzük] onun dövründəki kimi davam edir. Sağ və sol qollar, mərkəzlər atalarının zamanındakı kimi yerli-yerində durur. Sağ və sol qollarda kimin etibarı artıqsa o daha ziyadə baş tərəfdə durur.

Sağ qolda çıras ilə bəycik qəbilələrinin başa keçmə qovğası vardır. O zaman çırasın tümən bəyi Qaşqa Mahmuddu, çox cəsur bir igiddi. Tümən deyə məşhur olan Bəycik tüməninin tümən bəyi isə Əyyub Yaqubdu. Başa keçmək üçün mücadilə etdilər və bir-birlərinə qarşı qılınca sarıldılar. Axırda buna qərar verildi: biri sürək ovunda başda duracaq, digəri də səfdə başa keçəcək. Ertəsi sabah Sam-Sirək civarında sürək ovu keçirdilər. Oradan da Türək çarbağına gəldilər. **(10l a)**

İlk qəzəlimi o gün orada ikən tamamladım. O tamamlanan qəzəl budur:

Canımdan özgə yari-vəfadar tapmadım,
Könlümdən özgə məhrəmi-əsrar tapmadım.

Bu qəzəl altı beytdən ibarətdir. Bundan sonra tamamlanan hər qəzəl eynən bu tərtib ilə yazıldı.

Buradan mənzil-mənzil Xocənd çayının kənarına gəldik. Bir gün gə-

zinti niyyətilə suyu keçib yemək hazırladıq, igid və çöhrələri öz keflərinə buraxdıq. O gün mənim kəmərimin altın toqqasını oğurladılar. Ertəsi sabah Xanqulu Bəyanqulu ilə Sultan Məhəmməd Veys qaçıb Tənbəlin yanına getdikləri üçün hər kəs düşündü ki, bu onların işidir, lakin bu, təhqiq edilmədi.

Əhməd Qasım Kuhbər də izin alıb Ura-Təpəyə yola düşdü. Bir daha qayıtmadı və Tənbəlin yanına getdi.

FƏRQANƏ - 908 (7 İYUL 1502 - 26 İYUN 1503)

## DOQQUZ YÜZ SƏKKİZİNCİ İLİN HADİSƏLƏRİ

Xanın bu yürüşü çox faydasız bir yürüşdü. Kurqan almadan və düşmənə hücum etmədən gedib gəldi. Daşkənddə olduğum o günlərdə çox əziyyət və səfalət çəkdim. Vilayət yox idi, vilayət əldə etmək ümidi də yox idi. Adamlarımın çoxu dağıldı, qalan bir neçəsi də səfalət üzündən mənimlə qala bilmədi. Xan dayımın qapısına gedəndə bəzən bir, bəzən də iki adamla gedirdim, yaxşı ki yad deyildilər, qohum idilər. **(101 b)** Xan dayımın hüzurundan Şah bəyimin yanına öz evim kimi başı açıq, ayağı yalın gedirdim.

Axırda belə qərarsızlıqdan və sərsərilikdən bezdim, «Belə sıxıntı içində yaşamaqdansa başımı alıb getmək daha yaxşıdır, belə səfalət və şikayətlə göz önündə dolaşmaqdansa ayağımın götürəcəyi yerə qədər getmək daha yaxşıdır» dedim. Xıtaya [şimali Çin] getməyi qərara aldım və başımı alıb çıxmağa əzm etdim.

Uşaqlıqdan bəri Xıtay tərəfə getməyə həvəsim vardı, lakin səltənət və qohumlarım üzündən bu həvəsim heş cür gerçəkləşmirdi. İndi ki səltənət əldən çıxdı, anam da öz anasına və kiçık qardaşlarına qovuşdu, deməli, səyahətə mane olan şeylər aradan qalxdı və əski sıxıntılar qalmadı.

Xoca Əbülməkarimin vasitəsilə bu fikri xan dayıma çatdırdım, ancaq bu dəfə də Şeybani xan kimi bir düşmən ortaya çıxdı. Bunun zərəri türkə və moğola eyni nisbətdədir. Xalqın üzərində tam hakimiyyət qurmadan və çox böyümədən onun çarəsinə baxmaq lazım idi. Necə ki demişlər:

İmruz bekuş çü mitəvan kuşt,
Atəş ki bülənd şod cəhan suxt,
Məgər ki, ənh konəd kəmanra
Düşmən çü betir mitəvan duxt[1].

*Mümkünsə odu bugün söndür,*
*Atəş böyüsə dünyanı yaxar.*
*Bir oxla düşməni saxlamaq mümkünsə,*
*Yayını çəkməsinə imkan vermə.*

Böyük xan (Sultan Mahmud xan) dayım ilə kiçık xan (Sultan Əhməd Xan) dayım iyirmi dörd-iyirmi beş ildir bir-birlərini görməmişdilər. Mən isə onu heç görməmişdim. Görəsən, gedib kiçık xan dayımı görməyə və onun buraya gəlməsinə vasitəçilik etməyimə icazə verərlərmi? Arzum bu idi.

Bu bəhanə ilə buradan **(102 a)** çıxa bilsəm Moğolistan və Turfana getməmə heç bir maneə və qorxu qalmaz, öz yüyənim öz əlimdə olardı. Bu niyyətimi başqa heç kim bilmirdi və heç kimə də söyləyə bilməzdim. Çünki

[1] Sədi Şirazidən.

anamla bu mövzuda danışmaq mümkün deyildi, ətrafımda olan və başqa ümidlərlə mənə qoşularaq səfalət çəkən bir neçə böyük və kiçik adamıma da belə şeyləri söyləməyin heç bir mənası yox idi.

Xoca Əbülməkarim bu sözü Şah bəyimə və xan dayıma söyləyincə onlar da razı olurlar, ancaq elə fikirləşirlər ki, guya mən burada iltifat görmədiyim üçün getməyə izin istəyirəm. Ona görə də bunu namus məsələsi sayıb izin verməkdə bir az ağır tərpəndilər.

## BABURUN KİÇİK XAN DAYISININ DAŞKƏNDƏ GƏLMƏSİ

Bu əsnada kiçık dayımdan bir adam gələrək onun gerçəkdən gəlməkdə olduğu xəbərini gətirdi. Beləcə, bu niyyətim də gerçəkləşmədi. Sonra başqa bir adam gəlib kiçık xanın yaxınlaşdığını xəbər verəndə Şah bəyim, kiçık xan dayımın kiçık bacıları Sultan Nigar xanım və Dövlət Sultan xanım, mən, Sultan Məhəmməd Xanikə və Mirzə xan [Sultan Veys Mirzə] – hamımız kiçık xan dayımı qarşılamağa çıxdıq.

Daşkəndlə Sayram arasında Yağa kəndi və başqa bir neçə kənd var. İbrahim Ata və İshaq Atanın qəbrləri oradadır. Bu kəndlərə qədər getdik.

Kiçık xan dayımın nə zaman gələcəyini **(102 b)** dəqiq bilmədiyimiz üçün düşünmədən ata minib sürətlə getdim. Birdən-birə xan qarşıma çıxdı. Atı qabağa sürdüm. Mən atdan enən vaxt kiçık xan dayım başa düşdü ki, bu mənəm. Çox dilxor oldu. Sən demə, onun bir yerdə düşərgə quraraq mənimlə təntənəli bir şəraiddə görüşmək niyyəti varmış. Yaxınlaşıb atdan endim. Yer də münasib deyildi, üstəlik, diz çöküb yükünəcək zaman da qalmadı, yüngülcə yükünərək gedib görüşdüm. Canı sıxılıb əsəbiləşən dayım [oğulları] Sultan Səid xana və Baba xan sultana dərhal atdan enib mənimlə yükünərək görüşmələrini əmr etdi. Xanın oğullarından bu iki sultan da onunla gəlmişdi; on üç-on dörd yaşlarında idilər. Sultanlarla görüşüb atlanaraq Şah bəyimin yanına gəldik. Onlar gecə yarısına qədər oturub olub-bitənlər və keçmiş hadisələr barəsində danışdılar.

Ertəsi sabah kiçık xan dayım mənə moğol adətinə görə təpədən-dırnağa bir dəst paltar, öz kəmərini və yəhərli xas atını hədiyyə etdi. Moğol börkü sırmalı iplərlə işlənmiş, xalat zərli Çin atlasından tikilmiş, Çin kəməri isə əski üsulla düzəldilmişdi. Onun sol tərəfindən qadınların boyunlarına asdıqları ənbərdan və kisə kimi şeylərdən üç-dörd dənə, sağ tərəfindən də buna bənzər üç-dörd şey asılmışdı.

Oradan Daşkəndə doğru hərəkət etdik. **(103 a)** Böyük xan dayım da Daşkənddən üç-dörd ağac qədər bəri gələrək pişvaza çıxmış və bir yerdə çadırlar qurub oturmuşdu. Kiçık xan qarşıdan tərəfdən onun çadırına doğru gəldi, yaxınlaşınca xanın sol tərəfindən qövs cızaraq xanın önündə atdan endi və görüşüləcək yerə qədər doqquz dəfə hörmətlə yükünərək irəlilədi.

Kiçık xan yaxınlaşınca böyük xan da oturduğu yerdən qalxdı, onlar görüşdülər və qucaqlaşıb xeyli vaxt eləcə durdular. Qucaqlaşma bitdi, geri çəkilən kiçık xan yenə doqquz dəfə yükündü, hədiyyələrini təqdim edərkən də dəfələrlə hörmətlə diz çökdü. Sonra gəlib oturdular.

Kiçık xanın adamları tamamən moğol adətinə görə geyinmişdilər. Moğol biçimi börkləri, Çin atlasından işləməli paltarları, dana dərisindən moğol biçimi yaşıl oxdanları və yəhərləri vardı, moğol atları üstündə onlara xas olan şəkildə süslü idilər. Kiçık xanın adamları çox deyildi, mindən artıq, iki mindən bir az azdı.

Kiçık xan dayım qəribə bir adamdı. Yaxşı qılınc çalan və cəsur idi. Silahlar içində ən çox qılınca etibar edirdi. «Şeşpər, toppuz, əmud, ay-balta[1] və balta bir yerə dəysə, ancaq oraya təsir edər, amma qılınc dəydiyi yeri başdan-ayağa qədər kəsər» deyirdi. İti qılıncını heç zaman yanından ayırmazdı, ya belindən asar, **(103 b)** ya da əlində tutardı. Əyalətdə böyüdüyü üçün bir az köntöy, danışığı da bir az qaba idi.

Bir az öncə bəhs etdiyim kimi, [onun ərməğan etdiyi] bu moğol paltarı ilə kiçık xan dayımla birlikdə gəldim. Xoca Əbülməkarim isə böyük xan dayımla birlikdə idi. Məni tanımadı, «Bu hansı sultandır?» deyə soruşdu. Mən ona cavab verdikdən sonra məni tanıdı.

Daşkəndə gələr-gəlməz, xanlar Əndicana Sultan Əhməd Tənbəlin üstünə qoşun çəkərək Kəndirli keçidi yoluyla hərəkət etdilər. Ahəngəran ovasına çatanda kiçık xanla məni daha irəli göndərdilər. Keçiddən keçib Zirkan və Kəman kənarında qoşuna baxış keçirdilər, təxminən otuz minə qədər əsgər olduğu ortaya çıxdı.

Tənbəlin də öz qoşununu yığıb Axsiyə gəldiyi barədə xəbərlər alınmağa başladı. Xanlar vəziyyəti müzakirə etdilər və mənim bir dəstə əsgərlə Xocənd çayını keçərək Oş və Özgənd tərəfinə gedib Tənbəli arxadan mühasirəyə almağıma qərar verdilər.

Bu qərara uyğun olaraq Əyub Bəyciyi tüməniylə, Can Həsən Narini narinləri ilə, Məhəmməd Duğlat Hisarı və [onun kiçık qardaşı] Sultan Hüseyn Duğlatla Sultan Əhməd Mirzə Duğlatın özlərini -duğlat tüməni bunlarla deyildi- habelə Qənbər Əlini mənə qoşdular, Sarıqbaş Mirzə İtərçini isə çərikbəyi təyin etdilər.

Kernanda xanlardan ayrılıb Səkan civarından Xocənd çayını salla keçib Xukan **(104 a)** örçini Rabati-Çoban üzərindən yürüyərək Qubanı zəbt etdikdən sonra, Alayluq örçini üzərindən sürətlə Oşa doğru hərəkət etdik. Səhər vaxtı qəfildən Oş kurqanına girdik. Oş əhalisi müqavimət göstərmədən şəhəri təslim etdi. Vilayət xalqı, şübhəsiz, bizim gəlişimizi gözləyirdi. Tənbəldən qorxduqları və bizim uzaq olduğumuz üçün bir şey edə bilmirdi. Oşu ələ keçirincə Əndicanın şərqindəki və cənubundakı dağların və ovaların

[1] *Ay-balta:* təbərzin, kəsən qismi, yəni ağzı aypara şəklində olduğu üçün belə adlanır.

xalqı tamamən bizim tərəfimizə keçdi.

Əskidən Fərqanə vilayətinin paytaxtı olan Özgəndin sərhəd boyunda yaxşı bir kurqanı var. Oranın əhalisi bizə tabe olmağı qəbul edərək adam göndərib hakimiyyətimiz altına girdi. Bir neçə gün sonra mərginanlılar da öz valilərini qovaraq mənə tabe oldular. Əndicandan başqa Xocənd çayının Əndican tərəfində olan bütün kurqanları bizə qoşuldu.

O əsnada belə qarışıqlıqların yaşanmasına baxmayaraq Tənbəl hələ də bunlara aldırmadan Axsi ilə Kərnan arasında öz atlı və piyada qoşunu ilə xanlara qarşı ağac maneələr və xəndəklərlə yerini möhkəmləndirmiş halda dayanmışdı. Bir neçə dəfə o tərəflərdə kiçik çarpışmalar oldu, lakin hansı tərəfin qalib və ya məğlub olduğu anlaşılmadı.

Əndican tərəfindəki əhali, **(l04 b)** kurqanlar və vilayətlər mənə tabe olduqları üçün Əndican əhalisi də, əlbəttə ki, məni istəyir, lakin bir çarə tapa bilmirdi.

## ÇİHİL-DOXTƏRANDA ANİ BASQIN

Bir gecə Əndicanın yaxınına gedib adam göndərərək şəhərin xocaları və başbilənləri ilə danışsaq bəlkə bizi bir tərəfdən içəri buraxarlar deyə düşündüm. Bu niyyətlə Oşdan qalxıb gecə yarısı Əndicandan bir küruh məsafədəki Çihil-Doxtəranın qarşısına gəldik. Qənbər Əli bəylə bəzi igidlər bir az irəli göndərildi. Onlar gizlicə kurqana adam göndərib xocalar və başbilənlərlə danışacaqdılar. Biz də göndərilən bəyləri bekləyərək at üzərində dururduq. Bəziləri mürgüləyirdi, bəziləri da dərin yuxuya dalmışdı.

Gecənin üçüncü pəhəri olmuşdu. Birdən-birə davul səsləri və savaş nərələri duyuldu. Düşmənin az, ya çox olduğunu bilmədən qafil və yuxulu əsgər bir-birinə baxmadan anidən qaçmağa başladı.

Mən əsgəri toplamağa vaxt tapmadan düşmənə doğru cumdum. Mirşah Koçin, Baba Şirzad və Dost Nasir da mənimlə birlikdə hərəkət etdilər. Bizim bu dörd adamımızdan başqa bütün əsgərimiz qaçmağa davam etdi. Biz bir az irəliləyincə qarşımızdakılar ox atıb qışqırararaq üstümüzə cumdular. Qaşqa atı olan biri mənim lap yaxınıma qədər gəldi. Onun atını oxla vurdum, dərhal yerə yuvarlandı. Bundan sonra sanki bir az geri çəkilən kimi **(105 a)** oldular. Mənimlə birlikdə olan o üç adam belə dedilər: «Qaranlıq gecədə düşmənin az və ya çox olduğu bilinmir. Əsgərimizin də hamısı getdi. Biz dörd adam düşmənə nə edə bilərik. Yaxşısı budur ki, gedib dağılan adamlarımızı geri qaytarıb sonra vuruşaq».

Dərhal gedib əsgərə yetişdik. Lakin nə qədər vurub qamçılasaq, nə etsək də əsgəri geri qaytara bilmədik. Bu dörd adamla təkrar dönüb ox atdıq. Bir az durdular. Bir-iki dəfə bizim üç-dörd adamdan artıq olmadığımızı gördükləri üçün təkrar əsgəri təqib etməyə və atdan salmağa başladılar. Bu

şəkildə üç-dörd dəfə gedib bizim adamları saxlamağa çalışdım, ancaq onlar dayanmadılar. Belə olunca təkrar bu üç adamla qayıdıb ox ataraq düşməni qovdum. İki-üç adam əsgəri izləyərək Xarabuq və Bişamun qarşısındakı təpələrə qədər gəldik. Buraya çatanda qarşımıza Məhəmməd Əli Mübəşşir çıxdı. «Bunlar azdır, gəlin üstlərinə at salaq « dedim. Durub at saldıq, onlar dayandılar. Dağılmış olan əsgər oradan-buradan gəlib bir yerə yığıldı. Bəzi yaxşı igidlər elə dağılmışdılar ki, gedib birbaş Oşa çatmışdılar. Bu işin əsli belə olmuşdur: Əyyub Bəycik tüməninə mənsub bir neçə moğol Oşda bizdən ayrılıb yağmaçılıq etmək üçün Əndican civarına gəlmişmiş. Bizim əsgərin gurultusunu eşidərək gizlicə bir az irəli gəlib öz parollarını qışqırmışlar.

Bu parol iki cür olur. **(105 b)** Biri hər qəbilənin öz paroludur. Məsələn, bəzi qəbilələrin parolu dürdanə, bəzisininki toqqay, bəzisinin də lülüdür [inci]. İkincisi isə bütün əsgərə məxsus və sadəcə bir əməliyyat üçün işlənmək üzərə iki sözü birləşdirərək düzələn paroldur. Bu zaman qarşılaşanda biri bir sözü söyləyir, digəri də onun qarşılığı olan sözlə cavab verir. Bu şəkildə dost düşməndən ayrılır, öz adamın yabançıdan seçilir.

Bu səfər parol olaraq Daşkənd və Sayram sözləri müəyyən edilmişdi. Daşkənd deyiləndə Sayram, Sayram deyiləndə isə Daşkənd deyilməli idi. Bu qarşılaşmada Xoca Məhəmməd Əli [Kitabdar] bir az irəlidə imiş. Moğollar «Daşkənd, Daşkənd» deyə gəlirlər. Xoca Məhəmməd Əli sart idi, həyəcana qapılaraq o da «Daşkənd, Daşkənd» deyə cavab verir. Moğollar da onu düşmən sanaraq savaş nərəsi çəkərək davul çalıb ox atırlar. Bax, belə bir yanlışlıq üzündən perişan olduq və nəzərdə tutduğumuz plan gerçəkləşmədi. Təkrar qayıdıb Oşa gəldik.

## BABURUN ƏNDİCANI ƏLƏ KEÇİRMƏ TƏŞƏBBÜSÜ

Beş-altı gün sonra dağ, ova və kurqanlar təkrar mənim əlimə keçdiyi üçün Tənbəl və onun tərəfdarları dilxor olub qətiyyətlərini itirdilər, əsgərləri üç-üç, dörd-dörd dağlara və ovalara qaçmağa başladılar. Onların içindən bizim tərəfə keçən bəziləri dedilər ki, Tənbəlin işləri xarabdır, bu üç-dörd gün içində tam pozulacaq və o, geri çəkilməyə məcbur olacaq».

Bu xəbər gəlincə Əndican üzərinə hərəkət etdik. Əndican kurqanında Tənbəlin kiçık qardaşı Sultan Məhəmməd Kəlpük (Gülbəy) vardı. Tutluq yoluyla gəlib Əndicanın güney tərəfinə, Xaqan arxına **(106 a)** günorta namazı vaxtı axınçı göndərdik. Özüm də axınçıların arxasından Püşdə-Eyşin Xaqan arxı tərəfindəki ətəyinə gəldim.

Kəşfiyyatçılar Sultan Məhəmməd Kəlpükün əmrindəki adamlarıyla birlikdə şəhərin məhəllələrindən və bağlarından dışarı çıxaraq Püşdə-Eyşin ətəyinə getdiyini xəbər verdilər. Axınçılar hələ toplanmamışdı. Buna baxmayaraq dərhal düşmən tərəfinə hərəkət etdim.

Kəlpükün beş yüzdən artıq adamı vardı. Bizim adamlarımız ondan daha artıq idi, lakin əsgərimiz axına göndərilmişdi. Onunla qarşılaşanda biz də onlar qədər idik. Səf tutub nizama girməyi düşünmədən dördnala düşmən üstünə çapdıq. Yaxınlaşanda bizə müqavimət göstərə bilmədilər və bir-iki qılınc zərbəsindən sonra qaçıb dağıldılar. Onun adamlarını Xaqan qapısının yaxınına qədər atdan sala-sala təqib etdik.

Düşməni məğlub edib məhəllələrin kənarına, Xoca-Kəttəyə çatanda axşam olmuşdu. Tez qapıya yürümək niyyətindəydim. Amma yaşlı və təcrübəli böyük bəylərdən Dost bəyin atası Nasir bəy və Qənbər Əli bəy dedilər: «Artıq gecdir, qaranlıqda kurqana yaxın getmək ehtiyatsızlıq olar. Bir az geri çəkilib düşərgə quraq. Ertəsi sabah çarəsiz qalıb kurqanı necə olsa təslim edərlər». Bu təcrübəli bəylərin sözünə qulaq asaraq məhəllələrin kənarından **(l06 b)** geri qayıtdıq. Qapıya qədər getmiş olsaydıq, heç şübhəsiz, kurqanı ələ keçirərdik.

Yatsı namazı vaxtı gəlib Xaqan arxından keçərək Rabati-Ruzaq kəndinin yanında düşərgə qurduq. Tənbəlin nizamsız şəkildə qayıdıb Əndicana getməkdə olduğu xəbəri gəlməsinə baxmayaraq təcrübəsizlik üzündən qəflətə düşdük. Xaqan arxı kimi möhkəm bir arxın kənarında düşərgə qurmaq yerinə, arxdan keçib Rabati-Ruzaq kəndinin yanında düz yerdə dayanmış, qarovul və çağdavul qoymadan yıxılıb yatmışdıq. Dan ağararkən əsgər şirin yuxuda idi. Qənbər Əli sürətlə gəlib «Düşmən gəldi, qalxın!» deyə bağırdı. Belə dedi və durmadan keçib getdi.

Mən sülh dövründə belə daima paltarımı çıxarmadan yatırdım. Qalxar-qalxmaz qılıncımı və oxdanımı bağlayıb dərhal atlandım. Tuğcunun tuğ bağlamasına vaxt qalmadı, tuğu əlinə alaraq ata mindi. Düşmənin gəlməkdə olduğu tərəfə getdik. Hərəkət edərkən yalnızca on-on beş adam idik. Bir ox atımı qədər yol keçdikdən sonra düşmənin axınçısına yetişdik. Bu vaxt mənim yanımda ona qədər adam vardı. Sürətlə çapıb onlara çatdıq və ox atıb öndəki adamlarını ələ keçirərək yolumuza davam etdik. Təkrar bir ox atımı məsafə qədər təqib etdikdən sonra da mərkəzlərinə vardıq.

Sultan Əhməd Tənbəl yüzə qədər adamıyla **(107 a)** hərəkətsiz dururdu. Tənbəlin özü bir adamıyla birlikdə səfdən bir az irəlidəydi və «Vur, vur!» deyə hayqırırdı. Lakin adamlarının çoxu yan dönüb, qaçaq, yoxsa qaçmayaq deyirmiş kimi dururdu. Bu əsnada yanımda üç adam qalmışdı; bunlar Dost Nasir, Mirzəqulu Göyəldaş, Kərimdad Xudadad Türkməndi. Kamandakı oxu Tənbəlin dəbilqəsinə atdım. Əlimi təkrar oxdana apardım və xan dayımın verdiyi yaşıl boyalı, quşagir bir ox vardı, o çıxdı. Bunu atmaq istəmədim. Bunu oxdana qoyana qədər bəlkə iki ox atacaq qədər zaman keçdi. Kamana təkrar bir ox yerləşdirərək bir az irəlilədim. Yanımdakı üç adam bir az geridə qaldı.

Qarşımdakı iki adamdan biri Tənbəl imiş, o da bir az irəli yürüdü.

Aramızda böyük bir yol vardı. Mən bu tərəfdən, o da qarşı tərəfdən yola girərək yol üzərində qarşılaşdıq. Mənim sağ tərəfim düşmənə, Tənbəlin sağ tərəfi isə bizə çevrilmişdi. Tənbəlin at zirehindən başqa hər silahı tamamdı, mənimsə oxdanımla qılıncımdan başqa heç bir silahım yoxdu. Əlimdəki oxu atıb onun qalxanıyla ox qabını bir-birinə tikdim. Bu vəziyyətdə ikən onun oxu sağ buduma sancıldı. Başımda dəbilqə vardı, Tənbəl başıma vurdu. Başım qılınc zərbəsindən sərsəmləşdi **(l07 b)**. Dəbilqənin bir teli belə qopmadı, lakin başımda dərin bir yara açıldı. Qılınca əl ata bilməmişdim, qınında idi, lakin çıxarmağa vaxt qalmadı. İzdihamlı düşmən içində tək başıma qalmışdım, gözləmə zamanı deyildi və yüyəni çevirdim. Bir qılınc zərbəsi də oxdandakı oxlarıma dəymişdi. Yeddi-səkkiz addım geri dönmüşdüm ki, üç adam piyada olaraq mənə qoşuldu. Tənbəl məndən sonra Dost Nasirə də qılıncıyla hücum etmişmiş.

Bir ox atımı qədər dalımızca gəldilər.

Xaqan arxı böyük bir çaydır və dərindir. Hər yerindən keçilməz. Allah rast gətirdi və birbaş bu arxın bir keçidinə gəldik. Dost Nasirin atı bir az zəif idi, arxı keçən kimi yıxıldı. Durub onu ata mindirdik və Xarabuq ilə Fərqanə arasındakı təpə üzərindən Oşa doğru getdik. Bu təpəyə çıxanda Məzid Tağayi də gəlib bizə qoşuldu. Onun da sağ ayağına, dizindən bir az aşağıya bir ox dəymişdi. Düzdür, dəlib keçməmişdi, ancaq Oşa gələnə qədər çox əziyyət çəkdi.

Bu çarpışmada mənim yaxşı adamlarım həlak oldular. Nasir bəy, Məhəmməd Əli Mübəşşir, Xoca Məhəmməd Əli, Xosrov Göyəldaş və Numan Çöhrə burada öldülər. İgidlərdən də xeyli adam vuruldu.

## BABURUN XAN DAYILARI İLƏ GÖRÜŞMƏSİ

Xanlar Tənbəlin arxasından gəlib Əndican civarına endilər. Böyük xan qoruğnun yanında **(108 a)** nənəm İsən Dövlət bəyimə məxsus Qoş-Tigirmən adlı bağa, kiçık xan isə Baba-Təvəkkül təkkəsinin yaxınına endi. İki gün sonra Oşdan gəlib böyük xanı Qoş-Tigirməndə gördüm.

Xan o zaman mənim idarəmə girmiş olan yerləri kiçık xana vermişdi. Bəhanə olaraq da mənə belə dedi: «Şeybani xan kimi bir düşmən Səmərqənd kimi bir şəhəri alıb böyüməkdədir. Bundan dolayı da kiçık xanı nə qədər uzaq yerdən gətirtmişik. Burada barınacaq yeri yoxdur, öz vilayətləri uzaqdadır. Başda Əndican olmaq üzərə Xocənd çayının güney tərəfindəki vilayətləri kiçık xana vermək lazımdır ki, orada yurdu olsun». Sonra da başda Axsi olmaq üzərə Xocənd çayının şimal tərəfindəki vilayətləri mənə verməyi vəd etdi və buranın işi bittikdən sonra Səmərqənd vilayətini də alıb mənə verəcəklərini əlavə etdi. Ondan sonra Fərqanə bütünlüklə kiçık xanın olacaqmış. Hər halda bu sözlər məni qandırmaq üçün deyirdi. Bu işlər ol-

duqdan sonra nə olacağı bəlli deyildi. Çarəsizlik üzündən istər-istəməz razı oldum.

Böyük xanın hüzurundan çıxıb ata minərək kiçık xanı görməyə getdiyim zaman Sallax deyə bilinən Qənbər Əli bəy mənə yaxınlaşdı və dedi: «Gördünüzmü, bugün mövcud vilayətləri aldılar. Bunlarla sizin işiniz irəli getməz. **(108 b)** Oş, Mərginan, Özgənd və idarənizə girmiş olan vilayət və əhali hələ əlinizdədir. Dərhal gedib Oşa girərək kurqanları qapayın, Sultan Əhməd Tənbələ adam göndərib barışaraq moğolu vurub çıxarın və vilayətləri iki qardaş paylaşın».

Mən də belə dedim: «Bu, mümkün deyil, xanlar mənim öz qohumlarımdır. Bunlara xidmət etmək, Tənbələ padşahlıq etməkdən daha yaxşıdır». Qənbər Əli bəy sözünün təsir etmədiyini görüncə peşman olub geri qayıtdı.

Gedib kiçık xan dayımı gördüm, ilk görüşümüzə onun xəbəri olmadan getmişdim, kiçık xan atdan enməyə macal tapmamış və biz xüsusi ehtiram olmadan görüşmüşdük. Bu dəfə bir az yaxınlaşınca qaçaraq çadır iplərinin yanına qədər çıxdı. Ayağımdakı ox yarası üzündən əsaya söykənərək çətinliklə yeriyirdim. Gəlib mənimlə görüşdü, «Qardaşım, qəhrəmansınızmış» deyə əlimdən tutdu və kömək edərək çadıra götürdü. Çadır bir az kiçık idi. Əyalətdə böyüdüyü üçün çadırı və yaşayış yeri səliqəsiz və qazaxlarınkı kimi idi. Qovun, üzüm və at ləvazimatı elə çadırının içində idi.

Kiçık xanın hüzurundan çıxıb öz qərargahıma gəldim. Xan yarama baxması üçün Atikə bəxşi adlı bir moğol cərrahını göndərmişdi. Moğollar yaxşı cərraha da bəxşi deyirlər. Atikə bəxşi cərrahlıqda fövqəladə mahir idi. İnsanın beyni **(109 a)** çıxsa, müalicə edir, hər cür yara üçün köklərdən dərhal bir dərman düzəldirdi. Bəzi yaralara mərhəm kimi dərman qoyur, bəzilərinə də yemək üçün bir dərman verirdi.

Mənim budumun yarasına yandırılmış yun sürtməmi söylədi, fitil qoymadı. Bir dəfə də kök kimi bir şey yedirtdi. Özünün dediyinə görə, bir dəfə birinin ayağının incə sümüyü qırılıb dörd barmaq qədər yeri tamamən parça-parça olmuşdu. Ətini yarıb sümüklərini tamamən çıxararaq yerinə dərmanı toz halında qoymuş və o dərman sümüyü əvəz etmişdi. Belə qəribə şeylərdən çox danışdı. Vilayət cərrahları belə şeylər etməkdən acizdir.

Üç-dörd gün sonra Qənbər Əli söylədiyi sözlərdən xoflanaraq qaçdı və Əndicana getdi.

## BABURUN AXSİ ÜZƏRİNƏ GÖNDƏRİLMƏSİ

Bir neçə gün sonra xanlar ittifaq edib Əyyub Bəyciyi tüməniylə, Can Həsən Barini barin tüməniylə və Sarıqbaş Mirzəni də çərikbəyi təyin edərək iki min qədər adamı yanıma qatıb məni Axsi tərəfinə göndərdilər.

Axsidə Tənbəlin kiçık qardaşı Şeyx Bəyazid bəy və Kasanda isə

Şahbaz Karluq olurdu. O günlərdə Şahbaz gəlib Nevkənd kurqanının önündə yerləşmişdi.

Biçratanın qarşısından Xocənd çayını keçib Nevkəndə Şahbazin üzərinə axın etdik. Sabahdan bir az öncə Nevkəndə yaxınlaşanda **(109 b)** bəylər belə ərz etdilər: «Bu adam gəlişimizdən mütləq xəbər tutub, səfləri pozmadan aydınlıqda getməmiz daha uyğun olar». Bir az yavaş yürüdük. Şahbazın xəbəri yoxmuş. Biz Nevkəndə yaxınlaşdığımız vaxt eşidib, tez qaçıb kurqana girmişdi. Buna bənzər şeylər çox olur. Düşmən xəbərdar olmuşdur deyə düşünənlər fürsəti qaçırırlar. Təcrübə bunu təsdıq edir. Deyirlər ki, iş qapıya gələndə qeyrət və diqqətdə qüsura yol vermək olmaz, sonrakı peşmanlıq fayda verməz.

Dan ağarırkən kurqan ətrafında kiçık bir çarpışma oldu, lakin ciddi bir savaş olmadı. Sonra axın üçün Nevkənddən dağlara doğru, Bişharan tərəfinə getdik. Şahbaz Karluq fürsəti qənimət bilib Nevkəndi buraxdı və qaçıb Kasana getdi. Biz də qayıdıb Nevkəndə yerləşdik.

O günlərdə əsgərlər ətrafa bir neçə dəfə axın etdilər. Bir dəfə Axsinin kəndlərinə və bir dəfə də Kasana axın edildi. Şahbaz və Uzun Həsənin Mirim adlı oğulluğu onlara qarşı çıxdı, savaşdılar və yenildilər, Mirim orada öldü.

Axsinin möhkəm kurqanlarından biri də Bab kurqanıdır. Kurqandakılar Bab kurqanını qapadıb bizə adam göndərdilər. Seyid Qasım bir neçə igidlə birlikdə oraya göndərildi. **(110 a)** Onlar Axsinin yuxarı tərəfindəki kəndlərinin qarşısından çayı keçib Bab kurqanına girdilər.

Bir neçə gün sonra qəribə bir hadisə oldu. O günlərdə İbrahim Çapıq Tağayi, Əhməd Qasım Kuhbər və Qasım Xatikə Arğun Axsidə [Əhməd Tənbəlin kiçık qardaşı] Şeyx Bəyazidlə birlikdə olurdular. Tənbəl bu bəhs edilən adamlara iki yüzə qədər seçmə igid qoşaraq bir gecə ansızın Bab kurqanı üzərinə göndərir.

Seyid Qasım qəflətə düşərək ehtiyat tədbirləri görməmişdi. Bunlar kurqana varıb nərdivanla yuxarı çıxaraq qapını ələ keçirir və xəndək körpüsünü endirib yetmiş-səksən yaxşı silahlı igidi kurqana buraxırlar. Seyid Qasım ancaq o zaman bundan xəbər tutur. Gecə köynəyiylə qalxıb yanındakı beş-altı adamla birlikdə ox ataraq, vura-vura bunları dışarı çıxarır. Bir neçə adamın da başını kəsib göndərdi. Bu hadisədəki kimi bu cür qəflətə düşmək komandanlıq baxımından çox böyük bir qəbahət olsa da, az adamla silahlı bir çox igidi uğurla vurub çıxarmaq da böyük bir cəsarətdir.

Bu arada xan dayımlar Əndican kurqanının mühasirəsi ilə məşğul idilər. Kurqan əhalisi onları kurqana yaxınlaşmağa qoymurdu. İgidlər at üzərində dışarı çıxıb vuruşdular.

## BABURUN AXSİ KURQANINI ƏLƏ KEÇİRMƏ CƏHDİ

Axsidən Şeyx Bəyazid özünü bizə tərəfdar kimi göstərərək adam göndərməyə başladı və bizi israrla çağırdı. Bunun səbəbi məni hər cür hiylə ilə xanlardan ayırmaqdı. **(110 b)** Mən xanlardan ayrıldıqdan sonra onlar burada qala bilməzdilər. Bunu istəməsi böyük qardaşı Tənbəlin planı idi. Xanlardan ayrılıb bunlarla əməkdaşlığa getmək bizim üçün mümkün deyildi.

Onun bu arzusunu xanlara çatdırdım. Xanlar da oraya gedib hər hansı bir şəkildə Şeyx Bəyazidi əldə etməyimi uyğun gördüşlər. Belə hiyləgərlik bizim adət və üsulumuz deyildi. Özəlliklə arada bir əhd olsa, əhdi bu şəkildə pozmaq necə olar. Lakin ağlıma bu gəldi: hər hansı bir şəkildə Axsiyə girə bilsək, onda Şeyx Bəyazid Tənbəl ilə əlaqəsini kəsərək bizim tərəfimizə keçər, ya da iş tamam başqa səmtə yönələr və bizə də uyğun bir dövlət düşər. Biz də adam göndərdik.

Əhd və şərt bağlayıb bizim Axsiyə gəlməmizi istədi, biz də getdik. Qarşılamağa çıxdı. Kiçık qardaşım Nasir Mirzəni də yanında gətirmişdi. Bizi Axsi kurqanına götürdü. Dış kurqanda babamın imarətlərində mənə yer və məqam təyin etmişlər, oraya yerləşdim.

Tənbəl isə böyük qardaşı Bəy Tilbəni Şeybani xanın yanına göndərib itaətini bildirərək onun gəlməsini istəmişdi. O sırada Şeybani xanın gəlməkdə olduğunu bildirən məktubu alındı. Bu xəbər xanlara çatanda onlar qorxudan yerlərində qala bilməyərək Əndicandan getdilər.

Kiçık xan ədaləti və müsəlmanlığı ilə məşhur idi. Lakin Oş və Mərginan kimi onun idarəsinə girmiş olan kurqanlarda qoyduğu moğolları əhalini müdafiə etmək əvəzinə, tam əksinə, camaata əziyyət verir və pis rəftar **(111 a)** edirdilər. Xanlar Əndican üzərindən ayrıldıqdan sonra Oş və Mərginan əhalisi də hücum edərək kurqandakı moğolları tutub yağmaladı, qovub şəhərdən çıxardı.

Xanlar Xocənd çayını keçməyərək Mərginan və Kənd-Badam yoluyla qayıdıb çayı Xocənddən keçdilər. Tənbəl də xanların arxasından Mərginana gəldi. Mənsə bu vəziyyətdə qərarsız idim. Qalmaq üçün bunlara o qədər etimadım yox idi, bir zərurət olmadan Axsidən çıxmaq da yaxşı görünməzdi.

Bir sabah Cahangir Mirzə Tənbəldən ayrılaraq Mərginandan qaçıb gəldi. Mən hamamdaydım. Mirzə oraya gəldi, görüşdüm. O anda İbrahim bəy də həyəcanla içəri girdi, təlaşlı idi. Cahangir Mirzə ilə İbrahim bəy [Tağayi] dedilər: «Şeyx Bəyazidi yaxalayıb ərki ələ keçirməliyik». Gerçəkdən də, işin doğrusu bu idi. Ancaq mən «əhd elədik, indi bunu necə poza bilərik» deyə qarşı çıxdım. Şeyx Bəyazid ərkə getdi. Körpüyə adam qoymamız lazm idi, bunu da eləmədik. Belə səhvlər təcrübəsizlikdən oldu.

Dan ağararkən Tənbəl iki-üç min silahlı adamla gəlib körpüdən keçərək ərkə girdi. Əslində, mənim adamlarım çox deyildi. Üstəlik, Axsiyə girdikdən sonra bəziləri kurqanlara, bəziləri də valilik və təhsildarlıq üçün

müxtəlif tərəflərə göndərilmişdi. Axsidə mənimlə birlikdə **(111 b)** yüzdən bir az artıq adam qalmışdı. Bu adamlarımla ata minib küçə başlarında igidləri təyin edib müharibə hazırlığı görməklə məşğul olarkən Tənbəl tərəfindən göndərilən Şeyx Bəyazid, Qənbər Əli [Sallax] və Məhəmməd Dost sülh haqqında danışmaq üçün tələsik gəldilər. Savaş üçün vəzifələndirilən igidləri yerlərində qoyub danışıq üçün atamın türbəsinə endim və Cahangir Mirzəni də oraya çağırtdırdım.

Məhəmməd Dost geri qayıtdı, Şeyx Bəyazid ilə Qənbər Əli bəy gəldilər. Türbənin güney tərəfindəki eyvanında danışığa başlamaq üzərə idik, sən demə, Cahangir Mirzə ilə İbrahim Çapıq [Tağayi] bunları yaxalamağı qərara almışlar.

Cahangir Mirzə əyilərək qulağıma belə dedi: «Bunları yaxalamaq lazımdır». Mən də «Tələş etməyin; indi iş yaxalamaqdan keçdi. Görək, bəlkə sülh yolu ilə işi bir şeyə bənzədə bilərik» dedim, çünki onlar çox, biz isə azıq. Üstəlik, onlar bu üstün qüvvələri ilə ərkdə, biz isə zəif qüvvələrimizlə dış kurqanda idik. Şeyx Bəyazid ilə Qənbər Əli də bu toplantıda iştirak edirdilər.

Cahangir Mirzə də İbrahim bəyin tərəfinə baxıb onu dayandırmaq üçün işarə verdi. Amma o yanlış anladığı üçün, yoxsa anlamazlıqdan gəldiyi üçün, bilmirəm, tam tərsinə davranıb dərhal Şeyx Bəyazidi yaxaladı. Ətrafda duran igidlər də hər tərəfdən **(112 a)** yetişərək o iki adamı yaxaladılar. Artıq iş-işdən keçmişdi. Bu iki adamı birinə təhvil verib müharibə üçün atlara mindik.

Şəhərin bir tərəfi Cahangir Mirzənin məsuliyyətinə verildi. Mirzənin adamı az idi, buna görə öz adamlarımdan bir qismini ona köməyə verdim. Öncə oraya gedib hər tərəfə müharibə üçün adamlar təyin etdikdən sonra öz yerimə gəldim.

Şəhərin ortasında olduqca düz bir yer vardı. Orada bir dəstə igid qoymuşduq. Böyük bir atlı və piyada qrupu gəlib bunları oradan ataraq bir küçəyə sıxşdırmışdı. Bu vəziyyətdə ikən mən yetişdim və gələr-gəlməz dərhal atı oraya çapdım. Qarşı çıxmadan qaçdılar. Onları küçədən qovub düz yerə çıxararaq, qılıncla hücum edərkən atımm ayağına ox atdılar. Atım yıxılaraq məni düşmənin tam ortasında yerə saldı. Dərhal ayağa qalxıb bir ox atdım. Sahibqədəm Kahilin çox zəif bir atı vardı, özü atdan enib onu mənə verdi, mən də o ata mindim. Oraya adam təyin edib başqa bir küçə başına getdim. Atımın zəifliyini görən Sultan Məhəmməd Veys öz atını mənə verdi. O ata mindim.

Bu əsnada Qasım bəyin oğlu Qənbər Əli bəy də yaralı olaraq Cahangir Mirzənin yanından gəldi və dedi: «Artıq bir müddətdir ki, Cahangir **(112 b)** Mirzəni sıxışdırıb yerindən çıxardılar və Cahangir Mirzə şəhəri tərk etdi». Biz çaşıb qaldıq. Elə bu vaxt Bab kurqanında olan Seyid Qasım da yetişib

gəldi. Bu çox vaxtsız bir gəliş idi. Belə bir zamanda elə möhkəm bir kurqanı əldən buraxmaq olardımı?

«Nə edək?» deyə İbrahim bəydən soruşdum. Bir az yarası vardı, ondan, yoxsa təlaşından, əməlli bir cavab verə bilmədi.

Bir an üçün «Körpüdən keçib sonra körpünü yıxaraq Əndicana doğru gedərik» deyə düşündüm. Baba Şirzad orada çox yaxşı hərəkət etdi və «Qapıdan da zorlayaraq çıxarıq» dedi. Baba Şirzadin sözüylə qapıya doğru yürüdük. Xoca Mir Miran da o əsnada cəsuranə sözlər söylədi.

Küçə arasından gedərkən, Seyid Qasım və Dost Nasir Baqi Hız ilə çarpışdılar. Mən, İbrahim bəy [Bəycik Tağayi] və Mirzəqulu Göyəldaş bir az irəlidə idik. Qapının qarşısına çıxanda Şeyx Bəyazidin köynəyin üstündən xirqə geymiş olduğu halda, üç-dörd atlı adamla birlikdə qapıdan girməkdə olduğunu gördüm. Kirişimdəki oxu çəkib atdım, boynundan yaraladım, amma çox yaxşı bir atış idi. Təlaşla qapıdan girər-girməz sağ tərəfə dönən küçədən qaçıb getdi. Biz də onun arxasından yürüdük.

Mirzəqulu Göyəldaş bir piyadaya **(113 a)** toppuz tutuzdurdu. Bu arada başqa bir piyada Mirzəqulu keçincə İbrahim bəyə ox çəkdi. İbrahim bəy «hey-hey» deyə bağıraraq sürətlə keçincə, əsgərin çox yaxın məsafədən qoltuğuma atdığı ox mənə dəydi, kalmık zirehimin ikiqat yarpağını parçaladı. Əsgər qaçdı, amma mən də arxasından oxumu atdım.

Bu əsada bir piyada da divarın üzərindən qaçırdı, oxumu atıb börkünü divara mıxladım. Börkü divarın kənarında qaldı, amma sarığı qoluna dolayaraq getdi. Bir atlı da mənim yanımdan Şeyx Bəyazidin qaçdığı küçəyə doğru qaçırdı. Qılıncımla başına arxadan vurdum. Az qaldı atdan düşsün, küçənin divarına söykənib düşmədi, güc-bəla ilə qaçıb qurtuldu.

Oradakı atlı və piyadaları qapıya doğru qovaraq qapını aldıq. Artıq tədbir zamanı keçmişdi, çünki ərkdəki iki-üç min silahlı adama qarşı dış kurqanda cəmisi yüz-iki yüz adam vardı. Cahangir Mirzəni az əvvəl qovub çıxarmışdılar və bizim adamlarımızın yarısı da onunla birlikdə çıxmışdı. Bu hala təcrübəsizlikdən düşməmizə baxmayaraq qapıda durub «Yaxındadırsa gəlsin, birlikdə gedək» deyə Cahangir Mirzənin dalınca adam göndərildi. Lakin artıq iş bu dərəcədən keçmişdi.

İbrahim bəyin atı zəif idi, yoxsa yaralı idi, bilmirəm, mənə «Atımın halı xarabdır» dedi. Məhəmməd Əli Mübəşşirin Süleyman adlı **(113 b)** adamı orada idi, heç kim ona heç nə deməsiyi halda öz atından düşüb onu İbrahim bəyə verdi, çox mərdanə bir iş gördü.

Biz o qapıda durarkən Kül şikdarı[1] olan Kiçık Əli çox cəsarət göstərdi. O zamanlar Sultan Məhəmməd Veysin xidmətindəydi. Oşda da iki dəfə yaxşı hərəkət etdi. Mirzənin dalınca gedən adam geri dönənə qədər qapıda qaldıq. Gedən adam gəlib Cahangirin bir müddət əvvəl çıxıb getmiş olduğu

[1] *Şikdar:* hərbi bir vəzifədir.

xəbərini gətirdi. Artıq durmaq zamanı keçmişdi. Biz də hərəkət etdik. Orada bu qədər durmağımızın heç bir da faydası yox idi. Yanımızda yanlızca iyirmi-otuz adam qalmışdı. Biz hərəkət etdikdən sonra arxamızdan bir çox zirehli adam gəlib yetişdi.

Biz tam xəndək körpüsündən keçmişdik ki, o körpünün şəhər tərəfinə də düşmənin adamları yetişdi. Qasım bəyin oğlu Həmzənin anasının atası [Qasım bəyin qaynatası] Bəndə Əli bəy oradan İbrahim bəyə bağıraraq dedi: «Həmişə yüksəkdən atır və inad edirdin, dur bir az qılınc oynadaq». İbrahim mənim yanımdaydı və «Gəl, qabağını nə kəsir!» deyə cavab verdi. Ağılsız adam belə bir məğlubiyyət anında da inad edirdi. Bu, inad edəcək zamanmıydı? Durmaq və gözləmək zamanı deyildi, tez yürüdük. Düşmən bizim arxamızdan adamlarımızı qıra-qıra dördnala gəlirdi.

## BABURUN AXSİ KURQANINDAN QAÇMAŞI

Axsinin bir şeri məsafəsində Künbəd-Çəmən deyilən bir yer vardır. Oradan keçərkən İbrahim bəy mənə səsləndi. Dönüb geri baxdım: **(114 a)** Şeyx Bəyazidin bir çöhrəsi İbrahim bəyi oxla vurmuşdu. Cilovu çəkdim. Xanqulu Bəyanqulu yanımda idi. «İndi dönmə zamanıdırmı» dedi və cilovumu dartıb irəlilədi.

Səngə çatana qədər adamlarımızın çoxunu vurdular. Səng Axsidən iki şeri məsafədədir. Səng çayından keçəndən sonra arxamızda düşmənin adamları görünmədi və biz də Səng çayının sahilindən yuxarıya doğru yürüdük.

Bu vəziyyətdə səkkiz adam qalmışdıq: Dost Nasir, Qasım bəyin oğlu Qənbər Əli, Xanqulu Bəyanqulu, Mirzəqulu Göyəldaş, Şahım Nasir, Əbdülqüddüs Seydi Qara [Kuhbər], Xoca Hası və səkkizinci də mən idim.

Bu çayın yuxarısına doğru gedən yol olduqca yaxşı idi. Bu dərə ana yoldan uzaq və kimsəsizdi. Bu dərədən yuxarıya doğru yürüyəndən sonra çayı sağ tərəfimizdə buraxıb təkrar başqa bir quru dərəyə girdik. Ancaq ikindi namazı vaxtı bu dərədən düzlüyə çıxa bildik.

Düzlükdə uzaqdan bir qaraltı göründü. Yanımdakıları bir sığınaqda buraxıb özüm piyada olaraq bir təpəyə çıxıb ətrafa göz yetirdim, bir çox atlı arxamızdan sürətlə gəlib bir təpənin üzərinə çıxırdı. Çox və ya az olduqlarını dəqiqləşməyə vaxt yoxdu, atlara minərək yola düşdük. Təqib edənlər iyirmi-iyirmi beş olardı. Biz isə yuxarıda söylədiyim kimi, səkkiz adamdıq. Əgər o əsnada onların bu qədər adamdan ibarət olduğunu dəqiq bilsəydik, yaxşıca vuruşardıq. Biz bunların təqibçi olduğunu zənn etdik **(114 b)** və onların arxasından gələnlərin olacağını düşündük və bunun üçün dərhal yürüdük.

Qaçan düşmənin sayı çox belə olsa, dönüb sayı az olan təqibçiyə qarşı çıxa bilməz. Necə ki demişlər:

Səfi məğlubra huye bəsənd əst.
*Yenilmiş düşmənə bir hey səsi kifayətdir.*

Xanqulu belə bir təklifdə bulundu: «Bu iş belə olmaz, hamımızı ələ keçirəcəklər. Siz və Mirzə Kuh Göyəldaş atların arasından iki yaxşı at seçərək sürətlə gedin, bəlkə qurtula bilərsiniz». Söylədiyi yanlış deyildi. Savaş olmadığı üçün bəlkə bu şəkildə qurtulmaq mümkün olardı. Lakin içlərindən birini düşmən içində atsız qoymaq yaxşı deyildi. Amma yenə də axırda hamısı bir-bir düşmənin əlinə düşəcəkdi.

Mənim mindiyim at bir az süst idi. Xanqulu düşüb öz atını mənə verdi. Mən öz atımın üstündən sıçrayaraq ona mindim, Xanqulu da mənim atıma mindi. Bu zaman geridə qalmış olan Şahım Nasir ilə Əbdülqüddüs Seydi Qaranı vurub atdan saldılar. Xanqulu da geridə qaldı. Himayə və kömək zamanı deyildi. Atları son sürətlə çapırdıq. Atı vurulan geridə qalırdı. Dost [Nasir] bəyin atı da gücdən düşdü və geridə qaldı.

Bu mindiyim at da süstləşməyə başladı. Qənbər Əli enib atını verdi, mindim. Qənbər Əli də mənim atıma mindi və geridə qaldı. Xoca Hası topal bir adamdı, təpələrə doğru çəkildi.

Yalnızca Mirzəqulu Göyəldaş ilə mən qaldım. Atlarımızın dördnala çapmağa gücü **(115 a)** qalmamışdı, ancaq yenə də sürətlə gedirdik. Mirzəqulunun atı da süstləşməyə başladı. «Səni buraxıb hara gedim, yürü, ölümdə da, dirimdə də birlikdə olaq» dedim və bir müddət Mirzəquluya ayaq uyduraraq yürüdüm. Axırda Mirzəqulu dedi: «Mənim atım gücdən düşüb, yürüyə bilməz. Siz mənə görə yaxalanmayın, gedin. Bəlkə qurtula bildiniz». Bu mənə çox ağır gəldi. Mirzəqulu da geridə qaldı. Mən yalnız qaldım.

Düşməndən iki adam ortaya çıxdı. Birinin adı Baba Sayrami, digərinin adı isə Bəndə Əli idi. Mənə bir az daha yaxınlaşdılar. Atım heydən düşmüşdü, dağa qədər isə bir küruha yaxın məsafə vardı. Qarşıma bir daş yığını çıxdı. «Atım yorulub, dağ da bir az uzaq, hara gedə bilərəm ki? Oxdanımda iyirmi qədər ox var, bari enib bu daş yığınında oxlarım bitən qədər vuruşum» deyə bir an düşündüm. Sonra ağlıma «Bəlkə dağa yetişə bilərəm, dağa çıxdıqdan sonra bir qədər oxu belimə sancıb dağa dırmanaram» düşüncəsi gəldi. Çevikliyimə çox güvənirdim. Bu niyyətlə davam etdim. Atımın çabuq qoşacaq halı qalmamışdı. Bunlar da bir ox atımı məsafəyə qədər yaxınlaşdılar. Mən də oxumu atmağa qıymadım **(1l5 b)**. Bunlar da çəkindilər və daha artıq yaxınlaşmadılar, amma bu şəkildə arxamdan gəlməyə davam etdilər.

Günəş batarkən dağa yaxınlaşdım. Anidən bağırdılar: «Belə hara gedirsiniz? Cahangir Mirzəni ələ keçirdilər. Nasir Mirzə də onların əlindədir».

Bu sözlərlə xeyli təlaşlandım, çünki hamımız düşmən əlinə düşsək, təhlükə ehtimali çox idi. Cavab vermədən dağa doğru yürüməyə davam etdim. Xeyli yol getmişdim ki, təkrar səslənməyə başladılar. Bu dəfə əvvəlkindən daha mülayim danışdılar. Atdan enərək səsləndilər. Bunların sözünə

qulaq asmadan yürüməyə davam etdim.

Dərədən yuxarıya doğru gedirdim. Yatsı namazına qədər yürüdüm. Axırda bir ev böyüklüyündə bir daşın yanına çatdım. Daşın yanından dolandım. Uçurumlar başladı, at gedə bilmədi. Onlar da atdan endilər. Hörmət və sayğı göstərib daha mülayim olaraq sözə başladılar. «Gecə qaranlıq, yol da yox, belə hara gedirsiniz» dedilər, «Sultan Əhməd bəy sizi padşah edər» deyə and içdilər.

Mən də belə dedim: «Mənim ona güvənim yoxdur, oraya getmək mənim üçün mümkün deyil. Amma sizin mənə bir xidmət göstərmək niyyətiniz varsa, **(116 a)** illərcə arayıb tapa bilməyəcəyiniz xidmət budur: mənə xanların yanına gedən yolu göstərin. Sizə istədiyinizdən daha artıq iltifat və şəfqət göstərərəm. Bunu edə bilməsəniz, gəldiyiniz yolla qayıdın. Qoy mənə nə olursa-olsun. Bu da yaxşı bir xidmətdir».

«Kaş gəlməmiş olaydıq. Madam ki gəldik, sizi necə belə buraxıb gedək? Madam ki gəlmirsiniz, haraya getsəniz, xidmətinizdə olacağıq» dedilər.

«Elə isə sözünüzün doğruluğuna and için» dedim.

Quran üzərinə böyük and içdilər. Bundan sonra mənə də inam gəldi.

Mənə dərənin yaxınındakı sırtlardan bir dərə yolu göstərdilər.

«O zaman bu yolda qabağa siz keçin» dedim. Gərçi and içmişdilər, amma yenə onlara tam inanmırdım. Onları qabağıma qatıb arxalarından yürüdüm. Bir-iki küruh yol getdik, qabağımıza bir çay çıxdı.

«Geniş dərə yolu bu olmasın» dedim.

Buna ehtimal vermədilər və «O yol çox irəlidədir» dedilər, lakin geniş dərə yolu ora imiş və onlar mənə xəyanət edib gizləmişlər.

Gecə yarısına qədər yürüyüb təkrar bir çaya çatdıq, onlar «Biz səhv etmişik, geniş dərə yolu geridə qalıb» dedilər. «Elə isə nə edək?» dedim. «Önümüzdə Gavə yolu yaxındır, o yolla Fərkətə çıxmaq olar» dedilər **(l16 b)** və o yola girdilər. Gecənin üç pasına[1] qədər yürüdük və Gavədən keçən Kərnan çayına gəldik.

«Siz burada gözləyin, mən gedib Gavə yoluna baxıb gəlim» dedi Baba Sayrami və bir müddət sonra gəlib belə söylədi: «Moğollardan bir neçə adam bu yola gəlib, buradan keçmək olmaz».

Bu sözü eşidərək əndişəyə düşdüm. Vilayət içində idik, sabah yaxınlaşmışdı və hədəfimiz də uzaqdı.

«Bir yerə götürün ki, gündüz orada gizlənib gecə olunca atlarımızla Xocənd çayını keçərək o tərəfdən Xocəndə doğru gedək» dedim.

«Burada bir təpə var, orada gizlənmək mümkündür» dedilər.

Bəndə Əli Kərnanın darğasıydı. «Atlarımızın və özümüzün boğazını düşünmək lazımdır. Mən Kərnana gedib nə tapa bilsəm gətirim» dedi. Ora-

[1] *Pas:* günün səkkizdə birinə verilən ad, yəni üç saat.

dan dönüb Kərnana doğru getdik. Kərnana bir küruh məsafədə dayandıq. Bəndə Əli getdi, biz də orada gözlədik. Sabah yaxınlaşırdı, o isə hələ də gəlmirdi. Çox təlaşa düşdük.

Dan yeri ağaranda Bəndə Əli tələsik gəldi. Üç çörək gətirmiş, lakin atlara heç bir şey gətirməmişdi. Hər birimiz bir çörəyi qoynumuza qoyub təlaşla dönərək təpənin üstünə çıxdıq. Atları bir dərədə bağlayıb hərəmiz bir tərəfə, yüksək bir yerə çıxıb ətrafa göz qoymağa başladıq.

Günortaya yaxın **(117 a)** Əhməd Quşçu dörd atlıyla birlikdə Gavədən Axsiyə doğru gedirdi. Bir an üçün Əhməd Quşçunu çağırıb vədlərlə şirnikdirərək atlarını almağı düşündüm, çünki atlarımız bütün gecə-gündüz savaş və qaçışda idi, üstəlik, yem də tapılmadığı üçün haldan düşmüşdülər. Lakin qəlbim narahat idi, onlara güvənə bilmədim.

Yanımdakılarla qərara qldıq ki, bu gecə onlar Kərnana gedəcək, gecə gizlincə girib atları çıxaracaqlar ki, bizi bir yerə qədər götürə bilsinlər.

Günorta olmuşdu, uzaqda, amma gözlə görünən bir yerdə, bir atın üstündəki bir şey günəş şüalarıyla parlayırdı. Nə olduğunu heç cür başa düşmədik. Sonra anladıq ki, o, Məhəmməd Bakir bəymiş. Axsidə bizimlə birlikdəydi. Axsidən çıxanda hərə bir tərəfə getmişdi, Məhəmməd Bakir Bəy də bu tərəfə gəlib gizlənərək yürüyürmüş.

Bəndə Əli ilə Sayrami dedilər ki, atlar iki gündür acdır. Ovaya enib atları ota salaq. Oradan atlara minərək ovaya endik və atlarımızı ota saldıq.

İkindi namazı vaxtı atlı bir adam bizim gizləndiyimiz təpəyə çıxırdu. Onu tanıdım və Gavənin böyüyü Qədirverdi olduğunu anladım. Yanımdakılara dedim ki, Qədirverdini çağırsınlar. Çağırdılar, o da gəldi. Görüşüb hal-əhval tutduqdan sonra inayət və şəfqət sözləri söyləyib, vədlərdə bulunub şirnikdirərək urğan, oraq, balta və suyu keçmək üçün lazım olan əsbabla birlikdə atlara yem, özümüzə yemək **(117 b)** və əgər mümkünsə at da gətirməsini söyləyib göndərdik, yatsı namazı vaxtında həmin yerə gəlməsini qərarlaşdırdıq.

Axşam namazı vaxtında atlı bir adam Kəman tərəfindən Gavəyə doğru keçib gedirdi. «Kimsən?» deyə soruşduq, o da bir ad deyib cavab verdi. Sən demə, bu adam Məhəmməd Bakir bəyin ta özü imiş. Günorta gördüyümüz yerdən ayrılmış və gizlənmək üçün başqa bir yerə gedirmiş. Səsini elə dəyişdirmişdi ki, illərlə mənim yanımda qalmasına baxmayaraq heç tanıya bilmədim. Onu tanıyıb özümüzə qoşsaydıq, yaxşı olardı. Onun keçib getməsinə çox üzüldük. Qədirverdi Gavaniyə vət etdiyimiz yerdə qala bilmədik.

Bəndə Əli belə dedi: «Kərnanın məhəllələrində kimsəsiz bağlar var. Heç kim ağlına gətirməz ki, biz orada olarıq. Oraya gedib Qədirverdiyə adam göndərək, oraya gəlsin».

Bu niyyətlə atlara minib Kərnanin məhəllərinə gəldik. Qışdı və çox soyuq idi. Əski bir quzu dərisi tapıb gətirdilər, geydim. Bir çanaq darı şorba-

sı gətirdilər, içdim. Çox rahat oldum.

«Qədirverdiyə adam göndərdinmi?» deyə Bəndə Əlidən soruşdum.

«Göndərdim» dedi. Lakin bu alçaq həriflər onunla gizlicə danışaraq onu Axsiyə Tənbəlin yanına göndərmişlər.

Divarla çevrilmiş bir evə girdim və od qalayıb bir müddət yuxuya daldım. Bu həriflər nökərlik edib mənə təkrar belə dedilər: «Qədirverdidən xəbər almadan buradan hərəkət edə bilmərik. Bura məhəllə arasıdır, kənarda kimsəsiz bağlar var. Oraya **(l18 a)** getsək, heç kim bizim orada ola biləcəyimizi ağlına belə gətirə bilməz».

Gecə yansı ata minib kənar bağa getdim. Baba Sayrami divar üzərindən ətrafı gözətləyirdi. Günortaya yaxın divardan enib yanıma gələrək dedi: «Yusif darğa gəlir».

Buna çox üzüldüm və «Öyrən gör, mənim burada olduğumu bilərəkmi gəlir» dedim.

Çıxdı və danışdıqdan sonra gəlib belə dedi: «Yusif darğa deyir ki, Axsi qapısında qarşıma bir piyada çıxdı və padşahın Kərnanda filan yerdə olduğunu söylədi. Mən də başqaları bilmədən bu piyadanı müharibədə əlimə düşən Vəli Xəzinə[çi] ilə birlikdə bir yerə gizlədim, sonra da sizin yanınıza qoşdum. Bəylərin bu işdən xəbəri yoxdur».

«Sən nə düşünürsən?» deyə soruşdum.

«Bu adamlar hamısı da nökərlərinizdir, sizə nə eləyə bilərlər ki? Getmək lazımdır. Sizi padşah edəcəklər» dedi.

«Bu qədər qovğadan və savaşdan sonra necə etimad edib gedə bilərəm» dedim.

Biz belə danışarkən Yusif gəlib önümdə iki dizi üstünə çöküb dedi: «Sizdən nə gizlədim, bundan Sultan Əhməd bəyin xəbəri yoxdur. Şeyx Bəyazid bəy sizin xəbərinizi alıb məni göndərdi».

Belə deyincə mənə qəribə bir hal oldu. Dünyada can qorxusundan daha pis bir şey yox imiş. «Doğrusunu söylə, iş bir az başqa isə gedib abdəst alım» dedim.

Yusif and içdi, lakin onun andına kim inanar **(l18 b)**. Özümdəki taqətsizliyi düşündüm. Qalxıb bağın bir guşəsinə gedib öz-özümə düşünərək, «İnsan min il də yaşasa, axırda öləcək» dedim:

Əgər səd sal mane, var ya ki ruz,
Bibayəd rəft əz in kahi diləfruz.
*İstər yüz il, istər bir gün qal,*
*Bu könül aydınladan köşkü tərk edəcəksən.*

Ölümü qəbul etdim. Bu bağdan bir su axırdı. Abdəst aldım. İki rükət namaz qıldım. Başımı münacata qoyub dilək dilərkən yuxuya dalmışım.

Röyamda Xoca Yəhyanın oğlu və Xoca Übeydullah həzrətlərinin nəvəsi olan Xoca Yaqub ağ və qara nişanlı bir ata minmiş olaraq izdihamlı bir

camaatla birlikdə qarşıma çıxdı. Mənə belə dedi: «Qəm yeməyin, məni sizin yanınıza Xoca Əhrar göndərdi və dedi ki, biz ona kömək göndərib padşahlıq məqamına oturtmuşuq, bir yerdə çətinə düşsə, bizi göz önünə gətirib yad etsin, biz orada hazır olarıq. Bu anda belə şans hələ sizin tərəfinizdədir. Başınızı qaldırın və yuxudan oyanın». Bu vəziyyətdə sevinclə oyandım.

Yusif darğa və yanındakılar öz aralarında danışıb belə deyirdilər: «Bəhanələr tapıb hiylə eləyir, tutub bağlamaq lazımdır».

Bu sözü eşittim və «Siz belə danışırsınız, yaxınlaşın görüm, hansınız mənə yaxınlaşa bilərsiniz» dedim. Tam bu sözü söylərkən, bağın divarının dışından izdihamlı bir atlı qafiləsinin ayaq səsləri gəldi **(119 a)**

«Əgər bizimlə birlikdə Tənbəlin hüzuruna getsəydin, bizim işimiz düzələrdi. İndi isə sizi yaxalamaq üçün bu qədər adam gödərib» deyən Yusif darğa bu səslərin Tənbəlin göndərdiyi adamların səsi olduğunu təxmin etdi. Bunu eşidincə təlaşım lap artdı və nə edəcəyimi bilmədim.

O anda bu atlılar bağın qapısını aramaq üçün vaxt itirmədən əski divarın bir yerindən bir dəlik açaraq içəri girdilər. Baxdım ki, onlar mənə candan bağlı olan adamlarımdır. Qutlu Məhəmməd Barlas və Babayi-Pərgari yanlarında on beş və ya iyirmi adamla gəlib yetişmişdi. Yaxınlaşanda özlərini atlardan yerə atdılar və uzaqdan hörmətlə əyilib sayğı göstərərək ayaqlarıma qapandılar. O anda mənə qəribə bir hal oldu, sanki Allah mənə yenidən can vermişdi.

Mən gələnlərə «Bu Yusif darğanı və yanındakı xain hərifləri yaxalayıb bağlayın» dedim. Bu həriflər qaçmışdılar, amma onlardan birini bir yerdə yaxalayaraq bağlayıb gətirdilər.

«Siz hardan gəlirsiniz və necə xəbər aldınız?» deyə soruşdum.

Qutlu Məhəmməd Barlas belə anlatdı: «Axsidən qaçıb çıxarkən, sizdən ayrıldıqdan sonra Əndicana gəldim. Xanlar da Əndicana gəlmişdilər. Mən bir röya gördüm. Rüyamda Xoca Übeydullah mənə dedi ki, Babur padşah Kərnan **(1l9 b)** deyilən kənddədir, gedib onu gətirin. Padşahlıq məqamı ona verilmişdir. Bu röyanı gördükdən sonra sevinərək böyük və kiçik xana ərz etdim və dedim ki, mənim beş-altı kiçık qardaşım və oğlum var, bunlara bir neçə igid qoşun, mən də Kərnan tərəfinə gedib xəbər alım. Xanlar biz də onun o tərəfə getmiş olacağını düşünürük, deyərək yanıma on adam təyin etdilər və o tərəfə gedib yaxşıca araşdıraraq bir xəbər al, heç olmasa, o tərəfdə bir xəbər tapa bilərsən, dedilər. Biz belə danışarkən Babayi-Pərgari mən də gedib axtarım, dedi və o da iki igid kiçik qardaşı ilə birlikdə bizə qoşuldu. Bugün üçüncü gündür ki, yoldayıq. Əlhəmdülillah, sizi tapdıq».

Sonra isə dedilər ki, indi darhal ata minin və bu bağlananları da alaraq gedək. Burada durmaq yaxşı deyildir. Tənbəl sizin buraya gəldiyinizdən xəbər tutub. Tez buradan gedək və xanlara qoşulaq.

Dərhal ata minib Əndican tərəfinə yola çıxdıq. İki gündən bəri heç ye-

mək yemirdım. Günorta namazı vaxtı bir qoyun taparaq gedib bir yerdə fasilə verdik və kabab bişirdilər. Bu kababdan doyunca yedim. Ondan sonra atlara minib beş günlük yolu iki gün və iki gecədə sürətlə gedib Əndicana girdik. Orada böyük və kiçik xan dayılarımla görüşdüm, başımdan keçənləri tam şəkildə onlara danışdım.

Dörd ay xanların yanında qaldım. Hər tərəfə **(120 a)** dağılan adamlarım yığıldılar. Üç yüzdən bir az artıq adam vardı. «Madam ki bu Fərqanə vilayətində yersiz və yurdsuz olaraq yaşamam lazımdır, mən də başımı alıb başqa bir tərəfə gedim» deyə düşündüm və məhərrəm ayında Xorasana getmək niyyətilə Fərqanə vilayətindən yola çıxdım[1].

## II. KABİL

[1] Baburun xatirələri 908-ci ilin hadisələri başa çatmadan burada kəsilir, 909-cu ilin hadisələri isə bütünlüklə yoxdur. Həmin çatışmayan dövrdə bu hadisələr baş vermişdir: 909-cu ildə Əndican Baburun dayıları olan iki moğol xanının əlində, Babur özü dayılarının yanında olmuşdur. Tənbəlin vəziyyəti çox pisləşmiş, Fərqanədə qala bilmək üçün Şeybaniyə tabe olmağı qəbul edərək onu köməyə çağırmışdır. Şeybani xan savaşda moğol xanlarını məğlub etmiş, ancaq onları öldürməmiş, onların soyundan qızlar alaraq xanları buraxmışdır. Məqsədi moğolları öz ordusuna qatmaqdır.

Bu savaş zamanı dayılarının ordusunda olan Babur qaçmağı bacarmış və Şeybani onu yaxalaya bilməmişdir. Babur qaçıb Fərqanənin cənubundakı dağlarda gizlənmişdir. Şeybani xan Daşkəndi və Seyhunun sağ sahilindəki bir çox yeri də almışdır. Sonra Bəlxdə Bədiüzzaman Mirzənin üstünə hücum edib şəhəri bir neçə ay mühasirədə saxlamış, lakin ala bilməmişdir. Daha sonra Tənbəli Əndicanda ələ keçirmiş və öldürmüşdür. Bundan sonra Fərqanəyə bütünlüklə hakim olmuşdur.

Babur isə Fərqanənin cənubundakı dağlardan Xorasana getməyi qərara almışdır. Bu zaman onun yanında üç yüzdən bir az artıq adam olmuşdur.

KABİL - 910 (14 İYUN 1504 - 4 İYUN 1505)

## DOQQUZ YÜZ ONUNCU İLİN HADİSƏLƏRİ

Məhərrəm ayında [=1504 iyun-iyul] Xorasana getmək niyyətilə Fərqanə vilayətindən çıxıb Hisar vilayətinin yaylalarından olan İlək yaylasına endim. Orada iyirmi üç yaşıma girərkən ilk dəfə təraş oldum.

Hər hansı bir ümidə qapılaraq mənimlə birlikdə gələnlərin sayı böyük-kiçık iki yüzdən bir az artıq, üç yüzdən bir az azdı. Çoxu piyadə idi. Əllərində zopa, ayaqlarında çarıq və üstlərində çuldan başqa heç bir şeyləri yox idi. Səfalət o dərəcə idi ki, yalnızca iki çadırımız vardı. Mənim çadırım validəmə təxsis edilmişdi. Mənə isə hər getdiyimiz yerdə bir alaçıq qururdular və mən bu alaçıqda otururdum.

Gərçi Xorasana getmək niyyətilə yola çıxmışdıq, lakin bu vəziyyətdə bu vilayətdən və Xosrov şahın adamlarından ümidlənirdik. Hər neçə gündən bir bir adam gəlib vilayət və xalqdan xəbər gətirir, biz də ümidə qapılırdıq.

Bu əsnada Xosrov şahın yanına elçi olaraq göndərilən Molla Baba Pəşağari gəldi. Xosrov şahdan qəlbəyatan bir söz gətirməsə də əhalidən gətirdiyi sözlər **(120 b)** ümidverici idi.

İləkdən ayrılıb üç-dörd mənzildə gecələdikdən sonra Hisar civarında Xocaimad deyilən yerdə düşərgə qurduq. Orada ikən Mühib Əli Qurçu Xosrov şahın elçi olaraq gəldi. Xosrov şah kərəmi və səxavəti ilə məşhur idi, ancaq iki dəfə onun vilayətindən keçdiyimiz halda başqalarına elədiyi insaniyyəti bizə göstərmədi. Amma əhalidən və vilayətdən ümidvar olduğumuza görə hər mənzildə bir müddət qalırdıq.

O zaman ən böyqk adamımız Şirim Tağayi idi, onun da Xorasana getmək istəməyərək bizdən ayrılmaq niyyəti vardı. Sərpüldə məğlub olaraq Səmərqəndə döndüyüm zamanda da ailəsini uzaqlaşdırmış və qalanın müdafiəsində yalnız özü qalmışdı. Çox alçaq bir adamdı. Daha öncə də bir neçə dəfə belə hərəkətlərdə bulunmuşdu.

Qabadiyana gələndə Çağanyanı, Şəhri-Səfanı və Termizi əlində tutan, Xosrov şahın kiçık qardaşı Baqi Çağanyani Qarşı xatibini göndərib mənə öz sədaqətini bildirərək bizə qoşulmaq istədi və Amu çayını [Amu-Dərya] Ubaç keçidindən keçən zaman gəlib bizə qoşuldu.

Baqinin xahişi ilə Termiz qarşısına gəldik və sonrasında bütün köçlərini Amudan keçirib bizimkilərə qatılmasının ardından da Xosrov şahın qardaşı oğlu, Baqinin oğlu Əhməd Qasımın idarəsindəki Kahmərd və Bamyan tərəflərinə hərəkət etdik. Niyyətimiz Kahmərdin Əcər adlı dərə kurqanında ailə və adamlarımızın **(121 a)** təhlükəsizliyini təmin etmək, sonra da vəziyyətə görə hərəkət etmək idi.

Aybəkə gələndə əvvəlcə mənim yanımda olan, yaxşı qılınc çalan və

bu qarışıqlıqda məndən ayrılıb Xosrov şahın yanına gedən Yarəli Bilal bir neçə igidlə birlikdə qaçıb gəldi və Xosrov şahın moğollarından da sədaqət sözləri gətirdi.

Dəreyi-Zindana gələndə isə Sallax dedikləri Qənbər Əli bəy də qaçıb gəldi. Üç-dörd mənzildə dayandıqdan sonra Kahmərdə gəldik. Ev və ailələri Əcər kurqanına yerləşdirdik.

Əcərdə ikən Cahangir Mirzə ilə Sultan Mahmud Mirzənin Xanzadə bəyimdən olan qızının nikahları kəsildi. Cahangir Mirzə onu əvvəlcə hələ mirzələr sağkən istəmişdi.

Bu sırada Baqi Bəy mənə dəfələrcə dedi ki, bir vilayətə eyni anda iki padşah və bir əsgərə iki komandan qarışıqlığa və xarablığa səbəb olur, fitnə və pərişanlığa aparır, necə ki demişlər:

Dəh dərviş dər kilime bexoftənd,
Dü padşah dər iqlime nəqoncənd,
Nim nane gər xurənd mərdi-xuda,
Bəzli dərvişan konəd nimi-digər,
Mülki-iqlime bigərəd padşah
Həmçinin dər bəndi iqlimi-digər.

*On dərviş bir kilim üstündə yatar,*
*Lakin iki padşah bir iqlimə sığmaz.*
*Dindar adam bir çörəyin yarısını öz yesə*
*Digər yarısını kasıblara verər.*
*Bir iqlim mülkünü tutan padşah*
*Digərlərini də zəbt etmək fikrinə düşər.*[1]

Elə ümid edirdik ki, bugün-sabah Xosrov şahın yanında bulunan bütün adamları gəlib padşahın xidmətinə girəcəklər. Lakin orada Əyyubun [Bəycik] oğulları və digərləri kimi **(121 b)** bir çox fəsadçılar vardı ki, onlar bizim mirzələrin arasında daima pislik və fitnənin səbəbkarı və təhrikçiləri idilər. İndi bu zaman Cahangir Mirzənin Xorasan tərəfinə getməsinə xoşluq və gözəlliklə izin verilməli idi ki, gələcəkdə təəssüf və peşmanlığa səbəb olmasın.

Lakin qohum-qardaşdan bəzi qəbahətlər görsəm də, onların mənim üzümdən zərərə uğramalarını istəmək mənim təbiətimə xas deyildi. Düzdür, Cahangir Mirzə ilə aramızda əvvəlcə mülk, səltənət və adamlar üzündən inciklik, qovğa və gurultu çox olmuşdu, lakin bu dəfə o, vilayətdən mənimlə birlikdə gəlmişdi, qardaş və xidmətçi vəziyyətində idi, bugünlərdə də ondan incikliyə səbəb olacaq heç bir şey görmürdüm. Ona görə də Baqi bəy o sözü təkrar-təkrar söyləsə də, mən qəbul etmədim. Axırda Baqi Bəyin dediyi kimi, Yusif Əyyub və Bəhlul Əyyub kimi fitnəkarlar mənim yanımdan qaçıb Cahangir Mirzənin yanına getdilər, pisliklə, fitnə ilə uğraşaraq Cahangir

[1] Sədi Şirazidən.

Mirzəni məndən ayırıb Xorasana apardılar.

## SULTAN HÜSEYN MİRZƏDƏN GƏLƏN MƏKTUBLAR

O zaman Sultan Hüseyn [Bayqara] Mirzədən [oğlu] Bədiüzzaman Mirzəyə, mənə, Xosrov şaha və Zünnuna [bəy Arğun] eyni məzmunda uzun **(122 a)** məktublar gəldi. O məktublar hələ də məndədir.

Məktublarda belə deyilirdi: [Əbu Səid Mirzənin oğulları] Sultan Əhməd Mirzə, Sultan Mahmud Mirzə və Uluğ bəy Mirzə qardaşlar birləşib mənim üstümə hücum çəkəndə Murqab sahilini gücləndirmişdim. Mirzələr də yaxınlaşdıqları halda heç bir şey edə bilmədən geri qayıtmışdılar. İndi əgər özbəklər hərəkətə keçsələr mən yenə Murqab sahilini tutum, Bədiüzzaman Mirzə isə Bəlx, Şaburqan və Əndəhud kurqanlarına inanılmış adamlarını qoyub özü Gürzüvan, Dəreyi-Zəng və o dağlıq bölgəni tutsun. Mənim də bu civara gələndən xəbərdar olmuş, «sən də Kahmərd, Əcər və civardakı dağ ətəklərini tut» deyə yazmışdı. Xosrov şah da Hisar və Qunduz kurqanlarına inanılmış adamlarını qoyub kiçık qardaşı Vəli ilə birlikdə Bədəxşan və Xutlan dağlarını tutsunlar. Onda özbəklər heç bir şey edə bilmədən geri qayıdacaqlar.

Sultan Hüseyn Mirzədən gələn bu məktublar ümidsizliyə səbəb oldu, çünki Teymur bəyin yurdunda o dönəmdə yaş, vilayət və əsgər baxımından ondan daha böyük bir padşah yoxdu. Mən gözləyirdim ki, onun elçiləri və qasidləri dalbadal dələrək belə əmrlər gətirəcəklər: «Termiz, Kilif və Kərki keçidlərində **(l22 b)** gəmiləri belə düzəldin, körpü materialını bu miqdarda hazırlayın, yuxarıdakı Doqquz-Ölüm keçidlərini möhkəm qoruma altına alın ki, neçə ildən bəri özbəklər üzündən cəsarətini itirmiş olan xalqın könlünə qüvvət gəlib ümidvar olsun».

Teymur bəyin taxtında oturan Sultan Hüseyn Mirzə kimi böyük bir padşah düşmən üzərinə yürüməyi düşünmədən yalnız müdafiə olunma lüzumundan bəhs edirsə, daha xalqda necə bir ümid qala bilərdi.

Bizimlə birlikdə gələn ac adamların ailələrini, Baqi Çağanyani və oğlu Məhəmməd Qasımın mövcud sipahi və aymaqlarının köç və mallarının hamısını Əcərdə qoyub əsgərləri götürüb çıxdıq.

Xosrov şahın yanındakı moğollardan «Bütün moğol ulusu olaraq padşahın tərəfini tuturuq, Talikandan köç edib İşkəmiş və Fülul tərəflərinə doğru hərəkət edirik, qoy padşah da çalışıb tez gəlsin, Xosrov şahın adamlarının çoxu padşahın xidmətinə girəcəkdir» şəklində xəbərlər gətirən adamlar gəlməyə başladı.

Bu zaman Şeybani xanın Əndicanı alıb Hisar və Qunduz üzərinə qoşun çəkməsi xəbəri gəldi. Xosrov şah bu xəbəri eşidincə Qunduzda qalmayaraq bütün adamını alıb **(123 a)** Kabilə doğru getdi. Xosrov şah Qunduzu

qoyub çıxar-çıxmaz, Molla Məhəmməd Türküstani adında çox etibar etdiyi köhnə bir adamı da Qunduzu Şeybani xana qarşı gücləndirdi.

Biz Səmtu yoluyla Qızılsu tərəfinə gələndə Xosrov şaha tabe olan, Hisar və Qunduzda bulunan moğol ulusu köçləri ilə birlikdə gəlib bizə qoşuldu. Daha əvvəl də haqqında dəfələrlə söz açdığım Qənbər Əli moğol [Sallax] gəvəzə bir adamdı. Xasiyyəti Baqi bəylə [Çağanyani] tutmadı və Baqi bəyin xatiri üçün getməsinə izin verdim. [Qənbər Əlinin] oğlu Əbdüşşükür isə o zamandan bəri Cahangir Mirzənin xidmətində qaldı.

## XOSROV ŞAHIN BABURUN XİDMƏTİNƏ GİRMƏSİ

Xosrov şah moğol ulusunun bizə qoşulduğunu eşidəndə çox heyrət eləmişdi. Ancaq bir çarə tapmayınca kürəkənı Yaqub Əyyubu elçi olaraq göndərdi. Əhd bağlandığı təqdirdə qulluq və sədaqətini göstərib xidmətimizə gələcəyini bildirdi. Baqi Çağanyani nüfuz sahibiydi. Bizə sadiq olsa da, öz böyük qardaşının tərəfini verməzdi. O, araya girdi və bu şəkildə bir əhd bağlandı: onun həyatına toxunulmayacaq, malına da öz istədiyi kimi sərəncam verəcək, ona heç bir təzyiq göstərilməyəcək. Yaqubun getməsinə izin verdikdən sonra Qızılsuyu keçib Əndərab çayının birləşdiyi yerə yaxın bir yerdə **(123 b)** düşərgə saldıq.

Ertəsi gün, rəbiüləvvəl ayının ortalarında [=avqust ayının sonunda] bir neçə adamla Əndərab çayını keçib Duşi civarında böyük bir çinarın altında oturdum. Qarşı tərəfdən Xosrov şah əzəmət, ehtişam və izdihamlı məiyyəti ilə gəldi. Təşrifat qaydalarına müvafiq olaraq uzaqda atından düşdü və gəlib görüşərək üç dəfə, geri çəkilərək yenə üç dəfə, kef-hal soruşanda və hədiyyə təqdim edəndə birər dəfə yüköndü. Cahangir Mirzə ilə Mirzə xana [Baburun əmisinin oğlu Sultan Veys Mirzə] də eyni şəkildə yüköndü. Qoca və tənbəl hərif neçə ildir öz istədiyi kimi hərəkət edir və yalnızca öz adına xütbə oxutma dışında səltənət sürürdü. Bu şəkildə iyirmi beş-iyirmi altı dəfə ard-arda yüköndü, getib gəldi. Yorğunluqdan az qala yıxılacaqdı. Neçə ildir sürdüyü bəyliyi və səltənəti tamamən burnundan gəldi.

Görüşüb hədiyyə təqdim etdikdən sonra oturmasını buyurdum. Bir-iki qari[1] oturub oradan-buradan danışdıq. Alçaqlığı və nankorluğu ilə bərabər boş və zövqsüz bir danışığı da vardı. Etimad göstərdiyi, etibarlı adamları gözünün qabağında dəstə-dəstə gəlib mənim xidmətimə girirdilər. Onun işi o dərəcədə pozulmuşdu ki, padşahlıq etməkdə olan bu hərif bu cür həqir bir vəziyyətdə çar-naçar gəlib mənimlə görüşmüşdü.

Belə bir zamanda **(124 a)** iki qəribə söz söyləyib məni lap şaşırtdı. Biri budur: nökərlərinin yanından ayrılması üzündən ona təsəlli verəndə belə

[1] *Qari:* Hindistanda işlənən və 24 dəqiqəyə bərabər olan bir zaman ölçüsü.

cavab verdi: «Bu adam dörd dəfə məndən ayrılmış və təkrar gəlmişdir».

Biri də budur: kiçık qardaşı Vəli haqqında «O nə zaman gələcək və Amu-Dəryanın hansı keçidindən keçəcək?» deyə soruşanda o dedi: «Əgər keçid tapılsa, tez gələr, amma sular yüksəlincə keçidlər dəyişir. Bir məsəl vardır: «An güzərra ab burd»[1]. Dövləti və adamları onun əlindən gedən zaman söylədiyi bu sözü onun dilinə Allah gətirdi.

Bir-iki qaridən sonra mən ata minib qərargaha gəldim, o da öz düşərgəsinə getdi. O gündən etibarən böyük-kiçık, yaxşı-pis bəyləri və igidləri ailələri və malları ilə birlikdə ondan ayrılıb dəstə-dəstə bizim yanımıza gəlməyə başladılar. Ertəsi gün günorta və ikindi namazına qədər onun yanında heç kim qalmadı.

«De ki: «Allahım, (ey) mülkün sahibi, sən istədiyinə mülkü verirsin, istədiyindən də mülkü alırsan, dilədiyini yüksəldirsin, dilədiyini alçaldırsan. Xeyir sənin əlindədir. Sən hər şeyə qadirsən».[2]

Allahın içinə bax! Bir adam ki, iyirmi-otuz min nökər sahibiydi, Dərbəndi-Ahənin deyə də bilinən Kahluqdan Hinduquş dağına qədər [Baburun əmisi] Sultan Mahmud Mirzəyə aid olan vilayətlər tamamən onun hakimiyyəti altında idı, **(124 b)** onun Həsən Barlas adlı bir təhsildarı, ixtiyar bir hərif, İləkdən Ubaca qədər qaba bir şəkildə təhsildarlıq edərək bizim köçümüzü oradan buraya qovurdu, işə bax ki, bir yarım gündə heç bir müharibə və ya mübarizə olmadan, bizim kimi fəqir və yenilmiş iki yüz-iki yüz əlli adamın önündə elə səfil, həqir və aciz bir vəziyyətə düşmüşdü ki, nə adamlarına, nə malına, nə də canına yetəcək qüdrəti qalmamışdı.

Xosrov şah ilə görüşüb qayıtdığım gecə Mirzə xan hüzuruma gəlib böyük qardaşlarının qanını istədi. Bizim aramızda olanların bir qismi də eyni fikirdə idi. Gerçəkdən də, şəriətə və töröyə görə belə insanların cəzalarını alması doğru idi, lakin əhd bağlanmışdı.

Buna görə də Xosrov şahın götürə bildiyi hər şeyi alıb yanında götürməsinə iradə və fərman çıxdı. Üç-dörd qatar qatır və dəvəyə mövcud cəvahiratını, altın, gümüş və qiymətli əşyasını yükləyib götürdü. Şirim Tağayini Xosrov şaha müşayiətçi təyin etdik ki, onu Quri və Dəhanə yoluyla Xorasan tərəfinə göndərdikdən sonra Gahmərdə gedib köçümüzü arxamızdan Kabilə gətirsin.

O yurddan Kabilə getmək niyyətilə hərəkət etdik və Xoca-Zeydə gəlib endik. O gün Həmzə Bi Məngit komandanlığındakı özbək axınçısı gəlib Duşi civarına axın etdi. Seyid Qasım eşik-Ağa ilə Əhməd Qasım Kuhbər **(125 a)** də bəzi igidlərlə birlikdə onlara qarşı göndərildi. Bunlar gedib axınçıları tar-mar edərək bir neçə baş kəsib gətirdilər.

Bu yurdda ikən Xosrov şahın cəbbəxanasındakı silahlar da paylandı. Yeddi-səkkiz yüzə qədər zireh və yəhər vardı. Xosrov şahdan yalnız bunlar

---

[1] O keçidi su apardı.

[2] *Quran,* əl-İmran surəsi, 3:26.

qalmışdı. Bir xeyli də çini ələ keçdi. Bunlardan başqa, gözə dəyən bir şeyi yox idi.

Xoca-Zeyddən qalxıb dörd-beş mənzildən sonra Gur-Bəndə gəldik. Üşdür şəhərində dayananda eşitdik ki, [Zünnun bəy Arğunun oğlu] Müqimin ixtiyar bəyi olan Şikək Arğun bizdən bixəbər əsgərlə gəlib Baran çayı sahilində dayanmışdır. O, Pənchir yoluyla Əbdürrəzzaq Mirzənin yanına getmək istəyən adamları buraxmır. Mirzə o zaman Kabildən qaçaraq Ləmqan civarında tərkəlani əfqanlarının arasında idi. Bu xəbəri alınca günortadan sonra qalxıb gecə boyu at sürürək sübh çağı Xubiyan keçidini aşdıq.

O günə qədər Süheyl ulduzunu heç görməmişdim. Keçidə çıxar-çıxmaz, cənub tərəfdə bir az aşağıda parlaq bir ulduz göründü. «Bu, Süheyl olmasın» dedim. «Süheyldir» dedilər.

Baqi Çağanyani isə bu beyti oxudu:

Tu Süheyli ta koca tabiyu koca tuli şəvi,
Çeşmi tu bər hər ki, miəftad nişani-dövlət əst.
*Sən Süheyl ulduzusan, harada parlayıb işiq saçsan,*
*Gözün nəyə sataşsa, o, dövlət nişanıdır.*

Günəş bir nizə boyu qədər yüksələndə Sincid dərəsinin ətəyinə endik. Bizim irəli **(125 b)** gedən öncülərimiz və digər bəzi igidlər Qarabağın ətəyində Əyri-Yar civarında olan Şirkəklə qarşılaşan kimi dərhal savaşa girmişlər. Şirək bir az müqavimət edən kimi olur, lakin öncülərimiz yaxınlaşanda geri çəkilir. Şirkəki və yetmiş-səksən, ya da yüz yaxşı igidini yaxalayıb gətirdilər. Şirkənin qanını bağışlayıb özünü xidmətimizə aldıq.

Xosrov şah öz xalqının qayğısına qalmadan Kabilə getmək niyyətilə Qunduzdan çıxanda ona tabe olan el və ulus beş-altı qismə ayrılmışdı.

Bədəxşandakıların bir qismi Şeydim Əli Dərbanın başçılığı altında olub Rüstə həzarəsində idi. Onlar Pənchir yoluyla aşıb bu yurdda ikən gəlib bizə qoşuldular.

Bir qismi isə Yusif Əyyubla Bəhlul Əyyubun başçılığı altında idi, onlar da bu yurdda gəlib bizim xidmətimizə girdilər.

Bir qismi isə kiçık qardaşı Vəlinin başçılığı altında Xutlanda və digəri də İlancıq, Nəkdəri, Kakşal və Qunduz vilayətində yaşayan aymaqlardan ibarət idi. Bunlar Əndərab və Sərab yoluyla gəlib Pənchiri aşmaq niyyətində idilər. Aymaqlar daha öncə Səraba gəlmişdilər. Onların arxasından da Vəli gəldi. Aymaqlar yolu tutub müharibədə onu məğlub etdilər. Vəli qaçıb özbəklərə pənah apardı, Şeybani xan da Səmərqənd bazarında onun boynunu vurdurdu. Digər nökərləri və adamları isə yağmalanmış bir vəziyyətdə aymaqlarla birlikdə bu yurdda bizə qulluğa gəldilər. Seyid Yusif Oğlaqçı da **(126 a)** aymaqlarla birlikdə gəldi.

## BABURUN KABİLİ ALMASI

Bu yurddan qalxıb Qarabağ yanındakı Ağsaray çaynıa endik. Xosrov şahın adamları zülm və sərkəşliyə alışmış olduqları üçün əhaliyə zülm etməyə başladılar.

Axırda Şeydim Əli Dərbanın hörmətli bir adamını birinin bir çanaq yağını zorla aldığı üçün qapıya gətirdib şallaqlatdırdım. Şallaq altında canı çıxdı. Bu siyasətdən sonra hamısı yola gəldi.

Bu yurdda ikən Kabil üzərinə dərhal yürüyüb-yürüməyəcəyimiz müzakirə edildi. Seyid Yusif [Oğlaqçı] və bəzilərinin fikri belə idi: qış yaxınlaşmışdır, dərhal Ləmğana getməli və oradan vəziyyətə uyğun olaraq hərəkət edilməlidir. Baqi Çağanyani və digərləri isə Kabil üzərinə yürüməyi təklif edirdilər. Axırda bu sonuncusuna qərar verildi və buradan qalxıb Aba qoruğuna gəldik.

Biz burada ikən validəm xanım ilə Kahmərddə qalan uruğum[1] bir çox çətinlik və təhlükələr keçirib gələrək bizə qoşuldu. Təfsilatı belədir: Şirim Tağayi Xosrov şahı Xorasan tərəfə ötürdükdən sonra, gedib mənim uruğumu gətirməli idi. Dəhanəyə çatanda Şirim iradəsini ititrir və Xosrov şahla birlikdə Kahmərdə gedir. Xosrov şahın bacısı oğlu Əhməd Qasım burada olurdu. Xosrov şah **(126 b)** Əhməd Qasımla sözü bir yerə qoyaraq mənim uruğuma pislik etmək fikrinə düşürlər. Baqi Çağanyaninin bir çox moğol xidmətçisi də uruğun yanında Kahmərddə idi. Bunlar gizlicə Şirimlə qərarlaşdıraraq Xosrov şahla Əhməd Qasımı yaxalamaq istəyirlər. Xosrov şahla Əhməd Qasım Əcər dərəsinin yanındakı yolla qaçıb Xorasana gedirlər. Moğolların bu tərəfgirlikdəki məqsədi özlərini onlardan ayırmaq imiş. Uruğun yanında olanlar beləcə Xosrov şah təhlükəsindən qurtularaq Əcərdən çıxıb Kahmərdə gələndə iskançı qəbiləsi üsyan edib yolu tutmuş və uruğun önəmli bir qismini və Baqi bəyə mənsub el və ulusu yağma etmişdir. Qul-Bəyazidin oğlu Tizək hələ kiçık idi, orada ələ keçirildi və üç-dörd il sonra Kabildə bizə qoşuldu. Uruk yağmalandıqdan sonra bizim keçdiyimiz Qıpçaq yolunu aşaraq Aba qoruğunda gəlib bizə qoşuldu. Oradan qalxıb bir mənzildən sonra Çalaq çayırına endik.

Məsləhət-məşvərət edərək Kabili mühasirəyə almağa qərar verdik. Mən bütün mərkəzi qüvvələrlə birlikdə Heydər Tağının bağı ilə Qul Bəyazid Bəkavulun məzarının arasına endim. Cahangir Mirzə sağ qol adamlarıyla bizim böyük çarbağa, Nasir Mirzə isə sol qol adamlarıyla Qutlu Qədəmin məzarının arxasındakı çayıra endi. **(127a)**

Adamlarımız hər zaman gedib Müqim [Arğun] ilə danışırdılar. O da bəzən üzr istəyir, bəzən də yumşaq sözlər söyləyirdi. Bizim Şirəki ələ keçirməyimizdən sonra atasına [Zünnun bəy Arğun] və böyük qardaşına [Şah Şüca Arğun] adam göndərmiş, onlardan yardım gələcəyini ümid etdiyi üçün

[1] *Uruq:* qohum, əqrəba, boy; ailə üzvləri.

işi uzadırdı.

Bir gün mərkəz, sağ və sol qollara zirehlərini geyib, atlara da zireh örtüb həm öz silahlarını göstərmək və həm də içəridəki əhalini də bir az qorxutmaq üçün daha yaxına getmələri əmr edildi. Cahangir Mirzə sağ qolun olduğu yerin qarşısından Küçə-bağ yolu ilə irəlilədi. Mərkəzin önündə su olduğu üçün mən də mərkəzlə birlikdə Qutlu Qədəmin məzarı tərəfindən gəlib irəlidə yerləşən ikinci təpənin üstünə çıxdım. Öncülər indi Qutlu Qədəmin körpüsünün olduğu yerə doluşdular, o zamanlar bu körpü yox idi.

Qoçaq igidlər hiss etdirmədən dəriçilər qapısına qədər irəlilədi. İçəridən çıxan bir dəstə adam savaşmadan qaçıb kurqana girdi. Ərkin divarının dibi yüksək idi və Kabilin izdihamlı əhalisi də seyr etmək üçün oraya çıxmışdı. Əsgərin qaçmasıyla onlar da tez enib geri qayıtdılar.

Körpü ilə qapı arasındakı yüksək təpənin üzərinə və yolun ortasına çoxlu çuxur qazıb **(127 b)** üstlərini örtmüşdülər. Sultanqulu Çanaq və bəzi igidlər hücum edəndə oraya düşdülər. Sağ qol tərəfindən bir-iki igid Küçəbağ arasında, kurqandan çıxanlarlarla bir-iki dəfə qılıncla vuruşdular. Savaş əmri verilməmiş olduğu üçün bu qədərlə kifayətlənərək geri döndülər.

Kurqanın içindəkilər möhkəm vahiməyə düşmüşdülər. Müqim bəyləri vasitəçı edərək qulluğa gəlib Kabili təslim etmək istədi. Baqi Çağanyaninin vasitəsilə gəlib sədaqətini bildirdi. Biz də inayət və şəfqət göstərib təlaş və qorxunu ağlından çıxardıq. Ertəsi gün mövcud adamları, malı və əşyasıyla çıxıb kurqanı təslim etməsi qərarlaşdırıldı.

Xosrov şaha mənsub olan adamlar sərkəşliyə və yağmacılığa alışmış adamlar idi. Buna görə də Müqimi və Müqimə mənsub adamları mal və əşyasıyla birlikdə Kabildən çıxarmaq işi Cahangir Mirzə, Nasir Mirzə və digər böyük bəylərlə içkilərə tapşırıldı. Müqimə yurd olaraq Tibəni göstərdik.

Sabah tezdən mirzələr və bəylər kurqanın qapılara gedib xalqın çox həyəcanlı olduğunu görərək: «Siz gəlmədən bu xalqı heç kim dayandıra bilməz» deyə adam göndərdilər.

Axırda özüm getdim. Dörd-beş adamı oxla vurdurdum, bir-iki adamı da **(128 a)** parçalatdırdım. İğtişaş yatdı. Müqim adamlarıyla birlikdə sağ-salim gedib Tibəyə çatdı.

Rəbiüləvvəl ayının sonlarında [=sentyabr] tanrı təalanın fəzl və kərəmi ilə Kabil və Qəznə vilayətinin fəthi müharibə və mübarizə olmadan asanca gerçəkləşdirildi.

## KABİL VİLAYƏTİNİN TƏRİFİ

Kabil vilayəti dördüncü iqlimdədir və məmurənin ortasında yerləşir. Şərqi Ləmqanat, Pərşavər, Həşnəgar və digər hind vilayətləridir. Qərbi Kərnud və Gurun yerləşdiyi dağlıq bölgədir. İndi həzarə və nəkdəri qövmlərinin sığınağı

və məskəni bu dağlardır. Şimalı Qunduz və Əndərab vilayətləridir, Hinduquş dağı bunların ortasındadır. Cənubu Fərmül, Negar, Bennu və Əfqanıstandır.

Kiçık, lakin uzun bir vilayətdir. Şərqdən qərbə doğru uzanır. Ətrafı tamamən dağlıqdır. Qalası dağa bitişikdir.

Qalanin cənub-qərbində bir az kiçık bir dağ var və dağın başında [şəhərin banisi] Şah Kabil bir saray tikdirdiyi üçün bu dağa Şah Kabil deyirlər. Bu dağ Divrin boğazından başlayır və Dəh-Yaqub boğazında sona çatır. Ətrafında iki şeri qədər yer var və bu dağın ətəyi tamamən bağdır. Əmim Uluğ bəy Mirzə zamanında Mirzənin atəkəsi Veys Atəkə bu dağın ətəyində bir arx qazdırmışdır və ətəyindəki bütün bağlar bu arxla suvarılır.

Kanalın alt tərəfində Külkinə adlı bir məhəllə vardır, kimsəsiz bir yerdir. Orada bir çox dəfə ədəbsiz işlər görülmüşdür. Bəzən zarafatla **(128 b)** Xoca Hafizin beytini dəyişdirərək belə oxuyurdular:

Ey xoş an vəqt ki, bepavi sər əyyami çənd,
Sakini Gülkinə budim be bədnami çənd.
*Kəllə-mayallaq idik, necə xoş əyyam idi,*
*Gülkinədə oturan bir neçə bədnam idi.*

Qalanın cənubunda və Şah Kabilin şərqində böyük bir göl var. Ətrafı bir şeri qədərdir. Şah Kabil dağından Kabilə doğru üç kiçik çeşmə çıxır, onlardan ikisi Gülkinə ətrafındadır. Bir çeşmənin başında Xoca-Şemu (Xoca Əhməd Şəmsəddin Cambaz) adlı bir məzar və digərində də Xoca Xızırın ayaq izi [qədəmgah] vardır. Bu iki yer Kabil əhalisinin gəzinti yeridir. Bir çeşmə də Xoca Ruşənayi də dedikləri Xoca Əbdüssəmədin qarşısındadır.

Şah Kabil dağından Üqabeyn dedikləri bir çıxıntı ayrılmışdır. Ondan başqa yenə kiçicik bir dağ var və Kabil qalasının ərki bu dağın üzərindədir. Böyük kurqan ərkin şimal tərəfindədir. Bu ərk çox hündür və yaxşı havalı bir yerdədir. Böyük bir göl ilə Siyah səng, Səng kurqan və Çalaq adlarını daşıyan üç çayırın yanındadır. Hamısı də ayaq altındadır. Çayırlar yaşıllıq zamanında fövqəladə gözəl görünür.

Kabildə yaz mövsümü gələndə pərvan yeli dedikləri bir şimal rüzgarı sürəkli əsir. Ərkdə pəncərələri şimala açılan evlər fövqəladə havalıdır. Molla Məhəmməd Təbib Müəmmai Kabil ərkini **(129 a)** təsvir edərkən, bir beyti Bədiüzzaman Mirzə adına bağlayıb oxuyurdu:

Bixor dər ərki-Kabil mey, bigərdan kasə peydərpey,
Ki həm kuh əstü həm dərya, həm şəhr əstü həm səhra.
*Kabil ərkində mey iç, durmadan peydərpey iç,*
*Çünki ora həm dağdır, həm dərya, həm şəhərdir, həm səhra.*

Ərəblər ərəbdən başqa hamıya əcəm dediklər kimi, hindlilər də özlərindən başqasına Xorasan deyirlər. Hindistan ilə Xorasan arasındakı yolun üzərində iki ticarət mərkəzi var. Bunların biri Kabil, digəri isə Qəndəhardır. Fərqanə, Türküstan, Səmərqənd, Buxara, Bəlx, Hisar və Bədəxşandan kar-

vanlar Kabilə gəlir; Xorasandan da Qəndəhara gedirlər. Hindistan ilə Xorasan arasındakı yol bu vilayətdən keçir.

Fövqəladə yaxşı bir ticarət yeridir. Tüccarlar Çinə və ya Ruma getsələr belə ancaq bu qədər ticarət edə bilərlər. Kabilə hər il yeddi-səkkiz və ya on min at gəlir, aşağı Hindistandan da on-on beş və ya iyirmi min karvan gəlir. Hindistandan ağ parça, şəkər, qənd və ədviyyat gətirirlər. Tüccarların çoxu ona qarşı otuz, ya da qırx qazanca razı olmaz. Kabildə Xorasan, İraq, Rum və Çin malları tapılır və bura Hindistanın əsil bazarıdır.

Kabilin isti və soyuq yerləri yaxındır. Kabildən bir gün yol getsən heç bir zaman qar yağmayan bir yerə çatarsan, təxminən iki saatlıq yolda da kari heç bir zaman əskik olmayan bir yerə getmək olar, yalnızca ara-sıra kari tam əridəcək qədər isti yay gəlir. **(129 b)**

İsti və soyuq iqlimlərin meyvələri Kabilə bağlı olan yerlərə həm yaxın, həm də çoxdur. Kabil və kəndlərində soyuq iqlim meyvələrindən üzüm, nar, qaysı, alma, heyva, armud, şaftalı, ərik, innab, badam və qoz boldur. Mən vişnə fidanı gətirib əkdirdim, yaxşı vişnələr yetişdi və ağaclar hələ böyüyürlər. İsti iqlim meyvələrindən portağal, turunc, əmlük[1] və şəkər qamışını Ləmğandan gətirirlər. Şəkər qamışı gətirib əkdirmişdim. Çilgüzəni[2] Nicravdan gətirirlər.

Kabilin ətrafındakı dağlıq bölgələrdən çox bal gəlir. Arı pətəkləri var. Yalnız Qəznə tərəfindəki dağlardan bal gəlmir. Kabilin rivacı[3] yaxşıdır. Heyvası ilə əriyi də pis deyil, badrəngi[4] də yaxşı olur.

Abi-əngur dedikləri bir tür üzüm vardır, çox yaxşı üzümdür və ondan qüvvətli şərablar düzəldirlər. Xoca-Xavənd Səid dağının ətəkləri şərabının sərtliyi ilə məşhurdur. Gərçi başqasını təqlidlə deyirlər ki:

Ləzzəti-mey məst danəd, huşyaran ra çe həzz.

*Şərabın ləzzətini sərxoş bilər, ağlı başında olan ondan nə həzz alar.*

Taxılı yaxşı deyil. Əgər Xorasan toxumu olsa, o zaman ümumən pis olmaz. Qovunu da yaxşı deyildir.

Fövqəladə gözəl bir havası var. Dünyada Kabil qədər havalı başqa bir yer məlum deyil. Yayda gecələr rğansız yatmaq olmaz. Düzdür, qışda qar çox olur, amma sərt şaxtası yoxdur. Səmərqənd və Təbriz də yaxşı havasıyla **(l 30 a)** məşhurdur, amma oranın soyuğu sərtdir.

Şəhərin ətrafında dörd gözəl çayır var. Şimal-şərqində Sonaq-kurqan çayırı var. Kabildən təxminən iki küruh uzaqdadır və yaxşı bir çayırdır, otu ata yaxşı gəlir, milçəyi az olur. Şimal-qərbində Çalaq çayırı yerləşir. Kabil-

---

[1] *Əmlük:* Kabilin bir bölgəsində olub, digər yerlərdə olmayan bir meyvə. Türklər ona "qara yemiş" deyirlər.

[2] *Çilgüzə:* bir fıstıq növü.

[3] *Rivac: larivac* da deyilir, köklərindən düzəldilən dərman müshilə yaxşı təsir edir.

[4] *Badrəng:* limona bənzər yaşıl bir meyvədir. Böyük bir xiyar növünə də belə deyilir.

dən bir küruh uzaqda və geniş bir çayırdır, yayda miçəyi atı narahat edir. Qərbində Divrin çayırı var. Bunlar eyni təpənin iki çayırıdır.

Bir də Quş-Nadir çayırı vardır və bu hesabla beş çayır olur. Bu son iki çayır Kabildən bir şeri məsafədədir. Kiçık çayır olsalar da otu ata fövqəladə yaxşı gəlir və miçəyi yoxdur, Kabil çayırları arasında bu çayırlar kimi çayır yoxdur. Şərqində Siyah səng çayırı var. Dəriçirlər qapısıyla bu çayırın ortasında Qutlu Qədəmin məzarı yerləşir. Yayda miçəyi çox olduğu üçün bu çayıra rəğbət azdır. Bir də bu çayıra bitişik Kəməri çayırı vardır ki, onunla birlikdə Kabilin ətrafında altı çayır olur, lakin bunların dördü məşhurdur.

Kabil vilayəti qorunaqlı bir vilayətdir, düşmənin bu vilayətə girməsi çətindir. Bəlx, Qunduz və Bədəxşan ilə Kabil arasında Hinduquş dağı yerləşir. Bu dağ üzərindən yeddi yol aşır.

Bu yollardan üçü Pənchirdədir. Bir az yuxarıda Cavaq keçidi, ondan bir az aşağıda Tul və ondan daha aşağıda Bazarək keçidləri vardır. Bu üç keçiddən **(130 b)** ən yaxşısı Tul keçididir, lakin yolu bir az daha uzundur. Ehtimal ki, bu üzdən ona Tul [uzun] deyirlər. Ən doğru olanı Bazarəkdir. Tul və Bazarək Səraba gedir. Bazarək keçidi Parəndi adlı bir kəndə endiyi üçün Sərab əhalisi ona Parəndi keçidi deyir.

Yollardan biri də Pərvan yoludur. Böyük keçid ilə Pərvan çayının arasında yeddi keçid olduğu üçün ona Həft-beçə [yeddi uşaq] deyirlər. Əndərab tərəfindən iki yol gəlib bu keçiddə birləşərək, Həft-Beçə ilə Pərvana uzanır. Fövqəladə əziyyətli bir yoldur.

Yolların üçü isə Gur-Bənddədir. Pərvan yoluna daha yaxın olanı Yengi yol keçididir; Vəliyan ilə Hincana enir. Yolların biri də Qıpçaq keçididir, Əndərab çayı ilə Qızıl suyun birləşdiyi yerə enir, bu da yaxşı bir yoldur. Üçüncüsü is Şibertu keçididir. Yayda sular artanda Şibertu keçidindən aşıb Bamyan və Sayqan üzərindən, qışda isə Ab-dərə üzərindən gedirlər.

Qışda dörd-beş ay boyu Şibertu yolundan başqa bütün yollar bağlanır və o zaman da bu keçiddən aşıb Ab-dərə üzərindən gedirlər. Yayda sular daşanda isə bu yollar qışda olduğu kimidir, çünki su kənarındakı yollardan su yüksəldikdən sonra keçmək mümkün olmur, bu yollardan keçməyərək dağdan keçmək çox çətin olur. Bu keçidlər yalnız qarın az olduğu və suların çəkildiyi üç-dörd ay içində **(131 a)** keçilə bilən yerlərdir. Dağlar və boğazlarda yol kəsən kafirlər azdır.

Xorasan tərəfindən gələn yol Qəndəhardan keçir. Bu yol dümdüzdür və keçid yoxdur.

Hindistan tərəfindən dörd yol çıxır: biri Lemqanat üzərindən gəlir ki, bu yolda Xeybər dağlarında kiçik bir keçid vardır; biri Bəngəş üzərindən gəlir, biri Nəgar üzərindən, biri isə Fərmul üzərindən gəlir.

Bu yollarda bir neçə keçid vardır və bu yollarla gələnlər Sind çayının üç keçidindən keçirlər: Nilab keçidindən keçənlər Ləmqanat üzərindən gəlir.

Qışda Kabil çayı ilə Sind çayının birləşdiyi yerin bir az yuxarısında, hər iki çay da keçid üzərindən keçilir.

Mən Hindistan səfərləriində əksərən bu keçidlərdən keçirdim. Bir səfərində Sultan İbrahimi [Ludi] yenib Hindistanı fəth etdiyim zaman Nilab keçidindən gəmiylə keçdim. Nilab keçidinin dışında Sind çayının heç bir yerindən gəmisiz keçmək mümkün deyil.

Dinqut keçidindən keçənlər Bəngəş üzərindən gəlirlər. Çuparə keçidindən keçənlər Fərmül üzərindən gəlirlərsə Qəznəyə, Dəst üzərindən gəlirlərsə Qəndəhara gedirlər.

Kabil vilayətində müxtəlif tayfalar yaşayır. Dərə və ovalarda türklər, aymaqlar və ərəblər, şəhərində və bəzi kəndlərində sartlar, bəzi **(131 b)** kəndlərində və vilayətində isə peşayi, pəraci, tacik, bərəki və əfqanlar, Qəznə dağlarında da həzarə və nikdərilər yaşayır. Həzarə və nikdərilər arasında bəzi qəbilələr moğolca danışırlar. Şimal-şərqindəki Kəttur və Gəbrək kimi dağlıq ərazi Kafiristan, cənubu isə Əfqanıstandır.

Kabil vilayətində on bir-on iki dil danışılır: ərəbcə, farsca, türkcə, moğolca, hindcə, əfqanca, peşayicə, pəracicə, gəbəricə, bərəkicə və ləmğanca. Heç bir vilayətdə bu qədər müxtəlif qövmün yaşadığı və bu qədər müxtəlif dilin danışıldığı görünməmişdir.

Vilayət on dörd tümədən ibarətdir. Səmərqənddə, Buxarada və civarındakı böyük bir vilayətə bağlı olan kiçık vilayətlərə tümən deyilir. Əndican, Kaşğar və civarında ürçün, Hindistanda isə pərgənə deyirlər. Bəcur, Sevad, Pərşavər və Həşnəgar əskidən Kabilə tabe imiş, indi isə əfqan qövmü üzündən bəziləri xarab olmuş, bəziləri də əfqan idarəsinə girdikləri üçün vilayətlikləri qalmamışdır.

Şərq tərəfi Ləmqanatdır. Bu vilayət beş tümədən və iki bölükdən ibarətdir. Bu tümənlərin ən irisi Nigənxardır, bəzi tarix kitablarında Nigərxar deyə yazılmışdır. Bu tümənin mərkəzi Adinapurdur və Kabildən şərqə doğru on üç ağac məsafədədir. Nigənxar ilə Kabilin arası fövqəladə çətin və pis bir yoldur. Üç-dörd yerdə kiçık-kiçık **(132 a)** keçidləri və iki-üç yerdə də boğazları vardır. Xırılçılar və bütün digər yolkəsən əfqanlar üzündən bu yol təhlükəsiz deyildi və bu iki şəhər arasında məmurə yoxdu. Quru sayın alt tərəfindəki Qaratuyu mən saldırdım və bu sayədə yol əmin bir hala gəldi.

İsti iqlimlə soyuq iqlim arasındakı sərhəd Badam-Çeşmə keçididir. Bu keçidin Kabil tərəfində qar yağır, Quru say və Ləmqanat tərəfində isə qar yağmır. Bu keçiddən enincə insan özünü başqa bir aləmdə zənn edir, ağaclar, otlar, heyvanlar, əhalisinin adət-ənənələri tamamilə başqadır.

Nigənxarda doqquz çay vardır. Düyüsü və buğdası yaxşı olur. Portağal, turunc və narı fövqəladə bol və yaxşıdır.

Adinapur kurqanının altında və cənub tərəfindəki bir yüksəklikdə 914-cü (=1508/09) ildə Bağİ-Vəfa adında bir çarbağ saldırdım. Kurqanla bağ

arasından axan suya baxır. Portağal, turunc və narı fövqəladə çoxdur. Pəhar xanı məğlub edib Lahor və Dibalpuru fəth etdiyim il [=1524] banan gətirdib əkdirmişdim, yaxşı tutmuşdu. Ondan əvvəlki il də şəkər qamışı əkilmiş və yaxşı yetişmiş, onlardan Bədəxşana və Buxaraya göndərilmişdi. Yeri yüksəkdir, suyu qurumur, havası qışda da mülayimdir. Bağın ortasında kiçık bir **(132 b)** təpə var. Bir dəyirman işlədə biləcək gücdə bir çay bağın ortasından və bağın içindəki təpənin üzərindən fasiləsiz bir şəkildə axır, bağın ortasındakı böyük çəmənlik bu təpənin üzərindədir.

Bağın cənub-qərbində böyük bir hovuz vardır və ətrafı tamamən portağal ağaçlarıyla əhatə edilmişdir. Nar ağacları da vardır. Bu hovuzun ətrafı bütünlüklə çəmənlə örtülüdür və bağın ən gözəl yeri oradır. Portağalların saraldığı günlərdə olduqca gözəl görünür. Gerçəkdən də gözəl bir bağdır.

Kuhi-Səfid dağı Nigənxarın cənubundadır. Bəngəş ilə Nigənxarı bu dağ ayırır. Atlı bir adam buradan asanlıqla keçə bilməz. Bu dağdan doqquz çay axar. Bu dağda qar heç bir zaman əskik olmur. Bəlkə də bu üzdən ona Kuhi-Səfid [ağ dağ] demişlər. Aşağıdakı dərədə isə heç bir zaman qar yağmır. İkisinin arası yarım günlük yoldur. Bu dağın ətəklərində havalı yerlər var. Suları soyuqdur və buza ehtiyac yoxdur.

Adinapur kurqanının güney tərəfi isə Surx-rud çayıdır. Kurqanı yüksək bir yerdədir. Çay tərəfində isə qırx-əlli kari yüksəkliyində sarp bir dağ vardır. Kurqanın şimalında də dağın bir qismi bulunur. Olduqca qorunaqlı bir kurqandır. Bu dağ Nigənxar ilə Ləmqanat arasındadır. Kabilə qar yağan zaman bu dağın təpəsinə qar düşür, Ləmqan əhalisi **(133 a)** onda bilir ki, Kabilə qar yağmışdır.

Kabildən Ləmqanata gedərkən Quru say üzərindən gedənlər Dibri keçidini aşıb Bulanda Baran çayından keçirlər. Bir digər yol isə Quru saydan aşağıya, Qaratudan aşıb Uluğ-Nurda Baran çayını keçib Badic keçidindən Ləmqana gedir. Nicrav üzərindən gedənlər isə Bedrav və Qaranrıqdan keçib Badic keçidinə gedirlər.

Nigənxar Ləmqanın beş tümənindən biridir, lakin yalnız üç tümənə Ləmqanat adını verirlər. Bu üç tüməndən biri Əlişəng tümənidir O, Hinduquş dağına bitişik, qarlı, böyük və sarp dağları əhatə edir. Bu dağlar bütünlüklə Kafiristana aiddir. Kafiristanın Əlişəngə bir az yaxın olan qismi Mildir. Əlişəng çayı öz mənbəyini Mildən alır. Həzrəti Nuh peyğəmbərin atası Mehtər Lamın qəbri Əlişəng tümənindədir. Bəzi tarix kitablarında Mehtər Lama Ləmk və ya Ləmkan da deyirlər. Buranın əhalisi bəzən kaf yerinə ğəyn tələffüz edir. Bəlkə bu vilayətə bu üzdən Ləmğan demişlər.

Ləmqanat tümənlərindən biri də Əlinqardır. Kafiristanın Əlinqara ən yaxın olan qismi Gevardır. Əlinqar çayı Gevardan başlayır. Bu iki çay Əlişəng ilə Əlinqardan keçib birləşərək tümənlərdən biri olan Məndravərin **(133 b)** bir az aşağısında Baran çayına tökülür.

Ləmqanatın iki bölüyündən biri Dəreyi-Nurdur və misilsiz bir yerdir. Kurqanı dərənin önündə iki tərəfindən su ilə çevrilən bir çıxıntının üstündədir. Düyü tarlaları çoxdur. Oraya yol olmayan yerdən getmək mümkün deyil. Portağal, turunc və digər isti iqlim meyvələri, bir az da xurma ağacı var. Kurqanın iki tərəfindəki suyun sahilləri tamamən ağaclıqdır. Çoxu əmlük ağacıdır. Bu meyvəyə bəzi türklər qarayemiş deyirlər, Dəreyi-Nurda çox olur, başqa yerdə bu meyvəyə rast gəlmək olmaz.

Üzümü də olur. Üzümün hamısı ağaclara sarmaşıb yuxarı çıxır. Ləmqanatda Dəreyi-Nur şərabı məşhurdur. Ərrə daşı və suxan daşı adlanan iki növ şərabları var. Ərrə daşı sarımtıraqdır, suxan daşı isə gözəl rəngli və qıpqırmızı olur. Düzdür, hər ikisinin də keyfiyyəti şöhrətləri qədər deyildir, lakin ərrə daşı adama daha çox keyf verir.

Yuxarıdakı dərələrdə limon yetişir. Buradan aşağıdakı Hindistan tərəflərində də limon yetişir. Lakin buradan yuxarıda limon olmur. Buranın əhalisi əvvəllər donuz saxlayırdı, lakin bizim zamanımızda bundan vaz keçdi.

Ləmqanatın üç tümənindən biri də Künər və Nurgil tümənidir. Bu tümən Ləmqanatdan bir az fərqlidir. Kafiristanın içindədir və vilayətin sərhəddini təşkil edir. Gərçi böyüklüyü Ləmqan tümənləri qədər vardır, lakin məhsulu az olduğu üçün **(134 a)** daha az vergi verirlər. Çağan saray çayı şimal-şərqdən Kafiristanın içindən başlayır və bu vilayətin içindən keçərək Kamə bölüyündə Baran çayı ilə birləşib şərqə doğru axır. Bu çayın qərb tərəfi Nurgil, şərq tərəfi isə Künərdir.

Mir Seyid Əli Həmədani -Allah ona rəhmət eləsin- səyahət edərkən buraya gəlib Künərdən bir şeri məsafə daha yuxarıda vəfat etmişdir. Müridləri onu buradan alıb Xutlana götürmüşlər. Vəfat etdiyi yerdə bir məzar var. 925-ci ildə [=1519] gəlib Çağan sarayı alanda ziyarət etmişdim.

Portağal, turunc və düyü çox olur. Qüvvətli şərabları da Kafiristandan gətirirlər.

Buradakı əhali qəribə bir şey danışır, inanılmaz kimidir, lakin bu xəbəri dəfələrlə eşitdim. Bu tümənin aşağı qisminə Ləmətə-Öz deyirlər və oradan aşağıda olan yerlər Dəreyi-Nura və Ətərə tabedir. Bu hadisə Ləmətə kəndinin yuxarısına, Künər, Nurgil, Bəcur, Səvad və civarındakı bütün bu Kuhistana yayılmışdır: ölən hər qadını bir xərəyə qoyub dörd tərəfindən tutaraq yuxarı qaldırırlar. Əgər qadın pis işlər görmüşsə, onu qaldıranları o qədər sarsır ki, bütün səylərə baxmayaraq ölü xərəkdən yerə düşür. Əgər pislik etməmişsə, tərpənmir. Bunu yalnız oranın əhalisi deyil, Bəcur, Səvad və bütün Kuhistan əhalisi birağızdan **(l 34 b)** söyləyirdi.

Heydər Əli Bəcuri Bəcur sultanıydı və o vilayətdə çox yaxşı qayda yaratmışdı. Anası öləndə ağlamamış, matəm tutmamış, qaralar geyməmiş, «Gedin, xərəyə qoyun, qımıldamasa yandıracağam» demişdir. Xərəyə qoyurlar və ölüdə belə bir hərəkət görünür. Bunu eşidincə, qaralar geyib matəm tutur.

Bölüklərdən biri Çağan saraydır. Kafiristanın başlanğıcında kiçık bir kənddir. Əhalisi kafirlərlə qarışıq olduğu üçün müsəlman olduqları halda kafir adətlərinə uyurlar. Çağan saray çayı deyə məşhur olan böyük irmaq Çağan sarayın şimal tərəfindən və Bəcurun arxasından axır. Qərb tərəfindən Pih adlı daha kiçık bir çay Kafiristandan gəlib bu çayla birləşir.

Çağan sarayın sarımtıraq və qüvvətli şərabları var, lakin Dəreyi-Nur şərabıyla əsla müqayisə oluna bilməz. Oranın üzümü və bağı yoxdur, suyun üst tərəfindəki Kafiristan ilə Pih Kafiristanından gətirirlər. Mən Çağan sarayı alanda [=1514/5] Pih kafirləri bu xalqa yardım üçün gəlmişdilər. Şərab o tərəfdə o qədər yayılmışdır ki, hər kafirin boynunda bir tuluq şərab olur və su yerinə şərab içirlər.

Kamə ayrı bir yer olmayıb Nigənxara tabe olsa da, oraya da bölük deyirlər.

Tümənlərdən biri **(135 a)** Nicrav tümənidir. Kabilin şimal-şərqində Kuhistanda yerləşir. Arxasındakı dağların hamısı Kafiristandır. Uzaq bir guşədir. Üzüm və meyvəsi fövqəladə çox, şərabı da bol olur. Ancaq şərabı qaynadırlar. Qışda çox toyuq bəsləyirlər. Əhalisi əyyaş, namaz qılmaz, Allahdan qorxmaz və kafirə bənzər bir xalqdır.

Dağlarında şam, palıd və saqqız ağacı çoxdur. Çam, çilgüzə və palıd ağacları oradan aşağıda da bitir, lakin Nicravdan yuxarıda heç bitmir. Bunlar Hindistan ağaclarındandır. Bu Kuhistan xalqının çırağı çilgüzə ağacındandır və şam kimi yanır. Bu çox qəribədir.

Nicrav dağlarında rübeyi-pəran olur. Rübeyi-pəran bir heyvandır, sincabdan bir az böyükdür və iki qoluyla iki budunun arası yarasa qanadı kimi pərdəlidir. Hər zaman tutub gətirirdilər. Deyirlər ki, ağacdan-ağaca, aşağıya doğru bir ox atımı qədər uçur. Mən özüm uçduğunu görməmişdim. Bir ağaca qoyduq və dərhal dırmanaraq çıxdı. Oradan qovladılar və qanadını açaraq uçan kimi elədi, lakin ehmalca yerə düşdü.

Bu dağlarda luçə quşu da olur. Bu quşa buqələmun deyirlər, başından quyruğuna qədər beş-altı fərqli rəngi var və boynu göyərçin boynu kimi parlaqdır. Böyüklüyü cins kəklik qədərdir. Bu, hər halda, Hindistanın cins kəkliyi olmalıdır. Onun haqqında bölgə əhalisi qəribə şeylər söylədi: qış gəlincə dağın ətəklərinə enərək uçursalar belə **(135 b)** üzüm bağından o yana uça bilməz, sonra onları təkrar tutarmışlar.

Nicravda müşk siçanı deyilərn bir siçan varmış, ondan müşk qoxusu gəlirmiş. Özüm şəxsən görmədim.

Tümənlərdən biri Pənchir tümənidir və Pənchir yolu üzərində yerləşir. Kafiristan ona çox yaxındır. Yolkəsən kafirlərin yolu Pənchir üzərindəndir. Kafirlərə yaxın olduğu üçün bu tüməndən də vergi alırlar. Mən gəlib Hindistanı fəth etəndə [=1526] kafirlər də gəlib Pənchirdə bir çox adamı öldürərək hər yanı dağıtmışdılar.

Tümənlərdən biri Gur-Bənd tümənidir. O vilayətlərdə keçidə bənd deyirlər. Gür tərəfinə bu keçiddən gedirlər və hər halda buna görə ona Gur-Bənd demişlər. Dərə başlarını həzarələr işgal etmişdilər. Bir neçə kənddən ibarət və məhsulu az bir yerdir. Gur-Bənd dağlarında gümüş və laciverd mədənləri olduğunu söyləyirlər.

Dağ ətəyində yerləşən kəndlər başda Mitə-Kəcə və Pərvan ilə axırda Dürnamə olmaq üzərə on iki-on üç kənddən ibarətdir. Meyvəsi bol olan kəndlərdir və şərabları da digər yerlərinkinə nisbətən daha qüvvətlidir. Bu kəndlərin hamısı dağlarda və dağ ətəklərində yerləşdikləri üçün vergilərini ödəyirlər, lakin xəraca bağlı deyillər. Bu kəndlərin aşağısında dağ ətəyində və dağ ilə Baran çayı arasında Kürreyi-Taziyan və Dəşti-Şeyx dedikləri iki düz ovalıq var. Yayda çikin-tala[1] otu **(136 a)** fövqəladə yaxşı olur. Aymaqlar və türklər yayda buraya gəlirlər.

Bu dağ ətəyində rəngbərəng hər cür lalə var. Bir dəfə saydırdım və otuz iki-otuz üç növ nadir lalə çıxdı. Bu lalələrin bir növündən bir az qırmızı gül qoxusu gəlir, ona laleyi-gülbuy adını verdik. O, Dəşti-Şeyxdə də müəyyən bir yerdə olur, başqa yerdə olmur. Eyni dağın ətəyində və Pərvanın bir az aşağısında sədbərg (yüz yarpaq) lalə olur. O da yalnız müəyyən bir yerdə, Gur-Bənd boğazının sonunda yetişir.

Bu iki ovanın arasında kiçık bir dağ var. Bu dağda və dağın başından ətəyinə qədər Xoca-Rigi-Rəvan deyilən qumlu bir sahə var. Bu qumluqdan yayda nağara və davul səsləri gəldiyini söyləyirlər.

Bunlardan başqa, Kabilə bağlı olan daha bir çox kənd vardır. Kabilin cənub-qərbində və ondan üç şeri məsafədə hər zaman qarla örtülü böyük bir dağ vardır; bir ilin kari ikinci ilin qarına qədər qalır və nadir illərdə qar o biri qara çatmır. Kabil buzçularının buzları qurtaranda bu dağdan qar gətirərək buzlu su düzəldib içirlər. Bu dağ ilə Bamyan dağı sarp dağlardır. Hərmənd, Sind, Duqabə və Bəlxab çayları öz mənbəyini bu dağdan alır ki, bir gündə dörd çayın dördünün də suyundan içmək mümkündür.

Oradakı kəndlərin çoxu bu dağın ətəyində yerləşir. Bağların üzümü çox və hər növ meyvəsi bol olur. Bu kəndlərin arasında İstalif və Əstərqaça bənzəyən başqa kənd yoxdur. Uluğ bəy Mirzə bu kəndlərə **(136 b)** Xorasan və Səmərqənd deyirmiş.

Ləmqan da bu kəndlərin arasındadır. Djğrudur, üzümü və meyvəsi o kəndlərinki qədər deyil, lakin havası onlarla əsla müqayisə edilə bilməz. Ləmqan dağı qarlı dağdır.

İstafil kimi bir kəndə hər yerdə rast gəlmək mümkün deyil. Kəndin içindən böyük bir çay axır və çayın hər iki tərəfi bağdır. Yaşıl və olduqca səfalı bağları var. Suyu soyuqdur, buzlu suya ehtiyac yoxdur; əksərən şəffafdır. Bu kənddə Uluğ bəy Mirzənin sahibindən zorla aldığı Baği-Kəlan adlı bir bağı

[1] *Çikin-tala otu:* heyvanlara yedirilən bir ot növü.

var. Mən sahiblərindən satın aldım. Bağın dışında böyük çinarlar var, çinarların altı yaşıl, kölgəli və səfalı bir yerdir. Bağın ortasından bir dəyirman işlədə biləcək qədər su heç dayanmadan axır. Bu suyun sahilində çinarlar və digər ağaclar bitir. Bu arx əvvəllər əyri-üyrü və düzənsizdi, amma mənim əmrimlə doğru-düzgün bir şəkildə qazdılar, fövqəladə gözəl bir yer oldu.

Bu kəndlərin bir az aşağısında və ovadan yuxarıya doğru bir və ya bir yarım küruh məsafədəki dağ ətəyində Xoca-Seyaran dedikləri bir çeşmə var.

Bu çeşmədə və çeşmənin ətrafında üç cür ağac əkilmişdir. Çeşmənin ortasında xeyli çinar ağacı və onların lətif kölgəsi var. Çeşmənin iki tərəfində dağ ətəyindəki təpələrdə çoxlu palıd ağacı var. Bu **(137a)** iki palıdlıq istisna olmaqla Kabilin qərb tərəfindəki dağlarda heç palıd ağacı bitmir. Çeşmənin qabağındakı ova tərəfində isə böyük bir ərğuvan qoruğu var, bu vilayətdə oradan başqa heç bir ərğuvan qoruğu yoxdur.

Bu üç ağacın üç müqəddəsin kəraməti olduğunu deyirlər, seyaran [se yaran, üç yaran] adının verilməsinin səbəbi də bu imiş. Mən də bu çeşmənin ətrafını daşla hördürdüm, çeşməni kirəc və gipslə suvadaraq böyük hovuz düzəltdirdim. Çeşmənin ətrafı çox gözəl oldu. Hər tərəfi ərğuvan qoruğuna baxır. Ərğuvan gül açan günlərdə belə bir yer dünyada tapılmaz. Sarı ərğuvanı da çox olur. Sarı ərğuvan ilə qırmızı ərğuvan dağ ətəyində birdən açılır.

Bu çeşmənin cənub-qərbində bir dəyirman işlədə biləcək çayın yarısı qədər su fasiləsiz olaraq axır. Mən bir arx açdırıb bu suyu Seyaranın cənub-qərbindəki təpənin üstünə gətirtdim. Təpənin üstünə böyük yuvarlaq bir taxt düzəltdirdim. Onun ətrafına başdan-başa söyüd əkdirdim, çox gözəl bir yer oldu.Bu taxtın bir az yuxarısına, təpənin yanında bir də üzüm bağı saldırdım. Bu arxın tarixi «cuyi-xoş»[1] şəklində zəbt edildi.

Tümənlərdən biri də Ləhugər tümənidir. Ən böyük kəndi Çərx kəndidir. Molla Yaqub həzrətləri bu kənddəndir, Mollazadə Molla Osman da **(137 b)** çərxlidir. Secavənd də Ləhugərin kəndlərindən biridir. Xoca Əhməd ilə Xoca Yunus Secavənd kəndindəndir. Çərxin bağları çoxdur. Ləhugərin digər kəndlərində bağ olmur. Ləhugərin əhalisinə əfqan-şal deyirlər. Bu ad Kabildə çox yayılmışdır. Hər halda, bunun doğrusu əfqan-şiardır ki, sonradan əfqan-şal demişlər.

Biri Qəznə vilayətidir. Bəziləri ona tümən də deyirlər. Səbük-Təkin ilə [Hindistan fatihi] Sultan Mahmudun [Qəznəvi] və oğlunun paytaxtı Qəznə imiş. Bəziləri Gəznin deyə də yazmışlar. Sultan Şəhabəddin Qurinin də paytaxtı ora imiş. Bu Sultan Şəhabəddini [Quri] *Təbəqati-Nasiri*də və bəzi hind tarixlərində Müizzəddin kimi yazmışlar.

Qəznə üçüncü iqlimdədir. Ona Zabil də deyirlər. Zabilistan bu vilayətdən ibarətdir. Bəziləri Qəndəharı da Zabilistana daxil edirlər. Kabildən qərbə doğru on dörd ağac məsafədədir. Bu yolu gedənlər dan ağararkən Qəznə-

---

[1] *Cuyi-xoş:* hərflərin cəmi əbcəd hesabı ilə 926 edir.

dən hərəkət edib iki namaz arasında və ya ikindi namazı vaxtında Kabilə çatır. Adinapur isə on üç ağac məsafədədir, lakin yolunun pis olması üzündən oraya heç bir vaxt bir gün ərzində gedib çata bilməmişlər.

Kiçık bir vilayətdir. Çayının dörd-beş dəyirman işlədəcək qədər suyu var. Qəznə şəhəri və dörd-beş kəndi bu suyla, dörd-beş kəndi də kəhrizlə suvarılır. Qəznənin üzümü Kabilinkindən daha yaxşıdır. Qovunu da Kabil qovunundan daha yaxşıdır. Alması da yaxşı **(138 a)** olur, onu Hindistana ixrac edirlər. Taxılı fövqəladə əziyyətlə becərilir, əkdikləri hər sahənin üstünü hər il bütüblüklə yeni torpaqla örtürlər. Lakin oranın əkininin məhsulu Kabilinkindən daha artıqdır. Boyaqotu əkir və Hindistanın hər tərəfinə ixrac edirlər. Bu əhalinin ən yaxşı məhsulu boyaqotudur.

Köçəriləri həzarələr və əgqanlardır. Qəznə Kabilə nisbətən daima ucuzdur. Əhalisi hənəfi məzhəbli, təmiz etiqadlı və müsəlman bir xalqdır. Üç ay oruç tutanları çoxdur. Ailə və qadınları çox mühafizəkar və qapalıdır.

Molla Əbdürrəhman Qəznənin ən böyük adamlarındandır. Alim adamdı və daima dərs verirdi. Fövqəladə dindar, Allahdan qorxan və pəhrizkar bir adamdı. Nasir Mirzə ölən il [=1515] vəfat etdi.

Sultan Mahmudun qəbri Qəznə civarındakı məhəllələrin birindədir və sultanın qəbri orada olduğu üçün buraya rövzə deyirlər. Qəznənin yaxşı üzümü rövzədə yetişir. Oğulları Sultan Məsud ilə Sultan İbrahimin qəbri də Qəznədədir. Belə mübarək məzarlar Qəznədə çoxdur.

Kabil və Qəznəni zəbt etdiyim il [=1505] Kühət, Bennu ovası və Əfqanıstanı yağmalayıb bir çox insan öldürdükdən sonra Düki üzərindən keçib Abi-İstadənin sahili ilə Qəznəyə gəldim. Qəznə kəndlərinin birində bir məzar olduğunu və salavat oxuyunca yırğalandığını söylədilər. Gedib gördüm və qəbrin yırğalandığı **(138 b)** hiss edildi. Sonra anlaşıldı ki, bu, mücavirlərin bir hiyləsi imiş. Onlar qəbrin üstünə tavan kimi bir şey düzəltmişlər. Ona toxunanda o, yırğalanır və bu zaman adamda qəbr hərəkət edirmiş hissi oyanır. Necə ki, gəmiyə heç minməmiş bir adam gəmiyə minincə sahilin hərəkət etdiyini hissinə qapılır. Mücavirlərin qəbrdən uzaq durmalarını əmr etdim. Bir neçə salavat oxudular, lakin qəbrdə heç bir hərəkət hiss edilmədi. Tavanı söküb qəbrin üstünə künbəz tikilməsini əmr etdim. Mücavirlərə isə təhdidlə bir də belə hərəkət etmələri qadağan edildi.

Qəznə çox əhəmiyyətsiz bir yerdir. Hindistan və Xorasanı öz hakimiyyəti altına alan padşahların, ələlxüsus xorasanlıların belə həqir bir yeri necə paytaxt elədiklərinə heyrət etməmək olmur.

Sultan (Mahmud) zamanında [=998-1030] Qəznənin üç-dörd bəndi varmış. Bəndlərdən biri Qəznə çayında, Qəznədən şimala doğru üç ağac məsafədə və suyun yuxarı tərəfindədir. Burada Sultan (Mahmud) böyük bir bənd tikdirmişdir. bu bəndin yüksəkliyi qırx-əlli kari, uzunluğu isə təxminən üç yüz kari qədərdir. Suyu oraya toplayıb ehtiyaca görə əkinlərə verirlərmiş.

Əlaəddin Cahansuz Guri bu vilayətə müsəllət olanda bəndi dağıtmış, sultanın övladlarından çoxunun qəbirlərini də təxrib etmiş, Qəznə şəhərini yaxmış, əhalisini öldürüb mallarını yağmalamış, qətliamın və dağıntının **(139 a)** ardından geridə görünəcək heç bir şey qoymamışdır. Bax, bu bənd də o zamandan bəri xarabdır. Hindistanı fəth etdiyim il bu bəndi təmir etmək üçün Xoca Kəlan ilə pul göndərdim. Allahın inayətiylə bu bəndin təkrar inşa ediləcəyinə ümid vardır.

Bəndlərdən biri də Sixandır. Qəznənin şərqində və ondan iki-üç ağac məsafədə olan bu bənd də o zamandan bəri xarabdır. Təmir ediləcək vəziyyətdə deyil. Bəndlərdən digəri də Sərdihə bəndidir ki, bu bənd abaddır.

Kitablarda yazıldığına görə, Qəznədə bir çeşmə varmış və bu çeşməyə zibil atsalar, o zaman dalğa, daşqın, yağmur və boran olarmış. Bir tarix kitabında yazıldığına görə, hind padşahlarından biri [Sultan Mahmudun atası] Səbük-Təkini Qəznədə mühasirəyə alanda Səbük-Təkinin əmriylə bu çeşməyə zibal atılır, dalğa, daşqın, yağmur və boran olur və bu şəkildə düşməni dəf edir. Mən Qəznədə nə qədər araşdırdımsa da, heç kim bu çeşmənin yeri haqqında məlumat verə bilmədi.

İraqeyn və Azərbaycanda Sultaniyə ilə Təbriz soyuqluğu ilə məşhur olduğu kimi, bu vilayətlər arasında da Qəznə ilə Xarəzm soyuqluğu ilə məşhurdur.

Tümənlərdən biri də Zürmət tümənidir; Kabilin cənubunda, Qəznənin cənub-şərqindədir. Kabildən on iki-on üç, Qəznədən isə yeddi-səkkiz ağac məsafədədir və səkkiz kənddən ibarətdir. Vilayət mərkəzi Gərdizdir. Gərdiz kurqanının içindəki evlər əksərən üç və ya dörd qatlıdır. **(139 b)** Gərdiz olduqca möhkəm bir yerdir. Bu şəhər Nasir Mirzə ilə düşmən olub Mirzəyə xeyli problem yaratmışdı.

Zürmət əhalisi əfqan-şaldır, onlar əkinçilik və kənd təsərrüfatı ilə məşğul olurlar. Ağacları, bağ və bağçaları yoxdur.

Bu tümənin cənubunda Bərəkistan dedikləri bir dağ, onun ətəyində də yüksək bir yerdə bir çeşmə var. Şeyx Məhəmməd Müsəlmanın qəbri buradadır.

Tümənlərdən biri də Fərmül tümənidir. Önəmsiz bir yerdir. Alması pis deyildir, Multana və Hindistana ixrac edilir. Hindistanda əfqanlar zamanında etibar görən Şeyx Məhəmməd Müsəlmanın övladları olan Şeyxzadələr Fərmüldəndir.

Tümənlərdən biri də Bəngəş tümənidir. Hər tərəfi yolkəsən əfqanlarla doludur. Hugiyani, xırılcı, turi və ləndər qəbilələri kənarda yaşadıqları üçün vergilərini könüllü verməzlər. Qəndəhar, Bəlx, Bədəxşan və Hindistanın fəthi kimi böyük işlər araya girdiyindən Bəngəşin zəbti üçün fürsətim olmadı. Allah rast gətirsə və fürsət versə, Bəngəşin yolkəsənləri ilə və şəhərin zəbti ilə uğraşmaya qərar verdim.

Kabilin bölüklərindən biri də Ala say bölüyüdür; Nicravdan iki-üç şeri qədər məsafədədir. Şərqə doğru Nicrav tərəfindən yol dümdüz gəlir və Kürə deyilən yerə çatar-çatmaz Ala saya doğru bir az kiçık bir keçid enir. Bu tərəfin isti iqlimiylə soyuq iqliminin ayrıldığı yer Kürə keçididir. Bu Kürə keçidi ilkbaharda quşların keçdiyi bir yerdir. Nicrava tabe olan Piçgan əhalisi bu keçiddə çox **(140 a)** quş tutur. Keçidin sonunda hər yerə daş sığınaqlar tikmişlər. Quş tutan adamlar bu sığınaqlarda oturub torun bir ucunu beş-altı kari qədər uzaq bir yerə bağlayır və bir tərəfini yerə daşla bərkidir, digər tərəfinə də torun yarısına qədər uzaqda və üç-dörd kari uzunluğunda bir ağac bağlayırlar. Ağacın bir ucunu sığınaqda oturan adam əlində tutur və sığınağın dəliklərindən bayırı müşahidə edir. Quşlar yaxınlaşınca toru dərhal yuxarı qaldırır və quşlar hamısı tora düşürlər. Bu şəkildə o qədər çox quş tuturlar ki, kəsməyə vaxt tapmırlar.

O vilayətdə Ala sayın narından daha yaxşı nar tapılmaz və bu narı Hindistanın hər tərəfinə ixrac edirlər. Üzümü də pis deyil. Ala sayın şərabları Nicrav şərablarına görə daha qüvvətli, rəngi də daha gözəldir.

Bölüklərdən biri də Bedrav bölüyüdür və Ala sayın yanındadır. Burada meyvə olmur. Əhalisi kafirdir və əkin-biçinlə məşğul olur. Xorasan və Səmərqəndin köçəriləri türklər və aymaqlar olduğu kimi, bu vilayətin köçəriləri də həzarələr və əfqanlardır. Həzarələr arasında ən çoxsaylısı Sultan Məsudi həzarəsi, əfqanlar arasında isə məhmənd əfqanlarıdır.

Kabilin gəliri torpaq, gömrük və köçərilərdən alman vergilərlə birlikdə səkkiz lek[1] şahruxi[2] tutdu. **(140 b)**

Kabil vilayətinin şərq tərəfindəki dağları iki, qərb tərəfindəki dağları da iki cürdür. Əndərab, Hast və Bədəxşan dağları başdan-başa arçan ilə örtülü, bol sulu və yumşaq təpəli dağlardır.

Dağ, təpə və dərələrinin otu birbirinin eynidir və yaxşıdır. Çox yerində bütəkə otu bitir və ata fövqəladə yaxşı gəlir. Əndican vilayətində də bu ota bütəkə deyirlər, lakin nə üçün elə deyildiyi bilinmir. Bu vilayətlərdə anlaşıldı ki, bu ot dəmət-dəmət çıxdığı üçün bütəkə deyirlər. Hisar, Xutlan, Səmərqənd, Fərqanə və Moğolistan yaylalarının hamısı bu cür yaylalardır. Gərçi Fərqanə ilə Moğolistan yaylaları bu yaylalarla müqayisə edilə bilməz, lakin bunlara bənzər dağ və yaylalardır.

Nicrav, Ləmqanat, Bəcur və Sevad dağları isə sıx şam, çilgüzə, palıd, zeytun və saqqız ağaclarıyla örtülüdür. Otu digər dağların otuna bənzəməz; çox və yüksək olmasına baxmayaraq işə yaramır, ata və qoyuna xoş gəlmir. Düzdür, o dağlar qədər yüksək deyillər və gözə kiçık görünürlər, lakin çox sarp dağlardır. Düz təpələrmiş kimi görünürlər, lakin bütün təpə və dağları sarpdır, daşlıdır və hər yerindən atla keçilməz. Bu dağlarda Hindistan quş-

[1] *Lek:* 100.000-ə uyğun gələn bir rəqəm.

[2] *Şahruxi:* qızıl ölçüdür, 1 şahruxi = 4.5 qızıl quruş.

ları və heyvanları **(141 a)** lap çox olur. Tutuquşu, şarək, tovuz, lucə (nuha), meymun, nilqav, qısaayaq maral və bunlardan başqa da növ-növ elə quş və heyvanlar var ki, Hindistanda belə bu heyvanlar haqda heç nə eşitməmişlər.

Qərb tərəfindəki dağlardan Dəreyi-Zindan, Dəreyi-Suf, Gürzüvan və Garcistan dağları da bu cür dağlardır. Otlaqları əksərən dərələrindədir. Dağ və təpələrdə, o dağlardakı kimi hər yerdə ot olmaz, o qədər bol ağacı və arçanı da yoxdur, lakin otu ata və qoyuna yaxşı gəlir. Bu dağların üstü hər yerdə at çapacaq qədər düzdür. Əkin yerləri də orada yerləşir. Bu dağlarda geyik çoxdur. Yalnız suları sarp dərələrdədir. Çox yeri qayalıqdır, hər yerdən enmək mümkün deyil. Qəribədir ki, bütün dağların sarp yerləri yüksəkliklərdə olduğu halda, bu dağların sarp yerləri aşağı tərəflərindədir.

Gür, Gəzyu və Həzarə dağları da buna bənzər dağlardır. Otlaqları dərələrdədir, dağlarında ağacı azdır, arçan ağacı heç bitməz. Otu ata və qoyuna yaxşı gəlir. Geyiyi boldur. Yuxarıda sözü edilən dağların sarp yerləri aşağı tərəflərində yerləşir, bu dağlarsa elə deyildir.

Xoca İsmail, Dəşt, Düki və Əfqanistan dağları bu cür dağlardır. Ümumən alçaq, otu az, suyu az, ağacsız, görünüşü çirkin və şoran **(141 b)** dağlardır. Dağları əhalisinə uyğundur. Necə ki, «dəng olmayan tuş olmaz» demişlər. Dünyada belə şoran dağlar az tapılar.

Düzdür, Kabildə qışda qar çox yağır, lakin yaxşı odunları var və yaxınındadır. Bir gündə gedib gətirilə bilər. Odunları saqqız ağacı, palıd, acıbadam və kərkənddir. Bunların ən yaxşısı saqqız ağacıdır, parlayaraq yanır, tüstüsünün iyi yaxşı olur, istiliyi davamlıdır, hətta yaşı da yanır.

Palıd da yaxşı odundur. Düzdür, bir az yavaş yanır, lakin yaxşı yanır və istisi davamlıdır. Palıd ağacının qəribə bir özəlliyi var, yaşıl yarpaqlı budaqlarına od vurulsa, qəribə bir çıtırtı ilə yanır. Bir ucundan o biri ucuna qədər çıtırdayaraq birdən yanır. Bu ağacın yanması çox gözəl bir əyləncədir.

Acıbadam hamısından daha artıqdır və daha çox yayılmışdır.

Kərkənd bir tür qısatikanlı çalıdır. Yaşı da, qurusu da eyni şəkildə yanır, bütün Qəznə əhalisinin odunu budur.

Kabil vilayəti dağların arasındadır.Yonca sıraları kimi dağlar var, dağların arasında düz dərələr yerləşir və məmur yerləri bu aralıqlardadır. Geyiyi və ovu çox deyildir. Yaz və payız mövsümlərində qızıl geyik, yəni arxarqulçanın qışlaq və yaylağa keçərkən izlədiyi müəyyən boğazlar var. Köpəkləri və quşları olan həvəsli igidlər bu boğazları **(142 a)** tutaraq geyik ovlayırlar.

Xurd-Kabil və Sürxab tərəflərində qulan da olur. Lakin ağ geyik heç olmaz. Qəznənin isə ağ geyiyi və qulanı var. Qəznənin ağ geyiyi qədər kök geyik az yerdə tapılar.

Yazda Kabilin quş ovlayacaq yeri çoxdur. Quşların keçdiyi əsas yer Baran sahilidir. Çünki Kabilin şərq və qərb tərəfi dağlıqdır, Baran sahilinin qarşısı yalnızca böyük Hinduquş keçididir və bundan başqa bir keçid yoxdur,

bu üzdən bütün quşlar buradan keçir. Külək və ya Hinduquş keçidi üzərində bir az bulud olsa, quşlar keçə bilmir və hamısı Baran ovasına enir. Bax o zaman civardakı əhali çox quş tutur. Baran sahilində qışın sonlarında ördək çox, həm də fövqəladə kök olur. Ondan başqa, durna, qarqara və digər böyük quşlar saysız-hesabsızdır.

Baran sahilində ip ataraq çox durna tuturlar. Leylək, qızılqaz və durnaları iplə tuturlar. Bu şəkildə quş tutmaq buraya məxsusdur. Bu ovun təfsilatı belədir: bir ox atımı uzunluğunda incə bir ipi bükürlər. Bu ipin bir ucuna ox, o biri ucuna da budaqdan düzəldilmiş bir halqa bağlayırlar. Bilək yoğunluğunda **(142 b)** və bir qarış uzunluğunda bir ağac alırlar. Bu ipi sonuna qədər oxun bağlı olan ucundan başlayaraq bu ağaca sarıyırlar. İp bu şəkildə tamamilə sarıldıqdan sonra halqanı bağlayırlar. Ondan sonra bilək yoğunluğunda olan bu ağacı ipin içindən çəkirlər. İp sarılmış bir biçimdə və içi boş olaraq qalır. Halqanı ələ alıb gəlməkdə olan quşun önünə oxu atırlar. Qanadına və ya boynuna toxunanda, quş ipə sarılaraq düşür. Bütün Baran əhalisi bu üsulla çoxlu quş tutur.

Lakin bu quş ovu olduqca əziyyətli bir işdir. Bunun üçün yağmurlu və qaranlıq gecələr lazımdır. Belə gecələrdə quşlar yırtıcı heyvanlar üzündən sabaha qədər durub-dincəlmədən və eyni zamanda çox alçaqdan uçurlar. Qaranlıq gecələrdə quşların yolu axan sudur, çünki su qaranlıqda bəyaz görünür. Qorxudan su üzərində yuxarı-aşağı sabaha qədər gedib-gəlirlər. Bax, ipi bu zaman atırlar. Mən də bir dəfə gecə ip atdım. İp qopdu və quş da tapılmadı. Ertəsi sabah quşu qopmuş iplə birlikdə tapıb gətirdilər. Bu üsulla Baran əhalisi çox quş tutur.

Lələk durnadan əldə edilir. Kabildən İraqa və Xorasana ixrac edilən maddələrdən biri də bu ləlkdir.

Əhalidən başqa, bir də ayrıca ovçular da vardır. Bunlar iki-üç yüz ailə qədərdir. Teymur bəyin övladlarından biri bunları Multan civarından **(143 a)** buraya gətirdib yerləşdirmişdir. Bütün işləri-gücləri quş tutmaqdır. Bunlar gölməçələr düzəldib bir çox budaqlar dikərək, suyun ortasında torlar quraraq hər cür quş tuturlar. Yalnız ovçular deyil, bütün Baran əhalisi ip atıb tələ quraraq müxtəlif üsullarla çoxlu və hər cür quş tuturlar.

Bu mövsüm Baran çayından balıqların keçdiyi zamandır. Torla və ya səbət bağlayıb çox balıq tuturlar. Bir də payızda qulanquyruğu otundan on- on iki yük, göy şibək otundan isə iyirmi-otuz yükə qədər su yanına gətirib əzərək suya tökürlər və dərhal suya girib sərxoş olan balıqları tutmağa başlayırlar.

Bir az aşağıda və uyğun bir yerdə səbət bağlayırlar. Səbət bağlamaq bu şəkildə olur: barmaq yoğunluqda qələmələri tor zənbil kimi hörürlər. Bu toru suyun töküldüyü yerə qoyub ətrafına daş yığırlar. Belə ki, su çağlayaraq bu torun üzərinə tökülür və aşağıya gedir. Su aşağıya gedincə balıq da torun üstündə qalır. Sərxoş olan balıqları yuxarıdan yığa-yığa gəlirlər. Bu səbətlə çox

balıq tuturlar. Gülbahar, Pərvan və İstalif sularında bu şəkildə balıq ovlayırlar.

Qışda Ləmqanatda qəribə bir şəkildə **(143 b)** balıq tuturlar. Suyun töküldüyü məkanda yeri bir ev qədər qazaraq çuxurlar düzəldir və ocaq daşı boyda daşları bu çuxurlara qoyub üstünə daş yığırlar. Bu yerlərdə su altından bir dəlik buraxırlar. Daşları o şəkildə yerləşdirirlər ki, bu dəlikdən başqa heç bir yerdən balıq nə girə, nə də çıxa bilir. Su bu yığılmış daş üzərindən axır. Bu, bir balıq yuvası vəzifəsini yerinə yetirir. Qışda nə zaman balıq lazım olsa, bu çuxurların birini açıb qırx-əlli balığı birdən gətirirlər.

Bunları bu şəkildə açırlar: çuxuru müəyyən bir yerdə düzəldir və çuxurun dəliyindən başqa hər tərəfinə düyü samanı, onun da üstünə daş qoyurlar. Dəliyinə tor kimi bir şey toxuyub iki başını bir yerə birləşdirərək bağlayırlar. Onun içində yenə bir parça yeri torla bağlayırlar. Elə ki, ağzı bu torla birlikdə və uzunluğu da əvvəlki torun yarısı qədər olur, iç ağzını dar edirlər. Bu daxili torun iç ağzından girən balıqlar böyük torun içinə gedirlər. Böyük torun alt tərəfindəki ağzını elə düzəldirlər ki, onun yuxarı tərəfindəki ağzından girən balıq daxili **(144 a)** ağzından bir-bir keçir. Bu iç tərəfdəki ağızın ağaclarının uclarını birləşdirirlər.

Balıqlar bu ağızdan keçib böyük torun içinə girirlər. Çıxılacaq ağzı bağlı olduğundan balıq çıxa bilmir. Geri dönsə bu kiçık torun daxili ağzının şişləri üzündən keçə bilmir. Bu toru həmin o buraxmış olduqları dəliyə qoyurlar. Balıq yuvasının üstünü açırlar. Ətrafı da düyü samanıyla bağlıdır. Bu çuxurda ələ nə keçsə yaxalayırlar. Balıq qaçsa belə, dəlik bir dənə olduğu üçün o tora düşür və orada tuturlar. Bu cür bir balıq ovu başqa yerdə görünməmişdir.

## MÜQİMİN GETMƏSİ VƏ VİLAYƏTİN BƏYLƏR ARASINDA BÖLÜŞDÜRÜLMƏSİ

Kabilin alınmasından bir neçə gün sonra Müqim Qəndəhar tərəfinə getmək üçün izin istədi. Əhd və şərtlə gəlmiş olduğu üçün bütün adamları və malıyla birlikdə böyük qardaşının və bacısının yanına sağ-salamat getməsinə izin verildi. Müqimə izin verilmdikdən sonra Kabil vilayəti mirzələr və bütün qonaq bəylər arasında paylaşdırıldı.

Qəznə civarıyla birlikdə Cahangir Mirzəyə verildi. Nigənxar tüməni, Məndravər, Dəreyi-Nur, Nurgil və Çagan saray isə Nasir Mirzəyə verildi. Qazaxlıqlarda mənimlə birlikdə olub birlikdə gəldiyim bəylərin və igidlərin bəzilərinə **(144 b)** kənd və ərazi kimi şeylər verildi, heç kimə vilayət verilmədi. Yalnız bu dəfə deyil, tanrı təala bir dövlət verəndə hər zaman qonaqlar, yad bəylər və igidlər mənim əski silahdaşlarımdan və əndicanlılardan daha artıq və daha yaxşı iltifat görmüşlər. Buna baxmayaraq, qəribə bir ta-

ledir ki, məni hər zaman əski silahdaşlarımı və əndicanlıları başqalarından üstün tutmaqla suçlamışlar.

Bir məsəl vardır: «Düşmən nə deməz, düşə nə girməz». «Dərvazeyi-şəhr ra təvan bəst, nətvan dəhani müxalifan bəst»[1].

Səmərqənd, Hisar və Qunduzdan çoxlu el və ulus Kabil vilayətinə gəlmişdi. Buna görə də «Kabil kiçık bir yerdir; qələmdən daha çox qılıncla idarə edilir. Bütün gələnlərə pul vermək mümkün deyil. Bu el və ulusun ailələrinə bir qədər yemək verək və əsgər axına çıxsın» fikri uyğun görüldü və buna qərar verib Kabil və Qəznə vilayətlərinə və civarına otuz min eşşək yükü[2] qədər vergi kəsildi. Kabilin gəlirini və məhsulunu bilmədən bu qədər çox vergi kəsildiyi üçün vilayət çox ağır bir vəziyyətə düşdü.

Bu zamanlarda Baburi yazısını icad etdim.

Sultan Məsudi həzarəsinə xeyli qoyun və at vergisi kəsilib təhsildarlar göndərildi. Bir neçə gün sonra təhsildarlardan həzarələrin malı **(145 a)** verməyərək üsyan etdikləri xəbəri gəldi. Bundan bir müddət öncə onlar bir neçə dəfə Gərdiz və Qəznə yollarına basqın etmişlər. Bu üzdən Sultan Məsudi həzarəsinə axın etmək üzərə hərəkətə keçdik. Meydan yoluyla gəlib gecə Nırx keçidindən keçərək sabah namazı vaxtı Çetu civarında olan həzarələrə axın etdik, lakin istənilən nəticə alınmadı. Oradan Səngi-Surah yoluyla geri dönərkən Cahangir Mirzənin Qəznəyə getməsinə izin verildi. Kabilə gələndə Dərya xanın oğlu Yar Hüseyn Bxirə tərəfindən gəlib sədaqətini bildirdi. Bir neçə gün sonra əsgər səfərbər edildi və civarı bilən adamlar dəvət edilərək ətraf tədqiq olundu. Bəziləri Dəşti tövsiyə etdi, bəziləri Bəngəşi uyğun gördü, bəziləri də Hindistan üzərinə səfəri məsləhət bildi. Toplantının sonunda Hindistan səfərinə qərar verdik və şaban ayında [=1505 yanvar] günəş dəlv bürcündə ikən Hindistana getmək niyyətilə Kabildən yola çıxdıq. Badam-Çeşmə və Çigdəlik yoluyla altı mənzildən sonra Adinapura gəldik.

## HİNDİSTANA İLK AXIN

İsti iqlim vilayətlərini və Hindistan civarını o zamana qədər heç görməmişdim. Nigənxara varınca başqa bir aləm meydana çıxdı. Otlar, ağaclar, heyvanlar, quşlar, əhalinin **(145 b)** adət-ənənəsi tamamilə başqa idi. Heyret etdik və həqiqətən də heyrət ediləcək dərəcədə idi.

Bir az əvvəl vilayətinə getmiş olan [Baburun kiçık qardaşı] Nasir Mirzə Adinapurda gəlib bizə sədaqətini bildirdi. Bu münasibətlə oraya getmiş olan aymaq və adamlarm hamısı qışı keçirmək üçün köç edib Ləmqanata gəlmişdi.

[1] «Şəhərin qapılarını bağlamaq olar, müxaliflərin ağzını bağlamaq olmaz».

[2] *Eşşək yükü*: mətndə *xarvar* və ya *xərvar* olaraq keçən bu ağırlıq ölçüsünün dəyəri dəqiq müəyyən deyil. Xalvar sözü də bu sözdən olmalıdır.

Onların əsgərləri ilə geridə qalan əsgərləri gözləmək üçün bir-iki gün o civarda qaldıq. Onlar da bizə qoşuldqdan sonra gəlib Cuyi-Şahidən keçib aşağıda Quş-Künbəzdə düşərgə qurduq. Nasir Mirzə adamlarına vilayətindən bəzi şeylər gətirmək üçün iki-üç gün sonra gəlmək üzərə izin istəyərək orada qaldı. Quş-Künbəzdən qalxıb Gərm-Çeşməyə gələndə [əfqan qövmlərindən] kakiyaninin rəislərindən Pixi adlı birini yanıma gətirdilər. O buraya karvanla gəlmişdi. Yol və yer barədə yararlanmaq üzərə bu Pixli də bizimlə birlikdə qaldı.

Bir-iki mənzildə qaldıqdan sonra Xeyberdən keçib Cama endik. Körə-Kətri haqqında eşitmişdim. Ora yoqların və hindlərin məbədlərindən biri imiş. Uzaq yerlərdən gəlib burada saç və saqqallarını təraş edirlərmış. Cama enincə Biqramı seyr etmək üçün oraya getdim. Böyük bir ağaca çıxıb oradan Biqram civarını seyr etdim. Bələdçimiz Məlik Busəid Kəməri idi. Bir neçə dəfə Körə-Kətrini soruşdum, söyləmədi.

Dönüb qərargaha **(146 a)** gələndə Xoca Məhəmməd Eminə «Körə-Kətri Biqramın qarşısında idi, dar mağaralı və təhlükəli bir yer olduğu üçün söyləmədim» demişdi. Xoca onun hərəkətini bəyənmədiyi üçün dediklərini dərhal mənə söylədi. Gec olmuşdu, yol da uzaq idi. Gedə bilmədik.

## KÜHETƏ VƏ DƏŞTƏ AXIN EDİLMƏSİ

Bu yurdda Sind çayının necə keçiləcəyi və hansı tərəfə gediləcəyi barədə danışıb məsləhətləşdik. Baqi Çağanyani çayı keçməzdən əvvəl buradan iki günlük məsafədə yerləşən, Kühet deyilən, əhalisi çox və zəngin olan yerə getmək təklifini irəli sürdü. Kabilli bir neçə adam gətirdi, onlar da onun sözünə qüvvət verdilər. Bu yerlər barədə əvvəllər heç nə eşitməmişdik. Etibar sahibi bir adam Kühet tərəfinə yürüməyi uyğun görərək, öz fikrini isbat etmək üzərə bir neçə şahid də gətirdiyi üçün çayı keçib Hindistana getmək fikrindən vaz keçdik və Camdan qalxıb Bare çayını keçərək Məhəmməd Pixin ətəyinə yaxın bir yerə endik.

O zamanlar kakiyani əfqanları Perşavərdə olurdular və əsgərdən qorxaraq bu dağın ətəklərinə çəkilmişdilər. Kakiyaninin böyüklərindən olan Xosrov Kakiyani bu yurdda ikən gəlib bizə sədaqətini bildirdi. Onu da Pixli ilə birlikdə yol və yer **(146b)** xüsusunda yararlanmamız üçün yanımızda götürdük.

Bu yurddan gecə yarısı qalxdıq və günəş doğarkən Məhəmməd-Pixi keçib günortaya yaxın Kühetə axın etdik. Xeyli öküz və camış ələ keçirildi. Əfqanlardan da bir çox əsir ələ keçdi. Əsirlərin hamısı sərbəst buraxıldı. Evlərində ərzaq da çox idi. Axınçılar Sind dəryası sahilinə qədər axına getdilər və ertəsi gün gəlib bizə qoşuldular. Baqi Çağanyaninin söylədiyinin tərsinə, əsgərin əlinə heç bir şey keçmədi. Baqi Bəy bu üzdən bir az utandı.

Kühetdə iki gecə qalıb axınçıları topladıqdan sonra hansı tərəfə getmək xüsusunda məşvərət etdik. Bəngəş ilə Bennu civarındakı əfqanların üs-

tünə axın edilib Negar və ya Fərmül yoluyla qayıtmağı qərara aldıq. Kabildə gəlib mənim xidmətimə girən Dərya xan oğlu Yar Hüseyn belə bir xahişlə müraciət etdi: «Əgər diləzaq, Yusif-zey və kakiyanilərə [əfqan qəbilələri] mənə tabe olmaları haqqında fərman versəniz, onda mən padşahın qılıncını Sind çayının o tərəfinə apraram». İstədiyi fərmanları verərək onun Kühetdən getməsinə izin verdik.

Kühetdən qalxıb Həngü yoluyla yuxarı Bəngəş tərəfinə yürüdük. Kühet ilə **(147 a)** Həngü arasında bir dərə vardır. İki tərəfi dağdır və yol bu dərədən keçir. Qalxıb bu dərəyə girəndə Kühet və o civar əfqanlarının hamısı yığışaraq dərənin iki tərəfindəki dağın üzərinə çıxıb savaş nərəsi çəkərək gurultu qoparmağa başladı.

Məlik Busəid Kəməri bütün Əfqanistanı yaxşı tanıyırdı və bu səfərdə bələdçi o idi. O bir az irəlidə yolun sağında tək bir dağ olduğunu, əgər əfqanlar bu dağdan o dağa keçsələr, ora tək bir dağ olduğu üçün onları tam mühasirəyə alma imkanı olduğunu söylədi. Allah rast gətirdi və bu əfqanlar bizi təqib edərək o tək dağa çıxdılar, iki dağın arasındakı boyunu tutmaq üçün dərhal bir dəstə igid göndərildi. Digər əsgərlərə də hər iki tərəfdən olduqları yerdən yürümək əmri verildi.

Hər kəs olduğu yerdən yürüyüncə, onlar da vuruşa bilmədilər, qısa müddətdə yüz-yüz əlli əfqanı ələ keçirib bəzilərini diri olaraq, çoxunun da başını kəsərək gətirdilər.

Əfqanlar müharibədə aciz bir vəziyyətdə qalınca, düşmənlərinin qabağına dişləri arasına ot alaraq gəlirlər və bununla «mən sənin öküzünəm» demək istəyirlərmiş. Bu adəti orada **(147 b)** gördük. Aciz bir vəziyyətdə qalan əfqanlar, dişləri arasına ot alaraq gəldilər. Diri gətirilənlərin də boyunları vurdurularaq, endiyimiz yurdda kəsilən başlardan bir minarə düzəldildi.

Ertəsi sabah oradan qalxıb Həngüyə endik. O civardakı əfqanlar kiçık bir dağı səngər etmişdilər. Səngər kəlməsini Kabilə gəldiyimiz zaman eşitmişdik. Buradakı xalq dağı möhkəmləndirməyə səngər deyirmiş. Yetişən əsgər səngəri yıxaraq, yüz-iki yüz asi əfqanın başını kəsib gətirdi. Burada da kəsilən başlardan bir minarə düzəldildi.

Həngüdən qalxıb ertəsi gün yuxarı Bəngəşin ətəyində Til deyilən bir yerə getdik. Burada da əsgərlər ətrafdakı əfqanların üstünə axına getdi. Bir səngərdən bəzi axınçılar əliboş qayıtdılar.

Buradan qalxıb arada bir dincəldikdən sonra ertəsi sabah, dimdik bir enişdən enib çox uzun bir boğazdan keçərək Bennuya düşərgə qurduq.. Əsgərlər, dəvələr, atlar bu enişdə və boğazdan keçərkən fövqəladə çox əziyyət çəkdilər. Ələ keçən qənimət və öküzlərin də çoxu qaldı. Əsil yol sağ tərəfimizdə bir-iki küruh məsafədə imiş. Bu yol atlı yolu deyilmiş.

Çobanlar bəzən sürülərini bu yol və boğazdan **(148 a)** endirdikləri üçün bu yola usfənd-liyar [qoyun yolu] deyirlərmiş. Əfqan dilində yola liyar

deyirlər. Bələdçimiz Məlik Busəid Kəməri idi və əsgərin çoxu yolun tərs çıxmasında onu günahkar sayırdı.

Bəngəş və Negar dağlarından keçincə dümdüz bir yerdə Bennu yerləşir. Şimalı Bəngəş və Negar dağlarıdır. Bəngəş çayı Bennuya çıxır. Bennu bu su sayəsində abaddır. Cənubu Çuparə və Sind çayıdır. Şərqi Dinqut, qərbi Bazar və ya Tak da dedikləri bir çöldür. Əfqan qəbilələrindən kurani, kivi, sur, İsa-heyl və niyazilər bu vilayəti əkirlər.

Bennuya enəndə ovadakı qəbilələrin şimal tərəfdəki dağlarda bir səngər qazdığı xəbər alındı. Cahangir Mirzə komandanlığında əsgər göndərildi. Kivi səngəri imiş, gedib qısa müddətdə səngəri alaraq, qətliam edib bir çox baş kəsib gətirdilər. Əsgərin əlinə xeyli ağ qumaş keçdi. Bennuda da kəsilən başlardan bir minarə düzəldildi.

Bu səngər ələ keçirildikdən sonra kivinin böyüklərindən Şadi xan adında biri dişləri arasına ot alaraq sədaqətlərini bildirməyə gəldi. Əsirlərin həyatını bağışladıq.

Kühetə axın edərkən Bəngəş və Bennu civarındakı əfqanlara axın etdikdən sonra Negar və ya Fərmül yoluyla **(148 b)** geri qayıtmaq qərara alınmışdı. Lakin Bennuya axın etdikdən sonra bu civarı bilən adamlar Dəştin yaxın olduğunu, əhalisinin çox, yolunun da yaxşı olduğunu və Fərmülə çıxdığını söylədilər.

Dəştə axın edib o yolla çıxmağa qərar verdik və ertəsi sabah oradan qalxıb bu çayın sahilində yerləşən İsa-heyl qəbiləsinin kəndinə gəldik.

İsa-heyllər gəlişimizi xəbər alaraq Çuparə dağlarına çəkilmişdilər. Bu kənddən qalxıb Çuparə dağlarının ətəyinə getdik. Axınçılar dağlara gedərək İsa-heyllərin bir səngərini yıxıb qoyun, heyvan və qumaş gətirdilər. O gecə İsa-heyl əfqanları bir gecə basqını elədilər, amma o səfər zamanı çox ehtiyat tədbirləri alınmışdı və heç bir şey edə bilmədilər.

Ehtiyat tədbirləri bu şəkildə alınırdı: sağ qol, sol qol, mərkəz və öncülərin hamısı öz yerində enir, hər qol silahlanaraq öz olduğu yerdən piyada ordugahın ətrafına və çadırlardan bir ox atımı qədər uzaq bir məsafəyə çıxıb gecələri orada keşik çəkirdi. Hər gecə bu şəkildə əsgər çıxarılırdı. İçkilərdən üçü-dördü sıra ilə hər axşam növbəyə çıxırdı. Mən də bir dəfə dolaşdım. Növbəyə çıxmayan adamların **(149 a)** burunlarını dəlib əsgərlərin arasında gəzdirirdik.

Sağ qolda Cahangir Mirzə, Baqi Çağanyani, Şirim Tağayi, Seyid Hüseyn Əkbər və digər bəzi bəylər; sol qolda Mirzə xan [Baburun əmisi oğlu Sultan Veys Mirzə], [Kabilin son hökmdan Uluğ bəy Mirzənin oğlu] Əbdürrəzzaq Mirzə, Qasım bəy və digər bəzi bəylər dururdu. Mərkəzdə böyük bəylərdən heç kimsə yoxdu; hamısı içki bəylərdi. Öncü qolunda Seyid Qasım eşik-ağa, Baba oğlu Allahquluverən və digər bəzi bəylər olurdu. Əsgər altı bölüyə ayrılmışdı, hər bölük bir gecə-gündüz ard-arda növbə tuturdu.

O ətəkdən qalxıb qərbə doğru yürüyərək, Dəşt ilə Bennu arasında su-

suz bir dərədə endik. Əsgərlər sel yatağını qazıb özləri və heyvanları üçün su götürdülər. Bir-bir yarım kari qazılsa, sel yatağından su çıxırdı. Yalnız bu sel yatağının deyil, Hindistanın bütün sel yataqlarının belə bir özəlliyi var: bir və ya bir yarım kari qazılsa, mütləq su çıxır. Allahın qüdrətinə bax! Hindistanda çaylardan başqa axarsu yoxdur. Sel yataqları axarsulara yaxındır.

Bu quru sel yatağından səhər vaxtı qalxdıq və ikindi vaxtı yüngül süvari dəstəsi Dəştin kəndlərinə çatdı. Axınçılar bir neçə kəndə axın edib heyvan, qumaş və ticarət atları gətirdilər. Bu gecə sabaha qədər və ertəsi gün günortaya qədər geridə qalan yük heyvanları, dəvələr və piyada əsgərlər **(l49 b)** gəlməyə davam etdi. Burada qaldığımız gün axınçılar gedib Dəştin kəndlərindən xeyli öküz və qoyun ələ keçirdilər, əfqan tüccarlarına rast gələrək xeyli ağ qumaş, ədviyyat, şəkər, şəkər qamışı, cins atlar və ticarət atları gətirdilər. Hindi Moğol əfqanlar arasında məşhur və mötəbər tüccarlardan olan Xoca Xızır Nuhanini atdan salaraq başını kəsib gətirdi.

Şirim Tağayi axınçıların arxasından getmişdi. Bir piyada əfqan onunla qarşılaşaraq, [döyüşdə] Şirim Tağayinin şəhadət barmağını kəsib saldı.

## KABİLƏ QAYIDIŞ

Ertəsi gün qalxıb Dest kəndlərinə yaxın bir yerə, oradan da Gumel çayının sahilinə endik. Dəştdən Qəznə tərəfinə iki yol çıxır. Biri Səngi-Surah yoludur. Bu yol Bərkdən keçib Fərmülə gedir, o biri isə Gumel çayı sahilini təqib edərək Berkə çatmadan Fərmülə gedir. Bəziləri Gumel yolunu təriflədilər.

Biz Dəştdə ikən iki-üç gün boyunca aramsız yağış yağdı. Gumel çayı möhkəm daşdı və bir keçid taparaq təlaşla keçdik. Yolu bilən adamlar Gumel yolunda bu çayı bir neçə dəfə keçməmiz gərəkdiyini və su belə yüksək olsa keçilməsinin çətin olacağını dedilər. Onun üçün bu yolla bağlı tərəddüd etdik. Hələ qərar verməmişdık. Ertəsi gün «qalx!» davulları çalındıqdan sonra at üstündə **(150 a)** danışaraq hansı yoldan gedəcəyimizi qərarlaşdırmaq fikrindəydim.

Ramazan bayramı [=7 mart 1505] günü idi. Mən bayram qüslü ilə məşğul oldum. Cahangir Mirzə ilə bəylər danışmışlar. Bəziləri demiş ki, Dəştin qərb tərəfində Mehtər Süleyman dağı deyilən bir dağ, onun da Dəşt ilə Düki arasında bir çıxıntısı var. Bu çıxıntıdan sonra yol düzdür, amma bir-iki günlük qədər daha uzundur. O yoldan getməyə qərar verərək, çıxıntı yoluna girmişlər.

Mən qüslümü bitirincəyə qədər bütün əsgər çıxıntı yoluna doğru getmiş və böyük bir qismi də Gumel çayından keçmişdi. Bilinən yollar olmadığı üçün də yolun uzaq və ya yaxın olduğunu bilmədən bir yığın uydurma sözlərlə bu yola girdik.

Bayram namazı Gumel çayı sahilində qılındı. Novruz o bayrama yaxın

olub fərqi bir-iki gündü. O münasibətlə bu qəzəli söyləmişdim:

Yeni ay yar üzü birlə görüb, el şadi-xürrəmlər,
Mana üzü qaşından ayrı bayram ayında qəmlər.

Yüzi-novruziyü vəsli-eydini, Babur, qənimət tut,
Ki bundan yaxşı olmaz, olsa yüz novruz bayramlar.

Gumel çayını keçdik və dağ ətəyini izləyərək günəyə doğru yürüdük. Bir-iki küruh getmişdik **(150 b)** ki, dağ ətəyindəki təpələrdə gözünü qan tutan bir neçə əfqan ortaya çıxdı. Atları dördnala çaparaq dərhal o tərəfə cumduq.

Əfqanlarm çoxu qaçdı, bəziləri isə dağ ətəyindəki xırda təpə və kəmərlərdə kor-koranə toplandı. Bir əfqan kiçık bir təpənin üstündə dururdu. Deyəsən, arxasında uçurum vardı, ona görə gedəcək yeri yox idi. Sultanqulu Çanaq zirehli bir halda oraya çıxıb vuruşaraq adamı ələ keçirdi. Bu mənim hüzurumda gördüyü bir işdi və bu iş onun etibar görüb yüksəlməsinə səbəb oldu.

Bir kəmərdə isə Qutlu Qədəm bir əfqanla vuruşub tudaşdı, on-on iki kari qədər bir yerdən birlikdə aşağıya düşdülər. Başını kəsib gətirdi.

Kəpə də bir dağın üstündə bir əfqanla əlbəyaxa olaraq dağ üstündən dağın yarısına qədər yuvarlanıb gəldi. O da onun başını kəsib gətirdi. Bu əfqanların bir çoxu əsir edilmişdi, hamısı sərbəst buraxıldı.

Dəştdən qalxıb Mehtər Süleyman dağının ətəyi ilə günəyə doğru yürüdük. Üç dəfə dincəldikdən sonra Sind çayının sahilində yerləşən, Multana tabe olan kəndlərdən birinə, Bilə deyilən kiçık bir qəsəbəyə çatdıq. Əsgərlər gəmilərə minib suyu keçdilər, bəziləri isə üzərək keçdilər. Bu kənd qarşısında bir ada vardı. **(151 a)** Geri qalan əhalinin bir qismi bu adada göründü. Əsgərin böyük bir qismi at və silahlarıyla suya girərək oraya keçdi. Bir neçə adamı su götürdü. Bunlar arasında mənim adamlarımdan Qul Anıqla Mehtər Fərraş, Cahangir Mirzənin adamlarından isə Kaymas Türkmən də vardı.

Bu adada əsgərin əlinə qumaş və ev əşyası kimi bəzi şeylər keçdi. O civar əhalisinin hamısı adadan gəmilərlə Sind çayının digər tərəfinə keçdilər. Adanın qarşısına keçənlərin bir qismi suyun genişliyinə güvənib qılınclarını əllərinə alıb oynadaraq istehza etməyə başladılar.

Adaya keçənlərdən Qul Bəyazid Bəqavul tək başına və yalın atla özünü onların qarşısından suya atdı. Adanın o tərəfindəki suyun genişliyi bu tərəfinkindən iki-üç misli qədər çox idi. Atını üzdürərək, o tərəfdəkilərin qarşısında bir ox atımı qədər məsafədə dayaz yerə çıxdı. Su atın böyrünə qədər gəlirdi. Özünə gəlmək üçün bir qədər durdu. Arxasından heç kim getmədi, getmə ehtimalı da yox idi. Oradan sürətlə bunların üstünə cumdu. Bir-iki ox atdılar, lakin heç bir şey edə bilməyib qaçdılar. Tək başına, yəhərsiz atla, köməksiz Sind çayı kimi bir çaydan at üzdürərək keçib düşməni qaçırdı və yerini aldı. Çox cəsuranə bir iş görmüşdü. Düşməni qaçırdıqdan sonra **(151 b)** əsgər o tərəfə keçdi və qənimət olaraq qumaş və heyvanlar gətirdi. Düz-

dür, bundan əvvəl də bir neçə dəfə də xidməti və cəsarəti görünmüşdü, etibar və iltifat göstərib aşçılıq[1] rütbəsindən xassə bəkavul rütbəsinə yüksəltmişdim. Bu şücaətindən dolayı da ona çox inayət və ehsanlarda bulundum. Bu barədə irəlidə söz açılacaq. Gerçəkdən də inayət və ehsana layiq idi.

İki-üç mənzil boyunca Sind çayını sahildən izləyərək, çayın aşağısına doğru getdik. Əsgər axın edə-edə atlarını haldan saldı. Qənimət də axına dəyməzdi, hamısı öküzdən ibarətdi. Dəştdə ikən əsgərin əlinə qoyun və bəzi yerlərdə qumaş kimi şeylər keçmişdi, amma Dəşti keçdikdən sonra öküzdən başqa bir şey yox idi. Sind çayı sahilindəki mənzillərdə iş o dərəcəyə çatdı ki, bir qulluqçu üç-dörd yüz öküzü birdən gətirirdi. Çox olduğu üçün gətirirdilər, ancaq hər mənzildə bir o qədəri qalırdı.

Sind sahilini izləyərək üç mənzil gəldik. Üç mənzildən sonra Pir-Kanu məzarı qarşısında Sind çayından ayrılaraq Pir-Kanu məzarına gəlib dayandıq. Məzarın bəzi mücavirlərinə əziyyət verdikləri üçün əsgərlərdən birini ibrət olsun deyə parçalatdım. Bu məzar Hindistanda **(152 a)** fövqəladə mötəbər bir məzardır və Mehtər Süleyman dağına bitişik dağların ətəyində yerləşir.

Bu məzardan qalxıb keçid üzərinə endik. Oradan qalxıb Düki vilayətindəki çaya endik. O yurddan qalxanda isə Şah [Şüca] bəyin adamı və Sivinin valisi olan Fazil Göyəldaşın casusluq etməyə gəlmiş iyirmi qədər adamını tutub gətirdilər. O vaxtlar aramızda düşmənçilik olmadığı üçün atlarına və silahlarına toxunmadan sərbəst buraxdıq.

Ertəsi gün Düki kəndlərindən Çutali deyilən kəndin yaxınına endik. Sind çayının bir az o tərəfində və onun sahilində durmadan axın edildiyi halda at yemi və ot bol olduğu üçün atlar süstləşmirdi, lakin Sind çayından Pir-Kanu tərəfə doğru çıxanda ot heç tapılmır, ara-sıra iki-üç mənzildə bir az ot tapıla bilirdi. At yemi ise heç tapılmırdı. Bu yurdlardan etibarən əsgərin atları geri qalmağa başladı.

Çutalidən keçib endiyimiz yurdda yük heyvanı olmadığı üçün mənim öz çadırım da qaldı. Burada ikən bir gecə elə yağış yağdı ki, çadırda su topuğuma qədər çıxdı. Kilimləri bir yerə yığıb onların üstündə oturdum. O gecəni sabaha qədər bu cür sıxıntı içində keçirdim.

## BİR İNTRİQANIN ORTAYA ÇIXARILMASI

İki mənzildən sonra Cahangir Mirzə gəlib qulağıma **(152 b)** gizli bir sözü olduğunu söylədi. Yalnız qaldıq. Mənə belə dedi: «Baqi Çağanyani mənim yanıma gəlib dedi ki, padşahı yeddi-səkkiz və ya on adamla Sind çayının o biri üzünə keçirək və sizi padşah edək».

---

[1] *Aşçılıq,* yaxud *bavurçuluq:* hökmdar sarayında mətbəxdə çalışanlara məxsus rütbə. Bəkavulluqdan [yeməklərə nəzarət edən şəxsin ünvanı] aşağı dərəcədə bir rütbə.

«Bu fikirdə olan daha kimlər var?» deyə soruşdum.

«Mənə Baqi bəy indi söylədi, başqalarını bilmirəm» dedi.

«Daha başqaları varsa, onları da öyrənin. Bəlkə də Seyid Hüseyn Əkbər, Sultan Əli Çöhrə ilə Xosrov şaha mənsub bəy və igidlərdən də bəziləri vardır» dedim. Gerçəkdən də, Cahangir Mirzə bu dəfə fövqəladə yaxşı hərəkət etmiş və qardaşlığın gərəklərini yerinə yetirmişdi. Cahangir Mirzənin bu hərəkəti mən Kahmərddə ikən və o da bu bədbəxt hərifin azdırmalarına və fəsadına qapılmışkən ona qarşı elədiyim yaxşı hərəkətin cavabı idi.

O yurddan qalxıb təkrar bir yurda enəndə əsgər arasında atı işə yarayan adamlar Cahangir Mirzənin komandanlığına verilərək o civarda oturan əfqanlara axın etmək üçün göndərildi. Bu yurdlarda əsgərin atı daha çox geri qalmağa başladı. İki üç-yüz atın geri qaldığı günlər olurdu. Bir çox yaxşı adam atsız qaldı. Mənim yaxşı içkilərimdən olan Şah Mahmud Oğlaqçının atları tamamən geri qalıb özü də piyada gəldi. Qəznəyə qədər əsgərin atlarının vəziyyəti bu şəkildə davam etdi. Üç-dörd mənzildən sonra Cahangir Mirzə bəzi **(153 a)** əfqanlara axın edərək bir qədər qoyun gətirdi.

Bir-iki mənzildən sonra Abi-İstadəyə gəldik. Önümüzə böyük bir çay çıxdı. Çayın o tərəfindəki çöllər heç görünmürdü. Su sanki göylə birləşmiş kimi görünürdü. Sərabın o üzündəki dağlar və təpələr necə asılıymış kimi görünürsə, suyun o biri tərəfindəki dağlar və təpələr də yerlə göy arasında asılıymış kimi görünürdü. Burada yığılan sular Kəttəvaz vadisi, Zürmət vadisi, Qəznə çayı və Qarabağ çayırına yağan bahar yağışlarının selləri və yazda su daşanda suvarmadan artan sular imiş.

Abi-İstadəyə bir küruh yaxınlaşanda qəribə bir şey gördük: bu su ilə göy arasında şəfəqə bənzəyən qıpqırmızı bir şey görünür və təkrar yox olurdu. Yaxınlaşıncaya qədər bu vəziyyət davam etdi. O zaman anlaşıldı ki, bunlar bağlan [vəhşi qazlar] imiş. On min, iyirmi min deyil, daha çox qaz vardı. Bu qazlar uçub qanad açanda qırmızı tükləri bəzən görünür, bəzən də görünmürmüş. Yalnız bu quşlar deyil, burada hər növ çoxlu quş, suyun sahilində isə fövqəladə çoxlu quş yumurtası vardı.

Bu çayın sahilində quşların **(153 b)** yumurtalarını yığmağa gələn iki əfqan bizi görüncə özlərini suya atdılar. Bir neçə adam yarım küruha yaxın bir məsafəyə qədər gedib onları gətirdi. Su içində nə qədər irəliləsələr də, su yenə eyni dərinlikdə idi və atın qarnına qədər çıxırdı. Düz bir yer olduğu üçün hər halda suyu da dərin deyildi.

Kəttəvaz çölündən Abi-İstadəyə tökülən çayın sahilinə gəlib endik. Bu çay quruyan bir çaydır. Burada heç bir zaman su axmazdı. Neçə dəfə buradan keçsək də, bu çayda heç su görməmişdik. Amma bu dəfə bahar yağışları üzündən çaya o qədər su yığılmışdı ki, heç bir keçid tapa bilmədik. Düzdür, su çox geniş deyildi, lakin çox dərin idi. Bütün at və dəvələri üzdürərək keçdik. Əşyaların bir qismini urğanlarla bağlayıb suyun o tərəfindən çəkərək

çıxardılar. Bu sudan keçib Köhnə Nani yoluyla və Sərdih bəndi üzərindən Qəznəyə gəldik. Cahangir Mirzə bizi bir-iki gün qonaq edib ziyafətlər verərək hədiyyələr təqdim etdi.

O il çayların çoxu daşmışdı. İş o yerə çatmışdı ki, Dih-Yaqub çayından keçid tapılmırdı. Bir göldə düzəltdirmiş olduğum gəmini gətirdərək Kəmərinin qarşısından Dih-Yaqub çayına endirtdim. Hər kəs qarşı tərəfə gəmi ilə keçdi. Oradan Secavənd keçidindən aşıb Kəməridən suyu gəmiylə keçərək zilhiccə ayında [=1505 may] **(154 a)** Kabilə gəldik.

Yusif bəy [Oğlaqçı] bundan bir neçə gün əvvəl qulunc xəstəliyindən Allahın rəhmətinə qovuşdu.

## NASİR MİRZƏNİN XƏTASI

[Baburun ən kiçık qardaşı] Nasir Mirzə adamlarına vilayətlərindən bəzi əşyalarını gətirtmək və iki-üç gün sonra arxadan gəlmək üçün izin alıb Quş-Künbəzdə qalmışdı. Bizdən ayrılınca da Dəreyi-Nur xalqının sərkəşliyi üzündən əsgərini Dəreyi-Nur üzərinə göndərir.

Dəreyi-Nur kurqanının möhkəmliyi və ərazisinin çəltik tarlası olması dolayısıyla çətin keçilməsi haqqında əvvəlcə bəhs etmişdim. Bu əsgərin komandanı olan [Dərviş Məhəmməd] Fəzli isə əsgəri belə təhlükəli bir yolda və pis ərazidə ehtiyat tədbirləri almadan dağınıq bir halda axına göndərir. Dəreyi-Nur əhalisi çıxıb dağınıq haldakı axınçıları qovur, digərləri də qarşı çıxa bilməyərək qaçırlar. Xeyli adam, at və silahları da itirirlər. Fəzli kimi bir adamın komandanlıq etdiyi əsgərin halı belə olar. Bu üzdənmi, yoxsa könlündə pis bir niyyət vardı, ondanmı, bilmirəm, amma Nasir Mirzə bizim arxamızdan gəlmədi və orada qaldı.

Bir də Əyyubun [Bəycik] oğullarından Yusif ilə Bəhlul qədər şərir, fitnəkar, axmaq və kibirli adamlar yoxdur. Elingar tüməni Yusifə, Əlişəng isə Bəhlula verilmişdi. **(l54 b)** Bunlar da vilayətlərindən bəzi əşyalarını alıb Nasir Mirzə ilə birlikdə gələcəkdilər. Nasir Mirzə gəlmədiyi üçün bunlar da gəlmədilər. Bu qış Nasir Mirzənin içki və söhbət arxadaşları onlar idi. Yenə bu qış bir dəfə gedib tərkəlani əfqanlarına axın edirlər. Yaz gəlincə, Nigənxar və Ləmqanata gəlmiş olan bütün aymaq, el və ulusun ailə və mallarını oradan qaldırıb sürərək Baran sahilinə gəldilər.

Nasir Mirzə Baran və civarında olarkən bədəxşanlıların özbəkləri öldürərək özbəyə düşmən olduqları xəbəri gəldi.

Təfsilatı belədir: Şeybani xan Qunduzu Qənbər Biyə verib özü Xarəzmə getdi. Qənbər [Bi Mərvi] də Bədəxşan əhalisini öz tərəfinə çəkmək üçün Məhəmməd Məxduminin Mahmud adlı oğlunu Bədəxşana göndərdi. Ataları Bədəxşan şahlarının bəylərindən olan Mübarək şah da üsyan edib Məxduminin oğlunun və bir neçə özbəyin başını kəsdi. Əvvəlcə Şaf-divar deyə məş-

hur olan Qaleyi-Zəfəri kurqan edib möhkəmləndirdi. Ona Qaleyi-Zəfər adını o vermişdi. Xosrov şahın silahşoru olan və o zamanlar Həmləngan kurqanını əlində tutan Məhəmməd Qurçu da Rustakda Şeybani xanın sədrini bir neçə özbəklə birlikdə öldürüb Həmləngаnı möhkəmləndirdi. **(155 a)** Ataları Bədəxşan şahların bəylərindən olan Zübeyr Raqi də Raqda üsyan etdi. Xosrov şahın qardaşı Vəlinin nökəri Cahangir Türkmən də bu qarışıqlıqda bəyindən ayrılaraq, qaçan ya da qalan bir neçə sipahi və aymağı toplayıb qorunaqlı bir tərəfə çəkilmişdi. Nasir Mirzə bu xəbərləri alınca, Bədəxşanı ələ keçirmək niyyətilə bir neçə axmaq və darqafalı adamın təşviqi ilə dağın digər tərəfindən gələn bütün dış elləri ailə və mallarıyla birlikdə alaraq Şibertu və Ab-Dərə yoluyla dağın digər tərəfinə keçdi.

## XOSROV ŞAHIN ÖLÜMÜ

Xosrov şah Əhməd Qasım ilə birlikdə Əcərdən qaçıb Xorasan tərəfinə getmişdi. Yolda Bədiüzzaman Mirzə ilə Zünnun bəyə [Arğun] buluşub görüşərək birlikdə Herata gəlib Sultan Hüseyn [Bayqaral Mirzəyə sədaqətlərini bildirdilər. Bunlar neçə il Mirzəyə düşmənçilik etmişdilər və hər cür ədəbsizlik də bunlardan çıxmışdı. Bunların üzündən Mirzənin könlündə nə yaralar vardı. Bax, bu adamların hamısı mənim üzümdən bu cür aşağılıq və səfil bir halda gedib Mirzəni gördülər.

Xosrov şahı adamlarından ayıraraq belə gücsüz halda qoymasaydım və Kabili Zünnunun oğlu Müqimin əlindən almasaydım, gedib Mirzəni görməzdilər. Bədiüzzaman Mirzə də bunların **(155 b)** əlində xəmir kimiydi və onların sözündən çıxa bilmirdi. Sultan Hüseyn Mirzə hamısını yaxşı qarşıladı və etmiş olduqları pisləri üzlərinə vurmaq bir yana, onlara ehsanlarda belə bulundu.

Xosrov şah bir müddət sonra «Gitsəm, o vilayətləri tamamilə ələ keçirərəm» deyə düşünərək öz vilayətlərinə getmək üçün izin istədi. Amma silahsız və hesabsız olaraq gəlmiş olduğu üçün bir bəhanə taparaq getməsinə izin vermədilər. Fürsət tapdıqca getmək üçün izin arzusunu təkrarladı. Çox israr edincə, Məhəmməd Burunduq [Barlas] gözəl bir cavab verərək «Otuz min əsgərin və bütün vilayətlərin əlində ikən nə etdin ki, indi beş yüz adamınla özbəklərin nəzarətində olan vilayətlərdə bir şey etmək istəyirsən» dedi. Bir neçə dəfə nəsihət edib məqbul sözlər söylədilər; lakin müqəddəratı təyin edilmiş olduğu üçün təsir etmədi. Çox israr edincə, axırda izin verdilər.

Üç-dörd yüz adamıyla birbaşa Dəhanə sərhəddin gəlib girdi. O zaman Nasir Mirzə dağın o biri tərəfinə keçmişdi. Gəlib Dəhanə civarında Nasir Mirzəni gördü. Bədəxşan əşrəfi yalnız Nasir Mirzəni istiəyir, Xosrov şahı istəmirdi.

Nasir Mirzənin qeyrətinə baxmayaraq Xosrov şah vəziyyəti anlayaraq

Kuhistana getməyə razı olmadı. Xosrov şahın niyyəti Mirzəni vasitə **(156 a)** olaraq birlikdə götürüb vilayəti ələ keçirməkdi. Axırda dil tapa bilməyərək İşkəmiş civarında hər iki tərəf səflər düzüb zirehlər geydilər, az qala vuruşacaqdılar. Sonra bir-birlərindən ayrıldılar; Nasir Mirzə Bədəxşan tərəfinə getdi, Xosrov şah da bir sürü baldırı çılpaq sərsərini toplayıb yaxşı-pis minə yaxın adamla Qunduzu mühasirəyə almaq niyyətilə gəlib şəhərdən bir-iki agac məsafədə yerləşən Xoca Çartağa endi.

Məhəmməd Şeybani xanın Əndicanda Sultan Əhməd Tənbəli də yanına alıb Hisar üzərinə yürüməsi ilə Xosrov şah da vilayətlərini vuruşmadan və qarşı çıxmadan buraxıb çıxmış, Şeybani xan da Hisara gəlmişdi.

Hisarda Şirim Çöhrəylə bərabər bir dəstə yaxşı igid vardı. Bəylərinin vilayətlərini buraxıb getməsinə baxmayaraq bunlar Hisarı təslim etmədilər. Şeybani xan Hisarın mühasirəsini Həmzə Sultan ilə Mehdi Sultana tapşırıb özü Qunduza getdi və Qunduz vilayətini kiçık qardaşı Mahmud Sultana verib orada durmadan Xarəzmə, [Sultan Hüseyn Mirzənin adamı] Çin Sufinin üstünə qoşun çəkdi. Heç Səmərqəndə çatmamışdı ki, kiçık qardaşı Mahmud Sultan Qunduzda vəfat etmiş, buna görə Qunduzu Qənbər Bi Mərviyə vermişdi.

Xosrov şah gələndə Qunduzda Qənbər Bi [Mərvi] vardı. Qənbər Bi Həmzə Sultana və digər sultanlara ard-araa adamlar göndərib **(156 b)** onlardan yardım istədi.

Həmzə Sultan da Amu-Dərya sahilindəki Saraya gəlib əsgərini oğullarının və bəylərinin komandanlığında Qunduza göndərdi. Bunlar gələrgəlməz dərhal Xosrov şahın qarşısına çıxdılar. Şişman hərif vuruşa bilmədiyi kimi qaçmağı da bacarmadı. Elə o anda Həmzə Sultanın adamlarının əlinə düşdü. Bacısı oğlu Əhməd Qasımı, Şirim Çöhrəni və digər bəzi yaxşı igidləri öldürdülər. Xosrov şahı Qunduza gətirib boynunu vurdular və başını Xarəzmə Şeybani xanın hüzuruna göndərdilər.

Xosrov şahın dediyi kimi, o Qunduz civarına gələr-gəlməz mənim yanımdakı adamlarımın tövrləri bir az dəyişmişdi. Böyük bir qismi qalxıb Xoca-Rivaca və civarına getdi. Mənim yanımda olanların çoxu onun adamları idı. Moğollar [Xosrov şahı öldürərək] yaxşı hərəkət etdilər. Mənə qarşı birlik olanlar da bu xəbər gələr-gəlməz, oda su tökülmüş kimi sindilər.

KABİL - 911 (4 İYUN 1505 - 24 MAY 1506)

## DOQQUZ YÜZ ON BİRİNCİ İLİN HADİSƏLƏRİ

## BABURUN ANASININ ÖLÜMÜ VƏ BÖYÜK BİR ZƏLZƏLƏ

Məhərrəm ayında [=1505 iyun] anam Qutlu Nigar xanım qızdırma xəstəliyinə tutuldu. Qan aldılar, bir xeyri olmadı. Seyid Təbib adında xorasanlı bir həkim vardı, Xorasan üsuluna görə qarpız verdi. Əcəli gəlmişdi, altı gün sonra şənbə **(157 a)** günü Allahın rəhmətinə qovuşdu. [Baburun əmisi] Uluğ bəyin dağ ətəyində saldırdığı Baği-Novruzi adlı bir bağ vardı. Varislərinin iznini alaraq Qasım Göyəldaş ilə birlikdə bazar günü bu bağa gətirərək torpağa tapşırdıq.

Bu matəm əsnasında xan dayım Alaca xan ilə nənəm İsən Dövlət bəyimin də vəfat etdikləri xəbərini gətirdilər. Xanımın ölümünün qırxıncı günü yaxınlaşarkən xanların anası Şah bəyim, mənim xalam və Sultan Əhməd Mirzənin arvadı Mehrinigar xanım və Məhəmməd Hüseyn Gürgan Duğlat Xorasandan gəldilər. Matəmlər təkrar təzələndi və ayrılıq atəşi sonsuz oldu. Matəm mərasimindən sonra fəqirlərə və miskinlərə aş verilib ölülərin ruhuna dualar edildikdən sonra könülləri alıb matəm paltarını çıxardıq.

Bu önəmli işləri gördükdən sonra Baqi Çağanyaninin təkidiylə Qəndəhara qoşun çəkdik. Yola çıxdıqdan sonra Quş-Nadir çayırına gəlib enəndə mənə qızdırma gəldi. Bu, qəribə bir xəstəlikdir. Xeyli əlləşərək məni çətinliklə oyadırdılar, dərhal gözüm təkrar qapanır və yuxuya dalırdım. Dörd-beş gün sonra bir az yaxşılaşdım.

Bu zaman elə bir zəlzələ oldu ki, kurqan və bağ divarlarının böyük qismi yıxıldı. Şəhərdə və kəndlərdə bir çox ev yıxıldı, evlərin və divarların altında qalıb ölənlər çox **(157 b)** oldu. Pamğan kəndinin evləri tamamən yıxıldı; yetmiş-səksən qədər yaxşı adam divar altında qalaraq öldü.

Pamğan ilə Biqdut arasında bir böyük daş atımı genişliyində olan bir torpaq parşası bir ox atımı qədər aşağıya çökdü, yox olan toprağın yerində bulaqlar ortaya çıxdı. İstərqaçdan Meydana qədər -təxminən altı-yeddi ağac qədər bir məsafədir- torpaq elə yarılmışdı ki, bəzi tərəfində ərazi fil qədər yüksəlmiş və bəzi tərəfində də fil qədər çökmüşdü. Yarılan yerlərə bəzən bir adam sığardı.

Zəlzələ olanda bütün dağların başından toz buludları qopdu. Nurullah tənburçu qarşımda saz çalırdı. Bir sazı da vardı. O sırada hər iki sazını əlinə aldı. O qədər özündən keçdi ki, sazlar bir-birinə çarpdı.

Cahangir Mirzə təpədə, Uluğ bəy Mirzənin tikdirmiş olduğu imarətlərdən birinin üst qatındakı eyvanda idi. Zəlzələ olunca, özünü aşağıya atdı, bir şey olmadı. Cahangir Mirzənin yaxınlarından biri də bu üst qatda idi, üst

qatın damı üstünə yıxıldı. Lakin Allah qorudu və heç bir yerinə zərər dəy-mədi.

Təpədəki evlərin çoxu yerlə bir oldu. O gün yer otuz üç dəfə tərpəndi. Təxminən bir ay hər gecə və hər gündüz yer iki-üç dəfə tərpənirdi. Bəylərə və sipahilərə əmr etdim ki, kurqanın bürc və divarının yıxıq və yarıqlarını təmir etsinlər. **(158 a)** İyirmi gün və ya bir ay ərzində kurqanın bütün qırıq və çat yerləri ciddiyyət və diqqətlə təmir edilərək tamamlandı.

Əvvəlcə Qəndəhar tərəfinə getmək üçün başladığımız səfər xəstəlik və zəlzələ üzündən bir az gecikmişdi. Xəstəliyi atlatdıqdan və kurqanı yenidən təmir etdirdikdən sonra əvvəlki qərarımıza qayıtdıq.

Qəndəhar tərəfinə getmək, yoxsa axın etmək üçün dağ və ovaları do-laşmaq haqqında hələ bir qərara gəlməmişdik. Şənizin ətəyinə enəndə Ca-hangir Mirzə və bəyləri toplayıb məsləhətləşərək Qalat üzərinə yürüməyə qərar verdik. Cahangir Mirzə ilə Baqi Çağanyani bu yürüşdə daha artıq israr etdilər.

Yolun yarısına gələndə Şir Əli Çöhrə, Kiçık Baqi Divanə və digər bir neçə adamın qaçmaq niyyətində olduqlarını xəbər aldıq. Bunlar yaxalandı. Şir Əli Çöhrə həm mənim, həm də başqalarının yanında müxtəlif vilayətlər-də bir çox fitnəyə və pis əməllərə qarışdığı üçün edam edildi, digərlərinin isə at və silahlarını aldıqdan sonra sərbəst buraxdıq.

Qalata gələr-gəlməz, xüsusi bir silah və təchizat hazırlığı aparmadan hər tərəfdən hücuma keçdik. Çox şiddətli bir savaş oldu. Xoca Kəlanın bö-yük qardaşı Kiçık bəy çox cəsur bir igid idi. Əvvəllər də bəhs etdiyim kimi, mənim önümdə bir neçə dəfə qılıncla çarpışmışdı. Qalatın **(158 b)** cənub-qərb tərəfindəki bürcündən dırmanaraq divarın üstünə çıxanda gözünə nizə sapladılar, Qalatın zəbtindən bir-iki gün sonra bu yara üzündən öldü.

Şir Əli ilə qaçarkən yaxalanan Kiçık Baqi Divanə etdiyi qəbahəti ört-basdır etmək üçün qapıda kurqan divarının dibinə camənda aldığı daş ya-rasından orada öldü. Onların dışında bir-iki adam daha öldü.

Savaş ikindəyə qədər bu şəkildə davam etdi. İgidlər bir xeyli vuruşub sıxışdırdıqdan sonra süstləşməyə başlayanda içəridəkilər aman diləyib kur-qanı təslim etdilər.

Zünnun bəy Arğun Qalatı Müqimə vermişdi, burada Müqimin adam-larından Fərrux Arğun ilə Qara Bulud vardı. Onlar ox qılıflarıyla qılınclarını boyunlarına asaraq gəldilər. Günahlarını bağışladıq. Bu ailəyə əziyyət etmək niyyətində deyildim, çünki özbəklər kimi bir düşmənin yaxınımızda olduğu bir zamanda öz aramızda belə bir şey olsa, bunu uzaqdan və yaxından eşi-dənlər və görənlər nə deyərdilər.

Bu yürüş Cahangir Mirzə və Baqi bəyin israrları ilə keçirildiyi üçün Qalatı mühafizə vəzifəsini də Mirzənin öhdəsinə buraxdım, lakin o, qəbul etmədi. Baqi də bu xüsusda yaxşı bir cavab verə bilmədi. Beləcə, Qalatı bu

qədər müharibə ilə, zorla almağımız heç bir işə yaramadı.

Qalatdan günəyə doğru gedərək Sevasəng, Aladağ **(159 a)** və o civardakı əfqanların üstünə axın edib Kabilə döndük. Kabilə endiyim axşam mən kurqana getdim, çadır və atlar çarbağda idi. Xırılçı tayfasından bir oğru gəlib mənim zirehli savaş atımı və xas bir xəncərimi çarbağdan oğurlamışdı.

## BAQİ ÇAĞANYANİNİN ÖLÜMÜ

Baqi Çağanyaninin Amu sahilində gəlib bizə qoşulmasından bəri yanımızda ondan daha etibarlı və daha nüfuzlu bir adam yoxdu. Hər söz və hər işdə onun rəyi hakim idi. Gərçi onun münasib bir xidməti və layiqli bir insaniyyəti heç bir zaman görünməmiş, tam tərsinə, ondan hər cür ədəbsizlik və pislik çıxmışdı. Xəsis, alçaq, qısqanç, pis qəlbli, dargörüşlü və əxlaqsız bir adamdı. Xəsisliyi o dərəcədə idi ki, Termizi buraxıb köç və malıyla bizə qoşulanda bəlkə də otuz-qırx minə qədər qoyunu vardı. Hər yurdda bu qoyun sürüləri bizim önümüzdən keçdiyi, bizim igid və adamlarımız açlıqdan sıxıntı çəkdikləri halda, bizə tək bir qoyun belə vermədi. Nəhayət, Kahmərdə gələndə əlli qoyun verdi.

Məni padşah olaraq tanıdığı halda nağaranı[1] öz qapısında çaldırırdı. Heç kimsə ilə dost deyildi və heç kimsəni sevmirdi. Kabilin bütün gəliri damğa rəsmindəndir. Damğa rəsmi, Kabilin valiliyi, **(159 b)** Pənchir, Kedi-Həzarə, Quşqaq və eşik ixtiyarlığı tamamən onun əlində idi. Bu qədər etibar gördüyü halda heç məmnun və mütəşəkkir deyildi.

Daha əvvəl də dediyimiz kimi, o qədər pis niyyətləri olduğu halda bunları əsla diqqətə almadıq və etdiklərini üzünə vurmadıq. Daima nazlanıb getmək üçün izin istəyirdi. Lakin nazını çəkib səbəblər göstərərək bundan vaz keçirirdik. Bir-iki gün susur, sonra təkrar izin istəməyə başlayırdı. Axırda nazı və izin istəməsi həddən aşdı, biz də onun əxlaq və hərəkətlərindən bezdik və izin verdik.

İzin istədikdən sonra özü də peşman oldu. Canı sıxılmağa başladı, lakin xeyri olmadı. Mənə adam göndərərək «Doqquz günah işləmədən məni sorğuya çəkməyəcəyini şərt qoşmuşdu» deyə bildirdi. Mən də Molla Baba vasitəsilə on bir günahını tək-tək xatırladaraq cavab verdim. Axırda anladı, köç və malıyla birlikdə Hindistan tərəfinə getməsinə izin verildi.

Özünün bir neçə adamı onu Xeybərdən ötürüb geri gəldi. Baqi də kakiyani karvanına qoşularaq Nilabı keçdi.

O zamanlar Dərya xan oğlu Yar Hüseyn Keçə-Qutda olurdu. Kühetdə bizdən aldığı fərmanları dəstəvuz edərək yanına diləzaq və Yusif-zeyi qəbi-

[1] *Nağara:* ənənvi olaraq hökmdarın qapısı önündə hər alacaqaranlıq və şəfəq vaxtında çalınan davul.

lələrindən bir dəstə əfqanı, cet və qücur qəbilələrindən bəzilərini də almışdı. Bütün işi-gücü xalqı soymaq və yol kəsməkdi. Baqinin gəldiyi eşidən kimi **(160 a)** yolunu kəsib Baqi ilə birlikdə gedənlərin hamısını yaxaladı. Baqini öldürdü və arvadını aldı. Düzdür, biz heç bir yamanlıq etmədən Baqini buraxdıq, lakin öz yamanlığını əldən buraxmadı və öz amalına giriftar oldu.

Tu bəd konəndən xudra bərgüzar süpar,
Ki ruzigər tura çakər əst kinə güzar.
*Sana pislik edəni qədərə tapşır,*
*Çünki o sənin intiqam alan nökərindir.*

## TÜRKMƏN HƏZARƏSİ ÜZƏRİNƏ AXIN

Bu qış qar yağana qədər bir-iki dəfə həmin çarbağda qaldım. Biz Kabilə gələndən sonra türkmən həzarəsi də hər cür ədəbsizlik etmiş, yolları basmışdı. Onların üstünə axın etmək niyyətilə Uluğ bəy Mirzənin Bostansaray adlı imarətinə gəldik və şaban ayında türkmən həzarəsinə axın etmək üçün oradan yola çıxdıq.

Dəreyi-Xoşun ağzında Cəngliyə axınçılar göndərdik. Bir dəstə həzarəyə qarşı axın edildi. Dəreyi-Xoş yaxınlığında bir mağarada bir dəstə həzarə gizlənmişdi. Şeyx Dərviş Göyəldaş qazaxlıqların çoxunda mənimlə birlikdə olmuşdu və qurbəyilik[1] rütbəsi ondaydı. Yayı qüvvətli çəkir, oxu yaxşı atırdı. Qəflət göstərərək bu mağaranın ağzına çox yaxınlaşır və içəridən bir həzarə köksünə ox atır. Elə həmin gün vəfat etdi.

Türkmən həzarəsinin böyük qismi Dəreyi-Xoşda qışlamışdı. Onların üstünə hücum etdik. Dəreyi-Xoş gözəl bir dərədir. Dərənin ağzında yarım küruh qədər bir boğaz var. Yol dağın **(l60 b)** yamacındadır. Yolun aşağı tərəfi əlli-altmış kari dik qayalıqdır, yuxarı tərəfində isə yol cığırdır. Atlılar bir-bir keçirlər. Bu boğazdan keçərək o gün günorta ilə ikindi arasına qədər yürüyüb adamlara yetişmədən bir yerdə düşərgə saldıq.

Həzarənin kök bir yük dəvəsini tapıb gətirdilər. Onu kəsib ətindən bir qədər kabab elədik, bir azını da güvəcdə bişirib yedik. O qədər ləzzətli dəvə əti heç bir zaman yeməmişdim. Bəziləri qoyun ətindən ayırd edə bilmədilər.

Ertəsi gün erkəndən qalxıb həzarələrin qışladığı yurdun üzərinə yürüdük. Bir pəhər olmuşdu ki, irəlidən bir adam gəlib həzarələrin bir boğazda su keçidini ağac maneələrlə gücləndirərək əsgərin yolunu kəsib vuruşduqlarını söylədi. Bunu eşidincə dərhal hərəkət etdik.

Bir az getdik və həzarələrin yolu kəsib vuruşduqları yerə çatdıq. O qış möhkəm qar yağmışdı. Yolsuz yerdən yerimək çox çətin idi. Çayların sahilləri tamamən buz tutmuşdu. Buz və qar üzündən bu çayı yolsuz yerdən keçmək qeyri-mümkün idi. Həzarələr də çoxlu ağac kəsərək çayın keçid yerini

[1] *Qurbəyi:* hərbi bir rütbə.

bağlamışdılar. Özləri isə çayın ətrafında atlı **(161 a)** və piyada olaraq ox atıb vuruşurdular.

Məhəmməd Əli Mübəşşir mənim yeni yüksətdiyim bəylərimdən idi. Çox cəsur, etibarlı və yaxşı bir igid idi. Zirehsiz olduğu halda irəliləyərək ağac maneələrin olduğu yola girdi. Böyründən oxla vurdular və dərhal öldü.

Oraya sürətlə gəldiyimizdən çoxumuzun zirehi yox idi. Bir-iki ox yanımızdan keçib yerə saplandı. Əhməd Yusif həyəcanlı bir şəkildə və sürəkli olaraq «Çılpaq halda belə bir müharibəyə girirsiniz, iki-üç oxun başınızın üstündən keçdiyini gördüm» deyirdi. Mən də ona «Cəsur olun, mənim başımdan belə şeylər çox keçmişdir» dedim.

Bu əsnada sağ qol tərəfdən Qasım bəy suda bir keçid tapıb zirehli halda onların üstlərinə at saldı və həzarələr müqavimət edə bilmədən qaçdılar. Qarşılarında olanlar isə onları atlarından sala-sala arxalarından təqib etdilər.

Qasım bəyə bu iş üçün mükafat olaraq Bəngəş verildi. Hatim qurbəyi də bu səfərdə fəna deyildi, buna görə Şeyx Dərviş Göyəldaşda olan qurbəyi rütbəsi Hatimə ehsan edildi. Kibəqulu Babaya isə bu yürüşdə şücaətlər göstərdiyi üçün bir kənd bağışlandı.

Sultanqulu Çanaq həzarələri təqib edirdi. Qar çox qalın olduğu üçün yoldan çıxmaq mümkün deyildi. Mən də bu igidlərlə birlikdə getdim. **(161 b)** Həzarələrin qışlaqlarının yaxınlığında qoyun və at sürülərinə yetişdik. Şəxsən özüm dörd-beş yüzə qədər qoyun və iyirmi-iyirmi beş at yığdım. Civarda Sultanqulu və iki-üç adam daha vardı, bunları aramızda bölüşdürdük.

Axınlara iki dəfə şəxsən iştirak etdim. Biri budur. Bir dəfə də bu türkmən həzarəsi Xorasandan gələndə axınçılarla gedib çoxlu qoyun və at gətirmişdik.

Həzarələrin ailələri və uşaqları piyada halda qarlı təpələrə çıxdılar. Bir az ağır davrandıq. Vaxt da gec olmuşdu, bu səbəbdən geri dönüb həzarələrin evlərinə girdik. Bu qış qar hədsiz dərəcədə çox yağmışdı. Burada yoldan kənarda qar atın tam sağrısına çıxırdı. Gecə növbəyə çıxanlar qarın çoxluğu üzündən sabaha qədər atın üstündə qalırdılar.

Ertəsi gün qayıdıb həzarələrin Dəreyi-Xoşun içindəki qışlağında qaldıq. Oradan qalxıb Cəngliyə gəldik. Yarək Tağayi və bəziləri bir az geridə qalmışdılar. Onlara Şeyx Dərvişi oxla vuran həzarələri ələ keçirmələri əmr edildi. Qanları tutulmuş bu bədbəxtlər bir mağarada idilər. Oraya gedib tüstü buraxaraq yetmiş-səksən həzarəni ələ keçirdilər. Çoxu qılıncdan keçirildi.

Həzarə səfərindən dönüb Nicravdan vergi toplamaq niyyətilə Baranın alt tərəfindəki Aydoğdu civarına gəldik. Biz Aydoğdu civarında olanda Cahangir Mirzə də **(162 a)** Qəznədən mülazimətə[1] gəldi. Bu zaman ramazan ayının on üçündə [=7 fevral 1506] şiddətli bir bel ağrısına tutuldum. O dərə-

---

[1] *Mülazimət*: bir neçə mənası var: yavər, xidmət etmək, müşayiət etmək, məiyyətdə olmaq deməkdir. Mülazim isə əski dönəmdə hərbi rütbə olub leytenant deməkdir.

cədə ki, qırx günə qədər məni bir yandan digər yana bir adam çevirirdi.

Nicrav dərələrindən olan Picqan dərəsi və ələlxüsus da bu dərədəki Qeyn kəndinün böyüyü olan Hüseyn Qeyni ilə onun böyük və kiçık qardaşları quldurluq və həyasızlıqla məşhur və məruf idilər. Əsgər Cahangir Mirzənin komandanlığı altında oraya göndərildi. Qasım bəy də onunla birlikdə idi. Gedib təpəyə çıxdılar və quldurların möhkəmləndirdikləri yeri zorla alaraq onları qorxutmaq üçün bir neçəsini edam etdilər.

Bu bel ağrısı üzündən xərək kimi bir şey düzəldib Baran sahilindən şəhərə qədər məni əldə daşıyaraq Bostan saraya gətirdilər. O qış bir neçə gün Bostan sarayda oldum. Bu xəstəlik yaxşılaşmadan üzümün sağ tərəfinə bir çiban çıxdı. Nəştər vurdular. Bu xəstəlik üçün müshil də içdim. Yaxşılaşandan sonra çarbağa çıxdım.

## CAHANGİR MİRZƏNİN SƏHV HƏRƏKƏTİ

Cahangir Mirzə ziyarətə gəldi. Əyyubun oğulları Yusif və Bəhlul Mirzənin hüzuruna getdiklərindən bəri onu fitnə-fəsada, şər işlərə sövq edirdilər. Bu dəfə Cahangir Mirzənin əvvəlki kimi olmadığını gördüm.

Bir neçə gün sonra təpədən qalxıb silahlanaraq təcili Qəznəyə getdi. Nani kurqanını alıb bir neçə adamı öldürərək əhalisini tamamən yağmaladı və bütün adamlarını **(162 b)** da yanında götürərək həzarə arasından Bamyan tərəfinə getdi.

Allah bilir ki, məndən və mənim adamlarımdan belə bir küdurətə səbəb ola biləcək heç bir iş və söz vaqe olmamışdı. Sonradan anlaşıldı ki, getməyə səbəb olaraq bu sözü bəhanə etmiş: Cahangir Mirzə Qəznədən gələrkən Qasım bəy ilə digər bəzi bəylər onu qarşılamağa getmişlər. Mirzə bildirçinin üstünə şahin buraxır. Quş bildirçini pəncələri arasına alarkən bildirçin özünü yerə atır. «Tutdumu, tutdumu?» deyə qışqırırlar. Qasım bəy də «Düşməni belə zəif bir hala gətirdikdən sonra necə buraxar ki, əlbəttə, tutar» deyir və bu söz Mirzəni rəncidə edir. Getməsinin səbəblərindən biri bu idi. Bir də bundan daha kiçık və önəmsiz bir sözü də bəhanə eləmişdi.

Qəznəni o vəziyyətə saldıqdan sonra həzarə arasından aymaqlara getdi. Aymaqlar o zamanlar Nasir Mirzədən ayrılmış, lakin özbəklərə də qoşulmamışdılar, Yay, Əstər-Ab və civardakı yaylalarında olurdular.

Bu zaman Sultan Hüseyn Mirzə Məhəmməd Şeybani xanı dəf etməyi qəti surətdə qərara alaraq bütün oğullarını çağırtmış, Seyid Sultan Əli Həbbinin oğlu Seyid Əftalı göndərərək məni də dəvət etmişdi. Xorasan tərəfinə yürüş bizim üçün bir neçə baxımdan çox gərəkliydi. Bunlardan biri budur: Sultan Hüseyn Mirzə kimi Teymur bəyin **(163 a)** yerinə keçmiş bir padşah ətrafındakı və civarındakı oğullarını və bəyləri çağırıb toplayaraq Şeybani xan kimi bir düşmənin üstünə hücum niyyətində olanda hər kəs ayaqla getsə,

bizim başla getməyimiz, onlar zopayla getsə, bizim daşla getməyimiz lazım idi. Biri də bu idi: Cahangir Mirzə belə düşmənçilik və acıqla getdiyi üçün ya onun küdurətini dəf, ya da zərərlərini rəf etmək lazım idi.

Bu il Şeybani xan Xarəzmdə [Sultan Hüseyn Mirzənin adamı] Çin Sufini on ay mühasirə etdikdən sonra yenərək aldı. Bu mühasirə zamanı çox müharibə oldu. Xarəzm igidləri fövqəladə cəsarət göstərdilər və heç bir xüsusda qüsur etmədilər. Ox atmaqda elə məharət göstərdilər ki, dəfələrlə qalxanı, zirehi və bəzən də ikiqat zirehi oxla dəlmişdilər.

On ay boyunca mühasirə etdilər. Heç bir yerdən ümidləri qalmadı. Bəzi igidləri cəsarətsizlik göstərərək özbəklərlə danışıb bunları kurqana çıxarmışlar. Çin Sufi də bunu xəbər alıb özü şəxsən gəlmiş, kurqana çıxanları vurub aşağı salmışdı. Ancaq öz çöhrəsi tərəfindən kürəyindən oxla vurularaq öldürüldü. Vuruşacaq adam qalmadı və kurqanı aldılar. Çin Sufi -Allah rəhmət eləsin- cəsarətlə ölümün gözünə dik baxmaqda **(163 b)** bir an belə tərəddüd etməmişdi.

Şeybani xan da Xarəzmi Kibək Biyə verib özü Səmərqəndə gəldi.

Bu ilin sonlarında zilhiccə ayında [=1506 may] Sultan Hüseyn Mirzə Şeybani xanın üzərinə qoşun çəkib Baba-İlahiyə gələndə Allahın rəhmətinə qovuşdu.

## SULTAN HÜSEYN MİRZƏ

**Doğumu və nəsəbi:** 842-ci ildə [=1438] Heratda [Teymur bəyin oğlu] Şahrux Mirzənin hökmdarlığı dönəmində [1405-1447] doğulmuşdu. Əmir Teymur oğlu Ömər Şeyx oğlu Bayqara oğlu Mənsurun oğlu idi. Mənsur Mirzə ilə Bayqara padşahlıq etməmişlər.

Anası Teymur bəyin nəvəsi Firuzə bəyimdi. Sultan Hüseyn Mirzə [ana tərəfindən Teymur bəyin oğlu] Miranşah Mirzənin də nəvəsidir.

Sultan Hüseyn Mirzə ana və ata tərəfindən kərim və soylu bir padşahdı. İki doğma qardaş və iki bacı idilər: Bayqara Mirzə, Sultan Hüseyn Mirzə, Əkə bəyim və Əhməd xanla evli olan Büdəkə bəyim.

Bayqara Mirzə yaşca Sultan Hüseyn Mirzədən böyükdü, amma onun xidmətində idi. Divanda iştirak etməzdi, lakin divandan kənarda olanda eyni döşək üzərində otururdular. Kiçık qardaşı ona Bəlx vilayətini vermişdi, bir neçə il Bəlxdə hökm sürdü. Üç oğlu vardı: Sultan Məhəmməd Mirzə, Sultan Veys Mirzə və Sultan İskəndər Mirzə.

Əkə bəyim **(164 a)** [Sultan Hüseyn] Mirzənin böyük bacısı idi, onu Miranşah Mirzənin nəvəsi olan Sultan Əhməd Mirzə almışdı. Kiçık Mirzə adlı bir oğlu vardı, əvvəllər dayısına mülazimət edirdi, sonra sipahiliyi buraxıb kitab oxumaqla məşğul oldu, alim olduğunu söyləyirdilər. Kiçık Mirzənin şairliyi də vardı. Bu rübai onundur:

Ömri be səlah məstudəm xudra,
Dər şiveyi zöhd minəmudəm xudra,
Çün eşq aməd qədəm zöhdü, çi səlah,
Əlminnətülillah əz müdam xudra.

*Bütün bir ömür özümü salahla öydüm,*
*Özümü zöhd yolunda göstərdim.*
*Eşq gəlincə zöhd nə imiş, salah nə imiş,*
*Allaha şükür olsun, özümü sınadım.*

Mollanın [Mövlana Əbdürrəhman Cami] rübaisi ilə təvarüd[1] olmuşdur. Sonra həccə də getdi.

Büdəkə bəyim Mirzənin böyük bacısı idı. Qazaxlıqlar zamanı Əhməd xan Hacı Tarxana vermişdi. İki oğlu olmuşdu, onlar Herata gəlib bir müddət Mirzənin mülazimətində bulundular.

**Şəkili və görkəmi:** çəkik gözlü, şir əndamlı bir adamdı. Belindən aşağısı incəydi. Yaşı çox və saqqalı ağarmış olduğu halda xoş rəngli, qırmızı və yaşıl ipək paltar və qara quzu dərisindən börk, ya da qalpaq geyərdi. Bəzən bayramlarda kiçık sarığını yamyastı və səliqəsiz şəkildə üç dəfə dolayaraq vağ lələyi taxıb namaza gedərdi.

**Əxlaqı və xasiyyəti:** taxta çıxanda xütbədə on iki imamın adını (**164 b**) oxutmağı düşünürmüş. Əlişir bəy [Nəvai] və digər bəziləri buna əngəl olmuşlar. Sonralar hər halı və hərəkəti əhli-sünnət və camaat məzhəbinə uyğun idi. Məfsəl xəstəliyi üzündən namaz qıla bilmirdi. Oruc da tutmurdu. Zarafatcıl və xoş təbiətli bir adam idi. Xaraktercə bir az çılğın idi, sözü də məzacı kimiydi. Bəzi xüsuslarda şəriətə fövqəladə riayət edirdi: Bir dəfə oğullarından birini bir adamı öldürdüyü üçün qan davaçılarının əlinə verib məhkəməyə göndərmişdi.

Taxta çıxanda altı-yeddi il tövbəli idi. Ondan sonra özünü içkiyə verdi. Qırx ilə yaxın Xorasanda padşahlıq etdi və günorta namazından sonra içmədiyi heç bir gün yoxdu, lakin sabahlar heç içməzdi. Oğulları, sipahiləri və şəhər əhalisi hamısı bu vəziyyətdəydi. Aşırı dərəcədə işrətə və fisqə düşkün idilər.

Ürəkli və cəsur bir adamdı. Dəfələrlə şəxsən qılınc çalmışdır. Hətta hər müharibədə bir neçə dəfə qılınc çalmışdır. Teymur bəy nəslindən olan və Sultan Hüseyn Mirzə qədər qılınc çalmış heç kim məlum deyildir.

Şairliyi də vardı; bir divan tərtib etmişdi. Şeirlərini türkcə söyləyirdi. Təxəllüsü Hüseyni idi. Bəzi beytləri fəna deyildir, lakin divanı bütünlüklə eyni vəzndədir.

Yaş və səltənət baxımından böyük bir padşah olduğu halda, uşaqlar **(165 a)** kimi qoç bəsləyir, göyərçin saxlayır və xoruz döyüşdürürdü.

---

[1] *Təvarid*: iki şairin bir-birindən xəbərsiz eyni misra və ya beyti söyləməsi.

**Meydan müharibələri və digər döyüşləri:** qazaxlıq zamanında bir dəfə atla Gürgan çayını üzərək keçib xeyli özbəyi möhkəm məğlub etdi.

Bir dəfə Sultan Əbu Səid Mirzə Məhəmməd Əli Bəxşinin başçılığı altında üç min adamı ilqar [axınçı] olaraq göndərmişdi, Sultan Hüseyn Mirzə isə altmış igidlə gəlib onları dərhal məğlub etdi. Sultan Hüseyn Mirzənin yaxşı və parlaq işlərindən biri budur.

Bir dəfə Əstərabadda [Sultan Əbu Səid Mirzənin oğlu və Baburun əmisi] Sultan Mahmud Mirzə ilə vuruşaraq onu məğlub etdi.

Bir dəfə Əstərabadda soğdlu Hüseyn Türkmən oğlu Sadla vuruşaraq onu məğlub etdi.

Bir də taxtı aldıqdan sonra Çinaranda [Sultan Məhəmməd Mirzənin oğlu] Yadigar Məhəmməd Mirzə ilə vuruşaraq onu məğlub etdi.

Bir dəfə də Mürqab körpüsündən sürətlə gəlib Baği-Zağanda sərxoş yatan Yadigar Məhəmməd Mirzəni ələ keçirdi və beləcə Xorasana hakim oldu.

Bir dəfə də Əndəxud və Şaburqan civarında yerləşən Çikməndə Sultan Mahmud Mirzə ilə vuruşaraq qalib gəldi.

Bir dəfə də [Baburun əmisi] Əba Bəkr Mirzə İraqtan qaraqoyunlu türkmənləri ilə birlikdə gəlib Təkanə və Xumarda [Baburun digər bir əmisi] Uluğ bəy Mirzəni məğlub edərək Kabili almışdı, amma sonra İraq üzündən Kabili buraxıb Xeybərdən aşaraq Xoşab ilə Multan civarından keçməklə Siviyə çıxmış, oradan da gəlib Kirmanı almış, lakin orada da durmayaraq **(165 b)** Xorasan vilayətinə getmişdi, iştə o zaman Sultan Hüseyn Mirzə də sürətlə gedib oranı ələ keçirdi.

Bir dəfə də Püli-Çırağda oğullarından biri olan Bədiüzzaman Mirzəni yendi.

Bir dəfə də Halva-Çeşmədə iki oğlunu, yəni Əbülmöhsün Mirzə ilə Kibək [Məhəmməd Möhsün] Mirzəni yendi.

Bir dəfə də əsgər çəkib Qunduzu mühasirə etdi, lakin ala bilmədən geri qayıtdı.

Bir dəfə də Hisarı mühasirə etdi, lakin onu da alammadan geri döndü.

Bir dəfə də Zünnunun [bəy Arğun] vilayəti üzərinə yürüdü. Büst valisi Büstü təslim etdi, başqa heç bir şey etmədi və ən axırda Büstü də buraxıb geri qayıtdı. Sultan Hüseyn Mirzə kimi cəsur və böyük bir padşah bu iki-üç səfərdə padşahlara xas əzmini yerinə yetirə bilmədən və heç bir işi tamamlaya bilmədən geri dönmək məcburiyyətində qaldı.

Bir dəfə də Nişin çayırında Zünnunun oğlu Şah [Şüca] bəy ilə birlikdə gələn oğlu Bədiüzzaman ilə vuruşdu və onu məğlub etdi. Orada qəribə bir təsadüf olmuşdu: Sultan Hüseyn Mirzənin yanında əsgəri az imiş və əsgərinin çoxunu Əstərabad civarina göndəribmiş. Əstərabada gedən əsgər tam bu savaş günündə gəlib ona qoşulur. Digər tərəfdən də Sultan Məsud Mirzə Hi-

sarı [qardaşı] Baysunqur Mirzəyə təslim etmiş və Sultan Hüseyn Mirzənin yanına gəlirmiş, o da tam o gün gəlib qoşulubmuş.

**Torpaqları:** Xorasan vilayəti idi. Şərqi Bəlx, qərbi Bistam **(166 a)** və Damğan, şimali Xarəzm, cənubu Qəndəhar və Sistandır. Herat kimi bir şəhər əlinə keçdiyi halda gecə-gündüz işrət və fisqdən başqa işi yox idi, hətta ətrafında və məiyyətində olanlardan da işrət və fisqlə məşğul olmayan heç bir adam yox idi. Cahangirlik və sərkərdəliyin əziyyət və zəhmətini çəkmədiyi üçün, təbii olaraq, adamları və vilayəti getdikcə azaldı.

**Uşaqları:** on dörd oğlu və bir qızı qalmışdı.

**Bədiüzzaman Mirzə** oğullarından ən böyüyü idi. Anası [Bikə Sultan bəyim] Səncər Mirzə Mərvinin qızıydı.

**Şah Qərib Mirzə** öz xidmətindəydi. Xarici görkəmi [topal idi, bədəni də yöndəmsiz idi] pis olduğu halda, təbiəti yaxşı idi. Vücudu zəif olsa da, sözü gözəldi. Qəribi təxəllüsü ilə yazırdı. Türkcə və farca şeirlər söyləyirdi, bir divan da tərtib etmişdi. Bu beyt onundur:

Dər güzər didəm pəriruye şodəm divaneəş,
Çist nami, u, koca başəd nədanəm xaneəş.
*Yolda bir pəri üzlünü görüb divanəsi oldum,*
*Adı nədir və evi haradadır, bilmirəm.*

Sultan Hüseyn Mirzə Heratın idarəsini bir müddət Şah Qərib Mirzəyə vermişdi. Atası həyatda ikən vəfat etdi. Uşağı olmadı.

**Müzəffər [Hüseyn] Mirzə**: Sultan Hüseyn Mirzənin ən çox sevdiyi oğluydu, ancaq seviləcək elə bir əxlaqı və hərəkəti yox idi. Oğullarının çoxu onu çox sevdiyi üçün atalarına düşmən oldular.

Bu iki oğlunun anası Sultan Əbu Səid Mirzənin cariyəsi olan Xədicə bəyim idi. **(l66 b)** Mirzədən Ağ bəyim adlı bir qızı da vardı.

**Əbülmöhsün Mirzə** və əsil adı **Məhəmməd Möhsün** olan Kibək Mirzə: bu ikisinin anası Lətif Sultan ağaçə idi.

**Əbu Turab Mirzə**: əvvəllər onun çox fəzilətli olduğunu söyləyirdilər. Atasının xəstəliyi şiddətlənəndə başqa şeylər eşidərək kiçık qardaşı Məhəmməd Hüseyn Mirzə ilə birlikdə qaçıb İraqa getdi. İraqda sipahiliyi buraxıb dərvişliyə keçmişdir. Sonralar ondan bir xəbər alınmadı.

Söhrab Mirzə adlı bir oğlu vardı. Mən [özbək sultanları] Həmzə Sultanla Mehdi Sultanın komandanlığında olan sultanları məğlub edib Hisarı alanda mənim yanımdaydı. Bir gözü kor idi. Qəribə və çirkin bir görkəmi var idi, əxlaqı da görünüşü kimiydi. Bir çılğınlıq elədi, elə ona görə də yanımda qala bilməyib getdi. Əstərabad civarında çılğınlığı üzündən [Şah İsmayılın vəziri və sərkərdəsi] Nəcmi Sani onu işkəncə ilə öldürdü.

**Məhəmməd Hüseyn Mirzə**: İraqda onu Şah İsmayıl ilə eyni yerə həbs etmişlər və elə o zaman onun müridi olmuş. Sonradan qatı bir rafizi[1]

[1] *Rafizi:* Babur bu təbirlə şiəliyi nəzərdə tutur.

olmuşdu. Atası, böyük və kiçık qardaşları sünni olduğu halda o, rafızi idi. Əstərabadda batillik və xəta içində öldü. Onun olduqca cəsur və qəhrəman olduğunu söyləyirlər, lakin belə söyləməyə layiq bir işi görünmədi.

Şairliyi də varmış. Bu beyt onundur:

Aludeyi-gərdi zi payi seyd ki gəşti,
Qərqi-əraqi dər dili-gərm ki qozeşti.
*Toza bələnmisən, kimi ovlamaq üçün gəzib tozdun,*
*Tərə boğulmusan, kimin hərarətli könlündən keçdin.*

**Firidun (167 a) Hüseyn Mirzə**: yayı qüvvətli çəkir, yaxşı ox atırmış. Çəkdiyi oxunun qırx batman olduğunu söyləyirlər. Olduqca cəsur adamdı, lakin savaşda bəxti yoxdu, girdiyi hər müharibədə məğlub oldu.

Ribati-Dudezdə Firidun Hüseyn Mirzə kiçık qardaşı İbn Hüseyn Mirzə, Teymur Sultan və Übeyd Sultan ilə birlikdə Şeybani xanın ilqarıyla vuruşdular və məğlub oldular. O zaman Firidun Hüseyn Mirzə çox igidliklər göstərmişdir.

Damğanda isə Firidun Hüseyn Mirzə ilə [böyük qardaşı Bədiüzzaman Mirzənin oğlu] Məhəmməd Zaman Mirzə Şeybani xanın əlinə düşdülər, amma o, ikisini də öldürmədən buraxdı. Sonra Şah Məhəmməd Divanə Qalatı özbəklərə qarşı bərkidəndə oraya getdi, amma özbəklər Qalatı alanda o da onların əlinə keçdi və öldürüldü.

Sultan Hüseyn Mirzənin bu üç oğlu Minqli Bi ağaçə adlı bir özbək cariyəsindən doğulmuşdu.

**Heydər Mirzə**: anası Sultan Əbu Səid Mirzənin qızı Payəndə Sultan bəyimdi. Atasının zamanında bir müddət Məşhəddə və Bəlxdə hökm sürdü. Sultan Hüseyn Mirzə Hisarı mühasirə edəndə Sultan Mahmud Mirzənin Xanzadə bəyimdən doğulan qızını ona alıb barışaraq Hisarın mühasirəsindən vaz keçmişdir.

Həyatda qalan yeganə uşağı yalnızca Şad bəyim adlı qızıydı. Bu qız daha sonra Kabilə gəldi və Adil Sultana verildi.

Heydər Mirzə hələ atası həyatda ikən **(l67 b)** vəfat etdi.

**Məhəmməd Məsum Mirzə**: atası ona Qəndəharı vermişdi. Bu münasibətlə [Baburun əmisi] Uluğ bəy Mirzənin bir qızını bu oğluna istədi və Herata gətirəndə böyük bir toy edib gözəl bir çadır qurdurdu. Düzdür, Qəndəharı ona vermişdi, ancaq yaxşı-pis hər şeyi Şah [Şüca] bəy Arğun edirdi və Məhəmməd Məsum Mirzənin heç bir etibarı və nüfuzu yoxdu. Buna görə də Qəndəharda qalmayıb Xorasana getdi, atası hələ həyatda ikən vəfat etdi.

**Fərrux Hüseyn Mirzə**: ona çox yaşamaq nəsib olmadı və kiçık qardaşı İbrahim Hüseyn Mirzədən bir müddət əvvəl bu dünyadan köçdü.

**İbrahim Hüseyn Mirzə**: təbiəti pis deyildi, amma Herat şərabını aşırı bir şəkildə içdiyi üçün atası hələ sağkən öldü.

**İbn Hüseyn Mirzə** və **Məhəmməd Qasım Mirzə**: onlar haqqında irə-

lidə bəhs ediləcəkdir.

Bu beş mirzənın anası cariyələrdən Papa ağaçə idi.

Sultanım bəyim: qızlarının ən böyüyü və anasını tək övladı idi. Anası Çöli bəyim azaq bəylərinin qızıydı. Çox söz bilir və sərbəst danışırdı. Atası onu böyük qardaşı Bayqara Mirzənin ortancıl oğlu Sultan Veys Mirzə ilə evləndirmiş, ondan bir qızı və bir oğlu olmuşdu. Qızını Şeybani sultanlarından Yolbars Sultanın kiçık qardaşı İsənqulu Sultana vermişdilər. Oğlu Məhəmməd Sultan Mirzədır və indi onu Qanuc vilayətinə hakim qoymuşam. O zaman Sultanım bəyim Kabildən **(168 a)** nəvəsini alıb [Hindistana] gələndə Nilabda vəfat etmişdi. Adamları onun cənazəsini alıb [Kabilə] döndülər; nəvəsi mənim yanıma [Hindistana] gəldi.

[Sultan Hüseyn Mirzənin] Payəndə Sultan bəyimdən doğulan qızlarının ən böyüyü Ağ bəyimdi. Onu [Əbülqasım] Babur Mirzənin kiçık bacısı Bikə bəyimin nəvəsi Məhəmməd Qasım Arlata vermişdilər. Qaragöz bəyim adlı bir qızı olmuş, bu qızı da [Baburun kiçık qardaşı] Nasir Mirzə almışdı.

İkinci qızı Kiçık bəyim idi. Sultan Məsud Mirzə ona istəyirdi, amma bütün səyinə baxmayaraq [anası] Payəndə Sultan öz mülahizələrinə görə vermədi. Sonra Seyid Atanın [Xoca Əhməd Yəsəvi] nəslindən Molla Xocaya vermişdi.

Üçüncü qızı Bikə bəyimlə dördüncü qızı Ağa bəyimi kiçık bacısı Rəbiə Sultan bəyimin oğulları Babur Mirzə ilə Sultan Murad Mirzəyə vermişdi.

[Sultan Hüseyn Mirzənin] Minqli Bi ağaçədən iki qızı olmuşdu. Böyüyünün adı Bayram Sultandı. Əndəxud seyidlərindən və Bayqara Mirzənin qız nəvəsi olan Seyid Abdullah Mirzəyə vermişdilər. Seyid Bərkə adlı bir oğulları oldu. Mən Səmərqəndi alanda mənimlə birlikdəydi. Sonra Ürgənc tərəfə gedib səltənət davasına girişdi və qızılbaşlar tərəfindən Əstərabadda öldürüldü.

Digər qızının adı Fatma Sultandı. Teymur bəy nəslindən olan Yadigar Mirzəyə vermişdilər.

[Sultan Hüseyn Mirzənin] Papa ağaçədən üç qızı olmuşdu. Ən böyüyü Sultan Nijad bəyimdi və Sultan Hüseyn Mirzənin böyük qardaşının [Bayqara Mirzə] kiçık oğlu [Sultan] İskəndər Mirzəyə verilmişdi.

İkinci qızı Bəyim Sultandı; Sultan Məsud Mirzəyə gözünü **(168 b)** itirəndən sonra vermişdilər. Bir qızı və bir oğlu olmuşdu. Qızını Sultan Hüseyn Mirzənin arvadı [və eyni zamanda Papa ağaçənin sütbacısı] Apağ bəyim böyütmüşdü. Bu qız Heratdan Kabilə gəldi və Seyid Mirzə Apağa verildi. Sultan Məsud Mirzə özbəklər tərəfindən öldürüldükdən sonra Bəyim Sultan oğlunu alıb Kəbəyə getdi. Bugünlərdə özünün və oğlunun Məkkədə olduqları xəbəri gəldi. Oğlu olduqca böyüyübmüş.

Üçüncü qızını da Əndəxud seyidlərindən və daha çox Seyid Mirzə deyə bilinən birinə vermişdilər.

[Sultan Hüseyn Mirzənin] cariyəsindən də Ayşə Sultan adında bir qızı olmuşdu. Bu cariyə Həsən Şeyx Teymurun nəvəsi olan Zübeydə ağaçəydi. Bu qızı Şeybani sultanlarından Qasım Sultana vermişdilər və ondan Qasım Hüseyn [Sultan] adında bir oğlu olmuşdu. Bu oğlan Hindistanda mənim mülazimətimə gəldi, Rana Senqa ilə müharibəyə qoşuldu və ona Bedaun verildi. [Ayşə Sultanı] Qasım Sultandan sonra onun qohumlarından olan Boran Sultan adında biri aldı və ondan da Abdullah adlı bir oğlu oldu, ki indi mənim mülazimətimdədir, yaşı kiçık olmasına baxmayaraq xidməti pis deyil.

**Qadınları və cariyələri:** ilk aldığı qadın Səncər Mirzə Mərvinin qızı Bikə Sultan bəyimdi. Bədiüzzaman Mirzə ondan olmuşdu. Çox deyingən idi və Sultan Hüseyn Mirzəyə çox əziyyət verirdi. Mirzə onun deyingənliyindən bezdi. Axırda buraxdı və ondan qurtuldu. Nə **(169 a)** eləsin, haqq Mirzənin tərəfindəydi.

Zəni bəd dər sarayi-mərdi-niku,
Həm dər in aləm əst duzəxi-yu.[1]
*Yaxşı kişinin evində pis bir arvadı olsa,*
*Onun cəhənnəmi bu dünyada imiş.*

Allah heç bir müsəlmanı bu bəlaya salmasın. Ya rəb, pis xasiyyətli və deyingən qadın yer üzündə qalmasın!

Çöli bəyim: azaq bəylərinin qızıydı. Sultanım bəyim ondan olmuşdu.

Şəhribanu bəyim: [Baburun babası] Sultan Əbu Səid Mirzənin qızıydı. Taxta çıxdıqdan sonra almışdı. Çikmən müharibəsində Mirzənin bütün arvadları məhfədən[2] çıxıb ata minəndə o, kiçık qardaşına arxayın olduğu üçün məhfədən çıxmır və ata minmir[3]. Bunu Mirzəyə çatdırırlar. Bu üzdən Mirzə Şəhribanu bəyimi buraxdı və kiçık bacısı Payəndə Sultan bəyimi aldı. Özbəklər Xorasanı aldıqdan sonra Payəndə Sultan bəyim İraqa getdi və orada vəfat etdi.

Xədicə bəyim: Sultan Əbu Səid Mirzənin cariyəsiydi və Mirzədən Ağ bəyim adlı bir qızı vardı. İraqda Sultan Əbu Səid Mirzənin məğlubiyyətindən sonra Herata gəldi. Onu orada Sultan Hüseyn Mirzə aldı və çox sevdiyi üçün cariyəlik dərəcəsindən bəyimlik dərəcəsinə yüksəltdi. Sonralar fövqəladə nüfuz sahibi olmuşdu. [Bədiüzzaman Mirzənin oğlu] Məhəmməd Mömin Mirzəni onun təhrikiylə öldürdülər.

Sultan Hüseyn Mirzənin öz oğullarıyla düşmən olmasının ən böyük səbəbi də bu qadındır. Özünü çox ağıllı sayırdı, lakin ağılsız və çox danışan bir qadındı. Eyni zamanda rafizi imiş. [Sultan Hüseyn Mirzənin oğulları]

---

[1] Sədi Şirazidən.

[2] *Məhfə:* dəvə, fil kimi heyvanların belinə qoyulan, içində iki adamın qarşılıqlı otura biləcəyi şəkildə düzəldilmiş səbət.

[3] Şəhribanu bəyimin güvəndiyi kiçık qardaşı Çikmən müharibəsində Sultan Hüseyn Mirzə ilə savaşan [Baburun əmisi] Sultan Mahmud Mirzədir.

Şah Qərib Mirzə ilə Müzəffər Hüseyn Mirzə **(169 b)** ondan doğulmuşdular.

Apağ bəyim: heç uşağı olmadı. Mirzənin ən çox sevdiyi arvadı Papa ağaçə Apağ bəyimin süd bacısıydi. Öz uşağı olmadığı üçün Papa ağaçənin oğullarına öz uşağı kimi baxırdı. Mirzə xəstə olduğu zamanlarda ona fövqəladə yaxşı xidmət edirdi, arvadlarından heç biri o qədər xidmət edə bilməzdi. Hindistana getdiyim il Heratdan gəldi. Mən də əlimdən gəldiyi qədər ona sayğı və hörmət göstərdim. Çəndirini mühasirə etdiyim zaman Kabildə vəfat etdiyi xəbəri gəldi.

[Sultan Hüseyn Mirzənin] cariyələrindən biri də çərşənbehilərdən[1] Lətif Sultan ağaçəydi; Əbülmöhsün Mirzə ilə Kibək [Məhəmməd Möhsün] Mirzə ondan olmuşdu.

Cariyələrindən biri də özbəklərdən Minqli Bi ağaçəydi; Əbu Turab Mirzə, Məhəmməd Hüseyn Mirzə və Firidun Hüseyn Mirzənin anasıydı və Şəhribanu bəyimin xidmətçilərindəndi. Onun iki qızı da vardı.

Cariyələrindən biri də Apağ bəyimin südbacısı olan Papa ağaçəydi. Mirzə onu görüb sevərək almışdı. Daha öncə söyləndiyi kimi, beş oğlu ilə dörd qızının anasıydı.

Cariyələrindən biri də Bəgi Sultan ağaçəydi. Ondan uşağı olmadı.

Bunlardan başqa da aşağı və əsil cariyələri vardı. Qadınlarından və cariyələrindən mötəbər olanları yuxarıda sayılanlardır.

Sultan Hüseyn Mirzə böyük bir padşah və Herat kimi islam şəhərinin padşahı olduğu halda, qəribədir ki, bu on dörd oğlundan ancaq üçü bic deyildi. Pozğunluq onun özünə, **(170 a)** oğullarına və əhalisinə fövqəladə dərəcədə xas idi. Belə böyük bir ailədən yeddi-səkkiz il içində [Bədiüzzaman Mirzənin oğlu] Məhəmməd Zaman Mirzə istisna olmaqla, heç bir nam-nişan qalmaması məhz onların bu uğursuzluğundan irəli gəlmişdir.

**Əmirləri:**

**Məhəmməd Burunduq Barlas:** Çaku Barlas nəslindəndi. Çaku Barlas oğlu Cahan Şah oğlu Burunduq oğlu Əli oğlu Məhəmməd Burunduq.

Əbülqasım Babur Mirzənin yanında bəydi. Ondan sonra Sultan Əbu Səid Mirzə də iltifat etdi və o da Kabili Cahangir Barlasla birlikdə ona verərək oğlu Uluğ bəy Mirzəyə atəkə təyin etdi.

Sultan Əbu Səid Mirzənin ölümündən sonra Uluğ bəy Mirzə barlaslara qəsd etmə təşəbbüsündə bulundu. Bunlar da işi duyunca Mirzəni ələ keçirib el və uluslarını yanlarına alaraq Qunduz tərəfinə köç etdilər. Hinduquş üzərinə gələndə Mirzəni heç incitmədən Kabil tərəfinə göndərib özləri də Xorasana Sultan Hüseyn Mirzənin yanına getdilər və o da onları xoş qarşıladı.

Məhəmməd Burunduq fövqəladə bilgili bir adam və çox yaxşı bir sərdardı. Quşa çox marağı vardı, o qədər ki, əgər bir quşu ölsə, ya itsə, oğulla-

---

[1] *Çərşənbehi:* sevimli qadın, cariyə, gözde, favori qadın.

rının adını söyləyərək «Kaş bu quş ölənə və ya itənə qədər filan öləydi və ya filanın boynu qırılaydı» deyirmiş.

**Müzəffər Barlas:** qazaxlıq zamanlarında Mirzənin yanındaydı. Bilmirəm, Mirzəyə bunun nəyi xoş görünmüşdü ki, ona bu qədər çox iltifat göstərmişdi. Onun etibarı o dərəcədəydi ki, Sultan Hüseyn Mirzə qazaxlığında onunla belə şərt bağlamışdı: hər hansı bir vilayət ələ keçirilsə, üçdə ikisi Mirzənin **(170 b)**, üçdə biri isə onun olacaqdı. Bu, qəribə bir şərtdir. Bir nökəri özü ilə ortaq eləmək padşahlıqla bir araya sığarmı? Kiçık qardaşla və oğulla da belə bir şərt bağlanmaz, harada qaldı ki, bir bəy özünün bir adamı ilə belə bir şey eləsin. Mirzə taxta çıxdıqdan sonra bu şərti bağladığına peşman oldu, lakin fayda etmədi.

Bu qədər etibar gördüyü halda bu dar qafalı adam Mirzəyə qarşı çox tərbiyəsizlik edirdi. Mirzənin fikriylə hərəkət etmirdi. Axırda, deyilənə görə, zəhərlənmişdi. Doğrusunu Allah bilir.

**Əlişir bəy Nəvai:** əslində Mirzənin bəyi deyil, arxadaşıydı. Uşaqlıqda eyni məktəb oxumuş və yaxın dost olmuşlar.

Sultan Əbu Səid Mirzənin onu hansı qabahətindən dolayı Heratdan sürdüyünü bilmirəm, amma Səmərqəndə getdi və orada olduğu bir neçə il ərzində [Sultan Məlik Kaşğarinin oğlu] Əhməd Hacı bəy ona havadarlıq və hamilik etdi.

Əlişir bəy məcazının nəzakəti ilə məşhurdur. Xalq onun nəzakətinin dövlətinin qürurundan irəli gəldiyini zənn edirdi, lakin elə deyilmiş, o bu özəlliyə fitrətdən sahib imiş. Səmərqənddə ikən də təbi belə nazikmiş.

Əlişir bəy misilsiz bir adamdı. Türk dililə o qədər çox şeir söyləmişdir ki, kimsə o qədər çox və gözəl söyləməmişdir. Altı məsnəvi yazmışdır, beşi *Xəmsəyə* bənzədilərək, biri də *Məntiq üt-teyr* vəznində və *Lisan üt-teyr* adındadır. *Qəraib üs-siğər* [Uşaqlıq çağının qəribəlikləri], *Nəvadir üş-şəbab,* [Gənclik çağının nadirəlikləri], *Bədai ül-vəsət* [Orta yaş çağının möcüzələri] və *Fəvaid ül-kibər* [Qocalığın faydalı öyüdləri] adında dörd qəzəl divanı tərtib etmişdir. Rübailəri də vardır. Bunlardan başqa, bəzi əsərləri də vardır, lakin bu söylənənlərlə **(171 a)** müqayisədə daha aşağı və daha zəifdır.

Mövlana Əbdürrəhman Camini təqlid edərək məktublarını da toplamışdır. Vəlhasil, hər kəs və hər iş üçün bir məktub yazmış isə onları toplamışdır. Bir də *Mizan ül-övzan* [Vəznlərin mizanları] adlı bir əruz risaləsi yazmışdır, ancaq bunun tənqid ediləcək tərəfi çoxdur. İyirmi dörd rübai vəznindən dördündə yanılmışdır. Bəzi bəhrlərin vəznlərində də yanılmışdır və bunlar əruz ilə məşğul olanlara məlumdur. Farsca bir divan da tərtib etmişdir. Farsca nəzmdə Fani təxəllüsünü işlətmişdir. Bəzi beytləri fəna deyildir; lakin çoxu zəif və dəyərsizdir.

Musiqidə də gözəl şeylər bəstələmişdir. Gözəl nəqşləri və gözəl pişrovları vardır.

Fəzl və hünər əhli üçün Əlişir bəy qədər öyrədici və qoruyucu başqa bir adamın da var olduğu heç eşidilməmişdir. Sazda məşhur olan ustad Qul-Məhəmməd, Şeyxi [Neyi] və Hüseyn Udi Əlişir bəyin tərbiyə və himayəsi ilə bu dərəcədə tərəqqi və şöhrət tapdılar. Ustad Behzad və Şah Müzəffər rəsmdə Əlişir bəyin qeyrət və ehtimamıyla bu dərəcə məşhur və məruf oldular. Bu qədər xeyirli işlərdə çox az kimsə bu dərəcə müvəffəq olmuşdur.

Oğulsuz-qızsız, arvadsız və ailəsiz olaraq bu dünyada təkbaşına və subay yaşadı. Əvvəllər möhürdardı. Orta yaşlarında bəy olub bir müddət Əstərabadda hökm sürdü. Sonralar sipahiliyi tərk etdi. Mirzədən heç bir şey almırdı. Əksinə, özü hər il Mirzəyə xeyli miqdarda hədiyyələr verirdi. **(171 b)**

Sultan Hüseyn Mirzə Əstərabad səfərindən qayıdanda onu qarşılamağa gəldi. Mirzə ilə görüşdükdən sonra qalxmaq istəyəndə ona nəsə oldu, qalxa bilmədi. Qaldırıb əldə götürdülər. Həkimlər heç bir diaqnoz qoya bilmədilər. Ertəsi gün Allahın rəhmətinə qovuşdu. Bu beyti halına uyğun düşür:

Bu dərd ilə ki, ölürmən, mərəz çü zahir əməs,
Təbiblər bu bəlaya nə çarə qılğaylar?
*Zahir olmayan bu dərd ilə ölüb gedirəm,*
*Təbiblər bu bəlaya nə çarə edərlər?*

**Əhməd Təvəkkül Barlas:** öncə bir müddət Qəndəhar hökuməti onun əlindəydi.

**Vəli bəy:** Hacı Seyfəddin Bəyin nəslindəndi. Nökərdi və Mirzənin böyük bəyiydi. Sultan Hüseyn Mirzə taxta keçdikdən sonra çox yaşamadı, dərhal öldü. Müsəüman, namazında, sadə və sadiq bir adamdı.

**Həsən Şeyx Teymur:** ona [Əbülqasım] Babur Mirzə etibar göstərib bəylik dərəcəsinə yüksəltmişdi.

**Noyan bəy:** atası Termiz seyidlərindən idi, anası tərəfdən həm Sultan Əbu Səid Mirzəyə, həm də Sultan Hüseyn Mirzəyə qohum idi. Sultan Əbu Səid Mirzə də ona etibar etmişdi. [Sultan Əbu Səid Mirzənin oğlu] Sultan Əhməd Mirzənin nəzdində də mötəbər bir bəydi. Sultan Hüseyn Mirzənin nəzdində də çox etibar gördü. Zövqə, əyləncəyə və şəraba düşkün bir adamdı. Onun xidmətində olduğu üçün Həsən Yaquba Həsən Noyan da deyirdilər.

**Cahangir Barlas:** Kabildə bir müddət Məhəmməd Burunduq [Barlas] ilə birlikdə ortaq hökumət sürmüşdü. **(172 a)** Sonralar Sultan Hüseyn Mirzənin yanına getdi və yaxşı qarşılandı. Hal və hərəkətləri zərif və xoşdu. Əylənməyi bacaran bir adamdı. Ov və quşun üsul və adabını yaxşı bildiyi üçün Sultan Hüseyn Mirzə belə işləri əksərən ona tapşırırdı. Bədiüzzaman Mirzənin müsahibiydi. Mirzənin müsahibliyini yad edib daim ondan bəhs edirdi.

**Mirzə Əhməd Əli Farisi Barlas:** gərçi şeir söyləməzdi, lakin zövq sahibi və şeirdən anlayan, zərif və qəribə bir adamdı.

**Əbdülxaliq bəy:** Şahrux Mirzənin çox etibar etdiyi bəylərindən olan Firuzşah bəy onun babasıdır, bu üzdən ona Əbdülxaliq Firuzşah deyirlər.

Xarəzm bir müddət onun əlindəydi.

**İbrahim Dulday:** idarə işini və hökumət üsulunu yaxşı bilirdi. Məhəmməd Burunduqun bir tayı idi.

**Zünnun bəy Arğun:** cəsur bir adamdı. Gəncliyində Sultan Əbu Səid Mirzənin hüzurunda yaxşı qılınc çalmışdır. Ondan sonra da hər yerdə əli işə toxunmuşdur. Cəsarətinə söz yoxdu, lakin bir az dəlisovdu.

Bizim mirzələrin[1] yanından ayrılaraq Sultan Hüseyn Mirzənin hüzuruna getdi. Mirzə də ona Guru və Nəkdərini verdi. Yetmiş-səksən adamla o civarda çox yaxşı qılınc çaldı. Bir ovuc adamla **(l 72 b)** lap çox həzarəni və nəkdərini möhkəm məğlub etdi. Həzarələri və nəkdəriləri o qədər az adamla yola gətirən başqa adam olmamışdır. Bir müddət sonra Zəmindavəri də ona verdilər.

Oğlu Şah Şüca Arğun da lap kiçıkliyindən bəri atasıyla birlikdə səfərlərə qatılıb qılınc çaldı. Sultan Hüseyn Mirzə atasının acığına etibar edib Qəndəharı atasıyla ortaq olaraq ona verdi. Sonra bu ata ilə oğul arasına düşmənçilik salıb fitnə çıxardılar.

Axırda mən Xosrov şahı ələ keçirib əsgər və adamlarından ayıraraq, Kabili də Zünnunun [bəy Arğun] kiçık oğlu Müqimdən aldığım il Zünnun ilə Xosrov şah mənim üzümdən çarəsiz qaldılar və axırda gedib Sultan Hüseyn Mirzəni gördülər.

Sultan Hüseyn Mirzənin ölümündən sonra Zünnun daha da yüksəldi. Heratın dağ ətəyindəki vilayətlərindən Evbəni və Çahçəranı ona verdilər. Bədiüzzaman Mirzə ilə Müzəffər Mirzə ortaq bir şəkildə padşah olduqları zaman Bədiüzzaman Mirzənin qapısında sahibi-ixtiyar o idi. Müzəffər Mirzənin qapısında isə sahibi-ixtiyar Məhəmməd Burunduq idi.

Gərçi cəsarəti vardı, lakin bir az dəlsov və anlayışsız bir adamdı. Elə olmasaydı, belə üzə gülməyə aldanaraq özünü alçaldardımı? Bunun təfsilatı belədir: Heratda belə etibar və iqdidarda ikən bir neçə şeyx və molla onun yanına gəlib deyirlər ki: «Kütub[2] bizimlə münasibətdədir. Sənə Hizəbrullah [Allahın aslanı] ləqəbi verildi. Sən özbəkləri yenəcəksən». O da bu üzə gülücü sözlərə qapılaraq, boynuna fitə taxıb Allaha şükürlər etmişdir.

Şeybani xan Badğis civarında **(173 a)** mirzələrin üstünə gəlib qüvvələrini birləşdirməyə imkan vermədən onları məğlub edəndə Zünnun da bu sözə inanıb yüz-yüz əlli qədər adamla Qara-Ribatda Şeybani xana qarşı durdu. Üstün qüvvətlər gəlincə bunları alıb götürdülər və Zünnunu öldürdülər. Pak məzhəbli bir adamdı. Namazı tərk etməz, tez-tez də nafilə namazları qılardı. Şahmata çox maraqlıydı. Başqaları bir əllə oynadıqları halda, o iki əllə

---

[1] Teymurun oğlu Miranşahın soyundan olan və Baburun babası Əbu Səidi də əhatə edən mirzələr. Sultan Hüseyn Mirzə isə Mirahşahın böyük qardaşı Ömər Şeyxin soyundandır.

[2] *Kütub:* sufilərin işlətdiyi bir təsəvvüf deyimi olub mənəvi dərəcələrin yeddincisi və ən yüksəyidir. Hər dövrdə tanrı tərəfindən təsərrüf qüdrəti verilmiş bir kütub olur.

və canı necə istəsə, elə oynayırdı. Təbiətində xəsislik və tamahkarlıq vardı.

**Dərviş Əli bəy**: Əlişir bəyin doğma kiçık qardaşı idi. Bəlxin idarəsi bir müddət onda idı və yaxşı idarə etdi. Bacarıqsız və qabiliyyətsiz bir adam idi. Sultan Hüseyn Mirzə Qunduz və Hisar üzərinə ilk dəfə gələndə onun bacarıqsızlığı üzündən uğur qazana bilmədi. Onu Bəlx hökumətindən əzl etdilər. Mən 916-cı ildə [=1510] Qunduza gələndə yanıma gəlmişdi; çaşqın və bitkin bir halda idi. Bəylik qabiliyyətindən və elçilik səlahiyyətindən uzaqdı. Hər halda Əlişir bəy sayəsində belə etibar görmüşdür.

**Moğol bəy:** Heratın idarəsi bir müddət ondaydı. Sonra Əstərabadı verdilər. Əstərabaddan İraqa qaçıb [Ağqoyunlu Uzun Həsənin oğul] Yaqub bəyin hüzuruna getdi. Qəribə bir adamdı. Daima qumar oynayırdı.

**Seyid Bədr:** fövqəladə qüvvətli, lakin çox nazik tövrlü bir adam idi. **(173 b)** Rəqsdə üsul sahibiydi. Çox gözəl rəqs edirdi. Heç kim onun kimi oynaya bilməzdi. Hər halda, bu rəqs onun öz icadıydı. Daima Mirzənin mülazimətində bulunur, onun daimi arxadaşı və həmsöhbəti olurdu.

**İslim Barlas:** sadə bir adamdı. Quşçuluğu yaxşı bilirdi. Bəzi işləri gözəl görürdü. Otuz-qırx batmanlıq yayı çəkib oxu taxtadan keçirirdi. Qabaq meydanının bir başından at qoşduraraq girir, yayı əlinə alıb gərir və atıb hədəfi vururdu. Bir halqanı bir-bir yarım kari uzunluğunda bir ipə, ipin bir ucunu da bir ağaca bağlayıb halqa göydə dönərkən, oxu atıb halqanın içindən keçirirdi. Belə qəribə işləri çoxdu. Daima mülazimət edir və hər söhbətə qoşulurdu.

**Sultan Cüneyd Barlas:** sonra [Əbu Səid Mirzənin oğlu] Sultan Əhməd Mirzənin yanına getmişdi. İndi atasıyla birlikdə Cunəpuru idarə edir.

**Şeyx Əbu Səid xan Dərməyan:** bir müharibədə Mirzəyə at gətirdiyi üçünmü, yoxsa Mirzənin canına qəsd edən bir düşməni dəf etdiyi üçünmü, bilmirəm, ona bu Dərməyan [Xızır kimi yetişən] ləqəbi verilmişdir.

**Behbud bəy:** öncələr mühafiz kimi xidmət edirdi. Mirzənin qazaxlıq vaxtlarında **(l74 a)** xidməti təqdir edildi, ona bir lütf olaraq, damğa və pullarda adının zərb edilməsinə izin verilmişdi.

**Şeyxim bəy:** təxəllüsü Süheyli olduğu üçün ona Şeyxim Süheyli deyirdilər. Şeir söyləyəndə qorxu oyadan söz və təbirlər işlədirdi. Beytlərindən biri budur:

Şəbi-qəm gird badi ahəm əz ca bord gərdunra,
Furi bord əjdəhai seyli eşkəm rübi məskunra.
*Qəm gecəsi ahımın girdabı göy üzünü yerindən oynatdı,*
*Göz yaşımın seli əjdəhası isə rübi-məskunu*
*(dünyanın insanlarla məskun olan qismini) uddu.*

Bu beyti bir dəfə Mövlana Əbdürrəhman Caminin hüzurunda oxumuş və Mövlananın da «Mirzə, siz şeirmi söyləyirsiniz, yoxsa adammı qorxudursunuz?» demişdir.

Bir divan tərtib etmişdi. Məsnəviləri də vardır.

**Məhəmməd Vəli bəy:** yuxarıda söz etdiyim Vəli bəyin oğluydu. Sonralar Mirzənin yanında böyük bəy olmuşdu. Böyük bəy olduğu halda xidmətini heç bir zaman tərk etməzdi və gecə-gündüz saraydan ayrılmazdı. O dərəcə ki, yeməyi və şöləni daima sarayda hazırlanırdı. Təbiidir ki, belə mülazimət edən adam belə etibar görər. İndi biri bəy olub arxasında da beş-altı koru-keçəli gördümü, onu qapıya mərasimlə gətirmək lazım gəlir. O cür xidmət indi hardadır? Bu onunla bağlıdır ki, onlar bəlkə də dövlətə layiq deyillər.

Məhəmməd Vəli bəyin aşı və şöləni yaxşı idi. Adamlarını heç bir fərq qoymadan yaxşı bəsləyirdi. Fəqir və miskinlərə **(l74 b)** öz əliylə çox ehsanlar edərdi. Söyüşcül və ağızdan pərtoy bir adamdı.

917-ci ildə (=1511) Səmərqəndi alanda Məhəmməd Vəli bəy ilə Dərviş Əli Kitabdar mənim yanımdaydılar. O zaman iflic olmuşdu, nə sözündə bir dad vardı, nə də özündə. Belə bir etibara layiq deyildi. Hər halda vəzifəyə sədaqəti onu bu dərəcəyə yüksəltmişdi.

**Baba Əli eşik-ağa:** əvvəlcə Əlişir bəy [Nəvai] ona etibar edib bəylik, sonra eşik-ağa dərəcəsinə yüksəltmişdi. İndi mənim yanımda bəy, yaxınım və içkilərimdən olan Yunus Əli onun oğludur. İrəlidə ondan bəhs ediləcək.

**Bədrəddin:** əvvəllər Əbu Səid Mirzənin sədri olan Mirək Əbdürrəhimin yanındaydı. Fövqəladə çevik və cəld imiş, yeddi at üstündən birdən sıçrayırmış. O və Baba Əli yaxşı dost olmuşlar.

**Həsən Əli Cəlair:** əsl adı Hüseyn Cəlairdir, lakin Həsən Əli adıyla məşhurdur. [Əbülqasım] Babur Mirzə etibar göstərib onun atası Əli Cəlairi bəy eləmişdir. Daha sonra Yadigar [Məhəmməd] Mirzə Heratı alanda onun ən böyük adamı Əli Cəlair idi.

Həsən Əli Cəlair Sultan Hüseyn Mirzənin yanında quşbəyi idi. Şair idi, təxəllüsü Tüfeyli idi. Çox gözəl qəsidə söyləyirdi, öz dövründə qəsidədə çox məşhur idi.

917-ci ildə [=1511/2] Səmərqəndi alanda mənim yanıma gəldi və beş-altı il qaldı. Mənim adıma gözəl qəsidələr söylədi. Qorxusuz və israfçı **(175 a)** bir adamdı. Çöhrə saxlayıdı. Nərdə və qumara çox düşkün idi.

**Xoca Abdullah Mərvari:** əvvəlcə sədr idi, sonraları içki, yaxın və bəy olmuşdu. Çox fəzilətli bir adamdı. Qanunu onun qədər yaxşı çalan adam yox idi, qanunda zəngulə etmək onun icadıdır.

Müxtəlif xətləri yaxşı yazırdı. Ələlxüsus təliqi gözəl yazırdı. İnşası da yaxşı idi. Xoşsöhbət bir adamdı. Şeir söyləyirdi, təxəllüsü Bəyani idi. Şeiri digər qabiliyyətlərinə görə daha aşağı idi, lakin şeiri yaxşı başa düşürdü.

Fasiq və əxlaqsız idi. Əxlaqsızlıq üzündən zöhrəvi xəstəliyə yaxalandı, əli-ayağı tutmaz oldu. Bir neçə il min cür əzab-əziyyət çəkdikdən sonra bu fəlakət üzündən dünyanı tərk etdi.

**Məhəmməd Seyid Urus:** Sultan Əbu Səid Mirzə taxta çıxanda onun böyük və mötəbər bəyi olan Urus Arğunun oğludur. O zamanlar yaxşı ox atan igidlər vardı və bunların ən yaxşılarından biri o idi. Yayı sərt idi, oxu uzağa qüvvətli və yaxşı atanlardandı. Əndəxudun idarəsi bir müddət onun əlində idi.

**Mir Əli Miraxur:** Yadigar Məhəmməd Mirzənin qafil olduğu bir zamanda Sultan Hüseyn Mirzəyə adam göndərərək onun üstünə hücum çəkən adam budur.

**Seyid Həsən Oğlaqçı:** Seyid Oğlaqçının oğlu və Seyid Yusif bəyin kiçık qardaşı idi. Mirzə Fərrux adında məziyyətli və qabiliyyətli bir oğlu **(175 b)** vardı.

917-ci ildə [=1511] Səmərqəndi alanda yanıma gəlmişdi. Şeiri az, lakin gözəl söyləyirdi. Üstürlab və heyəti[1] yaxşı bilirdi. Söhbəti və rəftarı da yaxşı idi. Sərxoşluğu bir az fənaydı. Qacdevan savaşında öldü.

**Tanrıverdi Samançı:** sadə, cəsur və qılınc çalmağı bacaran bir bəydi. Yuxarıda da bəhs edildiyi kimi, Bəlx qapısında yaxşı qılınc çalıb Xosrov şahın Nazar Bahadır adlı böyük bir adamını məğlub etdi.

Bunlardan başqa, Mirzənin yanına gəlib etibara nail olan bir neçə türkmən bəyi vardı. İlk gələnlərdən biri **Əli xan Bayındır**dı.

Sonra **Əsəd bəy** ilə **Təhəmtən bəy** vardı. Bunlar qardaş idi. Təhəmtən bəyin qızını Bədiüzzaman Mirzə almışdı və ondan Məhəmməd Zaman Mirzə dünyaya gəldi.

Biri də **İbrahim Çağatay**dı.

Biri də **Əmir Ömər bəy**di. Daha sonra Bədiüzzaman Mirzənin yanında olacaqdı. Cəsur, sadə və yaxşı bir adamdı. Əbülfəth [Türkmən] adlı bir oğlu İraqdan mənim yanıma gəldi, hələ də yanımdadır, fövqəladə süst, cəsarətsiz və qavrayışsızdır. Belə bir atadan belə bir oğul!?

Sonradan gələnlər isə Şah İsmayıl İraq və Azərbaycana sahib olanda oradan Xorasana gəlmişdilər. Bunlardan biri Əbdülbaqi Mirzəydi. Teymur bəy nəslindən və miranşahilərdəndir. Əvvəllər bunun nəsli o vilayətlərə gedib səltənət davasından vaz keçərək **(176 a)** padşahlara mülazimət edib daima etibar görmüşdülər. Bu Əbdülbaqi Mirzənin əmisi Teymur Osman [Ağqoyunlu Uzun Həsənin oğlu] Yaqub bəyin yanında böyük və mötəbər bəy imiş. Bir dəfə onu çoxlu əsgərlə Xorasan üzərinə göndərməyi də düşünmüşdür. Əbdülbaqi Mirzə gələndə Sultan Hüseyn Mirzə çox etibar edib Məhəmməd Sultan Mirzənin anası olan Sultanım bəyimi ona verərək özünə kürəkən eləmişdi.

Sonradan gələnlərdən biri **Murad bəy Bayındır** idi.

**Sədrləri:**

---

[1] *Üstürlab:* ulduzların dünyaya görə yüksəkliyini tapmaqda işlədilən bir astronomiya aləti, astrolyabiya. *Heyət* və ya *elmi-heyət*, yaxud *nücum* astronomiya deməkdir.

**Mir Sər-Bərəhnə:** Əndican kəndlərindəndir. Deyəsən, həqiqi seyidlərdən deyildir. Fövqəladə xoşsöhbət, şirin sözlü və xoştəb bir adamdı. Xorasanın alim və şairlərinin arasında onun fikri və sözü mötəbər və keçərliydi. Əmir Həmzə qissəsinə qarşılıq olaraq, ömrünü zay edərək uzun və uydurma bir qissə yazmışdır. Bu, təbiətə və ağla uymayan bir işdir.

**Kəmaləddin Hüseyn Qazürgehi:** gərçi sufi deyildi, lakin mütəsəvvif idi. Əlişir bəyin [Nəvai] yanında belə mütəsəvviflər toplaşıb vəcdə gəlir və səma edirlərmiş. Bunun üsulu hamısından daha yaxşı imiş. Hər halda etibar görməsinin səbəbi də bu üsulu olmuşdur. Bundan başqa bəhs ediləcək bir məziyyəti yoxdu.

Sultan Hüseyn Mirzə adına yazılmış *Məclis ül-üşşaq* [Aşiqlər məclisi] adlı bir əsəri vardır. Fövqəladə zəif, çoxu uydurma, həm də dadsız uydurma **(176 b)** və ədəbsiz sözlər yazmışdır. O dərəcədə ki, bəziləri qorxunc küfrdür. Məsələn, bir çox ənbiya və övliyanı məcazi aşiq cərgəsinə mənsub edib hər birinə bir məşuq və məhbub yapışdırmışdır. Dibaçədə bunun Sultan Hüseyn Mirzənin öz təhrir və təsnifi olduğu yazılmışdır ki, bu da qəribə və axmaq bir şeydir. Bəhs etdiyim bu Kəmaləddin Hüseynin şeir və qəzəllərinin hamısının başında limühərririhi [mühərriri tərəfindən] yazılmışdır. Həmin Kəmaləddin Hüseynin üzə gülməsi nəticəsində Zünnun bəy Arğun hizəbrullah [Allahın aslanı] ləqəbini almışdır.

**Vəzirləri:**

**Məcdəddin Məhəmməd:** [Teymur bəyin oğlu] Şahrux Mirzənin divan[1] rəisi olan Xoca Pir Əhməd Xaninin oğluydu. Əvvəllə Sultan Hüseyn Mirzənin divanında arzu edilən tərtib və nizam yoxdu. İsraf və sovurqanlıq fövqəladə çox idi. Nə xalq rifahda idi, nə də ordu məmnundu. O zamanlarda Məcdəddin Məhəmməd pərvanəçi idi[2] və ona «mirək» deyirdilər. Mirzəyə bir az pul lazım olanda və bunu divandakılardan istəyəndə onlar «Pul yoxdur, gəlir də yoxdur» deyə cavab verirlər. Məcdəddin Məhəmməd də orada imiş, təbəssüm edir. Mirzə səbəbini soruşanda Mirzəni bir kənara çəkib könlündəki düşüncəni söyləyir və «Mirzə mənə yetki verib məmurların mənim sözümdən çıxmamalarını şərt qoysa, az bir zaman içində vilayətin **(177 a)** abad, xalqın məmnun, xəzinənin zəngin, ordunun da çox olmasını təmin edərəm» deyir.

Mirzə də onun istədiyi kimi əhd və şərt bağlayıb bütün Xorasan üzrə ona yetki verərək bütün mühüm işlərə onu məsul etdi. O da mümkün olduğu qədər qeyrət edib çalışaraq az zamanda ordunu və xalqı razı və məmnun etdi, xəzinəyə çox pul topladı, vilayətləri də abad və şən etdi.

Lakin Əlişir bəyin [Nəvai] ətrafındakı bütün bəylər və məqam sahib-

---

[1] *Divan:* idarəçiliyə, ələlxüsus də maliyyə idarəçiliyinə baxan mərkəzi təşkilat və bu təşkilatın rəhbəri.

[2] *Pərvanə:* hökmdarların əmr və fərmanlarını yazıb bildirən məmur.

ləri ilə dil tapa bilmədi, bu üzdən də bunların hamısı ona düşmən kəsildilər və yalan bilgilər verərək axırda Məcdəddin Məhəmmədi tutdurub vəzifədən qovdurdular.

Onun yerinə Nizamülmülk divan oldu. Bir müddət sonra Nizamülmülkü də yaxaladıb öldürdülər və yerinə İraqdan Xoca Əfzəli gətirdib divan rəisi qoydular. Mən Kabilə gələn zaman Xoca Əfzələ bəylik rütbəsi verilmişdi, həm də divanda möhür basırdı.

**Xoca Ata:** gərçi yuxarıdakılar qədər sahib-mənsəb divan rəisi deyildi, lakin bütün Xorasanda Xoca Atanın rəyi olmadan heç bir önəmli qərar verilməzdi. Namazında və dinində bütün bir adam idi, dövlət işləri ilə də məşğul olurdu.

## SULTAN HÜSEYN MİRZƏ DÖNƏMİNİN ALİM VƏ SƏNƏTKARLARI

Sultan Hüseyn Mirzənin adamları və məiyyəti bəhs edilən bu adamlar idi. Amma Sultan Hüseyn **(l 77 b)** Mirzənin dönəmi qəribə bir zamandı. Xorasan və özəlliklə də Herat şəhəri fəzilət əhli və misilsiz adamlarla doluydu. Bir iş üzərində çalışan hər kəs o işi ən yüksək dərəcəyə çıxarmaq qeyrəti və arzusu ilə çalışırdı.

**Mövlana Əbdürrəhman Cami** bunlardan biri idi, zahir və batin elmlərində o dövrdə o səviyyədə adam yox idi. Şeirləri yaxşı məlumdur. Mollanın özü tərifə möhtac olmayacaq dərəcədə yüksəkdir. Bu naçiz səhifələrdə yalnızca uğur sayaraq onun adından bəhs edilməsi və sahib olduğu özəlliklərin bir qisminin yazılması düşünüldü.

**Şeyxülislam Seyfəddin Əhməd:** Mövlana Sadəddin Təftəzaninin nəslindəndir və bu nəsil o zamandan bəri Xorasan məmləkətində şeyxülislam vəzifəsini tutmuşdur. Çox alim bir adamdı. Ərəbiyyə və nəqliyyə elmlərini yaxşı bilirdi. Fövqəladə təqva sahibi və dindar bir adamdı. Gərçi şafei məzhəbində idi, lakin digər məzhəblərə də riayət edirdi. Söylədiklərinə görə, yetmiş ilə yaxın camaatla namazı tərk etməmişdi. Şah İsmayıl Heratı alanda onu şəhid etdi və onların nəslindən heç kim qalmadı.

**Mövlana Şeyx Hüseyn:** Gərçi Molla Şeyx Hüseynin ortaya çıxması və yüksəlməsi Sultan Əbu Səid Mirzə zamanında olmuşdu, lakin Sultan Hüseyn Mirzə zamanında da yaşadığı üçün **(178 a)** ondan burada söz edildi. Hikəmiyyat, əqliyyat və kəlam elmini yaxşı bilirdi. Az sözdə çox məna tapıb sözü yerində işlətmək onun icadıdır. Sultan Əbu Səid Mirzə zamanında ona çox yaxın və iqtidardaydı. Dövlətin bütün önəmli işlərində onun rəyi vardı. Möhtəsib vəzifəsini ondan daha yaxşı bacaran adam yoxdu. Sultan Əbu Səid Mirzənin yaxınlarından olduğu üçün Sultan Hüseyn Mirzə zamanında belə bir misilsiz adama haqsızlıq etdilər.

**Mollazadə Molla Osman:** Kabil tümənlərindən olan Ləhugər tüməninin Çərx adlı kəndindəndir. Uluğ bəy Mirzə zamanında hələ on dörd yaşında dərs dediyi üçün ona molla madərzad («anadan doğma alim») deyirlərmiş. Səmərqənddən gedib Kəbəni təvaf etdikdən sonra Herata gələndə Sultan Hüseyn Mirzə buraxmadı və onu yanında saxladı. Fövqəladə alim bir adamdı. O zamanda onun qədər alim bir adam yoxdu. Dediklərinə görə, o ictihad mərtəbəsinə çatmışdı, lakin ictihad etmirdı. Onun «Bir adam bir şey eşitsə, onu necə unudar» dediyini söyləyirlər. Hafizəsi çox güclü imiş.

**Mir Mürtaz:** fəlsəfəni və müsbət elmləri yaxşı bilirdi. Fövqəladə çox oruc tutduğu üçün bu ləqəbi almışdır. **(178 b)** Şahmata çox marağı varmış. O dərəcədə ki, iki oyunçuya birdən təsadüf etsə, biri ilə şahmat oynayır və getməsin deyə digərinin də ətəyini tutub dururmuş.

Biri də **Molla Məsud Şirvani** idi.

**Əbdülqafur Lar:** Mövlana Əbdürrəhman Caminin həm müridi, həm də tələbəsi idi. Mollanın əsərlərinin çoxunu onun öz yanında oxumuşdu. *Nəfahat*a şərh kimi bir şey yazmışdır. Ülumi-zahiriyəyə fövqəladə vaqif idı. Ülumi-zahiri və ülumi-batinidə dərin biliyi olduğu halda iddiasız və təklifsiz bir adamdı. Molla ismini daşıyan hər kəsin önündə elmi mübahisə açmaqdan çəkinməzdi. Hər hansı bir yerdə bir dərvişin olduğunu söyləsələr, onun hüzuruna getmədən rahatlıq tapmazdı.

Mən Xorasana gedəndə Molla Əbdülqafur xəstə idi. Mollanın məzarını ziyarət edəndə Əbdülqafuru da ziyarət etmişdim. Mollanın mədrəsəsində idi. Bir neçə gün sonra bu xəstəlikdən vəfat etdi.

**Mir Cəmaləddin Mühəddis:** hədis elmini Xorasanda onun qədər bilən adam yoxdu. Hələ həyatda idi, lakin çox yaşlı idi.

**Mir Ətaullah Məşhədi:** ərəbiyyat elmini yaxşı bilirdi. Qafiyə haqqında farsca gözəl bir risalə yazmışdır. Qüsuru örnək olaraq hər zaman öz beytlərini **(179 a)** verməsi və hər beytdən öncə «çün an ki dər in beyti-bəndə» («bəndənizin bu beytində olduğu kimi») cümləsini yazmağa lüzum görməsidir. Qafiyə risaləsi haqqında bəzi müxalifləri çox yerində bir sıra düşüncələr irəli sürmüşər. Bir də poetik fiqurlar haqqında *Bədai üs-sənai* adlı bir risalə yazmışdır.

**Qazı İxtiyar:** qazılıq vəzifəsini yaxşı icra etdi. Fiqh haqqında farsca gözəl bir risalə yazmışdır. Bir də iqtibas üçün kəlam ayətlərini nəzmlərə görə bir yerə toplamışdır. Mürqabda Mirzələrlə görüşəndə Qazı Ixtiyar Mir Məhəmməd Yusif ilə birlikdə gəlib məni gördü. Söhbət zamanı Baburi xəttindən bəhs edildi. Hərflərin ayrı-ayrı yazılış formalarını istədi, yazdım. O məclisdə bunları oxuyub qaydalarını müəyyən edərək bəzi şeylər yazdı.

**Mir Məhəmməd Yusif:** şeyxülislamın [Qazı İxtiyar] müridi idi. Sonra şeyxülislam öz yerinə onu təyin etdi. Bəzi məclisdə şeyxülislam Qazı İxtiyar, bəzi məclisdə də bu önə keçirdi. Sonralar sipahilik və sərdarlıq işiylə

çox maraqlandı. Bu iki işdən başqa, onun sözlərindən nə elm məlum olurdu, nə də kəlamından fəhm. Gərçi hər ikisindən də nəsibi və qisməti yoxdu. Nəticədə bu dağdağa üzündən malını və canını, xanimanını bərbad etdi. Özü şiə imiş.

Şairlər arasında da ən məşhuru və ən böyüyü **(l79 b)** Mövlana Əbdürrəhman Cami idi.

Digər iki şair isə adları və sifətləri Sultan Hüseyn Mirzənin bəyləri və içkiləri cərgəsində çəkilən və yazılan Şeyxim Süheyli və Hüseyn Əli Tüfeyli Cəlair idi.

**Asəfi:** vəzirzadə olduğu üçün Asəfi təxəllüsünü işlətmişdir. Eşqdən və vəcddən məhrum olmasına baxmayaraq şeiri rəngsiz və anlamsız deyildi. Özü heç bir zaman qəzəllərini toplamaq arzusunda olmadığını iddia edir, lakin bu, əzilib-büzülmədir, çünki onun qəzəllərini ya kiçık qardaşı, ya da yaxın adamlarından biri toplamışdır. Qəzəldən başqa janrlarda da şeirlər söyləmişdir. Mən Xorasana gedəndə gəlib mənə mülazimət etmişdi.

**Bənnai:** Heratdandır. Atası ustad Məhəmməd sərbənna [baş memar] olduğu üçün bu təxəllüsü almışdır. Qəzəlində rəng və hal vardır. Bir divan tərtib etmişdir. Məsnəviləri də vardır. Mütəqarib bəhrində meyvələr haqqında bir məsnəvisi var, dəyərsizdir və boşuna uğraşmışdır. Xəfif bəhrində bir müxtəsər məsnəvisi var, yenə xəfif bəhrində yazılmış bir az daha böyük bir məsnəvisi vardır. Sonralar bu məsnəvisini tamamlamışdı.

Əvvəllər musiqidən xəbərsizmiş və bu üzdən də Əlişir bəy [Nəvai] tərəfindən məzəmmət edilirmiş. Bir il Mirzə qışı keçirmək üçün Mərvə gedəndə Əlişir bəy də onunla birlikdə gedir. Bənnai isə Heratda qalır. O qış musiqi ilə məşğul olur və yaza qədər bəstə yazacaq səviyyəyə çatır. Mirzə Herata **(180 a)** qayıdanda sövt və nəqş oxuyur; Əlişir bəy çox heyrət edir və bəyənir. Musiqidə gözəl bəstələri vardır. Bunlardan biri Noh-rəng [doqquz rəng] adlanır, doqquz rəngin sonu və nəqşin məqamı rastdadır.

Əlişir bəyə çox qarşı çıxırmış, bu üzdən çox cəfa çəkmişdi. Axırda orada qala bilməyərəq İraq və Azərbaycana [Uzun Həsənin oğlu] Yaqub bəyin yanına getdi. Yaqub bəyin yanında vəziyyəti fəna deyildi və onun məclis arxadaşı olmuşdu. Amma Yaqub bəyin ölümündən sonra o vilayətlərdə dura bilməyərək Herata qayıtdı. Yenə də zarafatından və şuxluğundan geri qalmazdı.

Bunlardan biri budur: bir gün şahmat məclisində Əlişir bəy ayağını uzadır və ayağı Bənnainin arxasına toxunur. Əlişir bəy zarafat olaraq belə deyir: «Əcəb bəla əst, dər Heri əgər pa diraz miquni be puşti şair mirəsəd» (*əcəb baladır, əgər Heratda ayağını uzatsan, mütləq bir şairin arxasına dəyər).* Bənnai isə ona belə cavab verir: «Əgər cəm miquni həm bə puşti şair mirəsəd» (*əgər ayağını geri çəksən, yenə də bir şairin arxasına dəyər).*

Axırda bu zarafatları üzündən Heratdan yenə də Səmərqəndə getdi.

Əlişir bəy bir çox şeylər, həm də yaxşı şeylər icad etmişdi. Bir adam hər hansı bir işdə bir şey meydana gətirsə, onun rəğbət görməsi və məşhur olması üçün ona «Əlişiri» deyərdi və bəziləri zarafatla onu Əlişir bəyə isnad edərdilər. Bir dəfə Əlişir bəy qulağı ağrıdığı üçün başına yaylıq bağlamışdı. Qadınlar kimi yaylığı qıyıq bağlamağa «nazi-Əlişiri» adını verdilər.

Bu cümlədən Bənnai Heratdan gedəndə **(180 b)** palançıya eşşəyi üçün görünməmiş bir palan düzəltdirir və ona «Əlişiri» adını verir. Sonra bu «palani-Əlişiri» deyə məşhur oldu.

**Seyfi Buxari:** bir az mollalığı vardı. Oxuduğu kitabların müfəssəl bir siyahısını göstərərək mollalığını sübut edirdi. Bir divan tərtib etmişdir. Bütün sənət ərbabı üçün tərtib etdiyi başqa bir divanı da vardır. Çoxlu deyim söyləmişdir, məsnəvisi yoxdur. Necə ki bu qitəsi buna dəlildir:

Məsnəvi gərçi sünnəti-şeir əst,
Mən qəzəl fərzi eyn midanəm,
Pənc beyt ki, dilpəzir bovəd,
Bihtər əz xəmsəteyn midanəm.

*Məsnəvi şeirin sünnəti olsa dar,*
*Mən qəzəli fərzi-eyn bilirəm.*
*Ürəyə təsir edən beş beyt,*
*Məncə iki Xəmsədən daha yaxşıdır.*

Bir də farsca bir əruz risaləsi vardır ki, bir cəhətdən çox qısa, digər cəhətdən çox uzundur. Qısadır, çünki lazım olan şeylər yazılmamışdır, uzundur, çünki məlum və aşkar sözlər nöqtəsinə və irabına qədər yazılmışdır.

Yaman içən imiş, sərxoşluğu da çox pis imiş. Çox qüvvətli yumruğu varmış.

**Abdullah Məsnəvigu:** Cam şəhərindəndir və Mollanın [Mövlana Əbdürrəhman Cami] bacısı oğludur. Təxəllüsü Hatifi idi. *Xəmsə*yə müqabil olaraq məsnəvilər yazmışdır. *Həft peykər*ə qarşılıq olaraq yazdığı məsnəvisinə *Həft mənzər* adını vermişdir. *İskəndərnaməyə* qarşılıq olaraq *Teymurnamə* təlif etmişdir. Məsnəvilərinin ən məşhuru *Leyla və Məcnun*dur, lakin lətafəti şöhrəti qədər deyil.

**Mir Hüseyn Müəmmai:** hər halda heç kim onun qədər müəmma söyləməmişdir. Bütün vaxtını müəmma üçün sərf etmişdir. Qayət təvazökar, iddiasız və zərərsiz adammış. **(181 a)**

**Molla Məhəmməd Bədəxşi:** İşkəmişdəndir. İşkəmiş Bədəxşana daxil deyildir, buna görə də Bədəxşi təxəllüsünü işlətməsi qəribədir. Şeiri bəhs etdiyim bu şairlərin şeirləri qədər deyildir. Müəmma haqqında bir risalə yazmışdır. Müəmması da o qədər yaxşı deyildir. Xoşsöhbət bir adamdı. Səmərqənddə gəlib mənə sədaqətini bildirmişdi.

**Yusif Bədii:** Fərqanə vilayətindəndir. Qəsidəni pis söyləməzmiş.

**Ahi:** qəzəli gözəl söyləyirdi. Daha sonra [Sultan Hüseyn Mirzənin oğlu] İbn Hüseyn Mirzənin yanında olurdu. Bir divan sahibidir.

**Məhəmməd Salih:** lətif qəzəlləri vardır, lakin düzgünlüyü lətafəti qədər deyil. Türkcə şeirləri də var və fəna deyil. Sonralar Şeybani xanın yanına getmiş və o da ona iltifat etmişdi. Şeybani xanın adına türkcə bir məsnəvi yazmışdır. Rəməli-müsəddəsi-məhbun vəznində ki, [Caminin] *Sübha* [poemasının] vəznidir və çox süst və fürud bir əsərdir. Oxuyan adam Məhəmməd Salihin şairliyinə inanmaz olur. Yaxşı bir beyti budur:

Oldu Tənbələ vətən Fərqanə,
Qıldı Fərqanəni tənbəlxanə.

Əndican vilayətinə Tənbəlxana də deyirlər. Lakin o məsnəvidə belə bir beyt olduğu məlum deyildir. Şərir, zalım və mərhəmətsiz bir adamdı.

**Şah Hüseyn Kami:** onun şeirləri də pis deyildir. Qəzəl söyləyirdi və gərək ki, bir divanı vardır.

**Hilali:** hələ həyatdadır. Qəzəlləri düzgün, rəngli, lakin təsiri azdır. Bir divanı var. Xəfif vəznində **(l8l b)** *Şah və dərviş* adında bir məsnəvisi də var. Gərçi bəzi beytləri gözəldir, lakin bu məsnəvinin mövusu və quruluşu olduqca boş və qüsurludur. Ondan əvvəl eşq və aşiqlik haqqında məsnəvi söyləyən şairlər aşiqliyi kişiyə, məşuqluğu isə qadına nisbət etmişlər, lakin Hilali dərvişi aşiq, şahı isə onun məşuqu kimi vermişdir. Şahın əfal və əhvalı haqqında söylədiyi beytlərində şahı bir küçə qadını və fahişə etmişdr. Öz məsnəvisinin icabı olaraq bir igidi, üstəlik, şah olan bir igidi küçə qadınları və fahişələr kimi tərif etməsini qəbul etmək əsla mümkün deyildir. Hafizəsi çox qüvvətli imiş. Otuz-qırx min beyti əzbər bilirmiş. Deyilənə görə, *Xəmsəteyn* beytlərinin çoxunu əzbər bilirmiş. Əruz, qafiyə və şeir elminə də vaqifdir.

**Əhli:** qara camaatdandır. Şeirləri pis deyildir. Bir divanı da var.

Xəttatlardan çox adam vardı. Lakin bunların ən məşhuru nəsx və təliqdə **Sultan Əli Məşhədi** idi. Mirzə və Əlişir bəy [Nəvai] üçün bir çox kitab köçürdü. Hər gün Mirzə üçün otuz, Əlişir bəy üçün isə iyirmi beyt yazırdı.

Rəssamlardan biri **Behzad** idi. Rəssamlıq işini fövqəladə incəltdi. Lakin saqqalsızların üzünü pis çəkir, çənəni xeyli böyük verirdi. Saqqallı adamları yaxşı, üzlərini də gözəl çəkirdi.

**Şah Müzəffər:** çox incə **(182 a)** rəsm çəkirdi, ələlxüsus saç rəsmlərini çox zərif rəsm edirdi. Çox yaşamadı, tərəqqi etməyə başlayanda vəfat etdi.

Musiqişünaslar arasında qanunu -əvvəllər bəhs etdiyim kimi- heç kim **Xoca Abdullah Mərvari** qədər çalammazdı.

**Qul Məhəmməd Udi:** gicəki də gözəl çalırdı. Gicəkə üç tel də əlavə etmişdi. Musiqişinas və saz əhlindən heç kim onun qədər çox və gözəl poşrov bəstələməmişdir. Pişrovdan başqa havaları o qədər yaxşı deyildir.

**Şeyxi Neyi:** udu və gəccəki yaxşı çalırmış. On iki-on üç yaşından bəri də neyi yaxşı çalırmış. Bir dəfə Bədiüzzaman Mirzənin söhbətində bir havanı neylə çox gözəl çalır. Qul Məhəmməd gəccəkdə o havanı çalammaz və «Gəccək qüsurlu bir alətdir» deyir. Şeyxi dərhal Qul Məhəmmədin əlindən gəccəki alıb o havanı həm gözəl, həm də tam çalır. Şeyxi haqqında deyilənə görə, nəğməyə o qədər vaqifmiş ki, hansı nəğməni eşitsə «Filan neyin filan pərdəsi bu ahəngdədir» deyirmiş. Lakin özü çox hava bəstələməmişdir. Ancaq bir-iki nəqşin onun olduğunu söyləyirlər.

**Şahqulu Gicəki:** İraqdandır. Xorasana gəlib saz məşq edərək şöhrət qazandı. Bir çox nəqş, pişrov və hava bəstələmişdir.

**Hüseyn Udi:** udu zövqlə çalır, zövqlü şeylər oxuyurdu. Udda bir simlə çalan o olmuşdur. Yeganə qüsuru çox nazlanaraq çalmasıydı. **(182 b)** Bir dəfə Şeybani xan ona çalmağı əmr edir. İstəmədiyi üçün həm pis çalır, həm də öz sazını gətirməyərək pis bir saz gətirir. Şeybani xan fərqinə varır və elə oradaca ona xeyli zopa vurmağı əmr edir. Şeybani xanın dünyada gördüyü yeganə yaxşı işi bu olmuşdur. Həqiqətən, yaxşı iş görmüşdür. Belə həriflər bundan daha artığına layiqdir.

**Qulam Şadi** də bəstəkarlardan biri olub Şadi xanəndənin oğluydu. Düzdür, saz çalırdı, lakin sazəndələr cərgəsində çalmırdı. Yaxşı sövtləri və gözəl nəqşləri vardır. O dönəmdə onun qədər nəqş və sövt bəstələyən adam yoxdu. Axırda Şeybani xan onu Qazan xanı Məhəmməd Əmin xanın yanına göndərdi, sonra ondan bir xəbər alınmadı.

**Mir Azu:** saz çalmırdı, yalnız bəstəkardı. Az hava bəstələmişdir, lakin zövqlü havaları vardır.

**Bənnai:** bəstəkardı, yaxşı sövt və nəqşləri vardır.

Misilsiz bəstəkarlardan biri də **Pəhlivan Məhəmməd Busəid** idi. Pəhlivanlıqda məşhur idi. Şeir də söyləyirdi, sövt və nəqşlər də bəstələyirdi. Çahargahdan yaxşı bir nəqşi vardır. Xoşsöhbət bir adamdı. Pəhlivanlıqla bəstəkarlıq məziyyətini özündə cəmləşdirməsi qəribədir.

Sultan Hüseyn Mirzə vəfat edəndə mirzələrdən Bədiüzzaman Mirzə ilə Müzəffər Hüseyn Mirzə onun yanında idilər.

Müzəffər Hüseyn Mirzə Mirzənin ən sevdiyi oğlu, Məhəmməd Burunduq Barlas da onun ixtiyar sahibi bəyi və atəkəsi, anası Xədicə bəyim də **(183 a)** Mirzənin etibarlı arvadı olduğu üçün və Mirzənin adamları daha ziyadə Müzəffər Mirzəyə təmayül göstərdikləri üçün belə bir fikir vardı ki, Bədiüzzaman Mirzə tərəddüd edərək oraya gəlməz. Müzəffər Hüseyn Mirzə ilə Məhəmməd bəy şəxsən gedib könlündəki tərəddüdü ortadan qaldıraraq Bədiüzzaman Mirzəni gətirdilər.

Sultan Hüseyn Mirzəni Herata gətirib şahanə bir mərasim və ayinlə öz tikdirdiyi mədrəsəsinə dəfn etdilər. O zaman Zünnun bəy Arğun da orada idi. Məhəmməd Burunduq bəy, Zünnun bəy və Sultan Hüseyn Mirzədən qalan

və bu iki Mirzə ilə birlikdə olan digər bəylər toplanıb fikir birliyinə vararaq Bədiüzzaman Mirzə ilə Müzəffər Hüseyn Mirzəni Herat taxtına ortaq bir şəkildə çıxardılar.

Bədiüzzaman Mirzənin qapısında ixtiyar sahibi Zünnun bəy, Müzəffər Hüseyn Mirzənin qapısında isə ixtiyar sahibi Məhəmməd Burunduq bəydi. Şəhərin valisi olaraq Bədiüzzaman Mirzə tərəfindən Şeyx Əli Tağayi, Müzəffər Mirzə tərəfindən isə Yusif Əli Göyəldaş təyin edildi. Bu, qəribə bir işdi. Heç bir zaman padşahlıqda ortaqlıq eşidilməmişdir. Şeyx Sədinin *Gülüstan*dakı bu sözünün tərsi oldu:

Dəh dərviş dər kilime bexoftənd,
Və dü padşah dər iqlime nəgoncənd.
*On dərviş bir kilimindəüstündə yatar,*
*Halbuki iki padşah bir iqlimə sığışmaz.*

KABİL - 912 (24 MAY 1506 - 13 MAY 1507)

## DOQQUZ YÜZ ON İKİNCİ İLİN HADİSƏLƏRİ

## BABURUN XORASANA DOĞRU YÜRÜŞÜ

Məhərrəm ayında [=1506 may-iyun] özbəkləri dəf etmək üçün **(183 b)** biz Xorasana yürüməyə qərar verərək Gur-Bənd və Şibertu yoluyla hərəkət etdik. Cahangir Mirzə o vilayətdən narazı çıxmış olduğu üçün əgər aymaqları öz yanına çəksə, bəzi fitnə və fəsadçıların bir çox qarışıqlıq törədə biləcəklərini düşünərək, aymaqları dərhal ələ keçirmək üçün Üşdür-Şəhərdə öz uruğumu və onun qorunması üçün də Vəli Xəzinə[çi] ilə Dövlət Qədəm Qaravulu qoyub oradan yüngül təchizatla və sürətlə hərəkət etdim.

O gün Zöhhak qalasına gəldik. Oradan Künbəzək keçidini aşaraq Sayğan üzərindən Dəndan-Şikən keçidindən keçib Kahmərd çayırına endik. Sultan Məhəmməd Dulday ilə birlikdə Seyid Əfzəl Xabbin Kabildən hərəkət etməmizin keyfiyyətini bildirmək üzərə Sultan Hüseyn Mirzəyənin yanına göndərildi.

Cahangir Mirzə bir az geridə qalmış və iyirmi-otuz adamıyla Bamyan tərəfinə gəlirmuş. Bamyana yaxınlaşanda geridə qoyduğumuz uruğa aid çadırlarımızı görüb bizim də orada olduğumuzu zənn edir və dərhal geri qayıdır. Ordugahına çatan kimi dərhal qalxaraq, arxalarına baxmadan Yekə çayırın civarına gedirlər.

Şeybani xan Bəlxi mühasirəyə almışdı. Bəlxdə o günlərdə Sultan Qulucaq olurdu. Şeybani xan iki-üç sultanı üç-dörd min adamla birlikdə Bədəxşana axın üçün göndərdi.

O əsnada [Bədəxşan bəylərindən] Mübarək şahla Zübeyr də gəlib [Baburun kiçık qardaşı] Nasir Mirzəyə qoşulmuşdular. **(184 a)** Gərçi əvvəlcə aralarında anlaşmazlıq və inciklik vardı. Kişmin aşağısında yerləşən Şahdanda və Kişm çayının şərq tərəfində əsgərləri ilə mövqe tutmuşdular.

Bu özbəklər sabaha qarşı basqına gəlib Kişm çayını keçərək Nasir Mirzənin üzərinə hücum etdilər. Nasir Mirzə dərhal təpəyə çəkilib adamlarını yığıb şeypur çaldırdı və təpədən aşağıya yürüyərək çarpışmaya başlayan kimi özbəklər geri çəkildilər. Onların keçib gəldikləri Kişm çayı yüksəldiyi üçün özbəklərin çoxu ox və qılıncla öldürüldü, bir çoxu əsir düşdü, suda da xeyli adam öldü.

Mübarək şah ilə Zübeyr isə Mirzədən bir az yuxarıda, Kişm tərəfində idilər. Onların üzərinə göndərilən özbəklər onları təpəyə doğru sıxışdırdılar. Nasir Mirzə düşmənini qaçıranda bu vəziyyəti xəbər alaraq dərhal onların üstünə yürüdü. Yuxarıdan Kuhistan bəyləri də atlı və piyada adamlarını yığıb gəlincə özbəklər savaşa bilməyərək qaçdılar. Bunlardan da bir çox adam ox və qılıncla öldürüldü, ya da suda boğuldu. Bəlkə minə, min beş yüzə qədər özbək öldü. Bu Nasir Mirzənin parlaq bir qələbəsi idi. Bu xəbəri bizə

Kahmərd ovasında ikən Nasir Mirzənin adamı gətirdi.

Biz o civarda ikən əsgərlərimiz Guri və Dəhanə tərəflərinə gedib ərzaq gətirdilər. **(184 b)** Orada olduğumuz müddət ərzində Xorasana göndərilmiş olan Seyid Əfzəl ilə Sultan Məhəmməd Duldayın məktubları gəldi. Bu məktublarda Sultan Hüseyn Mirzənin ölümü xəbər verilirdi. Bu xanədanın namusunu qorumaq üçün Xorasan tərəfinə yürüməyə davam etdik. Gərçi bu yürüyüşdə başqa səbəblər də yox deyildi.

Əcər dərəsinin içindən keçib Tüb, Mendaqan və Bəlxab yoluyla enib Kuhi-Safa çıxdıq. Özbəklərin San və Çəhar-Yekə axın etdiyi xəbərini alınca Qasım bəyi əsgərlə birlikdə bu axınçıların üstünə göndərdik. Bunlar da özbəklərə rast gəlib onları məğlub edərək bir çox baş kəsib gətirdilər.

Cahangir Mirzəyə və aymaqlara adamlar göndərdik. Onlardan xəbər alıncaya qədər bir neçə gün Kuhi-Saf yaylasında qaldıq. Bu civarın geyiyi olduqca çoxdur. Bir dəfə ova çıxdıq.

Bir-iki gün sonra bütün aymaqlar gəlib sədaqətlərini bildirdilər. Cahangir Mirzə də aymaqlara dəfələrlə adamlar göndərmişdi. Bir dəfə də İmaməddin Məsudu göndərdi, amma aymaqlar getmədilər və mənim yanıma gəldilər. Axırda Mirzə də məcbur qaldı və Kuhi-Safdan Dəreyi-Baya enəndə gəlib məni gördü. Biz Xorasanın qayğısında olduğumuz üçün Mirzəyə baxmadan və artıq aymaqlardan da çəkinmədən Gərzəvan, Əlmar, Qeysər və Çiçəkdu üzərindən yürüyərək Fəxrəddin-Ölümündən keçib Badğisə tabe olan Dəreyi-Bam deyilən yerə gəldik. **(185 a)**

Hər tərəf qarışıq olduğu və hər kəs əl atıb vilayətdən və xalqdan bəzi şeylər aldığı üçün biz də o civardakı aymaq və türklərdən öz adımıza vergi kəsib bəzi şeylər almağa başladıq. Bu bir-iki ay içində bəlkə də üç yüz tümən kibəki[1] alınmışdır.

Bizdən bir neçə gün öncə Xorasan ilqarı və Zünnun bəyin adamları Pənd-Dih və Mərvçaqda özbək axınçılarını məğlub edib xeyli özbəyi öldürmüşlər.

Bədiüzzaman Mirzə, Müzəffər Mirzə, Məhəmməd Burunduq Barlas və Zünnun Arğunun oğlu Şah [Şüca] bəylər Bəlxdə Sultan Qulucaqı mühasirə edən Şeybani xanın üzərinə yürüməyə qərar verərək bu niyyətlə Heratdan hərəkət etdilər və Sultan Hüseyn Mirzənin bütün oğullarına adamlar göndərib çağırdılar.

Badğisə gələndə isə Əbülmöhsün Mirzə Mərvdən gəlib Çihil-Doxtəranda onlara qoşuldu. Onun arxasından İbn Hüseyn Mirzə də Tün və Qayından gəldi. Kibək Mirzə isə Məşhəddə idi. Ona da bir neçə dəfə adam göndərdilər. Lakin o xoş görünməyəcək sözlər söyləyərək namərdlik edib gəlmədi. Onun kini Müzəffər Mirzəyə idi və «O padşah olsa, mən onun yanına

---

[1] Tümən sözü on min rəqəmini ifadə edir. Kibəki isə Mavəraünnəhr bölgəsində 1308-26-cı illər arasında hökm sürən Kibək xan tərəfindən qoyulmuş bir dinar standartıdır.

necə gedərəm» deyirdi. Belə bir zamanda bütün böyük və kiçık qardaşlar bir araya yığılıb **(185 b)** ağızbirliyi edərək Şeybani xan kimi bir düşmənin üstünə əzmlə yürüməkdə ikən belə lüzumsuz bir qürur göstərib gəlmədi. Bunun səbəbini qüruruna yazsa da, hər kəs bunu onun namərdliyinə bağlayacaqdır. Bu dünyada məqsəd insanın yaxşı işlərinin qalmasıdırsa, ağlı olan bir adam özündən sonra pis sayılacaq belə bir hərəkəti niyə etməlidir, şüuru olan bir adam özündən sonra yaxşı sayılacaq belə bir işə niyə diqqət göstərməsin.

Zikri-namira həkiman ömhi-sani qoftəənd.
*Həkimlər adın yad edilməsini ikinci ömür saymışlar.*

Mənim yanıma da elçilər gəldi. Sonra Məhəmməd Burunduq Barlas şəxsən gəldi. Mən də niyə getməyim dedim və yüz-yüz iyirmi ağac yolu bu məqsədlə yürüdüm. Məhəmməd Bəy ilə birlikdə hərəkət etdim. O əsnada mirzələr Mürqaba gəlmişdilər.

## BABURUN SULTAN HÜSEYN MİRZƏNİN OĞULLARI İLƏ GÖRÜŞMƏSİ VƏ HERATA GETMƏSİ

Bazar ertəsi günü cəmadiyülaxır ayının səkkizində (=26 oktyabr 1506) mirzələrlə görüşüldü. Əbülmöhsün Mirzə yarım küruh məsafədən qarşılamağa gəlmişdi. Yaxınlaşınca mən bu tərəfdən atdan endim, Əbülmöhsün o tərəfdən atdan endi və yürüyərək gəlib görüşdük, təkrar atlara mindik.

Bir az irəlilədikdən sonra, ordugahın yaxınında Müzəffər Mirzə ilə İbn Hüseyn Mirzə bizi qarşılamağa gəldi. Bunlar yaş baxımından Əbülmöhsün Mirzədən kiçıkdilər, ona görə də ondan daha əvvəl qarşılamağa gəlmələri lazım idi. Amma hər halda bu gecikmə **(186 a)** və qüsur, kibirdən və ya məni incitmək üçün olmayıb sərxoşluq və əyyaşlıq üzündən olmuşdur. Müzəffər Mirzə israr etdiyi üçün at üstündə görüşdük. İbn Hüseyn Mirzə ilə də bu şəkildə görüşdük.

Sonra gəlib Bədiüzzaman Mirzənin qapısına endik. Böyük bir izdiham toplanmışdı. İzdiham o qədər çox idi ki, bu izdihamda bəziləri ayaqları yerə dəymədən üç-dörd addım gedirdi. İşi-gücü üçün getmək istəyənlər özlərindən asılı olmadan üç-dörd addım geriyə sürüklənirdi.

Bədiüzzaman Mirzənin divan çadırına çatdıq. Qərarlaşdırıldığına görə, mən çadıra girincə sayğı göstərərək yükünəcəkdim və Bədiüzzaman Mirzə də yerindən qalxıb bir qədər gələcək və sonra görüşəcəkdik. Mən çadıra girincə bir dəfə yükündüm və durmadan yürüdüm. Bədiüzzaman Mirzə isə yerindən bir az yavaş qalxıb bir az ləng yürüdü. Qasım bəy [koçin] mənim sadiq adamlarımdan biri idi və mənim namusum onun namusuydu, qurşağımdan çəkdi. Durumun fərqinə vararaq daha yavaş yürüdüm və qərarlaşdırılmış olan yerdə görüşdük.

Bu böyük ağ çadıra dörd döşək qoymuşdular. Bədiüzzaman Mirzənin ağ çadırları mütlək yan qapılı olurdu və Mirzə daima bu qapının yanında otururdu. Bir döşəyi bu qapının yanına qoymuşdular; Bədiüzzaman Mirzə ilə **(186 b)** Müzəffər Mirzə bu döşəkdə oturdular. Bir döşək də sağ tərəfə, yuxarıya qoymuşdular, Əbülmöhsün Mirzə ilə mən bu döşəkdə oturduq. Bədiüzzaman Mirzənin döşəyindən aşağıya və sol tərəfə də bir döşək qoymuşdular, bu döşəyə isə Mirzənin bəyi və Qasım Hüseyn Sultanın atası olan özbək Şeybani sultanlarından Qasım Sultan ilə İbn Hüseyn Mirzə oturdular. Mənə qoyduqları döşəkdən aşağı, sağ tərəfimə bir döşək daha qoymuşdular, Cahangir Mirzə ilə Əbdürrəzzaq Mirzə də o döşəkdə oturdular. Məhəmməd Burunduq bəy, Zünnun bəy Arğun və Qasım bəy isə sağ tərəfimdə, Qasım Sultan ilə İbn Hüseyn Mirzədən xeyli aşağıda oturdular.

Yemək verildi. Söhbət olmadığı halda yemək verilən yerə masa qoyub altın və gümüş sürahiləri masa üzərinə düzdülər. Əvvəllər bizim atalarımız və ağalarımız Çingiz törəsinə çox riayət edirdilər. Məclisdə, divanda, şölən və yeməkdə oturmaq və qalxmaqda bu törədən kənara çıxmazdılar. Çingiz xanın törəsi mütləq şəkildə ona riayət edilməsi gərəkən sərt bir qanun deyildir. Lakin bir adamdan yaxşı bir nizam qalmışsa, ona uyğun hərəkət etmək lazımdır, atalar pis bir iş görmüşlərsə bunu yaxşı bir işlə əvəz etmək gərəkdir.

Yeməkdən sonra atlara minib endiyimiz yerə gəldim. Bizim ordugah ilə **(187 a)** mirzələrin ordugahının arasında bir şeri məsafə vardı.

İkinci dəfə getdiyim zaman da Bədiüzzaman Mirzə birinci dəfə olduğu kimi yenə hörmət göstərmədi.

Məhəmməd Burunduq bəy ilə Zünnun bəy [Arğun] vasitəsilə bunu çatdırdım: «Gərçi yaşım kiçıkdür, lakin törəm böyükdür. Ata taxtı olan Səmərqəndi iki dəfə müharibə ilə alıb orada oturmuşam. Bu ailə üçün yadla, yağı ilə kim mənim qədər mücadilə etmişdir. Mənə qarşı sayğı göstərməmək yaraşmaz». Bu ağla uyğun sözlər söylənincə etiraf etdilər və mənə sayğı göstərmə işini yerinə yetirdilər.

Bir dəfə də Bədiüzzaman Mirzənin yanına gedəndə günortadan sonra idi və içki məclisi oldu. Mən o zamanlar içki içmirdim. Gözəl və süslü bir məclis idi. Süfrədə hər cür məzə vardı. Toyuq və qaz kababları, hər növ yemək ikram etdilər. Bədiüzzaman Mirzənin məclisini çox tərifləyirdilər. Həqiqətən, əndişəsiz və rahat bir məclis idi. Mürqab sahilində olduğumuz vaxt ərzində Mirzənin içki məclisində iki-üç dəfə iştirak etdim, içki içmədiyimi bildikləri üçün təklif etmədilər.

Müzəffər Mirzənin məclisinə də bir dəfə getdim. Hüseyn Əli Cəlair və Mir Bədir də Müzəffər Mirzənin yanındaydılar, **(187 b)** o məclisdə iştirak edirdilər. Kefi gəlincə Mir [Seyid] Bədir rəqs etdi və gözəl rəqs etdi. Bu rəqs hər halda Mir Bədirin öz icadıdır.

Mirzələr Heratdan hərəkət edib bir-birlərinə katılaraq yığışıb Mürqaba gələnə qədər üç-dörd ay vaxt keçdi. Sultan Quluçaq sıxışaraq Bəlx qalasını özbəklərə təslim etdi. Özbəklər də Bəlxi aldıqdan sonra Mirzələrin bir yerə toplandıqlarını xəbər alaraq Səmərqəndə geri qayıtdılar.

Bu mirzələr söhbətdə, məclislərdə və insanlara olan rəftarda qüsursuz olsalar da, hərb sənətinin hiylələrindən və kələklərindən iraq, dava-döyüşün şücaətindən uzaq idilər.

Mürqabda olduğumuz zaman Haxnəzər Çapanın dörd-beş yüz adamla gəlib Çiçəkdu civarını yağmaladığı xəbəri gəldi. Bütün mirzələr yığışmış olduqları halda bu yağmacıların üstünə heç cürə ilqar göndərə bilmədilər. Halbuki Mürqab ilə Çiçəkdu arası on ağac məsafədir. Bu işi mən öz üzərimə almaq istədim. Amma bunu namus məsələsi edərək mənə də izin vermədilər.

Şeybani xan geri qayıtdığı və il də artıq gecikilmiş olduğu üçün mirzələrin bu qışı uyğun bir yerdə keçirərək, düşməni dəf etmək üçün yazda birlikdə hərəkət etmələri qərara alındı.

Mənə Xorasan civarında qışlamağı təklif etdilər. Kabil və Qəznə qarışıqlıqla dolu yerlər olduğu üçün türklər və moğollar, aymaqlar və məiyyətlər, əfqanlardan və həzarələrdən çeşitli xalq və el Kabilə **(188 a)** yığışmışdı. Üstəlik, Xorasan ilə Kabil arası ən qısa olan dağ yolu ilə qar və buz maneəsi olmasa bir ay qədər sürən bir yoldu, ovalıq üzərindən isə qırx-əlli günlük yoldu. Bundan başqa, vilayət də hələ mənə könül bağlamamışdı və tərəfdarlarımızdan heç kim bizim burada qışlamamızı doğru saymırdı.

Mirzələrə üzrümüzü söylədik, lakin qəbul etmədilər, daha artıq israr etdilər. Nə qədər məzur görmələrini söylədiksə, təkliflərində bir o qədər israr etdilər. Axırda Bədiüzzaman Mirzə, Əbülmöhsün Mirzə və Müzəffər Mirzə çadırıma qədər gəlib qışda burada qalmağı təklif etdilər. Mirzələrin üzünə «xeyr» deyə bilmədik.

Belə padşahların şəxsən özlərinin gəlib burada qalmağı təklif etmələri ilə yanaşı məndə dünyanın insanlarla məskun yerlərində bir bənzəri daha olmayan və özəlliklə də Sultan Hüseyn Mirzənin dönəmində və onun idarəsi altında gözəlliyi və işıltısı on, hətta iyirmi misli artmış olan Heratı görmək arzusu da çox idi. Bu üzdən burada qalmağı qəbul etdik.

Əbülmöhsün Mirzə öz vilayəti olan Mərvə getdi. İbn Hüseyn Mirzə də Tün və Qayına getdi. Bədiüzzaman Mirzə ilə Müzəffər Mirzələr də Herata hərəkət etdilər. İki üç gün sonra mən də arxalarından Çihil-Doxtəran və Daş-Ribat yoluyla Herata doğru yürüdüm.

Bütün bəyimlər, Payəndə Sultan bəyim, mənim bibim Xədicə bəyim, Apağ bəyim və Sultan Əbu Səid Mirzənin qızları olan digər bibi bəyimlərin hamısı Sultan Hüseyn Mirzənin mədrəsəsində toplandılar. Bütün bəyimlər **(188 b)** Mirzənin məqbərəsindəydilər, gedib onları gördüm. Öncə Payəndə Sultan bəyim ilə yükünərək görüşdüm. Ondan sonra Apağ bəyim ilə yükün-

mədən görüşdüm. Sonra Xədicə bəyim ilə yükünərək görüşdüm.

Bir müddət orada oturduq və hafizlər Quran oxuduqdan sonra Xədicə bəyimin çadırı qurulan güney tərəfindəki mədrəsəyə getdik. Xədicə bəyim tərəfindən yemək verildi.

Yeməkdən sonra Payəndə Sultan bəyimin evinə getdim. O gecə orada qaldım. Əvvəlcədən mənə Baği-Nevdə bir yer təyin etmişdilər. Ertəsi gün gəlib Baği-Nevə endim və Baği-Nevdə bir gecə qaldım. Sonra onu da uyğun görməyərək Əlişir bəyin [Nəvai] evlərini təyin etdilər və Heratdan gedənə qədər Əlişir bəyin evlərində qaldım.

Hər iki-üç gündə bir dəfə gedib Baği-Cahanarada Bədiüzzaman Mirzənin hüzuruna çıxardım.

## MÜZƏFFƏR MİRZƏNİN DƏVƏTİ

Bir neçə gün sonra Müzəffər Mirzə məni evinə dəvət etdi. Müzəffər Mirzə Baği-Səfiddə oturурdu. Xədicə bəyim oradaydı. Cahangir Mirzə də mənimlə birlikdə gəldi. Xədicə bəyimin hüzurunda yemək verildikdən sonra Müzəffər Mirzə bizi Babur Mirzənin tikdirmiş olduğu Tarabxana adlı imarətə götürdü. Tarabxanada içki məclisi quruldu.

Tarabxana bağın ortasında yerləşir, iki qatlı, bir az kiçık, lakin olduqca şirin bir imarətdir. Üst qatına bir az artıq bəzək vurmuşlar. Dörd guşəsində dörd hücrə vardır. Bundan başqa, bu dörd hücrənin arasındakı və ortadakı boşluq tamamən bir ev içidir. **(189 a)** Hücrələrinin arası dörd şahnişin şəklində tikilmiş bir həyətdir. Bu evin hər guşəsi rəsmlərlə süslüdür. Bu imarəti Babur Mirzə tikdirsə də, bu təsvirlər Sultan Əbu Səid Mirzənin əmri ilə çəkilmişdir və onun meydan müharibələrini və çarpışmalarını əkc etdirir.

Şimal tərəfdəki şahnişinə üzbəüz iki döşək qoydular, döşəklərin yanları şimala doğruydu. Bir döşəkdə Müzəffər Mirzə ilə mən oturdum, digər döşəkdə də Sultan Məsud Mirzə ilə Cahangir Mirzə oturdular. Müzəffər Mirzənin evində qonaq olduğumuz üçün Müzəffər Mirzə məni özündən yuxarıya oturtmuşdu.

Saqilər şərab piyalələrini doldurub dolaşaraq məclisdəkilərə təqdim etməyə, məclisdəkilər də bu saf şərabları abi-həyat kimi içməyə başladılar. Məclis qızışdı, şərablar başa vurdu. Məni də içirmək və bu məclisə daxil etmək niyyətindəydilər.

Mən gərçi bu vaxta qədər başıma vuracaq dərəcədə şərab içmir və sərxoşluğun necə olduğunu bilmirdım, lakin şərab içməyə arzum vardı və bu vadidən keçməyi könlüm istəyirdi. Uşaqlıqda içkiyə meylim yoxdu və şərabın ləzzətini bilməzdim. Bəzən atam şərab təklif edəndə üzr istəyir **(l89 b)** və qəbul etməzdim. Atamdan sonra Xoca [Mövlana] Qazının uğurlu təsiri ilə zahid və müttəqi idim. Şərab içmək o yana, şübhəli yeməklərdən belə sa-

qınırdım. Sonraları gənclik həvəsi ilə nəfsimə yenilərək şəraba meylim ortaya çıxdı, lakin təklif edəcək bir adam yoxdu, hətta şəraba meylimin olduğunu bilən də yoxdu. Meylim olsa da, o zamana qədər tutmadığım bir işi özözünə etmək çətin idi.

«Madam ki bu qədər təklif edirlər və bütün eyş-işrətin səbəb və vasitələri mükəmməl və hazırdır, Herat kimi arəstə bir şəhərə gəlmişik, indi də içməsəm, nə zaman içərəm» deyə düşündüm və içməyə qərar verərək bu vadidən keçməyə əzm etdim. Lakin «Bədiüzzaman Mirzə böyük qardaşdır. Onun əlindən və onun evində içməyib kiçık qardaşının əlindən və kiçık qardaşının evində içsəm, xatirinə bir şey gəlir» deyə düşündüm və bu tərəddüdümü dilə gətirdim. Bu sözümü məqbul görüb məclisdə bir daha şərab təklif etmədilər. Bədiüzzaman Mirzə ilə Müzəffər Mirzənin birlikdə olduqları bir zamanda hər iki mirzənin təklifiylə içməmə qərar verildi.

Məclisdə xanəndələrdən **(190 a)** Hafiz Hacı ilə Cəlaləddin Mahmud Neyi vardı. Qulam Sadinin kiçık qardaşı Şadi Beçə çəng çalırdı. Hafiz Hacı gözəl oxuyurdu. Heratlılar xəfif, nazik və düz oxuyur. Cahangir Mirzənin Mir Can adlı səmərqəndli bir xanəndəsi vardı, zildən, sərt və usulsüz oxuyurdu. Cahangir Mirzə keiflənincə onun oxumasını əmr etdi. Çox zildən, sərt və zövqsüz oxudu. Xorasanlılar zərifdirlər, onun bu oxumasından biri qulağını tutdu, digəri də üzünü turşutdu, lakin Mirzəyə görə heç kim ona mane ola bilmədi.

Axşamdan sonra Tarabxanadan Müzəffər Mirzənin tikdirmiş olduğu yeni qış evinə gəldik. Bu evə gələndə çox sərxoş olan Yusif Əli Göyəldaş qalxıb rəqs etdi. Üsul sahibi bir adamdı; yaxşı rəqs etdi. Bu evə gələndə söhbət möhkəm qızışdı. Müzəffər Mirzə mənə kəmərilə birlikdə bir qılınc, quzu dərisindən bir kürk və cins bir boz at verdi. Bu evdə Canik bir türkü söylədi. Müzəffər Mirzənin Kəttə Mah və Kiçık Mah adlı oğulları vardı. Sərxoş olub bir az zövqsiz masqaralıqlar elədilər, şənlik axşama qədər davam etdi. Məclis dağıldı. Mən o gecə o evdə qaldım.

Qasım bəy mənə şərab təklif etdikləri xəbərini duyub Zünnun bəyin yanına adam göndərmiş, Zünnun bəy də mirzələrə nəsihət edircəsinə sərt sözlər söyləmiş, onlar da şərab təklifindən tamamən vaz keçmişlər **(l90 b).**

## BƏDİÜZZAMAN MİRZƏNİN DƏVƏTİ

Bədiüzzaman Mirzə Müzəffər Mirzənin qonaqpərvərliyini eşidib Baği-Cahanaradakı Müqəvvixanadə bir məclis quraraq məni dəvət etdi. Bizim bəzi içkiləri və igidləri də dəvət etdilər.

Mənim yanımdakılar mənim üzümdən içmirdilər. Ayda və ya qırx gündə bir dəfə içəndə də qapıları bağlayıb qorxa-qorxa içirdilər. Belə adamları dəvət etdilər. Oraya gedəndə də ya məndən oğrun, yahud da əlləri ilə

gizləyərək min cür sıxıntıyla içdilər. Düzdür, mənim tərəfimdən məclisdə olanlara ümumi bir izin verilmişdi, çünki bu məclis atam və ya böyük qardaşımız kimi sayılacaq bir adamın məclisi idi.

Məclisə müəllih [salxım söyüd] gətirdilər. Təbii, yoxsa süni olduğunu bilə bilmədiyim saçlarının arasına kimsanı[1] uzununa incə-incə kəsib qoymuşdular. Gözəl görünürdü.

Bu məclisdə mənim önümə qaz kababı qoydular. Quş parçalamadığım və doğramadığım üçün əlimi vurmadım. Bədiüzzaman Mirzə «Niçin buyurmursunuz» dedi. Mən də «Doğramaqdan acizəm» dedim. Bədiüzzaman Mirzə dərhal mənim önümdəki qazı alıb parçalayıb doğrayaraq təkrar önümə qoydu. Belə **(191 a)** işlərdə Bədiüzzaman Mirzə misilsiz bir adamdı. Məclisin Axırda mənə dəgərli daşlarla bəzənmiş kəmərli bir xəncər, bir kürk və cins bir at verdi.

## BABUR HERATI GƏZİR

Heratda qaldığım iyirmi gün ərzində hər gün ata minib görmədiyim yerləri gəzirdim. Bu gəzintilərdə bələdçiimiz Yusif Əli Göyəldaş idı. Hər seyr yerinə gələndə o, başqa bir yemək ikram edirdi.

Bu iyirmi gün içində məşhur seyr yerlərindən Sultan Hüseyn Mirzənin xanəgahından başqa görmədiyim yer bəlkə də qalmamışdır. Qazürgah, Əlişir bəyin [Nəvai] bağı, kağız dəyirmanı, Təxti-Asitanə, Püli-Gah, Kəhdistan, Baği-Nəzərgah, Nemətabad, Qazürgah xiyabanı, Sultan Əhməd Mirzənin sərdabəsi, Təxti-Səfər, Təxti-Nəvai, Təxti-Bərkər, Təxti-Hacı bəy, Şeyx Bahaəddin Ömər, Şeyx İzzəddin və Mövlana Əbdürrəhman Caminin məzar və məqbərələri, Namazgahi-Muxtar, Hövzi-Mahiyan, Saqi-Salman, əvvəlki adı Əbülvəlid olan Billuri, İmam-Fəxr, Baği-Xiyaban, Mirzənin mədrəsələri və məqbərələri, Gövhərşad bəyimin mədrəsə, məqbər və məscid camisi, Baği-Zağan, Baği-Nev, Baği-Zübeydə, Sultan Əbu Səid Mirzənin tikdirdiyi və İraq darvazasının dışında yerləşən Ağ-Saray, **(191 b)** Puran, Süffeyi-Tirəndəzan, Çərgöləng, Əmir Vahid, Püli-Malan, Xoca-Tağ, Baği-Səfid, Tarabxana, Baği-Cahanara, Köşk, Müqəvvixana, Süsənixana, Dəvazdəh, Bürc, Cahanaranın şimal tərəfindəki böyük hovuz və dörd tərəfindəki dörd imarət, qalanın ön darvazası, Darvazeyi-Məlik, Darvazeyi-İraq, Darvazeyi-Firuzabad, Darvazeyi-Xoş, Darvazeyi-Qıpçaq, Məlik-Bazarı, çarşı, şeyxülislam mədrəsəsi, Məliklərin məscid camisi, Baği-Səhər, Bədiüzzaman Mirzənin Cuyi-Əncir sahilindəki mədrəsəsi, Əlişir bəyin yaşadığı və Ünsiyyə dedikləri evləri, məqbərəsi və Qüdsiyyə dedikləri məscid camisi, mədrəsəsi, Xilasiyyə və İxlasiyyə dedikləri xanəgahı, hamam, Səfaiyyə və Şəfaiyyə dedikləri darüşşəfası - bunların hamısını bu qısa zaman içində gəzdim.

[1] *Kimsan:* süsləmədə istifadə olunan yarpaq, buta.

Sultan Əhməd Mirzənin qızı Məsumə Sultan bəyimi anası Həbibə Sultan bəyim bu fətrətlərdən bir az öncə özü ilə birlikdə Xorasana gətirmiş imiş, Bir gün mən əkəmi görməyə gedəndə anası ilə gəlib məni gördü. Onu görəndə məndə ona qarşı böyük bir arzu oyandı. Gizlicə adamlar göndərib əkəm və yengəmlə -Payəndə Sultan bəyimə **(192 a)** əkə, Həbibə Sultan bəyimə yengə deyirdim- danışaraq yengəmin qızını yanına alıb mənim arxamdan Kabilə gəlməsini qərarlaşdırdıq.

Məhəmməd Burunduq bəy ilə Zünnun bəy Arğun mənim burada qışlamam üçün çox qeyrət edirdilər. Lakin qışlamaq üçün bir yer göstərmədikləri kimi, bunun üçün gərəkli olan şeyləri da təmin etmirdilər.

Qış gəldi və aradakı dağlara qar yağdı. Kabil tərəfindən da nigarançılığımız hələ çox idi. Bunlarsa nə qışı keçirə biləcək bir yer verir, nə də qışlamağa uyğun bir yer göstərirdilər.

## BABURUN KABİLƏ DÖNMƏK ÜÇÜN HERATDAN AYRILMASI

Axırda məcbur olduq, səbəbini açıqca da söyləyə bilmədik və qışlamaq bəhanəsi ilə şaban ayının yeddisində (=23 dekabr 1506) Heratdan çıxıb Badğis civarına gedərək endiyimiz hər yerdə vilayətlərə vergi və iş-güc üçün gedənlərin gəlib bizə qoşulmalarını gözləyərək bir-iki günlükləngimə və gecikmə ilə köç edirdik. O qədər yavaş getdik ki, Ləngəri-Mir Qiyasdan iki-üç mənzil keçdikdən sonra, nəhayət, ramazan ayı göründü.

Vilayətlərə iş-güc üçün gedən igidlərin bəziləri gəlib bizə qoşuldular; bəziləri da iyirmi gün və ya bir ay sonra biz Kabildə ikən gəldilər. Bəziləri də orada qalıb mirzələrin xidmətinə girdi. Bunlardan biri də Şeydim Əli Dərbandı və orada qalıb Bədiüzzaman Mirzənin xidmətinə girdi. Xosrov şahın adamlarından heç kimə onun qədər etibar etmirdım. Cahangir Mirzə Qəznəni buraxıb çıxanda Qəznənin idarəsi Seydimə verilmişdi. O da qaynı Dost **(192 b)** Əngü Şeyxi Qəznədə qoyub özü orduya gəlmişdi.

Həqiqətən, Xosrov şahın adamları arasında bu ikisindən -Şeydim Əli Dərban və Mühib Əli Qurçu- daha yaxşı adam yoxdu. Şeydim əxlaqı və davranışları yaxşı bir adamdı. Cəsarətlə qılınc çalırdı. Evində də məclis və söhbəti əskik deyildi. Olduqca cömərd idi. Çox idarəli və ölçülü bir adamdı. Çox zərif, davranışları və söhbəti xoş, təbiəti gözəl və zarafatı sevən bir adamdı. Qüsuru fisqə və gənc uşaqlara fövqəladə düşkün olmasıydı. Məzhəbində də doğru deyilmiş. Bir az fitnəkar təbiətə sahibdi. Bəziləri onun bu nifaqçılığını zarafatcıllığına bağlayırdılar, lakin bu iddia əsassız deyilmiş. Heratın Şeybani tərəfindən zəbt edilməsindən sonra Bədiüzzaman Mirzə Şah [Şüca] bəyin yanına gələndə Mirzə ilə Şah bəy arasına nifaq salacaq sözlər söylədiyi üçün Mirzə onu öldürdərək Hərmənd çayına atdırdı. Mühib Əlinin

hekayəsindən bu vəqayenin axırında bəhs ediləcəkdir.

Ləngəri-Mir Qiyasdan keçib Qarcistanın kənar kəndləri üzərindən Çaxçərana gəldik. Ləngərdən keçib Qarcistana gələndə hər tərəf qar idi, irəlilədikcə də qar daha da çoxalırdı. Çaxçəran Zünnun bəyə [Arğun] aid idi və orada onun Mirəkcan İrdi adlı bir adamı olurdu. Zünnun bəyin ərzağını tam qiymətlə satın aldıq.

Çaxçərandan iki-üç mənzil daha gedincə qar fövqəladə çoxaldı, üzəngidən də yuxarıya **(193 a)** çıxdı və çox yerdə atın ayağı yerə dəymədi. Qar durmadan yağırdı. Çıraqdan keçdikdən sonra da qar çox idi. Yol da bizə tanış deyildi. Ləngəri-Mir Qiyas civarında Kabilə hansı yoldan gedəcəyimiz haqqında danışıb məsləhətləşdik. Mən və olanların çoxu da «Qışdır və dağ yolu təhlükəlidir; Qəndəhar yolu bir az uzaq olsa da, təhlükəsizdir « fikrində idik. Lakin Qasım bəy «O yol uzaqdır, bu yoldan gedək» deyə çox böyük təcrübəsizlik göstərdi və bu yoldan getdik.

Peşailərdən Pir Sultan adlı biri bələdçimiz idi. İxtiyarlığındanmı, təlaşındanmı, yaxud qarın çoxluğundanmı, yolu itirdi və götürəmmədi. Qasım bəyin israrıyla bu yoldan getmiş olduğumuz üçün Qasım bəy də bunu namus işi edib özü və oğulları qarı təpir, yol açaraq irəlidə gedirdilər.

Bir gün qar fövqəladə çoxaldı. Yol da bilinmirdi. Bir neçə dəfə qeyrət etdik, lakin yürüyə bilmədik. Bir çarə tapammadan, təkrar dönüb ağaclı bir yerə endik. Yetmiş-səksən yaxşı igidə izimizi təqib edərək geri dönüb dərənin aşağısında qışlamaqda olan həzarələrdən birini alıb bələdçilik etmək üzrə buraya gətirməyi tapşırdıq. Gedənlər gələnə qədər üç-dörd gün burada qaldıq. Gedənlər də yaxşı bir bələdçi gətirə bilmədilər. **(193 b)**

Təvəkkül edib Sultan adlı peşaini önümüzə qatıb gediləcək yönü tapa bilməyərək geri döndüyümüz eyni yola təkrar girdik. O bir neçə gün ərzində fövqəladə iztirab və çətinlik çəkdik. Həyatım boyunca o qədər çətinlik az çəkmişəm. Bu mətlə o zaman söyləndi:

*Çərxin mən görməyən cövrü cəfası qaldımı?*
*Xəstə könlüm çəkməyən dərdü bəlası qaldımı?*

Bir həftəyə yaxın qarı təpərək yürüdük, gündə bir və bir yarım şeridən artıq gedə bilmədik. Qarı təpən adamlar mən, on-on beş içki, Qasım bəy, oğulları Tanrıverdi, Qənbər Əlivə bir də onun iki-üç adamıydı. Bu adamlarla birlikdə piyada yürüyərək qarı təpirdik. Hər adam yeddi-səkkiz və ya on kari irəli yürüyərək və hər addım atanda belinə və köksünə qədər bataraq qarı təpirdi. Bir neçə addım getdikdən sonra öndəki adamın dözümü qalmayıb durur və başqası önə keçirdi. Bu on-on beş və ya iyirmi adam piyada olaraq qarı təpdikdən sonra o yoldan yüksüz bir at keçə bilirdi və yüksüz at çəkilirdi. Bu yüksüz at da üzəngisinə və yəhərin arxasına qədər bata-bata on-on beş addım qədər məsafə yürüdükdən sonra haldan düşürdü. Bu atı bir kənara çəkib təkrar başqa bir yüksüz at qabağa sürülürdü.

Bu şəkildə biz on-on beş və ya iyirmi **(l94 a)** adam qarı təpdik və eyni adamların atları da irəli çəkildi. Digər bütün yaxşı igidlər və bəy adı verilənlər atlarından belə enməyərək təpilmiş hazır yola girib başlan aşağıya əyilmiş halda gəlirdilər. Başqasına təklif edəcək və zorlayacaq bir zaman deyildi. Himməti və cürəti olan hər kəs belə işləri özü istəyərək görür. Bu şəkildə qarı təpib yol açaraq endiyimiz yerdən üç-dörd gündə Zirrin keçidinin dibinə, Həval-Quti deyilən mağaraya gəldik. O gün şiddətli bir boran oldu. Hər kəs ölüm qorxusu içindəydi. O tərəfin əhalisi dağdakı mağara və yarıqlara həval deyir. Bu mağaraya gələndə boran fövqəladə qüvvətliydi. Mağaranın önünə endik. Qar çox, yol isə dardı, təpilmiş yoldan atlar zəhmətlə yürüyürdü. Günlər çox qısa olduğu üçün öndəki adamlar aydınlıqkən mağaranın önünə gəldilər, qalanlar axşam və yatsıya qədər gəlməkdə davam etdilər. Sonra hər kəs olduğu yerə endi. Bir çoxları sabaha qədər at üstündə qaldı.

Mağara bir az dar kimi göründü. Mən mağaranın önündə kürəklə qarı kürüyüb özümə dayanacaq bir yer düzəltdim. Qarı köksümə qədər qazdım; yenə də **(194 b)** torpağa çatmadım. Küləyə qarşı bir az daldalanacaq bir yer kimi oldu və orada oturdum. Mağaraya getməmi söylədilər, ancaq getmədim. «Bütün xalq qarda və borandaykən mən isti yerdə və istirahətdə, bütün xalq burada iztirab və zorluqda ikən mən orada uyğuda və rifahda olsam, bu, insanlıqdan uzaq bir hərəkət və xalqa qarşı laqeydlik olar, nə qədər iztirab və zorluq olacaqsa mən də görməli, xalq necə dözürsə, mən də dözməliyəm» deyə düşündüm. Farsca bir məsəl vardır: «Mərg ba yaran sur əst» *(dostlarla birlikdə ölüm toy-bayramdır*).

Beləcə boranda qazıb düzəltdiyim çuxurda oturdum. Yatsıya qədər qar elə bir boranla yağdı ki, gəl görəsən. Mən büzülüb oturmuşdum, arxama, başıma və qulaqlarımın üstünə dörd barmaq qalınlığında qar yığılmışdı. O gecə qulaqlarım dondu. Yatsı vaxtında mağaranı ciddi tədqiq edənlər «Çox genişdir, hər kəsə yer var» deyə bağırışdılar. Bunu eşidincə üzərimdəki qarı silkib mağaraya gəldim. Mağaranın ətrafındakı bəyləri də çağırdım. Qırxəlli adamı rahatca barındıracaq qədər yer vardı. Azuqə, yəxni, qovurma və başqa kimin nəyi varsa gətirdilər. Belə bir soyuqda və boranda çox isti, təhlükəsiz və rahat bir yerə qovuşduq.

Ertəsi gün qar və boran durdu. Sabah erkəndən qalxıb eyni biçimdə qarı təpərək yol açıb **(195 a)** təpənin üstünə çıxdıq. Yol dağı dolana-dolana yuxarıya doğru çıxırmış, keçidinə də Kötəli-Zərrin deyirlərmiş. Biz yuxarı çıxmadan dərə yoluyla endik. Təpəsindən dibinə varıncaya qədər vaxt gec oldu. Dərənin ağzında düşərgə saldıq.

O gecə fövqəladə soyuqdu və gecəni çox çətinlik və sıxıntıyla keçirdik. Bir çox adam soyuqdan əlini-ayağını itirdi. Kibəkin ayağı, Süyündük Türkmənin əli və bir də Əxinin ayağı o gecə soyuqdan dondu.

Ertəsi gün dərədən aşağıya doğru yürüdük. Yolun bu olmadığını bildi-

yimiz və gördüyümüz halda təvəkkül edib dərədən aşağıya yürüdük. Çox uçurumlu və dik yerlərdən endik. Gecə, axşam vaxtında dərənin ağzına çıxdıq, ixtiyarlardan heç kim bu keçidin bu qədər çox qarlı vaxtında bir adamın oradan keçmiş olduğunu xatırlamırdı. Hətta bu mövsümdə bu keçiddən keçmək fikri belə kimsənin ağlına gəlməmişdi.

Qarın çoxluğundan çox iztirab çəksək də, qarın çoxluğu sayəsində özümüzü axırda bir mənzilə çatdıra bildik, çünki bu qədər qar olmasaydı, bu cür yolsuz, uçurumlu və dik yerlərdən kim keçə bilərdi. **(195 b)** Qar bu qədər çox olmasaydı, bəlkə də ilk keçdiyimiz uçurumda əsgərın, at və dəvənin hamısı qalardı.

Hər niku bədi ki, dər şomar əst,
Tu dər nigari-səlahi-kar əst.
*Gələn hər yaxşılıq və pislik,*
*Diqqət etdikcə, işin xeyrinədir.*

Yekə çayırına gəlib enəndə artıq yatsı vaxtı olmuşdu. Yekə çayırının xalqı biz gəlib enər-inməz bundan xəbərdar oldular. İsti evlər, kök qoyunlar, atlar üçün ot və quru ot bol, yaxmaq üçün odun və təzək çox və dolu idi. Belə bir soyuq və qardan qurtularaq bir kənd və isti evlər tapmaq, belə çətinlikdən və bəladan qurtulub bu qədər bol çörək və kök qoyunlar tapmaq elə bir hüzurdur ki, bunu ancaq bu çətinlikləri görənlər bilər, bu elə bir rahatlıqdır ki, bunu ancaq belə bəlaları yaşayanlar bilər.

Qəlbimiz məmnun və könlümüz rahat olaraq bir gün Yekə çayırında qaldıqdan sonra, oradan qalxıb iki ağac yol gəlib təkrar endik. Ertəsi gün ramazan bayramı oldu. Sonra da Bamyan üzərindən yürüyüb Şibertu keçidindən keçərək Cəngliyə varmadan endik.

## TÜRKMƏN HƏZARƏSİ ÜSTÜNƏ AXIN

Türkmən həzarəsi köç və mallarıyla birlikdə yolumuzun üzərində qışlamışmış. Bizdən heç xəbərləri yoxdu. Ertəsi gün qalxıb gələndə bunların ağıl və komalarının arasına endik. İki-üç ağıl yağmalandı, digərləri də ev və mallarını buraxaraq çoluq-çocuqlarını **(l96 a)** alıb dağa çəkildilər.

İləridən xəbər gəldi ki, bir neçə həzarə əsgərin önünü tutub ox ataraq adamları keçməyə buraxmır. Bu xəbəri alınca dərhal oraya getdim. Baxdım ki, ora bir boğaz da deyil, bir neçə həzarə bir çıxıntıdan ox atır. Hər şey oraya yığılıb qalmışdı. Qoca-qoca igidlər orada:

Şeir:[1]

Yağı qaraltısın görübdürlər,
Dəngi-heyran baxıb durubdurlar.
Mən yetib tez ol sarı yürüdüm,

[1] Türkcə nəşrdə bu şeir nəsrlə verilmişdir.

Yürü-yürü deb irəli yürüdüm.
Qərəzim eli tez qılmaq idi,
Yağı bilə sitez qılmaq idi.
Tez yetib elə, çəkdim özümü,
Heç kim eşitmədi sözümü.
Yox idi nə zireh, nə çul, nə yaraq,
Məndə vardı min ox və sadaq.
Durdum ərsə, tamam el durdu,
Yağı sanki buları öldürdü.
Sən nökəri qılırsan onun üçün,
Yarağı bir mahalda canın üçün,
Yox ki, nökər durub bəyi yürüsün,
Nökəri asudə, bəyi çürüsün.
Nökər kim bu tövrdür, nə asığ,[1]
Nə işinə yarar, nə aşa qatıq.
Axır at saldım, irəli yürüdüm,
Sürübən dağa, yuxarı yürüdüm. **(l96 b)**
Məni görüb yürüdü el dəxi,
Qaldı eldən geriyə qorxağı.
Yetişibən tez dağa dırmaşdıq,
Oxuna baxmadan yürüyüb aşdıq.
Gahi atdan düşüb, gahi atlı,
Yürüdük irəliyə cürətli,
Yağı həm dağdan ox atır idi,
Zoru görcək qoyub qaçır idi.
Dağa çıxdıq həzarəni qovlab,
Qırda, dərədə geyik kimi ovlab,
Önə çıxanı geyik kimi oxladıq,
Talayıb mal-qoyunu payladıq.
Qırıban türkmən həzarəsini,
Bağladıq bənd kişi-qarasını,
Kişilərini dəstigir etdik,
Əhli, övladını əsir etdik.

Həzarənin malından mən də xeyli qoyun topladım, onları Yarək Tağayiyə tapşırıb özüm irəli keçdim. Qırlardan və dərələrdən yürüyərək həzarələrin at və qoyunlarını sürüb Teymur bəy Ləngərinə endik.

Türkmən həzarəsinin asilərindən on-dörd on beş adam və quldurbaşıların bir neçəsi ələ keçmişdi. Endiyimiz yurdda bütün quldur və asilərə ibrət olsun deyə bunların dürlü-dürlü əzab və işkəncə ilə öldürülmələrini düşünmüşdüm. Lakin yolda Qasım bəyə **(197 a)** rast gəlmişlər, o da yersiz mərhə-

---

[1] Nə asığ = nə xeyri.

mət göstərib onları sərbəst buraxmışdı.

Zəmini-şorü sünbül bər nəyərəd,
Dərü töxmi əməl zaye məgərdan,
Niküyi ba bədan kərdən çün an əst,
Ki bənd kərdən bəcai nikmərdan.[1]

*Şoran torpaq sümbül yetirməz,*
*İşini və toxumunu bu topraqda zay etmə.*
*Pis adamlara yaxşılıq etmək,*
*Yaxşılıq edənlərə pislik etmək kimidir.*

Mərhəmət göstərilərək əsirlər də sərbəst buraxıldı.

## KABİLDƏ ORTAYA ÇIXAN PROBLEM

Biz türkmən həzarəsini yağmalayan zaman Məhəmməd Hüseyn Mirzə Duğlat ilə Sultan Səncər Barlasın Kabildə qalan bütün moğollan öz tərəflərinə çəkərək Mirzə xanı [Baburun əmisi oğlu Sultan Veys Mirzə] padşah elan edib Kabili mühasirəyə aldıqlarını eşitdik. Xalq arasına isə belə bir şayiə yaymışdılar: Bədiüzzaman ilə Müzəffər Mirzə padşahı həbs edib Heratın indi Ala-Kurqan deyə məşhur olan İxtiyarəddin qalasına salmışlar.

Kabil kurqanında komandanlardan Molla Baba Pəşağari, Xəlifə [Nizaməddin Əli Barlas], Mühib Əli Qurçu, Əhməd Yusif və Əhməd Qasım [Kuhbər] vardı. Bunlar yaxşı hərəkət edərək kurqanı qapalı və gücləndirilmiş bir hala gətirib qorumağı bacarmışlar.

Teymur bəy Ləngərindən Qasım bəyin adamı Məhəmməd Əndicani adlı bir bayraqdar vasitəsilə Kabildəki bəylərə bu yerə gəldiyimizi yazıb göndərdik. Bu şəkildə qərar verilmişdi: «Biz Gur-Bənd boğazından çıxıb onların üstünə hücum edəcəyik. İşarə olaraq Menar dağından keçincə böyük bir tonqal qalayacağıq. Siz də gəldiyimizdən xəbərdar olduğunuzu bildirmək üçün bugün xəzinə olan əski köşkün üzərində böyük tonqal yaxın. **(197 b)** Biz bu tərəfdən yetişincə, siz də içəridən çıxıb əlinizdən gələn işi etməkdə qüsur göstərməyin». Bu sözlər yazdırıldı və Məhəmməd Əndicani göndərildi.

Ertəsi gün Ləngərdən hərəkət edilib Üşdür-Şəhər qarşısına endik. Oradan da erkəndən hərəkətə keçib günortaya doğru Gur-Bənd boğazından çıxaraq körpü başına gəldik. Atları suvarıb dinclik verdikdən sonra günorta vaxtı körpü başından hərəkətə keçdik.

Tutkavula qədər qar yox idi, amma Tutkavuldan etibarən qar artmaqda idi. Zəmmə-Yahşı ilə Menar arasında o qədər soyuq oldu ki, həyatımda belə bir soğuğu az görmüşəm.

[1] Sədi Şirazidən.

Әhmәd Yasavul ilә Qara Әhmәd Yurdçu «Verilmiş olan qәrara uyğun olaraq gәldik, xәbәriniz olsun vә cәsur olun» xәbәriylә Kabildәki bәylәrә göndәrildi. Menar dağından aşaraq dağın әtәyinә endik.

Soyuqdan taqәtsiz qalıb tonqallar yaxaraq isindik. Düzü, tonqal qalayacaq zaman deyildi, lakin soyuğun dәhşәtindәn taqәtimiz qalmadığı üçün od yaxdıq. Dan üzünә doğru Menar dağının әtәyindәn hәrәkәt etdik.

Menar ilә Kabil arasında qar atların dizinә qәdәr yüksәlirdi, hava çox sәrtlәşmişdi vә yoldan çıxan adam böyük çәtinliklә yürüyürdu. Bu yolda bir-birimizin arxasından irәlilәdik vә bu üzdәn Kabilә ancaq fәrz vaxtı **(198 a)** çata bildik.

Bibi-Mahruya gәlmәdәn bir az öncә, әrkdәn böyük bir tonqal yüksәldi vә onların da bizim gәldiyimizi öyrәndiklәrini anladıq.

## BABURUN KABİLDӘKİ ÜSYANÇILARA HÜCUM ETMӘSİ

Seyid-Qasım körpüsünә yaxınlaşınca Şirim Tağayi ilә sağ qol adamları Molla Baba körpüsü tәrәfinә göndәrildi. Sol qol vә mәrkәz adamları da Baba-Luli yolundan irәlilәdi.

O zamanlar Xәlifә bağının yerindә [Baburun әmisi] Uluğ bәyin tikdirmiş olduğu lәngәr biçimindә kiçicik bir bağ vardı, artıq ağacları qalmamışdı, lakin divarı dururdu. Mirzә xan oraya yerlәşmişdi. Mәhәmmәd Hüseyn [Duğlat] Mirzә isә Uluğ bәy Mirzәnin tikdirdiyi Baği-Behiştdәydi.

Mәn dә Molla Baba bağının yol tәrәfindәki mәzarlığa çatdım. Bu arada bizimkilәrdәn tәlәsib irәli getmiş olanlar da geri oturdulmuşlar. İrәlilәyib Mirzә xanın olduğu yerә girәnlәr dörd nәfәr idi: Seyid Qasım eşik-ağa, Qәnbәr Әli Qasım bәy, Şirqulu Qaravul Moğol vә şirqulu camaatindәn olan Sultan Әhmәd Moğol.

Bu dörd adam gedәr-getmәz, heç çәkinmәdәn dәrhal Mirzә xanın olduğu yerә girmişlәr. Gurultu qopmuş vә Mirzә xan ata minәrәk qaçıb getmiş. O günlәrdә Әbülhәsәn Qurbәyinin kiçık qardaşı Mәhәmmәd Hüseyn [Qurçu] da Mirzә xanın **(198 b)** xidmәtinә girmişdi vә bu dörd adamdan Şirquluya qılıncla vurub atdan salır, başını kәsmәk istәrkәn Şirqulu qurtulur. Bu dörd adam qılınc vә ox zәrbәsi yeyәrәk yaralı olduqları halda bәhs etdiyim yerdә bizә gәlib qoşuldular.

Bu dar yolda atlılar tıxanıb qaldılar. Nә irәli yürüyә, nә dә geriyә gedә bildilәr. Mәn dә yaxınımdakı igidlәrә «Atlardan enib saldırın» dedim. Dost Nasir, Xoca Mәhәmmәd Әli Kitabdar, Baba Şirzad, Şah Mahmud vә digәr bir neçә igid atlarından enib piyada olaraq ox atdılar. Düşmәn qaçdı.

Kurqandakıları müşahidә edirdik. Savaş vaxtında yetişә bilmәdilәr. Düşmәni yerindәn atdıqdan sonra ancaq bir-bir, iki-iki qoşaraq gәlmәyә başladılar. Mirzә xanın oturduğu çarbağa hәlә girmәmişdim ki, kurqandakı-

lardan Əhməd Yusif ilə Seyid Yusif gəldilər. Mirzə xanın oturduğu bağa onlarla birlikdə girdim. Gördüm ki, Mirzə xan yoxdur, qaçıb getmişdir və dərhal geri qayıtdım.

Əhməd Yusif mənim arxamdaydı. Kabildə ikən cəsurluğuna görə etibar görüb kütvallıq[1] rütbəsini alaraq orada qoyduğum Dost Sərpuli Piyadə əlində yalın qılıncla birdən çarbağın qapısından girdi. Mənə doğru gəlirdi. Mən zireh geymiş, lakin kəmər bağlamamış, **(199 a)** dəbilqə də qoymamışdım. Bir neçə dəfə «Hey, Dost, hey, Dost!» deyə qışqırdım. Əhməd Yusif də qışqırdı. Məni soyuqdan və qardan yanmış olduğum üçünmü tanımadı, yoxsa müharibənin təlaşındanmı, bilmirəm, heç çəkinmədən çılpaq qoluma bir qılınc endirdi. Allahın inayəti sayəsində qıl qədər təsir etmədi.

Əgər tiği-aləm becünbəd zi ca,
Nəbürrəd rəgi tu nəxahəd xuda
*Qılınc dünyanı yerindən oynada bilsə də,*
*Allahın izni olmadan, bir damar belə kəsməz.*

Mən bu duanı oxumuşdum, uca Allahın bu zərəri dəf və gələn bəlanı rəf etməsi onun təsiriydi. O dua budur[2]:

*Ey Allah, sən mənim rəbbimsən. Səndən başqa ilah yoxdur. Sənə təvəkkül etdim. Sən böyük ərşin rəbbisən. Allah nə istsə olar və nə istəməsə, olmaz; heç bir qüdrət və qüvvət mövcud deyildir və bunların hamısı böyük və uca Allahın əlindədir. Bil ki, Allah hər şeyə qadirdir, Allah hər şeyi elmi ilə əhatə etmiş və hər şeyi ədədi ilə saymışdır. Ey Allah, mən özümün pisliyimdən, özgələrin pisliyindən və bütün heyvanların pisliyindən sənə sığınıram. Sən böyük ərşın rəbbisən.*

Oradan çıxıb Məhəmməd Hüseyn [Duğlat] Mirzənin oturduğu Baği-Behiştə gəldim. Məhəmməd Hüseyn Mirzə oradan qaçıb gizlənmişdi. Məhəmməd Hüseyn Mirzənin oturduğu bağ divarının yıxığında oxlu-yaylı yeddi-səkkiz adam dururdu, atımı onların üstünə sürdüm. **(199 b)** Müqavimət göstərmədən qaçıb getdilər. Arxalarından yetişərək birinə qılıncla vurdum. Elə yuvarlandı ki, başının qopduğunu zənn etdim. Keçdim. Sən demə, bu qılıncla vurduğum adam Mirzə xanın südqardaşı Tülək Göyəldaş imış və qılınc çiyninə dəyibmiş.

Məhəmməd Hüseyn Mirzənin oturduğu evlərin qapısına gələndə dam üstündən bir moğol çox yaxın bir məsafədən üstümə doğru yay çəkdi. Bu mənim nökərlərimdən idi və mən onu tanıyırdım. Sağdan-soldan «Hey, hey, padşahdır» deyə qışqırdılar. Oxu çıxarıb qaçdı. Artıq ox atmağın zamanı keçmişdi. Mirzəsi və komandanları qaçmış və ya ələ keçirilmişdi, kimin üçün ox atacaqdı.

Biz orada ikən Sultan Səncər Barlası tutub boynu bağlı olaraq gətirdi-

---

[1] *Kütval:* hərbi bir rütbə.
[2] Bu iki sətir və altdakı duanın mətni özbəkcə nəşrdə yoxdur.

lər. Mən ona etibar edib Nigənxar tümənini ehsan etmişdim. O da bu fitnədə onlarla ortaqdı. Təlaşla «Hey, mənim nə günahım var» deyə qışqırırdı. «Bu camaatla əlbir olub onu hazırlayanların böyüklərindən biri sənsən, bundan daha böyük günah olarmı?» deyə cavab verdim. Amma o, xan dayımın anası Şah bəyimin bacısı oğlu olduğu üçün «Belə şərəfsizcə gəzdirməyin, ölüm yoxdur» dedim.

Kurqandakı bəylərdən biri olan Əhməd Qasım Kuhbəri **(200 a)** bir dəstə igidlə birlikdə Mirzə xanın arxasınca göndərdim.

Bu Baği-Behiştin yanında Şah bəyimlə [Baburun xalası Mehrinigar] xanım çadırlar qurub oturmuşdular. Bağçadan çıxıb Şah bəyim ilə xanımı görməyə getdim. Şəhər əhalisi və alt təbəqə hücum etmiş, küncdə-bucaqda adamları yaxalayıb mallarını yağmalamaqla məşğul idilər. Çevrəyə adamlar yerləşdirilərək bütün bu adamlar qovulub çıxarıldı.

Şah bəyimlə xanım eyni evdə otururdu. Əvvəlki kimi, atdan enərək piyada gedib ədəb və təzimlə görüşdüm. Şah bəyim ilə xanım fövqəladə sıxıntılı, mütəəssir, başları əyik və xəcil bir vəziyyətdə idilər. Nə məqbul bir üzrxahlıq edə bilir, nə də müşfiqanə bir xatir sormaq yolunu seçirdilər. Onların belə bir güruhla əlbir olmalarını düşünmək istəmirdim. Lakin o birilər də bəyimlə xanımın sözündən çıxacaq adamlar deyildilər. Mirzə xan Şah bəyimin doğma nəvəsi idi və gecə-gündüz onun yanında olurdu. Onların fikrinə qatılmaq istəməsəydi, Mirzə xanı buraxmayıb özlərinin yanında tutardılar.

Neçə dəfə taleyin uğursuzluğu və qəddarlığı üzündən taxt və mülkdən, əsgər və adamlardan ayırılıb onların **(200 b)** yanına getmişdim. Anam da onlara getmişdi. Lakin heç bir etibar və şəfqət görməmişdik. Mənim kiçık qardaşım Mirzə xanın və anası Sultan Nigar xanımın zəngin və abad vilayətləri vardı. Mən və anam isə vilayət bir tərəfə qalsın, bir kənd və bir neçə quş sahibi belə ola bilməmişdik. Anam Yunus xanın qızı və mən də onun nəvəsi deyildimmi? O ailədən mənim yanıma gələn hər kəsə əlimdən gəldiyi qədər qardaşlıq və insanlıq vəzifələrimi yerinə yetirmişdim. Nicə ki Şah bəyim gələndə Kabilin ən yaxşı yerlərindən olan Pamqanı ona verdim, oğulluqda və xidmətdə qüsur göstərmədim.

Kaşğar xanı Sultan Səid xan beş-altı piyada və çılpaq adamıyla gəldi; ona da kiçik qardaşlarım kimi baxıb Ləmqan tümənlərindən Məndravər tümənini verdim.

Şah İsmayıl Mərvdə Şeybani xanı ələ keçirəndə mən Qunduza keçmişdim. O günlərdə Əndican vilayəti mənim tərəfimi tutub bəziləri valilərini qovaraq, bir qismi də olduqları yerlərə qapanaraq mənə adam göndərdilər. Mən isə bütün adamlarımı, köməkçi hissələrlə birlikdə, Sultan Səid xanın əmrinə verib əsl vətənim olan Əndican vilayətini ona bağışladım və onu oraya xan edib göndərdim.

Ondan sonra da bugünə qədər o ailədən gələn hər kəslə öz doğma qar-

daşlarım kimi rəftar etdim. Necə ki [Baburun dayısı Sultan Əhməd xanın oğulları] Çin Teymur Sultan, İsən Teymur Sultan, Toxta Buğa **(20l a)** Sultan və Baba Sultan bugün də mənim yanımdadırlar. Hamısına də öz doğma qardaşlarımdan daha yaxşı davranıb etibar və şəfqət göstərirəm.

Bunları yazmaqdan məqsədim şikayət deyil, gerçəkləri söyləməkdir, bu söylənənlərdən məqsəd özümü tərif deyil, gerçəkləşmiş olanları bəyan etməkdir. Burada hər sözün doğrusunu və hər işi olduğu kimi yazmağı gərəkli saydığım üçün, şübhəsiz ki, ata və böyük qardaşdan yaxşı və pis nə eşidilib görülmüşsə onları söylədim, qohumlardan və yadlardan da nə qüsur və ya məziyyət görülmüşsə, onları yazdım. Oxuyan məzur görsün, eşidənlər də qınamasın.

Oradan qalxıb Mirzə xanın oturduğu çarbağa gələrək, vilayətlərə, aymaq və qəbilələrə zəfərnamələr göndərdim. Ondan sonra da atıma minərək ərkə gəldim.

## ÜSYANÇILARIN YAXALANMASI

Məhəmməd Hüseyn Mirzə qorxusundan qaçaraq xanımın sandıq otağına girmiş və yataq əşyaları arasında gizlənmişdi. Bu evləri axtamağı və Məhəmməd Hüseyn Mirzəni tutub gətirməyi kurqandakılardan Mirim Divan ilə digər bəzilərinə tapşırdım. Bunlar da xanımın qapısına gedib bir az qaba və tərbiyəsiz **(201 b)** sözlər söyləmişlər.

Axırda Məhəmməd Hüseyn Mirzəni xanımın sandıq otağında taparaq ərkə, mənim hüzuruma gətirdilər. Mən əvvəlki kimi hörmət göstərib yerimdən qalxdım və o qədər də sərt qarşılamadım. Bu cür nifrət ediləcək və utanılacaq bir hərəkətə girişən, bu cür bir fitnə və fəsada qarışan Məhəmməd Hüseyn Mirzəni parçalatdırsam yeriydi, dürlü-dürlü əzab və işkəncə ilə öldürülməyə dəyərdi. Lakin arada qohumluq olduğu və doğma xalam Xub Nigar xanımın uşaqları olduğu üçün bu qohumluq haqqını xatırlayaraq Məhəmməd Hüseyn Mirzəni sərbəst buraxdım, Xorasan tərəfinə getməsinə izin verdim.

Bu mürüvvətsiz və nankor adam canını bağışlayaraq etdiyim yaxşılığı tamamən unutmuş, Şeybani xanın yanında mənim haqqımda iftiralarda və şikayətlərdə bulunmuşdu. Qısa bir müddət sonra da şəxsən Şeybani xan onu öldürərək cəzasını verdi.

Tu bəd konəndən xudra bərgüzar sepor,
Ki, ruzigər tura çakər əst kinə güzar.
*Sana pislik edəni qədərə tapşır,*
*Çünki o sənin intiqam alan nökərindir.*

Mirzə xanın arxasından göndərilən Qasım Kuhbər və digər bir neçə igid Qarğabulaq təpələrində Mirzə xana çatırlar. Qaçıb qurtula bilmədiyi ki-

mi, əlini qaldıracaq gücü və cürəti də yoxdu, ələ keçirib gətirdilər. **(202 a)**

Mən əski divanxananın şimal tərəfindəki eyvanda otururdum: «Gəl görüşək» dedim. Təlaşındanmı-nədir, yükünərək gəlincəyə qədər iki dəfə yıxıldı. Görüşdükdən sonra onu yanıma oturdaraq təsəlli etdim. Şərbət gətirdilər. Mirzə xanın yersiz qorxusunu rəf etmək üçün şərbəti əvvəlcə özüm içdim, sonra da ona verdim.

Mirzə xanın tərəfini tutmuş olan sipahi və xalq, moğol və çağataylar qorxu və tərəddüd içərisində idilər. Tədbirli davranaraq, Mirzə xanın bir neçə gün öz böyük bacısının evində qalmasını əmr etdim. Bəhs etdiyim bu el və uluslar hələ qorxu və tərəddüd içində olduğu üçün Mirzə xanın Kabildə olmasını uyğun görməyərək bir neçə gün sonra Xorasan tərəfinə getməsinə izin verdim.

## BABUR ƏTRAFDA BİR GƏZİNTİYƏ ÇIXIR

Bunların ayrılıb getmələrinə izin verdikdən sonra Baran, Çaşdubə və Gülbahar ətəyi civarına gəzməyə getdik. Baharda Baran yaylası, Çaşdubə çölü və Gülbahar ətəyi çox gözəl olur. Yaşıllığı Kabil vilayətinin digər yerlərinə görə daha yaxşıdır.

Çeşid-çeşid lalələr açır. Bir dəfə çevrədəki lalə çeşidini saymalarını əmr etdim, otuz dörd çeşid lalə çıxdı.

Bu yerlərin təsvirində bir beyt söyləmişdim:

Səbzeyü güllər bilə cənnət olar Kabil bahar,
Xassə bu mövsümdə Varan yazısıyü Gülbahar.

Gəzməyə gəldiyimiz zaman da bu qəzəli yazdım:

Mənim könlüm ki gülün qönçəsi tək **(202 b)** təhbətəh[1] qandır,
Əgər yüz min bahar olsa, açılmağı naimkandır.

Gerçəkdən də bahar zamanı gəzmək, quş uçurmaq və quş ovlamaq üçün -Kabil və Qəznə vilayətinin tərifində qısaca söylənib yazıldığı kimi-buralar qədər yaxşı yer az tapılar.

## NASİR MİRZƏNİN BƏDƏXŞANDAN SÜRÜLÜB ÇIXARILMASI

Bu il [Baburun ən kiçık qardaşı] Nasir Mirzə və adamlarının davranışları və hərəkətləri üzündən Bədəxşan bəylərindən Məhəmməd Qurçu, Mübarək şah, Zübeyr və Cahangir bəylər özlərini təhqir olunmuş hiss etdilər, hətta ona düşmən oldular. Hamısı birləşib əsgər sövq edərək, Kökçə çayının Yəftəl və Raq tərəfindəki ovasında atlıları və yayaları toplayıb nizamlayaraq, təpələrin üzərindən Hamçanın yaxınlarına gəldilər.

---

[1] Təhbətəh – üst-üstə, qat-qat, lay-lay

Nasir Mirzə və yanındakı təcrübəsiz igidlərsə yaxşı düşünüb araşdırmadan bunlarla müharibə etmək üçün təpələrə gəlib vuruşurlar. Bu əngəbəli ərazidə izdihamlı piyadaların üstünə bir-iki dəfə atla hücum etsələr də, bərikilər qaçmayıb onları geri oturdur və lap axırda bunlar da heç bir şey edə bilmədən qaçırlar. Bədəxşanlılar Nasir Mirzəni məğlub edib ona bağlı olanların və yanındakı hər kəsin mallarını yağmalayırlar.

Nasir Mirzə də yanındakılarla birlikdə yenilmiş və yağmalanmış bir halda İşkəmiş və Narin üzərindən Kilagahiyə gəldi. Qızıl-Su sahilindən yuxarıya doğru yürümək surətiylə Ab-Dərə yoluna girərək Şibertu keçidini aşdı və yağmalanıb soyulmuş, ac və çılpaq yetmiş-səksən adamı ilə birlikdə Kabilə gəldi.

Allahın qəribə qüdrətidir ki, bundan iki-üç il əvvəl Nasir Mirzə bütün el və ulusunu köçürdüb sürərək düşmən vəziyyətində Kabildən çıxıb **(203 a)** Bədəxşana gedərək, dərə və kurqanlarını qapatmaq surətilə bəzi məqsədlər güdmüşdü. Amma indi əvvəlcə etdikləri üzündən başı əyik və xəcil, o şəkildə ayrıldığı üçün peşman və mütəəssirdi. Mən də heç bir surətdə sərt davranmadım və mehribanlıqla hal-əhval tutaraq onu sıxıntıdan qurtardım.

## KABİL - 913 (13 MAY 1507 - 2 MAY 1508)

## DOQQUZ YÜZ ON ÜÇÜNCÜ İLİN HADİSƏLƏRİ

## GİLCİLƏRİN ÜSTÜNƏ AXIN

[Əfqan əşirətlərindən] gilcilərə axın etmək məqsədilə Kabildən atlandıq. Sərdihə enəndə oradan bir ağac məsafədə olan Məst və Sihkanədə çoxlu məhmənədin [başqa bir əfqan qəbiləsi] bizdən xəbərsiz şəkildə oturduqları xəbəri gəldi. Bütün bəylər və igidlər məhmənədlərə axın edilməsinə tərəfdar idı. Amma mən dedim: «Heç rəvadırmı ki, başqa məqsədlə atlandığımız halda öz rəiyyətimizə axın edib geri qayıdaq. Bu, mümkün deyil».

Sərdihədən hərəkət edib Kəttəvaz ovasını gecənin qaranlığında keçdik. Gecə qapqaranlıq, yer də dümdüzdü, nə dağ nə təpə görünür, nə yol, nə də iz bəlli olurdu. Heç kim qılavuzluq edə bilmədi. Axırda mən qılavuzluq elədim. Bir-iki dəfə bu civara gəlmişdim. O zamandan xatırladıqlarımı yada salaraq qütb ulduzunu sağ tərəfimə alıb hərəkət etdim. Allah rast gətirdi və birbaşa Xoca İsmayıl dağlarına, gilcilərin oturduğu Qayaqtu və Ulabatu çayının yanına gəldik. Bu çaydan bir yol çıxırdı. O çaya enib özümüz bir qədər yatdıq, atlar isə **(203 b)** dincəldi, sonra dan ağararkən yenidən atlandıq.

Günəş çıxmışdı. Bu təpə və dərələrdən ovaya çıxanda gilcilərin qaraltısı və ya tüstüsü göründü. Ya məğrurluqdan, ya da gənclik atəşiylə əsgərin hamısı axına qoyuldu. Bir-iki küruh axın edib adamları və atları oxla vuraraq sürdülər. «Belə dördnala axın edən beş-altı min əsgərin dayandırılması çox çətin olacaq» deyə düşündüm. Allah rast gətirdi, əsgər yatışdı.

Bir şeriyə yaxın irəlilədikdən sonra əfqanlarm qaraltısını görərək təkrar axın etdik. Bu axında çox qoyun ələ keçirildi. Heç bir axında bu qədər çox qoyun ələ keçirilməmişdi. Malı toplayıb bir yerə endikdən sonra əfqanlar hər tərəfdən bölük-bölük gələrək ovaya enib bizi savaşa təhrik etdilər. Bəzi bəy və içkilər o bölüklərdən birinin üstünə yürüyərək hamısını ələ keçirib öldürdülər. Nasir Mirzə də digər bir bölüyə qarşı hərəkətə keçdi və hamısını doğradı. Ölən əfqanlarm başlarından bir minarə quruldu. Adı daha öncə çəkilmiş olan Dost Piyada Kütvalın ayağına bir ox dəydi və Kabilə gələndə öldü.

Xoca İsmayıldan qalxaraq Ulabatuya gəlib endik. Bəzi bəylərə və içkilərə gedib qənimətin beşdə birini diqqətlə almalarını əmr etdim. Qasım bəy ilə digər bəzilərinə hörmət edərək onların payının beşdə birini almadıq. **(204 a)** Qənimətin dəftərə keçirilən bu beşdə biri on altı min qoyun tutdu ki, bu da səksən minin beşdə biridir. Tələf olan və hörmət edilib alınmamış olanlarla birlikdə, heç şübhəsiz, yüz min qoyun vardı.

## BABURUN QATILDIĞI BİR OV

Ertəsi gün oradan qalxıb Kəttəvaz ovasında sürək ovu quruldu. Bu ovanın geyik və qulanı daima ətli və çox olur. Dairənin içərisinə çox qulan və geyik girdi. Xeyli qulan və geyik vurdular.

Ov əsnasında mən də bir qulanı təqib etdim və yaxınlaşaraq bir ox atdım. Bir ox daha atdım, lakin bu yaralar ona yerə yıxacaq dərəcədə təsir etməmiş, yalnızca bu iki yara üzündən qaçması bir az yavaşımışdı. Atımı mahmızladım. Gizlicə yaxınlaşaraq iki qulağı arasından tam ənsəsinə qılıncla vurdum. Başı kəsilib yalnız qırtlağından asılı qaldı, sıçrayıb öldü. Az qala arxa ayağı üzəngimə ilişəcəkdi. Qılıncım çox yaxşı kəsdi. Çox kök bir qulan idi. Bir qarışa yaxın yağı vardı.

Şirim Tağayi və Moğolistan qulanı görmüş olan digər bəziləri də heyrətlə «Biz Moğolistanda bu qədər kök qulan az görmüşük» dedilər.

O gün bir qulan daha vurdum. Bu ovda ələ keçən qulan və geyiklərin çoxu kök idi, lakin heç biri mənim vurduğum qulan qədər yağlı deyildi.

Bu axından dönüb Kabilə gəldik.

## ŞEYBANİ XANIN XORASANI ƏLƏ KEÇİRMƏ TƏŞƏBBÜSÜ

Keçən ilnin sonlarında Şeybani xan Xorasanı ələ keçirmək niyyətilə Səmərqənddən qoşun **(204 b)** çəkmişdi. Əndəxudu əlində tutan namussuz və nankor Şah Mansur Bəxşi Şeybani xanın yanına adamlar göndərib onun gəlməsini sürətləndirmiş və Əndəxud civarına gələndə də bu namussuz hərif «Adam göndərdim» deyə özbəklərə etimad edib bəzənərək və başına ləléklər taxaraq, peşkəş və hədiyyələrlə qarşılamağa çıxınca başıboş özbəklər hər tərəfdən hücum edərək bu alçağı, hədiyyələri və yanındakı adamları birlikdə yağmalamışlar.

Bədiüzzaman Mirzə ilə Müzəffər Mirzə, Məhəmməd Burunduq Barlas, Zünnun bəy Arğun hamısı Baba-Xaki civarında qoşunla birlikdə oturmuşdular, nə savaşmaq nə də kurqanı gücləndirmək üçün hazırlıq görməmişdilər. Heç bir işi qərarlaşdırmadan və nə edəcəklərini dəqiq olaraq bilmədən çaşqın bir vəziyyətdə otururdular.

Məhəmməd Burunduq bəy iş bilən adamdı. «Müzəffər Mirzə ilə mən Herat kurqanını gücləndirək, Bədiüzzaman Mirzə ilə Zünnun bəy də Heratın ətrafındakı və civarındakı dağlara gedib Sistandan Sultan Əli Arğunu, Qəndəhar və Zəmindavərdən Şah bəy ilə Müqimi əsgərləri ilə birlikdə özlərinə qatsınlar. Bütün həzarə və nəkdəri əsgərlərini də toplasın, hazırlıq görüb yürüsünlər. Düşmənin dağlara getməsi zor olacaq, həm də dışarıdakı əsgərin qorxusundan kurqanın üstünə də gələ bilməzlər» demiş və çox doğru söyləmişdi, ağlına çox yerində **(205 a)** bir fikir gəlmişdi.

Zünnun Arğun cəsur olmasına baxmayaraq xəsis və tamahkar, fikir və tədbirdən uzaq, gic və dəlisov bir adamdı. O zaman böyük və kiçık qardaş-

lar Heratda ortaq bir şəkildə hakim idilər və o da -daha öncə söylədiyim kimi- Bədiüzzaman Mirzənin yanında ixtiyar sahibiydi. Tamahkarlığı üzündən Məhəmməd Burunduqun şəhərdə qalmasına razı olmadı və özünün şəhərdə qalmasını düşündü, lakin bunu da bacarmadı.

Onun axmaqlığına və dəliliyinə bundan daha yaxşı bir dəlil ola bilərmi ki, bir dəstə saxtakar və hiyləgərin yalanlarına və öygülərinə inanaraq özünü rəzil və rüsvay elədi. Bu hadisənin təfsilatı belədir: Heratda bu qədər etibar və iqtidar sahibi olanda bir neçə şeyx və molla onun yanına gəlib deyirlər ki: «Kütub bizimlə münasibətdə bulunur, sənə hizəbrullah [Allahın aslanı] ləqəbi verildi. Sən özbəkləri yenəcəksən». O da bu sözlərə inanaraq, boynuna fitə bağlayıb Allaha şükürlər edirmiş. Bu üzdən də Məhəmməd Burunduqun məqbul fikriylə hərəkət etməmiş, nə kurqanın gücləndirilməsi işiylə, nə də savaş hazırlığıyla maraqlanmış, nə düşmənin yaxınlaşdığını xəbər verəcək önçü və kəşfiyyatçıların yerləşdirilməsiylə, nə də düşmən gəlsə, savaşmaq üçün səflərin düzənlənməsi ilə uğraşmışdı.

Şeybani xan məhərrəm ayında [1507 may-iyun] Mürqabdan keçib Sir-Kay civarına **(205 b)** yaxınlaşdığında Mirzələrin bundan ancaq xəbəri oldu. Sərsəmləşib heç bir iş görəbilmədilər. Nə qoşunu toplaya bildilər, nə də səfləri qura bildilər. Hər kəs olduğu yerdən qaçmağa qoyuldu. Zünnun Arğun ona söylənən bu sözə uyub qırx-əlli min özbəyin qarşısında yüz-yüz əlli qədər adamıyla birlikdə Qara-Ribatda qalır. Düşmənin izdihamlı əsgəri yaxınlaşınca da üstlərinə cumur. Özbəklər də onu ələ keçirib başını kəsdilər.

## ŞEYBANİ XANIN HERATI ALMASI

Mirzələrin anaları, böyük və kiçık bacıları, arvadları və xəzinələrin hamısı Ala-Kurqan deyə məşhur olan Qaleyi-İxtiyarəddində idi. Mirzələr gecə şəhərə çatırlar, atları dincini alana qədər gecə yarısınadək yatırlar və səhər vaxtı şəhəri tərk edirlər. Kurqanı gücləndirməyi belə düşünmürlər. Analarını, böyük və kiçık bacılarını, ailələrini və uşaqlarını yanlarına almadan, onları belə bir zamanda və belə himayəsiz bir vəziyyətdə özbəklərin əsarətinə buraxıb qaçırlar.

Payəndə Sultan bəyim ilə Xədicə bəyim başda olmaq üzrə Sultan Hüseyn Mirzənin arvadları, Bədiüzzaman Mirzə ilə Müzəffər Mirzənin bütün qadın və uşaqları, xəzinələri və ev əşyalarının hamısı Ala-Kurqanın içində idi. Kurqan gərəkdiyi kimi qapalı və qorunaqlı bir hala gətirilmimiş, kurqana yardım üçün göndərilən igidlər də hələ oraya çatmamışdılar.

Məzid bəyin [Arğun] kiçık qardaşı Aşiq Məhəmməd Arğun ordudan piyada qaçıb gələrək kurqana **(206 a)** girdi. Kurqanda ondan başqa Əmir Ömər oğlu Əli xan, Şeyx Məhəmməd Abdullah Bəkavul, Mirzə bəy Keyxosrovi və Mirək Kurdivan vardı.

Şeybani xan gəldikdən üç gün sonra şeyxülislam və böyüklər əhd və şərt bağlayıb dış kurqanın açarlarını alaraq onun hüzuruna getdilər. Bu Aşiq Məhəmməd kurqanı on altı-on yeddi gün müdafiə etdi. Dışarıdan, Atbazarı tərəfdən dəlik açıb kurqanın bir bürcünü havaya uçurdular. Kurqan əhalisi də çaş-baş qaldı və kurqanı müdafiə etmədən təslim etdi.

Şeybani xan Heratı alınca bu padşahların ailələri ilə pis rəftar etməyə başladı. Yalnız onlara qarşı deyil, bütün xalqa da eyni şəkildə pis davrandı. Bu qaba, görməmiş adam beş günlük fani dünyada belə yaman ad qazandı.

Şeybani xanın Heratda elədiyi uyğunsuz hərəkət və işlərin bəziləri bunlardı:

Bu dünyanın kirli hesabları üçün [Sultan Hüseyn Mirzənin arvadı] Xədicə bəyimi Şah Mansur Bəxşi kimi bir namussuza verərək dürlü-dürlü əzab və işkəncəyə məruz qoydurdu.

Şeyx Puran kimi vəli və əziz bir adamı moğol Əbdülvəhhaba, oğullarının hər birini də ayrı-ayrı adamlara payladı.

Bütün şeir ərbabı və zövq sahiblərini Molla Bənnainin hakimiyyətinə verdi. Xorasan nükdədanlarının buna dair söylədiyi bu qitə çox məşhurdu:

Bə cüz Abdullahi-kirxar imruz,
Nədidə heç şair ruyi-zərra,
Binai zər təmə darəd zi şair,
Məgər xahəd giriftan kiri-xərra[1].

*Bugün Abdullah Kirxardan başqa*
*Heç bir şair altın yüzü görməmişdir.*
*Bənnai şairdən altın umur,*
*Lakin kirxərdən başqa heç nə almayacaq.* **(206 b)**

Şeybani xan Heratı alan kimi Müzəffər Mirzənin Xanzadə xanım adlı arvadını, iddət müddətinin[2] dolmasına baxmadan nikahlayıb aldı.

Heratın məşhur və zövq sahibi mollalarından olan Qazı İxtiyar ilə Mir Məhəmməd Yusifə cahil olmasına baxmayaraq təfsir dərsi verdi.

Molla Sultan Əli Məşhədi ilə Bəhzad Mənsurun yazıları və rəsmləri üzərinə qələm vurub düzəlişlər elədi.

Bir neçə gündə zövqsüz bir beyt söyləyir və onu minbərlərdə oxudub bazarlarda asdıraraq şəhər xalqından hədiyyələr alırdı.

Düzdür, erkən qalxır, beş rükət namazını buraxmır və qiraət elmini yaxşı bilirdi, lakin belə bir sürü gic, əbləhanə və kafiranə əməllər və işlər də görmüşdü.

---

[1] Kirxər sözü erkək eşşəyin cinsi orqanı mənasına gəlir.

[2] *İddət müddəti:* keçmişdə ərindən ayrılan qadının təkrar ərə getməsi üçün keçməsi lazım olan zəruri müddət, yəni üç dəfə aybaşı keçirib təmizlənənə qədər keçəcək müddət (ərindən boşansa - 100 gün, əri ölsə - 130 gün).

Heratı aldıqdan on-on beş gün sonra Kəhdistandan Püli-Salara gəlib bütün qoşununu [oğlu] Teymur Sultan və Übeyd Sultanın tabeliyinə verib Məşhəddə qafil oturmaqda olan Əbülmöhsün Mirzə ilə Kibək Mirzənin üstünə göndərdi. Bunlar əvvəlcə qalanı gücləndirməyi düşünürdülər, sonra isə əsgərin gəlməkdə olduğunu eşidərək başqa bir yoldan Şeybani xanın üstünə sürətlə yürümək istəyirlər. Bu çox yaxşı bir fikirdi. Lakin heç birinə qərar verə bilməyərək oturduqları üçün Teymur Sultan ilə Übeyd Sultan qoşunla sürətli bir yürüyüş gerçəkləşdirərək gəlib yetişirlər. Mirzələr də qüvvətlərini düzüb onların qarşısına çıxırlar.

Əbülmöhsün **(207 a)** Mirzəni dərhal ələ keçirib götürürlər. Kibək Mirzə bir neçə adamıyla böyük qardaşının düşməninə hücum edir, onu da götürürlər. Hər iki qardaşı ələ keçirirlər. İkisini bir araya gətirdiklərində iki qardaş qucaqlaşıb öpüşərək halallaşırlar. Əbülmöhsün Mirzə qorxaqlıq edir, lakin Kibək Mirzə qorxusunu o qədər bəlli etmir. Şeybani xan Püli-Salarda ikən hər iki mirzənin başını kəsib ona göndərirlər.

O günlərdə Şah [Şüca] bəy və kiçik qardaşı Məhəmməd Müqim [Arğun], Şeybani xanın qorxusundan mənə dəfələrlə elçilər və məktublar göndərib bərabər olduqlarını və sədaqətlərini bildirdilər.

Müqim bir məktubunda məni açıqca çağırmışdı. Özbəklərin əyalətləri bu şəkildə ələ keçirdikləri bir zamanda bizim seyrçi qalmamız doğru deyildi. Bu qədər elçilər və məktublar göndərib bizi istədikləri üçün onların gəlib bizə qoşulacaqlarına heç şübhə edilə bilməzdi.

Bütün bəylər və görüş sahibləri ilə danışıb məsləhətləşərək yola çıxmağa və Arğun bəyləri də bizə qoşulduqdan sonra onların da fikirlərini və görüşlərini alaraq Xorasana doğru hərəkət etməyə qərar verdik. Bu niyyətlə də Qəndəhara tərəfə yola çıxdıq.

Daha öncə bəhs etdiyim kimi, yengə deyə xitab etdiyim Həbibə Sultan bəyim, Heratda qərarlaşdırdığımız kimi, qızı Məsumə Sultan bəyimlə birlikdə gəldi. **(207 b)** Qəznədə görüşdük. Onlarla birlikdə Xosrov Göyəldaş, Sultanqulu Çanaq və Gədayi Bilal da gəlmişdi. Bunlar Heratdan qaçıb öncə İbn Hüseyn Mirzənin, oradan da Əbülmöhsün Mirzənin yanına getmiş, lakin orada da qala bilməyərək bizə gəlmək üçün təkrar yola çıxmışlar.

Bunlarla birlikdə Qəlata çatanda orada ticarət üçün gəlmiş bir çox Hindistan tüccarının olduğunu gördük. Əsgər oraya qəfil yetişdiyi üçün qaça bilməmişdilər. Yanımdakıların çoxu «Savaş zamanında düşmən vilayətinə getməkdə olanları yağmalamaq lazımdır» dedi.

Amma mən razı olmadım və dedim: «Tüccarların nə günahı var, belə xırda-xuruş qazanca baxmadan, Allah rizasını almaq naminə bunlara toxunmasaq, Allah da bunun əvəzini bizə artıqlaması ilə nəsib edəcəkdir. Necə ki keçənlərdə gilcilərə axın üçün hərəkətə keçəndə məhmənd əfqanları qoyun və malları, ailə və uşaqlarıyla əsgərdən bir ağac məsafədə ikən çoxunuz on-

lara axın etmək fikrindəydiniz. Yenə eyni düşüncəylə mən buna razı olmamışdım və ertəsi gün uca Allah dərhal düşmənlərimiz gilci əfqanlarının malından əsgərə o qədər çox qismət etdi ki, o zamana qədər heç bir axında bu qədər çox qoyun ələ keçməmişdi».

Qəlatdan keçib endik və tüccarlardan hədiyyə olaraq bir az mal alındı.

Kabili aldıqdan sonra Xorasan tərəfinə getməsinə izin verdiyim Mirzə xan ilə Xorasandan **(208 a)** ayrılanda orada qalmış olan Əbdürrəzzaq Mirzə biz Qəlatdan keçərkən Qəndəhardan qaçıb gəldilər. Bəhar Mirzənin nəvəsi və Cahangir Mirzənin oğlu Pir Məhəmməd Mirzə və onun anası da digər mirzələrlə birlikdə gəlib bizə qoşuldular.

Şah [Şüca] bəy ilə Müqimə məktublar göndərib belə yazdıq: «Sizin sözünüzlə buraya gəldik. Özbək kimi yabancı bir düşmən Xorasanı zəbt etdi. Gəlin dövlətin yaxşılığı üçün nə şəkildə hərəkət etmək lazımsa, sizin iştirakınız və ittifaqınızla bir qərar verək».

Onlarsa məktub yazdıqlarını və bizi istədiklərini inkar edərək qaba və sərt cavablar göndərdilər. Qabalıqlarından biri bu idi: Şah bəy mənə yazdığı məktubunda möhürünü bir bəyin digər bir bəyə, hətta daha böyük dərəcədə olan bir bəyin daha kiçık rütbəli bir bəyə yazdığı məktubda olduğu kimi, məktubun arxasına və kağızın ortasına basıb göndərmişdi. Belə qaba hərəkət etməmiş və bu cür qaba cavablar göndərməmiş olsaydı, iş bu dərəcəyə gəlməzdi. Necə ki bu söz çox doğrudur:

Setizə bəcan rəsanəd süxən,
Ki viran konəd xanədani kuhən.
*Çəkışmə sözü elə bir məcraya çəkər ki,*
*Əski bir xanədanı məhv edər.*

Bu anlaşmazlıq və qabalıqları üzündən ocaqlarını və otuz-qırx il ərzində əldə etdikləri qazanclarını itirdilər.

Şəhri-Səfa civarında ikən bir gün yanlış həyəcan siqnalı nəticəsində ordugah içində qarışıqlıq çıxdı. Bütün əsgər silahlanaraq atlara mindi. Mən qüsl və təharətlə məşğul idim. **(208 b)** Bəylər çox təlaş etdilər. Mən də işimi bitirərək ata mindim, yanlış bir xəbər olduğu üçün bir müddət sonra ortalıq yatışdı.

Oradan qalxıb mənzil-mənzil yürüyərək gəlib Gura endik. Burada da [arğunlarla] bir neçə dəfə danışıb anlaşma yolunu seçdik, amma fayda vermədi, inad və sərkəşlik etdilər.

Ərazini bilən və bizə sadiq olanlar belə dedilər: «Qəndəhara gələn çayların mənbəyi Baba-Həsən-Abdal və Xalişək tərəfidir, o tərəfə keçib Qəndəhara gələn çayların hamısının qabağını kəsmək lazımdır». Buna qərar verib sabah tezdən silahlanaraq, sağ və sol qolları və səfləri düzüb Xalişək tərəfinə yürüdük.

## QƏNDƏHAR SAVAŞI

Şah bəylə Müqim Qəndəhar dağının bir daş imarət tikdirdiyim çıxıntısının önündə çadır qurub oturmuşdular. Müqimin adamları tələskənlik edib ağaclar arasından bir az yaxınlaşdılar. Biz Şəhri-Səfa civarında olanda qaçıb bizə gəlmiş olan Tufan Arğun arğunların səflərinə doğru tək başına, həm də gizlicə yaxınlaşlbmış. O əsnada Eşqullah deyilən biri yeddi-səkkiz adamla birlikdə digərlərindən ayrılaraq bir az bəri gəlir. Eşqullah yanındakılardan bir az daha irəli gedir. Tufan Arğun da tək başına qarşısına çıxıb qılıncla vuruşaraq onu atından salır. Mən Səngi-Lahşək qarşısından keçərkən başını kəsib gətirdi. Bunu xeyirli bir əlamət saydıq.

Ərazi məhəlləlik və ağaclıq olduğu üçün belə bir yerdə savaşmağı doğru saymayaraq, dağ ətəyindən keçib Xalişək önündəki çayın Qəndəhar tərəfindəki **(209 a)** çayırını yurd olaraq seçib enməyə hazırlaşdıq. Tam o əsnada Şirqulu tələsik gəldi və düşmənin [arğunların] döyüş cərgəsində yaxınlaşmaqda olduğunu söylədi.

Qəlatdan keçildikdən bəri əsgər çox açlıq və sıxıntı çəkmiş, Xalişək civarına gələndə isə əsgərin böyük bir qismi qoyun, sığır, ərzaq və saman üzündən Xalişəkin yuxarı vadisi tərəfinə dağılmışdı. Əsgərin toplanmasını gözləmədən atlandıq.

Bizim bütün adamımız iki minə yaxındı. Buraya enəndə, söylədiyim kimi, əsgərin bir çoxu yuxarı vadiyə getmişdi və savaşa vaxtında yetişə bilmədi. Savaşda hazır olanlar min nəfər qədər idi. Gərçi adamlarımız azdı, lakin çox yaxşı nizamlı və qapalı səflər yaradıb paylaşdırmışdım. İndəyə qədər heç bir zaman belə bir tərtib və düzən qurmamışdım.

Əlindən iş gələn bütün igidlər xassə alayına ayrılmışdı. Hamısını on-on və əlli-əlli ayırıb onbaşı və əllibaşıları təyin etmişdim. Hər on və hər əlli nəfərlik bölük sağ və sol qolda duracağı yeri və savaş vaxtında görəcəyi işi bilərək hazır və nazirdi. Barangar və cavangar, ön qol və sol qol[1], ön yan və sol yan önə və sola hərəkət vaxtı gələndə hər hansı bir zorluq olmadan və xəbərçilərə ehtiyac qalmadan düzənli bir şəkildə hərəkət edə biləcəkdilər. Əsgərin hər bölüyü olduğu yerdən hərəkətə **(209 b)** keçdi.

Gərçi barangar, ön qol və ön yan eyni mənaya gəlir, lakin ayırd etmək üçün sözləri dəyişdirərək, bunları ayrı-ayrı mənalarda işlətdim. Ordunun sağ və sol qanadına [ərəbcə] məymənə və məysərə, [türkcə] barangar və cavangar deyirlər, bunlar döyüş cərgəsinə girəndə [ərəbcə] qəlb, [türkcə] qol[2] deyilən mərkəzə daxil deyildir. Bu növ səfə bu şəkildə barangar və cavangar

---

[1] *Barangar* (döyüş cərgəsində olan ordunun sağ qolu), *cavangar* (həmin ordunun sol qolu), *ön* (həmin ordunun mərkəzinin sağ tərəfi), sol (həmin ordunun mərkəzinin sol tərəfi).

[2] *Qol:* döyüş cərgəsinə girəndə ordunun mərkəzinə (qəlb) verilən ad. *Yasal:* döyüş səfi. *Qəlb:* döyüş cərgəsində ordunun əsas qüvvələrinin olduğu mərkəz.

adı verdim.

Mərkəz [qol] isə başqa bir səfdir [yasal]. Ayırd etmək üçün bunun sağına və soluna sağ qol [ön qol] və sol qol dedim. Bir də mərkəzdə [qol] xassə tabını[1] vardır. Bunun sağına və soluna isə sağ yan [ön yan] və sol yan dedim. Xassə alayında bir də boy[2] vardır. Türkcədə mücərrədə[3] də boy deyirlər; burada işlədərkən məqsədim o boyu söyləmək deyildir, yaxın mənasında işlədirəm. Bunun sağına və soluna ön və sol adı verildi.

Sağ qolda Mirzə xan [Sultan Veys Mirzə], Şirim Tağayi, öz qardaşları ilə Yarək Tağayi, Çəlmə Moğol, Əyyub bəy, Məhəmməd bəy, İbrahim bəy [Bəycik Tağayi] və öz moğolları ilə Əli Seyid Moğol, Sultanqulu Çöhrə, Xudabəxş və öz qardaşları ilə birlikdə Əbülhəsən [Qurbəyi];

Sol qolda Əbdürrəzzaq Mirzə, Qasım bəy, Tanrıverdi, Qənbər Əli, Əhməd Elçi Buğa, Quri Barlas, Seyid Hüseyn Əkbər və Mir Şah Koçin;

Öncü bölüyündə Nasir Mirzə, Seyid Qasım eşik-ağa, Mühib Əli Qurçu, Babaoğlu Allahverən Türkmən, qardaşları ilə birlikdə Şirqulu Qaravul Moğol və Məhəmməd Əli [Tağayi];

Mərkəzdə mənim sağ qolumda isə Qasım Göyəldaş, Xosrov Göyəldaş, Sultan Məhəmməd Dulday, Şah Mahmud Pərvanıi Qul Bəyazid Bəkavul (210 a) və Kamal Şərbətçi;

Mərkəzdə mənim sol qolumda Xoca Məhəmməd Əli [Kitabdar], Dost Nasir, Mirim Nasir, Baba Şirzad, Xanqulu, Vəli Xəzinə[çi], Qutlu-Qədəm Qaravul, Maqsud Suçu və Baba Şeyx durmuşdular.

İçkilərin hamısı mərkəzdə idilər. Burada böyük bəylərdən kimsə yox idi. Bu bəhs edilənlərdən heç biri hələ bəylik rütbəsinə çatmamışdı.

Boyda isə Şir bəy [Şirək Arğun], Xatəm Qurbəyi, Kibək, Qulbaba, Əbülhəsən Qurçu, moğollardan Urus Əli Seyid, Dərviş Əli Seyid, Xoşgəldi Çəlmə, Dostgəldi Çəlmə Tağçı, Əməçi Mindi, türkmənlərdən Mansur, böyük və kiçık qardaşlarıyla birgə Rüstəm Əli, Şah Nəzər və Süyündük vardı.

Düşmənin adamları iki qismə ayrıldı. İlk qismi gələcəkdə Şah bəy deyə bəhs edəcəyimiz Şah Şüca Arğun və ikinci qismi də kiçık qardaşı Müqimin komandanlığındaydı. Bu arğunların qaraltısını altı-yeddi min qədər təxmin edirdilər. Ən azı, dörd-beş min silahlı adam olduğuna şübhə yoxdur.

[Şah bəy] mərkəz və sağ qolun qarşısına özü keçdi, Müqim isə sol qolun qarşısındaydı. Müqimin əsgəri böyük qardaşının əsgərindən bir az daha azdı. Bizim sol qolumuzda isə Qasım bəy ilə arxadaşları olurdu və vəziyyətləri də müşküldü. Savaş hələ başlamamışdı, ancaq Qasım bəydən iki-üç dəfə adam gəlib kömək istəmişdi. Bizim önümüzdəki düşmən da qüvvətli olduğu üçün adam ayırıb ona göndərə bilməmişdik.

---

[1] *Tabın:* bölük, alay.

[2] *Boy:* döyüş cərgəsinə girmiş ordunun mərkəzindəki özəl bir bölüyə verilən ad.

[3] *Mücərrəd:* təcrid edilmiş; soyulmuş; tək.

Vaxt itirmədən düşmənin üstünə cumduq. Bir ox atımı məsafəyə çatanda **(210 b)** düşmən ilk hücumda bizim öncümüzü vurub zorlayaraq geri oturdub mərkəzə doğru sovurdu. Biz ox atmadan irəliləməyə davam etdik. Qısa bir müddət onlar da ox atmayaraq duran kimi oldular. Qarşı tərəfimdən bir adam əsgərinə qışqıraraq atdan enib ox atmağı əmr etdi. Amma biz durmadan irəliləməkdə olduğumuz üçün bir şey edə bilmədən təkrar ata minib geriləd i. Bu adam Şah bəyin özü imiş.

Savaş əsnasında Piri bəy Türkmən dörd-beş qardaşıyla birlikdə sarıqlarını əllərinə alaraq düşməndən üz çevirib biz tərəfə keçdilər. Bu Piri bəy Şah İsmayıl bayındır sultanlarına müsəllət olaraq İraq vilayətini ələ keçirəndə Əbdülbaqi Mirzə və Murad bəy Bayındırın başçılığı altındakı türkmən bəyləri ilə birlikdə gəlmiş olan türkmənlərdən idi.

Sağ qolumuz düşməni hamıdan əvvəl məğlub edərək irəlilədi, sağ qolun ucu mənim saldırdığım bağa varmışdı.

Sol qolumuzsa Baba-Həsən-Abdaldan xeyli aşağıdakı böyük arxlara vardı. Bizim sol qolun qarşısında öz məiyyətiylə birlikdə Müqim dururdu. Sol qolumuzdakı adamlar qarşısındakı düşmənə, yəni Müqiminkinə nəzərən çox azdı. Amma Allah rast gətirdi ki, Qəndəhar və kəndlərinə gedən üç-dörd böyük arx bizim sol qolla düşmənin arasındaydı. Bu üzdən də keçidin başını tutaraq onları keçməyə qoymadılar. Sol qol adamlarımız az olmalarına baxmayaraq keçidi çox yaxşı müdafiə edib **(211a)** dirəndilər. Arğunlar tərəfindən Halvaçı Tarxan su içində Qənbər Əli və Tanrıverdi ilə vuruşdu. Qənbər Əli yaralandı. Qasım bəyin alnına ox isabət etdi. Quri Barlasın qaşının üstünə bir ox isabət etdi və yanağının üstündən çıxdı.

Bu əsnada düşməni qaçıraraq bu arxlardan Murğan dağının çıxıntısı tərəfinə keçdik. Arxlardan keçəndə boz ata minmiş bir adam dağ ətəyində o yan-bu yana çaparaq hansı tərəfə gedəcəyinə qərar verə bilmirdi, axıda bir tərəfə doğru getdi. Onu Şah bəyə bənzətdim. Hər halda Şah bəydi.

Düşməni məğlub edincə, bütün əsgərimiz düşməni təqib etməyə və vurab atdan salmağa qoyuldu. Özümlə birlikdə on bir adam qalmışdıq. Bunlardan biri Abdullah Kitabdardı. Müqim hələ yerində müqavimət göstərərək vuruşurdu. Adamlarımın azlığına baxmayaraq və Allaha təvəkkül edib davullar çalaraq düşmənin üzərinə yürüdük.

Köpü [çoxu], azğu [azı] tanrıdır bergücü [verən],
Bu dərgahda yoxdur kişinin gücü.

Kəm min fiətən qəlilətin qələbət fiətən kəsirətən biiznillah[1].

*Allahın izniylə çox kiçik dəstələr böyük dəstələrə qalib gəlmişdir.*

Davul səsini eşidincə bizim hərəkətə keçdiyimizi anlayaraq müqavimətdən vaz keçib qaçmaq yolunu seçdilər.

Allahın köməyi ilə düşməni qaçırdıqdan sonra Qəndəhar tərəfinə hərə-

[1] *Quran,* 2:249.

kət edib indi heç izi qalmayan Fərruxzad bəyin çarbağına **(211 b)** gəldik.

## BABURUN QƏNDƏHARA GİRMƏSİ

Şah bəylə Müqim qaçdı və Qəndəhar qalasına girə bilmədilər. Şah bəy Şal və Məstunq tərəfinə, Müqim isə Zəmindavər tərəfinə getdi.

Kurqanı müdafiə etmək üçün adam da qoymamışdılar. Mənə qarşı sədaqət və bağlılıqları məlum olan Qulu bəy Arğunun qardaşlarından Əhməd Əli Tarxan və digər bəziləri kurqanda idilər. Müraciət edərək qardaşları üçün aman dilədilər. Söylədiyim bu adamlara inayət edilərək istəkləri qəbul edildi.

Kurqanın Maşur qapısını açdılar. Xalqın təhlükəsizliyini düşünərək digər qapılar açılmadı. Bu açıq qapı Şirim bəy ilə Yarək bəyə tapşırıldı. Mən də bir neçə içkiylə birlikdə içəri girdim və başsız xalqın üzərinə yürüyərək azğınlıq edənlərdən bir-iki adamın ibrət üçün öldürülməsini əmr etdim.

İlk öncə Müqimin dış kurqanda saxlanan xəzinəsinə getdim. Kurqanın ortasında daş bir ev vardı. Əbdürrəzzaq Mirzə məndən daha öncə oraya gəlib enmişdi. Əbdürrəzaq Mirzəyə xəzinədən bir qədər ehsan edib xəzinənin mühafizəsini Dost Nasir bəy, Qul Bəyazid Bəkavul və bəxşilərdən[1] Məhəmməd Bəxşiyə tapşırdım.

Oradan ərkə getdim. [Buradakı] xəzinə mühafizliyinə Şah bəy, Xoca Məhəmməd Əli [Kitabdar], Şah Mahmud [Pərvanəçi] və bəxşilərdən Tağayi Şah Bəxşi təyin edildi.

Zünnunun divanı olan Mir xan adlı birinin evinə Mirim Nasir ilə Maqsud Suçu göndərildi və [bu ev] Nasir Mirzəyə verildi. Şeyx Əbu Səid Tarxanın evi isə Mirzə xana [Sultan Veys] **(212 a)** verildi.

O vilayətlərdə bu qədər çox ağ axça heç bir zaman görünməmişdi, hətta bu qədər axça görmüş olan adam haqqında da heç nə eşidilməmişdi. O gecəni ərkdə keçirdim. Şah bəyin Sünbül adlı qulunu tutub gətirdilər. Gərçi o zamanlarda onun yaxın bir dostu olduğu halda, o qədər də etibar görməmişdi. Keşiyini çəkmək üçün birinə tapşırdım, amma yaxşı yaxşı baxmadığı üçün əlindən qaçırmışdı.

Ertəsi gün ordugahın yerləşdiyi Fərruhzadın çarbağma getdim. Qəndəhar vilayətini Nasir Mirzəyə verdim. Xəzinələri zəbt edib yükləyərək şəhərdən çıxılanda Nasir Mirzə ərkdəki xəzinədən bir qatar dəvə yükü qədər ağ axça almışdı. Onu da geri istəməyərək Nasir Mirzəyə ehsan etdim.

Oradan qalxıb Quşxana çayırına endik. Ordugahı da oraya nəql etdirib özüm ətrafı gəzdikdən sonra bir az gec vaxtda ordugaha qayıtdım. Ordugah əvvəlkinə bənzəmirdi, tanınmayacaq şəkildə dəyişmişdi. Cins atlar, qatar-qatar nər və mayalar, qatırlar, qumaşlar, ata və heybəyə aid əşyalar, al qədifədən çadırlar və otaqlar, hər çadırda yığın-yığın sandıqlar vardı. Bu iki qar-

daşın qiymətli əşyaları ayrı-ayrı xəzinələrdə saxlanırmış. Hər xəzinədə sandıq-sandıq və top-top qumaşlar, yük-yük və küp-küp ağ axçalar, hər birinin otağında və çadırında hər cür qənimətdən ibarət fövqəladə çox əşya vardı. Qoyunlara isə heç əhəmiyyət verilmirdı. **(212 b)**

Qasım bəyə Qəlat içində olanları, başda Qoç Arğun və Tacəddin Mahmudunkular olmaq üzrə mal və əşyalarıyla birlikdə ehsan etdim. Qasım bəy hesab bilən bir adam olduğu üçün Qəndəhar civarında artıq qalmağımızı uyğun görmədi və bunu tez-tez xatırlatdı, onun məsləhətilə mən qoşunu oradan geri çəkdim. Söylədiyim kimi, Qəndəharı Nasir Mirzəyə bağışlayıb onun getməsinə izin verildikdən sonra, Kabilə hərəkət etdik.

Qəndəhar civarında xəzinəni bölüşdürməyə vaxt qalmadığı üçün Qarabağda dörd-beş gün qalıb xəzinəni bölüşdürdük. Pulları saymaq çətin idi, tərəziylə çəkilərək bölüşdürüldü. Bəylər və nökərlər yük-yük, küp-küp gümüş pulu miniklərinə yükləyərək daşıyırlardı. Bol qənimət və böyük bir şərəflə Kabilə gəldik.

Sultan Əhməd Mirzənin qızı Məsumə Sultan bəyimi Xorasandan gətirtmişdim. Bu dəfə Kabilə qayıdanda nikah qıydırdım.

## ŞEYBANİ XANIN QƏNDƏHARI MÜHASİRƏ ETMƏSİ

Altı-yeddi gün sonra Nasir Mirzənin adamlarından biri Şeybani xanın Kəndəharı mühasirəyə alması xəbərini gətirdi. Müqimin Zəmindavər tərəfinə qaçdığından əvvəlcə bəhs etmişdim. Orada gedib Şeybani xanı görür, Şah bəy də durmadan Şeynaniyə elçilər göndərir. Bunların fitnəsi və təhriki ilə **(213 a)** Şeybani xan mənim Qəndəharda olduğumu zənn edərək, Heratdan dağ yoluyla Qəndəhar üzərinə sürətlə yürüyür. Təcrübəli bir adam olan Qasım bəy bunu düşünərək bizi təhsildarlarla Qəndəhardan köçürtmüşdü.

Hərçi dər ayinə cəvan binəd,
Pir dər xişt püxtə an binəd.
*Gəncin aynada gördüyünü*
*İxtiyar bişmiş kərpicdə görür.*

Şeybani xan gəlib Nasir Mirzəni Qəndəharda mühasirəyə alır. Bu xəbər gəlincə, bəyləri çağırtdıraraq məşvərət etdik. Ortaya bu fikirlər çıxdı: özbəklər və Şeybani xan kimi, yad bir xalq və qarı düşmən Teymur bəy oğullarının əlində olan bütün əyalətləri əllərinə keçirdilər. Bəzi guşə və diyarda qalan türklərin və çağatayların bəziləri istəyərək, bəziləri da zorla özbəklərə qoşuldu. Üstəlik, mən də Kabildə tək qalmışam. Düşmən fövqəladə qüvvətli, biz isə çox zəifik. Nə sülh bağlamaq ehtimalı, nə də müqavimət göstərmək imkanı var. Belə bir qüvvət və qüdrət qarşısında biz özümüzə bir yer axtarmağı düşünməliyik. Belə bir fürsət varkən, bu qüvvətli düşməndən daha uzaqlara getməliyik. Ya Bədəxşan, ya da Hindistan tərəfinə getməmiz

lazımdır. İkisindən birinə qərar verməliyik.

Ətrafındakılarla birlikdə Qasım bəy ilə Şirim bəy Bədəxşana getmək fikrindəydi. O günlərdə Bədəxşanda bizə qarşı üsyan edən bədəxşanlılardan olan Mübarək Şah Vəzir, ondan başqa Cahangir Türkmən ilə Məhəmməd Qurçu vardı. Onlar Nasir Mirzəni qovmuşdular, lakin özbəklərə də **(213 b)** tabe olmamışdılar. Amma mən və bəzi içki bəylər Hindistan tərəfinə getməyi tərcih etdik və Ləmqana hərəkət etdik. Qəndəharın zəbtindən sonra Qəlat və Tərnük vilayətləri Əbdürrəzzaq Mirzəyə verilmiş və Əbdürrəzzaq Mirzəni Qəlatda qoymuşduq. Özbəklər Qəndəharı mühasirəyə alınca Əbdürrəzzaq Mirzə Qəlatda qala bilmədi və Qəlatı buraxaraq tam biz Kabildən ayrılarkən gəldi. Kabili Əbdürrəzzaq Mirzəyə tapşırdıq.

Bədəxşanda padşah və padşahzadələrdən heç kimsə yoxdu. [Bədəxşan şahı Şah Sultan Məhəmmədin qızı və Baburun ana tərəfindən babası olan Yunus xanın arvadı] Şah bəyimlə qohumluğu olduğu və ya onun icazəsini aldığı üçün Mirzə xan [Sultan Veys Mirzə] Bədəxşan tərəfinə getməyə meyl etdi. Axıda Mirzə xana ordudan ayrılıb Bədəxşan tərəfinə getməsi üçün izin verildi və Şah bəyim də Mirzə xanla birlikdə getdi.

Mənim xalam Mehrinigar xanım da Bədəxşana getmək istədi. Mənim yanımda olması daha münasib idi, öz qohumum idi. Nə qədər dilə tutsam da, fikrindən dönmədi və o da digərləri ilə birlikdə getdi.

## HİNDİSTANA GETMƏK NİYYƏTİYLƏ KABİLDƏN ÇIXIŞ

Cəmadiyüləvvəl ayında (=1507 sentyabr-oktyabr) Hindistana getmək niyyətilə Kabildən hərəkət etdik. Hurd-Kabildən keçərək Surx-Ribat yoluyla Quru saya endik.

Kabil ilə Ləmqan arasındakı əfqanlar sülh zamanında belə oğru və quldur idilər. Belə bir hadisə onlar üçün göydəndüşmə oldu. «Kabili buraxıb Hindistana gedirəm» deyə bir yamanlıqları on oldu. Yaxşıları da yaman oldular. **(214 a)** İş o dərəcəyə çatdı ki, Çiydəlikdən keçdiyimiz sabah buralardakı Xızır-heyl, xırılçı və hugiyani əfqanları Çiydəlik keçidini tutmaq niyyətilə qüvvələrini nizamlayaraq şimal tərəfindəki dağa gəldilər, davullar çalıb qılınc oynadaraq bizə meydan oxumağa başladılar. Atlara minər-minməz, əsgərə dərhal dağlara yürüməyi əmr etdim. Hər qol olduğu yerdən hərəkətə keçdi. Əfqanlar bir an belə müdafiə olunmağa macal tapa bilmədilər, bir ox belə ata bilmədilər və qaçıb getdilər.

Əfqanları qovalayaraq dağa çıxdım. Bir əfqan məndən bir az aşağıda, kənardan qaçırdu. Qoluna ox atdım. Bu ox isabət edən əfqanı və digər bir neçə əfqanı ələ keçirib gətirdilər. İbrət üçün bəziləri qazığa oturduldu.

Nigənxar tümənində Adinapur kurqanının qarşısında düşərgə qurduq. Əvvəllər gələcəyi heç düşünməyərək yurd fikri üzərində durmurduq. Nə

getmək üçün qərar verilmiş bir yer, nə də durmaq üçün müəyyən bir yurd vardı, ətrafdan bir xəbər gəlincə, dərhal köç edirdik.

Payızın sonları idi. Ovalardan düyü əksərən yığılmışdı. Civarı tanıyanlar Əlişəng tüməninin çayın yuxarı tərəfində [Mil kafirlərinin] çox düyü əkdiklərini və əsgərin qış ərzağını oradan təmin etmə imkanı olduğunu bildirdilər. Nigənxar vadisindən qalxıb sürətlə irəliləyərək Sayqildən keçib Pür-Emin dərəsinə **(214 b)** qədər getdik. Əsgər çox düyü əldə etdi. Düyü tarlaları dağın ətəyində idi. Əhalisi qaçıb dağlara çıxdı. Bir neçə kafir öldürüldü.

Pür-Emin dərəsinin çıxıntısından bir neçə igidi keşikçi olaraq qoymuşduq. Onlar qayıdanda kafirlər sürətlə dağ üstünə gəlib ox atmağa başladılar. Qasım bəyin kürəkəni Purana yetişib baltayla yaralayaraq ələ keçirdikləri anda igidlər geri dönüb onları qaçıraraq Puranı qurtardılar. Kafirlərin düyü tarlasında bir gecə qalıb çoxlu ərzaq alaraq ordugaha gəldik.

Bu Məndravər tüməni civarında olduğumuz günlərdə Müqimin indi Şah Həsənlə nikahda olan Mah-Çüçük adlı qızı Qasım Göyəldaşa nikahlandı. Hindistan tərəfinə yürümək hələ qeyri-müəyyən olduğu üçün Molla Baba Pəşağari bir neçə igidlə birlikdə Kabilə göndərdik. Məndravər civarından qalxıb Ətər və Şivəyə gəldik. Bir neçə gün o civarda oturduq. Ətərdən Künərə və Nurgilə gəlib seyr etdim. Künərdən sala minib ordugaha gəldim. Daha əvvəl heç sala minməmişdim. Çox xoşuma gəldi. O gündən etibaren saldan istifadə etməyə başladıq.

## ŞEYBANİ XANIN QƏHDƏHARDAN ÇƏKİLMƏSİ

O günlərdə Molla Mirək Fərkəti Nasir Mirzənin yanından gəlib Şeybani xanın Qəndəharın dış kurqanını zəbt edərək ərkini ala bilmədən geri çəkildiyini və Şeybani xan çəkildikdən sonra Nasir Mirzənin da bəzi səbəblərdən dolayı Qəndəharı buraxıb **(215 a)** Qəznəyə getdiyini xəbər verərək bu xüsusda bəzi açıqlamalarda bulundu.

Bir neçə gün sonra Şeybani xan Qəndəhara basqın edir və içəridəkilər də gücləndirə bilmədikləri üçün dış kurqanı tutur. Şeybani xanın adamları ərkin ətrafında bir neçə yerdə dəlik [tünel] açır və bir neçə dəfə də hücum edirlər. Şəhər bu vəziyyətdə çarəsiz ikən irəli səfdə olanlardan Xoca Məhəmməd Emin, Xoca Dost Xavənd, Məhəmməd Əli Piyadə və Şami kurqanı buraxıb qaçırlar. Kurqan xalqı da ümidsizliyə qapılıb kurqanı təslim etməyə hazırlaşdığı vaxt Şeybani xan sülh danışıqlarına başlayıb Qəndəhardan gedir. Getməsinin səbəbi bu imiş: Qəndəhar üzərinə yürüyəndə ailəsini Nirehtuya göndərmiş, Nirehtuda bir adam ona qarşı üsyan edib kurqanı ələ keçirmişdi. Bu üzdən də barışa bənzər bir şey bağlayıb geri qayıdır.

Qış ortası olmasına baxmayaraq bir neçə gün sonra Badic yoluyla Kabilə çatdıq. Badicin üst tərəfində bir daşa buradan gəlib keçməyimizin tari-

xinin qazılmasını əmr etdim. Hafiz Mirək yazdı və ustad Şah Məhəmməd də daşı oydu, amma tələsik olduğu üçün yaxşı oya bilmədi.

Qəznəni Nasir Mirzəyə ehsan etdim. Əbdürrəzzaq Mirzəyə də Nigənxar tüməni, Məndravər, Dəreyi-Nur, Künər və Nurgili verdim.

Bugünə qədər Teymur bəyin övladlarına səltənətə baxmayaraq Mirzə deyirdilər. Bu dəfə mənə padşah deməlırini əmr etdim.

## BABURUN İLK OĞLU HÜMAYUNUN DOĞULMASI

Bu ilnin sonlarında çərşənbə axşamı gecəsi zülqədə ayının **(215 b)** dördündə, günəş hut bürcündə ikən [=6 mart 1508] Kabil ərkində Hümayun dünyaya gəldi. Doğum tarixini şair Mövlana Seydi şair «Sultan Hümayun xan» şəklində, Kabilin kiçık şairlərindən biri isə «Şahi-firuz qədr» şəklində təsbit etdilər[1]. Üç-dörd gün sonra Hümayun adı verildi. Hümayun doğulduqdan sonra çarbağa çıxaraq doğum toyu keçirdik. Bəylər və əmirlər, böyüklər və kiçıklər toy hədiyyələri gətirdilər. Çoxlu ağ axça yığıldı. Bundan əvvəl bu qədər çox ağ axça bir yerdə görünməmişdir. Çox gözəl bir toy oldu.

KABİL - 914

## DOQQUZ YÜZ ON DÖRDÜNCÜ İLİN HADİSƏLƏRİ

[1] Təsbit olunan bu tarixlərin hər ikisindəki sözlərin hərflərinin cəmi əbcəd hesabı ilə 913 edir.

Bu yaz Mukur civarında yaşayan məhmənd əfqanlarının bir qisminin üzərinə axın edildi.

## MOĞOL İSYANI

Axından döndükdən bir neçə gün sonra Qoç bəy, Fəqir Əli, Kərimdad və Baba Çöhrə qaçmağa təşəbbüs etdilər. Amma bundan xəbər tutaraq dallarınca adam göndərildi və İstərğaçın aşağısında yaxalanıb gətirildilər. Cahangir Mirzə sağ ikən bunların söylədiyi bəzi fəna sözləri mənə bildirmişdi.

Hamısının bazarda edam edilməsini əmr etdim. Bazarın qapısına gətirib ip çəkərək tam asmağa hazırlaşdıqları əsnada Qasım bəy Xəlifəni [Nizaməddin Əli Barlas] yanıma göndərərək günahlarının əfv edilməsini israrla dilədi. Bəyin xatiri üçün qanlarını bağışlayıb həbsə atılmalarını əmr etdim.

Bu əsnada Xosrov şahın Hisarlı və Qunduzlu **(216 a)** nökərlərindən və moğolların böyüklərindən olan Çəlmə, Əli Seyid, Şəmkə, Şirqulu, İgü Salim, Xosrov şahın çağataylılar arasında etibar etdiyi nökərlərindən Sultan Əli Çöhrə ilə Xudabəxş, türkmənlərdənsə Süyündük və Şahnəzərin komandanlığında olan iki-üç min yaxşı igid öz aralarında gizlicə danışıb anlaşaraq mənə qarşı pislik etməyi qərara almışlar.

Bəhs etdiyim bu adamlar Xoca-Rivac önündə, Sonq-Kurqan çayırından Çalaq çayırına qədər olan yerlərdə otururdular. Əbdürrəzzaq Mirzə də Nigənxardan gəlib Dih-Əfqanda oturmuşdu. Mühib Əli Qurçu bir-iki dəfə bunların bu niyyətlə toplaşdıqlarını Xəlifə ilə Molla Babaya söyləyir. Bu işi mənə də eyhamla bildirdilər. Amma inanılacaq bir söz olmadığı üçün diqqət etmədim.

Bir gecə çarbağda divanxanada otururdum, yatsı vaxtında bir tərəfdən Musa Xoca yanında bir adamla birlikdə tələsik yenidən gəlib moğolların mütləq düşmən olmaq niyyətində olduqlarını qulağıma söylədi. Əbdürrəzzaq Mirzəni də özlərinə qatıb-qata bilmədiklərini dəqiq olaraq öyrənə bilmədik. Ayrıca, onların məhz bu gecə bir hərəkətə keçəcəkləri bəlli deyildi.

Özümü bilməzliyə vurub qısa bir müddət sonra hərəmə doğru getdim. O günlərdə qadınlar Bağİ-Xəlvət ilə Bağİ-Yurunçqada otururdular. Hərəmə yaxınlaşanda kişi və qadın xidmətçilər yerlərinə çəkildilər. Onlar çəkildikdən **(216 b)** sonra mən də sərvərqulla birlikdə şəhərə doğru hərəkət etdim.

Xəndək yoluyla Ahənin darvazasına varar-varmaz qarşı tərəfdən bazar yolundan Xoca Məhəmməd Əli [Tağayi] gəldi. Mən onunla hamamın...[1]

[1] Baburun xatirələri burada kəsilir, təxminən on bir illik fasilədən sonra yenidən başlayır. Yəni kitabda 914-cü ilin əvvəllərindən 925-ci ilə qədər olan (may 1508-3 yanvar 1519) dövr yoxdur. Bu dövrdə baş verən hadisələr aşağıdakı şəkildə cərəyan etmişdir: Babur bu moğol üsyanını yatırmışdır. Şeybani xanın üstünə qoşun çəkən Şah İsmayıl Xətai onu

# KABİL - 925 (3 YANVAR 1519 - 23 DEKABR 1519)

Mərvdə məğlub edərək öldürmüş və Xorasan bölgəsini istila etmişdir. Şeybani xanın ölümündən sonra Babur ata yurdunu yenidən ələ keçirmək arzusu ilə Qunduza gəlmiş, ancaq arzusuna nail ola bilməmiş və Şah İsmayıla tabe olaraq onunla müqavilə bağlamışdır. Onun yardımıyla güclənərək Hisar, Buxara, Səmərqənd və Daşkəndi almışdır. Lakin əvəzində şiəliyi qəbul etməsi lazım gəlmişdir. Xalq və qoşun bunu bəyənməmişdir. Nəticədə Babur zəifləyərək özbəklərə məğlub olmuş və yenidən Şah İsmayıldan kömək istəmişdir. Yenə yenilmiş, əvvəlcə Hisara, sonra Qunduza çəkilmiş, iki il orada qalıb fürsət gözləmişdir. Yavuz Sultan Səlimin 920-ci ildə (1514) Şah İsmayılı Çaldıran savaşında yenməsi nəticəsində Babur təkrar Kabilə qayıtmışdır. Ordusunu qüvvətləndirmiş, qardaşlarından və onların çıxardığı qarışıqlıqdan qurtulmuş, Hindistana hücumlar etməyə başlamışdır.

## DOQQUZ YÜZ İYİRMİ BEŞİNCİ İLİN HADİSƏLƏRİ

Məhərrəm ayının ilk bazar ertəsi günü [=3 yanvar 1519] Çendavəl vadisinin aşağı qismində şiddətli zəlzələ oldu və ulduz vaxtilə yarım saata qədər davam etdi.

## BƏCUR KURQANININ ALINMASI

Ertəsi sabah oradan qalxıb Bəcur kurqanını ələ keçirmək üçün kurqanın yaxınına endik. Bəcur sultanına və əhalisinə qalanı təslim etmələri üçün nəsihətlərdə bulunması niyyətilə diləzaq əfqanlarından mötəbər bir adamı göndərdik. Amma bu bədbəxtlər və cahillər nəsihəti qəbul etməyərək mənasız cavablar verdilər.

Əsgərə qalxan, nərdivan və kurqanı tutmaq üçün lazım olan digər hazırlıq görməsi əmr edildi. Bu iş üçün bir gün bu yurdda qaldıq.

Məhərrəm ayının dördündə, cümə axşamı günü [=6 yanvar] əsgərin zirehlər geyib silahlanaraq ata minməsi, ordunun sol qolunun irəliləyərək Bəcur kurqanının yuxarı tərəfində suyun dayaz yerindən keçib kurqanın şimal tərəfinə enməsi, mərkəzin **(217 a)** kurqanın şimal-qərbinə gedib çayı keçmədən, çətin keçilən bir yüksəkliyə və təpəli bir yerə enməsi, sağ qolun isə aşağıdakı qapının qərbinə enməsi əmr edildi.

Dost [Nasir] bəyin komandanlığında olan sol qol bəyləri suyu keçib enəndə kurqandan yüz-yüz əlliyə qədər piyada çıxıb ox atmağa başladı. Bu bəylər də onların üstünə cüməraq ox atıb onları divarın dibinə qədər təqib edərək kurqana girməyə məcbur etdilər. Molla Əbdülməlik Həsti adamları ilə birlikdə divarın dibinə qədər yürümüşdü. Əgər nərdivanlar və qalxanlar hazır olsaydı və axşam düşməsəydi, kurqan o saat zəbt edilərdi. Molla Türk Əli və Tanrıverdinin nökərləri isə düşmənlə qılıncla vuruşaraq onları məğlub edib başlarını kəsib gətirdilər. Hər birinə mükafat vəd edildi.

Bəcur əhalisi heç tüfəng görmədiyi üçün onun səsindən qorxmur, əksinə, tüfəng səsini eşidincə istehza ilə aşağılayıcı hərəkətlər edirdilər. O gün ustad Əliqulu beş adamı tüfənglə vurub yerə sərdi. Vəli Xəzinə[çi] isə iki adamı tüfənglə vurub yıxdı. Digər tüfəngçilər də böyük ustalıq göstərib yaxşı tüfəng atdılar. Qalxan, zireh və dəri paltarları dələrək vurduqları bir neçə adamı yerə sərdilər. Axşama qədər bəlkə yeddi-səkkiz və ya ona qədər bəcurlu tüfəng gülləsi ilə **(217 b)** yerə sərilmişdi. Sonra tüfəngdən qorxaraq başlarını qaldıra bilmədilər.

«Axşam olmuşdur, əsgərlər lazım olan vasitələri hazırlayıb səhər vaxtında kurqana dırmansınlar» deyə əmr verdim.

Məhərrəm ayının beşində, cümə günü [=7 yanvar] fərz vaxtında savaş davulları çalaraq hər kəsin olduğu yerdən yürüyüb kurqana dırmanmaları

əmr edildi. Sol qol ilə mərkəz olduğu yerlərdən hərəkətə keçib qalxanlarla qorunaraq nərdivanlarla divara dırmandılar. Xəlifə, Şah Həsən Arğun və Əhməd Yusif komandanlığında olan mərkəzin sol qanadına əmr edildi ki, sol qola kömək etsin.

Dost bəyin adamları da kurqanın şimal-şərq tərəfindəki bürcün dibinə qədər gedərək orada tünel qazmaq və bürcü yıxmaqla uğraşdı. Ustad Əliqulu da oradaydı. O gün də yaxşı tüfəng atdı, iki dəfə də frəngi [mancanaq] atdı. Vəli Xəzinə[çi] də bir adamı tüfənglə vurdu.

Mərkəzin sol qolundan Məlik Əli Qütbi nərdivanla daha əvvəl çıxıb bir müddətdən bəri [təkbaşına] vuruşurdu. Mərkəzin olduğu yerdən Məhəmməd Əli Cəng-Cəng və kiçık qardaşı Novruz da hər biri bir nərdivana çıxıb nizə və qılıncla vuruşurdular. Bir nərdivana da Baba Yasavul çıxıb balta ilə kurqanın divarını yıxmaq və dağıtmaqla uğraşırdı.

Bir çox igidlər orada yaxşı hərəkət edib çox ox **(218 a)** yağdıraraq düşmənin başını qaldırmasına imkan vermirdi. Bəzi igidlər isə düşmənin zərbələrinə aldırmadan, ox və yayına baxmadan kurqanı dəlmək və dağıtmaqla məşğul idi.

Günəş çeşdə qalxmışdı, Dost bəyin adamlarının qazmaqda olduqları şimal-şərq bürcü dəlindi və onun adamları düşməni qaçırdıb bürc üstünə çıxdılar. O anda mərkəz adamları da nərdivanlardan qalaya çıxdılar. Tanrı təalanın lütfü və inayətiylə bu qədər qapalı və qorunaqlı bir kurqan iki-üç ulduz saatı ərzində zəbt edildi. İgidlər əllərində olan bütün qeyrət və diqqətii göstərdilər; qəhrəmanlıq şərəfi və yaxşı ad qazandılar.

Bəcur xalqı dinsiz idi və ifrat düşmənçilikdən başqa, bu xalq arasında kafirlərin adətlərinin yayıldığı və islam adətləri də o sürü arasında yox olduğu üçün qırğına yol verildi, qadın və uşaqlarının hamısı əsir edildi. Kurqanın şərq tərəfində savaş olmadığı üçün xeyli adam qaçıb qurtuldu. Təxminən üç mindən artıq adam öldürüldü.

Kurqan zəbt edildikdən sonra girib kurqanı dolaşdıq. Divarların üstündə, evlərdə, küçələrdə və civarda saysız ölü yatırdı. Gəlib keçənlər ölülərin üstü ilə yeriyirdi. Gəzintini bitirdikdən sonra dönüb sultanlarının **(218 b)** evinə endik. Bəcur vilayətini Xoca Kəlana ehsan etdik. Ona köməkçi olaraq bir çox yaxşı igidlər təyin etdikdən sonra axşam vaxtı ordugaha gəldik.

Ertəsi sabaha qalxıb Bəcur vadisindəki Baba-Qara çeşməsinə endik. Xoca Kəlanın şəfaətilə geri qalan bir neçə əsirin günahlarını bağışlayaraq qadın və uşaqlarını qaytarıb getmələrinə izin verdik. Yaxalanan bəzi sultanlar və sərkəşlər isə edam edildi. Sultanlarının başı və digər bir neçə baş bu zəfər xəbərilə birlikdə Kabilə göndərildi. Bədəxşan, Qunduz və Bəlxə zəfərnamələrlə birlikdə başlar da göndərildi.

Yusif-Zeyidən gəlmiş olan Şah Mansur Yusif-Zeyi bu zəfər və qırğında bizimlə birlikdə idi. Ona xələt geydirilib siyasət fərmanları yazılaraq get-

məsinə izin verildi.

Bəcura aid işləri həll etdikdən sonra çərşənbə axşamı günü, məhərrəm ayının doqquzunda [=11 yanvar] qalxıb bir küruh daha aşağıda həmin Bəcur vadisinə enilərək yüksək bir yerdə kəsilən başlardan bir minarə qurulması əmr edildi.

Çərşənbə günü məhərrəm ayının onunda dolaşmaq üçün atlara minib Bəcur qalasına getdik. Xoca Kəlanın evində içki məclisi quruldu. Bəcur civarındakı kafirlər bir neçə tuluq içində şərab gətirdilər.

Bəcurun şərab və meyvəsi bütünlüklə civardakı Kafiristandan gəlir. **(219 a)** Gecəni orada keçirib sabah tezdən kurqanın bürc və divarlarını tədqiq edərək təkrar ordugaha gəldim.

Ertəsi sabah qalxıb Xoca-Xızır çayının sahilinə, oradan da Çendavəl çayının sahilinə endik. Bəcur kurqanına kömək üçün təyin olunanların oraya getmələrinə izin verdikdən bir-iki gün sonra bu şeir ağlıma gəldi, onu yazıb Xoca Kəlana göndərdim:

Qərarü əhd be yar inçenin nəbud məra,
Gəzid heç ru məra kərd biqərar axir.
Be işvəhai-zəmanə çe çarə sazəd kəs
Bəcur kərd cüda yarra zi yar axir.

*Yarla əhd və qərarımız belə deyildi,*
*Axırda hicran məni biqərar etdi.*
*Zəmanənin işvələrinə qarşı nə çarə var ki,*
*Axırda Bacur yarı yardan ayırdı.*

Məhərrəm ayının on yeddisində, çərşənbə axşamı [=19 yanvar] Sultan Veys Səvadinin müxalifi Sultan Əlaəddin Səvadi gəlib sədaqətini bildirdi.

Cümə axşamı günü Bəcur ilə Çendavəl arasındakı dağda ov etdik. Bu dağın geyiyi qapqaradır, amma quyruğu başqa bir rəngdədir, deyəsən, buradan aşağıdakı Hindistanın geyiyi bütün qapqaradır. O gün sarı bir quş ələ keçdi, o da qaraydı, gözləri də qaraydı. Yenə o gün qartal bir geyik yaxaladı.

Əsgərin azuqəsi azalmışdı. Kəhrac dərəsinə **(219 b)** gedib azuqə aldıqdan sonra Sevada, Yusif-zeyi əfqanlarına hücum çəkmək niyyətilə cümə günü oradan atlanaraq Çendavəl ilə Bəcur çayının birləşdiyi yerdə Pənc-Kürə çayının aralığına endik.

Şah Mansur Yusif-zeyi bir qədər ləzzətli və kefləndirici kəmali[1] gətirmişdi. Bir kəmalini üçə bölüb bir parçasını mən yedim, birini Gədayi Tağayi, birini də Abdullah Kitabdar yedi. Çox sərxoş etdi. O dərəcədə ki, axşam vaxtında bəylər toplanan zaman görüşməyə çıxa bilmədim. Qəribə bir şey idi. İndi o cür kəmalidən birini bütün yesən belə o günkünün yarısı qədər sərxoşluq yaratmır.

---

[1] *Kəmali:* məcuna bənzəyən ləzzətli, nəşə verən narkotik bir maddə.

Oradan qalxıb Kəhrac dərəsi ilə Pişqram dərəsinin ağzına yaxın bir yerə, Pənc-Kürənin önünə endik. Bu yurdda ikən topuğa qədər qar yağdı. Buralarda qar nadir yağırmış, əhali heyrət elədi.

Sultan Veys Səvadinin də razılığı ilə əsgərin ehtiyacı üçün Kəhrac əhalisinə dörd min eşşək yükü azuqə vergisi qoyuldu və bu azuqənin yığımı üçün Sultan Veys göndərildi. Qaba dağ əhalisi heç bir zaman belə vergi verməmiş olduğu üçün azuqəni verə bilməyərək sıxıntıya düşdü.

Məhərrəm ayının iyirmi üçündə çərşənbə axşamı günü [=25 yanvar] Hindu bəyin komandanlığında əsgərlər Penc-Kurəyə axına göndərildi. **(220 a)** Pənc-Kürə dağın ortasından bir az daha yuxarıda yerləşi. Pənc-Kürə kəndlərinə gedə bilmək üçün bir küruha yaxın yamac dırmanmaq lazımdı. Əhalisi qaçıb getmişdi. Bir qədər davar, öküz və xeyli azuqə gətirdilər.

Ertəsi sabah əsgər bu dəfə Qoç Bəyin komandanlığında təkrar axına göndərildi. Ayın iyirmi beşində, cümə axşamı günü [=27 yanvar] əsgərə azuqə təmin etmək üçün Kəhrac dərəsinin içinə, Mandiş kəndlərinə endik.

Hümayundan sonra onunla doğma qardaş bir neçə oğlan dünyaya gəlmiş, lakin heç biri yaşamamışdı. Hindal isə hələ doğulmamışdı. Mandiş civarlarında olduğumuz günlərdə [Baburun arvadı və Hümayunun anası] Mahım [bəyimdən] bir məktub gəldi. Məktubunda «Mənə bəxtim və taleyim nə isə, istər oğlan, istər qız olsun, bir uşaq verin. Mən onu özümə övlad edib böyüdüm» deyə yazmışdı.

Bazar günü ayın iyirmi altısında biz hələ yurdda ikən Hindalı Mahıma verib məktublarla birlikdə Yusif Əli Riqabdar Kabilə göndərildi. Hindal hələ doğulmamışdı.

Bu sözün təfsilatı belədir: onun doğma bacı-qardaşlarından o zamana qədər ondan kiçık və digərlərinin hamısından böyük bir qardaşı və üç bacısı vardı. Mehricandan başqa hamısı kiçıkkən öldülər. Bir doğma qardaşının olmasını çox istəyirdi.

O günlərdə [Baburun digər arvadı] Dildar ağaçə hamilə idi. Mən də «Onun bir qardaşı olsaydı, yaxşı olardı» dedim. Validə həzrətləri də «Dildar ağaçə bir oğlan doğsa və onu alıb böyütsəm, necə olar?» dedi. Mən də «Çox yaxşı olar» dedim.

Qadınlar arasında oğlanmı, yoxsa qızmı olacaq deyə fala baxmaq adəti vardır. İki kağızdan birinə Əli və ya Həsən, digərinə də Fatma yazıb bu iki kağızı çamurla yoğurub bir tas suyun içinə qoyurlar. Hansı əvvəl açılırsa, ona görə hökm edirlər. Oğlan çıxsa oğlan, qız çıxsa qız olacaq deyirlər. Fala baxdılar və oğlan çıxdı. Müjdə olduğu üçün dərhal bir məktub yazıb göndərdik. Bir neçə gün sonra Allah bir oğlan əta elədi.

Məktubu almazdan üç gün əvvəl uşaq dünyaya gələr-gəlməz onu zorla anasının yanından alaraq evimizə gətirib saxlamışlar. Doğum xəbərini göndərdilər. Bu xəbər Bxirə alındığında gəldi və bunu uğur saydıq. Adını Hin-

dal qoydular. Bu şəkildə o mənim həm kiçık qardaşım, həm də oğlum olur[1].

Bu yurdda olanda Mandiş vilayətində dərənin ortasında, bir yüksək yerin üstündə daşlardan böyük bir taxt tikildi. Oraya ağ çadır və səfər çadırı birlikdə sığdı. Bu taxtın daşlarının hamısını içkilər və sipahilər daşımışdı.

Yusif-zeyi əfqanlarmdan Məlik Şah Süleymanın oğlu Məlik Şah Mansur gələrək öz sədaqətini **(220 b)** göstərdi. Yusif-zeyi ulusunun xeyri üçün onun qızını istədim. Biz o yurdda ikən Şah Mansurun qızıyla birlikdə Yusif-zeyinin cehizinin də gəldiyini xəbər verdilər. Axşam üstü şərab məclisi quruldu. Məclisə Sultan Əlaəddin də dəvət edilərək xas xələt əta edildi.

Bazar günü, ayın iyirmi səkkizində [=30 yanvar] qalxıb Kəhrac dərəsindən çıxıb endik. Şah Mansurun kiçık qardaşı Tavus xan qardaşı qızını biz o yurdda ikən gətirdi.

Bisut xalqının Bəcur kurqanındakılarla əlaqələri olduğu üçün onları köçürdüb Bəcur kurqanına gətirməsi üçün Yusif Əli Bəkavul oraya göndərildi. Kabildə qalan əsgərlərə də gəlmələri üçün fərmanlar göndərildi.

Səfər ayının üçündə, cümə günü [=4 fevral] Pənc-Kürə çayı ilə Bəcur çayının birləşdiyi yerə endik. Ayın beşində, bazar günü [=6 fevral] Bəcura gedib Xoca Kəlanın evində içki məclisi qurduq.

Ayın yeddisində, çərşənbə axşamı günü [=8 fevral] bəyləri və diləzaq əfqanlarmm böyüklərini çağırıb danışaraq buna qərar verildi: ilnin sonu gəlmiş və günəşin hut bürcünə girməsinə bir-iki gün qalmışdır, ovalardakı məhsul da tamamən yığılmışdı. Bu zamanda Səvada getsək, əsgər azuqə tapa bilməyəcək və korluq çəkəcəkdir. **(221 a)** Ona görə Enbaher və Pani-Yali yoluyla yürüyərək Heşnəgarin yuxarı tərəfindən Səvad çayını keçib Yusif-zeyiyə aid Səngür-Mahura qarşısındakı ovada yaşayan Yusuf-zeyi və Məhəmməd-zeyi əfqanlarına axın etmək lazımdır. Gələcək il bir az daha erkəndən, əkin zamanında gəlib bu əfqanların işini kökündən həll etmək lazımdır.

Buna qərar verib ertəsi çərşənbə axşamı günü Sultan Veys ilə Sultan Əlaəddinə atlar və xələtlər əta edib vədlərdə bulunub getmələrinə izin verdik və biz də oradan qalxıb Bəcur qarşısına endik. Şah Mansurun qızını səfərdən dönüncəyə qədər Bəcur kurqanında qoydum.

Ertəsi gün atlanaraq Xoca-Xızırı keçib endik. Xoca Kəlana burada ayrılması üçün izin verildi. Saray müxəlləfatı, artıq əsgər ləvazımı və ağır yüklər Künər yoluyla Ləmqana göndərildi.Ertəsi sabah qalxıb ağır yükü və dəvələri Xoca Mir Miranin idarəsinə verib Curğatu və Darvaza yoluyla Qaraquba keçidinə göndərdikdən sonra, biz də xəfif atlarla hızla irəliləyərək Enbaher keçidini aşıb ikindi vaxtından bir az əvvəl Pani-Yaliyə endik.

Uğanverdi bir neçə adamla birlikdə dil tutmaq üçün irəliyə göndərildi. Əfqanlarla aramız yaxın olduğu üçün erkəndən hərəkət etmədik. Uğanverdi

[1] Bu sözün təfsilatı belədir ibarəsi ilə başlayan abzasdan buraya qədər olan hissə rusça nəşrdə buraxılmışdır.

çeşt vaxtında gəldi. Bir əfqanı yaxalayıb başını kəsmiş, **(221 b)** gələrkən də başı yolda salmışdı. Arzu edilən dəqiq xəbəri gətirmədi.

Günorta üstü qalxıb Səvad çayı keçdik və ikindidən bir az əvvəl endik. Axşam üstü hərəkətə keçib sürətlə yürüdük. Günəş bir nizə boyu yüksələndə öncü olaraq göndərilmiş olan Rüstəm Türkmən əfqanların xəbərdar olub hərəkətə keçdiyi və xeyli əfqanın dağ yoluyla getdiyi xəbərini gətirdi. Bunu eşidincə daha da sürətli irəliləyərək axınçıları irəli göndərdik. Gedib bir çox əfqanı öldürüb başlarını kəsərək xeyli əsirlə birlikdə öküz və davar gətirdilər. Diləzaq əfqanları da bir neçə baş kəsib gətirdilər. Oradan qayıdaraq Katləng civarına endik. Saray müxəlləfatını sövq etməkdə olan Xoca Mir Miranın yanına qılavuz göndərib Məqamda bizə qoşulmas tapşırıldı.

Ertəsi sabah qalxıb Katləng ilə Məqam arasına endik. Şah Mansurun adamı gəldi. Xosrov Göyəldaş ilə Əhmədi Pərvançı xeyli adamla birlikdə müxəlləfatı qarşılamağa göndərildi və ayın on dördündə, çərşənbə axşamı günü [=15 fevral] Məqama enəndə gəlib bizə qoşuldular.

Burada otuz-qırx il əvvəl Şahbaz Qələndər adlı bir bidətçi çıxmış və Yusif-zeyilərin və diləzaqların bir qismini dindən çıxarmışdı. Məqam dağının önündə alçaq bir təpə **(222 a)** var. Oradan bütün ovalar görünür. Şahbaz Qələndərin qəbri orada idi. Ətrafı gəzərkən oraya gəldim, incələdim. «Belə havalı bir yerdə bidətçinin qəbri nə gəzir» deyə düşündüm. Əmr etdim, oranı dümdüz etdilər. Çox gözəl və havalı bir yer olduğu üçün orada bir az məcun yeyərək bir müddət oturduq.

## İLK HİNDİSTAN SƏFƏRİ

Bəcurdan Bxirəyə yürümək niyyətilə qayıtmışdım. Kabilə gələndən bəri hey Hindistan səfəri niyyətindəydim, amma bəzi maneələr üzündən nəsib olmurdu. Üç-dörd ay davam edən Bəcur səfərindən də əsgərin əlinə ciddi bir şey keçmədi.

Hindistanın sərhəddi Bxirə yaxın olduğu üçün «Dərhal və yüngül silahlarla girsək, görəsən, əsgərin əlinə bir şey keçərmi» deyə düşündüm. Bu niyyətlə dönərək əfqanlara axın edib Məqama enəndə mənə sadiq olan bəziləri belə dedilər: «Hindistana girsək, gərək əsaslı girək. Əsgərin bir qismi Kabildə qaldı və bir dəstə yaxşı igid də Bəcurda qoyuldu. Atların zəifliyi üzündən bir çoxları da Ləmqana döndü. Buraya gələnlərin atları elə bitkin bir haldadır ki, bir gün belə sürətli qaça bilməzlər».

Düzdür, bu sözlər doğru idi, lakin artıq qərar verilmişdi, bu hesablara aldırmadan sabah tezdən **(222 b)** oradan qalxdıq və Sind çayının keçidinə doğru hərəkətə keçdik.

Sind çayının keçidini aramaq üçün Mir Məhəmməd Caləban böyük və kiçık qardaşları bir neçə igid ilə birlikdə çayın yuxarı və aşağı tərəflərinə

göndərildi.

Əsgəri çay tərəfinə göndərib özüm də kərgədan ovlamaq üçün Kərkxana dedikləri Səvati tərəfinə getdim. Bir neçə kərgədan göründü, lakin cəngəllik çox sıxdı və cəngəllikdən dışan çıxmadılar. Balalı bir kərgədan düzlüyə çıxıb qaçmağa başladı. Bir çox ox atdılar. Kərgədan özünü yaxındakı cəngəlliyə vurdu. Cəngəllikə od vurdular, lakin o kərgədan tapılmadı. Digər bir kərgədan balası odda yanmış, qıvrılırdı. Onu boğazladılar və hər kəs bir parça aldı. Səvatidən dönüb ətrafı dolaşdıqdan sonra yatsı vaxtında ordugaha gəldik. Keçid aramağa gedənlər bir keçid tapıb qayıtmışdılar.

Ertəsi sabah cümə axşamı günü, ayın on altısında [=17 fevral] at, dəvə və yüklərlə birlikdə keçiddən keçdik. Ordugah bazarını, yayaları və eşşəkləri salla keçirdilər. O gün keçid başında ikən nilablılar zirehli bir at və üç yüz şahruxi hədiyyə ilə gəlib məni gördülər.

Hamı keçincə həmin gün günorta vaxtı hərəkət edilib gecənin bir pasına qədər yürüyərək, Keçəküt çayının yaxınına endik. Oradan da sabah hərəkət eddi və Keçəküt çayını keçib günortaya yaxın bir vaxtda Səngdəki keçidi aşaraq **(223 a)** düşərgə qurduq.

Seyid Qasım eşik-ağa çağdavul idi. Arxadan bizim qatarların dalınca gələn qücurları ələ keçirərək bir neçə baş kəsib gətirdi.

Səngdəkidən səhər vaxtı hərəkət etdik və günortadan az sonra Suhan çayını keçərək düşərgə qurduq. Əsgərin arxası gecə yarısına qədər gəlməyə davam etdi. Çox uzun bir köç idi, atların gücsüzlüyü və zəifliyi üzündən fövqəladə çətin oldu. Bir çox at geridə qaldı.

Bxirədən şimala doğru yeddi küruh məsafədə bir dağ vardır. Bu dağ *Zəfərnamə* və digər bəzi kitablarda Kuhi-Cud adıyla anılır. Bu adın verilməsinin səbəbini bilmirdim, amma sonradan öyrəndim: Bu dağda eyni atanın nəslindən olan iki xalq vardır, birinə Cud, digərinə Cəncuhə deyirlər. Bu dağdakı və Nilab ilə Bxirə arasındakı qəbilələrə əskidən bəri bunlar hökm edir və fərman verirlərmiş. Ancaq bu idarə dostcasına və qardaşcasına bir idarə imiş. Xalqdan hər istədiklərini ala bilmirlərmiş. Əskidən bəri vergi kimi bir şey müəyyənləşdirmişlər, bunların aldığı və onların verdiyi bundan nə artıq, nə də əskik deyilmiş. Müəyyənləşdirilən şey budur: ev başına bir şahruxi, hər ailə başçısı isə yeddi şahruxi verir və əsgərə də gedirlərmiş.

Cud və Cəncuhənin hər ikisi də bir neçə qola ayrılır. Bxirədən yeddi küruh məsafədə yerləşən bu dağ Hinduquş silsiləsinə aid olan Kəşmir **(223 b)** dağlarından ayrılaraq cənub-qərbə uzanmaq surətilə Dinqutun ayağında Sind çayında sona çatır. Bu dağın bir yarısında Cud, digər yansında isə Cəncuhə xalqı yaşayır. Bu dağa Cuda nisbətlə Kuhi-Cud demişlər.

Bunlar arasındakı ən etibarlı olan böyüyə ray deyə xitab edilir, digər kiçık qardaşa və oğluna da məlik deyirlər. CəncuhələrLəngər xanın dayıları olur. Suhan çayının civarındakı qəbilələrin hakiminin adı Məlik Həstdi. Əsil

adı Əsəddir. Hindistanlılar belə hərəkələri bəzən sükunla oxuyurlar, *xəbərə xəbr* dedikləri kimi, əsədə də *əsd* deyirlər və bu söz zamanla *həst* olmuşdur.

Biz enər-enməzLəngər xanı Məlik Həst Cəncuhənin yanına göndədik. Sürətlə gedib onu inayət və şəfqətimizə əmin edərək yatsı vaxtı özünü də götürüb gətirdi. Bir zirehli at gətirib mülazimət etdi. Özü iyirmi iki-iyirmi üç yaşlarında vardı. Bu xalqın heyvan sürüləri ordugahın ətrafında və civarında xeyli çox idi.

Hələ Hindistanı ələ keçirmək niyyətindəydik. Bxirə, Xoşab, Çanab və Cenyut kimi bir neçə vilayət nə müddətdir türk idarəsindəydi və bunları öz mülkümüz kimi düşünürdük; zorluqla, ya xoşluqla idarəni ələ alacağımıza əmindik. Bu səbəblə bu dağ xalqıyla yaxşı münasibətlərdə olmaq vacib və gərəkli idi. **(224 a)** Onun üçün də «Heç kəs bunların heyvan sürülərinə, ip ucu və iynə ulduzu qədər belə zərər və ziyan vurmasın» deyə fərman oldu.

Sabah oradan qalxıb günorta vaxtı Kəldə-Kəhara gəlib endik. Ətraf və civarı bol otluq idi. Bu Kəldə-Kəhar çox gözəl bir yerdədir. Bxirənin on küruh məsafəsində, Cud dağlarının arasında bir düzlük və bu düzlüyün ortasında böyük bir göl var. Bu göl ətrafındakı dağlardan yığılan yağış sularından yaranmışdır. Çevrəsi üç küruha yaxındır və şimal tərəfində gözəl bir çayır vardır. Qərbində isə dağın təpəsində bir çeşmə vardır. Bu su gölə baxan təpələrdə yaşamaq imkanı verdiyi üçün buraya Baği-Səfa adında bir bağ saldırdım. Çox gözəl, havalı və səfalı bir yerdədir. Daha sonra təfsilatıyla nəql ediləcəkdir.

Kəldə-Kəhardan səhər vaxtı atlandıq. Hemtatu keçidinin başında yerlilərdən bir neçə adak kiçik hədiyyəylə gəlib sədaqətlərini bildirdilər. Əbdürrəhim Şiğavulu da bu gələn adamlarla birlikdə Bxirə xalqını öz tərəfimizə çəkməyə çalışaraq «Bu vilayətlər əskidən bəri türkün olmuşdur, saqın ola ki qorxu və təlaşa yol verib xalqı təlatümə salmasınlar; bu vilayətin xalqı ilə səmimiyyətimiz vardır və heç bir yağmalama olmayacaqdır» deyə söyləməsi üçün Bxirəyə göndərildi.

Çeşt vaxtı keçidin dibinə enib **(224 b)** Qurban Çərxi və Əbdülmülük Həstinin rəhbərliyi altında yeddi-səkkiz adamı xəbər bilmək üçün irəli göndərldik. İləri gedənlərdən biri olan Mir Məhəmməd Mehdi Xoca yanında bir adam gətirdi. Bu əsnada əfqanların böyüklərindən bir neçəsi də hədiyyələrlə gəlib mülazimət etdilər. Xalqı öz tərəfimizə çəkmək üçün Ləngər xanla birlikdə bunları da Bxirə xalqının yanına göndərdik.

Keçidi aşıb cəngəllikdən çıxaraq, sağ və sol qollar ilə mərkəz səfləri nizamla düzərək Bxirəyə doğru hərəkət etdik. Bxirəyə yaxınlaşanda Bxirənin böyükləri ilə birlikdə Dövlət xan Yusif-Heylin oğlu Əli xanın adamlarından Siqdu oğlu Divə Hindu yanımıza gələrək bir at hədiyyə edib mülazimət etdi. Günortaya doğru Bxirə əhalisinə zərər və ziyan vurmadan Bxirənin şərqindəki Bəhət çayının kənarında bir otluqda düşərgə qurduq.

## BXİRƏNİN SON DÖNƏMİNƏ AİD TARİXİ BİLGİLƏR

Teymur bəyin Hindistan səfərindən bəri[1] Bxirə, Xoşab, Çanab və Cenyut kimi bir neçə vilayət Teymur bəyin övladlarının və onların soyundan gələnlərin və onlara tabe olanların hakimiyyəti altında idi. [Teymur bəyin oğlu] Şahrux Mirzənin nəvəsi və Suyurqatmış Mirzənin oğlu Sultan Məsud Mirzənin -ki, Kabil və Zabil vilayətinin idarəsini o zamanlar əlində tutduğu üçün ona Sultan Məsud Kabili deyirdilər- yetirmələrindən olan Mir Əli bəyin üç oğlu -Baba Kabili, Dərya xan **(225 a)** və sonraları Qazi xan dedikləri Apağ xan- Sultan Məsud Mirzənin oğlu Əli Əsgər Mirzənin ölümündən sonra Kabil, Zabil və bəhs edilən bu Hindistan vilayət və pərgənələrinə[2] zorla sahib olmuşdular. [Baburun babası] Sultan Əbu Səid Mirzənin zamanında Kabil ilə Qəznə bunların əlindən çıxdı, amma Hindistandakı vilayətlər bunların əlində qaldı.

Doqquzyüz onuncu ildə [=1504] Kabilə ilk gəldiyim il Hindistana girmək niyyətilə Xeybərdən keçərək Perşavəra gələndə Baqi Çağanyaninin qeyrətiylə aşağı Bəngəş tərəfində yerləşən Kühətə yürüyərək Əfqanistanın bir çox yerlərinə axın edib Bennu və Dəst yağmalandıqdan sonra Düki yoluyla çıxmışdıq.

O günlərdə Bxirə, Xoşab və Çanabin idarəsi Mir Əlinin nəvəsi və Qazi xanın oğlu olan Seyid Əli xanın əlində idi. O da İskəndər Bəhlul [Ludi] adına xütbə oxutdururdu və ona tabe idi. Bu səfərdən şübhələnib Bxirəyi buraxaraq Bəxət çayından keçib Bxirənin Şirqut kəndinə yerləşmişdi.

Bir-iki il sonra bizə görə Seyid Əli xanla əfqanların arası dəydi. O da bu üzdən qorxu və təlaşa qapılaraq bu vilayətləri o günlərdə Lahorun hakimi olan Tatar xan Yusif-heylin oğlu Dövlət xana [Ludi] **(225 b)** təhvil verdi. Dövlət xan da Bxirəni ən böyük oğlu Əli xana vermişdi. O vaxt Bxirə Əli xanın hakimiyyəti altında idi.

Dövlət xanın atası Tatar xan Hindistanı ələ keçirdikdən sonra Bəhlulu [Ludi] padşah edən altı-yeddi sərdardan biri idi və Setlüc çayının şimal tərəfindəki vilayətlərin hamısı bu Tatar xanda idi. Bu vilayətlərin gəliri üç kururdan[3] bir az artıqdır. Tatar xanın vəfatından sonra Sultan İskəndər öz padşahlığı zamanında bu vilayəti Tatar xanın övladından almış və mənim Kabil vilayətinə gəlişimdən bir-iki il əvvəl Dövlət xana yalnızca Lahoru vermişdi.

Ertəsi gün bəzi lazımi yerlərə axınçılar göndərildi. O gün Bxirəni gəz-

---

[1] Teymur bəy Hindistan səfərinə 1398-ci ilin martında başlamış və Dehli kimi uzaq yerlərə qədər axın edib yağmaladıqdan sonra 1399-cu ilin aprelində Səmərqəndə dönmüşdü.

[2] *Pərgənə:* Hindistanda böyük vilayətlərə tabe olan daha kiçık ərazi-inzibatı vahidlərinə verilən ad.

[3] *Kurur:* Hindistanda on milyona uyğun gələn bir rəqəm.

dim, həmin gün Səngər xan Cəncuhə gələrək at hədiyyə edib sədaqətini bildirdi.

Çərşənbə günü, ayın iyirmi ikisində [=23 fevral] Bxirənin böyükləri ilə tüccarlarını çağırıb dörd yüz min şahruxi asayiş fidyəsi alınmasına qərar verildi və bu iş təhsildarlara tapşırıldı. Təkrar hərəkət edib ətrafı gəzdik və bir gəmiyə minərək məcun yedik.

Bxirə və Xoşabda yaşayan bəlucların yanına Heydər Ələmdar göndərilmişdi. Onlar cümə axşamı sabahı badam çiçəyi rəngində cins bir at hədiyyə edərək sədaqətlərini bildirdilər.

Əsgərin Bxirə əhalisini taladıqları və soyduqları bildirildi. **(226 a)** Tez adamlar göndərib belə hərəkət ədənlərin bəzilərini edam etdirdim, bəzilərinin da burunlarını dəldirib ordugahd a gəzdirtdim.

Cümə günü xoşablıların ərzi-halı gəldi. Xoşaba getməyə Şah Şüca Arğunun oğlu Şah Həsən məmur edildi. Şənbə günü, ayın iyirmi beşində [=26 fevral] Şah Həsən Xoşaba göndərildi.

Bazar günü elə yağış yağdı ki, bütün düz yerlər su oldu. Bxirə ilə ordugahın yerləşdiyi bağlar arasında kiçık bir su vardı. Günortaya qədər onun genişliyi böyük bir çay qədər oldu. Bxirənin yaxınlığında bir ox atımından artıq yerdən keçid yoxdu, at üzdürərək keçirdilər. Günortadan sonra yüksələn suyu görmək üçün hərəkət etdim. Yağış və fırtına o qədər arttı ki, dönüb ordugaha gəlmək belə təhlükəli oldu.

Günortadan sonra bu daşan sudan, at üzdürərək keçdim. Əsgərdə fövqəladə bir vahimə yarandı. Çoxu çadırlarını və ağır yüklərini buraxıb zirehlərini və silahlarını çiyinlərinə alıb çılpaq atlarını üzdürərək keçdilər. Düz yerlərin hamısı su altında qalmışdı. Sabah tezdən gəmilər gətirib əsgərin çadırlarım və əşyalarını gəmiylə keçirdilər. Günortaya yaxın Qoç bəyin adamları suyun bir şeri qədər yuxarı tərəfinə gedib bir keçid tapdılar. Geridə qalanlar da keçiddən keçdilər.

Cahannüma dedikləri Bxirə kurqanının içində **(226 b)** bir gün qaldıq və çərşənbə axşamı sabah hərəkət edilib yağmurun və selin qorxusundan Bxirənin şimal tərəfindəki təpələrin üzərinə endik.

Bu arada təyin olunan pulu vaxtında ödəmirdilər. Vilayəti dörd hissəyə ayırdım və bəylərə bu pulu diqqətlə yıqmalarını əmr etdim. Bir hissəyə Xəlifə [Nizaməddin Əli Barlas], bir hissəyə Qoç [bəy], bir hissəyə [Dost] Nasir, bir hissəyə isə Seyid Qasım ilə Mühib Əli Qurçu təyin edildi. Türklərin yaşadıqları vilayətləri özümüzünkü saymışdıq. Bu üzdən də oralar yağmalanmadı.

Xalq arasında danışırdılar ki, türkə aid olan vilayətlərə sülh üçün elçi getsə, onların hakimləri problem yaratmayacaqlar. Beləliklə, rəbiüləvvəl ayının ilk günü, cümə axşamı günü [=3 mart] atası Sultan İskəndərin bu son beş-altı ay içində ölməsindən sonra Hindistan səltənətini əlinə alan Sultan

İbrahimin yanına elçi olaraq getməyi Molla Mürşidə tapşırdım və bir şahin göndərib əskidən türkə aid olan vilayətləri istədik. Dövlət xana və Sultan İbrahimə yazılmış məktubları təslim edib ağızdan söylənəcək sözləri də söyləyərək Molla Mürşidin getməsinə izin verildi.

Bu Hindistan əhalisi və ələlxüsus da əfqanlar çox axmaq, düşüncədən və tədbirdən uzaq insanlarmış. Nə düşmənçilik göstərərək vuruşmaq və qarşı çıxmaq, nə də dostluq yolunu **(227 a)** seçə bilirdilər. Dövlət xan göndərdiyimiz adamı uzun müddət Lahorda saxlamış, nə özü görüşmüş, nə də İbrahimin yanına göndərmişdi. Göndərdiyimiz adam da heç bir cavab ala bilmədən bir neçə ay sonra Kabilə qayıtdı.

Cümə günü, ayın səkkizində Şeybani Piyada ilə indi tüfəngəndaz olan Dərviş Əli Piyada Kabildən məktublarla birlikdə Hindalin doğum xəbərini gətirdilər. Bu xəbər hindin ələ keçirilməsi zamanı gəldiyi üçün bunu uğurlu əlamət sayaraq ona Hindal adını verdim.

Qənbər [Əli] bəy də Bəlxdən gələrək [Bədiüzzaman Mirzənin oğlu] Məhəmməd Zaman Mirzənin məktublarını gətirdi.

## BABURUN İÇKİ VƏ MƏCUN MƏCLİSLƏRİ

Ertəsi gün divan dağıldıqdan sonra gəzməyə çıxaraq bir gəmidə mey içdik. Məclisdəkilər Xoca Dost Xavənd, Xosrov [Göyəldaş], Mirim [Nasir], Mirzəqulu [Göyəldaş], Məhəmmədi [Göyəldaş], Əhmədi, Gədai, Numan [Çöhrə],Ləngər xan, Ruhdəm, Qasım Əli Tiryaki, Yusif Əli və Tanrıquludan ibarət idi.

Gəminin baş tərəfində bir talvar vardı, üstü düz idi, bir neçə adamla birlikdə mən burada oturmuşdum. Bir neçə adam da talvarın altında oturmuşdu. Gəminin arxa tərəfində da oturulacaq yer vardı; Məhəmmədi, Gədai və Numan orada oturmuşdular. İkindəyə qədər araq içdik. Arağın pisliyndən nifrət edib bu tərəfdəkilərin də razılığı ilə məcuna keçdik. Gəminin o biri ucundakılar bizim məcun yediyimizi **(227 b)** bilmədilər və araq içməyə davam etdilər.

Yatsı vaxtı gəmidən qalxıb gecə ordugaha gəldik. Məhəmmədi ilə Gədai məni mey içən zənn edərək yaxşı bir xidmətdə bulunaq deyə mey kuzəsini at üstündə növbə ilə daşıyaraq, çox nəşəli və gülər üzlə gəldilər və «Belə qaranlıq bir gecədə kuzəni özümüz növbə ilə daşıyaraq gəldik» dedilər.

Bu arada onlara məclisin və keflənmənin fərqli şeylər olduğunu anlatdılar, bir tərəfdə məcun yeyilmiş, digər tərəfdə isə içki içilmişdi. Məcun söhbəti ilə içki söhbəti heç bir zaman bir-birinə uymadığı üçün çox mütəəssir oldular.

Mən də «Məclisi pozmayın, mey içmək istəyən adam mey içsin, məcun istəyən adam da məcun yesin, amma heç kimsə bir-birinə sataşaraq dil

uzatmasın» dedim. Bəziləri mey içdi və bəziləri da məcun yedi. Məclis bir müddət daha güclüklə davam etdi.

Babacan Qanbuzi məclisdə yoxdu, ağ çadıra gələndə onu da çağırtdıq. Mey içmək arzu etdi. Turdu Məhəmməd Qıpçaqı da çağırdaraq sərxoşlarla söhbət arxadaşı elədik.

Məcun söhbəti ilə içki və şərab söhbəti heç bir zaman bir-birinə uymaz. Sərxoşlar hər tərəfdən pis sözlər söyləməyə başladılar, sataşmaların çoxu məcuna və məcun yeyənlərə tuşlanmışdı. Babacan da lülqənbər olub çox pis sözlər söylədi. Sərxoşlar dolu-dolu qədəhləri arxa-arxaya verərək Turdu Məhəmmədi də qısa bir müddətdə tam sərxoş etdilər. Vəziyyəti nə qədər düzəltməyə **(228 a)** çalışsaq da, fayda etmədi. Çox rəzalət oldu. Söhbətin dadı qaçdı və axırda hamı dağıldı.

Bazar ertəsi günü, ayın beşində [=7 mart] Bxirə vilayəti Hindu bəyə [Koçin] verildi. Çərşənbə axşamı günü də Çanab vilayətini Hüseyn İgrəkə [Həsən İgrək] ehsan edib oraya getməsinə izin verdik.

Bu vaxt Seyid Əli xanın Mənuçöhr xan adlı oğlu gəlib sədaqətini bildirərək bizə qoşuldu. O, Hindistandan yuxarıkı yolla bizə gələrkən Tatar Kəkərə təsadüf edir. O da bunu buraxmadan saxlayıb qızını verərək özünə kürəkən edir, buna görə də bir müddətdir onun yanında imiş.

Nilab ilə Bxirə dağlarının arasında cud və cəncuhə qəbilələrindən başqa, Kəşmir dağlarına bitişik yerlərdə cet, gücür və o tayfalardan bir çox qəbilə vardır və onlar hər dərədə-təpədə kəndlər salıb yaşayırdılar. Bunların hakimi və böyükləri kəkər qəbiləsidir.

Bunlardakı hakimiyyət də cud və cəncuhənin hakimiyyətinə bənzəyir. Bu dağın ətəyindəki qəbilələrin hakimiyyəti o zamanlarda eyni atanın oğulları olan Tatar Kəkər ilə Hati Kəkərin əlindəydi. Bunlar əmioğlu idilər. Bunların möhkəm yerləri uçurumlar və qayalıqlardır. Tatarın olduğu yerin adı Piralə idi və qarla örtülü dağdan olduqca aşağıda idi. Hatinin vilayəti isə dağa bitişik idi. Qələncər isə Babu xan **(228 b)** Bisuta aid idi. Hati onu da özünə tabe etmişdi.

Tatar Kəkər Dövlət xanı görmüşdü və ona itaət edən kimiydi. Hati isə getmirdi, fitnə-fəsadla məşğul idi. Tatar Hindistan bəylərinin sözü və ittifaqı ilə gəlib bir az uzaqdan Hatini mühasirə edir kimi bir mövqe tutmuşdu.

Bizim Bxirədə olduğumuz dönəmdə Hati ov bəhanəsi ilə gizlicə Tatarın üstünə hücum edib onu öldürdü, vilayətini, arvadlarını və nəyi varsa hamısını ələ keçirdi.

Günorta vaxtı gəzmək üçün atlanaraq gəmiyə girib araq içdik. Məclisdə Dost [Nasir] bəy, Mirzəqulu, Əhmədi, Gədai, Məhəmməd Əli Cəng-Cəng, Əsəs [Xoca Məhəmməd Əli Tağayi], Uğanverdi Moğol, çalğıcılardan Ruhdəm, Babacan, Qasım Əli [Tiryaki], Yusif Əli, Tanrıqulu, Əbülqasım və Ramazan Luli vardı. Yatsıya qədər gəmidə içib yatsı vaxtı tam sərxoş bir

halda çıxaraq ata minmiş, məşəli əlimə almış, çay sahilindən ordugaha qədər gah atın bir tərəfinə, gah digər tərəfinə əyilərək və çılğınca at qoşduraraq gəlmişəm. Çox sərxoş imişəm. Ertəsi gün bu şəkildə əlimə məşəl alıb qərargaha gəldiyimi danışdılar. Heç xatırlaya bilmədim. Evə gəldikdən sonra xeyli qusmuşam.

Cümə günü gəzmək üçün hərəkət edib gəmiylə suyu keçdik. O tərəfdəki bağları, çiçəkləri və şəkər qamışı əkilən yerləri dolaşıb vedrə və çarxları tədqiq edərək su çəkmə üsulunu soruşub **(229 a)** bir neçə dəfə su da çəkdik. Bu gəzinti zamanı məcun yedik.

Oradan dönəndə təkrar gəmiyə mindik. Mənuçöhr xana da məcun verilmişdi. O, məcunun təsiri altında o qədər qaldı ki, iki adam qoltuğuna girib qaldırdı. Bir müddət su ortasında lövbər atıb durduq. Ondan sonra da suyun aşağısına doğru xeyli getdik. Bir müddət sonra gəmini yuxarıya sürdürdük. O gecə gəmidə uyuyub səhərə doğru ordugaha gəldik.

Şənbə günü, rəbiüləvvəl ayının onunda [=12 mart] günəş həməl bürcünə girdi. O gün günorta vaxtı gəzmək üçün atlanaraq gəmiyə girib araq içdik. Məclisdə Xoca Dost Xavənd, Dost [Nasir] bəy, Mirim Nasir, Mirzəqulu, Məhəmmədi, Əhmədi, Yunus Əli, Məhəmməd Əli Cəng-Cəng, Gədai Tağayi, Mir Hurd, Əsəs, çalgıcılardan Ruhdəm, Babacan, Qasım [Əli Tiryaki], Yusif Əli, Tanrıqulu ilə Ramazan [Luli] vardı.

Çayın qollarından birinə girib bir müddət suyun aşağısına doğru getdik. Bhirənin bir az aşağısından çıxıb gec vaxt ordugaha gəldik. O gün Şah Həsən Xoşabdan gəldi. Elçi göndərib əskidən türkə aid olan vilayətləri istəyərək uzlaşmaya varıldığı üçün müəyyən edilən qədər axça da bizə təhvil verildi.

İstilər də bir az yaxınlaşdı. Hindu bəyə köməkçi olaraq Şah Məhəmməd Möhürdar, onun kiçık qardaşı Dost Möhürdar və digər bəzi uyğun igidlər seçilərək hər birinə vəziyyətlərinə görə **(229 b)** yerlər təsbit və təyin edildi. Bu yürüşlərə qeyrət edən və səbəb olanLəngər xana Xoşabı əta edib tuğ verərək, onu da Hindu bəyə köməkçi təyin etdik. Bxirədə olan türk və yerli sipahiləri də yer və ülufələrini artırıb Hindu bəyə köməkçi təyin etdik. Bunlardan biri adından yuxarıda da bəhs etdiyim Mənuçöhr xan, digəri isə Nəzərəli Türk idi (o, Mənuçöhr xanın qohumu idi), biri Səngər xan Cəncuhə, digəri də Məlik Həst Cəncuhə idi.

Vilayətin işini yoluna qoymaq ümidilə bu şəkildə qərar verdik və bazar günü, rəbiüləvvəl ayının on birində [=13 mart] Bxirədən qalxıb Kabilə doğru hərəkət etdik. Kəldə-Kəhara gəlib endik. O gün də çox yağış yağdı. Yapınçılı adamla yapınçısız adam arasında fərq qalmadı. Əsgərin ardı gecə yatsıya qədər gəlməkdə davam etdi.

Bu yerin və məmləkətin havasını və suyunu bilən adamlar, ələlxüsus da Kəkərin əski bir düşməni olan [Məlik Həst] Cəncuhə «Buralarda pis

adamlardan biri Hati Kəkərdir, yolu kəsən və camaatı pozan odur. Elə etməli ki, ya o, buralardan gitsin, ya da ona yaxşı bir dərs verilsin» deyə bildirdi. Biz də belə davranmağa qərara alıb ertəsi gün əsgəri Xoca Mir Miran ilə Mirim Nasırin idarəsinə verərək özümüz günortadan sonra əsgərdən ayrılaraq, bəhs edildiyi kimi, bu bir neçə gün içində Tatarı öldürüb onun vilayəti Piraləni alaraq orada olan Hati Kəkərin üstünə **(230 a)** göndərdik.

İkindi vaxtı bir yerə enib atlara yem verdikdən sonra yatsı vaxtı oradan təkrar atlandıq. Bələdçi Məlik Həstin Sürpa adlı gücürlü bir nökəri idi. Gecə yolu itirib səhərə yaxın endik. Bəy Məhəmməd Moğol ordugaha geri göndərildi. Sabah erkəndən hərəkətə keçildi. Quşluq vaxtında zirehlər geyib sürətlə yürüdük. Bir şeri məsafə qalanda Piralənin qaraltısı göründü. Axınçılar irəli göndərildi. Sağ qol alayında olan Qoç bəy Piralənin şərq tərəfinə vardı. Sağ qolun arxasından köməkçi qüvvələr göndərildi. Sol qol ilə mərkəz adamları Piralənin tam üstünə çıxdılar. Dost bəy kömək üçün Piralənin üzərinə yürüyən sol qolun arxasına göndərildi.

Piralə uçurumların üzərində yerləşir və iki yolu vardır. Biri bizim gəldiyimiz cənub-şərq yönündədir ki, uçurumların üstündən keçir. Yolun hər iki tərəfində sıldırımlar və uçurumlar var. Piraləyə yarım küruh qala qapısına varıncaya qədər dörd-beş yerdə yolun hər iki tərəfinə uçurumlar düzəldib yolu tək bir adam keçə biləcək qədər daraltmışlar. Bir ox atımı qədər məsafəni tək-tək və arxa-arxaya yürümək gərəkdir.

İkinci yol isə şimal-qərbindədir və geniş bir dərənin içindən gəlib Piraləyə çıxır. Bu yol da ancaq tək bir adam keçə biləcək qədər dardır. Bunlardan başqa heç bir tərəfdən yol yoxdur. Piralədə divar və mazğal olmasa da, onun zorla alınacaq yeri də yoxdur. Ətrafı yeddi-səkkiz və ya on kari dərinliyində **(230 b)** sarp qayalıqdır.

Öncə sol qol adamları boğazlardan keçib qapıya soxuldular. Hati özləri və atları zirehli otuz-qırx qədər süvarisi və çoxlu piyadası ilə axınçıları geri oturtdu. Axınçıların arxasınca köməyə göndərilən Dost bəy də yetişərək düşmənin bir çox adamını öldürüb məğlub etdi. Hati Kəkər o tərəflərdə cəsarəti ilə məşhurdur, lakin nə qədər mücadilə etsə də, bir şey çıxmadı və qaçdı. Bu boğazlarda müqavimət göstərə bilmədiyi üçün kurqanına gedincə, onu da qapada bilmədi. Axınçılar da onun arxasından dərhal kurqana girdilər və Piralə kurqanının boğaz və uçurumundan şimal-qərb tərəfinə qoşdular. Hati isə tək başına qaçıb çıxdı. Dost [Nasir] bəy burada da çox yaxşı hərəkət etdi və qəhrəmanlıq payəsi Dost bəyə verildi.

Mən də dərhal Piralə kurqanına girib Tatarın evlərinə endim. Axınçılar hərəkətə keçəndə mənim yanımda qalmalı olan adamların bir qismi də axına getmişdi. Bunların arasında Emin Məhəmməd Tarxan Arğun ilə Qaraca bu itaətsizlikləri üzündən əsgərin gözü önündə çırılçılpaq bir halda çölə göndərildi, Sürpa adlı gücürlü də onlara bələdçi olaraq verildi.

Ertəsi gün şimal-qərb tərəfdəki uçurumdan keçib otluğa endik. Vəli Xəzinəçi bir neçə yaxşı igidlə birlikdə ordunun yanına göndərildi.

Cümə axşamı günü, ayın on beşində [=17 mart] oradan hərəkət edərək Suhan çayının sahilində bulunan Əndərabəyə endik. **(231 a)** Bu Əndərabə kurqanı əskidən bəri Məlik Həstin atasına məxsus imiş. Hati Kəkər Həstin atasını öldürdükdən sonra xarab olmuşdu. O zaman da xarab idi.

O gün yatsı vaxtında Kəldə-Kəharda qalan ordu da gəlib bizə qoşuldu. Hati biz Tatarı alan vaxt Pərpət adlı bir qohumunu zirehli bir at və digər hədiyyələrlə birlikdə mənim yanıma göndərmişdi. Bizə təsadüf etmədən, geridə qalan orduya rast gəlmiş və uruğu ilə birlikdə gəlib hədiyyələrini təqdim edərək sədaqətini bildirdi.

Ləngər xan da bəzi işləri həll etmək üçün geridə qalan uruqlarla birlikdə Bhirədən gəlmişdi. İşini həll etdikdən sonra bəzi yerli adamlarla birlikdə yenidən Bhirəyə getməsinə izin verdik.

Oradan təkrar hərəkət edərək Suhan çayını keçib bir təpənin üzərinə endik. Hatinin qohumu olan Pərpətə xələt geydirib cazib fərmanlar və Məhəmməd Əli Cəng-Cəngin bir adamıyla birlikdə Hatiyə göndərdik.

Baba Dost ilə Xəlaxilin başçılığı altında Hümayunun bir neçə nökəri Hümayuna verilmiş olan nilab və qarluq həzarəsinə gəlmişdilər. Baba Dost darğa təyin olunması münasibətilə mənim qəbuluma gəlmişdi. Səngər Qarluq ilə Mirzə Məlvi Qarluq özləri ilə birlikdə otuz-qırx qarluq əyanını gətirdilər, onlar zirehli bir at hədiyyə edib sədaqətlərini bildirdilər. Diləzaq əfqanlarından da bir dəstə əsgər gəldi.

Ertəsi gün oradan qalxıb iki şeri yürüyərək təkrar endik. Bir yüksəkliyə çıxıb ordunu təftiş etdim. **(231 b)** Ordudakı dəvələri saymalarını əmr etdim, beş yüz yetmiş dəvə vardı.

Sünbül bitkisinin tərifi eşitmişdim, bu yurdda ikən gördüm. Bu dağ ətəyində sünbül bitkisi çox deyil, tək-tük olur. Bir az irəlidəki Hindistanın dağ ətəyində sünbül lap çox olur. Hindistanın heyvanları və bitkilərindən bəhs edərkən onda da danışacağam.

Buradan nağara vaxtı qalxıb çeşdə doğru Səngdəki keçidinin dibinə endikdən sonra günorta üstü təkrar hərəkət edib keçid və çaydan keçərək bir yüksəklikdə dayandıq. Oradan da gecə yarısı qalxıb Bxirəyə gedərkən keçdiyimiz keçidi seyr etmək üçün atlanmışdıq.

O keçiddə azuqə daşıyan böyük bir çərşənbə axşamı çamura batıb qalmışdı, sahibləri uğraşdıqları halda hərəkətə gətirə bilmirdilər. Bu azuqəni alıb bizimkilərə paylaşdırdıq. Tam zamanında önümüzə çıxan azuqə idi.

Günortaya yaxın gəlib Kabil çayı ilə Sind çayının birləşdiyi yerdən bir az aşağıda və əski Nilabdan bir az yuxarıda iki çayın arasına endik. Nilabdan altı gəmi gətirilib sağ və sol qollar ilə mərkəz arasında paylaşdırıldı və dərhal çayı keçməyə başladılar.

Bizim gəldiyimiz bazar ertəsi, çərşənbə axşamı və çərşənbə gününə qədər çayı keçməyə davam etdilər. Cümə axşamı günü belə xeyli adam hələ çayı keçməkdə davam edirdi.

Əndərabə civarında ikən Məhəmməd Əli **(232 a)** Cəng-Cəngin bir adamıyla birlikdə Hatinin yanına göndərilmiş olan Pərpət adlı qohumu bu çayın sahilində ikən gəldi və Hatidən zirehli bir at hədiyyə gətirdi. Nilab əhalisi də zirehli bir at hədiyyə gətirib mülazimət etdi.

Məhəmməd Əli Cəng-Cəngin Bxirədə qalmağ həvəsi vardı. Bxirə Hindu bəyə [Koçin] əta edilmiş olduğu üçün Bxirə ilə Sind çayı arasındakı vilayətləri və elləri (Qarluq həzarəsi, hati, qiyas, al və kitib) Məhəmməd Əli Cəng-Cəngə ehsan edildi. Qulluğu qəbul edən qulluq etsin, əgər hər hansı bir vilayət boyun əyməsə

Hər kim ki, boyunu qoymasa onu tiygəy,
Çapğay, talağay, müntiyü münqəd etgəy.
*Kim boyun əyməsə ona yetişsin,*
*Çapsın, talasın, müti və münqəd etsin.*

Bu ehsanlardan sonra Məhəmməd Əli Cəng-Cənge xas siyah qədifədən bir has başlıq və zirehli bir paltar da verdim. Tuğ da ehsan etdim.

Hatinin qohumunun getməsinə də izin verib Hatiyə bir qılınc, bir dəst paltar və təsəlli edici fərmanlar göndərdim.

Cümə axşamı günü, günəş doğarkən, çayın sahilindən hərəkət etdik. O gün məcun yeyərək nəfis gül bağlarıni seyr etdik. Ayrı-ayrı yerlərdə toplu halda ərğuvani güllər açılmış, bəzi yerlərə də qarmaqarışıq səpələnmişdi. Ordugahın yanındakı bir təpənin üzərində oturub gülzara tamaşa etdik. **(232 b)** Sanki paylaşdırılmış kimi, təpənin alt tərəfində hər yanda bir sarı, bir ərğuvani güllər sıra-sıra, müsəddəs bir şəkildə açılmışdı. İki tərəfdə gül o qədər çox deyildi, amma göz ala bildiyi qədər belə gülzar idi. Perşavər civarında bahar mövsümündə gözəl gülzar olur.

Səhər vaxtı o yurddan qalxdıq. Gələrkən çay sahilində nərildəyən bir şir kənara doğru çıxdı. Atlar şirin səsini eşidib hürkdülər və özlərini qaya və çuxurlara atdılar. Şir qayıdıb yenə cəngəlliyə girdi. Bir camış gətirib cəngəlliyə salaraq şiri qırağa çıxarmalarını əmr etdim. Təkrar kənara doğru çıxdı. Hər yandan oxla vurdular; mən də bir ox atdım. Halvi Piyadə nizə ilə vurmaq istərkən nizənin dəmirini dişləri ilə qırdı. Pars bir çox ox dəydiyi halda kolluğun dibində büzülmüş dururdu. Baba Yasavul qılıncını çıxarıb yaxınlaşdı, şir həmlə edərkən başına vurdu, sonra da Əli Sistani belinə vurdu. Şir özünü çaya atdı. Suyun içində ikən öldürdülər. Sudan çıxarıb dərisini soymalarını əmr etdim.

Ertəsi gün hərəkət edib Biqrama gedərək Kürə-Kətrini gəzdik. Burası zaviyə kimi, bir az dar, qaranlıq və kiçık bir binaydı. Qapısından girib iki-üç pillə endikdən sonra sürünərək girmək lazımdır. Şamsız girmək mümkün

deyil. Qabaq tərəfində saç və saqqal qırxmışlar, hər yana tük yığılmışdı. Bu **(233 a)** Kürə-Kətrinin ətrafında mədrəsə və karvansara hücrələri kimi çoxlu hücrə vardı. Kabilə ilk gəldiyim il Kühet, Bennu və Dəştə axın edəndə Biqramdakı böyük bir ağacı görməyə getmiş və Kürə-Kətrini görə bilmədiyimə təəssüf etmişdim. O qədər da təəssüf ediləcək bir yer deyilmiş.

O gün Şeyxim Mir-Sikarın yetişdirdiyi yaxşı bir şahinim itdi. Durna və kəkliyi çox yaxşı tuturdu. İki-üç dəfə tükünü tökmüşdü. Elə gözəl tuturdu ki, mənim kimi həvəssiz birini də quşbaz eləmişdi.

Məlik Bu xan ilə Məlik Musa başda olmaqla diləzaq əfqanlarının böyüklərindən altı adamın hərəsinə Hindistan ehsanı olaraq yüz misqal gümüş, bir paltar, üç öküz və bir camış, digərlərinə də mövqelərinə görə ağ axça, qumaş, öküz və camışlar ehsan edildi.

Əli-Məscidə enəndə diləzaq Yaqub-heyldən Məruf adında biri on qoyun, iki eşşək yükü düyü və səkkiz böyük baş pendir hədiyyə gətirdi.

Əli-Məsciddən sonra Yedə-Birə endik, oradan da günorta vaxtı Cuyi-Şahiyə gəldik. O gün Dost bəyi qızdırma tutdu.

Cuyi-Şahidən səhər vaxtı qalxıb Baği-Vəfada yemək yedik və günorta oradan hərəkət etdik. Gəndəməkin Siyah-Abından keçib axşamdan sonra bir otluqda atları doyurduq və bir-iki geri sonra atlandıq. Surxabdan keçərək **(233 b)** Kərkə enib uyuduq.

Dan ağarmadan öncə Kərkdən hərəkət edib Qaratu yolunun ayrıldığı yerə gələndə beş-altı adamla birlikdə Qaratuda salınan bağı seyr etməyə getdim. Xəlifə, Şah Həsən bəy və digər adamları Quru sayda məni gözləmək üzərə doğru yoldan göndərdim. Qaratuya gələndə Şah bəy Arğunun Qızıl adlı xəbərcisi Şah bəyin Kahanı alıb yağmalayaraq geri döndüyü xəbərini gətirdi.

Heç kimsənin irəliyə xəbər götürməməsi əmri verilmişdi. Günortaya doğru Kabilə vardıq. Qutlu Qədəm körpüsünə varıncaya qədər heç kim xəbərdar olmadı. Ondan sonra [Baburun oğulları] Hümayun ilə Kamran xəbər tutmuşlar, lakin ata minmələrinə yetəcək qədər vaxt qalmamış, çöhrələri tərəfindən əldə daşınaraq şəhər qapısıyla ərk qapısının arasına gəlib mülazimət etdilər.

İkindi vaxtı Qasım bəy şəhərin qazısı və Kabildə qalmış olan dost və ərbablar gələrək ziyarət etdilər.

Cümə günü, rəbiüləvvəl ayının ilk günündə [=2 aprel] ikindi vaxtı içki məclisi quruldu. Şah Həsənə öz paltarlarımdan bir dəst ehsan etdim. Şənbə günü səhər vaxtı gəmiyə minib səbuhi[1] keçirdik. Nur bəy bu məclisdə ud çaldı, o günlərdə hələ tövbəli deyildi. Günorta gəmidən çıxıb Külkinə ilə dağ arasındakı bağı seyr edib ikindi vaxtı Baği-Bənövşəyə gəlib içdik. Axşamüstü olanda Külkinə tərəfindən divardan çıxıb ərkə gəldim.

---

[1] *Səbuhi:* sərxoşluğun axşamdan qalma halını ötürmək üçün səhər vaxtı içki içmək.

## DOST NASİR BƏYİN ÖLÜMÜ

Çərşənbə axşamı günü, ayın beşində [=6 aprel], yolda **(234 a)** şiddətli bir qızdırmaya tutulmuş olan Dost [Nasır] bəy Allahın rəhmətinə qovuşdu . Buna çox mütəəssir oldum. Dost bəyin nəşini Qəznəyə götürüb Sultan-rövzəsinin qapısı önünə gömdülər.

Dost bəy çox yaxşı bir igid idi. Bəylikdə hələ yüksəlirdi. Bəyliyindən öncə içkilik zamanı bir neçə dəfə böyük şücaət göstərmişdi. Bunlardan biri budur: bir dəfə Əndicandan bir ağaclıq məsafədə yerləşən Ribati-Zövrəqə Sultan Əhməd Tənbəl bir gecə basqın edəndə mən on-on beş nəfərlə ona qarşı yürüyüb axınçılarını geri oturdaraq mərkəzə çatanda Tənbəl orada yüzə yaxın adamı ilə dururdu. O zaman mənim yanımda üç adam qalmışdı. Onlardan biri Dost Nasir, biri Mirzəqulu Göyəldaş, biri də Kərimdad idi. Mən yalnız yayımı almışdım. Tənbəl də bir adamıyla birlikdə səfdən bir az irəlidə dururdu. Tənbəl ilə qarşı-qarşıya gəldim. Dəbilqəsinə bir ox vurdum, bir ox da atdım. Bu ox onun qalxanıyla oxdanını dəlib bir-birinə tikdi. Buduma bir ox isabət etdirdilər. Tənbəl də qılıncıyla başıma vurdu. Başımda dəbilqə vardı və qəribədir ki, tək bir teli belə qırılmadı, lakin başımda dərin bir yara açıldı. Heç kimdən yardım gəlmədi və yanımda da heç kim qalmadı. Məcbur olaraq atın başını çevirdim. Məndən bir az arxada Dost bəy vardı və məndən sonra o vuruşdu.

Bir də Axsidən **(234 b)** çıxdığımız vaxt Baqi Hız ilə qılıncla vuruşdu. Ona hız [ibnə, oğlan] deyirlər, lakin qılıncına çox hakimdi. Axsidən çıxarkən yanımda səkkiz adamla tək başıma qaldığım zaman da Dost bəy mənimlə birlikdəydi və atı vurulan üçüncü adam o idi.

Bəy olduqdan sonra Süyünçük xan sultanlarla birlikdə gəlib Daşkənddə Əhməd Qasımı [Kuhbər] mühasirə edəndə onları məğlub edib içəriyə girdi. Mühasirə zamanı da yaxşı çarpışdı. Əhməd Qasım bunlara xəbər verməmədən şəhəri buraxıb çıxanda xanları və sultanları məğlub edib Daşkənddən çıxmağı bacardı.

Sonra Şirim Tağayi, Məzid Tağayi və onların yanındakılar düşmən olduqları zaman Qəznədən iki-üç yüz adamla sürətlə gələrkən bu moğollar üç-dörd yüz yaxşı igidi ona qarşı göndərdilər. Şirukan civarında önünə çıxanları möhkəm məğlub edib bir çox adamını atdan salaraq bir çoxunun da başını kəsib gətirdi.

Bəcur kurqanında da Dost bəyin adamları hər kəsdən daha öncə yetişərək divara çıxdılar. Piralədə də Dost bəy irəlilədi, Hatiyi məğlub edib qaçırtdı və Piralə zəbt edildi.

Dost bəyin ölümündən sonra onun vilayətini kiçık qardaşı Mirim Nasirə əta etdim.

Cümə günü rəbilülaxır ayının səkkizində [=9 aprel] kurqandan çarba-

ğa çıxdım. Çərşənbə axşamı günü, ayın on ikisində [=13 aprel] Sultan Hüseyn Mirzənin böyük qızı, Məhəmməd Sultan Mirzənin anası Sultanım bəyim Kabilə gəldi. O, iğtişaş zamanı Xarəzmə getmişdi. Yolbars **(235 a)** Sultanın kiçık qardaşı İsənqulu Sultan bu bəyimin qızını almışdı. İqamət olaraq ona Baği-Xəlvət təyin edildi. Bağa yerləşdikdən sonra gedib onu gördüm. Böyük bacı olduğu üçün yükündüm. O da yükündü. Yeriyib orta bir yerdə görüşdük. Bundan sonra daima bu üsula riayət etdik.

Bazar günü, ayın on yedisində [=18 aprel] uzun bir müddətdən bəri həbsdə olan nankor Baba Şeyxin günahını bağışlayaraq həbsdən çıxardım və ona xələt ehsan etdim.

Çərşənbə axşamı günü, ayın on doqquzunda [=20 aprel] günortaya doğru Xoca-Seyaran tərəfinə hərəkət etdilm. O gün oruc tutmuşdum. Yunus Əli və digərləri buna təəccüb edərək «Çərşənbə axşamı günü gəzməyə çıxmaq və oruclu olmaq çox qəribədir» dedilər. Bihzadiyə gəlib qazısı evinə endik. Gecə bir məclis düzəldi. Qazı «Mənim evində belə şeylər olmamışdır, lakin padşah hakimdir» deyə bıldirdi. Məclis ərbabı hazırlanmış olduğu halda, qazının xatiri üçün süfrəyə içki qoyulmadı.

Çərşənbə günü Xoca-Seyarana getdim.

Cümə axşamı günü, ayın iyirmi birində [=22 aprel] bağ saldırmış olduğum dağın çıxıntısına böyük bir yuvarlaq taxt tikdirdim.

Cümə günü körpüdən sala mindik. Ovçuların evlərinin qarşısına gələndə ovçular tutduqları ding deyilən quşu gətirdilər. Bundan öncə ding görməmişdim. **(235 b)** Görünüşü qəribə bir quşdur. Hindistan heyvanlarından bəhs edəndə onun haqqında məlumat veriləcək.

Şənbə günü, ayın iyirmi üçündə [=24 aprel] bu yuvarlaq taxtın üstünə çinar budağı və söyüd əkildi. Günorta içki söhbəti quruldu. Səhər vaxtı bu yeni taxtın üstündə səbuhi keçirdik. Günortadan sonra atlara minib Kabilə hərəkət etdik. Xoca-Həsənə gələndə bir müddət sərxoş yatıb uyuduq. Xoca-Həsəndən hərəkət edib gecə yarısı çarbağa gəldik.

Xoca-Həsəndə ikən Abdullah [Kitabdar] sərxoş bir şəkildə özünü paltarlı suya atmışdı. Bir az gec hərəkət etdiyi üçün soyuqdan üşüyərək bizimlə gələməyib gecəni Qutlu Xocanın [Göyəldaş] malikanəsində keçirib sabah, keçən günün ifrat sərxoşluğundan dərs alaraq tövbə edib gəldi. «İndilik bu tövbəyə əməl edib-etməməyi özün bilərsən, barı mənim məclisimdən başqa bir yerdə içməməyə tövbə et» dedim. Qəbul etdi və bir neçə ay buna əməl elədi, amma sonra dözə bilmədi.

Bazar ertəsi, ayın iyirmi beşində Bxirədə və ətraf vilayətlərdə asayiş yaratması ümidiylə orada qoyduğumuz Hindu bəy yanıma gəldi. Biz oradan qayıdan kimi bir çox əfqan və hindistanlı toplaşıb sülh və barışıq haqqında sözləri heçə sayaraq, bizə və sözlərimizə aldırmadan Bxirəyə Hindu bəyin üstünə yürümüşlər. Yerli əhali də əfqanlarm tərəfinə keçmiş, Hindu bəy də

Bxirədə qalma bilməyərək Hoşaba gedib Dinqut vilayətindən Nilaba, oradan da **(236 a)** Kabilə gəldi. Siktunun oğlu Divə Hindunu və digər bir hindusu da Bxirədən zəncirə vuraraq gətirtmişdi. Onlar bəzi şeylər verib azad oldular. Bu hinduslara at və paltar əta olunaraq getmələrinə izin verildi.

Cümə günü, ayın iyirmi doqquzunda [=30 aprel] məni qızdırma tutdu. Qan aldırdım. Gün aşırı, bəzən iki, bəzən də üç gündə bir hərarət gəlirdi. Hər hərarət gələndə tərləyirdim. On-on iki gün sonra Molla Haceki nərgizlə qarışdırılmış şərab verdi. Bir-iki dəfə içdim, bir xeyri dəymədi.

Bazar günü, cəmadiyüləvvəl ayının on beşində [=15 may] Xoca Məhəmməd Əli [Tağayi] Hastdan gəldi. Bir yəhərli at hədiyyə edib cizyə olaraq ağ axça da gətirdi. Məhəmməd Şərif Münəccim və Hast mirzələri də Xoca Məhəmməd Əli ilə birlikdə gəlib mülazimət etdilər.

Bazar ertəsi günü Molla Kəbir Kaşğardan gəldi. Məlik Şah Mansur Yusif-zeyi Yusif-zeyinin böyüklərindən altı-yeddi adamla birlikdə Sevaddan gəlib mülazimət etdi.

Bazar ertəsi günü, cəmadiyülaxırın ilk günündə [=31 may] Şah Mansurun başçılığı altında gələn Yusif-zeyi əfqanlarının böyüklərinə xələtlər geydirildi. Şah Mansura zireh və düyməsi ilə bir ipək paltar, birinə yələkli ipək paltar, digər altı adama isə ipək paltar geydirib getmələri üçün izin verdik. Əbuhədən yuxarı Sevad vilayətinə müdaxilə etməmələri, bütün rəiyyətləri **(236 b)** aralarından çıxarmaları, Bəcur və Sevadda əkinçi əfqanlarm divana altı min eşşək yükü azuqə verməleri qərarlaşdırıldı.

Çərşənbə günü, ayın üçündə [=2 iyun] müshil içdim. Sonra təkrar iki gün müshil içdim.

Şənbə günü, ayın altısında qəbz dərmanı içdim.

Bazar ertəsi günü, ayın səkkizində [=7 iyun] Xəlifənin böyük qızına Qasım bəyin kiçık oğlu Həmzənin toy hədiyyəsi gəldi; min şahruhiydi. Bir də yəhərli at hədiyyə etdi.

Çərşənbə axşamı günü Şah Həsən Bəy şərab söhbətinə izin istəyib başda Xoca Məhəmməd Əli [Tağayi] olmaq üzərə bəzi bəyləri və içkiləri öz evinə apardı. Yunus Əli və Gədai Tağayi mənim yanımda qaldılar. Mən hələ şəraba pəhrizli idim. Mənim ağlım basımda ikən başqalarının içdiyini və mən ayıq olduğum halda bir qisminin sərxoş olduğunu heç görməmişdim. «Gəlin, mənim yanımda üçün, bir az baxım. Ağlı başında olanlarla sərxoşların bir-birilə necə rəftar etdiklərini görüm» dedim. Çarbağın qapısında tikdirdiyim rəsm salonunun cənub-şərqində bir az kiçık və bəmbəyaz bir çadır qurulmuşdu, bəzən orada otururdum. Məclis orada quruldu. Sonra Masqara Qiyas da gəldi. Bir neçə dəfə zarafatla məclisdən çıxarılmasını əmr etdim. Axırda səs-küy salıb masqaralıqla məclisə daxil oldu. Turdu Məhəmməd Qıpçaq ilə Molla Kitabdarı da məclisə çağırdıq. Şah Həsənlə **(237 a)** onun evindəki məclisdə olanlara bədahətən söylənən bu rübaini yazıb göndərdim:

Əhbab ki, bəzmində gülüstan xasdır,
Bilməm, varmı bəzmində bizə dəstur,
Gər sərdə hüzur birlə cəmiyyət var,
Yüz şükür, bu cəm bihüzur ərməsdir.

Bu rübaini İbrahim Çöhrə vasitəsilə göndərdim. Günortadan sonra bu məclisdəkilər sərxoş olub dağıldılar.

Bu xəstəlik zamanı məni təxti-rəvanla əldə daşıyaraq aparırdılar. Bir neçə gün öncə qarışıq şərab içmişdim, amma bir faydası olmadığı üçün artıq içmirdim. Xəstəliyin axırına doğru talvarlı bağın cənub-qərb yönündə alma ağacı dibində bir məclis düzəldib qarışıq şərab içdim.

Cümə günü, ayın on ikisində [=11 iyun] Bəcurda köməkçi olaraq qoyduğum Əhməd bəy [Yusif Oğlaqçı] ilə Sultan Məhəmməd Dulday gəldi.

Çərşənbə günü, ayın on yeddisində [=16 iyun] Heydər Tağının bağında Tanrıverdi bəzi bəylərə və igidlərə ziyafət verirdi. Mən də o məclisə gedib içdim. Yatsı vaxtında oradan qalxıb gəldik və böyük ağ çadırda da içdik.

Cümə axşamı günü, ayın iyirmi beşində [=24 iyun] Molla Mahmudun yanında fıqh dərsi oxunmasına qərar verildi.

Çərşənbə axşamı günü, ayın sonuncu günündə Əbu Müslim Göyəldaş, Şah Şüca Arğunun hüzurundan elçi olaraq gəldi və hədiyyə olaraq cins bir at gətirdi. O gün Yusif Əli Riqabdar Çinar-Bağdakı hovuzda üzərək qulac atıb yüz dəfə dövrə vurdu. Bir dəst paltar, yəhərli bir at və ağ axça ehsan etdim.

Çərşənbə günü, rəcəb ayının səkkizində [=6 iyul] Şah Həsənin evinə **(237 b)** gedib içdim. Bəylərin və içkilərin çoxusu orada idi.

Şənbə günü ayın on birində [=9 iyul] məclis vardı, ikindi ilə axşam arasında böyük göyərçinxananın damının üstünə çıxaraq içdik. Bir az gec vaxtda bir neçə atlı Dih-əfqan yolundan şəhərə doğru keçirdi. Araşdırıldı. Dərviş Məhəmməd Sarban imiş, Mirzə xanın [Sultan Veys] hüzurundan elçi olaraq gəlirmiş. Dam üzərindən çağırdıq və «Mərasimlə elçilik eləməyi burax və dərhal gəl» dedik. Dərviş Məhəmməd gəlib söhbətdə oturdu. O zaman tövbəli olduğu üçün içmirdi. Sabaha qədər orada içdik. Ertəsi gün mən divanda oturanda isə mərasimlə və üsula uyğun olaraq gəlib Mirzə xanın göndərdiyi hədiyyələri təqdim etdi.

Keçən il min cür çətinlik və dərd-bəla ilə o tərəfdəki bütün aymaqları Kabilə köçürmüşdük. Kabil dar bir yerdir. Aymaqların və türklərin heyvanlarına asanlıqla qışlaq və yaylaq tapılmır. Köçəri xalqı öz xoşuna qoysan heç bir zaman Kabili istəməz. Onlar Qasım bəyə müraciət edərək o tərəfə keçmək üçün onu minnətçi saldılar. Qasım bəy çox israr etdi və axırda aymaqlara Qunduz və Bağlan tərəfinə keçmək üçün izin aldı.

Hafiz Mir Katibin böyük qardaşı Səmərqənddən gəlmişdi. Səmərqəndə getməsinə izin verib Polad Sultana divanımı göndərdim. Divanın arxası-

na yalnız bu qiəni yazdım: **(238 a)**

Ol sərvin hərəminə gər yetsən, ey səba,
Vergil bu hicr xəstəsindən yad könlünə.
Rəhm eyləyib yad qılmadı Baburu, var ümid,
Sala xuda rəhmi polad könlünə.

Cümə günü, ayın on yeddisində [=15 iyul] Şah Məzid Göyəldaş Məhəmməd Zaman Mirzənin adından cizyə və hədiyyə olaraq bir at gətirib sədaqətini bildirdi. O gün Şah bəyin elçisi Əbu Müslim Göyəldaşa xələt geydirlib ehsanlarda bulunularaq getməsinə izin verdim. Xoca Məhəmməd Əli [Tağayi] ilə Tanrıverdiyə də vilayətləri olan Hast ilə Əndəraba getmələrinə o gün izin verildi.

Cümə axşamı, ayın iyirmi üçündə [=21 iyul] Keçə-Qut və Qarluq civarında qoyaraq o vilayətlərin məsuliyyətini tapşırdığımız Məhəmməd Əli Cəng-Cəng Mirzə Məlvi Qarluqun oğlu Şah Həsən və Hatinin bir adamıyla birlikdə gəldi. O gün köçünü gətirmək üçün Səmərqəndə gedən Molla Əlixan da gəlib bizə qoşuldu.

## ƏBDÜRRƏHMAN ƏFQANLARININ ÜSTÜNƏ AXIN

Əbdürrəhman əfqanları Gərdiz sərhəddində yaşayırdılar. Vergi verməkdən və özlərini yaxşı aparmaqdan uzaqdılar. Gedən və gələn karvanlar da onlardan zərər görürdü. Çərşənbə günü, rəcəb ayının iyirmi doqquzunda [=27 iyul] bu əfqanlara axın etmək için hərəkətə keçdik. Təngi-Vağcan civarında enib yemək yedik və günortadan bir az sonra oradan hərəkət etdik.

Gecə vaxtı yolu itirərək Pəncab-Şahnənin cənub-şərqindəki təpə və ovalarda xeyli avara **(238 b)** olduq. Bir müddət sonra təkrar yolu taparaq Çeşmeyi-Pərə keçidindən aşıb Gərdiz tərəfinə baxan dərədən çıxdıq və sabah vaxtında düzlüyə çatıb axınçılar göndərdik.

Əsgərin bir qismi Gərdizin cənub-şərqində yerləşən Kirmas dağı tərəfinə axın etdi. Axınçıların arxasına Xosrov [Göyəldaş], Mirzəqulu [Göyəldaş] və Seyid Əli komandanlığında olan mərkəzin sağ qolu göndərildi. Əsgərin böyük hissəsi isə Gərdizin şərq tərəfinə, dərənin yuxarısına doğru axın etdi. Bu axınçıların arxasından da Seyid Qasım eşik-ağa, Mirşah Koçin, Qiyam bəy Orduşah, Hindu bəy, Qutlu Qədəm və Hüseyn komandanlığındakı əsgərlər göndərildi.

Əsgərin böyük hissəsi dərənin yuxarısına doğru axın etdiyi üçün geri qalanları göndərdikdən sonra mən də onların arxasından getdim. Bu dərənin yuxarı tərəfindəki əhali uzaqda iymiş. Oraya gedən əsgərlərin atı qüvvədən düşdü. Əsgərin əlinə ciddi bir şey keçmədi. Qırx-əlliyə qədər əfqan piyadası düzənlikdə göründü. Bu əsgərin arxasından gedənlər onlara doğru hücum edərək mənə adam göndərib xəbər verdilər. Mən də daha sürətlə çapdım.

Mən gələnə qədər Hüseyn Həsən heç bir şeyi hesablamadan tək başına əfqanların içinə girib qılıncını çəkəndə atını oxla vurmuşlar, qalxan kimi də ayağını kəsərək yıxmışlar. Hər tərəfdən bıçaqlayaraq parça-parça etmişlər. Bu arada da bizim igidlər sadəcə qarşıdan baxıb köməyə gedə bilməmişlər. Bu xəbər gəlincə Gədai  Tağayi, Payəndə Məhəmməd **(239a)** Qaplan, Əbülhəsən Qurçu və Mömin Atəkə komandanlığında olan igidləri dördnala irəli göndərib özüm də sürətlə irəlilədim.

Hamısından əvvəl Mömin Atəkə bir əfqanı nizə ilə yıxıb başını kəsib gətirdi. Əbülhəsən Qurçu da zirehsız olduğu halda yaxşı hərəkət edib əfqanların önünü kəsərək atını sürdü və bir əfqanı vurub başını kəsib gətirdi. Özü üç yerindən, atı da bir yerindən yaralanmışdı. Payəndə Məhəmməd Qaplan da yaxşı hərəkət edib bir əfqanı qılıncla vuraraq başını kəsib gətirdi. Gərçi Əbülhəsən ilə Payəndə Məhəmməd Qaplanın igidlikləri bundan öncə də məlum idi, bu dəfə isə hünərlərini daha artıq göstərdilər. Bu qırx-əlli əfqanın hamısı ox və qılıncla parçalandı. Bunlar kəsildikdən sonra bir otluğa enib bu əfqanların başından bir minarə qurulmasını əmr etdim.

Yolda gələrkən Hüseyn ilə birlikdə olan bəylər gəldilər. Sərt və qəzəblə danışaraq belə dedim: «Bu qədər adam qarşıdan baxa-baxa dümdüz bir yerdə belə bir igidi bir neçə piyada əfqana necə qapdırırsınız. Sizin hamınızın rütbələrini və imtiyazlarını, əlinizdəki pərgənə və vilayətləri alıb saqqallarınızı qırxaraq sizi şəhərlərdə gəzdirmək lazımdır, ta ki hamı belə bir igidi düşmənin əlində qoyan və dümdüz bir yerdə əlləri qoynunda (239b) durub baxanların cəzasının nə olduğunu bilsin».

Kirmaş tərəfinə gedən əsgər qoyun və qənimət alıb gəldi. Baba Qaşqa Moğol da Kirmaş tərəfinə gedən əsgərlərlə birlikdə getmişdi. Bir əfqan onu qılıncla vurmaq istəyəndə Baba Qaşqa daha cəld tərpənərək oxunu çəkmiş və bu əfqanı vurub yıxmışdı.

Sabah tezdən qalxıb Kabilə doğru atlandıq. Məhəmməd Bəxşi, Əbdüləziz Miraxur və Mir Xurd Bəkavula Çeşmeyi-Pərədə qalıb xalqdan qırqovul yığmaları əmr edildi. Mən də bir neçə adamla birlikdə hələ görməmiş olduğum Meydani-Rüstəm yoluyla getdim.

Meydani-Rüstəm dağların arasında yerləşir və dağın təpəsinə yaxın bir yerdədir. O qədər səfalı bir yer deyildir. İki dağın arasında bir az geniş dərəsi, cənub tərəfində təpənin ətəyində bir az kiçık bir çeşməsi və böyük-böyük qovaq ağacları vardır. Bu Meydani-Rüstəmin Gərdiz tərəfinə çıxan yolunda da çeşmələr və ağaclardan xeyli var, lakin ağacları bir az daha kiçıkdir. Düzdür, dərəsi bir az dardır, lakin bu ağacların dibi yamyaşıl gözəl çayırlardır və olduqca səfalı bir dərədir.

Meydani-Rüstəmin cənub tərəfindəki dağa çıxdıq, oradan Kirmaş və Bəngəş dağları ayaq altındakı kimi görünürdü. Kirmaş dağlarının o yanında mövsüm yağışı buludları tək-tük görünürdü. **(240 a)** Mövsüm yağışı olma-

yan bu vilayətlərdə isə bulud heç görünmürdü.

Günorta vaxtında Huniyə gəlib endik. Ertəsi gün Məhəmməd ağa kəndinin civarına enib məcun yedik və suya balıq otu atıb bir az balıq tutduq.

Bazar günü, şaban ayının üçündə [=31 iyul] Kabilə gəldik.

Çərşənbə axşamı günü, ayın beşində [=2 avqust] Dərviş Məhəmməd Fəzli ilə Xosrovun [Göyəldaş] nökərini çağıraraq Hüseyn yaxalandığı zamankı alçaqlıqlarının səbəbini soruşub rütbə və imtiyazlarını əllərindən aldıq. Günorta üstü çinar dibində içki məclisi quruldu. Baba Qaşqa Moğola xələt ehsan edildi.

Cümə günü, ayın səkkizində [=5 avqust] Mirzə xanın [Sultan Veys] yanına getmiş olan Kibək gəldi.

Cümə axşamı günü, ikindi vaxtı Xoca-Seyaran, Baran və Damən-Kuh tərəflərini seyr etmək üçün getdim. Yatsı vaxtında Mama-xatuna endim.

Ertəsi gün İstalifə gəlib endik. O gün məcun yedik.

Şənbə günü İstafildə içki məclisi quruldu.

Sabah İstafildən hərəkət edib Sincid-dərə arasından keçib Xoca-Seyaranın yaxınına gələndə yoğunluğu bilək qədər və uzunluğu bir qulac olan böyük bir ilan öldürüldü. Bu ilanın içindən ondan bir az incə başqa bir ilan çıxdı. Hər halda qısa bir zaman öncə udmuş olmalı, bütün orqanları tamamdı. İncə ilan o böyük ilandan bir az qısa idi **(240 b)**. Bu incə ilanın içindən də böyük bir siçan çıxdı; o da tamdı və hələ heç bir yerinə zərər gəlməmişdi.

Xoca-Seyarana gəlib içki məclisi qurduq. O gün Kiçkinə Tünqatar vasitəsilə digər tərəfdəki bəylərə əsgərin toplanacağı yer müəyyənləşdirilərək ordunun hərəkətə keçəcəyi bildirildi və təyin olunan yerə vaxtında gəlib çatmaları əmr edilərək fərmanlar göndərildi.

Sabah hərəkətə keçib məcun yedik və Pərvan çayının qovuşduğu yerə gedib o civardakı əhalinin üsulu ilə Pərvan çayına balıq otu ataraq bir çox balıq tutduq. Mir-Şah bəy bizi yedirib içirdi.

Buradan atlanaraq Gülbahara getdik. Axşamdan sonra içki məclisi quruldu. Bu söhbətlərdə Dərviş Məhəmməd Sarban da vardı. Gərçi igid və sipahiydi, lakin içki içmirdi, tövbəliydi. Qutlu Xoca Göyəldaş uzun zamandan bəri sipahiliyi tərk edib dərviş olmuşdu. Yaşı da xeyli çoxalmış, saqqalı ağappaq olmuşdu. Lakin bu hərif bu söhbətlərdə daima içirdi. Dərviş Məhəmmədə belə dedim: «Qutlu Xocanın saqqalından utan, özü dərviş, ixtiyar və ağ saqqallı olduğu halda daim içki içir. Sənsə sipahi, igid və simsiyah saqqallı olduğun halda heç bir zaman içmirsən. Bunun səbəbi nədir?» İçməyən adama içki təklif etmək mənim adətim və üsulum deyildi. Beləcə bir zarafat etdik və ona içki təklif etmədik. Sabah səbuhi məclisi keçirdik.

Çərşənbə **(24l a)** günü Gülbahardan hərəkət etdik. Əbun kəndinə enib yemək yedikdən sonra təkrar atlanaraq Bağati-xuma gedib düşərgə qurduq. Günortadan sonra içki söhbəti təşkil etdik.

Ertəsi gün oradan hərəkət edərək Xoca Hand Səidin məzarını ziyarət edib dönərək Çinə kurqanı yanından sala mindik. Pənchir çayının qarışdığı yerdə sal dağın çıxıntısına çarpdı və az qalsın batırdı. Ruhdəm, Tanrqulu və Mir Məhəmməd Caləban salın qayaya çarpması nəticəsində suya düşdülər. Ruhdəm ilə Tanrıqulunu zorla çəkib təkrar sala çıxardılar. Çini qədəhim, bir qaşıq və çalğı da suya düşdü. Oradan keçib Səngi-Bəndə doğrusuna gələndə sal suyun ortasındakı bir budağa, ya da bənd üçün çaxılmış bir qazığa çarpdı. Şah Şüca bəyin oğlu Şah Həsən [Arğun] arxası üstə düşdü və Mirzəqulu Göyəldaşı da özü ilə birlikdə götürdü. Dərviş Məhəmməd Sarban da suya düşdü. Mirzəqulu yaxşı hərəkət etdi, yıxılanda əlində qovun kəsməkdə olduğu bıçağı sala döşənmiş həsirə sapladı, amma yenə də suya yıxıldı. Mirzəqulu sala gəlmədən paltarlı şəkildə üzüb çıxdı. Saldan çıxıb o axşam salçıların evində qonaq olduq. Dərviş Məhəmməd mənə suya düşən yeddi rəngli qədəhin eynisi olan başqa bir qədəh hədiyyə etdi.

Cümə günü çayın sahilindən hərəkət etdik. İnçkədən aşağıda olan Kuhi-Beçənin təpəsinə enib öz əlimizlə **(241 b)** xeyli misvaq yığdıq. Oradan keçib xoca-xızırlılarla yemək yeyib təkrar atlandıq. Günorta vaxtı Qutlu Xocanın ərazisindən Ləmqan kəndinə endik. Qutlu Xoca hazır nə vardısa gətirdi, yedik. Oradan qalxıb Kabilə gəldik.

Bazar ertəsi günü, ayın iyirmi beşində [=22 avqust] Dərviş Məhəmməd Sarbana xassə xələt və yəhərli bir at əta etdim, o da nökərliyə birlikdə yüklündü.

Dörd-beş aydır saçımı kəsmirdim. Çərşənbə günü, ayın iyirmi yedisində saçımı kəsdirdim. O gün içki söhbəti yapıldı.

Cümə günü, ayın iyirmi doqquzunda [=26 avqust] Mir Xurd Bəkavul, Hindalın atəkəliyinə yükündürüldü və min şahruxi hədiyyə verdi.

Çərşənbə günü, ayın beşində [=31 avqust] Tülək Göyəldaşın Barlas Ciki adlı bir nökəri onun məktubunu gətirdi. Özbək axınçısı o civara gəlmiş və Tülək də qarşılarına çıxıb vuruşaraq onları məğlub etmişdi. O qasid əsir bir özbəklə birlikdə digər bir özbəyin də başını gətirdi.

Şənbə axşamı, ayın səkkizində [=3 sentyabr] Qasım bəyin evinə gedib iftar etdik, yəhərli bir at hədiyyə etdi. Bazar axşamı da Xəlifənin evində iftar edildi; o da yəhərli bir at bağışladı.

Ertəsi gün hərbi işlər üçün çağrılmış olan Xoca Məhəmməd Əli ilə Can Nasir vilayətlərindən gəldilər.

Çərşənbə günü, ayın on ikisində [=7 sentyabr] **(242 a)** daha öncə bəhs etdiyim kimi, mən Hastdan Kabilə gedən il Kaşğara getmiş olan [Baburun oğlu] Kamranın dayısı Sultan Əli [Mirzə Tağayi] gəldi.

## ƏFQAN QƏBİLƏLƏRİ ÜSTÜNƏ AXIN

Cümə axşamı günü, ayın on üçündə [=8 sentyabr] Yusif-zey tayfasının cəzalandırılması məqsədilə hərəkət edib Dih-Yaqub çayının Kabil tərəfindəki çayıra endik. Ata minəndə Babacan axtaçı (mehtər) atı bir az tərs tutduğu üçün hiddətimdən üzünə bir yumruq vurmuş və adsız barmağım dibindən qırılmışdı. O zaman o qədər ağrımadı, lakin bu yurda gəlib enəndə çox iztirab verdi. Bir müddət çox əziyyət çəkdim, yazı yaza bilmırdım. Axırda yaxşılaşdı.

Bu səfərə çıxdığımız yerdə xalam Dövlət Sultan xanımın Qutlu Məhəmməd Barlas adlı südqardaşı Kaşğardan xanım tərəfdən məktub və xəbər gətirdi. O gün diləzaq əfqanlarmm böyüklərindən Məlik Bu xan ilə Məlik Musa da gəlib hədiyyələr verərək mülazimət etdilər.

Bazar günü, ayın on altısmda [=11 sentyabr] Qoç bəy gəldi.

Çərşənbə günü, ayın on doqquzunda qalxıb Püt-haqdan keçərək bu Püt-haq irmağının sahilində hər dəfə endiyimiz yerə endik. Bamyan, Kahmərd və Quri kimi Qoç bəyə aid vilayətlər özbəklərə yaxın olduğu üçün Qoç bəyi bu yürüşdən azad edib ona öz sardığım yaylıq ilə bir dəst paltar ehsan etdikdən sonra yanımızdan ayrılıb öz vilayətinə getməsinə izin verdim.

Cümə günü, ayın iyirmi birində [=16 sentyabr] Badam-Çeşməyə endik. **(242 b)** Ertəsi gün də Barıq-Aba endik. Özüm Qaratuyu gəzib gəldim. Bu yurdda bir ağacda bal tapıldı.

Mənzildən-mənzilə hərəkət etdik və çərşənbə günü, ayın iyirmi altısında [=21 sentyabr] Baği-Vəfaya endik. Cümə axşamı günü də bu bağda qaldım.

Cümə günü qalxıb Sultanpurdan keçib endik. O gün Şah Mir Hüseyn vilayətindən gəldi.

Başlarında Məlik Bu xan və Məlik Musa olmaq üzərə diləzaq böyükləri də o gün gəldilər. Yusif-zeyinin uzaqlaşdırılması üçün Sevad üzərinə yürümək niyyətilə çıxmışdıq. Lakin diləzaq məlikləri «Heşnəgarda əhali də, azuqə də çoxdur» deyərək Heşnəgara yürüş üçün israr etdilər. Danışılıb məsləhət etdikdən sonra Heşnəgarda azuqə çox olduğu üçün oradakı əfqanların üstünə axın edilməsinə, Heşnəgar və ya Pərşavər kurqanlarından birindən anbar kimi istifadə edərək bu taxıldan ərzaq hazırlayıb bir dəstə igidlə birlikdə Şah Mir Hüseynin orada qoyulması qərara alındı. Bu iş üçün öz vilayətinə gedib hazırlığını görüb gəlmək üzərə Şah Mir Hüseynə on beş günlük bir müddət üçün izin verildi.

Ertəsi gün qalxıb Cuyi-Şahiyə gəlib endik. Tanrıverdi ilə Sultan Məhəmməd Dulday da sonradan bu yurdda olduğumuz vaxt gəlib yetişdilər. Həmzə də Qunduzdan o gün gəldi.

Bazar günü, ayın sonuncu günü [=25 sentyabr] Cuyi-Şahidən atlanaraq Qırıq-Arxa **(243 a)** endik. Mən bir neçə yaxın dostla birlikdə salla gəldim. Bu yurdda ikən bayram hilalı göründü. Dəreyi-Nurdan bir neçə heyvan

yükü şərab gətirmişdilər, axşamdan sonra içki məclisi quruldu. Məclisdə Mühib Əli Qurçu, Xoca Məhəmməd Əli Kitabdar, Şah [Şüca] bəyin oğlu Şah Həsən, Sultan Məhəmməd Dulday və Dərviş Məhəmməd Sarban vardı. Dərviş Məhəmməd tövbəliydi. Kiçıklikdən bəri mənim adətim də eyləydi ki, içməyən adamı zorla içirtməzdim. Dərviş Məhəmməd hər zaman söhbətlərdə iştirak edir, amma içməsi üçün heç bir şəkildə israr edilməzdi. Xoca Məhəmməd Əli bir seçim şansı qoymadan zorla ona şərab içirtdi.

Bazar ertəsi, bayram günü hərəkət etdik. Yolda baş ağrısından qurtulmaq üçün məcun yedik. Məcunun təsiri altında ikən xənzəl[1] gətirdilər. Dərviş Məhəmməd xənzəli heç görməmişdi. Mən bunun Hindistan quvunu olduğunu söylədim və bir dilim kəsib verdim. İştahla dişlədi və acısı axşama qədər ağzından getmədi.

Gərm-Çeşmənin təpəsinə enib yemək yedikdən sonra xeyli müddətdən bəri öz vilayətində olanLəngər xan da at və bir xeyli məcun hədiyyəsi ilə gəlib bizə qoşuldu. Oradan qalxıb Yedəbirə endik. İkindi vaxtında bir neçə yaxın dostla sala minərək bir küruh qədər aşağı gedib çıxdıq.

Ertəsi gün də oradan qalxıb Xeybər keçidinin dibinə **(243 b)** endik. O gün Sultan Bəyazid bizim xəbərimizi alınca Bare yoluyla Nilabdan keçərək arxamızdan gəldi və belə ərz etdi: «Afridi əfqanları ailə və mallarıyla Baredə otururlar. Çoxlu düyü əkmişlər, tarlalarda düyü yetişmiş, ancaq yığılmamışdır». Amma biz Heşnəgardakı Yusif-zeyi əfqanlarının üstünə yürümək niyyətilə yola çıxdığımız üçün ona önəm vermədik.

Günorta Xoca Məhəmməd Əlinin [Kitabdar] çadırında şərab məclisi oldu. Tam bu məclisdəykən Sultan Tərahi vasitəsilə bu tərəflərə gəlməyimizin səbəbini açıqlayaraq Bəcura, Xoca Kəlana məktub göndərdik. Fərmanın haşiyəsinə bu beyti yazdım:

Səba, bə lütf bigu an ğəzəli rənara,
Ki sər bə kuhi biyaban to dadeyi-mara.
*Ey səba, lütfən, o gözələ söylə:*
*Bizi dağlara və çöllərə atan sənsən.*

Oradan sabah tezdən hərəkət edib keçiddən endik və Xeybər boğazından keçərək Əli-Məscidə gəldik. Oradan günorta üstü hərəkət edib müxəlləfatdan ayrılaraq iki pas sonra Kabil çayının sahilinə gəlib bir az uyuduq. Səhər vaxtı bir keçid taparaq sudan keçdik.

Önçülərimiz əfqanlarm xəbər alaraq qaçdıqlarını bildirdi. Yürüyüb Sevad çayından keçib əfqanlarm əkinləri arasına endik. Deyilənlərin yarısı, hətta dörddə biri qədər belə azuqə yox idi. Heşnəgarı bu azuqə ümidi **(244 a)** ilə gücləndirmək şəklindəki hesabımız baş tutmadı. Bu səfərə qeyrət etmiş olan diləzaq məliklərinin canları da bu üzdən sıxıldı.

İkindi vaxtı Sevad çayının Kabil tərəfinə keçib endik. Ertəsi gün Se-

[1] *Xənzəl:* yabanı qabaq, Hindistanda yetişən acı bir meyvə.

vad çayından qalxıb Kabil çayından keçərək endik. Toplantıya qatıla biləcək bəylər çağrılıb danışıldı və Sultan Bəyazidin dediyi kimi afridi əfqanlarına axın edib onların malları və azuqəsi ilə birlikdə Perşavər kurqanını hazırlayaraq orada əsgər saxlanılmasına qərar verildi. Hindu bəy Koçin və Hast mirzələri bu mənzildə arxamızdan gəlib yetişdilər.

O gün məcun yedik. Məclisdə Dərviş Məhəmməd Sarban, Məhəmmədi Göyəldaş, Gədai Tağayi və Əsəs [Xoca Məhəmməd Əli Tağayi] vardı. Sonra Şah Həsəni də dəvət etdik. Yeməkdən sonra ikindi vaxtı sala mindik. Ləngər xan Niyazini də sala çağırdıq. Axşam vaxtı saldan çıxıb ordugaha gəldik.

Verdiyimiz qərara görə, çayın sahilindən səhər vaxtı qalxıb Camdan keçərək Əli-Məscid çayının mənbəyinə endik. Arxamızdan gələn Əbülhaşim Sultan Əli belə dedi: «Ərəfə gecəsi Cuyi-Şahidə Bədəxşandan gələn bir adama birlikdə Cam çayından keçdim. Mənə Sultan Səid xanın Bədəxşan üstünə gəldiyini dedi. Mən də bunu padşaha xəbər vermək üçün gəldim». Bəyləri çağıraraq vəziyyəti dəyərləndirdik. Bu xəbər üzündən kurqanı **(244 b)** hazırlamağı uyğun görməyərək Bədəxşana getmək üzrə geri döndük.

Ləngər xana xələt geydirib Məhəmməd Əli Cəng-Cəngə köməkçi təyin edərək getməsinə izin verdim. O gecə Xoca Məhəmməd Əlinin [Kitabdar] çadırında içki məclisi quruldu. Sabah tezdən buradan qalxıb Xeybər keçidini aşaraq keçidin dibinə endik.

Xızır-xeyl əfqanlarından çox nalayiq hərəkətlər görünmüşdü. Əsgər gedib-gəlirkən geridə qalan və kənara düşən əsgərlərə ox atıb atlarını götürürdülər. Onlara hədlərini bildirmək və cəzalandırmaq zəruri idi. Bu niyyətlə səhər vaxtı keçidin altından qalxdıq, günorta yeməyini Dih-Gülamanda yeyib atlara da yem verdikdən sonra günorta təkrar atlandıq.

Kabildə olanların oradakı Xızır-xeyl əfqanlarını həbs etmələri və mallarını müfəssəl siyahıya alıb yazılı xəbər vermələri və Bədəxşandan da hər hansı bir xəbər gəlsə, izah edib bir adam vasitəsilə dərhal göndərmələri üçün Məhəmməd Hüseyn Qurçu təcili Kabilə göndərildi.

O gecə ikinci pasa qədər yürüyüb Sultanpurdan bir az irəlidə endik. Orada bir az uyuduqdan sonra təkrar atlandıq. Xızır-xeyllər Behar və Mihqramdan Qarasuya qədər olan yerlərdə yaşayırlarmış. Sabaha doğru gedib axınçılar göndərdik. Mallarının və çoluq-çocuqlarının böyük qismi əsgərin əlinə düşdü. Az bir qismi isə dağa yaxın olduğu üçün oraya qaçaraq qurtuldu.

Sabah tezdən Kılağuya **(245 a)** endik. Burada qırqovul aldıq. Geridə qalmış olan müxəlləfat da o gün gəlib bizə qoşuldu.

Vəziri əfqanları vergilərini hər zaman nizamlı bir şəkildə vermirdilər. Qorxularından üç yüz qoyun hədiyyə gətirdilər.

Barmağım qırılalı heç bir şey yaza bilmirdim. Bu yurdda bazar günü,

ayın on dördündə [=9 oktyabr] az bir şey yazdım.

Ertəsi gün xırılçı və səmu-xeyl əfqanlarının böyükləri gəldilər. Diləzaq əfqanlarının böyükləri də onların günahlarının bağışlanmasını israrla xahiş etdilər. Günahlarını bağışlayıb əsirləri azad elədik. Vergilərini dörd min qoyun olaraq müəyyənləşdirib böyüklərinə xələt geydirərək təhsildarlar təyin edib göndərdik.

Bu işi bitirdikdən sonra cümə axşamı günü, ayın on səkkizində [=13 oktyabr] oradan qalxıb Behara və Mihqrama endik, ertəsi gün də Baği-Vəfaya gəldik. Baği-Vəfanın çox gözəl zamanıydı. Meydanlar tamamilə yoncalıqdı, nar ağacları saralmışdı. Payız gözəl rəngini almışdı. Ağaclarda narlar qıpqırmızı olmuşdu. Portağal ağacları yaşıl idi və ağaclardakı portağallar hələ tam saralmamışdı. Narı bizim vilayətin yaxşı narı qədər olmasa da yaxşı idi. Baği-Vəfadan ilk dəfə belə bir həzz aldıq. Burada olduğumuz üç-dörd gün ərzində **(245 b)** bütün əsgərlər doyunca nar yedi.

Bazar günü oradan hərəkət etdik. Mən bir pəhərə qədər bəzi portağalları payladım. Şah Həsənə iki ağacın portağalı ehsan edildi, bəzi igidlərə bir ağacın portağalı, bəzilərinə iki adama bir ağacın portağalı ehsan edildi. Qışda Ləmqanı seyr etmək niyyətində olduğum üçün hovuz kənarındakı iyirmiyə qədər portağal ağacının mənim üçün qorunmasını əmr etdim. O gün Gəndəməyə, ertəsi gün isə Çiydəliyə endik.

Axşama yaxın şərab məclisi quruldu. İçkilərin çoxu orada idi. Söhbət sona çatarkən Qasım bəyin bacısı oğlu Gədai Behcət xeyli masqaralıq elədi. Sərxoş olunca mənim yanımdakı yastığa söykəndi. Gədai Tağayi onu məclisdən əlində qaldırıb çıxardı.

Sabah tezdən o yurddan qalxdıq. Quru say tərəfindəki Barıq-Abı bir aşağı-bir yuxarı dolaşmağa getdim. Bir neçə sərv ağacı fövqəladə gözəl saralmışdı. Orada enib yılqıran yeməyi yedik. Payızın şərəfinə şərab içdik. Yoldan qoyun gətirərək kabab çəkməyi əmr etdim. Palıd budaqlarına od vurub seyr etdik.

Molla Əbdülməlik Divanə gəlməkdə olduğum xəbərini Kabilə aparmaq üçün izin istədi. Molla Əbdülməlikə bu izin verilərək Kabilə göndərildi. Həsən Nəbirə də məni görmək üçün Mirzə xanın [Sultan Veys] yanından gəlmişdi, burada gəlib **(246 a)** mülazimət etdi. Günortaya qədər orada içdik, sonra hərəkət etdik.

Məclisdəkilər çox sərxoş olmuşdular. Seyid Qasım elə sərxoş olmuşdu ki, iki nökəri onu at üstünə qoyaraq çətinliklə ordugaha götürdü. Dost Məhəmməd Bağır da elə sərxoş olmuşdu ki, Emin Məhəmməd Tarxan ilə Məsti Çöhrə nə qədər çalışsalar da, onu ata mindirə bilmirlər. Başına su tökürlər, yenə olmur. Bu arada xeyli əfqan ortaya çıxır. Emin Məhəmməd Tarxan şərabın təsiri ilə «Onu bu şəkildə düşmənin əlinə verməkdənsə, başını kəsib aparım» deyə düşünür və min bir çətinliklə atın üstünə qoyub gətirirlər.

Gecə yarısı Kabilə gəldik. Kaşğara Sultan Səid xanın yanına elçi olaraq getmiş olan Qulu bəy [Arğun] geri qayıtmışdı, sabah divana gəlib mülazimət etdi. Qulu bəylə birlikdə Bişkə Mirzə İtərçini elçiliyə göndərmişdi, o, vilayətin məhsulundan bir qədər hədiyyə gətirdi.

Çərşənbə günü, zülqədə ayının ilk günü [=25 oktyabr] Kabilin məzarı qarşısına gedib tək başıma səbuhi içdim. Məclis əhli sonra bir-bir, iki-iki gəldi. Günəş doğandan sonra Baği-Bənövşəyə gedib hovuz kənarında içdik. Günortaya doğru uyuduq və günorta təkrar içdik. Bu günorta söhbətində bundan əvvəlki söhbətlərdə şərab təklif edilməyən Tanrıqulu bəylə Məhəndiyə **(246 b)** şərab verdim. Yatsı vaxtı hamama gəldim. O gecəni hamamda keçirdim.

Cümə axşamı günü Yəhya Nuhani başda olmaq üzrə Hindistan tüccarlarına xələtlər ehsan edərək getmələrinə izin verdim. Şənbə günü, ayın dördündə isə [=28 oktyabr] Kaşğardan gələn Bişkə Mirzəyə xələt geydirilərək ehsanlarla birlikdə getməsinə izin verdim.

Bazar günü qapı üzərindəki kiçık rəsm salonunda söhbət etdik. Dar bir hücrə olmasına baxmayaraq məclisdə on altı adam vardı.

## BABURUN XƏZAN SEYR ETMƏK ÜÇÜN İSTALİFƏ GETMƏSİ

Çərşənbə axşamı günü xəzan seyr etmək üçün İstalifə getdim. O gün məcun yemişdim. Gecə çox yağış yağdı. Mənimlə birlikdə gələn bəylərin və içkilərin çoxu Baği-Kəlan içində qurulmuş olan çadırıma girdilər.

Ertəsi gün bu bağda şərab məclisi qurduq və axşama qədər içdik. Sabah olanda isə səbuhi elədik. Sərxoş olaraq uyuyub günorta vaxtı İstalifdən hərəkət etdik, yolda məcun yedik. İkindi vaxtına yaxın Bihzadiyə gəldik.

Xəzan fövqəladə gözəl olmuşdu. Xəzan seyri zamanı şəraba meylli olanlar içki istəməyə başladılar. Məcun yemiş olmamıza baxmayaraq xəzan fövqəladə gözəl olduğu üçün xəzana uğrayan ağacların altında oturaraq şərab içdik. Yatsı vaxtına qədər eyni yerdə söhbət etdik. Molla Mahmud Xəlifə gəldi. Onu da söhbətə dəvət etdik. Abdullah [Kitabdar] yaman sərxoşdu. Xəlifənin ağzından bir söz çıxdı, **(247 a)** Abdullah isə Molla Mahmudun fərqində olmadan bu misranı oxudu:

Bər hər ki bengəri be həmin dağ mübtəla əst.
*Kimə baxsan, bu dərdə mübtəladır.*

Molla Mahmud ayıqdı, bu misranı oxuduğu üçün Abdullahı zarafatla daşlamağa başladı. Abdullah durumun fərqinə varınca, təlaşlandı və onu yatışdırmaq üçün xeyli şirin söz söylədi.

Cümə axşamı günü xəzanı seyr edib axşamdan sonra çarbağa gəlib endim. Cümə günü, ayın on altısında [=9 noyabr] Bağı-Bənövşədə məcun yeyib bəzi yaxın dostlarla gəmiyə mindik. Hümayun ilə Kamran [Mirzə] də

bir az sonra gəldilər. Hümayun məharət göstərərək bir ördək vurdu.

Şənbə günü, ayın on səkkizində [=11 noyabr] çarbağdan gecə yarısı hərəkət etdim. Mühafizləri və mehtərləri geri göndərdim. Molla Baba körpüsündən keçib Divrin boğazından çıxaraq Quş-Nadiri və bazarların kəhrizi ni xırsxana arxasından dönərək sabah tezdən Turdu bəy Xaksarın kəhrizinə gəldim. Turdu bəy bunu xəbər alıb tələşla qoşaraq qarşıma gəldi.

Turdu bəyin kasıblığı məlumdu. Yanımda yüz şahruxi götürmüşdüm. Turdu bəyə verdim və «Şərabı və digər gərəkli şeyləri hazırla, tək və ləvəndanə bir məclis istəyirəm» dedim. Turdu bəy şərab üçün Bihzadi tərəfinə getdi. Atımı Turdu bəyin adamlarından birinə verdim və gedib kəhrizin arxasında bir təpədə oturdum. Bir pas keçmişdi ki, **(247 b)** Turdu bəy bir kuzə şərab gətirdi. Qarşılıqlı oturub içməyə başladıq.

Turdu bəy şərab gətirdiyi vaxt Məhəmməd Qasım Barlas ilə Şahzadə [Şah İsmayılın oğlu Təhmasib] bunu eşitmişlər. Məndən xəbərləri olmadan Turdu bəyin arxasınca piyada gəldilər. Onları da söhbətə dəvət etdik.

Turdu bəy dedi: «Bülbül İnəkə sizinlə şərab içməyi arzu edir».

«Mən də bir qadının içdiyini heç görmədim, çağırın» dedim.

Şahi adlı bir qələndər ilə kəhrizli bir rübab çalanı da söhbətə dəvət etdik. Axşama qədər kəhrizin arxasındakı təpədə oturub içdik. Ondan sonra da Turdu bəyin evinə gedib yatsı vaxtına qədər şam ışığında içdik. Gözəl və dedi-qodusuz bir məclis oldu. Mən yatdım. Məclisdəkilər təkrar bir evə gedib nağara vaxtına qədər içdilər. Bülbül İnəkə gəlib mənə çox cilvələr etdi. Axırda özümü sərxoşluğa vurub qurtuldum.

O birilər fərqinə varmadan tək başıma İstərğəcə getməyi düşünürdum, amma onlar xəbər tutunca, mümkün olmadı. Axırda nağara vaxtı atlandım. Turdu bəy ilə Şahzadəyə xəbər göndərib üçümüz atlara minərək İstərğəc tərəfinə hərəkət etdik. Fərz vaxtı İstalifin altında olan Xoca-Həsənə vardıq. Bir müddət atlardan enərək məcun yeyib xəzan seyr etdik.

Günəş doğarkən İstalif **(248 a)** bağına enib üzüm yedik və oradan İstərğəcə tabe olan Xoca-Şəhaba enib uyuduq. Ata Miraxurun evi oralarda imiş. Uyğudan qalxıncaya qədər yemək və bir kuzə şərab hazırlamış.

Xəzan çox gözəldi. Bir neçə qədəh içib hərəkət etdik. Günorta vaxtı İstərğəcdə xəzanın ən gözəl olduğu bağa enib söhbət etdik. Qısa bir müddət sonra Xoca Məhəmməd Emin gəldi. Yatsı vaxtına qədər içdik. O gün və gecə Kabildən Abdullah [Kitabdar], Əsəs [Xoca Məhəmməd Əli Tağayi], Nur bəy və Yusif Əli gəldilər. Sabah tezdən yemək yeyib atlandıq, İstərğəcin altındakı Baği-Padişahini seyr etdik.

Bir alma ağacında çox gözəl bir xəzan görüntüsü yaranmışdı. Hər bir budağında beş-altı yarpaq düzgün bir biçimdə qalmışdı, elə gözəldi ki, rəssamlar uğraşsalar belə rəsm edə bilməzdilər.

İstərğəcdən hərəkət edib Xoca-Həsəndə yemək yedikdən sonra axşam

üstü Bihzadiyə gəlib Xoca Məhəmməd Eminin İmam Məhəmməd adlı nökərinin evində içdik. Ertəsi çərşənbə axşamı günü Kabil çarbağına gəldim.

Cümə axşamı günü, ayın iyirmi üçündə, oradan qalxıb qalaya girdim.

Cümə günü Məhəmməd Əli Heydər Riqabdar bir ağ şahin tutub hədiyyə etdi.

Şənbə günü, ayın iyirmi beşində Çinar-Bağda məclis quruldu. Yatsı vaxtı hərəkət etdik. Seyid Qasım keçən olaydan dolayı incik idi, gələrkən onun evinə enib bir neçə qədəh içdik.

Cümə axşamı günü, zilhiccə **(248 b)** ayının ilk günü [=24 noyabr] Qəndəhardan Tacəddin Mahmud gəlib mülazimət etdi.

Bazar ertəsi günü, ayın on doqquzunda [=12 dekabr] Məhəmməd Əli Cəng-Cəng Nilabdan gəldi.

Çərşənbə axşamı günü, ayın iyirmisində Səngər xan Cəncuhə Bxirədən gəlib bizə qoşuldu.

Cümə günü, ayın iyirmi üçündə Əlişir bəyin [Nəvai] dörd divanından gözəlliyinə və vəznlərinə görə ən gözəl qəzəl və beytlərini seçib qurtardım.

Çərşənbə axşamı günü, ayın iyirmi yeddisində [=20 dekabr] ərkdə bir məclis quruldu və burada hər kəsin sərxoş olunca getməsi və bir daha söhbətə qatılmaması əmr edildi.

Cümə günü, zilhiccə ayının axırıncı günü [=22 dekabr] Ləmqanı seyr etmək üçün atlandım.

KABİL-926 (23 DEKABR 1519 - 12 DEKABR 1520)

## DOQQUZ YÜZ İYİRMİ ALTINCI İLİN HADİSƏLƏRİ

Şənbə günü, məhərrəm ayının ilk günü [=23 dekabr 1519] Xoca-Seyarana gəldik. Təpə üzərində, yeni açılmış bir arxın kənarında şərab məclisi düzəldi. Sabah qalxıb Xoca-Rigi-Rəvanı seyr edərək Seyid Qasımın Bülbül köşkünə enib söhbət elədik. Sabah oradan qalxıb məcun yeyərək gedib Bilkərə endik. Gecə içdikdən sonra bir də səbuhi məclisi qurduq və günorta gedib Dürnaməyə endik. Şərab məclisi oldu. Sabah da yenə səbuhi məclisi quruldu. Dürnamənin böyüyü olan Haqdad mənə bağını hədiyyə etdi.

Cümə axşamı günü qalxıb Nicravda taciklərin kəndinə endik.

Cümə günü isə Çihil-Külbə ilə Baran çayı arasındakı dağda ov etdik. Xeyli geyik vurduq. Əlim qırılandan **(249 a)** bəri ox atmırdım. Çox sərt olmayan bir yayla bir geyiyin baldırına ox atdım, ox tüklü qisminın yarısına qədər batdı. İkindi üstü dönüb Nicrava gəldik.

Ertəsi gün də Nicrav əhalisinin cizyəsi altmış misqal qızıl olaraq təyin olundu.

## BABUR LƏMQANI SEYR ETMƏYƏ GEDİR

Bazar ertəsi günü Ləmqanı seyr etmək niyyətilə atlandıq. Bu gəzintidə Hümayunun da bizimlə birlikdə olmasını düşünmüşdüm, amma qalmaq arzusunda olduğunu söylədi və Kürə keçidində geri dönməsinə izin verdim. Gedib Bədrava endik. Oradan Uluğbuya gəldik.

Baran çayında ovçular bir qədər balıq tutdular, ikindi üstü bir sala minərək içki içdik. Axşam vaxtından bir az sonra da saldan çıxıb ağ çadıra gedib içməyə davam etdik. Heydər Ələmdar Davərtin kafirlərinin yanına göndərilmişdi, Badic dibində bu kafirlərin böyükləri bir neçə tuluq şərab gətirib mülazimət etdilər.

Keçiddən enəndə çoxlu çəyirtgə gördük. Ertəsi gün də sala minib məcun yedik və Bulandan bir az aşağıda saldan çıxaraq ordugaha gəldik, iki sal halında gəldik.

Cümə günü qalxıb Məndravərdən bir az aşağıdakı bir dağ ətəyinə endik. Axşam şərab məclisi yapıldı.

Şənbə günü sala minib Dərutə boğazından keçərək Cahannümanın bir az yuxarısında saldan çıxıb Adinapur önündəki Bağİ-Vəfaya gəldik. Nigənxar tüməninin hakimi Qiyam bəy Orduşah saldan çıxanda gəlib sədaqətini bildirdi.

Bir müddətdir Nilabda olan Ləngər xan **(249 b)** Niyazi də yolda gəlib mülazimət etdi. Bağİ-Vəfaya endik. Portağalları gözəl saralmış, səbzələri gözəl yetişmişdi, fövqəladə gözəldi. Beş-altı-gün Bağİ-Vəfada qaldıq.

Qırx yaşımda içkiyi buraxmaq niyyətində idim və buna da bir ildən az bir müddət qaldığı üçün ifrat dərəcədə içirdim.

Bazar günü, ayın on altısmda [=7 yanvar 1520] səbuhidən sonra ayılaraq məcun yediyimiz vaxt Molla Yarək pəncgahda müxəmməs formasında bəstələdiyi nəqşi çaldı. Gözəl bir nəqş bəstələmişdi. Xeyli zamandır belə işlərlə məşğul olmurdum. Məndə də bir şey bəstələmək arzusu doğdu. Yeri gələndə bəhs edəcəyim üzrə, bu münasibətlə çahargah sövtünü bəstələdim.

Çərşənbə günü səbuhi zamanı zarafatla: «Sartca oxuyan hər kəs bir qədəh içsin» dedi. Bu surətlə çox adam qədəh qaldırdı. Sübh namazı vaxtı çəmən ortasındakı ağacların arasında oturduq və «Türkcə oxuyan hər kəs bir qədəh içsin» dedim. Bu dəfə də çoxlu adam qədəh qaldırdı. Günəş doğunca portağalların dibinə, hovuzun kənarına gedib içdik.

Ertəsi gün Dutədən sala minib Cuyi-Şahidən keçib Ətərə vardıq. Ətərdən qalxıb Dəreyi-Nuru seyr edərək Susan kəndinə qədər getdikdən sonra geri qayıdıb Əmləyə endik.

Xoca Kəlan Bəcuru **(250 a)** yaxşı idarə edirdi. Mənim müsahibim olduğu üçün onu geri çağıraraq Bəcura Şah Hüseyni hakim təyin etdik. Şənbə günü, ayın iyirmi ikisində [=13 yanvar] Şah Hüseynin getməsinə izin verdim.

O gün də Əmlədə içdik. Ertəsi gün yağmur altında Künərdə Məlikqulunun evinin yerləşdiyi Küləqrama gəldik, onun ortancıl oğlunun portağal sahəsinə baxan evinə endik. Yağmur yüzündən portağallığa getmədən o evdə içdik. Yağmur fövqəladə çox yağdı. Bir tilsim bilirdim, Molla Əli xana öyrətdim. Dörd kağıza yazıb dörd tərəfə asdı. Yağış dərhal dayandı, hava açılmağa başladı.

Sabah bir sala mindik, başqa bir sala da igidlər mindilər. Bəcur, Sevad, Künər və o civarda bir növ boza düzəldirlər. Kim deyilən bir şeydən, ot köklərindən və bəzi ədviyyatdan düzəldirlər. Çörək kimi yuvarlaq edir, quruduraq saxlayırlar. Bozanın mayası həmən kim maddəsidir. Bəzi bozalar çox ləzzət verir, lakin çox duzlu və dadsız olur. Bu bozadan içmək istədik. Lakin duzluluğu üzündən içəməyərək məcuna üstünlük verdik.

Digər sala minmiş olan Əsəs [Xoca Məhəmməd Əli Tağayi], Həsən İgrək və Məsti Çöhrəyə bu bozadan içmələrini əmr etdim. Həsən İgrək içib sərxoş oldu, özünü nalayiq aparmağa başladı. **(250 b)** Əsəs də çox sərxoş oldu və bir çox çirkin hərəkətlər elədi. O qədər narahat olduq ki, onu saldan çıxarıb suyun digər tərəfinə keçirməyi düşündüm. Bəziləri rica edərək araya girdilər.

O vaxt Bəcuru Şah Mir Hüseynə əta edərək Xoca Kəlanı da müsahib olduğu üçün yanımıza çağırmışdıq. Onun Bəcurda qalması çox uzadı. Bəcurda işlərin artıq yolunda olduğunu təsəvvür edirdim. Şah Mir Hüseyn Bəcura gedərkən Künər çayının keçidində bizə rast gəldi. Çağırıb şifahi bəzi əmrlər verdikdən sonra bir xassə zireh ehsan edərək getməsinə izin verdim.

Nurgilin qarşısına gələndə bir qoca gəlib sədəqə istədi. Saldakılar ona

paltar, sarıq və dəsmal kimi şeylər verdilər, ixtiyar xeyli əşya yığdı. Yarı yolda pis bir yerdə sal təhlükəli bir yerə çarpdı. Çox qoxduq. Düzdür, sal batmadı, lakin Mir Məhəmməd Caləban suya düşdü.

Gecəni Ətərin yaxınlığında keçirdik. Çərşənbə axşamı günü Məndravərə gəldik. Qutlu Qədəm ilə atası Dövlət Qədəm [Qaravul] qalanın içində bir məclis düzəltmişdilər. Düzü, səfasız bir yerdi, lakin onların xatiri üçün bir neçə qədəh içib ikindi üstü ordugaha gəldik.

Çərşənbə günü Kəngdər çeşməsinə gedib seyr etdik. Kəngdər Məndravər tüməninə tabe bir kənddür. Bütün Ləmqanatda yalnızca bu kənddə xurma vardır. Bu kənd dağ ətəyindən bir az yuxarıda **(251 a)** yerləşir. Xurmalığı şərq tərəfindədir. Bu çeşmə də xurmalığın yanında və maili bir yerdədir. Çeşmə başından altı-yeddi kari aşağıda, daşları yığıb bir araya gətirərək qüsl etmək üçün bir sığınaq düzəltmişlər. Bu sığınağa gələn çayı o şəkildə yüksəltmişlər ki, su qüsl edən adamın başına tökülür. Çeşmənin suyu çox durğundur, qış günləri suyu əvvəlcə bir az soyuq təsir bağışlayır, lakin suda qaldıqca insana xoş gəlir.

Cümə axşamı günü Şir xan Tərkəlani bizi evinə çağırıb ziyafət verdi. Günorta oradan qalxıb bu iş üçün özəl olaraq düzəldilmiş balıqxanalarda balıq tutdular. Balıqxananın necə olduğundan daha əvvəl söz açmışdım.

Cümə günü Xoca Mirmiran kəndinün yaxınına endik. Axşam üstü məclis quruldu.

Şənbə günü Əlişəng ilə Əlingar arasındakı dağda ova çıxdıq. Bir tərəfdən əlingarlılar və bir tərəfdən da əlişənglilər dairə quraraq geyikləri dağdan endirdilər. Çox geyik vurduq. Ovdan dönüb Əlingarda məliklərin bağına enib məclis qurduq.

Qabaq dişimin yarısı qırılıb yarısı qalmışdı və o gün yemək əsnasında bu qalan yarısı da qırıldı.

Ertəsi gün qalxıb balıqlara tor atdırdıq. Günortaya yaxın Əlişəngə gedərək bağda içdik. Ertəsi gün də pis hərəkətlər edib haqsız yerə qan tökmüş olan Əlişəng məliki Həmzə xan qan davacılarına təslim edildi, qisas aldılar.

Çərşənbə axşamı **(251 b)** günü, əvrad[1] oxuduqdan sonra Yanbulaq yoluyla Kabilə doğru hərəkət etdik. İkindi çağı Uluğbudan çayı keçib axşam vaxtı Qaratuya gəldik, atlara yem verildi. Əlimizdə olan şeylərdən yemək hazırlandı. Atlar arpalarını bitirincə hərəkət etdik[2].

---

[1] Əvrad: vird sözünün cəmidir, oxunması adət halına gələn dualar.

[2] Baburun xatirələrinin bir qismi itmişdir. 926-cı ilin əvvəllərindən, yəni 12 dekabr 1520-ci ildən 932-ci ilə, yəni 18 oktyabr 1525-ci ilə qədər olan hissəsi yoxdur.

Bu müddət ərzində aşağıdakı hadisələr baş vermişdir. 926-cı ildə Babur üçüncü Hindistan səfərinə çıxmışdır. Həmin il Xan Mirzə Bədəxşanda öldüyü üçün Babur böyük oğlu Hümayunu oraya vali təyin etmişdir. Qəndəhar bölgəsini ələ keçirdikdən sonra Qəhdəhar şəhərini almağa çalışmış və 928-ci ildə buna nail olmuşdur.

929-cu ildən etibarən Baburun Hindistandakı işləri də asanlaşmışdır, çünki bəzi əfqan

# III. HİNDİSTAN

## HİNDİSTAN - 932 (18 OKTYABR 1525 - 8 OKTYABR 1526)

bəyləri Sultan İbrahim Ludiyə qarşı mübarizədə ondan kömək istəmişlər. Bu bəylərin dəstəyindən faydalanan Babur 930-cu ildə yenidən Hindistana girmiş, Lahor və Dibalpur şəhərlərini almış, Pəncabın böyük hissəsini ələ keçirmişdir. Ancaq Babur Kabilə döndükdən sonra ona kömək edən əfqan bəyləri Pəncabı almaq sevdasına düşmüşlər.

## DOQQUZ YÜZ OTUZ İKİNCİ İLİN HADİSƏLƏRİ

932-ci il səfər ayının birində, cümə günü [=17 noyabr 1525] günəş ox-atan bürcündə ikən Hindistan üzərinə yürümək niyyətilə hərəkət etdik, Yek-Ləngə təpəsini aşaraq Dih-Yaqub çayının qərb tərəfindəki çayıra endik.

Biz bu yurdda ikən yeddi-səkkiz ay öncə Sultan Səid xanın hüzuruna elçi olaraq göndərilmiş Əbdülmüluk Qurçu xanın Yengibəy Göyəldaş adlı bir adamıyla birlikdə gəldi, xanımlardan və xandan məktublar və bəzi hədiy-yələr gətirdi.

Əsgərin səfərə hazırlaşması üçün bu yurdda iki gün qaldıqdan sonra hərəkət etdik, bir mənzildə dincələrək Badam-Çeşməyə endik. Burada mə-cun yedik.

Çərşənbə günü Barik-Aba enəndə Xoca Hüseyn Divanın Lahorun gə-lirindən göndərmiş olduğu iyirmi min şahruxi dəyərində altın, əşrəfi və tən-gələri[1] Hindistanda qalan Nur bəyin kiçık qardaşlarından biri gətirdi. Bunun böyük bir qismini Bəlxin işləri üçün Bəlx ərbabından olan Molla Əhmədə göndərdim.

Cümə günü, ayın səkkizində **(252 a)** Gəndəməkə enəndə şiddətli nəz-ləyə tutuldum. Həmd olsun ki, asan keçdi.

Şənbə günü Bağİ-Vəfaya endik. Hümayun Mirzəni və o tərəfin əsgəri-ni gözlədiyimiz üçün bir neçə gün Bağİ-Vəfada qaldıq. Bağİ-Vəfanın bö-yüklüyü, səfası və gözəlliyindən bu əsərdə bir neçə dəfə söz edilmişdir. Ol-duqca səfalı bir bağdır. Alıcı gözüylə baxan hər kəs onun necə bir yer oldu-ğunu anlayar. Orada olduğumuz bu bir neçə gündə içki və səbuhi məclisləri qurduq, içməyən günlərdə də məcun söhbəti keçirdik. Gecikdiyi üçün Hü-mayuna çox sərt məktublar və şiddətli xitablar göndərdim.

Bazar günü, səfər ayının on yeddisində səbuhi məclisi keçirdik. Hü-mayun gəldi. Çox gec gəldiyi üçün onu danladım. Xoca Kəlan da Qəznədən elə o gün gəldi.

O bazar ertəsi axşamı Sultanpur ilə Xoca Rüstəm arasında salınmış Yengi-Bağa [yeni bağ] endik.

Çərşənbə günü də oradan qalxıb sala mindik və Quş Künbəzə qədər şərab içərək gedib Quş Künbəzdə saldan çıxıb ordugaha gəldik.

Ertəsi gün də orduya səfər əmri verib sala minərək məcun yedik. Hər zaman endiyimiz yer Qırx Arx idi. Qırx Arxın qarşısına gələndə ətrafa nə qədər baxsaq da, ordudan **(252 b)** bir əsər görünmədi. Atlar da meydanda yoxdu. Gərm-Çeşmə yaxın olduğu üçün «bəlkə ordu oraya enmişdir» deyə düşünərək buradan keçib getdik. Gərm-Çeşməyə çatanda gec olmuşdu. Ora-

---

[1] *Əşrəfi:* altın sikkələrə verilən ümumi ad. *Təngə:* gerçək dəyəri bu gün dəqiq bilinmə-yən bir pul vahidi.

da da qalmayaraq, gecə boyu yola davam etdik. Bir yerdə salı dayandırıb bir az uyuduq. Sübh çağı Yadabirə çıxdıq. Sabah erkəndən qoşun gəlməyə başladı. Sən demə, ordu Qırx Arx civarına enibmiş, biz görəməmişik.

Salda Şeyx Əbülvəcd, Şeyx Zeyn, Molla Əlixan, Turdu bəy Xaksar kimi şeir oxuyan çox adam vardı. Söhbətdə Məhəmməd Salihin[1] bu beyti oxundu:

Məhbubiyi hər işvəkarira çi künəd kəs,
Caye ki tu başe digərira çi künəd kəs.
*Hər işvəkarın məhbubluğunu insan nə etsin,*
*Sən olan yerdə başqa birinə nə lüzum var.*

Bu örnəyə dair başqa beytlər söyləmələrini əmr etdim. Şeir yazanlar söyləməyə başladılar. Molla Əlixana çox sataşırdılar. Sataşma qəblindən bu beyt bədahətən ağlıma gəldi:

Manəndi tu mədxuşu qərira çi künəd kəs,
Hər gavquni madə xərira çi kunəd kəs.
*Sənin kimi huşsuz bir axmağı insan nə etsin,*
*Hər öküz doğan dişi eşşəyi insan nə etsin.*

Bu vaxta qədər yaxşı və pis, ciddi şəkildə və zarafatla, ağlıma gələn hər şeyi dilxoşluq üçün nəzm edirdim, hər cür çirkin və qaba nəzmi də yazırdım. O zamanlar *Mübəyyin*[2] əsərini nəzmə çəkirdim, halım sıxıntılı idi və həzin könlümə belə bir fikir gəlmişdi: **(253 a)**

Heyf bulğay ol dildin kim, mundağ əlfəzni dərc qılğay,
Yana fikrini qəbih sözlərgə xərc qılğay,
Dariğ bulğay ol könqüldin kim, mundağ məani zühur etgəy,
Yana zişt xəyallar anda xütur etgəy.

O zamandan bəri də həcv və zarafat vadisində şeir və nəzm söyləməkdən vaz keçmişdim və tövbəli idim. Ona görə də bu beyti söyləyən zaman bunlar heç ağlıma gəlmədi və bu anlam da heç bir vaxt könlümə doğmadı.

Bir-iki gün sonra Biqrama enəndə nəzləyə tutuldum və isitdim. Sonra bu nəzlə öksürəyə çevirdi. Hər öksürəndə qan tüpürürdüm. Hərarətim heç aşağı düşmürdu. Birdən bunun haradan gəldiyini və iztirabımın səbəbini anladım: «*Kim əhdini pozsa, öz əleyhinə pozmuş olar. Və kim Allaha verdiyi sözə əməl etsə, Allah ona böyük bir mükafat verər*»[3].

Nə qılayın sənin bilə, ey dil,
Cəhətindən mənim içim qandır.
Neçə yaxşı desən bu həzl ilə şeir
Birisi föhşü, biri yalandır.

---

[1] *Məhəmməd Salih:* «Şeybaninamə» əsərinin müəllifi.
[2] *Mübəyyin:* Baburun hüquqi səciyyə daşıyan, iqtisadiyyat və vergi siyasəti haqqında nəzmlə yazılmış əsəri.
[3] *Quran,* Fəth surəsi, 48:10.

Gər desən qoymayın bu cürm bilə,
Cilovunu bu ərsədən yandır (bu yoldan çevir).

*Dedilər: «Rəbbimiz, biz özümüzə zülm etdik, əgər bizi bağışlamasan və bizə acımasan, mütləq ziyana uğrayanlardan olarıq».*[1]

Bir bir daha bağışlanmağı diləyib tövbə edərək, bu cür batil fikirlərdən və belə nalayiq alışqanlıqlardan könlümü çevirib qələmimi sındırdım. Bu cür tənbehlər asi qullar üçün o dərgahdan gələn böyük bir dövlətdir və bunlar sayəsində ağıllanan hər qul üçün böyük bir xoşbəxtlikdir.

O axşam oradan hərəkət edib Əli-Məscidə endik. Bu yurd **(253 b)** dar olduğu üçün mən daima bir təpənin üzərinə enirdim, əsgərin hamısı da mənim endiyim təpənin uçurum tərəfinə baxan bir dərəyə enirdi. Gecə olanda əsgərlərin tonqalları çox gözəl bir mənzərə yaradırdı. Buna görə də buraya enəndə mütləq içərdik. Bu dəfə də içdik. Sabah olmadan öncə məcun yedik və atlandıq. O gün oruc da tutdum. Gəlib Biqramın yanında düşərgə qurduq.

Ertəsi gün o yurdda qalaraq kərgədan ovuna çıxdıq. Biqramın önündəki Siyah-Abdan keçib çayın aşağısına doğru bir halqa yaratdıq. Bir müddət getdikdən sonra arxa tərəfdən bir adam gələrək, Biqramın lap yaxınında kiçik bir cəngəlliyə bir kərgədanın girdiyini və ətrafını mühasirəyə aldıqlarını söylədi. Dərhal dördnala oraya getdik. Cəngəllikdə halqa qurub gurultu qoparanda kərgədan dışarı çıxıb ovaya doğru qaçdı. Hümayun və o tərəfdən gələnlərdən heç kim kərgədan görməmişdi. Hamısı doyunca seyr etdi. Bir küruha yaxın qovalayıb çoxlu ox vuraraq yerə sərdilər. Bu kərgədan adama və ata hücum etmədi.

İki kərgədan daha vurdular. «Görəsən, kərgədan bir fillə qarşılaşsa, əcəba, nə edər» deyə daim düşünürdüm. Bu dəfə filçilər filləri gətirirmişlər və bir kərgədan **(254 a)** da onların tam qarşısına çıxıbmış. Filçilər bir az irəliləyincə kərgədan onlara qarşı dura bilməyib başqa bir tərəfə qaçıbmış.

Biqramda ikən bəzi bəylər və içkilər, bəxşilər və divanlarla birlikdə altı-yeddi qismə ayrılaraq bütün əsgərin adlarını tək-tək yazıb saylarını hesablamaq üçün Nilab keçidində gəmilərə təyin edildilər.

Axşam nəzləyə tutuldum və təkrar isitdim. Bu nəzlə öksürüyə çevirdi. Hər öksürəndə qan tüpürürdüm. Çox ağır keçirdim, iki-üç gün sonra keçdi.

Biqramdan qalxıb yağmur altında Kabil çayının sahilinə endik. Hindistandan Dövlət xanla Qazi xanın [Ludi] iyirmi-otuz min əsgər toplayıb Kəlanuru aldıqları və Lahor üzərinə yürümək istədikləri xəbəri gəldi. Oradakılara «Mənzil-mənzil irəliləyirik, biz gələnə qədər müharibə etməsinlər» deyərək, Mömin Əli Tavaçını qasid olaraq göndərdik.

İki mənzildən sonra cümə axşamı günü, ayın iyirmi səkkizində Sind sahilinə endik.

Şənbə günü, rəbiüləvvəl ayının ilk günü [=16 dekabr] Sind və Keçə-Qut

[1] *Quran,* Əraf surəsi, 7:23.

sularından keçib çayın sahilinə endik. Gəmilərə minən bəylər, bəxşilər və divanlar səfərə qatılan əsgərin saysını bildirdilər. Böyük və kiçık, yaxşı və pis, nökər və nökər olmayan, hamısı on iki min adam olaraq qeyd edilmişdi.

Bu il buralarda mövsüm yağmuru az, dağ ətəyindəki vilayətlərdə isə **(254 b)** çox olmuşdu. Azuqə işi üçün dağ ətəyindən Siyal-Qut yoluyla hərəkət etdik.

Hati Kəkərin vilayətinin qarşısına gələndə bir çayın bəzi yerlərində çoxlu su yığıldığını bu suların hamısının donduğunu gördük. Buz o qədər qalın deyildi. Hindistan vilayəti üçün belə bir buz qəribədir. Buzu yalnız burada gördük, Hindistanda olduğumuz bu bir neçə il içində qar və buzdan heç bir əsər-əlamət görünməmişdi.

Sinddən beş mənzil yürüdükdən sonra altıncı mənzildə Cud dağına bitişik olan Balnat-Cugi dağının dibinə, bügiyalların yurdu olan çaya gəlib endik. Əsgərin azuqə alması üçün ertəsi gün də o yurdda qaldıq. O gün mey içdik. Molla Məhəmməd Pərgari çox hekayə danışdı, o qədər çox danışdığı heç olmamışdı. Molla Şəms isə əskidən bəri masqaraçılığı ilə məşhur idi, masqaralığa başlasa, axşama qədər bitirməzdi.

Azuqə üçün gedən qullar, xidmətçilər və digər adamlar ərzaqdan başqa şeylər də axtararaq dağınıq və hesabsız şəkildə cəngəlliyə, dağlara, sarp və yolsuz yerlərə getdikləri üçün onlardan bir neçəsi itdi, Kiçkinə Tünqatar isə orada öldü.

Oradan qalxıb Ciləmdən bir az aşağıdakı keçid üzərindən Bəxət çayını keçdik. Bimrugiri və Əkriya pərgənəsinin hakimi, Siyal-Qut bölgəsinə köməkçi olaraq təyin edilən Vəli Qızıl biz burada ikən gəlib məni gördü. Siyal-Qutu mühafizə etmədiyi **(255 a)** üçün onu azarladım. «Mən pərgənəyə gəlmişdim. Xosrov Göyəldaş Siyal-Qutdan çıxdığı zaman mənə xəbər dəxi vermədi» deyə söylədi. Bundan xəbərim vardı. «Madam ki Siyal-Qutu mühafizə edə bilmədin, nə üçün gedib Lahorda bəylərə qoşulmadın» dedim. Susmaq məcburiyyətində qaldı, iş zamanı yaxınlaşdığı üçün onun bu qüsuruna göz yumdum.

Bu yurddan Lahordakılara «Müharibə etməyin, Siyal-Qutda və ya Persrurda gəlib bizə qoşulun» xəbərini götürməsi üçün Seyid Tufan ilə Seyid Laçın yedek atlarla birlikdə təcili göndərildi. Hər kəs bu fikirdə idi: Qazi xan otuz-qırx min adam yığmış, Dövlət xan isə qocalığına baxmayaraq belinə iki qılınc bağlamışdır. Bunlar şiddətli bir şəkildə vuruşacaqlar. Bir atalar sözü vardır: «Gah yəzdəh bəh, gah noh» (*on dost doqquzdan yaxşıdır*). Əldəki vasitələri cəmləmək üçün Lahordakıları da özümüzə qoşub sonra vuruşaq deyə düşündük.

Bəylərə adam göndərib arada bir dəfə dincəldikdə sonra Çanab çayının kənarına endik. Yoldan ayrılıb xassə əmlakdan olan Bəhlulpuru seyr etdik. Kurqanı Çanab çayının kənarında yüksək bir qayalığın üzərində idi, çox xoşuma gəldi. Siyal-Qutu buraya nəql etməyi düşündüm. İnşallah, fürsət

olan kimi dərhal buraya nəql ediləcəkdir.

Bəhlulpurdan ordugaha qədər gəmiylə gəldik. **(255 b)** Məclis quruldu, bəziləri mey, bəziləri boza içdi, bəziləri də məcun yeddi. Yatsı vaxtından bir az gec bir saatda gəmidən çıxıb çadırda da bir az içdik. Bu çayın sahilində bir gün qaldıq ki, atlar dincəlsin.

Cümə günü, rəbiüləvvəl ayının on dördündə [=29 dekabr] Siyal-Quta endik. Hindistana hər səfərimiz zamanı öküzlərimizi və camışlarımızı yağmalamaq üçün dağdan hədsiz-hesabsız sayda cet və gücür aşağı enirdi. Quldurluq və zülm edənlər də bu səfillər idi. Əvvəllər bu vilayətlər düşmən idi və biz onları o qədər möhkəm sıxmırdıq. Bu dəfə isə bu vilayətlərin hamısı bizə tabe olduğu halda yenə belə rəftar etməyə başladılar. Siyal-Qutun ordugaha gələn bu acları və çılpaqları, fəqir və miskinləri birdən qovğaya tutuşub yağmağa girişdilər. Quldurluq edənləri tapdıraraq iki-üçünü parçalatdırdım.

Şahım Nur bəyi Siyal-Qutdan Lahordakı bəylərin yanına göndərdim ki, düşmənin harada olduğunu məlumatlı adamlardan öyrənsin, bəylər bizə harada qoşulacaqlarını bildirsinlər.

## ALƏM XANIN SULTAN İBRAHİM XAN TƏRƏFİNDƏN MƏĞLUB EDİLMƏSİ

Bu yurdda ikən bir tüccar gəlib Aləm xanın [yəni Sultan Bəhlul Ludinin oğlu və Baburun xidmətində olan hind əmirlərindən Sultan Əlaəddin Ludinin] Sultan İbrahim xan tərəfindən məğlub edildiyini söylədi.

Bu belə olmuşdur: Aləm xan bizdən izin aldıqdan sonra belə bir isti havada yoldaşlarına baxmadan iki mənzili bir edib Lahora gəlir. Aləm xana izin verildiyi günlərdə özbəklərin **(256 a)** xanlarının və sultanlarının hamısı gəlib Bəlxi mühasirəyə almışdılar. Bu üzdən də Aləm xanın Hindistana getməsinə izin verildikdən sonra biz də Bəlx üzərinə hərəkət etdik. Aləm xan Lahora çatdıqdan sonra Hindistandakı bəyləri toplayır və «Padşah sizi mənə köməkçi təyin etmişdir, mənimlə birlikdə hərəkət edin. Qazi xanı özümüzə qoşub Dehli və Aqra üzərinə yürüyək» deyir.

Onlar da «Biz Qazi xana güvənərək qoşula bilmərik. Padşahın əmrində də deyilir ki, Qazi xan öz kiçık qardaşı Hacı xanı oğlu ilə birlikdə saraya göndərsə, yaxud onları Lahora göndərib girov olaraq qoysa, o zaman qoşulun, yoxsa ona qoşulmayın. Siz daha dünən onunla vuruşaraq məğlub olmusunuz, onunla təkrar necə birləşəcəksiniz. Sizin birləşməniz məsləhət deyil» deyirlər.

Belə söyləyərək mane olmağa çalışsalar da, Aləm xan onları dinləmir. Oğlu Şir xanı göndərərək Dövlət xan və [oğlu] Qazi xan ilə görüşüb danışır. Xeyli müddətdən bəri məhbus olan [Dövlət xanın kiçık oğlu] Dilavər xan həbsdən qaçaraq Lahora gələli iki-üç ay olmuşdu. Onu da özü ilə birlikdə aparır.

Lahorda pərgənə sahibi olan Mahmud xan Xani-Cahanı da yanında götürür.

Hər halda belə qərar vermiş olacaqdır: Dövlət xan ilə Qazi xan Hindistanda buraxılmış olan bəyləri, hətta bütün bu civarı özlərinə alıb [oğulları] Dilavər xan ilə Hacı xanı Aləm xana qatar, onlar da **(256 b)** Dehli və Aqra tərəfini özlərinə alarlar. İsmayıl Cilvani və digər bəzi əmirlər gəlib Aləm xana qoşulur və heç durmadan mənzildən-mənzilə keçərək Dehliyə doğru hərəkət edirlər. İndriyə gələndə Süleyman Şeyxzadə Fərmüli də gəlib onlara qatılır. Bunların sayı otuz-qırx minə çatır və Dehlini mühasirə edirlər. Amma savaşa bilmir və kurqandakılara heç nə edə bilmirlər.

Sultan İbrahim bunu eşidib onların üzərinə hərəkət edir. O yaxınlaşınca bunlar xəbərdar olub kurqan üzərindən qalxaraq ona qarşı çıxmaq istəyir və belə düşünürlər: «Əgər gündüz savaşsaq əfqanlar bir-birlərindən utanaraq qaçmazlar. Əgər gecə basqını təşkil etsək, qaranlıq gecədə adam-adamı görməz və hər kəs öz bildiyi kimi hərəkət edər». Bu düşüncə ilə təxminən altı küruhluq bir məsafədən qalxaraq gecə basqınına gəlirlər. Gecə basqını üçün iki dəfə gündüz günorta hərəkət edir, iki-üç pasa qədər at üstündə qalıb nə geri dönəcəklərini, nə də irəli gedəcəklərini qərarlaşdıra bilmədən irəliləyir və nəhayət, üçüncü dəfə sabaha bir pəhər qalmış basqına gəlirlər.

Bunların basqını çadırlara və otaqlara od vurmaqmış. Bir başdan od vurub qovğa qoparırlar. Cəlal xan Cighet və digər bəzi əmirlər gəlib Aləm xana qatılırlar. Sultan İbrahim öz köşkündə bir neçə xas süvarisi ilə birlikdə olduğu yerdə qalır. Bu zaman dan ağarır. Aləm xanın bütün adamları xalqı yağmalamaq və qənimət toplamaqla məşğuldur. **(257 a)** Sultan İbrahimin əsgəri bunların çox az olduğunu görüncə bir dəstə əsgər və bir fillə dərhal onların üstünə yürüyür. Fil irəliləyincə bunlar müqavimət göstərə bilmədən qaçırlar.

Aləm xan bu şəkildə qaçdıqdan sonra Miyan-Duab tərəfinə, sonra Panipat civarından təkrar Panipat tərəfinə keçir. İndriyə gələndə bir bəhanə taparaq Miyan-Süleymandan üç-dörd lek qoparır. İsmayıl Cilvani və Aləm xanın böyük oğlu Cəlal xan bunlardan ayrılaraq Miyan-Duab tərəfinə gedir. Aləm xanın yanında yığılan əsgərin Seyif xan Dərya xan, Mahmud xan Xani-Cahan, Şeyx Cemal Fərmüli və digər bəzilərinə tabe olan qismi savaşdan bir az öncə qaçıb İbrahimə qoşulur.

Aləm xan, Dilavər xan və Hacı xan Sihrinddən keçəndən sonra bizim gəlib Milvəti aldığımızı öyrənirlər. Dilavər xan bizim üçün üç-dörd ay həbsdə qaldığı halda hələ bizə sadiq olduğu üçün onlardan ayrılaraq köçünün yanına Sultanpura gəldi və biz Milvəti aldıqdan üç-dörd gün sonra da Milvət civarında gəlib bizə qatıldı.

Aləm xan ilə Hacı xan isə Şetlut çayını keçərək Dun ilə Dəst arasındakı dağda Gingutə adlı möhkəm bir kurqana girirlər. Bizə tabe əfqan və həzarələr **(257 b)** gələrək bunları mühasirəyə alırlar. Belə möhkəm bir kurqanı tam ələ keçirmək üzrə ikən axşam olur. Kurqandan çıxmaq istəyənlər də

[Aləm xan və Hacı xan] atların qapıya yığılması üzündən çıxa bilmirlər. Filləri varmış, onları qabağa verirlər. Fillər də atların çoxunu ezib öldürür. Atla çıxa bilmədikləri üçün qaranlıqda piyada çıxır, ancaq Milvətə də girə bilmir, dağ tərəfinə qaçmış olan Qazi xana min çətinliklə qoşulurlar. Qazi xan isə onları o qədər yaxşı qəbul etmir. Axırda Aləm xan məcbur olub dərənin sonundakı Pəhlur civarında bizə qoşuldu.

Biz Siyal-Qutdaykən Lahordakılardan bir adam gəldi və ertəsi gün hamısının gəlib bizə qoşulacağını bildirdi. Ertəsi gün Persrurə enəndə Məhəmməd Əli Cəng-Cəng, Xoca Hüseyn və digər bəzi igidlər də gəlib orada bizə qoşuldular.

Düşmənin ordugahı Ravi çayının Lahor tərəfində imış. Oradakı vəziyyəti öyrənmək üçün Böçkəni bir dəstə adamla oraya göndərdik. Gecənin üç pəhəri yaxınlaşanda xəbər gətirdi ki, düşmənin bizim gəldiyimizi xəbər alıb bir-birinə baxmadan nizamsız halda qaçır.

Sabah Şah Mir Hüseynlə Can bəyi [Can Məhəmməd bəy] yüklərin və sursatın yanında qoyaraq özümüz sürətlə hərəkət etdik. İki namaz arasında Kəlanura gəlib endik. Məhəmməd Sultan Mirzə, Adil Sultan və digər bəylər burada **(258 a)** gəlib bizə qoşuldular.

Sabah qalxıb yolda gedərkən Qazi xanla digər qaçanların xəbərini gətirdilər. Məhəmmədi, Əhmədi, Qutlu-Qədəm və Vəli Xəzinə[çi]nin komandanlığında olanları və bu səfər üçün Kabildə bəyliyə yüksəldilmiş olan bəylərin böyük qismini qaçanları təqib etmələri üçün ayırdık. Qərara görə bunlar düşmənə yetişə bilsələr yetişəcək, yetişə bilməsələr kurqandakıların qaçıb getməmələri üçün Milvət kurqanın ətrafını mühsirəyə alacaqlar. Belə bir tədbir almaqdan əsas məqsəd Qazi xandı.

Bu bəyləri irəli göndərdikdən sonra Kanvəhinin qarşısından Biyah çayını keçib endik. Oradan qalxıb arada iki dəfə istirahətdə sonra Milvət kurqanının olduğu dərənin ağzına endik. Öncədən gəlmiş olan bəylər və Hindistandakı bəylərə kurqanı yaxından mühasirəyə almaq əmri verildi. Dövlət xanın nəvəsi -böyük oğlu Əli xanın oğlu- olan İsmayıl xan burada yanımıza gəldi. Bir çox vədlər və təhdidlərlə onu da kurqana geri göndərdik.

Cümə günü ordunu irəli götürüb kurqana yarım küruh məsafədə endik. Şəxsən gedib kurqanı gördükdən sonra sağ və sol qollarla mərkəzin yerlərini müəyyənləşdirərək ordugaha qayıtdım.

Dövlət xan adam göndərib **(258 b)** «Qazi xan qaçıb dağa getdi, mənim günahımı bağışlasa, qulluğa gəlib kurqanı təslim edərəm» deyə bildirdi. Xoca Mir Miran oraya göndərildi, qorxusunu bərtərəf edib onu da özü ilə gətirdi. Dövlət xanla birlikdə oğlu Əli xan da gəldi. Bizimlə vuruşmaq üçün belinə bağladığı iki qılıncını boynuna asmağı əmr etdim, iş bu dərəcəyə gəldiyi halda hələ də bəhanə arayacaq qədər qaba və abdal bir adam olurmu? Bir az irəli gətirdilər. Qılıncları boynundan almalarını əmr etdim. Qarşıma görüş-

mək üçün gələndə yükünməkdə gecikmişdi. Ayağından çəkdirərək qarşımda yükündürülməsini əmr etdim.

Qarşıma oturdub hind dilini bilən bir adama belə buyurdum: «Bu sözləri bir-bir onun zehninə nəqş edərək söylə və de ki: mən sənə ata dedim, könlün istəyəndən daha artıq təzim və ehtiram göstərdim. Özünü və oğlunu bəluclardan sədəqə dilənməkdən qurtardım. Arvad-uşağınızı İbrahimin köləliyindən xilas etdim. Tatar xanın [Yusif-Heyl] üç kürur vilayətini sənə ehsan etdim. Sənə nə pislik etdim ki, döşünə və belinə iki qılınc bağlayıb qoşun çəkərək bizim vilayətlərin üstünə yürüyüb fitnə və fəsad çıxarırsan».

Axmaq qoca ağzında bir-iki söz **(259 a)** gəvələdi, cavab verə bilmədi. Hərəmlərini və uruğunu özünə verib digər bütün əmlakının zəbt edilməsinə qərar verildi. Özünün də Xoca Mir Miranın yanında qalması əmr edildi.

Şənbə günü, rəbiüləvvəl ayının iyirmi ikisində [=6 yanvar 1526] bunların uşaqlarını və hərəmlərini sağ-salim olaraq çıxarmaq üçün şəxsən gəlib Milvət kurqanının qapısının qarşısındakı təpəyə endim. Əli xan çıxıb bir qədər əşrəfi hədiyyə etdi. İkindəyə doğru bunların uşaqlarını və hərəmlərini çıxarmağa başladılar.

Gərçi Qazi xanın kurqandan çıxıb getmiş olduğunu söyləyirdilər, lakin bəziləri onun da kurqanda olduğunu və orada gördüklərini söylədilər. Buna görə bəzi içkilər və çöhrələr Qazi xanın hiylə ilə çıxmaması üçün şübhəli adamları araşdırmaq üzrə qapıya qoyuldu. Bütün məqsəd bu idi. Bundan başqa bəzi cəvahir və qiymətli daşları gizlicə çıxarmaq istəsələr, onları da zəbt edəcəkdilər.

Qapının önündəki təpəyə çadır qurduraraq gecəni orada keçirdim. Sabah Məhəmmədi, Əhmədi, Sultan Cüneyd, Əbdüləziz [Miraxur], Məhəmməd Əli Cəng-Cəng, Qutlu-Qədəm və bir neçə içki bəylərə içəri girib xəzinələri və bütün əmlakı zəbt etmələrini əmr etdim. Xalq kurqan **(259 b)** qapısında çox gurultu qoparırdı. Qorxutmaq üçün bir neçə ox atdım. Bir qəza oxu təsadüfən Hümayunun hekayəçisinə isabət edib onu dərhal öldürdü.

Bu təpədə iki gecə qaldıqdan sonra, bazar ertəsi günü kurqana girib ətrafı tədqiq edərək Qazi xanın kitabxanasına gəldim. Bir neçə nəfis kitab çıxdı. Bir neçəsini Hümayuna verdim, bir neçəsini də Kamrana [Mirzə] göndərdim. Mollayanə kitablar xeyli çox idi, lakin gözü cəzb edəcək nəfislikdə kitablar yox idi.

Gecə orada qalıb sabah ordugaha gəldim. Qazi xanın kurqanda olduğunu zənn edirdik, lakin o qeyrətsiz adam atasını, böyük və kiçik qardaşlarını, anasını və bacılarını Milvətdə qoyaraq bir dəstə adamla birlikdə dağ tərəfinə qaçıbmış.

Məbin an bihəmiyyətra ki hərgiz,
Nəxahəd did ruyi nikbəxti,
Tən asani guzinəd xiştənra

Zənü fərzənd begüzarəd be səxti[1].

*Xoşbəxtliyin üzünü əsla görməyəcək*
*O həmiyyətsizə baxma,*
*Özü üçün asan olanı seçər,*
*Arvad-uşağını sıxıntıya tərk edər.*

Çərşənbə günü o yurddan qalxıb Qazi xanın qaçdığı dağa doğru hərəkət etdik. Milvətin ağzındakı yurddan bir küruh yol gedərək bir dərəyə endik. Dilavər xan burada gəlib sədaqətini bildirdi.

Dövlət xan, Əli xan və İsmayıl xan ilə bir neçə böyüyü daha yaxalayıb Bxirədəki Milvət kurqanına **(260 a)** götürərək mühafizə etməsi üçün Kəttəyə təhvil verdik. Çeşitli adamların mühafizəsinə verilmiş olan digərləri üçün də Dilavər xanın məsləhəti ilə qurtuluş fidyələri müəyyənləşdirildi. Bəzilərini kəfalətlə sərbəst buraxıb bəzilərini də zəncirə vuraraq mühafizə etdilər. Kəttə əsirləri götürdü. Dövlət xan Sultanpura yaxınlaşdıqları zaman öldü.

Milvət kurqanı Məhəmməd Əli Cəng-Cəngin idarəsinə verildi. O da öz tərəfindən böyük qardaşı Arğunu bir dəstə igidlə birlikdə orada qoydu. Həzarə və əfqanlardan iki yüzə qədər adam kurqana köməkçi təyin edildi.

Xoca Kəlan Qəznə şərablarından bir neçə dəvə yüklətmişdi. Xoca Kəlanın yurdu kurqana və ordugaha baxan bir təpədə idi. Orada söhbət etdik, bəziləri şərab, bəziləri də araq içdi. Gözəl bir məclis oldu.

Oradan qalxıb Milvətin keçidlərlə dolu kiçık dağlarından aşaraq Duna gəldik. Hindistan dilində dərəyə «dun» deyirlər. Hindistanda bir axarsu bu Dundadır və Dunun ətrafında bir çox kənd yerləşir. Bura Cesvalin pərgənəsi imiş. Dilavər xan onların dayıları olur. Dun gözəl bir vadidir. İrmağın ətrafı çayırdır. Bəzi yerlərində düyü əkilmişdir. Ortasından üç-dörd dəyirman işlədəcək gücdə bir su axır. Vadinin genişliyi bir-iki küruh və bəzi yerlərində də **(260 b)** üç küruh qədər vardır. Dağları kiçık-kiçık təpələr halındakı dağlardır. Kəndləri bu dağların ətəklərində yerləşir. Kənd olmayan yerlərdə tovuz quşu və meymun çoxdur.

Ev toyuğuna bənzəyən bir cür toyuq da çoxdur, eynən toyuq kimidir, lakin çoxu düz rəngdədir.

Qazi xanın harada olduğu dəqiq olaraq bilinmədiyi üçün harada olsa oraya gedib hər hansı bir şəkildə ələ keçirilməsi işini Birim-Div Məlinhəslə birlikdə Turdukeyə tapşırdım.

Dunun ətrafındakı bu kiçık dağlarda çox qorunaqlı qalalar var. Şimal-şərq yönündə Qutilə adlı bir qala var ki, ətrafı yetmiş-səksən kari dərinliyində qayalıqlarla çevrilmişdir. Böyük qapısının yerləşdiyi tərəf yeddi-səkkiz kari qədərdir. Asma körpü qoyulan yerinin genişliyi on-on iki kan qədərdir. İki uzun kötüyü körpü etmişlər, atları və heyvanları oradan keçirirlər. Bu

[1] Sədi Şirazidən.

dağlarda Qazi xanın gücləndirdiyi kurqanlardan biri də bu imiş. Onun orada adamları varmış. Axınçılar gedib savaşırlar. Tam almaq üzrə ikən axşam olur, kurqanın içindəkilər də belə möhkəm bir kurqanı buraxıb qaçırlar.

Dun civarındakı digər bir möhkəm kurqan isə Gingutə kurqanıdır. Onun da ətrafı uçurumdur, lakin digər kurqan qədər möhkəm deyildir. Aləm xan, daha öncə də söyləndiyi kimi, bu Gingutə kurqanına girmişdi. **(26l a)**

## BABURUN SULTAN İBRAHİMİN ÜSTÜNƏ HƏRƏKƏTƏ KEÇMƏSİ

Qazi xanı tutmaq üçün ilqar ayırdıqdan sonra himmət üzəngisinə basıb təvəkkül cilovunu ələ alaraq o zamanlar paytaxtı Dehli olan Hindistan məmləkətlərini idarə edən Sultan Bəhlul Ludi Əfqan oğlu Sultan İsikəndər oğlu Sultan İbrahimin üzərinə hərəkət etdik. Mövcud əsgərinin min lek olduğunu söylərlər və özü ilə bəylərində minə yaxın fil olduğunu təxmin edirdilər.

Bir mənzildən sonra Baqi Şiğavula Dibalpuru ehsan edib köməkçi olaraq Bəlxə göndərdim. Bəlxin işləri üçün çoxlu ağ axça və Kabildəki əqraba və uşaqlara Milvət fəthində ələ keçən əşyadan hədiyyələr də göndərdim.

Dundan aşağıya doğru bir-iki mənzildən sonra Şah İmad Şirazi mənə Arayiş xan ilə Molla Məhəmməd Məzhəbin məktublarını gətirdi. Bir qədər sədaqət göstərib bu səfərə qeyrət və diqqət etmişlər. Biz də bir piyada vasitəsilə inayət fərmanları göndərdikdən sonra irəli hərəkət etdik.

Milvətdən gedən axınçılar Hürur, Kehlur və o civardakı dağ kurqanlarının hamısini zəbt edib əhalisini yağmalayaraq gəlib bizə qoşuldular Çox möhkəm olduğu üçün uzun zamandan bəri buralara heç kimsə girə bilməmişdi. Aləm xan da çox pis bir vəziyətdə piyada və çılpaq gəldi. Bəy və içkilərdən bəzilərini atlarla onu qarşılamağa göndərdim. Bu civarda ikən **(261 b)** gəlib bizə qoşuldu.

Axınçılar bu civarın dağ və dərələrinə də gedib bir-iki gün sonra gəldilər. Önəmli bir şey ələ keçmədi. Şah Mir Hüseyn, Can bəy [Can Məhəmmədi] və digər bəzi igidlər də izin alıb axına getdilər. Dunda olduğumuz günlərdə iki dəfə İsmayıl Cilvani ilə Bibənin məktubları gəldi. Buradan da onların arzu etdikləri fərmanlar göndərildi.

Dundan qalxıb Rupərə gəldik. Burada ikən çox yağmur yağdı və hava ümumən soyuq oldu. Ac və çılpaq hindistanlılar çox qırıldı. Ruperdən qalxıb Sihrind qarşısında yerləşən Kerələ enmişdik ki, «Sultan İbrahimin elçisiyəm» deyən bir hindistanlı gəldi, amma yanında məktub və yazısı yoxdu. Bizdən elçiliyə bir adam istəmiş. Onu bir sevadlı mühafizlə birlikdə geri göndərdik. Bu zavallılar gedincə İbrahim hər ikisini həbsə atdırmış. İbrahimi məğlub etdiyimiz gün [=20 aprel 1526] sevadlı qurtularaq gəldi.

Bir dəfə də dincəldikdən sonra Bənur və Sənur çayının sahilinə endik.

Hindistanın böyük çayların dışındakı axarsulardan biri də budur. Buna Gəgər çayı deyirlər. Çitər də bu çayın kənarındadır.

Çayın yuxarı tərəfini seyr etmək üçün getdik. Bu çay Çitərin üç-dörd küruh yuxarısında bulaqdan başlayır. Seyr etmək üçün getdiyimiz bu çayın yuxarı tərəfindəki geniş bir dərədən dörd-beş **(262 a)** dəyirman işlədə biləcək qədər su çıxır. Bir az daha yuxarıda isə çox gözəl, havası xoş və uyğun olan yerlər var. Bu çayın geniş dərədən çıxdığı yerə bir çarbağ salınmasını əmr etdim.

Bu su düzlüyə enib bir-iki küruh məsafə getdikdən sonra çaya tökülür. Gəgər çayı qaynaqdan sızır. Yağmur mövsümündə bu çayın suyu çoxalaraq üç-dörd küruh aşağıda Gəgər çayı ilə birləşdikdən sonra Samana və Sünnama gedir.

Biz o yurdda ikən Dehlinin bu tərəfində duran Sultan İbrahimin oradan irəliyə doğru yürüdüyü xəbərini aldıq. Hisari-Firuzənin şikdarı Həmid xan Xassə-Heyl də Hisari-Firuzənin və o civarın əsgəriylə birlikdə hisardan on-on beş küruh daha bu tərəfə doğru gəlibmiş. Kəttə bəy informasiya yığmaq üçün İbrahimin ordugahına tərəf yola düşdü, Mömin Atəkə isə Hisari-Firuzə əsgəri haqqında bilgi toplamaq üçün göndərildi.

Bazar günü, cəmadiyüləvvəl ayının on üçündə [=25 fevral] Embalədən qalxıb bir göl kənarına enmişdik. Mömin Atəkə ilə Kəttə bəy gəldilər. Həmid xanın üstünə yürüməsi üçün Xoca Kəlan, Sultan Məhəmməd Dulday və Vəli Xəzinə[çi]nin əmri altındakı bütün sağ qol adamını, Hindistanda qalan bəylərdən Xosrov, Hindu bəy [Koçin], Əbdüləziz [Miraxur] və Məhəmməd Əli Cəng-Cəngi, mərkəzdən də içki və igidlərdən Şah Mansur Barlas, Kəttə bəy, Mühib Əli Qurçu və digər adamlarla birlikdə Hümayunu **(262 b)** görəvləndirdik.

Bibən də biz bu yurdda ikən gəlib bizə qoşuldu. Əfqanlar çox qaba və axmaq olurlar. Dilavər xan həm nökər, həm də mövqeyi baxımından ondan daha yüksək olduğu, Aləm xanın oğulları isə padşahzadə olduqları halda hüzurumuzda oturmazdılar. Amma bu adam oturmaq istədi. Onun bu məqbul olmayan arzusuna kim qulaq asar.

Bazar ertəsi günü, ayın on dördü sabahı [=26 fevral] Hümayun Həmid xanın üstünə hərəkət etdi. Hümayun sürətlə hərəkət edir və özündən əvvəl yüz-yüz əlli yaxşı igidi öncü olaraq göndərir. Bunlar yaxınlaşıb savaşa tutuşaraq bir-iki əl atışdıqdan sonra arxadan Hümayunun qaraltısı görününcə düşmən dərhal qaçır. Yüz-iki yüz adamını ələ keçirərək yarısının başını kəsib, yarısını da yeddi-səkkiz fillə birlikdə gətirdi.

Bəy-Mirək Moğol Hümayunun bu zəfərinin xəbərini cümə günü, ayın on səkkizində biz bu yurdda ikən gətirdi. Ona dərhal bir xas paltar və axırdakı xas atlardan biri ehsan edilərək, mükafat da vəd olundu.

Bazar ertəsi günü, ayın iyirmi birində [=5 mart] biz hələ o yurdda ikən Hümayun yüzə qədər əsir və yeddi-səkkiz fillə gəlib bizə qoşuldu. Ustad

Əliquluya və tüfəngəndazlara **(263 a)** əmr edildi, əsirləri ibrət üçün tüfənglə qırdılar.

Bu, Hümayunun ilk səfəri və ilk dəfə gördüyü bir işdi, gələcək üçün xeyirli bir əlamət idi. Qaçanları təqib edənlər onları qovalayaraq Hisari-Firuzəyə qədər gedib onu da dərhal alaraq yağmalayıb gəldilər. Hümayuna çevrəsindəki bağlı yerlərlə birlikdə bir kürurluq vilayət olan Hisari-Firuzə və bir kürur ağ axça mükafat verildi.

O yurddan qalxıb Şahabada gəldik. Dil yaxalamaq üçün Sultan İbrahimin ordugahına adam göndərib bir neçə gün burada qaldıq. Rəhmət Piyadə zəfərnamələrlə birlikdə Kabilə göndərildi.

Biz bu yurdda ikən bazar ertəsi günü, cəmadiyüləvvəl ayının iyirmi səkkizində [=12 mart] günəş həməl bürcünə döndü.

İbrahimin ordusunun bir-iki küruh yürüyüb hər mənzildə iki-üç gün duraraq gəldiyi haqqında arxa-arxaya xəbərlər alınmağa başlandı. Biz də hərəkət edib Şahabaddan sonra arada iki dəfə dincələrək Cun çayının sahilində Sərsavənin qarşısına gəlib endik.

Xoca Kəlanın nökəri Heydərqulu dil yaxalamaq üçün göndərildi. Mən də Cun çayını keçid üzərindən keçərək gedib Sərsavəni seyr etdim. O gün məcun yemişdik. Sərsavənin bir çeşməsi vardır və bu çeşmədən xeyli su axır. Pis yer deyildir. Turdu bəy Xaksar tərif etmişdi **(263 b)** Mən də «Sənin olsun» dedim və bu münasibətlə Sərsavə Turdu bəyə verildi.

Bir gəmidə talvar düzəltdirmişdim və bəzən gəmi ilə gəzintiyə çıxırdım. Bəzi səfərlərə də gəmiylə gəlirdim.

O yurddan çay sahilini izləyərək aşağıya doğru iki-üç mənzil getmişdim. Dil yaxalamaq üçün gedənlərdən Heydərqulu xəbər gətirdi ki, Davud xan ilə [onun böyük qardaşı] Hətəm xan beş-altı min adamla birlikdə Miyan-Duab tərəfinə keçmişdir və bunlar İbrahimin ordugahından üç-dörd küruh irəlidə çəmbər qurub oturmuşlar.

Bunların üstünə yürümək üçün bazar günü, cəmadiyülaxır ayının səkkizində [=l aprel] Çin Teymur Sultan, Mehdi Xoca, Məhəmməd Sultan Mirzə ilə Adil Sultanı, Sultan Cüneyd, Şah Mir Hüseyn və Qutlu-Qədəmdən ibarət bütün sol qol adamlarını, mərkəzdən isə Yunus Əli, Abdullah [Kitabdar], Əhmədi və Kəttə bəyi ilqara ayırdıq. Günorta üstü buradan suyu keçib ikindiylə axşam arasında digər yaxadan hərəkətə keçdilər. Bibən də bu ilqar bəhanəsi ilə suyu keçib qaçdı.

Bunlar fərz vaxtında düşmənin üstünə yetişirlər; onlar da bir az özlərini döyüş nizamına girirmişlər kimi göstərir, lakin bizim adamların yetişməsi ilə dərhal qaçırlar. Onları İbrahimin ordugahının qarşısına qədər vura-vura təqib edirlər. Davud xanın böyük qardaşı və sərdarlarından biri olan Hətəm xanı ələ keçirib yetmiş-səksən əsir və altı-yeddi fillə birlikdə gətirdilər. İbrət üçün **(264 a)** əsirlərin çoxu qılıncdan keçirildi.

## SAVAŞA HAZIRLIQ

Oradan qalxıb sağ və sol qollarla mərkəz səfləri təftiş etdim. Əsgərimiz təxmin etdiyimiz qədər çıxmadı. Burada bütün əsgərə öz vəziyyətlərinə görə arabalar gətirmələri əmr edildi. Yedi yüz araba oldu. Ustad Əliquluya rum üsuluna görə, arabaların arasındakı zəncirlər yerinə öküz dərisindən qayışlar büküb arabaları bir-birinə bağlamasını əmr etdim. Hər iki araba arasında altı-yeddi qalxan olacaq, tüfəngəndazlar da bu arabaların və qalxanların arxasında durub tüfəng atacaqdıları. Bu hazırlığı tamamlamaq üçün burada beş-altı gün qaldıq.

Hazırlıqlar tamamlandıqdan sonra bütün bəyləri və söz anlayan yaxşı igidləri də dəvət edərək ümumi bir məşvərət şurası keçirib buna qərar verildi: Panipat bir şəhərdir, məhəllə və evləri çoxdur, hər tərəfi məhəllə və evdir. Ətrafını araba və qalxanlarla çevirib tüfəngəndazları və piyadaları da arabalarla qalxanların arxasına qoymaq lazımdır.

Bu qərarla qalxıb arada bir dəfə yolda gecələdikdə sonra cümə axşamı günü, cəmadiyülaxır ayının sonuncu günü [=12 aprel] Panipata gəldik.

Sağ tərəfimizdə şəhər və məhəllələr, önümüzdə yaradılan qalxanlar, sol tərəfdə **(264 b)** və bəzi yerlərdə xəndəklər və ağac maneələr vardı. Hər ox atımı məsafədə yüz-yüz əlliyə qədər atlının dışarı çıxa biləcəyi yerlər buraxıldı.

Əsgərin bir bölümü xeyli tərəddüd və qorxu içində idi, lakin tərəddüd və qorxu yersizdi, çünki Allahın əzəldə təqdir etdiyindən başqa bir şey ola bilməzdi. Lakin onları da ayıblamaq olmaz, onlar da haqlıydı, çünki vətəndən iki-üç ay yol qət edilərək gəlmişdilər və işləri də qəribə bir qövmlə idi. Nə biz onların dilini bilirdik nə də onlar bizim dilimizi bilirdi.

Pərişan cameyü came pərişan,
Giriftar qövmeyü qövmi əcaib.
*Pərişan bir topluluq ilə yenə pərişan bir kütlə,*
*Giriftar bir qövmlə əcaib bir qövm.*

İbrahimin əsgərinin sayını bir lek təxmin edir, özünün və əmirlərinin minə yaxın fili olduğunu söyləyirdilər. İki atasından [atası və babası] qalan xəzinə də nəqd olaraq əlindəydi. Hindistanda bir adət var: belə bir iş olanda ağ axça verib müəyyən bir müddətə əsgər tutur, bunlara da «bidhindi» deyirlər. Sultan İbrahim istəsə bir lek, hətta iki lek belə adam tuta bilərdi. Tanrı təala rast gətirdi, nə əsgərini məmnun edə bildi, nə də xəzinəsini paylaşdıra bildi. İgidini necə məmnun edə bilirdi ki, özü çox xəsis idi, üstəlik, sərvət yığmağa çox həris idi. təcrübəsiz bir gənc idi, gəlişi, **(265 a)** duruşu, yürüşü və savaşı diqqətsiz və məqsədsizdi.

Panipatda əsgərin ətrafı və civarı arabalar, ağac maneələr və xəndəklərlə düzənlənib gücləndiriləndə Dərviş Məhəmməd Sarban «Bu qədər ehti-

yat tədbirləri alındı, onun üstümüzə gəlməsi mümkün deyil» deyə ərz etdi.

Mən də belə dedim: «Sən bunları özbək xanları və sultanlarıyla müqayisə edirsən? Bizim Səmərqənddən çıxıb Hisara gəldiyimiz il özbəklərin bütün xan və sultanları yığılaraq hamısı birlikdə üstümüzə gəlmək niyyətilə Dərbənddən keçmişdilər. Biz də bütün sipahilərin və moğolların ailələrini və mallarını məhəllələrə doldurub məhəllələri sipərlərlə gücləndirmişdik. O xanlar və sultanlar yürüşün və savaşın hesab və üsulunu bildikləri üçün bizim ölümü və həyatı Hisarda görərək Hisarı gücləndirdiyimizi anlayınca Hisar üzərinə yürümənin yolunu tapa bilməyib Çağanyan civarındakı Nəvəndakdan geri dönmüşdülər. Amma sən bunları onlara bənzətmə, bunlar iş hesabını və yürüş üsulunu haradan biləcəklər». Allah rast gətirdi və tam mənim dediyim kimi oldu.

Yeddi-səkkiz gündür Panipatda idik. Adamlarımız kiçik dəstələr halında düşmən ordugahına qədər gedib izdihama qarşı ox atır və baş kəsib gətirirdilər. Onlar isə heç bir hərəkətdə buluna bilmirdilər.

Axırda bizə sadiq olan **(265 b)** bəzi Hindistan bəylərinin fikrinə görə hərəkət edib Mehdi Xoca, Məhəmməd Sultan Mirzə, Adil Sultan, Xosrov, Şah Mir Hüseyn, Sultan Cüneyd Barlas, Əbdüləziz Miraxur, Məhəmməd Əli Cəng-Cəng, Qutlu-Qədəm, Vəli Xəzinə[çi], Mühib Əli Xəlifə, Məhəmməd Bəxşi, Can bəy [Can Məhəmməd] və Qara Quzu komandanlığındakı dörd-beş min adamı gecə basqınına göndərdik. Bunlar gecə bir-birləri ilə əlaqə qura bilməyərək dağınıq bir halda gedirlər. Bir iş görə bilmədilər. Dan ağarıb aydınlıq oluncaya qədər də düşmən ordugahının yaxınında qaldılar. Düşmən birlikləri naqaralar çalıb filləri ilə birlikdə döyüş nizamına girmiş bir halda qarşı çıxdı. Bizimkilər bir iş edə bilməsələr də, bu qədər çox insanla çarpışaraq itkiyə uğramadan sağ və salim çıxıb gəldilər. Məhəmməd Əli Cəng-Cəngin ayağına bir ox isabət etdi, gərçi təhlükəli deyildi, lakin savaş günü o, işə yaramadı.

Bu xəbəri alınca, Hümayunu əsgəriylə onların qarşısına bir və ya bir yarım küruh qədər göndərib özüm də qalan əsgərlə birlikdə döyüş nizamına girmiş bir halda irəlilədim. Gecə basqınına gedənlər də gəlib Hümayuna qoşuldular. Düşmən artıq irəliləməyincə biz də yerimizə döndük. O gecə ordugahda yersiz bir qarışıqlıq çıxdı. Bir geriyə yaxın bir müddət boyunca savaş nərələri və gurultu davam etdi. Belə gurultuya alışıq olmayan əsgərlər xeyli tərəddüd və qorxu keçirdilər. Bir müddət sonra **(266 a)** gürültü yatdı.

## PANİPAT SAVAŞI

Cümə günü, rəcəb ayının səkkizində [=20 aprel] fərz vaxtı öncülərimizdən düşmənin səf halında irəliləməkdə olduğu xəbəri gəldi. Biz də zireh geyib silahlanaraq atlara mindik.

Sağ qol alayında Hümayun, Xoca Kəlan, Sultan Məhəmməd Dulday, Hindu bəy, Vəli Xəzinə[çi], Pirqulu Sistani, sol qol alayında Məhəmməd Sultan Mirzə, Mehdi Xoca, Adil Sultan, Şah Mir Hüseyn, Sultan Cüneyd Barlas, Qutlu-Qədəm, Can, Məhəmməd Bəxşi və Şah Hüseyn Yaregi Moğol Qançı, mərkəzin sağ qolunda Çin Teymur Sultan, Süleyman Mirzə, Məhəmmədi Göyəldaş, Şah Mansur Barlas, Yunus Əli, Dərviş Məhəmməd Sarban və Abdullah Kitabdar, mərkəzin sol qolunda Xəlifə, Xoca Mir Miran, Əhmədi Pərvançı, Turdu bəy, Qoç bəy, Mühib Əli Xəlifə və Mirzə bəy Tarxan, önçü qolunda Xosrov Göyəldaş və Məhəmməd Əli Cəng-Cəng vardı. Əbdüləziz Miraxuru ehtiyatda saxlamışdıq. Sağ qol alayının bir ucunda Vəli Qızıl və moğollarıyla birlikdə Məlik Qasım Baba-Qaşqa, sol qol alayının bir ucunda da Qara Quzu, Əbülməhəmməd Nizəbaz, Şeyx Camalın oğlu Şeyx Əli Barin, Mehdi və Tanrıqulu Pışqı Moğolu mühasirə bölüyü üçün ayırdıq. Bu mühasirə bölüyündəki iki qitə düşmən yaxınlaşınca, sağ və sol qoldan irəliləyərək düşməni arxadan mühasirə edəcəkdi. **(266 b)**

Düşmənin qaraltısı görünəndə daha çox sağ qol alayı tərəfinə doğru ağırlıq verdikləri anlaşıldı və bu üzdən də ehtiyatda saxlanan Əbdüləziz sağ qol alayına köməkçi göndərildi. Sultan İbrahimin qaraltısı uzaqdan göründüyü andan etibarən heç bir yerdə durmadan sürətlə gəlirdi. Bir az irəliləyincə bizim qaraltımız da onlara göründü. Bizim savaş düzənini və səflərimizi gördükdə sıxılmış bir vəziyyətdə «Duraqmı, durmayaqmı, gedəkmi, getməyəkmi?» dermiş kimi, nə dura bildilər, nə də əvvəlki kimi heç durmadan üstümüzə yürüyə bildilər.

Mühasirə bölüyünə sağ və sol qoldan düşmənin arxasına keçib ox ataraq savaşa girməsi, sağ və sol qol alaylarının da yürüyərək düşmənə hücum etməsi əmr edildi. Mühasirə alayı düşmənin arxasına keçib ox atmağa başladı. Sol qol alayından Mehdi Xoca daha əvvəl hücum etdi. Mehdi Xocanın qarşısına yanlarında bir fili olan bir dəstə irəlilədi, bunlar da o dəstəni ox yağmuru altında qoyaraq geri qaytardılar.

Sol qol alayına mərkəzdən Əhmədi Pərvançı, Turdu bəy, Qoç bəy və Mühib Əli Xəlifə köməkçi olaraq göndərildi. Sağ qol alayı da savaşa girdi. Məhəmmədi Göyəldaş, Şah Mansur Barlas, Yunus Əli və Abdullaha mərkəzin önündən qarşıya yürüyüb hərəkətə keçmələri əmr edildi. Ustad Əliqulu da mərkəzin önündən bir neçə dəfə firəngi topuyla yaxşı mərmi atdı. Mustafa Topçu [Rumi] də mərkəzin sol qolundan araba üzərindəki **(267 a)** zərbzən toplarıyla yaxşı mərmi atdı. Sağ və sol qol alayları, mərkəz və mühasirə alayındakılar düşmənin ətrafını çevirib ox yağmuruna tutaraq şiddətlə savaşdılar.

Düşmən bizim sağ və sol qol alaylarımız tərəfinə bir-iki dəfə qısa-qısa hücumlar etdi. Bizim adamlarımız da ox atıb ox yağmuruyla onları təkrar mərkəzlərinə qaytardılar. Düşmənin sağ və sol qol alayları hamısı bir yerdə toplanaraq elə bir şəkildə tıxandılar ki, nə irəli gələ bildilər, nə də

qaçmaq üçün yol tapa bildilər. Savaş başladığında günəş bir nizə boyu qədər yüksəlmişdi, günortaya qədər şiddətli savaş davam etdi. Günorta vaxtı düşmənlər qəhr olub məğlub edilərkən dostlar da sevindilər.

Tanrı təala öz fəzl və kəramiylə bu qədər zor bir işi asanlaşdırdı. İzdihamlı bir ordunu yarım gündə yerlə bir etdi. Beş-altı min adam İbrahimin tam yaxınında bir yerdə vurulmuşdu. Bu savaşda bütün cəbhədə ölənlərin sayını on beş-on altı min qədər təxmin edirdik. Sonradan Aqraya gələndə Hindistan xalqının söylədiyinə görə bu savaş meydanında qırx-əlli min adamın ölmüş olduğu anlaşıldı.

Düşməni məğlub etdikdən sonra vura-vura təqib etdik. Qarşı tərəfdən ələ keçirilən əmirləri və bəyləri gətirməyə başladılar. Filçilər filləri sürülər halında gətirib hədiyyə etdilər. Düşməni **(267 b)** təqib edərkən İbrahimi şəhərdən çıxmış zənn edərək xassə alayından Qəsəmtay Mirzə, Baba Çöhrə və Böçkə komandanlığındakı adamlara İbrahim Aqraya varmadan sürətlə yürüyüb onu ələ keçirmələri üçün təqibçi olaraq vəzifə verdik.

İbrahimin ordugahının içərindən keçərək otaqları və çadırlarını seyr edib Qarasuyun kənarına endik. İkindəyə yaxın Xəlifənin kiçık qaynı Tahir Təbəri Sultan İbrahimin cəsədini bu qədər ölünün içindən tanıyıb başını kəsib gətirdi.

O gün dərhal Hümayun Mirzə, Xoca Kəlan, Məhəmmədi, Şah Mansur Barlas, Yunus Əli, Abdullah [Kitabdar] və Vəli Xəzinə[çi]yə yüksüz olaraq sürətlə yürüyüb Aqrayı ələ keçirmək və xəzinələri zəbt etmək tapşırıldı. Mehdi Xoca, Məhəmməd Sultan Mirzə, Adil Sultan, Sultan Cüneyd Barlas və Qutlu-Qədəmi də yüksüz olaraq sürətlə hərəkət edib Dehli kurqanına girərək xəzinələri mühafizə etmələri üçün ayırdıq.

## BABURUN DEHLİYƏ GİRMƏSİ

Ertəsi gün qalxıb bir küruh məsafə gəldikdən sonra atlar üçün Cun sahilinə endik. Arada iki dəfə dincəlib çərşənbə axşamı günü Şeyx Nizam Övliyanın məzarını ziyarət edərək Dehlinin qarşısına Cun sahilinə endik.

Çərşənbə günü Dehli kurqanını seyr edib gecəni orada keçirdikdən sonra ertəsi cümə axşamı günü Xoca Qutbəddinin məzarını ziyarət edib Sultan Qiyasəddin Balban və Sultan Əlaəddin Xilçinin qəbrlərini, imarətlərini, **(268 a)** minarəni, hövzi-şəmsi və hövzi-xası, Sultan Bəhlul ilə Sultan İskəndərin qəbr və bağlarını seyr etdikdən sonra ordugaha gələrək gəmiyə minib mey içdik. Dehlinin şikdarlığını Vəli Qızıla ehsan edib Dostu [eşik-ağa] Dehli vilayətinə divan təyin etdik. Mövcud xəzinələri möhürləyib bunların məsuliyyətinə verdik.

Cümə axşamı günü oradan qalxıb Tuğluqabad qarşısında Cun sahilinə endik. Cümə gününü orada keçirdik. Mövlana Mahmud Fərabi ilə Şeyx

Zeyn gedib Dehlidə cümə namazını qılıb mənim adıma xütbə oxutdular; fəqir və miskinlərə bir qədər ağ axça paylayaraq orduya gəldilər.

Şənbə oradan qalxıb Aqraya doğru mənzil-mənzil hərəkət etdik. Mən gedib Tuğluqabadı seyr etdikdən sonra təkrar ordugaha gəldim.

Cümə günü, rəcəb ayının iyirmi ikisində [=4 may] Aqranın məhəllələri içində olan Süleyman Şeyxzadə Fərmülinin imarətinə endik. Bu yer kurqandan xeyli uzaqda olduğu üçün ertəsi gün qalxıb Cəlal xan Cighətin imarətinə gəldik. Hümayun bir az öncə gəlmişdi. Kurqandakılar bəhanə irəli sürərək hiyləyə əl atmışlar. Bunlar da əhalinin başsızlığını düşünüb «Birdən xəzinələrə əl uzadarlar» deyə biz gəlincəyə qədər dışarı çıxılacaq yolları qoruma altına almışdılar.

Bikermacit Hindu Güvalyar racəsi idi və babaları yüz ildən artıq Güvalyar vilayətində **(268 b)** səltənət sürmüşdülər. İskəndər Güvalyarı almaq üçün bir neçə il Aqrada oturdu. Sonra İbrahim zamanında da Əzəm Hümayun Servani bir neçə dəfə buranı şiddətli bir şəkildə mühasirəyə almış və axırda [=1518] barış yoluyla ələ keçirib yerinə Şəmsabadı vermişdi.

Bikermacit də biz Sultan İbrahimi yendiyimiz zaman cəhənnəmə vasil olmuşdu. Ev əhli və uşaqları Aqradaydı. Hümayun Aqraya gələndə Bikermacitin ev əhlinin qaçma niyyəti varmış. Hümayun getmələrinə izin verməmiş. Bir çox cəvahiri və qiymətli daşı Hümayuna könüllü hədiyyə etmişlər. Bunlar arasında Sultan Əlaəddinin [Xilçi] gətirmiş olduğu məşhur bir almas vardı. Elə məşhurdu ki, bir mütəxəssis bunun qiyməti haqqında «Bütün dünyanın iki yarım günlük məsrəfi» demişdir. Deyəsən, səkkiz misqaldır. Mən gələndə Hümayun onu mənə peşkəş etdi, mən də Hümayuna bağışladım.

Kurqandakı sipahilər arasında məşhur adamlardan Məlikdad Kərani, Məlik Süruk və Firuz xan Mivati də vardı. Bunlardan bəzi hiyləgərlik gördük və cəzaları nə isə verdik. Məlikdad Kəranini göndərərək bəzi istəklərdə bulundular. Bir qərara bağlanıncaya qədər gedə-gələ dörd-beş gün vaxt keçdi. Axırda onlara istədikləri kimi inayət və şəfqət göstərib bütün mallarını özlərinə verdik. İbrahimin atasını da xidmətçiləri ilə birlikdə çıxarıb Aqradan bir küruh məsafədə və suyun aşağısında yeddi leklik bir yurd **(269 a)** verdik. Digər bəylərə də ayrıca pərgənələr verildi.

Cümə axşamı günü, rəcəb ayının iyirmi səkkizində [=10 may] ikindi vaxtı Aqraya girərək Sultan İbrahimin sarayına endik.

Doqquz yüz onuncu ildə [=1504/5] Kabil vilayətinin zəbt edilməsindən bəri daim Hindistana yürümək arzusunda idik. Bəzən bəylərin dargörüşlülüyündən, bəzən də qardaşlarımın müxalifətindən Hindistan səfəri gerçəkləşmir və məmləkətləri də ələ keçirilə bilmirdı. Axırda əngəllər ortadan qalxdı. Böyük və kiçık bəylərdən heç kim məqsədə zidd söz söyləmədi.

Doqquzyüz iyirmi beşinci ildə [=1519] qoşun çəkib Bəcuru zorlayaraq iki-üç geridə [otuz ilə qırx beş dəqiqə arasında] zəbt edib əhalisini qılıncdan

keçirdikdən sonra Bxirəyə gəlmişdik. Buranı yağmalamadan əhalisinə bir qurtuluş fidyəsi təyin edib nəqd və ya mal olaraq dörd lek şahruxi alıb əsgərin sayına görə paylaşdırdıqdan sonra Kabilə geri dönmüşdük.

O tarixdən doqquz yüz otuz ikinci ilə [=1525/6] qədər də Hindistana əsgər yeritməyi sürdürmüşdük. Bu səfərlərin beşincisində də tanrı təala öz fəzl və inayətiylə Sultan İbrahim kimi bir düşməni qəhr və pərişan edərək Hindistan kimi məmləkəti ələ keçirməmizi asanlaşdırdı.

Həzrəti peyğəmber zamanından bu tarixə qədər Hindistan vilayətlərini dışarı padşahlardan üç adam ələ keçirərək orada səltənət sürmüşdür.

Biri Sultan Mahmud Qazi [Qəznəvi] və övladlarıdır, Hindistan məmləkətində uzun müddət hökmdarlıq taxtında oturmuşlar[1].

İkincisi Sultan Şahabəddin **(269 b)** Quri ilə qulları və xidmətində olan şəxslərdir, çox illər bu məmləkətlərdə padşahlıq sürmüşlər[2].

Üçüncüsü də mənəm, lakin mənim işim o padşahlarınkına bənzəmir, çünki Sultan Mahmud Hindistanı zəbt edəndə Xorasan taxtı onda idi, Xarəzm və Darülmürz sultanları ona itaət edərək boyun əymişdilər. Səmərqənd padşahı da onun himayəsindəydi. Əsgəri iki lek olmasa da, bir lekdən heç az deyildi. Düşmənləri də racələrdi və bütün Hindistan tək bir padşahın idarəsində deyildi. Hər bir racə öz başına bir vilayətdə padşahlıq edirdi.

Sultan Şəhabəddin Quriyə gəlincə, Xorasan səltənəti onda deyil, böyük qardaşı Qiyasəddin Quridə idi. *Təbəqəti-Nasir*də yazıldığına görə, Hindistana bir səfərində bir lek və iyirmi min zirehli sipahi sövq etmişdir. Onun düşmənləri də ray və racələrdi, bütün Hindistan yalnızca tək bir adamın əlində deyildi.

Bxirəyə gələndə mənim min beş yüz, ən çoxu iki min adamım vardı. Beşinci dəfə gəlib Sultan İbrahimi yenərək Hindistanı fəth etdim. Heç bir zaman Hindistana bu qədər az əsgərlə gəlməmişlər. Əsgər, tüccar və xidmətçilər daxil olmaq üzrə orduyla birlikdə olanların hamısı on iki min adam olaraq qeyd edildi. Mənə bağlı vilayətlərsə **(270 a)** Bədəxşan, Qunduz, Kabil və Qəndəhardan ibarətdi. Lakin bu vilayətlərdən də önəmli bir yardım gəlmirdi. Tam tərsinə, düşmənə yaxın olduqları üçün bəzi vilayətlərə heç durmadan yardım etmək lazım gəlirdi. Bütün Mavəraünnəhr vilayətləri özbək xanlarının və sultanlarının idarəsindəydi. Onların yüz minə yaxın əsgəri vardı və əski bir düşmən idilər.

---

[1] 963-1187-ci illər arasında hökm sürən Qəznəvi türk dövlətinin başına 998-ci ildə keçən Sultan Mahmud hakimiyyətini Hindistana qədər genişlətmiş və Lahoru Bəlxdən sonra üçüncü dövlət mərkəzi etmişdir. 1031-ci ildə öldükdən sonra oğulları taxta keçərək 1186-cı ilə qədər Pəncab bölgəsində hökm sürmüşlər.

[2] Əfqanistanda hökm sürən Quri xanədandan olan Sultan Şəhabəddin Quri qəznəvilərin son hökmdarı Xosrov Məliki yenərək 1187-ci ildə bu xanədana son vermiş və Hindistan içlərinə səfərlər edərək burada Quri hakimiyyətini qurmuşdur. Onun xanədanından gələnlər Şimali Hindistanda 1206-cı ilədək hakimiyyət sürmüşlər.

Hindistan məmləkəti isə Bxirədən Behara qədər əfqan idarəsindəydi, padşahı da Sultan İbrahimdi. Vilayət hesabıyla beş lek əsgəri olmalı idi. O günlərdə əmirləri özünə müxalif etdiyi üçün mövcud əsgərini bir lek qədər təxmin edirdilər. Özünün və əmirlərinin əlində minə yaxın fil olduğu söylənirdi.

Bu vəziyyətdə və bu qədər bir qüvvə ilə təvəkkül edib yüz min adamlıq bir qüvvəyə sahib olan özbəklər kimi əski bir düşməni arxada qoyaraq, Sultan İbrahim kimi çox əsgərli və geniş məmləkətli bir padşahla qarşılaşdıq. Bu təvəkkülümüz nisbətində tanrı təala əziyyət və zəhmətimizi boşa çıxarmayıb belə güclü bir düşməni məğlub edərək Hindistan kimi geniş bir məmləkəti fəth etdirdi. Bu dövlətə öz güc və qüvvətimizdən deyil, sırf Allahın lütf və şəfqətindən, bu xoşbəxtliyə isə öz qeyrət və səylərimizdən deyil, Allahın eyni kərəm və inayəti sayəsində çatdıq deyə bilərik.

## HİNDİSTANIN TƏRİFİ

Hindistan, məmləkətləri geniş, xalqı və məhsulu çox olan bir ölkədir. **(270 b)** Şərqi, cənubu və hətta qərbi də Hind dənizinə qədər uzanır. Şimali dağlıq olub Hinduquş, Kafiristan və Kəşmir dağlarıyla bitişikdir. Yenə şimalında Kabil, Qəznə və Qəndəhar yerləşir.

Bütün Hindistan vilayətlərinin paytaxtı Dehli sayılır. Sultan Şəhabəddin Quridən sonra Sultan Firuz şahın son günlərinə qədər Hindistanın böyük bir qismi Dehli sultanlarının idarəsi altmdaymış. Mənim Hindistanı fəth etdiyim dönəmdə beş müsəlman və iki kafir Hindistanda səltənət sürürdu. Dağlarda və cəngəlliklərdə böyüklü-kiçıkli xeyli ray və racə də vardı, lakin etibarlı və müstəqil olanları bunlardı.

Bunlardan biri əfqanlar olub paytaxt Dehli onlarda idi. Bxirədən Behara qədər olan yerlər onların idarəsindəydi. Əfqanlardan əvvəl isə Cunpur Sultan Hüseyn Şərqinin idarəsindəydi[1]. Bu sülaləyə Purebi deyirlər, bunların ataları Sultan Firuz şah və soyunun yanında saqi imiş, Firuz şahdan sonra Cunpur məmləkətini əllərinə keçirmişlər.

Dehli isə Sultan Əlaəddinin əlindəydi və bu sülalə də seyidlərdəndir[2]. Teymur bəy Dehlini aldığı zaman [=1398 dekabr] Dehlinin idarəsini bunların atalarına vermişdi. Sultan Bəhlul Ludi Əfqan və oğlu Sultan İskəndər paytaxt Dehli ilə paytaxt Cunpuru əllərinə keçirdilər və beləcə hər iki paytaxta tək bir padşah oturdu.

İkincisi Quceratdakı Sultan Müzəffərdi[3]. Sultan İbrahimin məğlubiy-

---

[1] Sultan Hüseyn Cunpurdakı Şərqi sultanlarının sonuncusudur, 1458-79-cu illər arasında hökm sürmüşdür.

[2] Seyidlər sülaləsindən olan Sultan Əlaəddin [Ludi] 1446-51-ci illər, Bəhlul Ludi 1451-89-cu illər, oğlu Sultan İskəndər isə 1489-1517-ci illər arasında hökm sürmüşdür.

[3] Sultan Müzəffər 1512-26-cı illər arasında hökmdarlıq etmişdir.

yətə uğramasından bir neçə gün öncə dünyadan **(27l a)** köçdü. Şəriətə fövqəladə vaqif bir padşah idi. Elmlə uğraşır, hədis oxuyur və durmadan *Quran* yazaraq çoxaldırdı. Bunların sülaləsinə Tank deyirlər. Bunların ataları da Sultan Firuz və soyunun şərabdarlarıymış, Firuz şahdan sonra Qucerat vilayətini əllərinə keçirmişlər.

Üçüncüsü Dəkkəndəki Bəhmənilərdir[1]. Lakin bu dövrdə Dəkkən sultanlarının gücləri və iqtidarları qalmamışdı, bütün vilayətlərini böyük bəylər əllərinə almışdılar. Bir şeyə möhtac olunca bəylərindən diləyirdilər.

Dördüncüsü Mendav da dedikləri Malvə vilayətindəki Sultan Mahmuddur[2]. Bu sülaləyə xilçi deyirlər. Rana Sanka adlı kafir onu məğlub edib vilayətinin böyük bölümünü əlinə keçirmiş, o da zəif düşmüşdü. Bunların ataları da Firuz şahın yetişdirdiyi adamlardanmış. Onun ölümündən sonra Malvə vilayətini əllərinə keçirmişlər.

Beşincisi isə Benqal vilayətindəki Nüsrət şahdır. Atası Benqal vilayətində padşah olmuşdu və seyidlərdəndi. Sultan Əlaəddin ləqəbini daşıyırdı. Səltənət ona mirasla keçmişdi.

Qəribə bir adətdir ki, Benqalda mirasla səltənət çox az olur. Padşahın müəyyən bir taxtı, əmirlər, vəzirlər və digər məqam sahiblərinin hər birinin müəyyən yerləri vardır. Benqal xalqının gözündə mötəbər olan taxtdır. Hər birinin özünə tabe olan və itaət edən əsgərlərinin və xidmətçilərinin hamısı özəl və sadiqdir. Padşah birini təyin etmək və ya əzl etmək **(271 b)** istəsə və o məqama hər hansı bir adamı təyin etsə, o məqama bağlı olub itaət edən əsgərlərin və qulluqçuların hamısı o adamın olur. Hətta padşahlıqda da belədir. Kim padşahı öldürərək taxta keçmək imkanını tapsa, padşah olur, əmirlərin və vəzirlərin, sipahilərin və xalqın hamısı ona itaət edərək boyun əyir. Onu eynən əski padşah kimi padşah olaraq tanıyır və əmirlərinə itaət edirlər.

Benqal əhalisinin sözü şudur: «Biz taxtın köləlƏriyik, taxta keçən hər kəsə itaət edirik». Necə ki Nüsrət şahın atası Sultan Əlaəddindən öncə bir həbəş padşahı öldürərək taxta keçdi və bir müddət səltənət sürdü[3]. Sultan Əlaəddin də həbəşi öldürmək surətilə taxta keçmişdi. Sultan Əlaəddindən sonra da miras yoluyla oğlu padşah olmuşdur[4].

Benqalda bir də bu adət vardır: bir adam padşah oldumu onun əvvəlki padşahların xəzinələrini sərf edib və xərcləməsi çox ayıb və utanılacaq bir şey sayılır. Padşah olan hər kəs yenidən xəzinə yığmalıdır. Xəzinə yığmaq o əhalinin gözündə iftixar və sevinc vəsiləsidir.

Adətlərindən biri də budur: Xəzinə, axır, hətta sultanlarının bütün bi-

[1] Bəhmənilər xanədanı Dəkkən bölgəsində 1347-1527-ci illərdə hökmdarlıq etmişdir.

[2] Sultan Mahmud 1512-31-ci illər arasında hökm sürmüşdür.

[3] Bu həbəşin adı Şəmsəddin Müzəffərdir. 1494-97-ci illərdə padşah olmuşdur.

[4] Sultan Əlaəddin 1497-1519-cu, oğlu Sultan Nüsrət şah isə 1519-32-ci illər arasında hökmdar olmuşdur.

nalarının əskidən bəri qərarlaşdırılmış və müəyyənləşdirilmiş gəlirləri və pərgənələri vardır, bunlar başqa yerlərə heç bir şəkildə xərclənə bilməz.

Müsəlmanlar arasında böyük və mötəbər olan, çox əsgərə və çox vilayətə sahib olan padşahlar burada bəhs etdiklərimdir.

Kafirlər arasında isə vilayət və əsgər baxımından böyük olanlardan biri **(272 a)** Bicangər racəsidir[1].

Bir də bu yaxınlarda özünün cürəti və qılıncıyla böyümüş olan Rana Sanka vardır. Əsl vilayəti Çiturdu. Mendav sultanlarının səltənəti yıxılanda Mendava bağlı olan Rətənbur, Sarəngpur, Bhilsan və Çəndiri kimi bir çox vilayəti ələ keçirdi. Doqquz yüz on dördüncü ildə [=1528] Allahın inayəti ilə neçə ildir savaş alanı olan Çəndirini -Rana Sankanın Midni Rav adlı böyük və etibarlı bir adamı dörd-beş min kafirlə birlikdə orada olurdu- bir-iki geridə [yarım saat içində] zorla aldım və kafirləri qılıncdan keçirərək oranı islam yurdu elədim. Təfsilatı irəlidə söylənəcəkdir.

Hindistanın ətrafında və civarında bir çox ray və racə vardır. Bunların bəziləri islama itaət etmişdi. Bəziləri isə uzaqda olduqlarından, ya da yerlərinin qorunaqlı olması üzündən müsəlman padşahlara itaət etmirdi.

Hindistan birinci, ikinci və üçüncü iqlimdədir. Hindistan dördüncü iqlimə daxil deyil. Qəribə bir ölkədir. Bizim vilayətlərlə müqayisədə başqa bir aləmdir. Dağları, suyu, cəngəllikləri, ovası, torpağı, vilayəti, heyvanları, bitkiləri, xalqı, dili, yağmuru, rüzgarı, hamısı tamamən başqadır. Kabilə bağlı isti ölkələr bəzi xüsuslarda Hindistana bənzəyir, bəzi xüsuslarda isə bənzəmir. Sind çayını keçincə yer və su, ağac və daş, el və ulus, adət və örf **(272 b)** tamamən Hindistandakı kimidir.

Söyləndiyi kimi, şimal yönündəki dağlar və bu dağların Sind çayının o biri tərəfində yerləşən vilayətləri Kəşmirə tabedir. Hal-hazırda Pekli və Şəhməng kimi bu dağdakı vilayətlərin çoxu Kəşmirə itaət etməsə də, əskidən Kəşmirə daxil imiş.

Kəşmirdən keçdikdən sonra bu dağda sayısız el və ulus, pərgənə və vilayət vardır. Benqala, hətta Hind dənizi sahilinə qədər bu dağda sıx bir xalq kütləsi yaşayır. Hindistan xalqı bütün araşdırma və incələmələrə baxmayaraq bu qəbilələr haqqında dəqiq məlumat verə bilmədi, yalnızca bu dağın xalqına Kas dediklərini söylədilər. Hindistanlılar «ş»ni «s» şəklində tələffüz etdikləri və bu dağda ən böyük şəhər Kəşmir olduğu və Kəşmirdən başqa o dağda digər bir şəhərin varlığı da bilinmədiyi üçün bəlkə bu üzdən Kəşmir demiş ola bilərlər deyə düşündüm.

Bu dağ əhalisinin ticarət malı müşk, kutasi-bəhri (dəniz öküzü), zəfəran, qurğuşun və misdir. Hindistan əhalisi bu dağa Seva-Lek-Perpet deyir.

---

[1] Bicangər racəliyi Dəkkəndə 1336-cı ildə qurulmuşdur və bu sülalədən gələn racələr 1565-ci qədər, yəni güclərini birləşdirən digər Dəkkən racələri tərəfindən yenilib Bicangər şəhəri yıxılanadək hökm sürmüşlər.

Hind dilində *seva* «dörddə bir», *lek* «yüz min», *perpet* isə «dağ» deməkdir. Yəni dörddə bir və yüz min dağ ki, yüz iyirmi beş min dağ edir. Bu dağlarda qar heç əskik olmaz, bu dağların qarla örtülü bəyaz zirvələri Hindistanın Lahor, Sihrind və Sənbəl kimi bəzi vilayətlərindən də görünür. Bu dağlar Kabildə Hinduquş adıyla anılır və Kabildən bir qədər günəyə meyl edərək şərqə doğru uzanır. Güney tərəfi tamamən Hindistandır. Bu dağların **(273 a)** və Kas dedikləri bu məchul qəbilələrin şimali Tibet vilayətidir.

Bu dağlardan bir çox çay çıxaraq Hindistanın içindən keçir. Sihrinddən şimala doğru Sind, Bəxət, Çanab, Ravi, Biyah və Setlücdən ibarət olan altı çay bu dağdan çıxaraq Multan civarında bir yerdə birləşir. Hamısı bir yerdə birləşəndə ona Sind deyirlər. Qərbə doğru axan bu çay Tatta vilayətinin içindən keçdikdən sonra ümman ilə birləşir. Bu altı çaydan başqa Cun, Qanq, Rəhəb, Qumti, Gəgər, Sem və Gəndək kimi bir çox digər çaylar da vardır. Bunların hamısı Qanq çayıyla birləşir və Qanq adıyla şərqə doğru axaraq Benqal vilayətinin içindən keçmək surətiylə axırda dənizə tökülür. Hamısının qaynağı bu Seva-Lek-Perpet dağıdır.

Çənbəl, Bənas, Bitvi və Sun kimi bəzi çaylar da Hindistandakı digər dağlardan çıxır, amma bu dağlarda qar heç olmur və bu çaylar da Qanq çayı ilə birləşir.

Hindistanda da dağlar vardır. Bunlardan biri şimaldən cənuba doğru uzanan bir dağdır. Bu dağ Dehli vilayətində və [Sultan] Firuz şahın kiçık və qayalıq bir dağın üstündə tikdirdiyi Cahannüma adlı imarətindən başlayır. Buradan keçincə Dehli civarında parça-parça, ufaq-ufaq və ara-sıra qayalıqlı kiçık dağlar ortaya çıxır. Mivat vilayətinə varınca bu dağlar bir az daha böyüyür və Mivatdan keçib **(273 b)** Biyanə vilayətinə uzanırlar. Sikri, Barı və Dulpurun dağları da bitişik olmamalarına baxmayaraq bu dağ silsiləsindəndir. Kalpur dedikləri Güvalyarın dağları da bu dağla bağlantılıdır. Bundan başqa, Rətənbur, Çitur, Mendav və Çəndiri dağları da bu dağın qollarındandır. Bəzi yerlərdə araları yeddi-səkkiz küruh qədər kəsikdir. Bu dağlar alçaq, sarp, qayalı və cəngəllikli dağlardır. Bu dağlara qar heç yağmaz. Hindistandakı bəzi çayların mənbəyi bu dağlardadır.

Hindistan vilayətlərinin çoxu düz yerdir. Bunca şəhər və vilayətlərin heç birində axarsu yoxdur. Tək axarsu böyük çaylardır. Bəzi yerlərdə yığılmış sular vardır. Bəzi şəhərlərdə arx açaraq su çıxarmaq mümükün olduğu halda bunu etmirlər. Bunun üçün bir neçə səbəb ola bilər. Biri əkin və bağları üçün suya heç ehtiyacları yoxdur: payız məhsulu mövsüm yağmuruyla yetişir və bu qəribədir ki, yaz məhsulu yağmur olmasa da yetişir. Ağacların fidanına bir-iki il su daşıyır, ya da çarx və dəsti ilə su verirlər. Ondan sonra su verməyə gərək qalmır. Bəzi səbzələrə su verirlər. Lahor, Dibalpur, Sihrind və o civarlarda su çarxla verilir. Quyu dərinliyində iki ipin uclarını bağlayaraq halqa düzəldir, bu iki ipin arasına ağaclar və bu ağaclara da dəstilər

bağlayırlar. Bu vedrələrin bağlandığı **(274 a)** ipi quyunun üstündəki çarxa qoyur və onun yanında mili dik duran ikinci bir çarx daha düzəldirlər. Öküz bu ikinci çarxı çevirəndə onun dişləri dəstilərin bağlandığı birinci çarxın dişlərinə girib onu döndərir. Suyun töküldüyü yerə holuq qoyurlar və bu holuqdan suyu hər tərəfə aparırlar.

Aqra, Çəndvar, Biyanə və o civarlarda suyu vedrə ilə verirlər. Bu məşəqqətli və çirkli bir işdir. Quyunun kənarına bir çəngəl ağac dikir və çəngəlin dişləri arasına diyircək yerləşdirirlər. Vedrəni uzun bir ipə bağlayıb bu diyircək üzərinə qoyur və ipin bir ucunu da öküzə bağlayırlar. Bir adamın öküzü sürməsi və birinin də vedrədəki suyu boşaltması lazımdır. Bu öküz bu ipi çəkıb təkrar geriyə döndüyü zaman hər dəfə ip öküzün sidiyi və axbunu ilə kirlənmiş olan yolun üzərinə sürtünüb təkrar quyuya düşür.

Bəzi əkin sahələrində əgər su lazım olsa, kişi və qadın su daşıyaraq suvarırlar.

Hindistanın şəhər və vilayətləri fövqəladə səfasız yerlərdir. Bütün şəhər və ərazi birbirindən fərqsizdir. Bağlarında divar yoxdur. Ərazi əsasən dümdüzdür. Bəzi çay və çayırlarının sahilləri mövsüm yağmurları üzündən su altında qalır **(274 b)** və hər yerdən keçmək mümkün olmur. Bəzi yerlərdə tikanlı cəngəllikləri var, pərgənələrin əhalisi bu cəngəlliklərdə gizlənərək inad edib vergilərini vermirlər.

Hindistanda çaylardan başqa axarsu azdır. Bəzi yerlərdə yığılmış sulara nadir hallarda təsadüf edilir. Bunca şəhər və vilayətlər quyu, ya da mövsüm yağmurundan yığılmış olan hovuz suyu ilə keçinir.

Hindistanda binaların və kəndlərin, hətta şəhərlərin dağılması və tikilməsi bir anda baş verir. Hətta böyük şəhərlərdə illərcə yaşayan əhali əgər qaçsa, elə qaçır ki, bir, ya da bir yarım gündə ortada o şəhərdən nə bir əsər, nə də bir əlamət qalır. Tikmək istədikləri vaxt isə arx qazmağa və bənd düzəltməyə lüzum yoxdur, əkinləri daim yağmurla suvarılır. Əhali də fövqəladə çoxdur, hamısı yığılaraq bir hovuz düzəldir, ya da bir quyu qazır. Ev tikmək və ya divar çəkmək də yoxdur. Qamış və ağac boldur, buna görə də koma düzəldirlər. Dərhal bir kənd, ya da bir şəhər olur.

## HİNDİSTANA XAS VƏHŞİ HEYVANLAR

**Fil:** hindistanlılar ona *hati* deyirlər. Fil Kalpi vilayətinin sınırlarında olur. Oradan yuxarıya və şərqə doğru getdikcə daha çox vəhşi filə təsadüf edilir. O tərəflərdən fil tutub gətirirlər. Kərrə və Manikpurda otuz-qırx kəndin işi **(275 a)** fil tutmaqdır. Vergilərini də fillə ödəyirlər.

Fil nəhəng və çox ağıllı bir heyvandır. Nə söylənsə anlayır, nə əmr edilsə yerinə yetirir. Qiyməti böyüklüyü ilə düz mütənasibdir və onu ölçüsünə görə satırlar. Nə qədər böyük olsa, qiyməti də o qədər artıq olur. Deyilənə görə, bəzi adalarda on kari böyüklüyündə fil varmış. Buralarda isə dörd-

beş karidən daha yüksək olanlara təsadüf edilmir.

Fil xortumu vasitəsilə yeyib-içir. Xortumu olmasa, yaşaya bilməz. Xortumun iki tərəfində üst çənəsində iki böyük dişi var, bu dişləri vasitəsilə divarları və ağacları zorlayıb yıxır. Dişləri ilə vuruşur, hər hansı çətin bir işi də bu dişləri ilə görür. Bu dişlərə *ac* deyirlər. Bu dişlər Hindistan əhalisinin gözündə çox qiymətlidir. Filin tükü yoxdur.

Hindistanda filin etibarı çox böyükdür. Hər hərbi hissədə mütləq bir neçə fil olur. Filin bəzi yaxşı məziyyətləri var: böyük, dərin və it axanı sulardan çoxlu yüklə asanca keçir, dörd-beş yüz adamın çəkdiyi top arabasını üç-dörd fil asanlıqla çəkib aparır. Lakin fil üçün çox yem lazımdır, tək bir fil iki qatar dəvənin yemi qədər yem yeyir.

**Kərgədan (qurk):** bu da nəhəng bir heyvandır. **(275 b)** Cüssəsi üç camış qədər olar. O tərəflərdə belə bir söz məşhurdur: kərgədan fili buynuzuyla qaldırar. Bu, hər halda, yanlış sözdür. Burnunun üstündə tək bir buynuzu var, uzunluğu da bir qarışdan bir az artıqdır. İki qarış uzunluğunda buynuzu olanı heç görünməmişdir. Böyük bir buynuzdan bir qədəh və bir dənə zər qutusu düzəldildi. Bundan başqa bəlkə də üç-dörd düymə qədər artıq qaldı.

Dərisi fövqəladə qalındır. Sərt bir yay qoltuğa qədər çəkilərək atıldığı təqdirdə və yaxşı saplananda onun bədəninə dörd barmaq qədər işlədiyini söylədilər. Dərisinin bəzi yerlərindən ox daha çox keçirmiş. İki çiyninin və iki budunun üstündə dəri qat-qatdır, uzaqdan bir çul kimi görünür.

Digər heyvanlardan ən çox ata bənzəyir. Atın qarnı böyük olmadığı kimi, bunun da qarnı böyük deyil. Atın aşıq yerində necə bir sümük varsa, bunun da aşıq yerində elə bir sümük var. Bunun ön ayaqlarındakı sümük də atın ön ayaqlarındakı sümüyə bənzəyir.

Bu heyvan fildən daha vəhşidir, onun qədər itaətkar və dinc deyil. Pərşavər və Heşnəgar cəngəlliklərində çox olur. Bir də Sind çayı ilə Bxirə vilayətinin arasındakı cəngəlliklərdə olur. Hindistanda Saru çayının sahilində də çoxdur.

Hindistan **(276 a)** səfərlərinin çoxunda Pərşavər və Heşnəgar cəngəlliklərində kərgədan ovladıq. Yaxşı buynuz vurur. Bu ovlarda bir çox adamı və atı buynuzuyla vurmuşdur. Bir ovda Maqsud adlı çöhrənin atını buynuzu ilə qaldırıb bir nizə boyu qədər atdı. Bu üzdən Maqsuda Qurk ləqəbi verildi.

**Çöl camışı:** bu heyvan camışdan xeyli böyükdür. Buynuzu camışın buynuzu kimi arxaya bükük deyil. Çox müzür və yırtıcı bir heyvandır.

**Niləgav** (mavi öküz): hündürlüyü at qədərdir və atdan bir az incədir. Erkəyinin rəngi mavidir, hər halda buna görə niləgav deyirlər [nilə: mavi, gav: öküz]. Bir az kiçık iki buynuzu var. Boğazında bir qarışdan bir az uzun tükləri var. Dəniz öküzünə bənzəyir. Dırnağı öküz dırnağı kimi haçadır. Di-

şisi buğu-maral[1] rəngindədir. Buynuzu və boğazında tükü yoxdur. Erkəyinə nəzərən cins bir ata bənzəyir.

**Gödəkpa:** böyüklüyü ağ geyik qədərdir. Bunun qabaq və arxa ayaqları bir az qısadır və bu üzdən gödəkpa deyirlər [gödək: qısa; pa: ayaq]. Buynuzu buğu buynuzu kimi şaxəli və ondan bir az kiçıkdir. Bu da eynən buğu kimi hər il buynuz dəyişdirir. Qaçmaqda bir az zəifdır və onun üçün cəngəllikdən çıxmır.

**Kəlhərə:** erkəyi hunaya[2] bənzəyən bir geyikdir. Beli qara, qarnı ağdır. Bunun buynuzu hunanınkından **(276 b)** daha uzun və daha şaxəlidir. Hindistanlılar buna kəlhərə deyirlər. Əsli kalahran, yəni «qara geyik»dir, ancaq qısaldaraq kəlhərə (kəlhərn) yazırlar. Dişisinin rəngi ağdır.

Bu kəlhərə ilə geyik ovlayırlar. Kəlhərənin buynuzuna tələnin halqasını və ayağına isə topuqdan bir az böyük bir daş asırlar ki, vəhşi geyik yaxalandıqdan sonra uzağa getməsinə əngəl olsun. Ondan sonra vəhşi bir kəlhərə görününcə onun qarşısına buraxırlar. Bu geyik vuruşmağa çox həvəslidir və dərhal vuruşmağa girişir. Buynuzlarıyla döyüşərək toqquşub irəli-geri gedib gələndə vəhşi geyiyin buynuzu bu geyiyin buynuzuna bağlanmış tələyə ilişir. O qaçmaq istəyəndə isə əhliləşdirilmiş geyik qaçmır, hər halda ayağına bağlanmış olan daş da buna mane olur. Bu üsulla çox geyik ovlayırlar. Ovladıqdan sonra onları əhliləşdirib təkrar geyik ovlamaqda istifadə edirlər. Bu əhliləşmiş geyikləri evdə döyüşdürürlər. Yaxşı döyüşürlər.

Hindistanın dağ ətəklərində daha kiçık bir geyik növü də var. Böyüklüyü arxarqulçanın[3] bir yaşındakı balası qədərdir.

**Gini öküz:** kiçık bir öküzdür. Bizim tərəflərin böyük qoçu qədər olar. Əti olduqca yumşaq və ləzzətlidir.

**Meymun:** hindistanlılar buna *bandər* deyirlər. Bunların növü çoxdur. Bunlardan biri bizim tərəflərə gətirdikləri növdür. Kəndirbazlar ona oyun **(277 a)** öyrədirlər. Dəreyi-Nur dağlarında, Kuhi-Səfidin Xeybər civarındakı ətəklərində və oradan aşağıda, Hindistanın hər yerində olur, daha yuxarıda olmur. Tükü sarı, üzü ağdır. Quyruğu o qədər də nuzun deyildir.

Bir cür meymun da var ki, Bəcur, Sevad və o civarlarda buna təsadüf edilmir. Bizim tərəflərə gətirilən meymunlardan xeyli böyükdür, quyruğu da çox uzundur. Tükü bir az ağ, üz qismində qapqaradır. Bu cür meymun Hindistanın dağlarında və cəngəlliklərində olur, bizim tərəflərdə olmur.

Bir cür meymun da var ki, üzü, tükü və bütün orqanları qapqaradır.

**Nul:** sincabdan bir az daha kiçıkdir. Ağaca çıxır. Bəziləri buna muşixurma deyir və mübarək sayırlar.

---

[1] *Buğu:* geyik, ren geyiyi. Baburda bəzən buğu-maral şəklində birlikdə və tək bir ad kimi keçir, lakin bu iki təbirlə geyiyin erkəyi və dişisi nəzərdə tutulur.

[2] *Huna:* bir geyik növü, dişisinə ceyran, erkəyinə huna deyilir.

[3] *Arxarqulça:* qızıl geyik.

**Gəlahri:** bir siçan növüdür. Amma daim ağaclarda yaşayır. Ağacların üsütündə böyük bir cəldliklə aşağı-yuxarı qaçır.

## QUŞLAR

**Tovuz:** çox rəngli və süslü bir quşdur. Rəng və süs baxımından olmasa da, cüssə baxımından durna boydadır, lakin durna qədər hündür deyildir. Erkək və dişisinin başında iyirmi-otuz tük var, uzunluğu iki-üç barmaq qədərdir. Dişisinin başqa bir süsü və rəngi yoxdur. Erkəyinin başında süslü bir mavi halqa olur. Boynu parlaq mavi rəngdədir. **(277 b)** Boynundan aşağı arxası sarı, yaşıl, mavi və bənövşəyi rənglərlə naxışlıdır. Beli kiçık xallarla bəzənmişdir. Belindən bir az aşağıda eyni rənglərlə naxışlı iri xallar quyruğunun ucuna qədər gedir.

Bəzi tovuzların quyruğu bir qulaç olur. Bu xallı tüklərinin altında bir az qısa və digər quşların quyruğuna bənzəyən bir quyruğu daha vardır. Bu quyruğu və qanadları qırmızıdır.

Tovuz Bəcur, Sevad və daha aşağıda olur, ondan yuxarıda, Künərdə və Ləmqanatda heç bir yerdə olmur. Uçuşda qırqovuldan daha acizdir, bir-iki dəfədən artıq uça bilmir və bu üzdən dağda, ya da cəngəllikdə olur. Qəribədir ki, tovuzun olduğu cəngəlliklərdə çaqqal çox olur. Bir qulaç quyruğu ilə çaqqaldan zərər görmədən cəngəllikdən-cəngəlliyə necə gəzə bilir? Hindistanlılar ona mor deyirlər.

Əti imam Əbu Hənifə məzhəbində halaldır. Əti dadsız deyil və turac ətinə bənzəyir. Lakin dəvə əti kimi ikrahla yeyilir.

**Tutuquşu:** bu da Bəcur və aşağısındakı vilayətlərdə olur. Bahar mövsümündə tut yetişəndə Nigənxar və Ləmqanata gəlir, digər zamanlarda orada olmurlar. Müxtəlif növləri var. Biri bizim tərəflərə götürdükləri növdür, ona danışmaq öyrədirlər.

Biri də bu tutuquşundan bir az kiçık **(278 a)** olur, ona da danışmaq öyrədirlər. Bu növə *cəngəli* deyirlər. Bu növ Bəcur, Sevad və o civarda fövqəladə çoxdur, o dərəcədə ki beş-altı minlik sürü halında uçurlar. Bu iki növ tutuquşu cüssəcə bir-birindən fərqli, rəngcə eynidir.

Bir növ tutuquşu da var ki, cəngəli tutuquşundan bir az kiçıkdir. Başı qıpqırmızı, qanadlarının üstü də qırmızıdır. Quyruğunun ucunda iki barmaq qədər yeri ağdır. Bu növün bəzilərinin başı mavi olur. Bu növə danışmaq öyrətmək olmur. Buna Kəşmir tutuquşusu deyirlər.

Cəngəli tutuquşuna bənzəyən kiçik bir növ də var, bunun dimdiyi qaradır, boynunda isə böyük qara bir halqa olur. Qanadlarının altı qırmızıdır. Danışmağı yaxşı öyrənir.

Biz belə zənn edirdik ki, tutuquşu və şarek nə öyrədilsə onu söyləyir, lakin özü bir şey düşünüb söyləyəməz. O zamanlar yaxın mülazimlərimdən

biri olan Əbülqasım Cəlair qəribə bir şey söylədi. Bu növ bir tutuquşunun qəfəsi bağlı imiş və tutuquşu demiş ki: «Ruyi məra ba kon ki dəmgir şodəm» *(üzümü aç, boğuluram).* Bir dəfə isə onu daşıyanlar dincəlmək üçün oturarkən yanlarından yolçular keçib gedirmuş; tutuquşu demiş ki: «Mərdom rəftənd, şomayan nəmirəvəd?» (*hamı gedir, siz niyə getmirsiniz?).*

Vəbalı deyənin boynuna. İnsan öz qulağıyla eşitməsə inanmaz.

Bir növ tutuquşu da var ki, rəngi parlaq və qıpqırmızıdır. Digər bəzi rəngləri isə **(278 b)** xatirimdə yaxşı qalmadığı üçün bu anda müfəssəl yaza bilmirəm. Qırmızı və fövqəladə göstərişli bir tutuquşudur. Ona danışmaq da öyrədirlərmiş. Qüsuru səsinin qırıq bir çininin mis bir tabağa sürtüldüyü zaman çıxardığı səs kimi pis və sərt olmasıdır.

**Şarək:** Ləmqanatda və Hindistanın daha aşağılarında lap çox olur. Bu da növ-növdür. Ləmqanatda çox olan bir növün başı qara, qanadları alaca, vücudu sığırçından bir az böyük, ondan daha qabadır. Ona danışmaq öyrədirlər.

Şarəkin bir növünə mina deyirlər. Benqaldan gətirirlər. Tamamən qaradır. Bədəni bu şarəkdən xeyli böyük, ayağı sarıdır. Qulaqlarında sarı dəriləri var, asılıdır. Bunun görünüşü pisdir. Danışmaq öyrədilir, yaxşı və aydın şəkildə danışır.

İlk bəhs edilən şarəkdən bir az incə olan bir növ şarek də var. Gözlərinin ətrafı qırmızıdır. Bu növ danışmağı bacarmır. Buna vin-şarek deyirlər.

Körpü quraraq Qanq çayını keçib düşmənləri qaçırdığımız zaman Leknur və civarında döşü ağ, başı alaca, beli qara bir şarək növü də gördüm. O günə qədər heç görməmişdim. Bu növ də, deyəsən, danışmağı bacarmır.

**Lüçə:** bu quşa buqələmun da deyirlər. Başından quyruğuna qədər beş-altı müxtəlif rəngi var və göyərçin boynu kimi parlaqdır. Göyərçin **(279 a)** boyda olur. Hər halda o da Hindistanın göyərçinidir. Göyərçin dağların təpəsində yaşadığı kimi, o da dağın təpəsində yaşayır.

Kabilin Nicrav vilayətində və daha aşağıdakı dağlarda olur, oradan yuxarıda olmur. Oranın əhalisi qəribə bir şey söylədi. Qış gəlincə, lüçə dağın ətəklərinə enirmiş. Əgər uçursalar, üzüm bağından keçsə belə daha irəli əsla uça bilmir və dərhal yaxalanırmış. Əti yeyilir və olduqca ləzzətlidir.

**Turac:** bu, Hindistana xas bir quş deyil, isti iqlimə daxil vilayətlərdə olur. Lakin bəzi növləri Hindistandan başqa yerdə olmadığı üçün ondan da bəhs etməyi lazım bildim.

Kəklik boydadır. Erkəyinin beli dişi qırqovulun rənginə bənzəyir. Boynu və döşü qaradır. Bəmbəyaz tükləri var. Gözünün hər iki tərəfində qırmızı çizgi var. Səsi gözəldir, adama elə gəlir ki, qışqırarkən belə deyir: «Şir darəm şəkərək» (*şəkər kimi südüm var*). Bu zaman «şir» sözünü qısa, «darəm şəkərək» qismini isə aydın tələffüz edir. Əstərabad turacları belə qışrırlar: «Bat məni tutdular» (*məni tez yaxaladılar*). Ərəbistanın və o civarın turacları isə qışqıraraq belə deyirlər: «Biş-şükri tədumun ən-nəum» (*şükr*

*etsən, firavanlıq uzun sürər*).

Dişisi qırqovul kimi rənglidir. Bunlar Nicravdan aşağıda olur.

**Kəncəl:** turac cinsindən olan bir quşdur. Turac boydadır. Səsi kəklik səsinə bənzəyir. Lakin bunun səsi **(279 b)** çox sərtdir. Erkəyi ilə dişisi arasında fərq azdır. Pərşavərdə, Heşnəgarda və daha aşağıdakı vilayətlərdə olur, oralardan yuxarıda olmur.

**Pül-peykər:** göyərçin boydadır. Vücudu ev toyuğuna bənzəyir. Rəngi də toyuq rəngindədir. Boğazından döşünə qədər qismi parlaq və qıpqırmızıdır. Pül-peykər Hindistan dağlarında olur.

**Vəhşi toyuq:** ev toyuğundan fərqi bunun qırqovul kimi uçmasındadır və ev toyuğu kimi hər yeri eyni rəngdə deyildir. Bu toyuq Bəcur dağlarında və daha aşağıdakı dağlarda olur, Bəcurdan yuxarıda olmaz.

**Cəlsi:** bədəni pül-peykər kimidir, lakin pül-peykarın rəngi daha xoşdur. Bəcur dağlarında olur.

**Şam:** ev toyuğu boydadır. Qeyri-adi rəngləri var. Bu da Bəcur dağlarında olur.

**Bildirçin:** Hindistana xas deyil, lakin Hindistana xas olan dörd-beş növ bildirçin var. Biri bizim vilayətlərə gedən bildirçindir. Biri isə bizim tərəflərə gedəndən daha kiçikdir, qanadı və quyruğunun rəngi daha qırmızıdır. Bu növ bildirçin çir[1] kimi sürü halında uçur. Bunun başqa bir növü isə bizim tərəflərə gedən bildirçindən bir az kiçıkdir, boğazıyla döşündə qarası daha artıqdır. **(280 a).** Biri də Kabilə çox az gedən kiçicik bir bildirçindir. Qarçadan bir az böyükdür. Kabildə ona qaratu deyirlər.

**Xərçəl:** böyüklüyü doğdaq qədərdir. Hər halda o da Hindistanın doğdağı olmalıdır. Əti fövqəladə ləzzətlidir. Bəzi quşların bud əti yaxşı olur, bəzilərinin isə döş əti yaxşı olur, xərçəlin isə hər tərəfi ləzzətlidir.

**Çərz:** cüssəcə toğdarıdan bir az kiçıkdir. Erkəyinin beli toğdarınınkı kimidir, döşü qaradır. Dişisi bir rəngdədir. Çərzin əti də olduqca ləzzətlidir. Xərçəl necə doğdağa bənzəyirsə, çərz də toğdarıya o cür bənzəyir.

**Bağrıqara:** Hindistan bağrıqarası bağrıqaradan bir az kiçık və daha incədir. Bağrının qarası da azdır. Səsi də ondan daha incədir.

## SUDA VƏ SU KƏNARINDA OLAN QUŞLAR

Bir də suda və su kənarlarında yaşayan quşlar vardır.

**Ding:** yaxud piri-ding. Böyük cüssəli bir quşdur. Hər qanadı bir qulaçdır. Başının və boynunun tükü yoxdur. Boğazında cib kimi bir şey asılıdır. Beli qara, döşü ağdır. Bəzən Kabilə gedir. Bir il Kabildə bir ding tutub gətirmişdilər. Yaxşıca əhliləşmişdi. Ət atsalar, heç yanılmadan dimdiyi ilə tuturdı. Bir dəfə nalçalı bir ayaqqabı udmuşdu. Bir dəfə isə bütöv bir toyuğu

[1] Çir: kiçik bir quş növü.

**(280 b)** qanadları və tükləriylə birlikdə uddu.

**Sarəs:** Hindistanda yaşayan türklər ona dəvə-durna deyirlər. Bu quş dingdən bir az kiçıkdir. Boyu da onunkundan bir az yüksəkdir. Başı qıpqırmızıdır. Bunu evdə bəsləyirlər və yaxşı əhliləşir.

**Mənik:** sarəs boydadır. Bədəni bir az kiçıkdir. Leyləkdən xeyli böyükdür. Leyləyə bənzəyir. Dimdiyi leyləyinkindən bir az uzun və qaradır. Başı mavi, boynu ağ, qanadları alacadır. Qanadlarının ucları və dibləri ağ, ortası isə qaradır.

**Leylək:** boynu ağ, başı və hər tərəfi qaradır. Bizim o tərəflərə gedən leyləkdən bir az kiçıkdir. Bu leyləyə hindistanlılar yek-rəng deyirlər. Bir növü də var ki, rəngi və şəkli bizim tərəflərə gedən leyləklərin eynisidir, lakin dimdiyi daha qara və o tərəflərin leyləyindən xeyli kiçıkdir.

**Uqar** ilə leyləyə bənzəyən bir quş da var. Dimdiyi uqarınkından bir az daha böyük və uzundur. Cüssəsi leyləkdən daha kiçıkdir.

**Böyük büzək:** sığırçın boydadır. Qanadlarının arxası ağdır. Yüksək bir səsi vardır.

**Ağ büzək:** başı və dimdiyi qaradır. Bizim tərəfə gedən büzəkdən xeyli böyük, Hindistan büzəyindən bir az kiçıkdir. **(28l a)**

**Gərmpa:** bir ördək növü olub sona-bürçindən[1] daha böyükdür. Erkəyi və dişisi eyni rəngdədir. Heşnəgarda olur, bəzən Ləmqanata gedir. Əti olduqca ləzzətlidir.

**Şahmürğ:** Bir tür ördək olub qazdan bir az kiçıkdir. Dimdiyinin üstündə bir çıxıntı var. Döşü ağ, beli qaradır; əti ləzzətlidir.

**Zümməc:** şahin boydadır. Rəngi qaradır.

**Sar** (sığırçın): beli və quyruğu qırmızıdır.

**Hindistan alaqarğası:** bizim tərəflərin alaqarğasından bir az daha kiçık və incədir. Boynunda bir qədər ağ vardır.

**Mürği-cəngəl:** qarğa ilə saxsağana bənzəyən bir quşdur. Ləmqanatda buna mürği-cəngəl deyirlər. Başı və döşü qara, qanadları və quyruğu bir az qırmızı, gözləri qıpqırmızıdır. Uça bilmədiyi üçün cəngəldən çıxmaz və bu üzdən ona mürği-cəngəl deyirlər.

**Çəmgədər:** böyük bir yarasa olub bayquş boydadır. Başı it küçüyünü başına bənzəyir. Ağaca qonmaq istəyəndə bir budağa yapışıb başı aşağı vəziyyətdə durur. Çox qəribədir.

**Məta:** Hindistan saxsağanıdır, saxsağandan bir az kiçıkdir. Saxsağan ağ alacadır; məta isə alacadır.

**Sanduvaç**[2] böyüklüyündə kiçicik bir quş daha vardır ki, **(281 b)** rəngi parlaq qırmızıdır, qanadlarında bir azca qarası var.

**Kərcə:** qaranquşa bənzəyir və ondan xeyli böyükdür. Hər tərəfi qap-

---

[1] *Sona:* erkək çöl ördəyi, dişisinə *bürçin* deyilir.

[2] *Sanduvaç:* bülbül, yaxud kanarya növündən bir quş.

qaradır.

**Kuyəl:** kiçık qarğa boydadır, ondan xeyli incədir. Gözəl ötür. Hindistan bülbülü bu imiş. Hindistan əhalisinin gözündə bülbül qədər mötəbərdir. Çox ağaclı bağlarda olur.

Şaqraq kimi ağaclara yapışaraq yürüyən bir quş da var. Şakrak boydadır və tutuquşu kimi yaşıl rəngdədir.

## SU HEYVANLARI

**Şiri-abi** [su aslanı]: yığılmış sularda olur. Timsaha bənzəyir. Deyilənə görə, insanı, hətta camışı belə qapırmış.

**Sisar:** bu da timsah şəklindədir. Hindistanın bütün çaylarında olur. Bir dəfə yaxalayıb gətirmişdilər, uzunluğu dörd-beş kariyə yaxındı, yoğunluğu isə qoyun qədərdir. Bundan daha böyükləri də varmış. Ağzı yarım karidən bir az daha uzundur. Üst və alt çənələrində sıra-sıra incə-incə dişləri vardır. Su kənarlarına çıxıb yatır.

**Xuki-abi** [hərfən: su donuzu, əslində: Qanq delfini]: bu da bütün Hindistan çaylarında olur. Sudan birdən-birə çıxar, başı görünər-görünməz təkrar suya dalır və yalnızca quyruğu gözə dəyir. Bunun ağzı da **(282 a)** sisarın ağzı kimi uzundur, sıra-sıra kiçık dişləri var. Başının digər qismi və gövdəsi balıq kimidir. Suyun içində oynayanda tuluq kimi görünür.

Saru çayındakı xuki-abilər oynayan zaman suyun üstünə çıxırlar. Eynən balıq kimi heç bir zaman sudan dışarı çıxmırlar.

**Qaryal:** böyükdür, Saru çayında əsgərin bir çoxu onu gördü, insana hücum edir. Saru sahilində olan zaman bir-iki köləni qapmışdı. Qazipur ilə Benares arasında da ordudan üç-dörd adamı qapdı, o civarda qaryali mən də bir az uzaqdan gördüm, lakin yaxşı və müfəssəl şəkildə görə bilmədim.

**Kəkkə balığı:** iki qulağının önündə iki sümük çıxır, uzunluğu üç barmaq qədərdir. Yaxalananda bu sümükləri oynadır və bundan gözəl bir səs çıxır. Hər halda ona bu səsinə görə bu adı qoymuşlar.

Hindistan balıqlarının əti ləzzətlidir; qılçığı yoxdur. Çox çevik balıqlardır. Bir dəfə adamlarımız bir suyun iki tərəfindən tor atıb gəldilər. Torun hər tərəfi yarım karidən artıq suyun üstündəydi. Balıqların bir çoxu toru bir kari daha yuxarı sıçrayaraq aşdılar.

Hindistanın bəzi sularında kiçik balıqlar var ki, bunlar qüvvətli bir səs və ya gurultu olunca **(282 b)** birdən-birə sıçrayaraq sudan bir və ya bir yarım kari yuxarı tullanırlar.

**Hindistan qurbağaları:** bildiyimiz qurbağalar kimidirlər, lakin suyun üstündə yeddi-səkkiz kari qaçırlar.

## HİNDİSTANA XAS BİTKİLƏR

**Ənbə:** Hindistan xalqı be hərfini hərəkəsiz tələffüz edir və bu söyləniş pis səsləndiyi üçün bəziləri ona nəğzək demişlər. Necə ki Xoca Xosrov belə demişdir:

Nəğzəki ma nəğz koni bustan,
Nəğztərin meyveyi-Hindustan.
*Ey bizim nəğzəkimiz, bağları bəzərsən,*
*Sən Hindistanın ən gözəl meyvələrindənsən.*

Yaxşısı gözəldir, çox yeyilə bilir, lakin yaxşısı az olur. Əsasən kal ikən yığırlar, evdə dəyir. Kalından yemək üçün gözəl ədviyyat düzəldirlər. Kalından düzələn mürəbbə də gözəl olur. Gerçəkdən də, Hindistanın ən yaxşı meyvəsi budur.

Ağacı çox hündür olur. Bəziləri deyir ki, ənbə qovundan sonra bütün meyvələrdən üstündür. Lakin xalqın təriflədiyi qədər deyil. Şaftalının kərdi növünə bənzəyir. Yağmur mövsümündə dəyir.

İki şəkildə yeyilir: biri sıxıb yumşaldaraq hər tərəfini dəlib əzmək surətiylə suyunu içirlər. Bir də kərdi-şaftalı kimi qabığınu soyaraq yeyirlər. Yarpağı bir az şaftalı yarpağına bənzəyir. Gövdəsi çirkin və biçimsizdir. Benqalda və Quceratda daha yaxşıları olurmuş.

**Kilə:** ərəblər buna muz [yəni banan] deyirlər. Ağacı o qədər hündür deyil, **(283 a)** hətta ona ağac demək olmaz, kol ilə ağac arasında bir şeydir. Yarpağı aman-qara yarpağına bənzəyir, amma banan yarpağının uzunluğu iki karidir, eni isə bir kariyə yaxındır.

Ortasından ürəyə bənzəyən bir zoğ çıxar. Qönçəsi bu zoğdadır. Böyük qönçəsi qoyun ürəyi şəklindədir. Qönçəsinin hər yarpağı açıldıqca yarpağın dibində sıra halında altı-yeddi çiçək çıxır. Bu sıra-sıra çiçəklər sonra banan olur. Ürəyə bənzəyən bu zoğ uzandıqca, o böyük qönçənin yarpaqları da açılır və sıra halındakı banan çiçəkləri görünür.

Hər banan ağacı yalnız bir dəfə meyvə verir. Bananın iki gözəl xüsusiyyəti var: qabığı asan soyulur, çəkirdəyi və puşası yoxdur. Badımcandan bir az daha uzun və daha incədir. Çox şirin deyil. Benqal babanı fövqəladə şirin imiş. Olduqca xoş görünən bir ağacı var. Geniş və parlaq yaşıl yarpaqlarının görünüşü çox gözəldir.

**Ənbuli:** hind xurmasına bu adı verirlər. Kiçicik yarpağı var və ümumən hind quzu (buya) yarpağına bənzəyir, lakin bunun yarpağı hind qozu yarpağından daha kiçikdir. Ağacı çox gözəl görünür. Kölgəsi çox olur. Ağacı olduqca yüksəkdir. Yabanısı da çoxdur.

**Mehvə:** gül-çikan da deyirlər. Bunun ağacı da olduqca hündürdür. Hindistan əhalisinin evləri **(283 b)** əksərən mehvə ağacındandır. Mehvənin çiçəyindən şərbət düzəldirlər. Çiçəyini qurudaraq kişmiş kimi yeyirlər. Araq də düzəldirlər. Ümumən kışmişə bənzəyir. Pis bir tadı var. Çiçəyinin təzəsi

pis deyil. O da yeyilir. Bunun da yabanısı var. Meyvəsi şirin deyil. Dənəsi bir az böyük, qabığı incədir. İçindən yağ da çəkirlər.

**Kirni:** ağacı çox hündür olmamaqla birlikdə kiçık də deyil. Meyvəsinin rəngi sarıdır. İnnabdan (çiydə) bir az incədir. Dadı ümumən üzümə bənzəyir. Bir az dadsız olsa da pis deyildir. Fövqəladə çox olur. Dənəsinin qabığı incədir.

**Cəman:** yarpağı ümumən söyüd yarpağına bənzəyir, ondan daha dəyirmi və daha yaşıldir. Ağacının görünüşü pis deyil. Meyvəsi qara üzümə bənzəyir, bir az turş dadı var. O qədər yaxşı deyildir.

**Kəmrək:** meyvəsi beş guşəlidir. Şaftalı boydadır, uzunluğu dörd barmaq qədər olar. Dəyəndə saralır. Bunun da çəkirdəyi yoxdur. Kal ikən qoparılanı çox turş olur. Dəymişinin turşuluğu meyxoşdur, pis deyil. Gözəllik baxımından o qədər də yaxşı deyildir.

**Qədhil:** görünüşü və dadı çox pis bir meyvədir. Eynən **(284 a)** qoyun qarnı kimidir, dolma kimi içi dışına çevrilmişdir. Mədə bulandıran bir dadı var. İçində fındığa bənzəyən çəkirdəkləri olur. Ümumən xurmaya bənzəyir. Bunun çəkirdəkləri uzun deyil, yuvarlaqdır. Bu çəkirdəklərin xurmadan bir az daha yumşaq əti var və onu yeyirlər.

Çox yapışqan olduğu üçün bəziləri onu əllərini və ağızlarını yağlayaraq yeyirlərmiş. Bunlar ağacın həm budağında, həm gövdəsində, həm də kökündə olurmuş. Sanki ağaca dolmalar asmışlar.

**Bədhəl:** alma boyda olar, ətri pis deyil. Kal ikən çox turş və dadsız bir şeydir. Dəymişi pis deyil, yumşaqdır. Hər hansı bir yerini əllə qoparıb yemək mümkündür. Dadı heyvanın tüklü halındakı dadına çox bənzəyir. Turş və olduqca gözəl bir dadı var.

**Bir:** farsca künar deyirlərmiş. Bunun bir neçə növü var. Ərikdən azca böyükdür. Hüseyni üzümü şəklində bir növü də var, o qədər də yaxşı olmur.

Bandirdə çox gözəl bir bir gördük. Bunun ağacı günəş səvr və cövza bürcündə ikən yarpaqlarını tökür, sərətan və əsəddə, yəni yağmur mövsümündə təkrar yarpaq açıb yaşıl olur. Meyvəsi dəlv və hutda dəyir.

**Gərundə:** bizim vilayətin cikəsi[1] **(284 b)** kimi koma-komadır. Cikə dağlarda, bu isə ovalarda bitir. Dadı mərmincana bənzəyir, ondan bir az daha şirin və daha az şirəlidir. Bundan kalyalı aş bişirirlər, çox gözəl olur.

**Pənyalə:** ərikdən bir az böyükdür. Qızıl almanın kalına bənzəyir. Turş sayaq bir dadı var. Ağacı nar ağacından bir az böyükdür. Yarpağı isə badam yarpağına bənzəyir.

**Gülər:** meyvəsi ağacın gövdəsindən çıxır. Əncirə bənzəyir və çox dadsız bir meyvədir.

**Amilə:** bu da beşküncdür. Pambıq qozasına bənzəyir. Qatı və dadsız bir şeydir. Mürəbbəsi pis olmur. Çox faydalı bir meyvədir. Ağacının gözəl

---

[1] *Cikə:* nə olduğu tam olaraq anlaşılmayan bir bitki.

görünüşü vardır. Çox kiçık yarpaqlıdır.

**Çirunçi:** ağacı dağda yetişirmiş. Bizim bağlarda üç-dörd dənə varmış, sonradan öyrəndim. Mehvəyə çox bənzəyir. İçi pis deyil, qoz ləpəsi ilə badam içi arasında bir şeydir. Pis deyil. İçi fıstıq içindən bir az kiçıkdir. Çirunçinin içi yuvarlaqdır. Pəludəyə və halvaya qoyurlar.

**Xurma:** düzdür, xurma Hindistana xas deyil, lakin bizim tərəflərdə olmadığı üçün burada bəhs etdim. Xurma ağacı Ləmqanatda da var. Budaqları ağacın ucunda bir yerdə olur. Yarpaqları budaqlarının dibindən ucuna qədər iki tərəfindədir. Gövdəsi buruşuq və çirkindir. Meyvəsi isə üzüm **(285 a)** salxımı kimidir, lakin üzüm salxımından xeyli böyükdür.

Deyilənə görə, bitkilər arasında xurma ağacı iki xüsusda heyvanlara bənzəyir: birincisi, heyvanların başı kəsilincə necə həyatları da bitirsə, xurma ağacı da başı kəsilincə quruyur. İkincisi, heyvanlarda erkəksiz necə bir nəticə hasıl olmursa, xurma ağacı da erkək xurmanın budağı gətirilib toxundurulmasa, yaxşı meyvə vermir. Bu sözün doğru olub-olmadığı bəlli deyil.

Xurmanın yuxarıda bəhs edilən başı bir pendirdən ibarətdir. Xurma pendiri belədir: budaq və yarpağının çıxdığı yer pendir kimi ağdır. Bu ağ pendir kimi şeydən budaq və yarpaq çıxır. Budaq və yarpaq böyüdükcə yaşıllaşır. Bu ağ bölümə xurma pendiri deyirlər. Gözəldir, pis deyil, qoz ləpəsinə çox bənzəyir.

Bu peynirin olduğu yeri dəlirlər və bu dəliyə oradan çıxan suyun üzərindən axa biləcəyi şəkildə xurma yarpağı yerləşdirirlər. Yarpağı bir kuzənin ağzına salıb kuzəni də ağaca bağlayırlar. Dəlikdən çıxan su kuzədə yığılır. Bu su dərhal içilsə şirin bir sudur. Üç-dörd gün sonra içilsə adama kef verir. Bir dəfə Barini seyr etməyə gedən zaman **(285 b)** Çenbəl çayı sahilində yerləşən kəndləri də görməyə getmişdim. Yolda ovada bu cür xurma suyunu yığanlar bizə təsadüf etdilər. Bu sudan xeyli içdim, lakin təsir etmədi. Təsir etməsi üçün hər halda çox içmək lazımdır.

**Nargil:** ərəblər ərəbləşdirərək *narcil* deyirlər, hindistanlılar isə *nalir* deyirlər. Hər halda qələti-məşhurdur[1].

Nargilin meyvəsi Hindistan qozudur və qara qaşıqları ondan düzəldirlər. Böyüklərindən gəmi ipləri düzəldirlər. Ağacı xurma ağacı ilə eynidir, yalnız nargilin budağı daha yarpaqlı, yarpağının rəngi isə daha parlaqdır. Eynən qozun olduğu kimi nargilin də dışında yaşıl bir qabığı var, lakin nargilin qabığı yarıq-yarıqdır. Çay qayıqlarının hamısını və gəmilərin iplərini bu nargilin qabığından düzəldir, qayıqların çatlarını da bunun ipiylə tikirlər.

Nargilin qabığı təmizlənincə bir başında üçbucaq şəklində üç dəlik yeri meydana çıxır, ikisi sərt, biri yumşaqdır. Bu yumşaq yeri cüzi basdıqda dəlinir. Dəyməzdən əvvəl nargilin içi su olur. Bu dəliyi açıb suyunu alırlar. Dadı pis deyil, xurma pendirinin suda əzilmişi kimidir.

---

[1] Səhv olduğu hamı tərəfindən bilindiyi halda işlənən söz.

**Tar:** bunun budaqları təpəsində **(286 a)** olur. Tara da xurmada olduğu kimi kuzə bağlayaraq suyunu alıb içirlər. Bu suya tari deyirlər, bunun kefi xurma suyundan daha qüvvətli olurmuş.

Tar budaqlarının bir-bir yarım kariyə qədər heç yarpağı yoxdur. Ondan sonra ucunda otuz-qırx yarpaq birdən çıxır. Bu yarpaqların uzunluğu bir kari qədərdir. Hindlər öz yazılarını əsasən –eynən dəftər kimi- bu yarpaqlara yazırlar. Hindistanlılar geniş dəlikli qulaqlarına taxmağa sırğa tapa bilməyəndə bu tar yarpağından sırğa dzəldib qulaqlarına asırlar. Qulaq dəliyinə qoymaq üçün tar yarpağından düzəlmiş sırğalar bazarlarda satılır.

Gövdəsi xurma ağacının gövdəsindən daha gözəl və daha düzdür.

**Portağal və bənzərləri:** portağal Ləmqanat, Bəcur və Sevadda çox gözəl olur. Ləmqanatda bir az kiçık və oyuqludur. Fövqəladə gözəl, incə qabıqlı və şirəlidir. Xorasan civarının portağalına bənzəmir. Qabığının incəliyinə görə Ləmqanatdan on üç-on dörd ağac məsafədə olan Kabilə gətirilinə qədər bəzi portağallar xarab olur.

Əstərabad portağalını iki yüz yetmiş-iki yüz səksən ağac məsafədə olan Səmərqəndə qədər aparırlar, qabığı qalın və şirəsi az olduğu üçün **(286 b)** o qədər xarab olmur. Bəcur portağalları heyva boydadır, şirəsi çoxdur və digər portağalların şirəsindən daha turşdur. Xoca Kəlan mənə dedi ki, Bəcurda bu cins portağalı bir ağacdan dərib saymış və yeddi min dənə olduğunu görmüşlər. Narınc sözünün ərəbcələşmişə bənzədiyini daima düşünürdüm və elə imiş. Bəcur və Sevad əhalisi narınca daim *narəng* deyir.

**Limon:** fövqəladə çoxdur. Yumurta boyda və yumurta şəklindədir. Zəhərlənmiş bir adam onun kökünü qaynadıb içsə, zəhərin təsirini yox edir.

**Turunc:** portağala bənzər bir meyvədir. Bəcur və Sevad əhalisi *baling* deyir. Buna görə turunc qabığının mürəbbəsinə mürabbeyi-baling deyirlər. Hindistanda isə turunca *bəcuri* deyirlər.

Turunc iki növdür. Biri şirindir, lakin zövqsüz və mədə bulandıran bir daddadır, yeməyə yaramır, lakin qabığı mürəbbəyə yarayır. Ləmqanatın turuncu belə mədə bulandıran bir daddadır. Biri də Bəcur və Hindistan turunclarıdır ki, turşdur, lakin turşluğu xoş olur. Şərbəti fövqəladə gözəl və ləzzətlidir.

Turunc Xosrovi-qovun boydadır. Qabığı buruşuq və düzənsizdir. Ucu incə və çıxıntılıdır. Turuncun rəngi portağalınkından bir az daha sarıdır. Ağacı isə gövdəli bir ağac deyil, bir az kiçıkdir və koma-koma **(287 a)** olur. Yarpağı portağalınkından daha böyükdür.

**Səngtarə:** portağala bənzər bir meyvədir. Rəngi və şəkli turunc kimidir. Yalnız bunun qabığı buruşuq olmayıb düzdür və turuncdan bir az daha kiçıkdir. Ağacı böyükdür, qaysı ağacı qədərdir. Yarpağı portağal yarpağına bənzəyir. Gözəl bir turşluğu var. Şərbəti çox ləzzətli və dadı xoşdur. Bu da eynən limon kimi qəbizliyə səbəb olur və portağal kimi yumşaldıcı deyildir.

**Uluğ-limu** [böyük limon]: portağala bənzər bir meyvədir. Hindistanda *qəlqəl limu* deyirlər. Forması qaz yumurtasına bənzəyir, lakin onun əksinə, iki ucu elə sivri deyil. Qabığı da səngtarəninki kimi düzdür. Çox şirəli olur.

**Çənbiri:** portağala bənzər bir meyvədir. Şəkli portağal kimidir, lakin rəngi sarıdır və portağal rəngində deyildir. Ətri turunc ətrinə bənzəyir. Bunun da turşluğu gözəldir.

**Sədafəl:** portağala bənzər, armud formasında bir meyvədir, rəngi heyva rəngi kimidir. Çox şirindir, lakin şirin portağal qədər mədə bulandıran deyil.

**Əmrədpəl:** portağala bənzər bir meyvədir.

**Kərnə:** bu, *qəlqəl-limu* boydadır. Bu da turşdur.

**Əməlbid:** portağala bənzər bir meyvədir. Üç ildən sonra indi gözümə dəydi. Deyilənə görə, içinə bir iynə **(287 b)** saplansa, turşuluğundan və ya başqa bir özəlliyindən iynəni əridər. Turşuluğu portağal və limon qədərdir.

## HİNDİSTANIN ÇİÇƏKLƏRİ

Hindistanda gözəl çiçəklər vardır.

**Casun:** bu çiçəklərdən biridir və bəzi hindistanlılar ona *kərhəl* deyir. Bu, ot deyil, qızılgül fidanından bir azca hündürdür. Rəngi nar çiçəyindən daha açıq yaşıldır. Qızılgül boydadır. Lakin qızılgül qönçə olduqdan sonra birdən açılır, amma bu casun açıldıqdan sonra ortasından açılan yarpaqdan incə bir zoğ çıxır və bir barmaq boyu uzandıqdan sonra təkrar casun yarpaqları açılır. Nəhayət, üst-üstə qonmuş qətmərli bir çiçək olur. Qəribə bir şeydir desəm, səhv olmaz.

Ağacının üstündə fövqəladə dərəcədə möhtəşəm və gözəl görünür. Di gəl ki, çox qalmır, bir günün içində solub gedir. Dörd ay sürən yağmur mövsümü boyunca fövqəladə gözəl və çox açılır. İlin böyük bir hissəsində açılır. Çox olmasına baxmayaraq ətri yoxdur.

**Kənir:** ağı və qırmızısı da olur. Şaftalı çiçəyi şəklində beş yarpaqlıdır. Qırmızı kənirin şaftalı çiçəyinə bənzərliyi vardır. Kənir çiçəyinin on dördü-on beşi bir yerdə açılır və uzaqdan çox böyük bir çiçək kimi görünür. Bunun koması də qızılgül fidanından bir az böyükdür. Qırmızı kənirin olduqca xoş bir ətri vardır və gözəldir. Bu çiçək də yağmur mövsümündə çox və gözəl açılır, **(288 a)** ilin böyük hissəsində görünür.

**Kiyura:** fövqəladə lətif bir ətri var. Müşkün çatışmayan cəhəti quru olmasıdır, buna təzə müşk demək olar. Qəribə bir görünüşü var. Çiçəyinin uzunluğu bir yarım-iki qarış olur. Yarpağının şəkli qamış yarpağı kimi uzun və tikanlıdır. Qönçə kimi yığılmış olan dış ləçəkləri daha yaşıl və daha tikanlı, daxili ləçəkləri isə yumşaq və ağdır, daxili ləçəklərinin arasında çiçəyin özəyi kimi bir şey olur və gözəl ətir buradan gəlir.

Yeni açılan və hələ kol təşkil etməyəni erkək qamış başağına bənzəyir. Bunun yarpağı daha yastıdır. Tikanlı halda çox görkəmsizdir, kökləri dışarıdadır.

**Yasəmən:** ağdır. Buna *cəmbuli* deyirlər. Bizim tərəfin yasəmənlərindən daha böyük və daha ətirlidir.

## HİNDİSTANDA ZAMAN VAHİDLƏRİ

Bizim tərəflərdə dörd fəsil, Hindistanda isə üç fəsil var. Dörd ay yay, dörd ay yağmur fəsli, dörd ay da qış olur. Aylarının başlanğıcını hilala görə hesablayırlar. Hər üç ildə bir yağmur fəsli aylarına, üç ildə bir qış aylarına, üç ildə bir də yaz aylarına bir ay əlavə edirlər. Bu aylar visokos[1] **(288 b)** ayları sayılır.

Çitar, bisaq, çit və əsar yay aylarıdır. Bunlar hut [balıq], həməl [qoç], səvr [buğa] və cövzaya [ekizlər bürcü] uyğun gəlir. Savən, badun, küvar və katik yağmur mövsümü aylarıdır. Bunlar sərətan [xərcəng], əsəd [şir, aslan], sünbülə [başaq, qız] və mizana [tərəzi bürcü] uyğundur. Aqan, pus, maq və fagün qış aylarıdır. Bunlar isə əqrəb, qövs [yay, oxatan], cədi [oğlaq] və dəlv [dolça] bürclərinə[2] müvafiqdir.

Hind eli dörd ay olaraq müəyyənləşdirdiyi fəsillərin hər birində iki ayı istinin, iki ayı yağmurun, iki ayı da soyuğun şiddətli olduğu ay saymışdır. Yay aylarının son iki ayı çit ilə əsardır şiddətli isti bu iki aydadır. Yağmur fəslinin ilk iki ayı savən ilə badundur, şiddətli yağmur bu iki aydadır. Qış fəslinin ortadakı iki ayı pus ilə maqdır, şiddətli soyuq da bu iki aydadır. Bu münvalla bunların fəsillərinin sayı altı olur.

Həftənin günlərinə də adlar vermişlər: şənbə saniçer, bazar eytvar, bazar ertəsi somvar, çərşənbə axşamı manqalvar, çərşənbə budvar, cümə axşamı prispatvar, cümə isə sükrvar adlanır.

Bizim vilayətlərdə gecə-gündüzü iyirmi dördə bölüb hər birinə saat, hər saatı da altmışa bölüb hər birinə dəqiqə demişlər. Bir gecə-gündüz min dörd yüz qırx dəqiqə olur. Dəqiqənin uzunluğu təxminən altı **(289 a)** dəfə *Fatihə* surəsini *bismillah* ilə birlikdə oxuyuncaya qədərdir ki, bir gecə-gündüzdə səkkiz min altı yüz qırx dəfə *bismillah* ilə birlikdə *Fatihə* surəsi oxuna bilər.

Hind elində isə gecə-gündüzü altmış qismə bölüb hər birinə *geri,* gecəni və gündüzü ayrı-ayrı dörd qismə bölüb hər birinə *pəhər* demişlər ki, bunun farscası *pas* olur.

---

[1] Orijinalda *kəbisə* adlanan bu aylara qriqori təqvimində visokos ay, yəni fevralı 29 gün olan ay deyilir.

[2] Şərq təqvim sistemləri, bürclər və aylar haqqında ətraflı bilgi üçün bax: Ramiz Əskər. Təqvimdən-təqvimə, iqlimdən-iqlimə. Bakı, İşıq, 1987.

Bizim tərəflərdə *pas* və *pashan* sözləri eşidilirdi, lakin belə bir özəlliyi olduğu bilinmirdi. Bu iş üçün Hindistanın bütün böyük şəhərlərində *geriyali* adlanan müəyyən və xüsusi bir icma var. Bürüncdən qab kimi yastı bir şey qoymuşlar, böyüklüyü sini, qalınlığı isə iki barmaq qədər olar. Bu bürünc şeyə *geriyal* deyirlər. Bu geriyalı yüksək bir yerə asmışlar. Bir də tasları var: cam-saat. Bunun altı dəlikdir, hər geridə bir dəfə dolur. Geriyalilər növbə ilə bu tası suya qoyub gözləyirlər. Məsələn, gün doğarkən tası qoyurlar, tas bir dəfə dolanda toxmaqlarıyla geriyala bir dəfə vururlar, iki dəfə dolsa iki dəfə. Pəhər bitincəyə qədər belə edirlər. Hər pəhər başa çatanda toxmağı geriyala tez-tez və qüvvətli bir şəkildə vururlar. Gündüzün ilk pəhəri olmuşsa, tez-tez vurduqdan **(289 b)** sonra bir azca duraraq bir dəfə daha vururlar. Əgər ikinci pəhər olmuşsa, tez-tez vurduqdan sonra iki dəfə vururlar. Üçüncüsündə üç, dördüncüsündə dörd dəfə vururlar. Gündüzün dörd pəhəri tamam olunca gecə pəhərindən başlayaraq bu şəkildə gecənin dörd pəhərini də tamamlayırlar.

Əvvəlcə geriyalilər hər dəfə gecə və gündüz pəhəri tamamlananda pəhər işarəsini vururdular. Amma gecə yuxudan oyananlar üç və ya dörd geri üçün vurulan səsi eşidəndə ikinci və ya üçüncü pəhərdən hansısı olduğu başa düşmürdülər. Onun üçün mən əmr etdim ki, gecələr və buludlu gündüzlər zamanı geriləri vurduqdan sonra pəhərin işarəsini də vursunlar. Məsələn, gecənin ilk pəhərindən üç gerini vurduqdan sonra bir azca durub təkrar pəhərin işarəsini də vursunlar ki, bu üç gerinin ilk pəhərə aid olduğu bəlli olsun. Gecənin üçüncü pəhərindən dörd geri vurduqdan sonra bir azca durub pəhərin işarəsi olan üçü vursunlar ki, bu dörd gerinin üçüncü pəhərə aid olduğu bilinsin. Çox yaxşı oldu. Gecələr oyanan adam nə zaman geriyal səsi eşitsə, bunun hansı pəhərdən və neçə geri olduğu bu şəkildə anlamış olurdu.

Bir də hər gerini altmışa bölüb hər birinə pel demişlər, hər gecə **(290 a)** və gündüz üç min altı yüz peldir. Hər pelin müddətini altmış dəfə gözü açıb yumuncaya qədər keçən zaman olaraq müəyyən etmişlər ki, gecə və gündüz iki yüz on altı min dəfə gözü açıb yumuncaya qədər sürür. Təcrübə edildi və bir peldə səkkiz dəfə *bismillah* ilə birlikdə *qulhuvallah* surəsi oxuna bildi ki, gecə-gündüz ərzində iyirmi səkkiz min səkkiz yüz dəfə *bismillah* ilə birlikdə *qulhuvallah* surəsi oxuna bilər.

## HİNDİSTANDA İŞLƏNƏN ÖLÇÜ VƏ ÇƏKİ VAHİDLƏRİ

Bir də hind elində ölçüləri gözəl müəyyən etmişlər: səkkiz reti bir maşə, dörd maşə bir tank, yəni otuz iki reti, beş maşə bir misqal, yəni qırx reti, on iki maşə bir tülə, yəni doxsan altı reti, on dörd tülə bir sər deməkdir. Hər yerdə qırx sər bir batman olaraq qəbul edilmişdir. On iki batman bir mani, yüz mani bir minasədir. Qızıl və mirvarini tanq ilə çəkirlər[1].

Hind elində ədədləri də gözəl müəyyənləşdirmişlər: yüz min bir lek,

yüz lek bir kürur, yüz kürur bir ərb, yüz ərb bir kərb, yüz kərb bir nil, yüz nil bir pədəm, yüz pədəm bir sanq deməkdir. Bu ədədlərin çoxluğu Hindistanın zənginliyinə bir dəlildir.

Hindistan əhalisinin böyük bölümü kafirdir və hind xalqı kafirə hindu deyir. Hinduların çoxu tənasühə inanır. İşçilər, muzdlular və xidmətçilər də hamısı hindudur[1].

Bizim vilayətlərdə köçəri xalqın öz qəbilələrinə görə xüsusi adları var. Burada da vilayət və kəndlərdə yaşayan **(290 b)** əhalinin qəbilələrinə görə adları var. Hər peşə sahibi o peşə ilə dədə-babadan bəri məşğuldur.

Hindistan lətafəti az olan bir yerdir. Əhalisində gözəllik, yaxşı rəftar və tərbiyə, aralarında xoş münasibət, təb, idrak və ədəb, kərəm və mürüvvət yox, hünər və işlərində üsul və intizam, qayda və düzən, yaxşı at və yaxşı ət, üzüm, qovun və yaxşı meyvələr, buz, soyuq su, bazarlarında yaxşı yemək və yaxşı çörək, hamam, mədrəsə, şam, məşəl və şamdan yoxdur.

Divti dedikləri çoxsaylı və kirli bir zümrə var ki, bunlar sol əllərində şam və məşəl yerinə kiçicik bir üçayaq tuturlar. Bu üçayağın bir ayağının ucundan şamdan başına bənzəyən bir dəmiri üçayağın ağacına bağlayır, baş barmaq yoğunluğuda bir fitili də üçayağın ağaca saplı olan dəmir ayağına bağlayırlar. Sağ əllərində isə dəliyi bir az dar açılmış olan bir çanaq tuturlar. Yağ oradan sızır. Fitilə nə zaman yağ lazım olsa bu çanaqdan qoyurlar. Şam və məşalə yerinə bundan istifadə edirlər. Böyük adamların bunlar kimi yüz-iki yüz divtiləri var.

Padşahın və ya bəylərin gecə şama ehtiyacı olan bir işi olsa, bu çirkin divtilər **(291 a)** bu lampanı gətirib onların yanında dururlar.

Çay və yeraltı suları ilə çuxurlarda yığılan suların dışında bağ və binalarında axarsu yoxdur. Binalarında səfa, hava, gözəllik və nizam yoxdur.

Qullar və aşağı təbəqə tamamilə çılpaq gəzir. Lüngutə deyilən bir şeyi bağlayır və göbəkdən aşağı iki qarışlıq bir bez parçası asırlar. Bu asılan bez parçasının üstündə bir bez parçası daha var. Bunun bir ucunu lüngutənin ipinə bağlayır, digər ucunu isə iki budun arasından keçirərək lüngutənin arxa bağından keçirib bərkidirlər. Qadınları uzun bir lüng bağlayır. Yarısını bellərinə bağlayır, yarısını başlarına örtürlər.

## HİNDİSTANIN MƏZİYYƏTLƏRİ

Hindistanın məziyyəti böyük bir vilayət olmasıdır. Burada altın və axça çox olur.

Yağmur mövsümündə havaları fövqəladə gözəldir. Bəzi günlərdə on-on beş dəfə yağır. Yağmur zamanı sellər yaranır. Heç su olmayan yerlərdə çaylar axır. Yağış yağanda və yağışdan sonra hava çox gözəl olur. O dərəcədə ki, etidalının və lətafətinin bənzəri yoxdur. Qüsuru budur ki, havası çox

[1] Bu cümlə rusca nəşrdə yoxdur.

rütubətli olur. Yağmur mövsümündə bizim tərəflərin yaylarıyla əsla ox atmaq olmaz, yay pozulur. **(291 b)** Rütubət yalnız yaylara deyil, zireh, kitab, qumaş və mala da təsir edir. Bina da çox davam gətirmir.

Yağmur mövsümünün dışında qışda və yayda hava yaxşıdır, lakin durmadan şimal küləyi əsir və toz çox olur. Yayda yağmur mövsümünə yaxın buğa və ekizlər ayında bu külək ildə dörd-beş dəfə fövqəladə şiddətli əsir və toz o dərəcədə qatı olur ki, adamlar bir-birini görə bilmir. Bu külək andi adlanır[1].

Ekizlər ayı isti keçir, lakin o qədər də bürkü olmur. Bəlxin və Qəndəharın istisinin yarısı qədər yoxdur.

Hindistanın başqa bir məziyyəti hər sinif və peşə ərbabının lap çox olmasıdır. Hər iş və hər şey üçün xüsusi olaraq seçilmiş insanlar var, bunlar dədə-babadan bəri bu işi görürlər. Necə ki Molla Şərəf *Zəfərnamə* adlı əsərində Teymur bəyin daş məscidi tikilərkən Azərbaycan, fars, Hindistan və digər məmləkətlərin daş ustalarından hər gün iki yüz adamın məsciddə işlədiyini xüsusi qeyd etmişdir.

Mənim tikintilərimdə isə yalnızca Aqrada yerli daş ustalarından hər gün altı yüz səksən adam çalışırdı. Bir də Aqra, Sikri, Biyanə, Dulpur, Güvalyar və Kulda min dörd yüz doxsan bir daş ustası hər gün mənim tikdirdiyim binalarda işləyirdi. Hindistanda bunun kimi hər peşə **(292 a)** və hər məslək sahibi saysız-hesabsızdır.

Bxirədən Behara qədər mənim sərəncamımda olan vilayətlərin gəliri əlli iki kürurdur. Bu, aşağıdakı müfəssəl cədvəldən də görünür. Bunun səkkiz-doqquz kürуru ray və racələrin pərgənələrindən gəlir ki, onlar itaət edib əskidən bəri bu pərgənələrə doğruluq yoluyla sahib olmuşlar.

Felən bizim müzəffər bayrağımızın hakimiyyəti altında olan Hindistan vilayətlərinin təxmini gəliri (cədvəl farsca yazılmışdır – tərc.):

| **Sərkar vilayət** | **Kürur** | **Lek** | **Təngə** |
|---|---|---|---|
| 1. Sətlücün o biri üzü, Bxirə, Lahor, Siyal-qut, Dibalpur v.s. | 3 | 33 | 15.989 |
| 2. Sihrind | 1 | 29 | 31.985 |
| 3. Hisari-Firuzə | 1 | 30 | 75.174 |
| 4. Paytaxt Dehli və Miyan-Duab | 3 | 60 | 50.254 |
| 5. Mivat (İskəndər zamanında bizim mülklərimizə daxil deyildi) | 1 | 69 | 81.000 |
| 6. Biyanə | 1 | 44 | 14.930 **(292 b)** |
| 7. Aqra | - | 29 | 76.919 |
| 8. Miyan vilayəti | 2 | 91 | 19.000 |
| 9. Güvalyar | 2 | 29 | 57.450 |

[1] Bu cümlə türkcə nəşrdə buraxılmışdır.

| | | | |
|---|---|---|---|
| 10. Kalpi, Sehəndə və başqaları | 4 | 28 | 55.950 |
| 11. Kanuc | 1 | 36 | 63.358 |
| 12. Sənbəl | 1 | 38 | 44.000 |
| 13. Ləknur və Bəkəsər | 1 | 39 | 82.433 |
| 14. Xeyrabad | - | 12 | 65.000 **(293 a)** |
| 15. Ud və Bəhrac | 1 | 17 | 1.369 |
| 16. Cunpur | 4 | - | 88.333 |
| 17. Kərrə və Manikpur | 1 | 63 | 27.282 |
| 18. Bəhar | 4 | 5 | 60.000 |
| 19. Sərvar | 1 | 55 | 175.062 2/1 |
| 20. Sarən | 1 | 10 | 18.373 |
| 21. Çəparən | 1 | 90 | 86.080 |
| 22. Kəndlə | - | 43 | 30.300 |
| 23. Racə Rup-Nərindən işlənməmiş gümüş və qara təngə | - | 2 | 55.000 |
| 24. Rətənbur (Buli, Çatsu, Məlanə) | - | 20 | - |
| 25. Naqur | - | - | - |
| 26. Racə Bikrəmacit (Rətənburdan) | - | - | - |
| 27. Racə Kələncəri | - | - | - |
| 28. Racə Sing-Div | - | - | - |
| 29. Racə Bikəm-Div | - | - | - |
| 30. Racə Bikəm-Çənd | - | - | - **(293 b)** |

Hindistan vilayətlərinin yerinin və elinin xüsusiyyət və keyfiyyətlərinin nə qədəri məlum və müşəxxəs idi, hamısı zikr edildi və yazıldı. Bundan sonra da yazılası bir şey gözə çarpsa yazacağam, eşidiləsi bir şey eşidilsə onu da bildirəcəyəm.

## AQRADA XƏZİNƏNİN BÖLÜŞDÜRÜLMƏSİ

Bazar ertəsi günü, rəcəb ayının iyirmi doqquzunda [=12 may] xəzinəni görmək və bölüşdürmək işiylə məşğul olduq. Hümayuna xəzinədən yetmiş lek verildi, bir də bilinməyən və incələnib sayılmamış olan bir xəzinəni ona ehsan edim. Bəzi bəylərə on lek, bəzilərinə iyirmi, yeddi və altı lek verildi. Orduda olan bütün əfqan, həzarə, ərəb və bəluclara, hər camaata mövqelərinə uyğun şəkildə nəqd ənamlar verildi. Yenə ordu ilə birlikdə olan hər tüccar, elm əhli və digər hər kəs ehsan və bəxşişdən bol-bol qismət və tam nəsib aldı.

Orduda olmayanlara da bu xəzinədən bir çox ehsan və bəxşiş göndərildi. Məsələn, Kamrana [Mirzə] on yeddi lek, Məhəmməd Zaman Mirzəyə on beş lek, Əsgəriyə, Hindala, hətta bütün qohumlara altından, gümüşdən, qumaşdan, cövhərdən və kölədən bir çox şeylər göndərildi. Digər tərəfdəki

bəylərə və sipahilərə çox hədiyyələr göndərildi. Səmərqənd, Xorasan, **(294 a)** Kaşğar və İraqa qohumlar üçün hədiyyələr göndərildi. Səmərqənd və Xorasandakı məşhur şəxslərə və Məkkə ilə Mədinəyə də nəzirlər göndərildi. Kabil vilayəti ilə Vərsək həvalisinə kişi və qadın, kölə və sərbəst, böyük və kiçık hər adam başına birər şahruxi ehsan edildi.

Aqraya ilk gələndə bizimkilərlə yerli xalq arasında çox ayrılıq və soyuqluq vardı. Əsgəri və xalqı bizimkiləri görəndə dörd bir tərəfə qaçırdı. Dehli ilə Aqranın dışında bütün kurqanlı yerlər öz kurqanlarını gücləndirərək itaət edib təslim olmadılar.

Sənbəldə Qasım Sənbəli, Biyanədə Nizam xan, Mivatda isə Həsən xan Mivati olurdu və bu qarışıqlığın səbəbkarı məhz bu dinsiz hərifdi. Dulpurda Məhəmməd Zeytun, Güvalyarda Tatar xan Sarənghani, Rabiridə Nuhani xan oğlu Hüseyn xan, Ətavədə Qütb xan Sərvani və Kalpidə Aləm xan [Cəlal xan Cighetin oğlu] vardı. Kanuc və Qanqın o tərəfi isə Nasir xan Nuhani, Məruf Fərmüli və digər bir çox əmirlər kimi tamamən müxalif əfqanların əlində idi. Biz İbrahimi məğlub etdiyimiz zaman bunlar Kanuc və o tərəfdəki bütün vilayətləri əllərinə keçirərək Kanucdan bir-iki mənzil bu tərəfə gəlib mövqe tutmuşdular. Dərya xanın oğlu Behar xanı **(294 b)** padşah edib ona Sultan Məhəmməd ləqəbini vermişdilər. Mehavində Mərğubqul hakim idi. Bu qədər yaxınlığımızda olduğu halda uzun zaman gəlmədi.

## BƏYLƏR ARASINDAKI NARAZILIQ

Biz Aqraya gələndə isti fəsil idi. Əhali qorxudan tamamilə qaçmışdı. Özümüzə və atlara azuqə və yem tapılmırdı. Kəndlər ayrılıq və aradakı ziddiyyətlər üzündən düşmənliyə, oğruluğa və yol kəsməyə başlamışdılar. Yollardan keçmək mümkün deyildi. Biz də xəzinəni bölüşdürməklə məşğul olduğumuz üçün ayrı-ayrı pərgənələrə və digər yerlərə möhkəm adamlar təyin edə bilməmişdik.

O il çox isti idi. Bir çox adam səmum küləyinin təsiri ilə birdən-birə yıxılıb öldü. Bu üzdən də bəylərin və yaxşı igidlərin bir çoxu buradan soyumuşdu. Hindistanda qalmağa razı deyildilər, hətta getməyə belə üz tutmuşdular. Belə sözləri yaşlı və təcrübəli bəylər söyləsəydilər, ayıb olmazdı, amma onlar bu cür sözləri az söylədilər. Bir adamda bir az ağıl və məntiq olsa, izahatdan sonra doğrunu və əyrini anlayar, pisi və yaxşını ayırd edər. Lakin bir adam düşünüb-daşınıb bir qərara görə hərəkət edərkən, söylənmiş sözlərin təkrarlanmasında nə məna var? Gənclərin və kiçıklərin belə sözləri, belə **(295 a)** mənasız fikirləri söyləməsinin harası uyğundur? Qəribədir ki, bu dəfə Kabildən hərəkət edəndə bu adamların bir neçəsi hələ yenicə bəy olmuşdu. Mən oda, ya da suya girsəm və çıxsam, bunların da heç çəkinmədən mənimlə girib-çıxacaqlarını və hansı tərəfə üz tutsam, onların da mənimlə bir-

likdə gələcəklərini ümid edirdim. Mən inanmırdım ki, bunlar mənim niyyətimin əleyhinə çıxacaqlar, hamısı ilə danışıb məsləhətləşdikdən sonra birlikdə qərar verilən bir işə qarşı çıxacaqlar.

Gərçi bunlar pis hərəkət etdilər, lakin Əhmədi Pərvanəçi ilə Vəli Xəzinə[çi] bunlardan da pis hərəkət etdilər. Kabildən çıxıb İbrahimi məğlub edərək Aqranı zəbt edincəyə qədər Xoca Kəlan yaxşı hərəkət etmiş, cəsur sözlər söyləyib faydalı fikirlər irəli sürmüşdü. Lakin Aqranı aldıqdan bir neçə gün sonra bütün düşüncəsi dəyişdi və getməyə çalışanlardan biri də Xoca Kəlan oldu.

Adamlarımın bu tərəddüdünü öyrənincə, bütün bəyləri çağıraraq danışıb məsləhət etdik. Mən dedim ki: «Səltənət və cahangirlik vasitəsiz olmaz, padşahlıq və əmirlik nökərsiz və vilayətsiz mümkün deyil. Neçə ildir qeyrət edir, çətinliklər içində uzaq məsafələr qət edərək əsgərlə yürüyür, özümüzü və əsgəri savaş və ölüm təhlükələrinin **(295 b)** içinə atırıq. Biz Allahın inayəti ilə bu qədər çoxsaylı düşməni məğlub edib belə geniş məmləkətləri aldıq. İndi isə hansı çətinlik və hansı zərurət üzündən belə zəhmət hesabına zəbt etdiyimiz vilayətləri səbəbsiz yerə buraxmalıyıq. Əgər Kabilə dönsək, təkrar sıxıntıya məruz qalacağıq. Xoş niyyəti olan heç kim bundan sonra belə sözlər söyləməsin. Dayana bilməyib getmək istəyən isə getsin və bir daha geri qayıtmasın».

Belə məqbul və uyğun sözləri xatırladaraq bu sıxıntıları uzaqlaşdırdıq.

## XOCA KƏLANIN HİNDİSTANDAN GETMƏSİ

Xoca Kəlanın qalmağa niyyəti olmadığı üçün «Xoca Kəlanın əsgəri çoxdur, hədiyyələri o götürsün. Kabildə və Qəznədə də adam azdır, onları bir nizama salsın» deyə qərar verdik. Qəznə, Gərdiz və Sultan-Məsudi həzarəsini Xoca Kəlana ehsan etdim. Hindistandan da üç-dörd leklik Kühram pərgənəsi verildi.

Xoca Mir Miranın da Kabilə getməsi qərarlaşdırıldı. Hədiyyələr də onun məsuliyyətinə verildi, əmanətçi olaraq da Molla Həsən Sərraf və Tükə Hindu təyin olundu. Xoca Kəlan Hindistanı sevmədiyi üçün gedərkən evinin divarına bu beyti yazdırmışdı: **(296 a)**

Əgər be xeyri-sələmət güzər zi Sind kunəm,
Siyahru şəvəm, gər həvayi-hind kunəm.
*Əgər sağ-salamat keçsəm bu Sindi,*
*Üzüm qara olsun bir də istəsəm hindi.*

Biz Hindistanda ikən belə gülməli bir beyt söyləmək və yazmaq nəzakətsizlikdir. Getməsi üzündən bir buruqluq yaranmışdı, bu beyt bunu bir qat daha artırmışdı. Mən də içimə doğduğu kimi o anda söyləyərək bu rübaini yazıb göndərdim:

Yüz şükr de, Babur ki, kərimü qaffar
Verdi sana Sindü Hindü mülki-bisyar,
İstiliyinə gər sana yoxdur taqət,
Soyuq üzün görək desən, Qəznə var.

Bu əsnada əskidən rütbəsi çox kiçık olan və iki-üç ildən bəri böyük və kiçık qardaşlarını yığıb bir dəstə təşkil edən Molla Apağ oruq-zeyi və Sind sahilindəki bəzi əfqanlara başçı təyin edilərək Külə göndərildi. O civardakı oxçulara və sipahilərə təsəlli fərmanları göndərildi.

Şeyx Gürən etiqad və imanla gəlib bizə qoşuldu və Miyan-Duab oxçularından da iki-üç min sipahi gətirdi.

Yunus Əli Dehli ilə Aqra arasında yolu çaşıb Hümayundan ayrılanda Əli xan Fərmülinin oğullarına və ailəsinə rast gəlir. Bir az vuruşandan sonra onları məğlub edib Əli xanın oğullarını əsir alaraq gətirmişdi. Bu fürsətlə, Dövlət-Qədəm Türkün oğlu Mirzə Moğol vasitəsilə **(296 b)** Əli xanın əsir oğullarından biriylə birlikdə bu qarışıqlıqda Mivata getmiş olan Əli xana təsəlli fərmanları göndərildi. Mirzə Moğol Əli xan ilə birlikdə qayıtdı. Əli xana hörmət göstərib öz pərgənələrindən iyirmi beş lek verildi.

Sultan İbrahim Mustafa Fərmülini və Firuz xan Sarənghaninin idarəsindəki bir neçə əmiri Purabdakı asi əmirlərin üstünə göndərmişdi. Mustafa bu asi əmirlərlə yaxşı savaşaraq onları bir neçə dəfə möhkəm məğlub etmişdi. Mustafa bu İbrahimin məğlubiyyətindən bir az öncə öldü. Şeyx Bəyazid onun kiçık qardaşı idi, İbrahim vacib işlə məşğul olduğu üçün böyük qardaşının idarəsindəki vilayət və əhalini dərhal o, əlinə almışdı. Firuz xan, Şeyx Bəyazid, Mahmud xan Nuhani və Qazı Ciya qulluğa gəldilər. Bunlara da umduqlarından daha artıq etibar və şəfqət göstərib Firuz xana Cunpurdan bir kürur, qırx altı lek və beş min təngə, Şeyx Bəyazidə Uddan bir kürur, qırx səkkiz lek və əlli min təngə, Mahmud xana Qazipurdan doxsan lek və otuz beş min təngə, Qazı Ciyaya Cunpurdan iyirmi lek ehsan edildi.

## SULTAN İBRAHİMİN SARAYINDA KEÇƏN MƏCLİS

Şəvval bayramının üstündən bir neçə gün keçmişdi. Sultan İbrahimin hərəm sarayının ortasındakı daş sütunlu eyvanlı kümbəzdə böyük bir məclis qurduq.

Hümayuna işləməli bir köynək, kəmərli bir qılınc və altın yəhərli bir cins at, Çin Teymur Sultan, Mehdi Xoca və Məhəmməd **(297 a)** Sultan Mirzəyə işləməli köynək, kəmərli qılınc və kəmərli xəncərlər ehsan edildi. Digər bəylərə və igidlərə də mövqelərinə görə kəmərli qılınc, kəmərli xəncərlər, xələtlər bağışlandı. Hamısının siyahısı burada yazılıdır: yəhərli iki cins at, qəbzəsi qiymətli daşlarla bəzənmiş iyirmi beş ədəd xəncər, yenə qiymətli daşlarla bəzənmiş iki qılınc kəməri, səkkiz qumaş çəkmən, qiymətli daşlarla

bəzənmiş on altı ədəd qəmə, altın qəbzəli bir ədəd hind bıçağı, qiymətli daşlarla bəzənmiş iki ədəd geniş ağızlı xəncər və əlli bir parça qumaş.

Bu söhbət günündə olduqca çox yağış yağdı. On üç dəfə yağdı. Bəziləri yer çatmadığı üçün dışarıda oturmuşdular, hamısı islandılar.

Məhəmmədi Göyəldaşa Samanə vilayətini ehsan edib Sənbələ ilqar təyin etdik. Hisari-Firuzə mükafat olaraq Hümayuna verilmişdi, Sənbəli də Hümayuna ehsan etdim.

Hindu bəy Hümayunun yanına təyin edilmişdi,ona görə də Məhəmmədinin yerinə Hindu bəy, Kəttə bəy, böyük və kiçık qardaşları ilə birlikdə Məlik Qasım Baba-Qaşqa, Molla Apağ və Miyan-Duab oxçularıyla birlikdə Şeyx Gürən ilqar olaraq Sənbələ göndərildi.

Qasım Sənbəli üç-dörd dəfə **(297 b)** «Alçaq Bibən Sənbəli mühasirəyə alıb hücum edir, ora ilqar getsin» deyə adam göndərmişdi. Bibən bizdən qaçdıqdan sonra vaxt itirmədən dağ ətəyindən yürüyərək irəliləmiş və pərən-pərən düşən əfqanları və hindistanlıları yığıb bu qarışıq dönəmdə meydanı boş görərək gedib Sənbəli mühasirəyə almışdı.

Ahar keçidinə çatan Hindu bəy, Kəttə bəy və təyin edilən ilqar qolu suyu keçəndə böyük və kiçık qardaşları ilə birlikdə Məlik Qasım Baba-Qaşqanı irəliyə göndərirlər. Məlik Qasım suyu keçdikdən sonra qardaşları və yüz-yüz əlli igidlə birlikdə sürətlə çapıb günorta vaxtı Sənbələ çatır. Bibən isə adamlarını düzüb ordugahından hərəkət edir. Məlik Qasım sürətlə gedib kurqanı arxasına alır və hücum edir. Bibən müqavimət göstərə bilməyərək qaçır. Məlik Qasım onun xeyli adamının başını kəsib bir neçə fil, bir çox at və qənimət ələ keçirir.

Ertəsi gün digər ilqar bəyləri də yetişirlər. Qasım Sənbəli gəlib onları görür, lakin «kurqanı bunlara təslim etmək yaxşı olmaz» deyə düşünür. Bir gün Şeyx Gürən, Hindu bəy [Koçin] və digərləri ilə danışıb qərarlaşdıraraq bir bəhanəylə Qasım Sənbəliyi bu bəylərin yanına gətirir və bizim adamları Sənbəl kurqanına buraxır. Qasım Sənbəlinin köçünü və ailə üzvlərini sağ-salamat çıxarıb yolladılar.

Qələndər Piyada vasitəsilə Biyanədə bulunan Nizam xana vəd və təhdid fərmanlarıyla **(298 a)** birlikdə o anda içimdən gəldiyi kimi söylənən bu qitə yazıb göndərdim:

Ba türki siteza məqun, ey miri-Biyanə,
Çalaki-yo mərdanəgine türk əyan əst,
Gər zud nəyaiyü nəsihət naquni quş,
Anca ki əyan əst, çi hacət bə bəyan əst.

*Ey miri-Biyanə, türklər ilə oyun oynama,*
*Türklərin çevikliyi və qəhrəmanlığı əyandır.*
*Əgər tez gəlməsən və öyüd dinləməsən,*

*Əyan olanın bəyana nə lüzumu var.*

Biyanə kurqanı Hindistanın məşhur qalalarındandır. Axmaq hərif qalasının möhkəmliyinə güvənib başından böyük iddialarda bulunaraq adam göndərmişdi. Göndərdiyi adama yaxşı bir cavab vermədən qala zəbti üçün lazım olan şeylərin hazırlanmasıyla məşğul olduq.

Babaqulu bəy də vəd və təhdid fərmanlarıyla Məhəmməd Zeytunun yanına göndərildi. O da bəzi bəhanələr göstərərək hiylə yoluna sapmışdı.

Rana Sanka kafir biz Kabildə ikən elçisini göndərib sədaqətini açıqlamış və «Əgər padşah o tərəfdən Dehli civarına gəlsə, mən də bu tərəfdən Aqra üstünə yürüyərəm» deyə qərar vermişdi. Mən İbrahimi məğlub edib Dehli və Aqranı aldım. Bugünə qədər bu kafirdən heç bir hərəkət görünməmişdi, amma bir müddət sonra Məkənin Həsən adlı oğlunun olduğu Kəndar kurqanını mühasirəyə aldı. Həsən Məkəndən bir neçə dəfə adamlar gəldi. Məkən özü isə hələ gəlib görünməmişdi. O civardakı **(298 b)** Ətavə, Dulpur, Güvalyar və Biyanə kimi kurqanlar da hələ ələ keçməmişdi. Şərq tərəfdəki əfqanlar da inadkarlıq və sərkəşlik edirdilər və Kanucdan Aqraya doğru iki-üç mənzillik yerdə əsgərləri ilə mövqe tutmuşdular. Ətrafdaki itaət etməyənlərdən hələ tamamən əmin olmadığımız üçün ona yardıma getməyə adamlar ayıra bilmədik. İki-üç ay sonra Həsən çarəsiz qalıb şərtlə Kəndar kurqanını təslim etdi.

Rabiridəki Hüseyn xan [Nuhani] da qorxusundan Rabirini buraxıb çıxdı. Rabiri Məhəmməd Əli Cəng-Cəngə verildi.

Qütb xan Servani Ətavədə idi. Neçə dəfə ona vəd və təhdid fərmanları göndərildi, nə gəlib bizi gördü, nə də Ətavəni buraxıb çıxdı. Ətavəni Mehdi Xocaya ehsan edib Məhəmməd Sultan Mirzə, Sultan Məhəmməd Dulday, Məhəmməd Əli Cəng-Cəng və Əbdüləziz Miraxur idarəsində olan bəylərdən və içkilərdən bir dəstə adamı yardıma verib Ətavə üzərinə göndərdik.

Kanuc da Sultan Məhəmməd Duldaya verildi. Firuz xan, Mahmud xan Nuhani, Şeyx Bəyazid və Qazı Ciyaya da fövqəladə etibar göstərilib Purab tərəfindən pərgənələr verilmişdi, onlar da Ətavəyə təyin edildilər.

Məhəmməd Zeytun **(299 a)** Dulpurda olur və hiylə yoluna sapıb gəlmirdi. Dulpuru Sultan Cüneyd Barlasa ehsan edib Adil Sultan, Məhəmmədi Göyəldaş, Şah Mansur Barlas, Qutlu-Qədəm, Abdullah [Kitabdar], Vəli Xəzinə[çi], Can bəy [Can Məhəmmədi], Pirqulu və Şah Hüseyn Yaregi idarəsində olanları Dulpuru zorla alıb Sultan Cüneydə təslim etdikdən sonra Biyanə üzərinə yürüməlləri üçün təyin etdik. Bu əsgərləri təyin etdikdən sonra türk və hind əmirlərini məşvərətə çağırıb bu sözü təklif etdik:

«Purabdakı asi əmirlər -Nasir xan Nuhani və Məruf Fərmüli- qırx-əlli min adamla Qanqdan keçərək Kanucu ələ keçirmiş və bu tərəfə doğru iki-üç mənzil gəlib mövqe tutmuşlar. Kafir Rana Sanka da Kəndarı alıb fitnə və fəsadla məşğuldur. Yağmur mövsümü də sona yaxınlaşdı. Ya asilərin, ya da kafirlərin üstünə hərəkət etmək gərəkli və labüd görünür. Bu civardakı və

ətrafdakı kurqanların işi asandır. Bu böyük düşmənlər dəf edildikdən sonra bunlar nə edə bilərlər? Rana Sankanın belə hərəkət edəcəyi ağla gəlmirdi».

Hamısı da yekdil şəkildə belə dedi: «Rana Sanka bir az uzaqdadır, yaxınlaşa biləcəyi də məlum deyildir. Madam ki, bu düşmənlər bu qədər yaxına gəlmişlər, bunların dəf edilməsi önəmli və zəruridir».

Biz bu düşmənlərin üzərinə hərəkət etməyə qərar verəndə **(299 b)** Hümayun belə dedi: «Padşahın səfərə çıxmasına lüzum yoxdur, bu işi mən görərəm». Bu, hamının xoşuna gəldi. Türk və hind əmirləri bu fikri bəyəndilər. Hümayun Puraba təyin edildi, Dulpura təyin edilmiş olan əsgərlərin yanına Kabili Əhməd Qasım göndərildi, onların da Çəndvara gələrək Hümayuna qoşulmaları əmr edildi. Mehdi Xoca ilə Məhəmməd Sultan Mirzənin idarəsində Ətavə üzərinə göndərilən əsgərlərə də Hümayuna qatılmaları üçün fərman göndərildi. Cümə axşamı günü, zülqədə ayının on üçündə [=21 avqust] Hümayun səfərə çıxıb Aqradan üç küruh məsafədə yerləşən Cəlisir adlı kiçik bir kəndə endi. Orada bir gün qaldıqdan sonra qalxıb mənzil-mənzil irəlilədi. Cümə axşamı günü, ayın iyirmisində [=28 avqust] Xoca Kəlanın Kabilə getməsinə izin verildi.

## BABUR BİR BAĞ SALMAQ İSTƏYİR

Hindistanın böyük bir qüsuru axarsularının olmamasıdır. Yaşanacaq hər yerdə çarxlardan istifadə edərək su çıxarmaqla planlı və müntəzəm bağlar salmaq barədə düşünürdük. Aqraya gəlişimdən bir neçə gün sonra bu məqsədlə Cun çayından keçib bağ salınacaq yerləri araşdırdım. Elə səfasız və xarab yerlərdi ki, oralardan iyrənmə və diksinmə ilə keçdim. Bu yerin **(300 a)** iyrəncliyi və pisliyi üzündən çarbağ xəyalını ağlımdan çıxardım.

Amma oradan başqa Aqraya bu qədər yaxın olan bir yer də yoxdu. Bir neçə gün sonra istər-istəməz eyni yerdə işə başladıq. Hamamın suyunu təmin edən o böyük quyu qazıldı, ənbəli ağaclarıyla səkkiz guşəli hovuzun olduğu bir yer, onlardan sonra da böyük hovuz və saray tikildi. Daha sonra daş binanın önündəki hovuz və talvar inşa edildi. Sonra xəlvətxana bağı ilə evləri, ondan sonra da hamam tikildi. Beləcə səfasız və nizamsız hinddə gözəl, planlı və müntəzəm bağlar salındı. Hər guşəsi gözəl çəmənliklər və hər çəmənlik də uyğun güllər və nərgizlərlə bəzəndi.

Hindistanın üç şeyindən şikayətçi idik: istisi, küləyi və tozu. Hamam hər üçünün də çarəsi imiş. Toz və külək hamamda nə gəzir, ayrıca hamam, isti havalarda elə sərin olur ki, adam soyuqdan üşüyəcək dərəcəyə gəlir. Hamamın isti hovuzunun olduğu otağı bütünlüklə daşdan tikdilər. Ağ daşdan tikilən fəvvarə dışında bütün döşəmə və tavanı qırmızı Biyanə daşındandır.

Xəlifə, Şeyx Zeyn, Yunus Əli və çay sahilinə yerləşən hər kəs **(300 b)** düzgün və gözəl planlı bağlar, hovuzlar saldılar. Lahor və Dibalpur üsulu ilə

çarxlar qurub su çıxardılar. Hindlər belə planlı və düzgün yer görmədikləri için Cunun bu tərəfindəki gözəl binalı yerlərə «Kabil» adını vermişlər.

## BÖYÜK BİR QUYUNUN QAZILMASI

Kurqanın içində İbrahimin imarətiylə divar arasında boş bir yer vardı, oraya da böyük bir vayin, hövzi-kəbir düzəldilməsini əmr etdim. Pilləli və böyük quyuya hindlər vayin deyirlər. Bu vayin çarbağdan öncə düzəldilmişdi. Həmin yağmur mövsümündə qazmaqla uğraşdılar. Bir neçə dəfə çökdü və işçilər altında qaldı. Rana Sanka müharibəsindən sonra tamamlandı. Tarixinin yazıldığı daşda bunun tamamlanmasının müharibədən sonra [1527 martından sonra] olduğu göstərilmişdir. Gözəl bir vayin oldu.

Bu vayinin içində üç qatlı bir bina, onun ən aşağı qatında üç eyvan var. Quyuya pillələr vasitəsilə enmək olur. Hər üç eyvana eyni yoldan gedilir. Hər eyvan digərindən üç pillə yüksəkdir. Su çəkildiyi zaman su xətti ən aşağıdakı eyvandan bir pillə alçaq olur. Yağmur mövsümündə su yüksəldiyi zaman isə su bəzən ən yuxarı eyvana qədər çıxır.

Orta qatda oymalı bir eyvan var. Bu eyvanın yaxınlığında su çarxını çevirən öküzün olduğu bir kümbəz var. **(30l a)** Ən üst qatı da eyvandır. Quyunun üzərindəki dış səhndən bu eyvana, beş-altı pillə daha aşağıya hər iki tərəfdən pillələrlə bir yol gedir. Sağ tərəfə gedən yolun qarşısında tarix daşı vardır. Bu quyunun yanına bir quyu daha qazılmışdır. Bunun dibi digərinin ortasından bir az daha yuxarıdadır. Bəhs etdiyim kümbəzdəki öküzün çevirdiyi çarx vasitəsilə su o quyudan bu quyuya keçir. Bu quyuya da bir çarx qoyulmuşdur. Su bu çarxla yer üzünə çıxır və oradan da yuxarıda yeləşən bağa gedir.

Quyu nərdivanının qarşısına daşdan bir bina tikilmişdir. Quyunun ətrafındakı divar dışında isə daş bir məscid vardı, lakin gözəl deyildi və hind tərzində tikilmişdi.

## HÜMAYUNUN ÜSYANI YATIRMASI

Hümayun hərəkətə keçəndə Nasir xan Nuhani ilə Məruf Fərmüli komandanlığındakı asi əmirlər toplu bir halda Cacmavuda idilər. Hümayun onon beş küruh məsafəyə gələndə Mömin Atəkəni xəbər bilmək üzrə göndərir. Amma o daha çox mala axın etmək istəyir və işə yarayan bir xəbər də gətirə bilmir. Mömin Atəkənin gəldiyini xəbər alan asilər qaçıb gedirlər.

Mömin Atəkədən sonra xəbər bilmək üçün Qəsəmtay, Baba Çöhrə və Böçkəni göndərir. Bunlar da düşmənin nizamsız halda qaçdığı xəbərini gətirirlər. Hümayun hərəkətə keçib Cacmavunu aldıqdan sonra oradan keçib Dilmavu **(301 b)** civarına gəlir və Fəth xan Sərvani gəlib onu görür. Hümayun da Fəth xan Sərvanini Mehdi Xoca və Məhəmməd Sultan Mirzə ilə bir-

likdə bizim yanımıza göndərdi.

## XORASANDA ÖZBƏKLƏRİN MƏRVƏ SALDIRMASI

Bu il Übeyd xan Buxaradan qoşun çəkib Mərv üzərinə gəldi. Mərvin ərkində on-on beş adamlıq rəiyyət varmış, onları öldürüb Mərvin bəndini qırx-əlli gündə bağladıqdan sonra Səraxs üzərinə yürüdü. Səraxsda da otuz-qırx qızılbaş varmış. Bunlar qapını bağlayıb kurqanı təslim etmirlər. Amma kurqanın içindəki xalq üsyan edib qapını açır və özbəklər də girib bu qızılbaşları doğrayır.

Səraxsı aldıqdan sonra Tus və Məşhədə doğru hücuma keçirlər. Məşhəd əhalisi çarəsiz qalıb şəhəri təslim edir. Tusu səkkiz aylıq mühasirədən sonra sülh yoluyla alır. Lakin sözündə durmayaraq bütün kişiləri öldürür, qadınlarını isə əsir edir.

Bu il Sultan Müzəffər Quceratinin Bahadır xan adlı oğlu -indi atasının yerinə Quceratda padşah olmuşdur- atasından şikayətçi olaraq Sultan İbrahimin hüzuruna getmiş, lakin umduğu etibarı görməmişdi. Panipat civarında olduğumuz günlərdə mənə ərzi-halı gəldi. Mən də inayət və şəfqət fərmanları göndərib çağırdım. Gəlmək niyyətində idi, lakin sonra fikrini dəyişdirib İbrahimin ordusundan ayrılaraq Qucerat tərəfinə hərəkət etdi.

Bu zaman atası Sultan Müzəffər vəfat etdi və böyük qardaşı **(302 a)** İskəndər şah -ki, Sultan Müzəffərin böyük oğludur- atasının yerinə Quceratda padşah oldu. Pis rəftarından dolayı başqalarıyla birləşən İmadülmülk adlı bir qulu İskəndər şahı boğaraq hələ yolda olan Bahadır xanı dəvət edir və onu Bahadır şah ləqəbiylə atasının yerinə oturdur. Amma Bahadır şah da yaxşı hərəkət edir və belə nankorluq edən İmadülmülkü öldürərək cəzasını verir. Əlavə olaraq, atasından qalan bir çox bəyləri də öldürdür. Çox qan tökən və qorxmaz bir igid olduğunu söyləyirlər.

HİNDİSTAN - 933 (8 OKTYABR 1526 - 27 SENTYABR 1527)

## DOQQUZ YÜZ OTUZ ÜÇÜNCÜ İLİN HADİSƏLƏRİ

Bəy Veys məhərrəm ayında [=oktyabr 1526] Faruqun doğulduğu xəbərini gətirdi. Gərçi ondan öncə bu xəbəri bir piyada gətirmişdi, lakin Bəy Veys o ay müjdə ilə birlikdə özü də gəldi. Uşaq şənbə günü, şəvval ayının iyirmi üçündə [=2 avqust] doğulmuşdu və ona Faruq adı verildi.

## ƏLİQULU BÖYÜK BİR TOP TÖKÜR

Biyanə və tabe olmayan digər bəzi kurqanlar üçün ustad Əliqulıya böyük bir top tökməsi əmr edilmişdi. Ocağı və digər bütün lazım olan şeyləri hazırladıqdan sonra mənə adam göndərdi. Bazar ertəsi günü, məhərrəm ayının on beşində [=22 oktyabr] ustad Əliqulunın top tökməsini görməyə getdik.

Topun töküldüyü yerin ətrafına səkkiz ocaq qazıb metalı əritmişdi. Hər ocağın **(302 b)** dibindən bu topun qəlibinə bir arx gedirdi. Biz gəlincə ocaqların dəliklərini açdı. Ərimiş metal hər arxdan su kimi şırıltıyla qəlibə axırdı. Amma bir müddət sonra qəlib hələ dolmadan bu ocaqlardan ərimiş melalın axışı bir-bir kəsildi. Ya ocaqda, ya da metalda bir əskiklik varmış. Ustad Əliqulu çox dilxor oldu. Az qala özünü qəlibin içindəki ərimiş misin içinə atacaqdı. Ustad Əliqulunun könlünü alıb xələt geydirərək bu üzüntüdən qurtardıq.

Bir-iki gün gözləyib qəlib soyuduqdan sonra açdılar. Ustad Əliqulu fövqəladə sevincli bir şəkildə «Topun dış qəlibi qüsursuzdur, barıtxanasını tökmək asandır» deyə adam göndərdi. Topun dış qəlibini çıxarıb adamlarına onu təmir etməyi tapşırdı, özü də barıtxanasini tökməklə məşğul oldu.

Mehdi Xoca Feth xan Sərvanini Hümayunun yanından gətirdi. Onlar Humayundan Dilmavuda ayrılmışlar. Fəth xanı xoş qarşıladım, özünə atası Əzəm Hümayunun pərgənələrini və əlavə olaraq başqa vilayətləri də ehsan etdim. Bir kürur və altmış leklik pərgənə verdim.

Hindistanda çox etibar görən əmirlərə Əzəm Hümayun, Xani-xanan **(303 a)** və Xani-xanan kimi müəyyən ünvanlar verirlərmiş. Onun atasının unvanı Əzəm Hümayun idi. Öz oğlum Hümayuna görə bu ünvanı bir başqasına vermək yaraşmazdı. Onun üçün də bu ünvanı ləğv etdim və Fəth xan Sərvaniyə Xani-cahan ünvanı verildi.

Çərşənbə günü, səfər ayının səkkizində [=14 noyabr] ənbəli ağaclarının üst tərəfindəki hovuzun kənarında çadırlar qurub məclis keçirdik. Fəth xan Sərvanini içki məclisinə dəvət etdim, ona şərab ikram edib əynimdəki

çalma və paltarlarımı ehsan etdim. Bu ehsan və iltifatlardan sonra yanımızdan ayrılıb vilayətinə getməsinə izin verdim. Oğlu Mahmud xan Sərvaninin daima bizimlə qalması qərarlaşdırıldı.

## BİYANƏ KURQANININ TƏSLİM OLMASI

Çərşənbə günü, məhərrəm ayının iyirmi dördündə [=31 oktyabr] Məhəmməd Əli Heydər Riqabdar bu təcili mesajla Hümayunun yanına göndərildi: «Həmd olsun ki, Purab asiləri qaçmış, bu gedən adam varır-varmaz, Cunpura bir neçə bəyi təyin etməli, özün isə əsgərini alaraq sürətlə bizə yetişməlisin, çünki kafir Rana Sanka yaxındadır və qapıya gəlmişdir. Onun işini həll edək».

Əsgər Purab tərəfinə getdikdən sonra Biyanə civarına axın etmək və kurqandakıları **(303 b)** bizə xoşluqla tabe etmək, yoxsa axın və yağma surətilə düşmənə hücum etmək işi Turdu bəy Qoç bəyə və kiçık qardaşı Şir Əfkənə, böyük-kiçık qardaşları və axtacıları ilə Məhəmməd Xəlil Axta bəyə, böyük və kiçık qardaşları ilə Rüstəm Türkmənə və hindistanlılardan Ravuy Sərvaniyə tapşırıldı.

Biyanədəki bu Nizam xanın böyük qardaşlarından Aləm xan adlı biri də Təhəngər kurqanında olurdu. Bunun adamları dəfələrlə gəlib qulluq və sədaqətlərini bildirmişdilər. Bu Aləm xan «Padşah bir bölük göndərsə, bütün Biyanə oxçularını vədlərlə öz tərəfimizə çəkməyi və Biyanə kurqanını zəbt etməyi bacararam» deyərək işi öhdəsinə almışdı. Bu üzdən də bu iş üçün ayrılmış Turdu bəyin komandanlığındakı ilqar igidlərinə «Aləm xan müttəfiqimiz olduğu üçün bu qulluğu və xidməti öz üstünə alıb, Biyanə işində onun fikri və rəyi ilə hərəkət edin» deyə əmr edildi.

Hindistanlıların bir qismi qılınc oynatmağı bacarsa da, lakin çoxu əsgərlikdən və komandanlıqdan bixəbər və binəsibdir. Bizim ilqar da gedib bu Aləm xana qoşulunca, o da başqa heç kimin sözünə baxmadan, işin yaxşı-pis tərəfini düşünmədən ilqarı Biyanə yaxınlığına aparır.

Bizim oraya gedən ilqarda türklərdən iki yüz əlli-üç yüz, hindistanlılar ilə civardan alınan əsgərdən də iki mindən bir az artıq adam vardı. Nizam xan və Biyanədəki əfqan və sipahi qüvvələri isə dörd mindən artıq, atlı ilə on mindən çox piyadadan ibarət idi.

Nizam xan bizim ilqarı görüb **(304 a)** sayını öyrənincə, bəhs etdiyim bu atlı və piyada əsgəriylə dərhal bunlara qarşı çıxır. Atlarına minib sürətlə saldıran bu izdiham ilqar adamlarımızı qaçırır və böyük qardaşı Aləm xan Təhəngərini ələ keçirir. Ondan başqa beş-altı adam və bir qədər də sursat ələ keçirirlər.

Bu hərəkətinə baxmayaraq Nizam xana vədlərdə bulunaraq, bundan öncəki günahlarını bağışlayıb fərmanlar göndərdik. Kafir Rana Sankanın ya-

xınlaşdığı xəbərini alınca çarəsiz qalıb Seyid Rəfini çağıraraq onun vasitəsilə kurqanı bizim adamlara təhvil verməsindən sonra yenə Seyid Rəfi ilə birlikdə gəlib mülazimət şərəfinə nail oldu. Ona Miyan-Duabda iyirmi leklik bir pərgənə ehsan etdim.

Dost eşik-ağa da müvəqqəti olaraq Biyanəyə göndərildi. Bir neçə gün sonraysa Biyanəni Mehdi Xocaya ehsan edib gəlirini yetmiş lekə çıxararaq oraya getməsinə izin verdim.

## RƏHİMDADIN GÜVALYARI ALMASI

Güvalyarda olan Tatar xan Sarənghaninin adamı da gəlib qulluq və sədaqətini bildirmişdi. Kafir [Rana Sanka] Kəndarı alıb Biyanəyə yaxınlaşanda isə Güvalyar racələrindən Dərmənket ilə Xani-cahan adlı kafirlər Güvalyar civarına gəlib qalanı ələ keçirmək ümidiylə qarışıqlıq çıxarmağa başladılar.

Tatar xanın adamı gəlib Güvalyarı təslim edəcəklərini söylədi. Bəylərin, içkilərin və yaxşı igidlərin böyük bir qismi səfərlərə və hər tərəfə ilqara getmişdi. **(304 b)** Böyük və kiçık qardaşları ilə birlikdə Həstiçi Tünqatar, bir neçə bxirəli və lahorlu adamla birlikdə Rəhimdad pərgənələri Güvalyarda olmaq üzərə oraya göndərildi. Molla Apağ ilə Şeyx Gürən də Rəhimdadı Güvalyarda yerləşdirib qayıtmaq üzrə göndərildi.

Bunlar Güvalyara yaxınlaşanda Tatar xanın fikri dəyişmiş və bunları kurqana buraxmamışdı. O zaman dünya ləzzətlərindən əl çəkməsilə tanınmış, müridi və dostları çox bir dərviş olan Şeyx Məhəmməd Qövs Güvalyar kurqanının içindən Rəhimdada adam göndərərək «Nəyin bahasına olsa kurqana girin, çünki bu adamın fikri dəyişmişdir. Pis niyyətləri vardır» deyir.

Rəhimdad bu xəbəri alınca «Dışarısı kafirlər üzündən təhlükəlidir, mən bir neçə adamla kurqana girim, digərləri dışarıda qalsın» deyə xəbər göndərir və israr edir, Tatar xan da buna razı olur. Bir neçə adamıyla içəri girincə də «Bu qapıda bizim adamlar dursun» deyə Hati-Pülə öz adamlarını qoyur və o gecə bütün adamlarını Hati-Püldən içəri buraxır. Ertəsi gün də Tatar xan çarəsiz qalıb kurqanı istər-istəməz təslim edir. Sonra da gəlib Aqrada bizə qoşuldu. Onun təxsisatı Biyanə pərgənəsindən iyirmi lek olaraq müəyyənləşdirildi.

Məhəmməd Zeytun da çarəsiz qalarq Dulpuru **(305 a)** təslim edərək gəlib mülazimət etdi. Ona bir neçə leklik pərgənə ehsan edildi. Dulpur xassə əmlak siyahısına alındı və şikdarlığı Əbülfəth Türkmənə ehsan edilərək oraya göndərildi.

Hisari-Firuzə civarındakı Həmid xan Sarənghani də pani əfqanlarının bir qismiylə o tərəfdəki əfqanlardan üç-dörd min adamı yığıb fitnə və fəsad çıxarmaqla uğraşırdı. Çərşənbə günü, səfər ayının on beşində [=21 noyabr]

Əhmədi Pərvançı, Əbülfəth Türkmən, Məlikdad Kərani (Kərərani) və Mücahid xan Multani idarəsində olanlarla birlikdə Cin-Teymur Sultana bu əfqanlara hücum etməyi tapşırdım. Bunlar gedib öndən sürətlə yürüyərək bu əfqanları möhkəm məğlub etdikdən sonra adamlarından çoxunu öldürüb bir çox baş kəsib gətirdilər.

Səfər ayının sonlarında İraqa, şahzadə Təhmasibin yanına elçiliyə getmiş olan Hacəgi Əsəd yanında Süleyman adında bir türkmənlə birlikdə gəlib hədiyyə gətirdi. Bunlar arasında iki çərkəz qızı da vardı.

## BABURU ZƏHƏRLƏMƏ TƏŞƏBBÜSÜ

Cümə günü, rəbiüləvvəl ayının on altısında [=21 dekabr] qəribə bir hadisə oldu. Bunu Kabilə göndərilmiş olan məktubda ətraflıca anlatmışam, nə artıq, nə də əskik olaraq burada da eynən verirəm. O məktub budur:

«Cümə günü, rəbiüləvvəl ayının on altısında, doqquz yüz otuz üçüncü ildə meydana gələn böyük olayın təfsilatı belədir: İbrahimin [Sultan İbrahim Ludi] anası, bu bədbəxt qadın mənim **(305 b)** hinduların əliylə bişirilən yeməkləri yediyimi eşidir.

Bu hekayə də bundan ibarətdir: bundan üç-dörd ay əvvəl Hindistan yeməklərini görməmiş olduğum üçün İbrahimin aşçılarını (bavurçu) gətirmələrini söylədim. Əlli-altmış qədər aşçıdan dördünü yanıma aldım. O da bunu eşidərək Ətavəyə adam göndərib dördə qatlanmış bir kağız içində gətirtdiyi bir tülə zəhəri bir cariyənin casitəsilə Əhməd Çeşnigirə -hind eli bəqavula çeşnigir deyir- verir, tülə iki misqaldan bir az artıqdır.

Əhməd də bizim aşxanadakı hindistanlı aşçıya dörd pərgənə verəcəyini vəd edib mənim yeməyimə hər hansı bir şəkildə qatması üçün zəhəri verir. Zəhəri Əhməd Çeşnigirə aparan cariyənin arxasından digər bir cariyə də gönrərir ki, bunu verib-vermədiyini öyrənsin.

Yaxşı ki, aşçı zəhəri qazana deyil, boşqaba qoyur. Qazana qoymamasının səbəbi bu idi: bəkavullara hindular yemək bişirəndə daima orada olmalarım möhkəm-möhkəm əmr etmişdim və onlar da yemək bişiriləndə yeməyi aşçılara daddırırdılar.

Yeməyi daddıqları zaman bizim bədbəxt bəkavullar qəflətə düşürlər. Aşçı çini boşqab üzərinə çörək dilimini qoyanda, dilimin üzərinə o kağızdakı zəhərin yarısından bir qədər azını səpir. Zəhərin üstünə yağda qızardılmış əti qoyur. **(306 a)** Zəhəri ət üzərinə səpsə, ya da qazana töksəydi, pis olardı. Çaşqınlıqla zəhərin yarısından artığını ocağa atır.

Cümə günü, axşam üstü, ikindi vaxtında yemək verdilər. Dovşan yeməyindən xeyli yedim. Qızardılmış yerkökü də yedim. Bu zəhərli hind yeməyindən bir-iki loxma aldım, qızardılmış ət də yedim. Dadından heç bir şey bəlli deyildi. Qurudulmuş ətdən bir-iki tikə aldım. Midəm bulandı. Ke-

çən gün qurudulmuş ət yediyim vaxt dadı pis idi. Mədə bulantısının ondan olduğunu zənn etdim. Təkrar mədəm bulandı. Süfrədə iki-üç dəfə mədəm bulandı. Az qala qusurdum. Axırda gördüm ki olmur, yerimdən qalxdım. Ayaq yoluna gedincəyə qədər yolda da az qala qqsurdum. Ayaq yolu önünə gedib çox qusdum. Yeməkdən sonra heç qusduğum olmamışdı, hətta içdiyim zaman da qusmazdım.

İçimə şübhə girdi. Aşçını mühafizə altına alaraq, o qusmuğu köpəyə verib köpəyi də nəzarət altına almalarını əmr etdim. Ertəsi gün bir pəhərə yaxın köpək bir az xəstələnib qarnı şişən kimi oldu. Nə qədər ətrafını çevirib daşla vursalar da qımıldanmadı. Bu halı günortaya qədər davam etdi. Ondan sonra qalxdı. Ölmədi.

Bir-iki çöhrə də bu yeməkdən yemişdi. Ertəsi gün onlar da çox qusdular. **(306 b)** İçlərindən birinin halı xarabdı. Axırda hamısı qurtuldu.

«Rəsidə bud bəlayi, vəli bəxeyr güzəşt» (*bir bəla yetişdi, lakin xeyrlə keçdi).* Allah mənə təkrar can verdi. O dünyadan qayıtdım, sanki yenidən doğuldum, can qədrini, billah, indi bildim.

Sultan Məhəmməd Bəxşiyə aşçını nəzarət altına almasını əmr etdim. Aşçı işkəncə nəticəsində sizə söylədiyim şeyləri tək-tək uzun-uzadıya anlatdı. Bazar günü divan günüydü. Əkabirrin və əşrafin, üməra və vüzəranın divanda iştirak etmələrini, iki kişi ilə iki qadını gətirib sorğuya çəkmələrini əmr etdim. Hadisənin necə olduğunu bütün təfsilatı ilə danışdılar.

O çeşnigiri parçalatdırdım. Aşçının da diri-diri dərisini soydurdum. Qadınlardan birini filin altına atdırdım, birini güllələtdim. Birini mühafizə altına aldırdım, o da öz etdiyinə giriftar olub cəzasını çəkəcəkdir.

Şənbə günü bir fincan süd içdim. Bazar günü də bir fincan süd içdim. Gili-məxdumla[1] güvvətli tiryəki əzib içdim. Süd içimi təmizlədi. İlk gün öd kimi qara-qara şeylər çıxdı. Şükür ki, artıq heç bir sıxıntım yoxdur.

Can belə əziz bir şeymiş, bu qədər əziz olduğunu bilməzdim. Bir misra var:

Kim ölər həlakətə yetsə, ol bilir can qədrini.

Bu qorxunç hadisəni nə zaman xatırlasam, istəmədən ağlım başımdan **(307 a)** çıxır. Tanrı təala öz inayəti ilə mənə yenidən can bağışladı. Bunun şükrünü hansı dillə ifadə edim. Ağlınızda bir tərəddüd qalmasın deyə gerçəkləşən hər şeyi bütün təfərrüatı ilə yazdım. Gərçi dilə və ağıza sığmayacaq qorxunc bir hadisə idi. Allaha şükür ki, əcəlim gəlməmişdi, axırı xeyir oldu.

Ağlınıza heç bir sıxıntı və tərəddüd gətirməyin deyə çərşənbə axşamı günü, rəbiüləvvəl ayının iyirmisində [=25 dekabr] çarbağda ikən yazıldı».

Bunlardan qurtulunca yazılan bu məktubu Kabilə göndərdim.

O bədbəxt qadından belə böyük bir günah zühur etdiyi üçün sahib ol-

[1] *Gili-məxdum:* bir cür torpaqdır, zəhərlənməyə qarşı dərman olaraq işlədilir.

duğu əmlak Yunus Əli ilə Hacəgi Əsəde yağmalatdırıldı. Nəqd, əşya, qul və cariyələri alındıqdan sonra, özü də nəzarət altında saxlanmaq üzrə Əbdürrəhim Şiğavula təhvil verildi. Onun nəvəsi, yəni İbrahimin oğluna çox saygı və hörmətlə davranılırdu. Lakin belə bir qəsd bu ailədən ortaya çıxdığı üçün onun da burada qalması uyğun görülməyərək, cümə axşamı günü, rəbiüləvvəl ayının iyirmi doqquzunda [=3 yanvar 1527] Kamranın yanından bəzi işlərin həlli üçün gəlmiş olan Molla Sərsan ilə birlikdə Kamrana göndərildi.

## YENİDƏN HÜMAYUNUN SƏFƏRİ HAQQINDA

Hümayun Purabdakı asilərin üzərinə getmişdi. Cunpuru **(307 b)** fəth etdikdən sonra sürətlə Qazipura, Nasir xanın üstünə yürüdü. Nasir xan da bunu xəbər alaraq Qanq çayını keçdi. Buna görə də Hümayun Qazipurdan Harid üzərinə doğru yürüdü. Oradakı əfqanlar da bunu eşidib Saru çayını keçdilər. Əsgər Haridi yağmaladıqdan sonra oradan geri döndü.

Daha öncədən müəyyən etdiyim şəkildə Şah Mir Hüseyn ilə Sultan Cüneyd bir dəstə yaxşı igidlə birlikdə Cunpurda qaldı. Qazı Ciya da onların yanına təyin edildi. Uda isə Şeyx Bəyazid təyin edildi. Bu işləri düzənləyib tamamlayandan sonra Hümayun da Kərrə-Manikpur civarından Qanqı keçərək Kalpi yoluyla hərəkət edir.

Cəlal xan Cighetin oğlu Aləm xan Kalpidə olurdu. Ərzi-halı gəlir, lakin özü gəlmirdi. Hümayun Kalpi qarşısına gedin onun qorxusunu könlündən çıxarıb özü ilə birlikdə gətirdi. Hümayun bazar günü, rəbiülaxır ayının üçündə [=6 yanvar] Həşt-Behişt bağında gəlib mülazimət etdi. O gün Xoca Dost Xavənd də Kabildən gəldi.

## RANA SANKA HƏRƏKƏTƏ KEÇİR

O günlərdə Mehdi Xocanın adamları da tez-tez bu barədə xəbər gətirirdilər: «Rana Sankanın hərəkətə keçəcəyi məlum oldu. Həsən xan Mivati də Ranaya qoşulmaq fikrindədir. Bunların işini həll etmək lazımdır. Əsgərdən bir az əvvəl Biyanəyə bir az kömək gəlsə, daha **(308 a)** yaxşı olar».

Qoşun çəkməyə qərar verib ordunun hərəkətə keçməsindən bir az əvvəl Məhəmməd Sultan Mirzə, Yunus Əli, Şah Mansur Barlas, Kəttə bəy, Qəsəmtay və Böçkə idarəsində olanlar Biyanəyə ilqar olaraq göndərildi.

Həsən xan Mivatinin Nahir xan adlı oğlu İbrahimlə müharibədə mənə əsir düşmüşdü, onu girov olaraq saxlamışdım. Bu üzdən də atası Həsən xan zahirən mənimlə münasibət saxlayır və oğlunu daim geri istəyirdi. Bəziləri «Həsən xanı bu tərəfə çəkmək üçün oğlu göndərilirsə, ona daha çox təsir edər və vəzifəsini daha yaxşı ifa edər» fikrini irəli sürdülər. Həsən xanın oğlu Nahir xana xələt geydirilib atasına vədlərdə bulunaraq getməsinə izin

verildi. Bu münafiq hərif isə oğlunun izin ala bilməsi üçün hərəkətsiz durumuş, oğluna izin verildiyini xəbər alar-almaz, daha oğlu oraya çatmadan Əlvardan çıxıb Tudəyə gedib Rana Sankaya qoşuldu. Onun oğluna o zaman izin vermək doğru bir iş deyilmiş.

O arada çox yağış yağırdı. Daima söhbət məclisləri qurulur və Hümayun da bu söhbətlərdə iştirak edirdi. İçkidən uzaq dursa da, bu bir neçə gün içdi.

## BƏLXİN ÖZBƏKLƏRİN ƏLİNƏ KEÇMƏŞİ

O günlərdə baş verən qəribə hadisələrdən biri də budur: Hümayun Qaleyi-Zəfərdən Hindistan səfərinə gəldiyi vaxt **(308 b)** yolda Molla Baba Pəşağari və onun kiçık qardaşı Baba Şeyx qaçıb Kitin-Qara Sultanın yanına getmişdilər. Bəlxdəkilər də aciz qaldılar və Bəlx Kitin-Qara Sultanın əlinə keçdi. Bu boş adam kiçık qardaşları ilə birlikdə bu civarın idarəsini öz üzərinə alaraq Aybək, Xürrəm  və Sarbağ civarına gəlir. Şah İskəndər də Bəlxin istilasından qorxub Quri qalasını özbəklərə təslim edir. Molla Baba ilə Şeyx bir neçə özbəklə birlikdə Quri kurqanına gəlib girirlər.

Mir Həmə kurqanı yaxın olduğu üçün başqa çarə tapmayaraq o da özbəklərə tabe olur. Bir neçə gün sonra Mir Həməni adamlarıyla birlikdə köçürdüb Bəlx tərəfinə götürmək işini həll etmək üçün Baba Şeyx bir neçə özbəklə birlikdə Mir Dərhalin kurqanına gəlir. Mir Həmə Baba Şeyxi kurqanda endirir və digərlərinə ayrı-ayrı yerlərdə otaq verir, Baba Şeyx ilə çarpışır və bir neçə adamıyla birlikdə onu da yaxalayıb həbs edir; sonra Tanrıverdiyə, Qunduza adam göndərir. Tanrıverdi də bir neçə yaxşı adamla birlikdə Yarəli ilə Əbdüllətifi [Bəxşi] oraya göndərir.

Bunlar yetişincəyə qədər Molla Baba özbəklərlə birlikdə Mir Dərhalin kurqanına gəlib savaşmaq istəyir, lakin heç bir şey edə bilmir. Tanrıverdinin adamlarıyla birlikdə Qunduza gəlirlər. Baba Şeyxin yarası ağırmış, onun üçün Mir Həmə o günlərdə onun başını kəsib gətirdi. **(309 a)** Ehsan və şəfqətlərlə onun mövqeyini yüksəldərək tay-tuşları arasında seçkin qıldım.

Baqi Şiğavul geən zaman bu iki əski bədbəxtin hər birinin başı üçün bir ser altın vəd etmişdim. Amma indi bu ehsanların dışında, belə bir vəddə bulunduğum üçün o bir ser[1] altın da Mir Həməyə verildi.

Bu sıralarda Biyanəyə ilqar kimi göndərilən Qəsəmtay ilə Böçkə bir neçə qazax igidlə birlikdə dil yaxalamaq üçün gedəndə kafirin iki bölük axınçısını məğlub edib yetmiş-səksən qədər adamını ələ keçirirlər. Həsən xan Mivatinin dəqiq olaraq gəlib düşmənə qoşulduğu xəbərini Qəsəmtay gətirdi.

Bazar günü, ayın səkkizində [=10 fevral] Ustad Əliqulunun topla daş

---

[1] *Ser/sir:* indi qarşılığı tam olaraq bilinməyən bir ağırlıq ölçüsüdür.

atmasını seyr etməyə getdim. Əvvəlcə tökdüyü böyük topun lüləsin heç bir nöqsan yoxdu və barutxanasını də sonradan tökərək tamamlamışdı, ikindi vaxtı daş atdı, daş min altı yüz qədəm məsafəyə getdi. Ustada kəmərli bir xəncər, xələt və cins bir at ehsan etdim.

## RANA SANKA ÜZƏRİNƏ SƏFƏR HAZIRLIĞI

Bazar ertəsi günü, cəmadiyüləvvəl ayının doqquzunda [=11 fevral] müharibə üçün yola çıxaraq məhəllələrin dışındakı ovaya endik. Əsgər yığmaq və əsgərin təchizatını tamamlamaq üçün burada üç-dörd gün qaldıq.

İnanmadığımız üçün hindu əmirləri çeşitli yerlərə ilqar təyin etdik. Aləm xan [Təhəngəri] **(309 b)** Rəhimdada köməkçi olaraq Güvalyara ilqar göndərildi. Məkən, Qasım bəy Sənbəli, Məhəmməd Zeytun, böyük və kiçık qardaşları ilə Həmid [xan Sarənghani] də Sənbələ ilqar təyin edildilər.

Bu yurdda alınan xəbərlərə görə, Rana Sanka bütün əsgəriylə Biyanənin yaxınına qədər axın edir. Önçülüyə gedənlər xəbər verə bilməmiş, hətta kurqana belə girə bilməmişlər. Kurqandakılar da düşmənə qarşı kurqandan bir az uzağa, həm də bir az ehtiyatsız davranaraq çıxmışlar. Düşmən daha qüvvətli olduğu üçün bunları məğlub edərək qaçırmış.

Səngər xan Cəncuhə orada şəhid oldu. Döyüşün qaynar çağında Kəttə bəy zirehsiz olduğu halda qoşaraq irəli çıxır. Bir kafiri atından salıb tam ələ keçirəcəyi əsnada o kafir Kəttə bəyin qılıncını qapıb Kəttə bəyin düz çiyninə vurur. Kəttə bəy çox iztirab çəkdi və Rana Sanka ilə savaşa gələ bilmədi. Bir müddət sonra bir az yaxşılaşdı, lakin şikəst qaldı.

Qəsəmtay, Şah Mansur Barlas və Biyanədən gələn digər hər kəs qorxduqları üçünmü, yoxsa xalqı qorxutmaq istədiklərindənmi, bilmirəm, kafirin əsgərini cürət və cəsarət baxımından möhkəm öydülər.

Səfərə çıxdığımız yurddan Medhakur pərgənəsində ordunun enəcəyi yerə qədər bir çox quyunun qazılması üçün istehkamçılarla birlikdə Qasım Miraxur göndərilmişdi. Şənbə günü, cəmadiyüləvvəl ayının on dördündə [=16 fevral] Aqra civarından qalxıb quyuların qazıldığı yurda gəlib endik. **(310 a)**

Ertəsi gün də oradan qalxıb bu civarda suyu bol olan və orduya yetərli gələcək yerin Sikri olduğunu, lakin oranın kafir tərəfindən zəbt edilmiş ola biləcəyini düşünərək sağ və sol qollarımızı və mərkəz səflərimizi döyüş nizamına salaraq hərəkət etdik.

Dərviş Məhəmməd Sarban ilə Qəsəmtay Biyanəyə gedib gəlmiş olduqları üçün ərazini tanıyırdılar. Onlar Sikri gölünün sahilində düşərgə yeri tapmaq üçün irəli göndərildilər. Gedib o yurda enər-enməz, Mehdi Xoca və Biyanədəkilərə dərhal gəlib bizə qoşulmaları üçün çapar göndərdik.

Hümayunun nökəri Bəy Mirək Moğol kafirdən xəbər bilmək üçün bir

neçə igidlə birlikdə irəli göndərildi. Gecə getdilər və sabah düşmənin Büsavərdən bir küruh daha irəliyə enmiş olduğu xəbərini gətirdilər. O gün Mehdi Xoca, Məhəmməd Sultan Mirzə və Biyanədəki ilqar gəlib bizə qoşuldu.

Bəylər növbə ilə önçülüyə təyin edildilər. Əbdüləziz [Miraxur] önçülük növbəsində irəlini-gerini düşünmədən birbaşa Sikridən beş küruh məsafədə yerləşən Qanvahəyə getmişdi. Kafir bir az irəliyə köç etmiş imiş. Bunların belə dördnala irəlilədiklərini öyrənərək dörd-beş min düşmən gəlib yetişirlər. Əbdüləziz ilə Molla Apağın yanında min-min beş yüzə qədər adam vardı. **(310 b)** Düşmənin sayını nəzərə almadan bunlar da savaşa girirlər, lakin izdihamlı əsgər hücuma keçincə qaçırlar.

Bu xəbəri alınca nökərləri ilə birlikdə Mühib Əli Xəlifəni dərhal oraya göndərdik. Molla Hüseyni və digər bəzilərini də arxa-arxaya bunlara köməkçi göndərdik. Sonra Məhəmməd Əli Cəng-Cəng də göndərildi.

Amma kafirlər Mühib Əli yetişincəyə qədər Əbdüləziz və yanındakıları qaçıraraq bayrağını alıb Molla Nemət, Molla Davud, Molla Apağın kiçik qardaşı və digər bir neçə adamı yaxalayıb şəhid edirlər. Bizimkilər də yetişir və Mühib Əlinin dayısı Tahir Təbəri dərhal hücum edir. Lakin digər yardım gücləri hələ yetişmədiyi üçün kafirlər Tahiri də orada ələ keçirirlər. Mühib Əli də savaş zamanı yerə düşür, amma Baltu yandan girərək Mühib Əlini qurtarır. Kafirlər bir küruh məsafəyə qədər bizimkiləri təqib edir və Məhəmməd Əli Cəng-Cəngin qaraltısı görününcə dayanırlar.

Bizə düşmənin yaxınlaşdığı xəbərləri ard-arda gəlirdi. Zireh geyib, atlara da zireh örtüb silahlanaraq sürətlə hərəkət etdik. Top arabalarını çəkib gətirmələrini əmr etdim. Bir küruh qədər irəlilədik. Düşmənin adamları geri dönmüşdü.

Yaxınımızda böyük bir göl vardı. Su üçün oraya endik. Arabaları ön tərəfdən qorunaqlı bir hala gətirib onları zəncirlərlə bir-birinə bağladıq. Hər iki arabanın arası yeddi-səkkiz kari qədərdı və buraya zəncir çəkilirdi. Mustafa Rumi rum **(311 a)** tərzində arabalar düzəltmişdi. Çox yüngül, funksional və gözəl arabalardı.

Ustad Əliqulu ilə yola getmədiyi üçün Mustafa sağ qola, Hümayunun yanına təyin edildi. Araba yetişməyən yerlərə xorasanlı və hindistanlı istehkamçılara xəndəklər qazdırıldı.

Kafirin bu qədər tez gəlməs, Biyanədəki savaş, Şah Mansur, Qəsəmtay və Biyanədən gələn digərlərinin anlatdıqları və öygüləri üzündən əsgərlərin cəsarəti qırılmışdı. Əbdüləzizin yenilgisi də bunu büsbütün artırdı. Xalqın əndişəsini azaltmaq və əsgərin istehkam hazırlığı üçün arabaların yetişmədiyi yerlərə ağacdan səhpa kimi şeylər qoyuldu, yeddi-səkkiz kari olan hər səhpanın arası da öküz dərisindən düzəldilmiş qayışlarla bir-birinə möhkəmcə bağlandı.

Bu hazırlıq tamamlanıncadək iyirmi-iyirmi beş gün keçdi.

O əsnada Kabildən Sultan Hüseyn Mirzənin qızının oğlu olan Qasım Hüseyn Sultan, Seyid Yusifun oğlu Əhməd Yusif, Qivam bəy Orduşah və oradan-buradan yığılmış beşbyüzə qədər adam daha gəldi.

Məhəmməd Şərif Münəccim uğursuz da bunlarla birlikdə gəldi. Şərab gətirmək üzrə Kabilə getmiş olan Baba Dost Suçu da Qəznənin məqbul şərablarından üç qatar **(311 b)** dəvə yüküylə bunlarla birlikdə gəldi.

Söylədiyim kimi, meydana gələn olaylar və durumlar, saçma sözlər və dedi-qodular üzündən əsgərin təlaşının və qorxusunun artdığı bir zamanda bu uğursuz Məhəmməd Şərif Münəccim də -gərçi mənə söyləyəcək faydalı bir sözü yoxdu- rast gəldiyi hər kəsə sürəkli olaraq bugünlərdə Mərrixin qərb tərəfində olduğunu və bu tərəfdə savaşan hər kəsin məğlub olacağını söyləyirdi. Bunu belə bir uğursuzdan kim xəbər almış ki. Bu vəziyyət cəsarətsiz xalqın gözünü daha artıq qırdı. Onun bu saçma sözlərinə qulaq vermədən, görəcəyimiz işləri dayandırmadan savaş hazırlığı ilə uğraşaraq səfləri nizamlamağa qeyrət etdik.

Bazar günü, ayın iyirmi ikisində [=24 fevral] Şeyx Cəmalini, Miyan-Duab oxçularını və Dehlidən yığa bildiyi qədər əsgər yığıb bunları digər tərəfdən düşmənə narahatlıq yaratmaq üzrə Mivat kəndlərinə axın etmələri və əllərindən gələn hər şeyi etmələri üçün göndərdik. Kabildən gəlməkdə olan Molla Türk Əliyə də Şeyx Cəmaliyə qoşularaq Mivata axın etməsi və düşməni vahiməyə çalışması əmr edildi. Məğfur Divana da eyni əmr verildi.

Bunlar da gedib Mivatın bir neçə kənar kəndlərinə axın edərək yağmalamış və əsirlər almışlar. Lakin bu surətlə düşmən umduğumuz qədər da narahat olmadı.

## BABURUN İÇKİYƏ TÖVBƏ ETMƏSİ

Bazar ertəsi günü, cəmadiyüləvvəl ayının iyirmi üçündə [=25 fevral] **(312 a)** bir az gəzmək üçün ata mindim. Gəzinti əsnasında [içkiyə] tövbə etmə sıxıntısını düşünürdum və məşru olmayan bir işi görməyə davam etdiyim üçün sürəkli vicdan əzabı duyurdum. Dedim ki: «Ey nəfs,

*Çənd başi zi məasi məzəkəş,*
*Tövbə həm biməzə nist bi çəş*[1].

Necə üsyan[2] ilə aludəliyin,
Necə hirman[1] ara asudəliyin,

[1] Nə vaxtadək günah işlərdən zövq alacaqsan,
Tövbə həm biməzə deyil, ona bax.

[2] Üsyan – şəriətə əməl etməmək.

Necə nəfsinə olursan tabe,
Necə ömrünü qılırsan zaye?

Niyyəti-qəzv[2] ilə kim, yürübsən,
Ölməyini özünə görübsən,

Kim ki, ölmək özünə cəzm[3] edər,
Uşbu halətdə bilirsənmi nedər?

Dur[4] edər bütün mənahidən[5] özün,
Arıdar cümlə günahından özün,

Xoş qılıb öznü bu keçməklikdən,
Tövbə qıldım çaxır içməklikdən,

Altunü nüqrə,[6] sürahiyü əyağ[7],
Məclis aləti tamamın ol çağ

Hazır edib, hamısın sındırdım,
Tərk edib meyi, könül dindirdim.

Bu qırılmış altın və gümüş sürahilər və taqımlar ehtiyacı olanlara və dərvişlərə paylandı. Bu tövbədə məni dəstəkləyən ilk adam Əsəs oldu. Saqqal buraxmağa da razı olmuşdu[8].

O gecə və ertəsi sabah bəylər, içkilər, sipahi və sipahi olmayanlardan üç yüzə **(312 b)** yaxın adam tövbə etdi. Əldəki şərabları tökdürdüm və Baba Dostun gətirdiyi şərablara da duz qoyub sirkə düzəltməyi əmr etdim.

Şərabların töküldüyü yerdə böyük bir vayin qazdırıldı. Bu vayini daşla hördürərək yanına imarət tikilməsinə qərar verdim. Doqquz yüz otuz beşinci ilin məhərrəm ayında [=sentyabr 1528] gedib Güvalyarı seyr edərək dönəndə Dulpurdan Sikriyə getmişdim və bu vayin də bitirilmişdi.

Daha əvvəl kafir Sankaya qalib gəlsəm, müsəlmanları damğa (gömrük) vergisindən azad etməyi qərara almışdım. Tövbə əsnasında Dərviş Mə-

[1] Hirman – məhrum olma, əl üzmə; qovulma.
[2] Qəzv – qəzavat, cahad.
[3] Cəzm – əhd.
[4] Dur – uzaq.
[5] Mənahi – mən edilən, yasaq olunan şeylər.
[6] Altunü nüqrə – qızıl və gümüş.
[7] Sürahiyü əyağ – şüşə və qədəh.
[8] *Saqqal buraxmaq:* kafirlərə qarşı səfərə çıxanda, qələbəyə qədər saç və ya saqqalın kəsilməyəcəyi barədə içilən and.

həmməd Sarvan ilə Şeyx Zeyn damğanı bağışlama vədini də xatırlatdılar. «Yaxşı xatırlatdınız» dedim və əlimizdə olan vilayətlərdəki müsəlmanlar damğa vergisindən azad edildi.

Katibləri çağırıb gerçəkləşən bu iki böyük hadisənin bildirilməsi üçün fərmanlar yazılmasını əmr etdim. Şeyx Zeynin inşası ilə fərmanlar yazılaraq bütün məmləkətə göndərildi. Bu inşa budur:

## ZƏHİRƏDDİN MƏHƏMMƏD BABURUN FƏRMANIDIR[1]

*Tövbə edənləri və təmizləri sevən tövbə qəbulediciyə həmd edirik. Günahkarlara doğru yolu göstərən və məğfirət istəyənlərin diləyini yerinə yetirən bağışlayıcıya şükr edirik. Xəlq olunmuşların ən xeyirlisi Məhəmmədə, alihi-teyyibinə və tahir əshabına Allahdan rəhmət diləyirik*[2].

Ağıl sahiblərinin, əsbabın surətlərinin məkəsi və sədaqət ilə doğruluq incilərinin məxzəni olan fikir aynaları bu fikrin parlaq cövhərlərinin **(313 a)** süsünü qəbul edəcəkdir, insanın təbiəti yaradılış icabı nəfsani ləzzətlərə maildir. Şübhəli şeylərə qarşı olan istəyi tərk etmək isə Allahın yardımına və səmavi bir dəstəyə bağlıdır. İnsan pisliyə meyl etməkdən uzaq deyildir.

*Nəfsimi təmizə çıxarmıram. Çünki nəfis daima pis şeyləri əmr edir*[3] və ondan saqınmaq yalnızca bağışlayıcı padşahın inayəti ilə mümkündür.

*Bu, Allahın dilədiyinə verəcəyi lütfdür. Allah böyük lütf sahibidir.*[4]

Bu yazını yazmaqdan və bu sözləri söyləməkdən murad budur:

İnsanlığın icabı, padşahlıq mərasimləri və gərəkli olan şeylərin yerinə yetirilməsi, şah və sipahilərdən mövqe sahiblərinin adətləri dolayısıyla insan gənclik anlarında bəzi günahlar işləyir və bir sıra boş işlərlə məşğul olur. Bir neçə gün sonra tamamən həsrət və peşmanlıq gəlincə, bütün bu işlənən günahlar bir-bir tərk edilir və dönüş qapısı saf bir tövbə ilə örtülürdü. Amma bu məqsəd yolunda istənilən şeylərin ən önəmlisi və hiss edilən ehtiyacların ən şiddətlisi olan şərab tövbəsi *«işlər vaxtlarına bağlıdır»* pərdəsi ilə örtülü qalmışdı.

Əskiksiz bir çalışma ilə cihad ehramını bağladığımız və islam əsaslı əsgərlə birlikdə kafirlərə qarşı savaşa girişdiyimiz bu uğurlu anlarda, gözlə görünməyənin verdiyi ilham sayəsində şübhədən arınmış çağırıçıdan gələn *İnananlar üçün hələ vaxt gəlmədimi ki, qəlbləri Allahın zikrinə və enən haqqa saygı duysun* [5] kimi incə sözü eşidərək, günah səbəblərini kökündən qazmaq üçün tam bir qeyrət göstərərək tövbə qapılarını çaldıq. Müqəddəs

[1] Bu fərmanın orijinalı farscadır.
[2] Bu abzas ərəbcədir. Özbək nəşrində ərəbcə verilmişdir.
[3] *Quran,* Yusif surəsi, 12:53.
[4] *Quran,* Hədid surəsi, 57:21.
[5] *Quran,* Hədid surəsi, 57:16.

köməyin bələdçi olan *bir qapını çalmaqda inad edən içəri girər* **(313 b)** sözünün gərəyincə iqbal qapısını açdı və bu cihada başlamaqla birlikdə nəfsə müxalifətdən ibarət olan ən böyük cihadı da əmr etdi. Qısaca desək, *Rəbbimiz, biz özümüzə zülm etdik*[1] ayəsini könüldən bağlılıq dilinə gətirərək, *Sən ulusan, sənə tövbə etdim, mən inananların ilkiyəm* [2] ilə könül lövhəsini süslədik. Könüldə gizli bir istək olan şərab tövbəsini niyyətdən əmələ keçirdik.

Zəfər ehtişamlı xadimələr sonu uğurlu olan bu hökm gərəyincə çoxluq və ziynət baxımından ulu səmanın ulduzlarına bənzəyən gözəl məclisin bəzəyi olan sürahiləri, qədəhləri, digər altın və gümüş alət və şüşələri şəriətin ucalığı üçün alçaqlığın və xor görmənin torpağına çarparaq –inşallah, qırmağı bacaracağımız bütlər kimi- parça-parça etdilər və hər bir parçasını da bir yoxsula və bir çarəsizə verdilər.

Bu qəbulu yaxın tövbənin uğuruyla yaxınlarımın çoxu *Xalq padşahının dinindədir* sözünə uyğun olaraq, eyni məclisdə tövbə şərəfinə çatıb şərab içmə həvəsindən tamamən vaz keçdilər. Beləcə saatdan-saata əmr və yasağa baş əyənlər bölük-bölük bu səadətə yetişdilər.

*Xeyrə yol göstərən xeyir işləyən kimidir* sözünə uyğun olaraq bu işlərin səvabının falı uğurlu olan nəvvabımızın padşahlığı zamanına aid olması və bu səadətin uğurluluğuyla fəthlərin və uğurun gündən-günə artması ümid edilməkdədir.

Bu niyyətin tamamlanmasının və bu əmniyyətin alınmasının ardından mühafizəmiz altındakı məmləkətlərdə -Allah buraları fəlakət **(314 a)** və bəlalardan qorusun- heç bir canlı fərdin şərab içməməsi, onu əldə etməyə çalışmaması, şərab düzəldib satmaması və dəxi satın almaması, götürüb gətirməməsi, hətta evində belə saxlamamasını və *Bunlardan qaçının ki, qurtuluşa çatasınız*[3] anlamını da ehiva edən aləmin boyun əydiyi fərman əmr edildi.

Bu fəthlərə təşəkkür və bu saf tövbənin qəbulunun sədəqəsi olaraq verilmək üzrə padşahın cömərtlik dənizi hərəkətə keçərək, cahanın abadlığına səbəb olan və adəmoğullarının üzünü ağardan lütf dalğaları ortaya çıxdı. Bütün məmləkətlərin, öncəki padşahların almaqda bir an belə gecikmədikləri həddən və hesabdan artıq vergilərini peyğəmbərlərin əfəndisinin yoluna zidd olduğu üçün müsəlmanlardan qaldırdı, heç bir şəhər, qəsəbə, yol, keçid, uğraq və limandan vergi alınmaması, bu əmrin qaydalarını dəyişdirmək və başqalaşdırmaq kimi qanunsuzluqlara yol verilməməsi xüsusunda *Kim eşitdikdən sonra vəsiyyətini dəyişdirsə, günahı onu dəyişdirənlərin boynunadır*[4] mənasını ehtiva edən fərman çıxdı.

Türk, tacik, tatar, ərəb, əcəm, hindu, fars sipahi, rəiyyət və bütün mil-

---

[1] *Quran,* Əraf surəsi, 7:23.
[2] *Quran,* Əraf surəsi, 7:143.
[3] *Quran,* Maidə surəsi, 5:90.
[4] *Quran,* Bəqərə surəsi, 2:181.

lətlər ilə padşahın lütfünün kölgəsində əmin olaraq yaşamaq istəyən adəmoğulları bu əbədi ümidə bel və ümid bağlayaraq əbədi dövlətin duasıyla məşğul olsunlar, bu hökmlərin gərəkdirdiyi şeylərdən ayrılmayıb başqa tərəfə sapmasınlar. Bu fərmanın gərəklərinə görə hərəkət edib hökmlərini yerinə yetirərək yüksək və şərəfli möhrünün olduğunu görüncə mütləq güvənsinlər.

Doqquz yüz otuz üçüncü ilin cəmadiyüləvvəl **(314 b)** ayının iyirmi dördündə [=26 fevral 1527] onun ulu əmri ilə yazıldı. Tanrı təala onu yüksəltsin və nüfuzunu əbədi qılsın».

## BABURUN ADAMLARINI CƏSARƏTLƏNDİRMƏSİ

O günlərdə, bəhs etdiyim kimi, meydana gələn olaylar üzündən böyüklərdə və kiçıklərdə sıxıntı və təlaş çox idi. Heç kimdən mərdanə bir söz, cəsur bir rəy eşidilmirdi. Hekayət deyən vəzirlərin və vilayət deyən əmirlərin nə sözləri mərdanə idi, nə tədbirləri, nə özləri himmət sahibi idi, nə təqrirləri. Amma Xəlifə bu səfər əsnasında da yaxşı hərəkət etdi, zəbt və istehkam xüsusunda qeyrət və diqqət göstərməkdə qüsur etmədi.

Elin belə cəsarətsizliyini və bu cür süstlüyünü görəndə, nəhayət, ağlıma bir tədbir gəldi. Bütün bəyləri və igidləri çağıraraq onlara dedim ki:

«Ey bəylər və igidlər!

Hər ki aməd be cahan, əhli-fəna xahəd bud,
An ki payəndeyi-baqist, xuda xahəd bud.
*Dünyaya gələn hər kəs əhli-fənadır, öləcək,*
*Qalan və əbədi olan yalnız Allahdır.*

Həyat məclisinə girən hər kəs axırda əcəl qədəhindən içəcəkdir, dirilik mənzilinə gələn hər kəs, nəhayət, dünya deyilən bu qəm evindən keçəcəkdir. Yaman adla yaşamaqdansa, yaxşı adla ölmək daha yaxşıdır.

Bə nami nikü gər bemirəm rəvast,
Məra nam bayəd ki tən mərgrast[1].
*Yaxşı adla ölsəm, mənə yetər,*
*Mənə nam lazımdır, çünki tən ölərgidir.*

Tanrı təala bizə elə bir səadət nəsib etmiş və elə bir dövlət vermişdir ki, ölən şəhid və öldürən qazidir. Hamımızın Allahın kəlamıyla **(315 a)** and içməmiz lazımdırı, heç kimsə bu savaşdan üz çevirməyi düşünməsin və canı bədənindən ayrılıncaya qədər bu döyüşdən ayrılmasın».

Bəylərin və nökərlərin, böyüklərin və kiçıklərin hamısı bu sözlərimə sayğı göstərib əllərinə Quranı alaraq bu şəkildə and içib yəmin etdilər. Gözəl bir tədbir idi. Yaxından və uzaqdan, dostların və düşmənin görməsi və eşitməsi üçün yaxşı oldu.

---

[1] *Şahnamə* əsərindən.

## HƏR TƏRƏFDƏ FİTNƏ VƏ FƏSAD ÇIXIR

O günlərdə hər tərəfdə fitnə və fəsad hakim idi. Hüseyn xan Nuhani gəlib Rabirini zəbt etdi. Qütb xan Sərvaninin adamı Çəndvarı aldı. Rüstəm xan deyilən bir hərif Miyan-Duabdakı oxçuları toplayaraq gəlib Külü aldı və Kiçık Əlini əsir etdi. Zahid Xoca Sənbəli buraxıb çıxdı. Sultan Məhəmməd Dulday Kanucu buraxıb qayıtdı. Güvalyarlı kafirlər gəlib Güvalyarı mühasirə etdilər. Güvalyara yardıma göndərilmiş olan Aləm xan da oraya getmədən öz vilayətinə getdi.

Hər gün hər tərəfdən yaman bir xəbər gəlirdi. Bəzi hindistanlılar əsgərlikdən qaçmağa başladılar. Heybət xan Görkəndaz qaçıb Sənbələ getdi, Həsən xan Barival qaçıb kafirlərin tərəfinə keçdi.

Bunlara baxmayaraq irəliləməyə davam etdik, arabalar, təkərli səhpalar və hazırlanmış digər texnika ilə birlikdə çərşənbə axşamı günü, **(315 b)** cəmadiyülaxır ayının doqquzunda [=13 mart] Novruz günü hərəkətə keçdik.

Sağ qol, sol qol və mərkəz səflərini nizamlayıb önümüzə arabaları və təkərli səhpaları aldıq, bunların arxasında da bütün tüfəngəndazlara Ustad Əliqulu başçı təyin edildi. Piyadalar bir-birlərindən ayrılmadan arabaların arxasında səf halında yürüməli idilər.

Səflər öz yerlərinin aldıqdan sonra bütün səflərə doğru sürətlə at çapıb sağ və sol qollar və mərkəzdəki bəylərə, igidlərə və sipahilərə yetişərək onlara cəsarət verdım, hər bölüyün harada duracağını, nə şəkildə yürüyəcəyini göstərib vəzifələrini bildirərək, bu nizam və cərgə ilə bir küruh qədər məsafə gət edib düşərgə saldıq.

Kafirlər də bu durumdan xəbərdar olaraq bölük-bölük düzənlənmiş bir şəkildə qarşı tərəfdən gəldilər.

Düşərgə saldıqdan sonra ordugah və ordugahın önü arabalarla və xəndəklərlə dəstəklənib qorunaqlı bir hala gətirildi.

O gün savaşmaq niyyətimiz olmadığı üçün bir dəstə igid irəli gedib düşmənla çarpışaraq bəxtini sınadı. Bir neçə kafiri ələ keçirib başlarını kəsib gətirdilər. Məlik Qasım [Baba-Qaşqa] da bir neçə baş kəsib gətirdi. Məlik Qasım yaxşı hərəkət etmişdi, beləcə əsgərin mənəviyyatı çox yüksəldi və özünə inamı qüvvətləndi.

Orduda ruh yüksəkliyi yarandı. Ertəsi sabah qalxıb savaşmağı düşünürdük. Lakin Xəlifə və digər sadiq dostlar **(316 a)** gediləcək yurd yaxın olduğu üçün əvvəlcə oranı xəndəklərlə qorunaqlı bir hala gətirdikdən sonra getməyin daha doğru olacağını bildirdilər. Xəndək işi üçün Xəlifə oraya gedib xəndək yerlərini istehkamçılara göstərərək çavuşlar təyin edib gəldi.

## RANA SANKA İLƏ KANVA SAVAŞI

Şənbə günü, cəmadiyülaxır ayının on üçündə [=17 mart] arabaları önümüzdən çəkdirərək sağ və sol qollarla mərkəzimiz bir küruha yaxın məsafəni səf halında yürüyüb müəyyən edilmiş yurda endik. Bəzi çadırlar qurulmuş və bəziləri də qurulmaqda ikən düşmən səflərinin göründüyü xəbərini gətirdilər. Dərhal atlara minilib sağ və sol qolların öz yerlərinə gedərək arabalarla səfləri yaradıb düzənləmələri əmr edildi.

İslam əsgərinin vəziyyəti və kafirlər sürüsünün özəllikləri, səflərin vəziyyəti və müsəlmanlarla kafirlərin savaşının tamamən bilinməsi üçün Şeyx Zeyn tərəfindən qələmə alınan bu fəthnamə eynən buraya alındı.

## ZAHİRƏDDİN MƏHƏMMƏD BABUR QAZİNİN FƏRMANIDIR

*Hər cür həmd vədinə sadiq, quluna köməkçi olub və əsgərinə arxa çıxaraq düşmənlərini təkbaşına aşağılayan və hər şeyin onun sayəsində ayaqda durduğu Allaha məxsusdur. Doğru yola girmiş vəlilərinin yardımıyla islamın sütunlarını yüksəldən, bütlərin ayaqlarını asi* **(316 b)** *düşmənlərini qəhr edərək alçaldan, zülm edənlərin kökünü qıran Allahım, yardım səndəndir. Aləmlərin rəbbi Allaha həmd olsun!*[1]

*Allahın səlat və səlamı qiyamətə qədər yaratdıqlarının ən xeyirlisi, qazilərin və cihad savaşçılarının əfəndisi Məhəmmədin, soyunun və yol göstərici əshabının üzərinə olsun.*

Allahın nemətərinin danışılaraq ağızdan-ağıza yayılması şükür və öygüsünün çoxaldılmasına səbəb olur. Şükür və öygüsünün çoxaldılması da nemətərinin danışılaraq ağızdan-ağıza yayımasını labüd edir. Hər bir nemət bir şükrü vacib qılır və hər bir şükürdən sonra da bir nemət qərarlaşdırılmışdır. Lakin şükrün vacib qıldığı şeyləri yerinə yetirmək insanın qüdrətinin dışındadır, iqdidar sahibləri onun mərasimini yerinə yetirməkdən acizdirlər. Özəlliklə də bir nemətə qarşılıq verilməsi lazım gələn şükrdən böyük dünyada nə bir dövlət var, nə də axirətdə ondan böyük bir xoşbəxtlik görünür. Bax, bu nemət *Onlar kafirlər, haqdan sapanlardır*[2] ayetində söyləndiyi kimi, əmsalları haqqında nazil olan kafirlərin qüvvətliləri üstündə üstünlük tapmaq və günahkar zənginləri istila etməkdən başqa bir şey deyildir. Ağıl sahiblərinin dəlib keçən düşüncələrində bundan daha gözəl bir xoşbəxtlik görülə bilməz. Minnət Allahadır ki, bu böyük səadət və ulu ehsan beşikdən bu vaxta qədər xeyir düşünən qəlbin və doğru hökm edən ağlın soylu istəyi və yeganə məqsədidir.

Bu mübarək günlərdə hər şeyi bilən padşahın xeyirxahlığı üz göstərdi.

---

[1] *Quran,* Ənam surəsi, 6:45. Farsca olan fərmanın kursivlə verilən qismi ərəbcədir.
[2] *Quran,* Abəsə surəsi, 80:42.

Minnətsiz nemət qapılarını açan və illətsiz bilgi bəxş edən Allah bilgi qapılarının fəthinin açarıyla böyüklüyü uğurun sığındığı nəvvabımızın əməllərinə açdı. Gülərüzlülük sahibi qövmümüzün məşhur isimlərini kərəm sahibi qazilərin dəftərinə keçirdi. İslamın bayrağı zəfər sahibi əsgərlərimizin yardımıyla **(317a)** ucalığın zirvəsinə çatdı.

Bu dövlətin ortaya çıxımasın və bu xoşbəxtliyin gerçəkləşməsi belə olmuşdur: islamiyyəti qoruyan əsgərlərimizin qılınclarının işıqları Hindistan məmləkətlərini fəth etməsi və zəfər nurlarının işıqlarıyla -əvvəlki fethnamələrdə yazıldığı kimi- aydınladtılmış qılınca, müqəddəs yardım, zəfər nişanəsi olan bayraqlarımızı Dehli, Aqra, Cunpur, Harid, Behar v.s. məmləkətlərində dalğalandırdı. Müsəlman və kafir olan qövimlərin böyük hissəsi gələcəyi qutlu nəvvabımıza itaət edib baş əyməyi seçərək doğruluq və səmimiyyət addımlarıyla qulluq yolunu tutdular. Lakin daha əvvəl uğurlu nəvvabımıza itaət etməkdən dəm vuran (Rana Sanka) kafiri indi *Dirəndi, kibrləndi, nankorlardan oldu*[1] sözünə uyğun olaraq iş işləyib şeytan kimi baş qaldırdı. Zamanə əsgərinin komandanı və tərk edilmiş orduların bələdçisi halına gələrək bəzilərinin gərdanlarında lənət boyunduruğu olan zünnarı, bəzilərinin də ətəklərində islam dinindən ayrılma kədərinin tikanı olan güruhların bir araya toplanmasına səbəb oldu.

O məlun kafirin -qiyamət günündə rəzil olsun- Hindistan vilayətindəki istilası o dərəcəyə vardı ki, padşahlıq dövləti günəşinin doğmasından və şahlar şahı xəlifəliyi nurunun parlamasından əvvəl bu vuruşmada onun fərmanına boyun əyən əsl racələr, raylar bu müharibədə hökmü altında bulunub islam dinindən ayrılaraq din dəyişdirən hakim, **(317 b)** rəhbər və böyüklər onu göz önündə tutub heç bir müharibədə ona baş əyməmiş və bəlkə də uzlaşmamışlar, heç bir səfərdə onun söhbət və arxadaşlığı yolunu tutmamışlar.

Bu geniş diyarın, Dehli sultanı, Qucerat sultanı, Mandu sultanı vəsair bütün sultanları, digər kafirlərin aralarında bir uzlaşma olmadığı üçün o pis gedişli adama müqavimət etməkdən aciz qalmışlar və dürlü-dürlü hiylələri ilə üzə gülərək dost kimi görünürlər. Dinsizliyin bayrağı təxminən iki yüz islam şəhərində dalğalanmışdı. Tapınaqları və məscidləri təxrib edərək, o şəhər və məmləkətlərin müsəlmanlarının uşaqlarını və qadınlarını əsir etmişdi. Qüdrəti və qüvvəti o dərəcəyə varmışdı ki, hindin davam edib gələn və bir lek gəliri olan vilayəti yüz atlı, bir kürуru isə on min atlı olaraq saymaqdan ibarət olan qaydası göz önünə alındıqda bu kafir başbuğu hərifin ələ keçirdiyi məmləkəti on kürura çatmışdı, bu da bir lek [yüz min] süvarilik yer edir. Bu zamana gəldiyində isə daha öncə heç bir savaşda ona yardım etməyən məşhur kafirlərin çoxu islam əsgərinə olan düşmənlikləri üzündən bu kafirin işləri-gücləri qldurluq olan əsgərinə qoşuldular.

İş o dərəcəyə vardı ki, on müstəqil hakim hər biri dikbaşlılıq dava-

[1] *Quran,* Bəqəra surəsi, 2:34.

sında bulundular və hər biri bir qitədə kafir kütlələrindən birinə komandan olaraq o pis huylu kafirə xalxal və zəncir kimi yapışdılar. **(318 a)** Əşəreyi-mübəşşirənin[1] tərsinə, quldurluğu artıran, *Onlara acı bir əzabı müjdələ*[2] bayrağını çəkən bu on kafir izdihamlı qullara, əsgərlərə və geniş pərgənələrə sahibdilər.

Bunlardan Səlahəddin otuz min süvarinin başbuğuydu. Ravəl Udi Sing Bageri on iki min, Midni Rav on iki min, Həsən xan Mivati on iki min, Barməl İdəri dörd min, Nərpət Harə yeddi min, Sətərvi Keçi altı min, Dirim-Div dörd min, Bir-Sing Div dörd min atlıya sahibdilər. Sultan İskəndərin oğlu Mahmud xan da vilayət və pərgənəsi olmamasına baxmayaraq sərdarlıq ümidiylə təxminən on min atlı yığmışdı. Bu səlamət və əmniyyət vadisindən ayrılmış olanların cəmi hind vilayət və pərgənə qaydasına görə iki lek və min atlı idi [ikiyüz bir mini].

Nəticə olaraq, iç üzündə məğrur və görünüşdə kor olan bu kafir, günləri qara kafirlərin qisvətli gönüllərini *Bir-biri üstünə yığılmış qaranlıqlar*[3] kimi birbirlərinə bağlayıb müxalifet edərək və insanların əfəndisinin –Allahın salat və səlamı üzərinə olsun- şəriətinin təməlini yıxmağı qəsd edərək müsəlmanlarla savaşmağa gəldi.

Padşahın din üçün savaşan savaşçıları Allahın yazğısı kimi o tək gözlü dəccalın[4] başına üşüşərək, *Qəza gəlincə, göz kor olur* cümləsini bəsirət sahiblərinin nəzərlərinə ərz etdilər və *Kim cihad edərsə, ancaq öz yararına cihad edər*[5] **(318 b)** ayətini göz önündə tutaraq, itaət edilməsi gərəkli olan *Kafirlərə və münafiqlərə qarşı cihad et*[6] hökmünü tətbiq etdilər. Doqquz yüz otuz üçünca ilin cəmadiyülaxır ayının on üçüncü şənbə günü [=17 mart 1527] -ki, Allah şənbə günlərinizi mübarək etmişdir, o günün mübarəkliyinin bir nişanəsidir- Biyanəyə bağlı olan Kanva mövqeyi civarında olan və iki tərəfi din düşmənləriylə dolu olan dağlıq ərazi əncamları uğur olan islam əsgərlərinin çadır qurduqları yer oldu. İslam əsgərinin ululuğu və ehtişamı din düşmənlərinin və məlun kafirlərin qulağına çatanda isə əshabi-fil[7] kimi

---

[1] *Əşəreyi-mübəşşirə:* cənnətlik olduqlan sağlıqlarında özlərinə peyğəmbərimiz tərəfindən müjdələnən on adam: hz. Əbubəkr, hz. Ömər, hz. Osman, hz. Əli, hz. Talha, hz. Zübeyr, Əbdürrəhman bin Övf, Əbu Übeydə bin Cərrah, Səid bin Zeyd, Səd bin Əbu Vəqqas.

[2] *Quran,* Ali-İmran surəsi, 3:21.

[3] *Quran,* Nur surəsi, 24:40.

[4] Rana Sankanın taygöz olmasına işarə edilir. Rananın bir gözü kor idi.

[5] *Quran,* Ənqəbud surəsi, 29:6.

[6] *Quran,* Tövbə surəsi, 9:73.

[7] *Əshabi-fil:* fil sahibləri. Həbəşistan kralı Nəcaşi Əshamə tərəfindən Yəmənə hökmdar təyin edilən Əbrəhə bin Səbbah-ül-Əşrəm və ordusu fil sahibləridir. Ziyarətçiləri Kəbə yerinə öz bölgəsinə çevirmək istəyən Əbrəhə Sənada Qülleys deyilən bir kilsə tikdirir. Kinanə qəbiləsindən bir adam isə bir gecə bu kilisəyə təcavüz və həqarətdə bulunur. Bundan qəzəblənən Əbrəhə Kəbəni yıxmağa and içir və ordusuyla birlikdə Məkkəyə gəlir.

Yanında ən qüvvətlisi Mahmud adını daşıyan bir sürü fil varmış. Əbrəhə bu fillərlə Kə-

əhli-islamm Kəbəsini yıxmaq istəyən, Məhəmməd ümmətinin müxalifləri dağ görünüşlü, ifritə üzlü filləri özlərinə sipər etdilər.Hamısı də müttəfiq və yekdil olaraq, işləri quldurluq olan əsgərlərini bölük-bölük ayırdılar.

Bə an filha hinduvani zəlil,
Şodənd qürrə manəndi «əshabi-fil».

Çü şami-əcəl cümlə məkruhu şum,
Siyahtər zi şəb, biştər əz nücum.

Həmə həmçü atəş, vəlekin çü dud,
Kəşidə sər əz kin bə çərxi kəbud,

Çü mür amədənd əz yəminü yəsar,
Süvarü piyadə həzəran həzar.

*Bu aşağılıq, zəlil hindular*
*Əshabi-fil kimi məğrur oldular.*

*Hamısı əcəl gecəsi kimi ikrah doğurur,*
*Gecədən qara, ulduzdan çoxdular.*

*Hamısı atəş kimiydi, duman kimi,*
*Başlarını mavi göy üzünə qaldırdılar.*

*Qarışqa kimi sağdan və soldan,*
*Atlı və piyada min-min saldırdılar.*

Üzlərini vuruşmaq və savaşmaq niyyətilə şüarı qələbə olan orduya çevirdilər. İgidlik bağının ağacları olan islam qaziləri şam fıstığı ağacları kimi səflər bağlayaraq **(319 a)** günəş kimi parlayan sanəvbər heybətli nizələrini Allah yoluna cihad edənlərin qəlbləri kimi yüksəkliyin zirvəsinə çıxardılar. İskəndərin səddi kimi dəmir rəngli bir səf və peyğəmbərin şəriətinin yolu kimi doğruluq və əminlik baxımından dayanıqlı bir sığınaq meydana gətirdilər.

*Öz yolunda kənətlənmiş binalar kimi*[1] bunun möhkəmliyinə bir işarə, qurtuluş və zəfər, *Onlar rəblərinin inayətiylə hidayət üzrə olub fəlah bulmuşların ta özləriydi*[2] gərəyincə, o xalqa xas bir sifətdir.

Qitə:

---

bəyə doğru getmək istədikdə heyvanlar diz çöküb hərəkətsiz qalır, başqa səmtlərə yönəldildikdə isə qaçaraq gedirdilər. Allah Əbrəhənin ordusunun və fillərinin təpəsinə sürülərlə quşlar göndərib hamısını öldürdü. Hz. Məhəmmədin bu hadisənin baş verdiyi il içində doğulması bu ilə "fil ili" adının verilməsinə səbəb olmuşdur.

[1] *Quran,* Səf surəsi, 61:4.

[2] *Quran,* Bəqərə surəsi, 2:5.

Dər an rəxnə ni əz təbayü vəhim,
Çü rəyi şahənşahü dini-qəvim.
Ələmhayi u fərşi fərşa həmə,
Əlifhayi «İnnə fətəhna»[1] həmə.

*Bu səfdə nə rəxnə, nə qorxu var,*
*Çünkü şahlar şahı qərarlı və din kimi güvənlidir.*
*Onun səmanı süpürən bayraqları*
*İnnə fətəhnanın əlifləridir.*

Nəhayət, tədbirli davranmağı göz önünə alaraq, rum qaziləri kimi, ordunun önündə olan tüfəngçi və radəndazları[2] qoruması üçün arabalarla bir sıra yaradılaraq bir-birlərinə zəncirlə bağlandı. Nəticədə islam əsgərləri elə bir nizam və güclü sipərlər yaratdılar ki, qoca ağıl və çərxi-əsr bunun tədbirini alan və nizamlayan kişiyə afərin oxudu. Bu nizam, güclü sipərlər, möhkəmlik və düzgünlük xüsusunda o sultanın yaxınlarından və dövləti-xaqaniyyənin dayağı Nizaməddin Əli Xəlifə xeyli çalışqanlıq və bacarıq göstərdi, gördüyü bütün tədbirlər təqdirə layiqdi, rəisliyi və uğurları da parlaq ağlın zövqünə uyğun idi.

Padşahın ali məqamı mərkəzdə idi. **(319 b)**

Mərkəzin sağında izzətli, yetkin, bəxtiyavər bəradər və hər kəsin yardımını istədiyi padşahın qarşılıq gözləmədən göstərdiyi sevgiylə sivrilən Çin Teymur Sultan, izzətli, rəşid, Allahü təalanın təvəccüh nəzərinə məzhər olan məxdum Süleyman şah [Baburun dayısının nəvəsi], hidayətin sığınağı və vəliliyin müntəsibi Xoca Kəmaləddin Dost Xavənd, səltənəti-aliyyənin dayağı və padşahın sarayının əmini, ixtisas sahiblərinin ən seçkini və xas yaxın Camaləddin Yunus Əli, xasların dəstəyi və ixtisası tam Cəlaləddin şah Mansur Barlas, xasların dəstəyi və ixtisas sahiblərinin ən seçkini Nizaməddin Dərviş Məhəmməd Sarban; xasların dəstəyi və sevgisi həqiqi Şəhabəddin Abdullah Kitabdar və Nizaməddin Dost eşik-ağa yerlərini almışdılar.

Mərkəzin solunda isə səltənətin sığınağı, xilafətin müntəsibi və hər kəsin yardımını istədiyi padşahın qarşılıq gözləmədən göstərdiyi sevgiylə sivrilən Sultan Bəhlul Ludi oğlu Sultan Əlaəddin Aləm xan, müşarünileyh sultan həzrətlərinin yaxını, insanlar arasındakı vəzirlərin ən böyüyü, xalqın sığınağı və islamiyyətin qüvvətləndirəni Şeyx Zeyn Hafi, müşarünileyh sultan həzrətlərinin yaxınının oğlu, xasların dəstəyi və səmimiyyəti tam Kəmaləddin Mühib Əli, mərhum Qoç Əhmədin qardaşı və xasların dəstəyi Nizaməddin Turdu bəy, **(320 a)** böyüklərin və irəli gələnlərin dəstəyi və mərhum Qoç bəyin oğlu Arayiş xan, millətlər arasındakı vəzirlərin böyüyü və arslan

[1] *İnna fətəhna:* «bizlər fatehlərik" cümləsi bayraq dirəkləri kimi dimdik yüksələn əliflərlə başlayır və bitir mənasındadır.

[2] *Radəndaz:* savaşda yüksək nəslə nərə çəkib düşməni vahiməyə salan dəstə.

qıran Qoca Kəmaləddin Hüseyn və divan məmurlarının bir qismi müəyyənləşdirilmiş yerlərinə yerləşmişdilər.

Sağ qanadda isə bəxtiyavər, səadət sahibi, arzularına çatmış, yaradıcı Allahın inayət nəzərinə məzhər, səltənət və arzu bürcünün ulduzu, hökmdarlıq və xilafət səmasının günəşi, kölələrin və hürlərin lisanıyla mədh edilmiş, səltənət və xilafətin əziz qıldığı, yetkin məxdum Məhəmməd Hümayun Bahadır yer almışdı.

Onun səadətə yaxın olan sağında isə səltənət sığınağı həzrətlərinin məxdumu və mükafatlar bəxş edən padşahın qarşılıq gözləmədən göstərdiyi sevgiylə sivrilən Qasım Hüseyn Sultan, xasların dəstəyi Nizaməddin Əhməd Yusif Oğlaqçı, mülkün dayağı, sevgisi tam Cəlaləddin Hindu bəy Koçin, mülkün dayağı, sevgisində sadiq Cəlaləddin Xosrov Göyəldaş, mülkün dayağı Qıvam bəy Orduşah, xasların güvənəcəyi kişi, bağlılığı və sevgisi kamil Vəli Xəzinə[çi] Qaraquzu, xasların dəstəyi Nizaməddin Pirqulu Sistani, millətlər arasındakı vəzirlərin dəstəyi Xoca Kəmaləddin Pəhlivan Bədəxşi, xasların dayağı Nizaməddin Əbdüşşükur, əyanların dəstəyi, İraq elçisi Süleyman ağa ilə **(320 b)** Sistan elçisi Hüseyn ağa bulunurdular.

Onun zəfərlə dolu olan soluna isə müşarünileyhin istək sahibi oğlu, səltənətin sığınağı, alicənab və həzrəti-mürtəzaya müntəsib Mir Həmə, xasların dirəyi və ixtisası kamil Şəmsəddin Məhəmmədi Göyəldaş ilə Nizaməddin Hacəgi Əsəd Candar təyin edilmişdilər.

Sağ qanaddakı hind əmirləri arasında mülkün dəstəyi, xanlar xanı Dilavər xan, əyanların dəstəyi Məlikdad Kərkərani və əyanların dayağı, şeyxlər şeyxi Şeyx Gürən də özlərinə fərman buyurulan yerlərini almışdılar.

Şüarı islamiyyət olan ordunun sol qanadında isə mövqeyi uca, naqibliyin sığınağı, yüksəkliyin dəstəyi, Təha və Yasin ailəsinin iftixar qaynağı, rəsullar əfəndisinin oğullarının örnəyi Seyid Mehdi Xoca, kam sahibi, əziz, yetkin və xaliq həzrətlərinin inayət nəzərlərinə məzhər olmuş bəradər Məhəmməd Sultan Mirzə, səltənətin sığınağı, xilafətə müntəsib və özündən yardım istənilən padşahın qarşılıq gözləmədən göstərdiyi sevgiyə məzhər olan Mehdi Sultan oğlu Adil Sultan, mülkün dayağı və sevgisi kamil Müizzəddin Əbdüləziz Miraxur, mülkün dayağı Şəmsəddin Məhəmməd Əli Cəng-Cəng; xasların dayağı və sevgisi kamil Cəlaləddin Qutlu-Qədəm Qaravul, xasların dayağı və sevgisi kamil Cəlaləddin şah Hüseyn Yarəgi, Moğol Qançı və Nizaməddin Can Məhəmməd bəy-atəkə səf bağlamışdılar.

Sol qanadda olan hind əmirləri arasında sultanların nəsli və məzkur Sultan Əlaəddinin oğullarından Kamal xan və Cəlal xan **(32l a)**, əyanların dayağı Əli xan Şeyxzadə Fərmüli, əyanların dayanı Nizam xan Biyanə təyin edilmişdilər.

Ehtiyat qüvvələri olaraq da xasların dayağı və sevgisi Kamil Turdukə və Baba-Qaşqanın qardaşı Məlik Qasım Baba-Qaşqa bir dəstə moğolla sağ

qanada, xasların dayağı, sevgisi həqiqi Mömin Atəkə ilə xasların dayağı Rüstəm Türkmən də bir dəstə xas mühafizlə birlikdə sol qanada göndərildilər.

İxtisas sahiblərinin seçkini, xasların dəstəyi və ixtisası kamil Nizaməddin Sultan Məhəmməd Bəxşi islam qazilərinin irəli gələnlərini və rəislərini qərarlaşdırılmış yerlərinə və mövqelərinə yerləşdirmişdi və özü də veriləcək əmrlərimizi eşitmək üçün hazır durur, tavaçı və yasavulları[1] ətrafa və yanlara göndərərək piyadaların və süvarilərin nizamı və idarəolunması barədəki itaət edilməsi qəti olan əmrlərimizi böyük sultanlara, kərim əmirlərə və digər ehtiram sahibi qazilərə çatdırırdı.

Ordunun təməl dirəkləri dikilib hər kəs öz yerinə qoşunca, heç kimin olduğu yerdən qımıldanmaması və izinsiz bir şəkildə müharibəyə başlamaması barədə əməl və itaət edilməsi şərt olan bir fərman çıxarıldı.

Bəhs etdiyim o gündən bir pas keçmişdi ki, qarşılıqlı iki firqə qarşı-qarşıya gələrək savaşmağa və vuruşmağa başladı. İki tərəfin əsgərlərinin mərkəzləri **(321 b)** işıq və qaranlıq kimi qarşı-qarşıya gəlmiş bir vəziyyətdə ikən sağ və sol qanadlarda elə böyük bir boğuşma başladı ki, yeri zəlzələ, uca göyü də bir vəlvələ bürüdü.

Əsərləri quldurluq olan kafirlərin sol qanadı şüarı islamiyyət olan əsgərlərin meymənət örtülü sağ qanadının üstünə yürüyüncə başda Xosrov Göyəldaş və Baba-Qaşqanın qardaşı Məlik Qasım olmaq üzrə irəliyə həmlə etdilər. Əziz qardaş Çin Teymur Sultan fərmana uyğun olaraq onların yardımına qoşaraq cəsuranə döyüşməyə başladı və kafirləri yerlərindən qoparıb mərkəzlərinə qədər sürdü. Bu əziz bəradərə gərəkli mükafat verildi.

Əsrimizin yeganəsi Mustafa Rumi isə arabaları -əmr edən və yasaqlayan padşahın inayət nəzərlərinə məzhər olmuş əziz və kam sahibi oğlu-Məhəmməd Hümayun Bahadırın mərkəzindən irəli sürərək, kafir əsgərinin səflərini tüfəng və zərbzənlərlə öz qəlbləri kimi qırmışdı. Savaş zamanı əziz və rəşid bəradər Qasım Hüseyn Sultan, xasların dəstəyi Nizaməddin Əhməd Yusif və Qivam bəy Orduşah da əmr alaraq onların yardımına qoşdular.

Kafir bölükləri də zaman-zaman və arxa-arxaya öz adamlarının yardımına gəlirdilər. Biz də mülkün dayağı Cəlaləddin Hindu bəyi, onun arxasından xasların dəstəyi Məhəmmədi Göyəldaşı, Hacəgi Əsəd Candarı, ondan sonra da **(322 a)** ulu sultanın dayağı, yüksək eşiyin güvənilən kişisi və xas yaxınlardan Cəmaləddin Yunus Əlini, xasların dayağı və sevgisi tam Cəlaləddin şah Mansur Barlası, xasların dəstəyi Şəhabəddin Abdullah Kitabdarı, onların arxasından xasların dəstəyi Dost eşik-ağa və Şəmsəddin Məhəmməd Xəlil axta-bəyini yardıma göndərdik.

Kafirlərin sağ qanadındakılar islam əsgərinin sol qanadının üstünə təkrar-təkrar hücum etdilər və özlərini salamat olmuş qazilərə çatdırdılar. Lakin

[1] *Yasavul:* yasaqçı, mühafizə məmuru, səflərin nizamını təmin edən zabit.

hər həmlələrində böyük qazilər nəticəsi zəfər olan oxlarının yarasıyla onların bir qismini *Yanacaqları cəhənnəmə (götürdülər). Nə pis bir yerdir* o[1], hüsran evinə göndərib bir qismini da qaçırdılar.

Belə olduqda xasların dayağı Mömin Atəkə və Rüstəm Türkmən də quldurluğun sığınağı olan kafirlərin qaranlığın dəzgahı olan əsgərlərinin arxasından hücum etdilər. Xasların dayağı, sevgisi həqiqi və nökərlərin başı Xoca Mahmud Əli Atəkə və sultan həzrətlərinin yaxını, dövlətin dayağı Nizaməddin Xəlifəni də onların yardımına göndərdik.

Əziz və rəşid qardaş Məhəmməd Sultan Mirzə, səltənətin sığınağı Adil Sultan, mülkün dayağı Müizzəddin Əbdüləziz Miraxur, Cəlaləddin Qutlu-Qədəm Qaravul, Şəmsəddin Məhəmməd Əli Cəng-Cəng və xasların dəstəyi Şah Hüseyn Yarəgi və Moğol Qançı da inamla savaşa girdilər. Millətlər arasındakı vəzirlərin ən böyüyü Xoca Kəmaləddin Hüseyni divanilərdən **(322 b)** bir dəstə ilə birlikdə onlara yardıma göndərdik.

Bütün cihad əhli ən yüksək səy və qeyrətlə vuruşmağa rəğbət göstərərək *De ki: «Bizə yalnız iki yaxşılıqdan (ya qazilik, ya da şəhidlik) birini gözətmirsinizmi?»*[2] ayəti-kərimısini göz önündə tutdular. Canlarını fəda etməyi gözə alaraq, can alma bayrağını yüksəltdilər.

Savaş və vuruşma uzanınca arabaların arxasında zəncirlənmiş aslanlar kimi duran, padşahın xassə əsgərlərindəki müharib igidlərin və birlik ormanı aslanlarının mərkəzin sağ və solundan dışarı çıxmalarına və tüfəngçiləri ortaya alaraq savaşa girmələrinə dair müvafiq fərman çıxarıldı. Bunlar da dan yeri ağarmasının üfüqdə üz göstərişi kimi arabaların arxasından dışarı cumdular. Meymənətsiz kafirlərin şəfəq rəngli qanlarını dönən göy üzünə bənzəyən savaş meydanına tökərək neçə itaətsizin başlarını ulduz kimi vücud göyündən ayırdılar.

Adamlarıyla birlikdə mərkəzin önündə duran əsrin nadir şəxsiyyəti Ustad Əliqulu da igidliklər göstərərək kafirlərin dəmir qapılı hasara bənzəyən səflərinə elə ağır daşlar atırdı ki, o daşların birini əməllər tərəzisinin bir gözünə qoysalar sahibi *Kimlərin (əməllərinin) çəkisi ağır gəlsə, onlar xilas olanlardır*[3] sirrinə məzhər olardı və ya daşları mətanətli və uca bir dağa atsa, *...atılmış rəngli yun kimi...*[4] onu sovurardı. Daş, tüfəng və zərbzən ataraq kafir cəsədlərinin binalarından çoxunu yıxdı. **(323 a)**

Mərkəz tüfəngçiləri də fərmana uyğun arabalardan ayrılaraq döyüş meydanına girib hər biri bir çox kafirə ölüm zəhəri daddırdı. Piyada olaraq böyük təhlükə məhəllinə gəlib adlarını qəhrəmanlıq ormanı aslanları və igidlik meydanı qəhrəmanları arasında göstərdilər.

---

[1] *Quran,* İbrahim surəsi, 14:29.
[2] *Quran,* Tövbə surəsi, 9:52.
[3] *Quran,* Möminin surəsi, 23:102.
[4] *Quran,* Qəariyyə surəsi, 101:5.

Bu əsnada xaqan həzrətlərinin mərkəzdəki arabaların irəli sürülməsini əmr edən fərmanı çıxarıldı. Şəxsən padşah sağında fəth və dövlət, solunda tale və uğur olduğu halda kafir əsgərinə doğru irəlilədi.

Zəfər mənqibəli ordu bunu görüncə şüarı qələbə olan əsgərin yaratdığı coşqun dəniz böyük bir dalğalanma göstərərək bu dənizin timsahlarının ürəkliliyini düşüncədən əmələ keçirdi. Toz bir sis halında bütün savaş meydanını qara bir bulud kimi tutdu. Kəsici qılıncların parıltısının şimşəyi ildırım parlamasını keçdi. Qalxan toz günəşin üzünü eynən bir aynanın arxası kimi işıqdan məhrum elədi. Qalib və məğlub, vuran və vurulan bir-birinə qarışaraq fərqlər gözə görünməz oldu. Zamanın sehrbazı gözlər önünə elə bir gecə gətirdi ki, hərəkətli səyyarələr oxdan, hərəkətsiz ulduzlar isə atların ayaqlarından qopan qığılcımdan başqa bir şey deyildi.

Füru rəftü bər rəft ruzi nəbərd,
Nəmi xun bə mahiyu bər mah gərd,

Zi sümmi süturan dər an nahi dəşt,
Zəmin şeş şodü asiman gəşt xəşt.

*Müharibə günü qan balığa çatdı,*
*Toz isə aya qədər yüksəldi.* **(323 b)**

*O geniş meydanda atların toynaqlarından*
*Yer altı qat oldu, göy isə səkkiz qat.*[1]

Baş və can oynatmaqda olan qazi mücahitlər görünməyən çağırıçıdan gələn *Süstləşməyin, üzülməyin, əgər inanırsınızsa, mütləq siz üstün gələcəksiniz*[2] müjdəsini eşidib gözə görünməyənin xəbərcisindən *Allahdan bir zəfər və yaxın bir fəth (var)... Möminləri müjdələ*[3] müjdəsini dinləyirdilər. O dərəcədə şövqlə savaşırdılar ki, yüksək ruhların qütsilərindən qulaqlarına əhsən sədaları gəlir və Allaha yaxın olan mələklər başlarının üstündə pərvanələr kimi dönürdülər. İki namaz arasında savaşın atəşi o dərəcə tutuşdu ki, alovları göklərə doğru yüksəldi. İslam əsgərinin sağ və sol qanadları sonları bərbad kafirlərin sağ və sol qanadlarını mərkəzləri ilə eyni yerdə topladı.

Məşhur mücahidlərin qalibiyyət əsərləri və islam bayrağının yüksəlişi açıqça görünməyə başlayınca o kafir qovulmuşlar, o şərir dinsizlər bir saat qədər çaşqın bir halda qaldıqdan sonra canlarından vaz keçərək mərkəzin sağ və soluna hücum etdilər. Sol tərəfə çox yüklənərək yaxınlara qədər gəldilər. Lakin igidlik əlamətli qazilər, səvab meyvəsini göz önündə tutaraq hər

---

[1] Firdövsinin *Şahnaməsi*ndən. Dini təsəvvürə görə, göylər yeddi, yer isə beş təbəqədir. Şair demək istəyir ki, toz üzündən göylər səkiz, yer isə altı təbəqə olmuşdur.

[2] *Quran,* Ali-İmran surəsi, 3:139.

[3] *Quran,* Səf surəsi, 61:13 və Tövbə surəsi, 9:112.

birinin köks torpağına ox fidanları dikdilər və hamısını qara bəxtləri kimi geri oturtdular. Bu əsnada tale və qələbə rüzgarları nəvvabımızın dövlət çəmənlərində əsdi. **(324 a)**

*Biz sənə apaçıq bir fəth verdik*[1] müjdəsini gətirdilər. Fəth dilbəri dünyanı süsləyən Və *Allah sənə şanlı bir zəfər versin*[2] pərçəmiylə süslənmiş və gizlilik pərdəsi arxasında olan tale və xoşbəxtlik ona yar olmuş bir vəziyyətdə ortaya çıxanda batil hindular durumlarının güclüyünü anlayıb *...atılmış yun kimi...* dağılaraq *yayılmış pərvanələr kimi*[3] təlaşa qapıldılar. Çoxu savaş meydanında öldü. Bir qismi də başlarından keçərək sərsərilik çölünə düşdülər, qarğalara və çaylaqlara yem oldular. Ölülərdən təpələr yüksəldi və başlardan minarələr tikildi.

Həsən xan Mivati bir tüfəng zərbəsi ilə ölüm yoluna girmişdi. Qövmün irəli gələnləri arasındakı doğru yoldan sapma əlamətli o üsyançıların böyük hissəsinin həyat günləri ox və tüfəng zərbəsi ilə beləcə sona çatmışdı. Bunlar arasında bilxassə Udeypur vilayəti valisi və on iki min atlı sahibi Ravəl Udi Sing Bagəri, dörd min atlı sahibi Rav Çəndərban Çuhan, altı min atlı sahibi daha əvvəllər bəhs edilmiş Səlahəddinin oğlu Çəndiri hakimi Pupet Rav, Manikçənd Çuxan və dörd min atlı sahibi Dilpet Rav, Gəngü və Kərm-Sing, üç min atlı sahibi Rav Dənkusi və hər biri bir **(324 b)** camaatın böyüyü, şövkət və səltənət sahibi bir güruhun başbuğu olan digər bir qrup da cəhənnəm yolunu tutmuşdular. Bu çamur dünyasından cəhənnəmin ən dibinə köçmüşdülər.

Savaş meydanının yolu yolda ölmüş yaralılar üzündən cəhənnəm kimi doldu. Cəhənnəmin ən dibi cəhənnəm malikinə can vermiş münafiqlərla dolub-daşdı. İslam əsgəri hansı tərəfə səyirtsə, hər addımda bir xotkarı ölüsünü görürdü. Şöhrətli ordu bundan sonra nə qədər uzağa köç etsə möhtəşəm bir şəxsin yıpranmış vücudundan xali bir yer tapa bilmirdi.

Həmə hinduvan küştə zarü zəlil,
Bə səngü tüfək həmçü əchabi-fil.

Zi tənha bəsi kuhha şod əyan,
Bə hər kuh əz an çeşmeyi-xun rəvan.

Zi səhmi-sihami safi pürşükuh,
Güzəran-güzəran bə hər dəştü kuh.

*Bütün hindular zarü zəlil olmuşdular*
*Əshabi-fil kimi tüfəng daşından.*

[1] *Quran,* Fəth surəsi, 48:1.
[2] *Quran,* Fəth surəsi, 48:3.
[3] *Quran,* Qəariyyə surəsi, 101:5 və 101:4

*Cəsədlər üzündən hər birindən*
*Qan çeşməsi axan dağlar yarandı.*

*Şövkətli səflərin oxlarının qorxusundan*
*Hər çöldə, dağda donuzlar (və ya bahadırlar) qaçışırdılar.*

*...Arxalarına dönüb qaçırlar... Allahın əmri olub-bitmiş bir şeydir*[1]

Bilən və eşidən Allaha həmd edirik. Yardım yalnızca əziz və hakim olan Allahdandır.

Doqquz yüz otuz üçüncü il cəmadiyülaxır ayının iyirmi beşində [=29 mart 1527] yazıldı.

Bu fəthdən sonra tuğrama *Qazi* yazıldı. Fəthnamədə tuğramın altına bu rübaini yazdım:

İslam üçün avareyi-yazi[2] oldum,
Küffarü[3] hünud[4] hərbsazi oldum[5],
Cəzm eylər idim özüm şəhid olmağa,
Əl-minnətillah ki, qazi oldum.

Şeyx Zeyn bu fəthə *Fəthi-padşahi-islam*[6] sözünü tarix düşürmüşdü. Kabildən gələn adamlar vasitəsilə Mir Gisu də bu sözü tarix düşürərək bir rübai yazıb mənə göndərmişdi.

Beləcə, təvarüd olmuşdu, həm Şeyx Zeyn, həm də Mir Gisu öz rübailərində tapdıqları tarix çox yaxşı oldu, həm də eyni söz alındı. Yenə bir dəfə Dibalpur fəthində Şeyx Zeyn *Vəsəti-şəhri-rəbiüləvvəl*[7] sözünü tarix düşürmüşdü. Mir Gisu də həmin sözü tapmışdı.

## KANVA SAVAŞININ SONRASI

Düşməni məğlub etdikdən sonra vura-vura təqib etdik. Kafirin düşərgəsindən bizim ordugaha iki küruh qədər məsafə vardı. Ordugahlarına getdik. Məhəmmədi, Əbdüləziz, Əli xan [Fərmüli] və başqa adamlar kafiri arxadan təqib üçün göndərildi. Lakin bir az diqqətsizlik göstərdilər. Gərək bu işi başqasına tapşırmayıb özüm gedəydim. Kafirlərin düşərgəsindən bir küruh qədər irəliləmişdim, lakin artıq gec olduğu üçün dönüb yatsı zamanı or-

---

[1] *Quran,* İsra surəsi, 17:46 və Əhzab surəsi, 33:38.
[2] Yazı – çöl.
[3] Küffar – kafirlər.
[4] Hünud – hind sözünün cəmi, hindlər.
[5] Hərbsazi oldum – hərb elədim, savaşdım.
[6] Fəthi-padşahi-islam: (islam padşahının fəthi) ifadəsindəki hərflərin əbcəd hesabı ilə cəmi 933 (=1527) edir.
[7] Vəsəti-şəhri-rəbiüləvvəl: (rəbiül-əvvəl ayının ortası) ifadəsindəki hərflərin əbcəd hesahesabı ilə cəmi 930 (=1524) edir.

dugaha gəldim.

O qədər uğursuzluq etmiş olan Məhəmməd Şərif Münəccim dərhal təbrik üçün gəldi. Ağzıma gələni deyib içimi boşalttım. Gərçi bu kafir uğursuz, özünü hədsiz bəyənən və çox itaətsiz bir adamdı, lakin əski xidmətləri vardı. Bir lek pul ehsan edib mənim **(325 b)** məmləkətimi tərk edərək getməsinə izin verdim.

Ertəsi gün də həmin yerdə qaldıq. Məhəmməd Əli Cəng-Cəng, Şeyx Gürən və Əbdülməlik Qurçuya böyük bir qüvvə verdim, Miyan-Duabda üsyan edib Külü alaraq Kiçık Əlini əsir edən İlyas xanın üstünə göndərdim. Bunlar gedəndə düşmən vuruşmadan hər tərəfə dağılır. Mən Aqraya gəldikdən bir neçə gün sonra özünü ələ keçirib gətirdilər. Diri-diri dərisini üzdürdüm.

Ordugahın önündə bir təpə vardı, savaş da bu təpənin önündə cərəyan etmişdi. Bu təpənin üstünə kafirlərin başından bir minarə dikilməsini əmr etdim.

Bu yurddan qalxıb iki dəfə dincəldikdən sonra Biyanəyə gəldik. Biyanəyə, hətta Əlvar və Mivata qədər yerdə yatan kafirlərin və islam dinindən dönənlərin cəsədləri saysız-hesabsızdı. Gedib Biyanəyi gəzdim. Ordugaha dönüb türk və hind əmirlərini çağırdım, bu kafirin vilayətinə qoşun çəkmək haqqında danışıb məsləhətləşdik. Lakin yollarda suyun azlığı və istinin şiddəti üzündən bu səfərdən vaz keçdik.

Mivat vilayəti Dehlinin yaxınındadır və təqribən üç-dörd kürur qədər gəliri var. Həsən xan Mivatinin babaları yüz-iki yüz ilə yaxın bir müddətdən bəri Mivatı müstəqil bir şəkildə idarə etmişlər. Dehli sultanlarına **(326 a)** bir qədər itaət edirlərmiş. Hind sultanları isə ya öz vilayətlərinin genişliyi, ya imkanlarının darlığı, ya da Mivatın dağlıq olması üzündən bu vilayətin zəbt edilməsinin dalısınca düşməmiş, bu qədər itaəti kafi sayaraq vilayəti onların idarəsində qoymuşdular.

Biz də Hindistanın fəthindən sonra əski sultanların düsturuyla hərəkət edərək Həsən xanın etibarını saymaqda davam etdik. Lakin o, haqq tanımaz kafir və mülhid bizim lütf və inayətimizi heçə sayaraq, ona tərbiyə və etibar göstərməmizə şükr etmədən, daha öncə bəhs etdiyim kimi, bütün fitnələrin başı və bütün pisliklərin səbəbi idi.

Bu səfər tamamlanınca Mivatı zəbt etmək üçün hərəkət etdik. Dörd dəfə dincəldikdən sonra Mivatın mərkəzi olan Əlvar kurqanından altı küruh məsafədə yerləşən Manəsni çayının sahilinə endik.

Həsən xandan əvvəl onun babaları Ticarədə otururlarmış. Mən Hindistana gəlib Pehar xanı məğlub edərək Lahor və Dibalpuru aldığım il [=1524] məndən qorxduğu üçün gələcəyi düşünərək bu kurqanın möhkəmləndirilməilə məşğul olmuşdu.

Həsən xanın Kərmçənd adlı mötəbər bir adamı -oğlu Aqrada ikən də

gəlmişdi- yenə oğlunun yanından Əlvardan **(326 b)** gəlib aman dilədi. Əbdürrəhim Şiğavul vəd fərmanlanyla və onunla birlikdə oraya göndərildi. O da gedib Həsən xanın oğlu Nahir xanı alıb gəldi. Təkrar inayət göstərildi və bir neçə leklik pərgənə təxsisat olaraq verildi.

Xosrovun savaşda yaxşı işlər görmüş olduğunu zənn etdiyim üçün təxsisatını əlli lek edib Əlvara təyin etdik, amma bəxtsizliyi üzündən nazlanaraq qəbul etmədi. Sonradan anlaşıldı ki, işi Cin-Teymur Sultan görübmüş. Mükafat Sultana verilib Mivatin paytaxtı olan Ticarə şəhəri ona ehsan edildi və təxsisatı da əlli lekə çıxarıldı.

Sanka müharibəsində sağ qolun pusquçusu olan Turdukə, digərlərinə nəzərən daha yaxşı vuruşmuşdu, onun təxsisatı on beş lekə çıxarılaraq, özünə də Əlvar kurqanı ehsan edildi. Əlvar kurqanının xəzinələri isə içindəkilərlə birlikdə Hümayuna verildi.

O yurddan rəcəb ayının birinci çərşənbə günü [=3 aprel] qalxıb Əlvarın iki küruh məsafəsinə gəldik. Gedib Əlvar kurqanını gəzdim və o gecəni orada keçirərək ertəsi gün ordugaha gəldim.

## HÜMAYUNUN KABİLƏ QAYITMASI

Kafirlərlə savaşın başlamasından bir az əvvəl, bəhs etdiyim kimi, böyüklər və kiçıklər and içəndə **(327 a)** bu fəthdən sonra heç kimə vəzifə təklif edilməyəcəyi və getmək istəyən hər kəsə izin veriləcəyini də söyləmişdim.

Hümayunun nökərlərinin əksəriyyəti Bədəxşan civarındakı xalqdandı. Daha öncə heç biri bir, ya da iki ay qədər davam edən səfərdə iştirak etməmişdi. Hələ savaş başlamadan taqətsiz düşmüşdülər. Belə bir vəddə bulunduğum və Kabil də boş qaldığı üçün Hümayunun Kabilə qayıtmasına izin verməyi qərarını aldım.

Bu qərarla birlikdə Əlvardan cümə axşamı günü, rəcəb ayının doqquzunda hərəkət edib dörd-beş küruh gedərək Manəsni çayının sahilinə endik. Mehdi Xocanın da çox iztırabı vardı, onun da Kabilə getməsinə izin verildi. Biyanənin şikdarlığı Dost eşik-ağaya verildi. Mehdi Xocaya daha öncə Ətavə verilmişdi. Amma Qütb xan Sərvani Ətavəni buraxıb qaçınca oraya Mehdi Xocanin yerinə oğlu Cəfər Xoca göndərildi.

Hümayuna izin verdiyim üçün iki-üç gün boyunca bu yurdda qaldım. Mömin Əli Tavaçı da bir fəthnaməylə birlikdə bu yurddan Kabilə göndərildi.

## FİRUZPUR ÇEŞMƏSİNƏ VƏ KUTİLƏNİN BÖYÜK GÖLÜNƏ GƏZİNTİ

Firuzpur çeşməsinin və Kutilənin böyük gölünün tərifini eşitmişdim. Həm Hümayunu yola salmaq, həm də bu yerləri gəzmək üçün ordugahı bu-

rada qoyub bazar günü **(327 b)** hərəkət etdim.

O gün Firuzpuru və çeşməsini sey redib məcun yedik. Çeşmənin suyunun gəldiyi dərədə tamamiln kənir çiçəkləri açmışdı. Tərif edildiyi qədər olmasa belə, xoş bir yerdi. Bu dərənin içinə, suyun bir az geniş olduğu bir yerə daşları yontub hövzi-kəbir tikilməsini əmr etdim.

Gecəni o dərədə keçirib ertəsi gün Kutilə gölünü gəzdim. Gölün hər tərəfinə bir dağın ətəyi uzanır. Manəsni çayı bu gölə axır. Olduqca böyük bir göldü. Bir sahilindən digər sahili yaxşı görünmürdu. Gölün ortasında bir yüksəklik, onun ətrafında bir çox kiçık qayıqlar vardı. Civarındakı kəndlilər qarışıq zamanlarda qayıqlara minərək oraya gedib özlərini qurtarırlarmış. Biz gələndə də xeyli adam qayıqlara minib gölün içərisinə doğru getdi.

Gölü seyr etdikdən sonra gedib Hümayunun ordugahına endik. Orada dinclənib yemək yedikdən sonra Mirzəyə və bəylərə xələtlər geydirib yatsı vaxtı Hümayuna vida etdik. Oradan hərəkət etdik və yolda bir yerdə uyuyub təkrar hərəkət edərək dan ağaranda Kühri pərgənəsindən keçib yenə qısa bir müddət uyuduqdan sonra Tudəyə enmiş olan ordugaha döndük.

Tudədən qalxıb Sunkara enəndə Əbdürrəhimə [Şiğavul] təslim edilmiş olan Həsən xan **(328 a)** Mivatinin oğlu Nahir xan qaçdı.

Oradan qalxıb arada bir dəfə dincəldikdən sonra Büsavər ilə Çusə arasındakı dağın çıxıntısında yerləşən bulağa enib çadırlar qurduraraq məcun yedik. Orduyla birlikdə buradan keçərkən Turdu bəy Xaksar bu bulağı tərif etmişdi, orada gəlmiş və at üstündə seyr edib keçmişdik. Gözəl bir bulaqdır.

Hindistanda axarsu heç yoxdur, bulaq da azdır. Nadir olaraq rastlanan bulaqlar da yerdən sızıntı kimi sızaraq çıxır, bizim tərəflərin bulaqları kimi fışqıraraq çıxmır. Bu bulağın suyu isə bir dəyirmanı işlədəcək suyun yarısı qədər vardı və dağın ətəyindən fışqıraraq çıxırdı. Ətrafı tamamilə çayırdı. Çox xoşuma gəldi. Bulağın üstünə, yonulmuş daşlardan səkkiz guşəli bir hovuz tikilməsini əmr etdim.

Bulağın yanında otururkən məcunun təsiri altında ola Turdu bəy öyünərək, durmadan belə təkrar edirdi: «Çün çaye xoş kərdəəm, name mibayəd mand» (*Madam ki bir yeri gözəlləşdirdim, bir ad verilməsi lazımdır).* Abdullah [Kitabdar] da dedi ki: «Çeşmeyi-padişahi-Turdu bəy xoşkərdə» (*Turdu bəy tərəfindən gözəlləşdirilən padşah bulağı demək lazımdır).*

Onun bu sözü xeyli gülüşməyə və zarafata səbəb oldu.

Dost eşik-ağa, Biyanədən gəlib bu bulaq başında mülazimət etdi.

Buradan **(328 b)** gedib təkrar Biyanəni gəzdim. Oradan da Sirkiyə gələrək salınması əmr edilən bağın yanında iki gün qaldım. Bağa diqqət yetirdikdən sonra, cümə axşamı günü, rəcəb ayının iyirmi üçündə [=25 aprel] səhər vaxtı Aqraya çatdım.

Bəhs etdiyim kimi, düşmənlər bu qarışıqlıq zamanında Çəndvar ilə Rabirini də əllərinə keçirmişdilər. Məhəmməd Əli Cəng-Cəng, Qoç bəy oğ-

lu Turdu bəy, Əbdülməlik Qurçu və dəryaxaniləri ilə birlikdə Hüseyn xan Çəndvar ilə Rabirinin üstünə göndərildilər.

Çəndvara yaxınlaşdıqlarında orada olan Qütb xan Sərvaninin adamı bunların gəldiyini eşidərək qaçıb gedir, bunlar da Çəndvarı zəbt etdikdən sonra Rabiriyə keçirlər.

Hüseyn xan Nuhaninin adamları küçələrə barrikadalar quraraq bir az savaşmaq niyyətilə qarşı çıxırlar, amma bizimkilər üstlərinə yüklənincə qarşı dura bilməyib qaçırlar. Hüseyn xan filə minərək bir neçə adamıyla birlikdə çaya girir və suda boğulur.

Bu xəbəri duyunca, Qütb xan Sərvani də Ətavəni buraxıb bir dəstə adamıyla birlikdə qaçdı. Ətavə öncədən Mehdi Xocaya vəd edilmiş olduğu üçün Ətavəyə onun yerinə oğlu Cəfər Xoca göndərildi.

## DİGƏR TƏYİNATLAR

Bəhs etdiyim kimi, kafir Sankanın üsyanında hindistanlılar ilə əfqanların çoxu bizdən üz çevirərək bütün pərgənə və vilayətləri əllərinə keçirmişdilər. Sultan Məhəmməd Dulday Kanucu buraxıb gəlmiş olduğu üçün **(329 a)** qorxusundan və ya xəcalətindən Kanuca getməyi qəbul etmədi və Kanucun otuz lekini Sihrindin on beş lekinə dəyişdi. Kanuc da Məhəmməd Sultan Mirzəyə ehsan edilib təxsisatı otuz lek oldu.

Bedaunu Qasım Hüseyn Sultana verildi. Onu türk əmirlərindən böyük və kiçık qardaşları və moğollarıyla birlikdə Məlik Qasım Baba-Qaşqa, Əbülməhəmməd Nizəbaz, atasıyla Müəyyəd, dəryaxaniləri ilə və Sultan Məhəmməd Duldayın nökərləri ilə birlikdə Hüseyn xan, hind əmirlərindən Əli xan Fərmüli, Məlikdad Kərərani, Şeyx Məhəmməd Şeyx Nikari, Tatar xan Xani-cahan ilə birlikdə Məhəmməd Sultan Mirzəyə qoşub kafir Sankanın yaratdığı qarışıqliq dönəmində gəlib Ləknuru zəbt etmiş Bibənin üstünə göndərdim. Bu ordu Qanq çayından keçdiyi zaman Bibən onların gəldiyini xəbər alaraq əşyalarını buraxıb qaçdı. Əsgər arxasından Xeyrabada gedib bir neçə gün qaldıqdan sonra, oradan geri qayıtdı.

Xəzinələr bölüşdürülmüşdü. Vilayətlər ilə pərgənələri təqsim edincəyə qədər bu kafir işi araya girmişdi. Kafirlə savaşdan sonra isə vilayət və pərgənələr paylaşdırıldı. **(329 b)** Yağmur mövsümü yaxınlaşdığı üçün hər kəsin öz pərgənəsinə gedib hazırlığını görməsinə və yağmur mövsümü keçər-keçməz də hərəkətə hazır olmasına qərar verildi.

Bu əsnada Hümayunun Dehliyə gedib oradakı xəzinələrin bir neçəsini icazəsiz zəbt etdiyi xəbəri gəldi. Ondan heç bir zaman belə bir hərəkət gözləmirdim. Bu mənə çox ağır gəldi. Ağır xəbərdarlıq məktubu göndərdim.

İraqa elçi olaraq gedib oradan Süleyman Türkmən ilə birlikdə dönmüş olan Hacəgi Əsəd, cümə axşamı günü, şaban ayının on beşində [=16 may],

yenə Süleyman ilə birlikdə və müvafiq hədiyyələrlə şahzadə Təhmasibin yanına elçi olaraq göndərildi.

Turdu bəy Xaksarı dərvişlikdən çıxarıb sipahi eləmişdim. Bir neçə il mülazimətdən sonra, dərvişlik dərdi təkrar oyanaraq izin istədi, izin verib elçi olaraq Kamran [Mirzə]nin yanına göndərildi.

Keçən il Hindistanı tərk edib gedənlər haqqında tək bir qitə yazmışdım. Molla Əlixana xitabən yazılmış bu qitə Turdu bəy vasitəsilə ona göndərildi. O qitə budur:

Ey olar kim, bu hind kişvərindən
Vardınız anlab özgə rəncü sitəm. **(330 a)**

Kabilə, xoş havasına darıxıb,
Hinddən uzaq getdiniz ol dəm.

Gördünüz, tapdınız ikən onda –
İşrətü eyş bilə nazü neəm.

Biz dəxi ölmədik bihəmdülla,
Gərçi çox rənc yedik, bihəd qəm.

Xətti-nəfsi məşəqqət bədəni,
Sizdən ötdiyü ötdü bizdən həm.

Bu ramazanı Həşt-Behişt bağında keçirdik. Hər təravih qüsl ilə qılındı. On bir yaşımdan bəri iki ramazan bayramını arxa arxaya eyni yerdə keçirməmişdim. Ötən ramazan bayramı Aqrada olduğum zamana təsadüf etmişdi. Bu qaydaya xələl gətirməmək üçün ayın sonuncu bazar günü axşamı bayramı qeyd etmək üzrə Sikriyə getdim.

Sikridə salınan Baği-Fəthin şimal-qərb tərəfindəki daş taxt hazır olmuşdu. O taxtın üzərində ağ çadır qurub bayramı orada qeyd etdik. Aqradan hərəkət etdiyimiz axşam Mir Əli Qurçu da Şah Həsənin yanına Təttəyə göndərildi. Şah Həsənin karta çox düşkün idi, bir dəst istəmişdi, onunla bir dəst də kart göndərdim.

Bazar günü, zülqədə ayının beşində [=4 avqust] xəstələndim, xəstəliyim on yeddi gün davam etdi.

Cümə günü, həmin ayın iyirmi dördündə [=23 avqust] Dulpura gəzməyə getdik. Gecə yarı yolda uyuyub **(330 b)** sabah tezdən Sultan İskəndərin bəndinə gəlib endim. Bənddən bir az aşağıda, dağın bittiyi yerdə, tikintidə işlənən qırmızı daşdan böyük bir parça düşmüşdü. Ustad Şah Məhəmməd daşçını gətirdib əgər yekparə bir ev düzəltmək mümkünsə yekparə bir ev düzəltməyi, əgər alçaq gəlsə, həmin daşdan yekparə bir hovuz qazmağı əmr etdim.

Dulpurdan Bari tərəfinə getdim. Ertəsi gün Baridən hərəkət edib Bari ilə Çənbəl arasındakı dağı keçərək, Çənbəl çayını seyr etdikdən sonra geri döndüm. Bu aradakı dağda abnus ağacı gördük. Sən demə, bu ağacın bəyazı da olurmuş. Bu dağdakıların çoxu ağ abnus ağacıydı. Baridən gedib Sikrini gəzdikdən sonra çərşənbə günü, ayın iyirmi doqquzunda [=28 avqust] Aqraya gəldim.

O günlərdə Şeyx Bəyazid haqqında çox da yaxşı olmayan xəbərlər söyləyirdilər. Sultan Əli Türk iyirmi günlük möhlət ilə Şeyx Bəyazidin yanına göndərildi.

Cümə günü, zilhiccə ayının ikisində [=30 avqust] qırx bir dəfə oxunan virdə[1] başladım.

Yenə o günlərdə

Gözü qaşü sözü telinimi de,
Qəddü xəddü saçü belinimi de

beytimi beş yüz dörd vəzndə təqti etdim[2]. Bu xüsusda bir risalə yazdım.

O gün təkrar **(331 a)** xəstələndim və bu dəfə xəstəliyim doqquz gün davam etdi. Cümə axşamı günü, zilhiccə ayının iyirmi doqquzunda [=25 sentyabr] gəzmək üçün Kül və Sənbələ hərəkət etdim.

[1] *Vird:* müəyyən zamanlarda oxunması adət olan *Quran* cüzləri, duaları.
[2] *Təqti:* ədəbiyyatda mənzuməni vəzn parçalarına görə ayırıb aralıqlı oxuma.

HİNDİSTAN - 934 (27 SENTYABR 1527 - 15 SENTYABR 1528)

## DOQQUZ YÜZ OTUZ DÖRDÜNCÜ İLİN HADİSƏLƏRİ

Məhərrəm ayının birinci şənbə günü [=28 sentyabr] Külə endik.

Hümayun Dərviş Əli ilə Yusifi [Riqabdar] Sənbəldə buraxmışdı, onlar da çaydan keçərək Qütb Sərvani ilə bir neçə racəni möhkəm məğlub etmişlər. Bir çox adamı öldürmüş, xeyli baş və bir də fil göndərmişlər, biz Küldə ikən gətirdilər.

İki gün Külü seyr edib Şeyx Gürənin xahişi ilə onun evinə düşdük. Ziyafət verib hədiyyələr təqdim etdi. Oradan hərəkətlə Ötrüliyə endik. Çərşənbə günü Qanq çayından keçib Sənbəl kəndlərində dincəldik və cümə axşamı günü Sənbələ endik. Sənbəldə iki gün gəzdikdən sonra, şənbə günü, səhər vaxtı geri qayıtdıq.

Bazar günü Sikəndərədə Rav Sirvaninin [Ravuy Sərvani] evinə endik. Yemək verib xidmət etdi. Oradan dan üzü hərəkət etdik. Yolda bir bəhanə ilə məiyyətimdəkilərdən ayrılıb atımı dördnala çaparaq, Aqradan bir küruh məsafəyə qədər təkbaşıma gəldim. Məiyyətimdəkilər sonra arxadan gəlib yetişdilər. Günorta Aqraya endik.

Bazar günü, məhərrəm ayının on altısında [=13 oktyabr] isitdim, titrətdim, xəstəlik iyirmi beş-iyirmi altı gün çəkdi, dərman içdim, axırda yaxşılaşdım. Yuxusuzluq və susuzluq üzündən çox iztirab çəkdim.

Xəstə olduğum o günlərdə üç-dörd **(331 b)** rübai söylədim. Onlardan biri də budur:

Cismimdə isitmə gündə möhkəm oladır,
Gözdən uçadır uyğu, çü axşam oladır,
Hər ikisi qəmim bilə səbrim tək
Hey dəyişər; bu artadır, ol kəm oladır.

Şənbə günü, səfər ayının iyirmi səkkizində [=23 noyabr] xalalarım Fəxri-Cahan bəyim ilə Xədicə Sultan bəyim gəldilər. Gəmiylə gedib Sikəndərabaddan bir az yuxarıda mülazimət etdim.

Bazar günü Ustad Əliqulu böyük topla bir daş atdı. Gərçi daşı uzağa getdi, amma top parça-parça oldu. Bir parçası xalqın üstünə düşdü, səkkiz adam həlak oldu.

Bazar ertəsi günü, rəbiüləvvəl ayının yeddisində [=2 dekabr] gəzmək üçün Sikriyə getdim. Gölün içində tikilməsini əmr etdiyim səkkiz guşəli taxt tamamlanmışdı. Gəmiylə oraya gedib çadır qurduraraq məcun yedik.

## BABUR ÇƏNDİRİ SƏFƏRİNƏ ÇIXIR

Sikri gəzintisindən sonra bazar günü axşamı, rəbiüləvvəl ayının on dördündə savaşmaq niyyətilə Çəndiri tərəfinə hərəkət edib üç küruha qədər getdikdən sonra Cəlisirə endik. Orada əsgərin hazırlıqlarını tamamlaması üçün iki gün qaldıqdan sonra cümə axşamı günü atlanaraq Ənvara vardıq. Ənvardan gəmiyə minərək Çəndvara çıxdıq. Oradan da mənzil-mənzil irəliləyərək bazar ertəsi günü, ayın iyirmi səkkizində Kənar keçidinə endik.

Cümə axşamı günü, rəbiüləvvəl ayının ikisində [=26 dekabr] çaydan keçdim. Əsgər suyu keçincəyə qədər dörd-beş gün **(332 a)** orada qaldıq. Bu bir neçə gün içində arxa-arxaya gəmidə məcun yedik. Çənbəl çayının bu nəhrə töküldüyü yer Kənar keçidindən bir-iki küruh daha yuxarıdadır. Cümə günü Çənbəl çayında gəmiyə minib iki çayın birləşdiyi yerdən keçərək ordugaha gəldik.

Gərçi Şeyx Bəyaziddən açıq bir müxalifət görünmürdu, lakin hərəkət və tövründən müxalifət niyyətində olduğu bəlliydi. Bu işlə maraqlanması üçün Məhəmməd Əli Cəng-Cəngi ordudan ayıraraq Kanucdan Məhəmməd Sultan Mirzəni və o civardakı Qasım Hüseyn Sultan, Bixub Sultan, Məlik Qasım, Kuki, Əbülməhəmməd Nizəbaz, böyük və kiçık qardaşları və dəryaxaniləri ilə birlikdə Mənuçöhr xan kimi sultan və əmirləri toplayıb Sərvardakı asi əfqanlarm üsyünə hərəkət etmək üçün göndərdik. Bunlar Şeyx Bəyazidi də çağıracaqdılar. O, səmimiyyətlə gəlib qoşulsa birlikdə gedəcək, gəlməsə əvvəlcə onu bərtərəf edəcəkdilər. Məhəmməd Əli bir neçə fil istədi, ona qədər fil verildi. Məhəmməd Əliyə izin verdikdən sonra Baba Çöhrəyə gedib onlara qoşulması əmr edildi.

Kənardan bir neçə gəmiylə irəlilədik. Çərşənbə günü, rəbiülaxır ayının səkkizində [=l yanvar 1528] Kalpidən bir küruh məsafədə endik. Sultan Səid xanın kiçık qardaşı Sultan Xəlil Sultanın oğlu Baba Sultan bu yurdda ikən gəlib bizə mülazimet etdi. O, keçən il böyük qardaşlarından qaçıb **(332 b)** Endərab sınırına gəlincə peşman olmuş və təkrar dönərkən Kaşğara yaxınlaşdığı sırada, xan Heydər Mirzəni göndərib onu geri qaytarmışdı.

Ertəsi gün Kalpidə Aləm xanın [Cəlal xan Cighetin oğlu] evinə endik, Hindistan tərzində yeməklər ikram edib hədiyyələr verdi.

Bazar ertəsi günü, ayın on üçündə [=6 yanvar} Kalpidən hərəkət etdik. Cümə günü İricə, şənbə günü də Bəyazidə endik.

Bazar günü, ayın on doqquzunda Cin-Teymur Sultan komandanlığında altı-yeddi min adam bizdən bir az irəliyə, Çəndiri üstünə göndərildi. Gedən ilqar bəyləri Baqi minbəyi, Turdu bəy, Qoç bəy, Aşiq Bəkavul, Molla Apağ, Möhsün Dulday və Hindistan bəylərindən Şeyx Gürəndi.

Cümə günü, ayın iyirmi dördündə [=17 yanvar] Keçvə sahilinə endik. Keçvə xalqına vədlərdə bulunduq və Keçvə bölgəsi Bədrəddinin oğluna verildi.

## KEÇVƏNİN TƏRİFİ

Keçvə olduqca gözəl bir yerdir. Ətrafında kiçık-kiçık təpələr var. Keçvənin cənub-şərqi yönündəki dağ arasına bir bənd düzəltmişlər, böyük bir göl olmuş. Ətrafı beş-altı küruh olar. Bu göl Keçvənin üç tərəfini əhatə edir. Şimal-qərb tərəfində kiçık bir çayır var, şəhərin qapısı da bu tərəfdədır.

Gölün içində üç-dörd adam sığacaq kiçık qayıqlar vardır. Əgər xalq qaçmağa məcbur olsa, bu qayıqlara minib **(333 a)** suyun içinə doğru gedirmiş.

Keçvəyə qədər yenə iki yerdə dağ arasında belə bənd düzəldib Keçvə gölündən bir az daha kiçık göllər yaratdıqlarını görmüşdük.

Keçvədə bir gün qaldım, arabalar və topun zəhmətsizcə keçə bilməsi üçün yoldakı çuxurları doldurub cəngəllikləri kəsmək üzrə çavuşlar və bir çox istehkamçı təyin edildi.

Keçvədən qalxıb arada bir dincəldikdən sonra Çəndiridən üç küruh məsafədə yerləşən Burxanpur çayını keçib endik.

## ÇƏNDİRİ KURQANININ ALINMASI

Çəndirinin ərki dağın üstündə yerləşir. Dış kurqanıla şəhər isə dağ arasındadır. Arabaların keçdiyi düz yol kurqanın dibindən keçir.

Burxanpurdan qalxıb arabalar üzündən Çəndiridən bir küruh aşağıdan gəldik. Bir mənzil sonra çərşənbə axşamı günü, ayın iyirmi səkkizində Bəhçət xan hovuzunun kənarındakı bəndin üstünə endim.

Ertəsi gün hərəkətə keçərək kurqanın ətrafı mərkəzimizlə sağ və sol qollarımız arasında paylaşdırıldı. Ustad Əliqulu daş atmaq üçün bir bağda düz bir yer seçdi. Topları yerləşdirmək üçün yer hazırlamaq üzrə çavuşlar ilə istehkamçılar təyin edildi. Bütün əsgərə qalanın zəbti üçün gərəkli olan qalxanlar, nərdivanlar və nökəri qalxanları hazırlamaları əmr edildi.

Çəndiri əvvəllər **(333 b)** Mendav padşahlarına aid imiş. Sultan Nəsirəddinin ölümündən sonra hələ Mendavda olan oğullarından Sultan Mahmud Mendava və o civara sahib olur. Məhəmməd şah adlı bir oğlu da Çəndiriyi əlinə keçirərək kömək üçün Sultan İskəndərə müraciət edir. Sultan İskəndər də çox əsgər göndərərək onun hamisi olur. Sultan İskəndərdən sonra Sultan İbrahim zamanında Məhəmməd şah ölür və Əhməd şah adlı kiçık bir oğlu qalır. Amma Sultan İbrahim Əhməd şahı uzaqlaşdırıb oraya öz adamlarını qoyur. Rana Sanka İbrahimin üzərinə qoşun çəkərək Dulpura gələndə isə İbrahimin bəyləri müxalifət edirlər. Çəndiri o vaxt Sankanın əlinə keçir və bu da onu Midni Rav adlı çox etibarlı bir kafirə verir.

İndi o Midni Rav dörd-beş min kafirlə birlikdə Çəndiri kurqanında idi. Arayiş xanın onunla tanışlığı varmış. Arayiş xan ilə Şeyx Gürən oraya gön-

dərilərək inayət və şəfqət sözləri söylənərək ona Çəndiri yerinə Şəmsabad vəd edildi. Etibarlı adamlarından bir-ikisi buna qarşı çıxdı. Bizə etimad etmədi, yoxsa kurqanına güvəndi, bilmirəm, barış təşəbbüsü nəticə vermədi.

Çəndiri kurqanını zorla almaq niyyətilə çərşənbə axşamı günü sabah, cəmadiyüləvvəl ayının altısında [=28 yanvar] Behçet xan hovuzundan atlanıb kurqanın yaxınlığında yerləşən **(334 a)** ortadakı hovuzun kənarına endik.

O sabah yolda gedərkən Xəlifə bir-iki məktub gətirdi. Məktubda Puraba göndərilmiş əsgərin ehtiyatsız hərəkət edib savaşda yenildiyini və Ləknuyu buraxıb Kanuca gəlmiş olduğu yazılmışdı. Xəlifənin bu üzdən olduqca qərarsız və çox təlaşlı olduğunu gördüm və dedim ki: «Tərəddüd və təlaş yersizdir, Allahın təqdirindən başqa heç bir şey ola bilməz. Madam ki bu iş önümüzdədir, başqa bir şey düşünməmək lazımdır, sabah qalaya hücum edəcəyik və ondan sonra nə olacağını görərik».[1]

Düşmən ərki gücləndirmiş, lakin dış kurqanda ehtiyatda bir-iki adam qoymuşdu. O axşam bizim əsgər hər tərəfdən dış kurqana çıxdı. Düşmənin orada bir az adamı vardı, gerçək bir savaş belə etmədən qaçıb ərkə çəkildilər.

Çərşənbə günü, cəmadiyüləvvəl ayının yeddisində [=29 yanvar] əsgərin silahlanaraq yerlərinə gedib savaş hazırlıqlarını görməsi, sonra mən nağaralar və bayraqlarla hərəkətə keçəndə hər kəsin olduğu yerdən hücuma keçməsi əmr edildi.

Savaş qızışmağa başlayanda nağara və bayrağı buraxıb Ustad Əliqulunun daş atmasını şəxsən görməyə getdim. Üç-dörd daş atdı. Olduğu yer yamaçsız və qala bəndi **(334 b)** çox möhkəm və tamamən daşdan olduğu üçün ciddi təsir etmədi.

Söz etdiyim kimi, Çəndirinin ərki dağ üstündə yerləşir. Bir tərəfində su üçün iki yanı divarlı bir yol düzəltmişlər, bunun divarları dağdan aşağıdır. Bizim hücum edəcəyimiz yer bura idi. Mərkəzin sağ və sol qolları ilə xassə alayının payına bura düşmüşdü. Daha çox buradan zorladılar. Kafirlərin yuxarıdan atdığı daşlara və oda aldırmadılar. Axırda Şahım yüzbəyi dış kurqanın divarıyla su yolu divarlarının birləşdiyi yerdən dırmandı, iki-üç yerdən daha igidlər dırmanaraq çıxdılar. Su yolundakı kafirlər qaçıdılar və bura zəbt edildi.

Yuxarıdakı kurqanda isə bu qədər də vuruşmadılar, tez qaçdılar. Bir çox adam dırmanaraq yuxarıdakı kurqana çıxdı. Qısa bir müddət sonra kafirlər tamamən çılpaq bir halda gəlib vuruşmağa başladı. Bir çox əsgəri qovaraq divardan aşağı tökdülər. Bir neçə adamı vurub öldürdülər.

Divarın üzərindən təcili uzaqlaşmalarının səbəbi bu imiş: yeniləcəklərini kəsdirərək, qadınlarını tamamən doğrayıb özləri üçün ölümü gözə alaraq çılpaq bir halda vuruşmağa gəlmişlər.

---

[1] Baburun bu sözləri farscadır.

Axırda bizimkilər hər tərəfdən zorlayaraq **(335 a)** onları divar üstündən qaçırtdılar. İki-üç yüz kafir Midni Ravin olduğu yerə girdi. Orada çoxu bir-birini öldürmüşlər. Belə etmişlər: birisi əlinə bir qılınc almış, digərləri də bir-bir və özləri istəyərək boyunlarını uzatmışlar. Çoxu bu şəkildə cəhənnəmə getdi.

Allahın inayətilə belə məşhur bir kurqan bayraq və nağara gətirmədən və ciddi bir müharibə belə etmədən iki-üç geri içində [bir saatdan daha qısa bir müddətdə] fəth edildi. Çəndirinin şimal-qərb tərəfindəki dağın üstündə kafirlərin başından bir minarə düzəldildi.

Bu fəthin tarixi üçün «Fəthi-darül-hərb»[1] sözünü tarix düşürmüşdülər. Mən də bunu belə bağladım:

Bud çənde məqami Çəndiri
Pür zi küffarü darül-hərb,
Fəth kərdəm bə hərb qəleyi u,
Gəşt tarix «fəthi-darül-hərb».

*Bir müddət Çəndirinin olduğu yer*
*Kafirlər ilə doldu və hərbü zərb sahəsı oldu.*
*O qalanı hərblə fəth etdim,*
*«Fəthi-darül-hərb» də bunun tarixi oldu.*

## ÇƏNDİRİNİN TƏRİFİ

Çəndiri gözəl bir vilayətdir. Ətrafında və civarında xeyli axarsu vardır. Ərki dağın üstündədir. İçərisində daşdan üç böyük hovuz qazmışlar. Bir böyük hovuz da kurqanın zorlanaraq alındığı su yolundaydı.

Aşağı və yüksək təbəqənin evləri bütünlüklə daşdandır. Böyüklərinin evlərini səliqə ilə yonulmuş daşdan tikmişlər, xalqın evləri də daşdandır, lakin heç yonulmuş deyil. Damın üstünə kirəmit yerinə **(335 b)** düz və yastı daşlar qoymuşlar.

Kurqanının önündə üç böyük hovuz var. Ətrafında və civarında əski hakimlər bəndlər qurub hovuzlar meydana gətirmişlər. Bir az yüksəkdə Bitvi deyilən kiçik bir çay axır. Bu çay Çəndiridən üç küruh məsafədədir, özü də dadı və ləzzətiylə məşhurdur; gözəl bir çaydır. Ortasında parça-parça qayalar var. Bunlar bina üçün əlverişlidir.

Çəndiri Aqradan güneyə doğru doxsan küruh məsafədədir. Çəndiridə Qütb ulduzunun yüksəkliyi iyirmi-iyirmi beş dərəcədir.

Ertəsi sabah, cümə axşamı günü kurqanın yanından qalxıb Mellu xan hovuzunun kənarına endik. Çəndirinin fəthindən sonra buraya kafir Səlahəddinə aid olan Ray-Sing, Bhilsan və Sarəngpur üzərinə yürümək niyyətilə

[1] Fəthi-darül-hərb: kafir diyarının fəthi deməkdir. Əbcəd hesabı ilə 934 (=1527) edir.

gəlmişdik. Buraları da zəbt etməmizin ardından Sankanın üzərinə doğru Çitura yürüyəcəkdik. Amma o qarışıq xəbərləri alınca, bəyləri çağırdıq və danışıb məsləhətləşdikdən sonra bu fitnəçilərin və asilərin fitnəsini və fəsadını dəf etmək üçün hərəkətə keçməmiz daha uyğun və münasib sayıldı.

Çəndiri Sultan Nəsirəddinin nəvəsi Əhməd Şaha verildi, yuxarıda ondan bəhs etmişdim. Çəndiridən əlli lek xassə mülkü üçün ayırdım, şikdarlığı da Molla Apağın sərəncamına verdim və o da üç bin türk və hindistanlı ilə birlikdə Əhməd şaha köməkçi olaraq burada qaldı.

## ASİLƏRİN ÜSTÜNƏ YÜRÜŞ

Bu işləri həll etdikdən sonra **(336 a)** bazar günü, cəmadiyüləvvəl ayının on birində [=2 fevral] geri dönmək niyyətilə Mellu xan hovuzundan qalxıb Burxanpur çayının sahilinə endik. Yekə Xoca ilə Cəfər Xoca Kalpi gəmilərini Kənar keçidinə gətirmələri üçün Bandirdən Yekşənbehiyə göndərildilər. Şənbə günü, ayın iyirmi dördündə Kənar keçidinə enərək əsgərin suyu keçməyə başlamasını əmr etdim.

O günlərdə ilqar gedənlərin, Kanucu da buraxaraq Rabiriyə gəldikləri xəbəri alındı. Şemsabad kurqanını EbülMəhəmməd Nəyzəbaz qapatmış; lakin qalabalık qüvvətlər gəlib kurqanı zorlayaraq zəbt etmişlər.

Əsgər çaydan keçincəyə qədər üç-dörd gün boyunca çayın hər iki tərəfində qaldıq. Çaydan keçdikdən sonra Kanuc tərəfinə doğru mənzildən-mənzilə yürüyüb düşməndən xəbər bilmək üçün irəliyə qazax igidləri göndərdik. Bunlar da Kanuca iki-üç mənzil qalanda geri dönüb Mərufun oğlunun dil yaxalamaq üçün gedənlərin qaraltısını görərək Kanucdan çıxdığı xəbərini gətirdilər.

Bəyazid ilə Məruf bizim xəbərimizi alaraq Qanqdan keçib Kanucun qarşısında Qanqın şərq tərəfindəki keçidi tutmaq niyyətilə oturmuşlar.

Cümə axşamı günü, cəmadiyülaxır ayının altısında [=27 fevral] Kanucdan keçərək Qanqın qərb sahilinə endik. Bizim igidlər gedib düşmənin **(336 b)** bir neçə gəmisini ələ keçirdilər. Yuxarıdan və aşağıdan böyüklü- kiçikli otuz-qırx gəmi gətirdilər.

Mir Məhəmməd Caleban körpü qurmaq üçün uyğun bir yer seçib körpü ləvazımatını hazırlamaq üzrə göndərildi. Ordunun endiyi yerin bir küruh qədər aşağısında bir yer seçib gəldi. Ora yaxşı çavuşlar təyin edildi.

Körpünün salınacağı yerə yaxın bir nöqtəyə də Ustad Əliqulu topu yerləşdirib daş atmaq üzrə yer seçərək daş atmaqla uğraşdı.

Körpünün bağlanacağı yerdən bir az aşağıda isə Mustafa Rumi zərbzənli arabalarını bir adaya keçirdi və bu adadan zərbzən atmağa başladı. Körpünün yuxarı tərəfinə sipər qurulmuşdi və tüfəngəndazlar da bu sipərin üzərindən isabətli atışlar gerçəkləşdirdilər.

Bir-iki dəfə Məlik Qasım Moğol və digər igidlər çayı gəmiylə keçərək adamları çox az olmasına baxmayaraq yaxşı vuruşdular. Baba Sultan və Dərviş bir axşam on-on beş adamla birlikdə cəsarət göstərərək, amma yaxşı hesablamadan çayı gəmiylə keçdi, lakin savaşmadan və heç bir şey edə bilmədən qayıdıb gəldi. Bunun üçün onu çox danladım.

Axırda Məlik Qasım adamı az olmasına baxmayaraq coşub düşmənə hücum etdi, onu düşərgəyə qədər sürdü, lakin düşmənlər çoxlu adamla və bir fillə hərəkətə keçib bunları qaçmağa məcbur etdilər. Gəmiyə minib hərəkət edənə qədər **(337 a)** fil yetişdi və gəmini batırdı. Məlik Qasım bu savaşda öldü.

Körpü bağlanıncaya qədər keçən bu bir neçə gün içində Ustad Əliqulu çox dəqiq atışlar elədi, ilk günü səkkiz daş, ikinci günü on altı daş atdı. Üç-dörd gün bu şəkildə daş atdı. Bu daşları Qazi topuyla atırdı. Bu, kafir Sanka müharibəsində daş atan top idi, o üzdən də ona Qazi ismi verilmişdi.

Ustad Əliqulu ondan başqa böyük bir top daha tökmüşdü. Bu top yalnızca bir daş atdı və sonra qırıldı.

Tüfəngəndazlar da bir çox adamı və atı tüfənglə vurdular. Qaçan işçi və yolçulardan da bir neçə adamı və bir çox atı yerə sərdilər.

Körpünün qurulma işinin tamamlanması yaxınlaşanda çərşənbə günü, cəmadiyülaxırın on doqquzunda hərəkətə keçərək körpünün üzərinə gəldik.

Əfqanlar körpünün qurula biləcəyinə ehtimal verməyərək bizə istehza edirdilər. Cümə axşamı günü körpü hazır oldu. Piyadalardan və lahorlulardan ibarət kiçık bir dəstə qarşıya keçdi və önəmsiz bir çarpışma gerçəkləşdi.

Cümə günü mərkəzdən xassə alayı ilə mərkəzin sağ və sol qol igidləri və tüfəngəndazları piyada olaraq körpüdən keçdilər. Əfqanlarm hamısı silahlanaraq, filləri ilə gəlib onları sıxışdırdılar və bir dəstə sol qol adamını qaçırtdılar. Amma mərkəz və sağ qol adamları yerlərində qalıb **(337 b)** düşməni geri oturtdular.

Düşmənin adamlarından ikisi kütlədən ayrılaraq hücum etdi. Birini dərhal vurub ələ keçirdilər, digərini isə atıyla birlikdə o qədər çox yerindən vurdular ki, atı şahə qalxaraq geri döndü və öz güruhunun arasında yerə yıxıldı. O gün yeddi-səkkiz baş gətirdilər. Bir çox adamları ox və tüfəng yarası aldı. İkindi vaxtı keçənə qədər çarpışma davam etdi. O axşam körpünü keçənlərin hamısı geri qayıtdı. Halbuki adamların hamısı o şənbə axşamı keçirilmiş olsaydı, düşmənin çoxunun ələ keçirilməsi ehtimali vardı. Lakin ağlıma bu gəldi: keçən il çərşənbə axşamı günü, Novruz günü, Sankayla savaşmaq niyyətilə Sikridən hərəkət edib şənbə günü düşməni yenmişdik. Bu il də çərşənbə günü, Novruz günü, bu düşmənlərə qarşı savaşmaq niyyətilə hərəkət etmişdik. Bazar günü düşmənə galib gəlsək bu, qəribə hadisələrdən biri olacaqdı.

Bu üzdən adamlar keçirilmədi. Onlar da şənbə günü çarpışmağa gəl-

mədilər və hazır olaraq uzaqda dayandılar. O gün arabalar keçirildi və səhər vaxtı əsgərin keçməsi əmri verildi. Nağara vaxtında bizim avanqarddan düşmənin qaçıb getmiş olduğu xəbəri gəldi.

Cin-Teymur Sultana əsgəri götürüb düşməni təqib etməsi əmri verildi. Məhəmməd Əli Cəng-Cəng, Hüsaməddin Əli Xəlifə, Mühib Əli Xəlifə, Kuki Baba-Qaşqa, **(338 a)** Dost Məhəmməd Baba-Qaşqa [Dost eşik-ağa], Baqi Daşkəndi və Vəli Qızıl idarəsində olanlar təqibçi təyin edildi. Bunlar Sultan ilə birlikdə olub onun əmrlərinə itaət edəcəkdilər.

Sünnət vaxtında mən də körpünü keçdim. Dəvələrin bir az aşağıda yerləşən keçiddən keçirilmələri əmr edildi. O gün, bazar günü, Bəngərmavudan bir küruh məsafədə yerləşən durğun su sahilinə endik.

Təqib üçün göndərilmiş olanlar yavaş hərəkət etmişlər, Bəngərmavuya enmişlər və o gün günorta vaxtı oradan hərəkət etmişlər.

Ertəsi gün Bəngərmavunun önündəki gölün kənarına endik. O gün kiçık xan dayımın oğlu Toxta Buğa Sultan gəlib mülazimət etdi.

Şənbə günü, cəmadiyülaxır ayının iyirmi doqquzunda [=21 mart]Ləknuyu gəzdikdən sonra Guy çayından keçərək endik. O gün Guy çayında qüsl etdim. Qulağıma su girdi, yoxsa soyuğa verdim, bilmirəm, sağ qulağım eşitməz oldu, lakin bir neçə gün ağrısı yoxdu.

Uda bir-iki mənzil qala Çin Teymur Sultandan bir adam gəlib düşmənin Saru çayının o biri tərəfində oturmaqda olduğunu bildirərək kömək istədi. Mərkəzdən minə yaxın igidi Qaraca komandanlığında yardıma ayırdıq.

Şənbə günü, rəcəb ayının yedisində [=28 mart] Uddan iki-üç küruh daha yuxarıda yerləşən Gəgər ilə Sarunun **(338 b)** birləşdiyi yerə endik.

Şeyx Bəyazid o günə qədər Ud qarşısında və Sarunun o biri tərəfində olurmuş və Sultana məktub göndərərək danışıq aparmaq istəyirmiş. Amma onun bu hiyləsini anlayan Sultan günorta vaxtı Qaracaya adam göndərərək çayı keçməyə qərar verir və Qaraca ona qoşulanda dərhal suyu keçirlər. Düşmənin əlliyə yaxın atlısı və üç-dörd fili varmış, savaşa bilmədən qaçırlar. Bir neçə adamını ələ keçirərək başlarını kəsib göndərdilər.

Bixub Sultan, Turdu bəy, Baba Çöhrə, Qoç bəy və Baqi Şiğavul çayı Sultandan sonra keçirlər. Bunlar hələ keçmədən ilk keçənlər Şeyx Bəyazidi axşama qədər təqib edirlər. Şeyx Bəyazid özünü cəngəlliyə ataraq qurtulur.

Cin Teymur Sultan gecə Qara su sahilinə enib gecə yarısı təkrar hərəkətə keçərək düşməni təqibə başlayır və qırx küruh yol qət edib onun ailəsinin və həlayiqlərinin olduğu yerə çatır, amma düşmənin qaçdığı anlaşılır. Oradan hər tərəfə axınçılar göndərilir. Baqi Şiğavul bir neçə igidlə birlikdə düşmənin arxasından gedib ailəsinə və həlayiqlərinə yetişərək əfqanların bəzilərini yaxalayıb gətirdi.

Ud və civarını ələ keçirib nizam qurulması üçün orada bir neçə gün qaldıq. Uddan yeddi-səkkiz küruh yuxarıda olan Saru çayının sahili ovlaq

yeri kimi tərif edildiyi üçün Mir Məhəmməd Caləban oraya göndərildi. Gəgər çayı ilə Saru çayının keçidini **(339 a)** tədqiq edib gəldi.

Cümə axşamı günü, ayın on ikisində [=2 aprel] ov etmək niyyətilə oraya hərəkət ettim[1].

[1] Burada 1528-ci ilin 2 aprelindən 15 sentyabrınadək beş yarım ayı əhatə edən və açıqlanmayan bir qopma vardır.

HİNDİSTAN - 935 (15 SENTYABR 1528 - 5 SENTYABR 1529)

## DOQQUZ YÜZ OTUZ BEŞİNCİ ILİN HADİSƏLƏRİ

Cümə günü, məhərrəm ayının üçündə [=18 sentyabr] Çəndiri səfərinə çıxmazdan bir az öncə Multan işi üçün çağırtmış olduğum Əsgəri [Baburun oğlu] gəlib mənə xəlvətxanada mülazimət etdi.

Ertəsi gün isə Yunus Əlinin yaxın adamlarından olan tarixçi Xandəmir, Mövlana Şəhab Müəmmai və Mir İbrahim Qanuni -bunlar da mülazimət niyyəti ilə uzun bir müddət öncə Heratdan çıxmışdılar- gəlib mülazimət etdilər.

Bazar günü, ayın beşində [=20 sentyabr] ikindi vaxtı kitablarda Galyur şəklində yazılan Güvalyarı gəzmək üçün Cundan keçib Aqra qalasına girərək -o iki-üç gün ərzində Kabilə getmək istəyən Fəxricahan bəyim ilə Xədicə Sultan bəyimə yaxşı yol dilədikdən sonra- hərəkət etdim. [Bədiüzzaman Mirzənin oğlu] Məhəmməd Zaman Mirzə izin istəyərək Aqrada qaldı.

## BABURUN DULPUR ÜZƏRİNDƏN GÜVALYARI GƏZMƏYƏ GETMƏSİ

O gecə üç-dörd küruh yol qət edərək bir göl sahilinə enib uyuduq. Namazı bir az erkən qılıb atlandıq. Gembir çayının sahilində yemək yedikdən sonra günorta vaxtı oradan qalxıb yolda Molla Rəfinin hazırladığı toz halındakı dərmanı nəşə verməsi üçün buğda əzməsi ilə qarışdırıb içdik. Çox dadsız idi. İkindidən bir az sonra Dulpurdan qərbə doğru bir küruh məsafədə tikilməsini əmr etdiyim bağ ilə binaya **(339 b)** gəldim.

Bu bağla binanın tikilməsini əmr etdiyim yer bir dağ çıxıntısının ucunda yerləşir. Bu dağ çıxıntısının ucu yekparə qırmızı inşaat daşı olduğu üçün bu dağı dibinə qədər qazmalarını bina qazıla biləcək böyüklükdə yekparə bir daş çıxsa o daşdan bir bina qazmalarını, o qədər böyük bir daş çıxmasa düz qalan meydanda yekparə daşdan bir hovuz qazılmasını əmr etmişdim. Amma bina qazıla biləcək qədər böyük bir daş çıxmamışdı.

Əmrimə görə daşçı Ustad Şah Məhəmməd yekparə bir meydan olan bu daşın üzərinə üstü qapalı səkkiz guşəli bir hovuzun planını hazırladı. Daşçıların da sürətlə bu işlə məşğul olmalarını əmr etdim.

Həmən yerin şimal tərəfində içində hind gilası, ənbə, camən və hər növ başqa ağaclar olan böyük bir ağaclıq var idi. Bu ağacların arasında bir böyük hovuz salınmasını əmr etmişdim. Bu hovuz tamamlanmaq üzrəydi. Bunun suyu o hovuza gedir.

Bu hovuzun şimal-qərbində Sultan İskəndər bir bənd, bəndin də üstün-

də binalar tikdirmişdir. Bəndin yuxarı tərəfində yağmur mövsümündə sular yığılaraq böyük bir göl əmələ gətirir. Bu gölün şətq tərəfləri bağlıqdır.

Gölün bu **(340 a)** tərəfinə də yekparə daşdan taxtlar oyulmasını və qərb tərəfində bir məscid tikilməsini əmr etdim. Çərşənbə axşamı və çərşənbə günləri bu işlər üzündən Dulpurda qaldım.

Cümə axşamı günü hərəkət edib Çənbəl çayından keçərək günorta namazını çay sahilində qıldıqdan sonra iki namaz arasında Çənbəl sahilindən yenidən atlanıb axşamla yatsı arasında Kevari çayından keçib dincəldik. Yağmurlardan su yüksəlmişdi, atlar üzdürüldü və biz də gəmiylə keçdik.

Ertəsi cümə günü aşura idi. Oradan hərəkət edib yoldakı bir kənddə yemək yedikdən sonra yatsı vaxtı Güvalyardan şimala doğru bir küruh məsafədə olan və keçən il salınmasını əmr etdiyim çarbağa gəlib endim. Ertəsi gün günortadan sonra atlanaraq Güvalyarın şimal təpələrini gəzdikdən sonra gəlib Güvalyarin Racə Man-Singin sarayının bitişik olduğu Hati-Pul adlı qapısından girdim və ikindi vaxtı Rəhimdadin iqamət etdiyi Racə Bikermacitin sarayına gəlib endim.

O gecə qulağımdakı ağrı üzündən acı çəkdiyim üçün tiryək çəkdim - mehtab da buna səbəb oldu. Ertəsi gün tiryəkin yaratdığı baş ağrısı və sərsəmlik çox iztirab verdi. Çox qusdum. Halıma aldırmadan Man-Sing ilə Bikermacitin evlərinin hamısını gəzib baxdım. **(340 b)**

## GUVALYARDA BİR GƏZİNTİ

Parça-parça və ahəngsiz olmalarına baxmayaraq qəribə binalardır. Bu binaların hamısı yonulmuş daşdandır. Man-Singin binaları bütün racə binalarından daha yaxşı və daha hündürdür. Man-Singin binasının divarının bir yanı şərgə tərəfdır. Bu cəhətinə digərlərinə nəzərən daha artıq diqqət göstərmişlər. Hündürlüyü təxminən qırx-əlli karidir və bütünlüklə yonulmuş daşdandır. Üzü kirəclə ağardılmışdır. Bəzi yerləri dörd qatlıdır. Aşağı iki qatı çox qaranlıqdır, bir müddət oturduqdan sonra bir azcıq aydınlıq yaranır. Buraları şamla gəzdik. Bu binanın hər yanında beş kümbəz və kümbəzlərin aralarında da Hindisdan tərzində dördbucaq kiçık kümbəzlər vardır. Bu böyük beş kümbəzi altın suyu çəkilmiş mis təbəqələrlə örtmüşlər.

Divarların dış qismi yaşıl çinilərlə qaplanmışdır. Divarlara yaşıl çini ilə banan ağacları rəsm etmişlər. Şərq tərəfindəki bürcündə «hati» vardır. Buralılar filə «hati», qapıya da «pul» deyirlər. Bu qapının çıxışına üzərində iki filçi olan bir fil heykəli qoymuşlar, gerçək fil kimidir, çox bənzətmişlər. Bu üzdən də oraya Hati-Pul deyirlər **(34l a)**.

Dörd qatlı binanın ən aşağı qatının bu fil heykəli tərəfinə baxan bir pəncərəsi var, buradan fil çox yaxından görünür. Üst qatı isə söz etdiyim kümbəzlərdir. İkinci qatında yaşayış mənzilləri var. Bu mənzillər çuxurlar-

dadır. Bunlar Hindistan tərzində mükəmməl sayılacaq şəkildə tikilmiş olmaqla birlikdə bir az havasız yerlərdir.

Man-Singin oğlu Bikermacitin [Hindu] binaları isə kurqanın şimal tərəfində, ortada yerləşir. Oğlunun binaları atasınınkılar qədər deyil. Tikdiyi böyük kümbəz çox qaranlıqdır və ancaq bir müddət qaldıqdan sonra göz alışır. Bu böyük kümbəzin altında ondan bir az kiçık bir bina daha vardır və ona heç bir tərəfdən ışiq düşmür.

Bu böyük kümbəzin üstündə isə Rəhimdad bir az kiçık bir köşk tikdirmiş, özü də Bikermacitin evlərinə yerləşmişdir.

Bikermacitin bu binalarından atasının binalarına gedən bir yol çəkmişlər, dışarıdan heç bəlli deyil, içəridən də heç bir yer görünmür. Bəzi yerlərindən işıq düşür, qəribə bir yoldur.

Bu binaları gəzdikdən sonra Rəhimdadın tikdirdiyi mədrəsəni və kurqanın güney tərəfində böyük bir hovuzun kənarında yenə Rəhimdadın saldırdığı bağı gəzdik, gec vaxtda **(341 b)** ordunun endiyi çarbağa gəldik.

Bu bağa bir çox çiçək əkilmişdi. Parlaq qırmızı kənir bu bağda lap çox idi. Bu tərəflərin kəniri şaftalıçiçəyi rəngindədir. Güvalyarın kəniri isə qıpqırmızı və parlaqdır. Güvalyardan bir qədər qırmızı kənir gətirtərək Aqra bağlarına əkdirdim.

Bu bağın cənubunda böyük bir göl var. Yağmur mövsümünün suları burada yığılır. Bu gölün qərbində yüksək bir bütxana yerləşir. Sultan Şəmsəddin Eltutmuş bu bütxananın yanına böyük bir cami tikdirmişdir. Bütxana çox hündürdür, kurqanda ondan daha hündür bina yoxdur. Dulpur dağından baxanda Güvalyar kurqanı və bu bütxana çox yaxşı görünür. Bu bütxananın daşlarının hamısını oradakı böyük göldən qazıb gətirdiklərini söyləyirlər.

Bu bağda ağacdan bir köşk tikmişlər, bir az alçaq və formasızdır. Bağın qapısında Hindistan tərzində zövqsüz eyvanlar düzəltmişlər.

Ertəsi gün günorta vaxtı Güvalyarın hələ görümədiyimiz yerlərini gəzmək niyyətilə çıxaraq, Man-Singin kurqan dışındakı Badəlgər adlı binasını gəzdik və Hati-Pul qapısından girib Urva deyilən yerə getdik.

Bu Urva deyilən yer kurqanın qərb tərəfində yerləşən bir vadidir. Bu vadi dağın üstündə tikilən divar bəndinin dışında olsa da, onu çevrələyən iki sıra hündür divar çəkmişlər. Divarların hündürlüyü otuz-qırx kari qədər var. İç divar bir az daha uzundur. **(342 a)** Bu divar düzlüyün hər iki tərəfindəki kurqan divarıyla birləşdirilmişdir. Bu divarın ortasında və ondan bir az alçaq bir divar daha çəkmişlər, bu divar başdan-başa çəkilmiş deyil, bunu suya yön vermək üçün çəkmişlər. Bu duvarın içində də su almaq üçün bir vayin [quyu] qazmışlar. On-on beş pillə enərək suya çatırlar. Bu böyük divarın vayinli divara çıxan qapısının üstündə bir daşa Sultan Şəmsəddin Eltutmuşun adını həkk etmişlər, üstündəki tarix «səneyi-səlasinə və sittə miə»dir.[1]

[1] Hicri tarixlə 630-cu ildir (=1232/3).

Bu dış divarın altında, kurqanın dışında, böyük bir göl vardır. Anlaşıldığına görə, suyu azalan bir göl deyil. Bunun suyu məcraya axır. Urva deyilən bu yerin içində iki böyük göl daha vardır. Kurqan əhalisi bu göllərin suyunu digər sulara tərcih edir.

Urvanın üç tərəfi yekparə bir dağdır. Daşının rəngi Biyanə daşları qədər qırmızı olmayıb onlardan bir az daha rəngsizdir. Ətrafındakı yekparə qayaları qazıb böyük və kiçık bütlər oymuşlar. Güney tərəfində böyük bir büt var ki, hündürlüyü təxminən iyirmi kari qədərdir. Bu bütlərin hamısı çılpaqdır, ayıb yerləri belə örtüsüzdür, görünür.

Urvanın içindəki **(342 b)** iki böyük gölün ətrafına iyirmi-iyirmi beş quyu qazmışlar. Bu quyulardan su çəkib bağbanlıq edərək çiçək və ağaclar yetişdirmişlər. Urva gözəl bir yerdir. Qüsuru çevrəsindəki bütlərdir. Bütlərin yıxılmasını əmr etdim.

Urvadan çıxıb təkrar kurqana girərək kafirlərin zamanından bəri qapalı duran Sultan-Pulu gəzdikdən sonra axşam vaxtı Rəhimdadın saldırdığı bağa gəldim və gecəni o bağda keçirdim.

Çərşənbə axşamı günü, ayın on dördündə [=29 sentyabr] Rana Sankanın Bikermacit adlı ikinci oğlunun yanından adamlar gəldi. Özü anası Pedmavəti ilə birlikdə Rətənbur qalasında olurdu. Biz Güvalyarı gəzməyə getmədən öncə Bikermacitin Esuk adlı çox etibarlı nökəri tərəfindən göndərilən adamlar gəlmiş, qulluq və xidmətlərini təqdim edərək yetmiş leklik təxsisat verilmək şərtilə Rətənburu təslim etməyə hazır olduğunu bildirmisti. Biz də onun arzu etdiyi kimi pərgənələr ehsan edib adamlarına izin vermiş və Güvalyara gəzməyə gedəcəyimiz üçün orada yenidən görüşmək üzrə bəlli bir vaxt təyin etmişdik. Təyin olunan vaxtdan bir neçə gün gecikərək gəldilər.

Esuk deyilən bu hindu Bikermacitin anası Pedmavətinin yaxın qohumu **(343 a)** imiş. O, bu vəziyyəti ana ilə oğula izah etmiş, onlar da bu Esuk ilə birlikdə sədaqət və xidmətkarlığı qəbul etmişlər.

Sanka Sultan Mahmudu məğlub edib əlinə keçirəndə tac, küllah ilə altın kəmərini alıb özünü sərbəst buraxmışdı. O tac, küllah ilə altın kəmər Bikermacitdə imiş. Atasının yerinə rana[1] olaraq Çituru hələ əlində tutan böyük qardaşı Retensi tac, küllah ilə altın kəməri kiçık qardaşından istədiyi halda bu vermirmiş. Bu gələn adamlar vasitəsilə tac, küllah ilə altın kəməri mənə verəcəyinə söz vermiş və Rətənbura qarşılıq olaraq Biyanəni istəmişdi. Onları Biyanə sözündən vaz keçirərək Rətənburun əvəzinə Şəmsabadı vəd etdik. Yenə həmin gün gələn bu adamlara xələtlər geydirilərək doqquz gün içində Biyanəyə gəlmələri söylədik və getmələrinə izin verildi.

Bu bağdan hərəkət edib Guvalyarın bütxanalarını gəzdik. Bütxanaların bəziləri iki, bəziləri da üç qatlı idı. Qatları bir az alçaq və əski tərzdə idı. Ətraflarına daşdan heykəllər qazmışdılar. Bəzi bütxanalarda -mədrəsələrdə

[1] *Rana:* Hindistandakı yerli hökmdarların titulu.

olduğu kimi- taxtında böyük və hündür kümbəzlər ilə mədrəsə hücrələrinə bənzəyən hücrələr vardı. Hər hücrənin üstündə yonulmuş daşdan çoxlu kümbəz tikmişlər. Aşağı **(343 b)** hücrələrində daşdan heykəllər yonmuşlar.

Bu binaları gəzdikdən və Guvalyarin qərb tərəfindəki qapısından çıxıb kurqanın cənub tərəfindən dönərək oranı da gördükdən sonra Hati-Pulun önündə Rəhimdadın saldırdığı çarbağa gəldim.

Rəhimdad çarbağda bir ziyafət hazırlamışdı. Gözəl yeməklərin ikram edilməsindən sonra bir çox hədiyyə də təqdim etdi. Maldan və nəqddən dörd lek hədiyyə verdi. Sonra da bu çarbağdan hərəkət edərək gec vaxt öz bağıma gəldim.

Çərşənbə günü, ayın on beşində [=30 sentyabr] Guvalyarın cənub-şərq tərəfində olan və ondan altı küruh məsafədə yerləşən şəlaləni görməyə getdim. Yola bir az gec çıxmışdıq, şəlaləyə günorta vaxtından az sonra vardıq. On beş-on altı urğamçı[1] qədər hündür bir qayadan bir dəyirman işlədə biləcək qədər su şırıltıyla tökülürdü. Töküldüyü yerin bir az aşağısında böyük bir göl yaratmışdı. Bu su şəlaləyə gəlmədən öncə yekparə bir qayanın üstündən axır. Suyun yatağı yekparə bir daşdır. Müxtəlif yerlərdən tökülərək göl olmuşdur. Bu suyun kənarlarına da oturulacaq böyüklükdə parça-parça daşlar düşmüşdür. Lakin bu su daimi deyilmiş.

Şəlalənin yuxarısında oturaraq məcun yedik. Suyun başladığı nöqtəyə qədər yuxarı gedib buraları gəzdikdən sonra dönüb bir təpənin üstündə bir müddət oturduq. Sazəndələr saz çaldılar, xanəndələr **(344 a)** də bəzi şeylər oxudular. Hindlərin *tindu* dediyi abnus ağacı görməyənlərə göstərildi. Oradan dönüb dağdan enərək axşamla yatsı arasında yola qoyulduq. İkinci pasa doğru bir yerə gəlib uyuduq. Günün ilk pəhəri olanda da çarbağa gəldik.

Cümə günü, ayın on yeddisində Səlahəddinin doğulduğu Suhcənə deyilən kəndi və kəndin yuxarı tərəfində dağ arasında yerləşən bir vadidəki limon və sədafəl bağlarını gəzdikdən sonra ilk pəhərdə gəlib çarbağa endim.

Bazar günü, ayın on doqquzunda [=4 oktyabr] dan ağarmadan bir az öncə çarbağdan hərəkət edib Kevari çayını keçərək yemək yedik və günorta vaxtı oradan qalxıb günəş batarkən Çənbəl çayından keçmək surətiylə axşam ilə yatsı arasında Dulpur kurqanına girdik. Əbülfəthin [Türkmən] tikdirmiş olduğu hamamı məşəllə gəzdikdən sonra oradan hərəkət edib yeni çarbağm salındığı yerə, bənd başına gəlib endik.

Ertəsi gün tikilməsini əmr etdiyim yerləri dolaşdım. Yekparə daşdan tikilməsi əmr olunan üstü qapalı hovuzun üzünü bir dəfə belə tam cilalamamışdılar. Daşçıların sayını artıraraq əvvəlcə hovuzun içini tamamən oymalarını əmr etdim. İkindidən sonra hovuzun içini bir dəfə də tamamən cilaladılar. Su doldurmalarını əmr etdim. **(344 b)** Ətrafını su ilə ölçərək meylliliyi düzəltmək işiylə uğraşdılar. Bir də abdəstxana tikilməsini, onun döşəməsi-

[1] *Urğamçı* və ya *ərğəmçi:* Baburda yüksəklik ölçüsü kimi işlədilir.

nin və içindəki kiçık hovuzun da yekparə daşdan qazılmasını əmr etdim.

Bazar ertəsi günü məcun söhbəti keçirdik. Çərşənbə axşamı gecəsi də orada qaldım. Çərşənbə günü, iftar açaraq bəzi şeylər yedikdən sonra Sikriyə getmək niyyətilə yola çıxdim. İkinci pəhərə doğru bir yerə enib uyuduq. Qulağım, deyəsən, soyuğun təsiri ilə o gecə yaman ağrıdı, uyuya bilmədim.

Dan ağararkən oradan atlanaraq ilk pəhərdə Sikridə salılan bağa endik. Bağın divarı və quyu arzu etdiyim kimi olmadığı üçün çalışanlar təhdid edildi və cəzalandırıldı.

Sikridən ikindi ilə axşam arası hərəkət edib Medhakurdən keçərək bir yerə enib uyuduq. Oradan da ilk pəhərə doğru Aqraya gəldim və bəzi işləri üzündən Fəxri-Cahan bəyim ilə birlikdə gedə bilməmiş olan Xədicə Sultan bəyimi qalada ziyarət etdikdən sonra Cunu keçib Həşt-Behişt bağına getdim.

Şənbə günü, səfər ayının üçündə [=17 oktyabr] ikindi ilə axşam arasında Tutədən keçib məhəllələrin kənarında, çay sahilinə enmiş olan böyük xalalarımdan üç bəyimi – Gövhərşad bəyim, Bədiülcamal bəyim, Ağ bəyim və kiçık bəyimlərdən Xanzadə bəyim, Sultan Məsud Mirzənin qızı Sultanbəxt bəyimin qızı və yengə çiçəmin, yəni Zeynəb Sultan bəyimin nəvəsini **(345 a)** gedib gördüm. Oradan gəmiylə döndüm.

Bazar ertəsi günü, səfər ayının beşində [=19 oktyabr] Bikermacitin ilk və sonraki elçiləri ilə bxirəli hindulardan əski nökərim Divə oğlu Hamusu Rətənburun təslim olub bizə bağlılığının qəbul edilməsi ilə əlaqədar öz üsul və tərzlərinə görə əhd və şərt bağlaması üçün oraya göndərdim. Bizim bu gedən adamımız bütün bunları öz gözüylə görüb qənaət gətirdikdən sonra dönəcəkdi. O verdiyi sözü tutsa və Allah da rast gətirsə, mən də atasının yerinə onu rana təyin edib Çitur taxtına oturdacağımı vəd etdim.

## İSKƏNDƏRİN VƏ İBRAHİMİN XƏZİNƏLƏRİNİN TÜKƏNMƏSİ

O günlərdə İskəndər ilə İbrahimin Dehli ilə Aqradakı xəzinələri tükəndi. Ordunun silahlandırılması, top və tüfəngçilərin barutları və ülufələri üçün cümə axşamı günü, səfər ayının səkkizində [=22 oktyabr] təxsisatı olan hər kəsdən bu gəlirin yüzdə otuzunu divana verməsini, bunun da söylədiyim bu yolda sərf edilməsini əmr etdim.

Şənbə günü, ayın onunda [=24 oktyabr] Sultan Məhəmməd Bəxşinin bir dəfə Xorasan əhalisinə vəd fərmanları götürmüş olan Şah Qasım adlı piyadası təkrar Herata göndərildi.

Götürdüyü fərmanlarda bunlar yazılmışdı: Hindistanın şərq və qərb **(345 b)** tərəfindəki düşmənlər və kafirlər Allahın inayətilə bərtərəf edilmişdir. Bu yaz, Allah nəsib etsə, nə olursa-olsun, mütləq oraya gələcəyik.

Əhməd Əfşara da bir fərman göndərildi. Fərmanın kənarına öz əlimlə yazaraq Firidun Qopuzini istədim. O gün günorta civə yeməyə başladım.

Çərşənbə günü, ayın iyirmi birində [=4 noyabr] hindistanlı bir piyada [Baburun oğlu] Kamran [Mirzə] ilə Xoca Dost Xavəndin ərzi-hallarını gətirdi. Xoca Dost Xavənd zilhiccə ayının onunda Kabilə çatıb Hümayunun yanına getmək üzrə yola çıxmışdı. Xubiyana gələndə isə Kamranın bir adamı gəlib «Xoca gəlsin, nə kimi fərman varsa bildirsin, söylənəcək sözləri görüşdükdən sonra da getsin» demişdir. Kamran zilhiccə ayının on yeddisində [=2 sentyabr] Kabilə varmışdı. Xoca ilə danışdıqdan sonra da həmin ayın iyirmi səkkizində [=13 sentyabr] onu Qaleyi-Zəfərə göndəribmiş.

Gələn bu ərzi-hallarda yaxşı xəbərlər vardı. Şahzadə Təhmasib özbəkləri dəf etmək üçün hərəkətə keçmiş və özbək Renişi Damğanda yenərək adamlarını qılıncdan keçiribmiş. Übeyd xan da qızılbaşların hərəkətini qəti bir şəkildə öyrənincə Herat civarından qalxıb Mərvə gedərək Səmərqənddəki və o civardakı sultanları Mərvə dəvət edibmiş. Mavəraünnəhrdəki sultanların hamısı Mərvə yardıma gedibmiş. **(346 a)**

Hümayunun Yadigar Tağayinin qızından bir oğlu olmuş. Kamran da Kabildə evlənirmuş, dayısı Sultan Əli Mirzənin qızını alırmuş. Bu xəbərləri də həmin piyada gətirdi.

O gün Seyid Dəkni Şirazi Cibəgərə xələt geydirərək ehsanlarda bulundum və içmə suyu quyusunu bildiyi kimi tamamlamasını əmr etdim.

Cümə günü, ayın iyirmi üçündə [=6 noyabr] vücudumda bir hərarət yarandı. O dərəcədə ki, cümə namazını məsciddə güclə qıla bildim. Günorta namazı ehtiyatını da kitabxanamda bir müddət sonra zəhmətlə qıla bildim. Hərarət düşdü. Bazar günü yenidən istilik gəldi və bir az titrədim.

## BABUR XOCA ÜBEYDULLAHIN «VALİDİYYƏ» RİSALƏSİNİ NƏZMLƏ ÇEVİRİR

Çərşənbə axşamı günü gecəsi, səfər ayının iyirmi yeddisində [=10 noyabr] Xoca Übeydullah həzrətlərinin *Risaleyi-validəyyə*[1] əsərini çevirmək ağlıma gəldi. Həzrətin ruhuna sığınıb könlümdən «Əgər bu mənzumə o həzrət tərəfindən bəyənilsə -necə ki *Qəsideyi-bürdə*[2] sahibinin qəsidəsi bəyənilib özü fəlc xəstəliyindən qurtulmuşdu- və mən də bu xəstəlikdən qurtulsam, bu da nəzmimin qəbul olunduğuna bir dəlil olar» deyə düşündüm.

Bu niyyətlə rəməli-müsəddəsin zərb və əruzu məhbun, bəzən əbtər, bəzən də məhbun və məhzuf olan **(346 b)** vəznindəki -ki, Mövlana Əbdürrəhman Caminin *Sübha* əsəri də bu vəzndədir- risaləsini nəzm halında tərcümə etməyə başladım və o gecə on üç beyt çevirdim. Belə-belə hər gün on beytdən az tərcümə etmirdim. Deyəsən, bir gün ara verdim.

[1] Mətni Baburun «Seçilmiş əsərləri»nin (Bakı, MBM, 2011) 270-289-cu səhifəsindədir.

[2] *Qəsideyi-bürdə* (Xirqə haqqında qəsidə) VII əsri şairi Kəab bin Zübeyr tərəfindən hz. Məhəmmədin şərəfinə yazılmış bir əsərdir.

Keçən il də bir dəfə belə bir xəstəlik gəlmiş və ən az bir ay və ya qırx gün davam etmişdi. Allahın inayəti və həzrətin himmətiylə cümə axşamı günü, ayın iyirmi doqquzunda [=12 noyabr] xəstəlik bir az yqngqlləşdi, sonra bu xəstəlikdan qurtuldum.

Şənbə günü, rəbiüləvvəl ayının səkkizində [=20 noyabr] risalənin tərcüməsi tamamlandı. Bir gündə əlli iki beyt yazıldı.

Çərşənbə günü, səfər ayının iyirmi səkkizində [11 noyabr] ətrafdakı və civardakı əsgərlərə «Allah nəsib etsə, yaxın bir zamanda səfərə çıxacağıq, əsgər hazırlanaraq tez gəlsin» deyə fərman göndərilmişdi.

Bazar günü, rəbiüləvvəl ayının doqquzunda [=21 noyabr] bəy Məhəmməd Talikçi gəldi. Keçən il məhərrəm ayının axırında Hümayuna xələt və at götürmüşdü.

## HÜMAYUNUN OĞLUNUN DOĞULDUĞU XƏBƏRİNİN GƏLMƏSİ

Bazar ertəsi günü, ayın onunda Bəyginə Veys Lağarı və Hümayunun Bəyan Şeyx adlı bir nökəri Hümayunun yanından gəldilər. Bəyginə, Hümayunun oğlunun doğulduğu müjdəsini vermək üçün gəlmişdi. Uşağın adını Əlaman qoymuşlar.

Şeyx Əbülvəcd onun doğumuna **(347a)** «Şahi-səadətmənd»[1] tarixini tapmışmış.

Bəyan Şeyx isə Bəyginədən xeyli sonra yola çıxmış, cümə günü, səfər ayının doqquzunda [=23 oktyabr] Qişmin dibindəki Düşənbə deyilən yerdə Hümayundan ayrılmışdı. Çərşənbə axşamı günü, rəbiüləvvəl ayının onunda [=22 noyabr] Aqraya gəldi, tez gəldi, bu Bəyan Şeyx yenə bir dəfə Qaleyi-Zəfərdən Qəndəhara on bir gündə gəlmişdi.

Şahzadənin [Təhmasib] gəldiyi və özbəklərin yenildiyi xəbərini də bu Bəyan Şeyx gətirdi.

Təfsilatı belədir:

## QIZILBAŞ VƏ ÖZBƏKLƏRİN CAMDAKI SAVAŞI

Şahzadə Təhmasib qırx min adam ilə rum üsulu tüfəng və arabalar düzəldib İraqtan sürətlə gəlir, Bistam və Damğanda özbək Rənişi yenib adamlarını doğrayıb sürətlə keçir. Qızılbaşlar Kibək-Binin oğlu Qənbər Əlini də yenirlər və o da az bir qüvvə ilə Übeyd xanın yanına gəlir. Herat civarında qalmaq imkanı tapa bilməyən Übeyd xan isə Bəlx, Hisar, Səmərqənd və Daşkənddəki bütün xan və sultanlara çaparlar yollayıb özü də Mərvə gəlir. Xan və sultanlar dərhal toplaşırlar. Daşkənddən Süyünçük xanın ikinci oğlu Baraq Sultan, Səmərqənd və Miyan-Qaldan Küçüm xan, Əbu Səid Sultan,

[1] *Şahi-səadətmənd* əbcəd hesabı ilə 934 (=1528) edir.

Polad Sultan, **(347 b)** oğullarıyla birlikdə Cani bəy Sultan, Hisardan Həmzə Sultan ilə Mehdi Sultan və digər bütün sultanlar dərhal gəlib Mərvdə Übeyd xana qoşulurlar, yüz beş min adam yığılır.

Bunların casusu isə xəbər gətirir ki, şahzadə Təhmasib Übeyd xanın Herat civarında az bir əsgərlə oturmaqda olduğunu zənn etdiyi üçün qırx min adamla sürətlə gəlib, amma çoxlu qüvvənin yığıldığı xəbərini alınca Radəgan çayırında xəndəklər qazaraq yerləşib. Özbəklər bu xəbəri almaqla birlikdə düşməni heçə sayır, məsləhətləşib «Bütün xan və sultanlar Məşhəddə otururuq, qızılbaş ordugahının civarında olub düşmənin baş qaldırmasına imkan verməmək üçün bir neçə sultanı iyirmi min əsgərlə oraya təyin edərik. Günəş əqrəb bürcünə girincə də yadaçılara yada etməyi əmr edər və beləcə onları zəiflədib məğlub edərik» deyə qərar verir və Mərvdən qalxıb gedirlər.

Şahzadə isə Mərvdən çıxanlarla Cam və Xirgird civarında qarşılaşır və özbəklər yenilir, bir çox sultanları ələ keçirilib öldürülür.

Bu məktubda Küçüm xanın dışında **(348 a)** heç bir sultanın qurtulduğunun dəqiq bəlli olmadığını da yazmışdılar. Əsgər arasında olan sultanlardan hələ heç kim gəlməyibmiş. Hisardakı sultanlar Hisarı buraxıb çıxmışlar. İbrahim xanın [Cani] oğlu Çəlmə -ki, əsl adı İsmayıldır- Hisar kurqanında imiş.

## BABURUN HÜMAYUNA YAZDIĞI MƏKTUB

Yenə bu Bəyan Şeyx Hümayun ilə Kamrana [Mirzə] yazılan məktublarla birlikdə təcili geri göndərildi. Cümə günü, ayın on dördündə [=27 noyabr] məktub və yazılar hazırlanıb Bəyan Şeyxə təslim edilərək izin verildi. O da şənbə günü, ayın onbeşində Aqradan ayrıldı. Hümayuna yazılan məktubun surəti şudur:

«Həsrət və xiffətlə salamladıqdan sonra Hümayuna sözüm budur ki, bazar ertəsi günü, rəbiüləvvəl ayının onunda [=23 noyabr] Bəyginə ilə Bəyan Şeyx gəldilər.

Məktub və ərzi-hallar sayəsində oradakı vəziyyət açıqca anlaşıldı.

Şükr, vermiş sənə həq fərzəndə,
Sənə fərzəndü mənə dilbəndə

Tanrı təala belə sevinçləri mənə və sənə daima nəsib eyləsin, amin, ya rəbbül-aləmin. Adını Əlaman qoymusan. Allah mübarək etsin. Lakin özün yazdığın halda, düşünməmisən ki, çox işlənməsi üzündən xalq buna Ələma, ya da əl-Aman **(348 b)** deyər. Çünki belə əlif-lam adda az olur. Allah onun adını və zatını təqdis və mübarək etsin. Çox uzun illər və çox uzun zamanlar boyunca Əlamanı dövlət və səadətlə qorusun.

Tanrı təala öz fəzl və kərəmilə bizim işlərimizi düzəldir. O qədər ki, heç bir dövirdə belə olmamışdır.

Sonra, çərşənbə axşamı günü, ayın on birində, bu əsnada Bəlx əhalisinin Qurbanı dəvət edib içəriyə aldığı xəbəri gəldi.

Kamrana və Kabildəki bəylərə əmr edildi ki, gedib sənə qoşulsunlar. Lazım gəlsə Hisar ya da Səmərqənd tərəfinə gedər və Allahın inayəti ilə düşmənləri yenib vilayətləri alar, dostları şad, düşmənləri də dilxor edərsiniz, inşallahu təala. Bu sizlərin ən çox qılınc çalacaq zamanınızdır. Qapıya gələn işdə qüsur etməyin. Tənbəllik və səhlənkarlıq padşahlıqla bir araya sığmaz.

Cahangire təvəqqüf bər niyabəd,
Cahan anra buvəd kü beh şitabəd,
Həmə çizi zi ruyi kədxudai,
Sükun miyabəd illa padişahi[1].

*Cahangirlik durmaqla olmaz,*
*Dünya tələsməyi bacaranındır.*
*Hər işdə durub-dayanmaq olar,*
*Padşahlıqda durub-dayanmaq olmaz.*

Əgər tanrı inayəti ilə Bəlx və Hisar vilayətini asanlıqla ələ keçirilsə, Hisarda sənin adamın olsun, Bəlxdə Kamranın adamı. Əgər tanrı inayətiylə Səmərqənd də ələ keçirilsə, Səmərqənddə sən otur. Hisar vilayətini **(349 a)** inşallah xassə mülkü edəcəyəm. Əgər Kamran Bəlxi az saysa, bildirin, inşallah onun əskiyini də bu vilayətlərdən tamamlayarıq.

Sonra, daima riayət edilən bu qaydanı sən də bilirsən: altı hissə sənin olursa, beş hissə Kamranındır. Bu qaydaya daima riayət edərək bunun dışına çıxmayın. Onunla yaxşı rəftar et. Böyüklər səbrli olmalıdır. Ümid edirəm ki, sən də yaxşı rəftar edəcəksən. O da şəriətə hörmətkar yaxşı bir igiddir. O da mülazimət və sədaqətdə qüsur etməz.

Sonra, səndən bir az incimişəm, bu iki-üç ildən bəri heç bir adamın gəlmədi və mənim göndərdiyim adam da tam bir il sonra gəldi. Belə olarmı?

Sonra, məktublarında yalnızlıq, yalnızlıq deyirsən. Yalnızlıq padşahlıqda ayıbdır. Necə ki demişlər:

Əgər pay bəndi riza peş gir,
Və gər yek süvari səri xeş gir.
*Əgər ayağın bağlı isə razı ol,*
*Əgər tək atlı isən bildiyin kimi hərəkət et.*[2]

Heç bir zəncir padşahlıq zənciri kimi deyildir. Padşahliq ilə yalnızlıq bir araya sığmaz. Sonra, dediyim kimi, yazdığın məktubları oxumursan, çünki oxumaq **(349 b)** istəsəydin belə, oxuya bilməzdin, əgər oxuya bilsəydin, əlbəttə ki, dəyişdirərdin. Məktubunu ancaq zorlanaraq oxumaq mümkündür, lakin çox dumanlıdır. Mənsur müəmmanı heç kim görməmişdir.

---

[1] Nizaminin *Xosrov və Şirin* əsərindən.
[2] Sədi Şirazidən.

İmlan o qədər doğru olmamaqla birlikdə fəna deyildir.

İltifatı ta ilə yazımısan, qulancı isə ya ilə yazmısan.

Xəttin çətinliklə də olsa oxunur, lakin bu dumanlı sözlərindəki məna tam anlaşılmır. Hər halda məktub yazmaqdakı tənbəlliyin də bu üzdəndir. Təmtəraqlı yazmaq istəyirsən, ona görə də dumanlı olur. Bundan sonra sadə, açıq və bəsit sözlərlə yaz, sənə də daha az zəhmət olar, oxuyana da.

Sonra, böyük bir iş üçün gedirsən. İş görmüş, fikir və tədbir sahibi bəylər ilə danışıb məsləhətləşərək onların sözüylə hərəkət etməlisən.

Əgər mənim razı qalmağımı istəyirsənsə, yalnızlığı və xalqdan uzaq olmağı burax. Gündə iki dəfə kiçık qardaşını və bəyləri öz başına buraxmayaraq hüzuruna çağırıb nə iş olursa-olsun, bu sadiq dostlarla birlikdə danışıb məsləhətləşərək qərar verməlisin.

Sonra, Xoca Kəlan mənimlə çox səmimi münasibətdə olmağa alışmışdı. Sən də **(350 a)** ona qarşı mənim kimi hərəkət etməlisin.

Əgər tanrı inayətilə o tərəfdəki işlər yüngülləşsə və Kamrana ehtiyac olmasa, Kamran Bəlxdə sağlam adamlar qoyub özü mənim yanıma gəlsin.

Sonra, bu qədər fəth və zəfərlər Kabildə ikən oldu. Kabili uğur sayıram və onu xassə mülkü etdim. Heç biriniz ona tamah etməyin.

Sonra, yaxşı hərəkət edib Sultan Veysin könlünü almısan. Onu yanına alıb onun fikrilə hərəkət etməlisin. O, sözü dinlənəcək bir adamdır.

Əsgəri yaxşı yığıb yürüməlisən. Ağızdan söylənəcək sözləri Bəyan Şeyx bilir və söyləyəcək. Həsrətlə salam edirəm.

Cümə axşamı günü, rəbiüləvvəl ayının on üçündə [=26 noyabr] yazıldı. Kamran ilə Xoca Kəlana da bu məzmunda öz əlimlə məktublar yazdım.

## ƏSGƏRİNİN ŞƏRQƏ GÖNDƏRİLMƏSİ

Çərşənbə günü, ayın on doqquzunda [=2 dekabr] mirzələrı, sultanları, türk və hind əmirlərini çağırıb danışıb məsləhətləşərək buna qərar verildi: «Bu il də bir tərəfə mütləq səfər etmək lazımdır. Əsgəri bizdən bir az öncə Puraba hərəkət etsin. Qanq çayının digər yaxasındakı sultanlar və əmirlər də əsgərləri ilə birlikdə Əsgəriyə qoşulsunlar. Hansı tərəfə getmək münasib görülsə, oraya getsinlər».

Bunları yazıb şənbə günü, ayın **(350b)** iyirmi ikisində [=5 dekabr] on altı günlük bir müddət verilərək Qiyasəddin Qurçu başda Sultan Cüneyd Barlas olmaq üzərə Purab əmirlərinə qasid olaraq göndərildi.

Ağızdan söylənənlər isə bunlar idi: zərbzən, araba, tüfəng və digər savaş vasitələri hazırlanana qədər özümüzdən öncə Əsgəri göndərildi. Qanqın digər yaxasındakı bütün sultan və əmirlərə də hazırlanan kimi dərhal Əsgərinin yanında toplaşmaları əmr edildi: «Hansı tərəfə yürümək münasib görülsə, tanrının inayətilə o tərəfə hərəkət ediləcək. Oradakı dostlarla danışıb

məsləhətləşin, əgər mənim gəlməyimi zəruri edən bir şey olursa, mənim göndiyim adam gələr-gəlməz, inşaallahu təala, dərhal hərəkət edəcəyəm. Əgər benqallar tərəfimizi tutub bizə bağlı olsalar və orada mənim iştirakımı zəruri qılacaq bir iş olmasa, bunu da açıqca ərz edin. Boş durmaq olmaz, mən başqa tərəfə yürüyəcəyəm. Sizlər də dostlarla danışıb məsləhətləşərək Əsgəriylə birlikdə yürüyün və oradakı işlərə tanrı inayətilə bir xitam verin».

Şənbə günü, rəbiüləvvəl ayının iyirmi doqquzunda [=12 dekabr] Əsgəriyə qiymətli daşlar la bəzənmiş kəmərli bir xəncər ilə padşanə xələt geydirib bayraq, tuğ, nağara, cins atlar, on ədəd fil, bir qatar dəvə **(351a)** və digər padşahanə vasitələlər ehsan edərək, divana riəasət etməsinə qərar verdim. Mollasına və iki atəkəsinə də düyməli yeləklər, digər adamlarına isə üç dəfə doqquz paltar ehsan etdim.

Bazar günü, ayın sonuncu günündə isə  Sultan Məhəmməd Bəxşinm evinə getdim. Xalı sərib hədiyyələr gətirdi. Nəqd və mal olaraqla iki lekdən bir az artıq hədiyyə verdi. Hədiyyələrin təqdimatındansonra isə başqa bir otağına keçərək məcun yedik. Oradan da üçüncü pəhərdə çıxıb suyu keçərək, xəlvətxanaya gəldim.

## AQRA VƏ KABİL ARASINDA POÇT SİSTEMİNİN QURULMASI

Cümə axşamı günü, rəbiüləvvəl ayının dördündə [=17 dekabr] belə qərar verdim: «Çıxmaq bəy katiblik vəzifəsini yerinə yetirəcək Şahi Tamğaçıyla birlikdə Aqradan Kabilə qədər olan məsafəni ölçərək hər doqquz küruhda on iki kari hündürlükdə qüllə və üstündə bir otaq tikəcəklər, hər on səkkiz küruhda altı yam [poçt] atı bağlayacaqlar, yamçıya [poçtalyon] və mehtərə maaş və atlara yem təyin ediləcək. Elə buyuruldu ki, əgər bu poçt atı bağlanan yer bir xassə mülkünə yaxınsa, bu söylənənləri oradan təmin etsinlər, əgər hər hansı bir bəyin pərgənəsinə yaxınsa, bu işi o bəyin məsuliyyətinə versinlər».

O gün Çıxmaq ilə Şahi Aqradan ayrıldılar. Bu küruhlar milə görə Müəyyənləşdirildi. Necə ki *Mübəyyən*də belə deyilir: (351 b)

Dörd min qədəm bilə bir mil,
Bir küruh ona hind eli der, bil.

Dedilər bir yarım kari bir qədəm,
Hər xari bil ki vardır altı tutam.

Hər tutam dörd əlik[1], yenə hər əlik
Altı cəv ərzi buldu, bil bu bilik.

---

[1] Əlik çağatayca barmaq, cəv isə farsca arpa deməkdir.

Ölçü ipi, burada söyləndiyi kimi, bir qədəm = doqquz tutam = bir yarım kari hesabıyla qırx qədəm uzunluğunda müəyyən edildi ki, belə yüz ip bir küruh edir.

## ELÇİLƏRİN QATILDIĞI BİR ZİYAFƏT

Şənbə günü, ayın altısında [=19 dekabr] bir toy oldu. Qızılbaş, özbək və hind elçiləri bu ziyafətdə iştirak etdilər. Qızılbaş elçiləri mənim sağımda yetmiş-səksən kari uzaqlığa çadır qurdurularaq oraya oturduldular. Bəylərdən Yunus Əlinin da qızılbaşlarla birlikdə oturması əmr edildi. Solumda da eyni şəkildə özbək elçilərini oturdub bəylərdən Abdullahın [Kitabdar] da bunlarla birlikdə oturması əmr edildi.

Özüm isə yeni tikilən səkkizguşəlı və təzə otlarla örtülü köşkün şimal yönündə oturdum. Sağımda beş-altı kari uzaqda Toxta Buğa Sultan, Əsgəri, Xoca həzrətlərinin oğlu Xoca Əbdüşşəhid, Xoca Kəlan, Xoca Hüseyni, Xəlifə və Səmərqənddən gələn xocaların xidmətində olan hafiz və mollalar oturdular. Solumda isə beş-altı **(352 a)** kari uzaqda Məhəmməd Zaman Mirzə, Tan-Atmış Sultan, Seyid Rəfi, Seyid Rumi, Şeyx Əbülfəth, Şeyx Camali, Şeyx Şəhabəddin Ərəb və Seyid Dəkəni oturdular.

Bütün sultanlar, xanlar, irəli gələnlər və əmirlər yeməkdən öncə altın, gümüş və mis axçalar, qumaş və digər əşyalardan ibarət saçıqlar gətirdilər. Önümə bir xalı sərmələrini əmr etdim. Altın və gümüşü bu xalı üzərinə tökdülər. Qumaşları, bezləri və axça torbalarını isə altın və gümüşün yanına yığdılar.

Yeməkdən bir az öncə saçıqlar təqdim olunarkən azğın dəvələr ilə filləri qarşıdakı adada vuruşmağa saldılar. Bir neçə qoç da vuruşdurdular. Ondan sonra pəhlivanlar güləşdi.

Böyük yeməkdən sonra Xoca Əbdüşşəhid ilə Xoca Kəlana incə qumaşdan paltarlar və müvafiq xələtlər geydirildi. Molla Fərrux ilə Hafiz [Mir Katib] rəyasətində gələnlərə də yeləklər geydirildi. Küçüm xanın elçisi ilə Həsən Çələbinin kiçık qardaşına da qumaş başlıqlı və düyməli samur kürkləri və mövgelərinə uyğun xələtlər ehsan edildi. Əbu Səid Sultanın və Mehriban xanımın və oğlu Polad Sultanın elçilərinə və Şah Həsənin elçisinə düyməli yeləklər, qumaş **(352 b)** libaslar ehsan edildi. İki xocaya və iki böyük elçiyə -ki, kiçık xanın adamı ilə Həsən Çələbinin kiçık qardaşlarıdır- gümüş daşı ilə qızıl və qızıl daşı ilə gümüş çəkilərək ehsan edildi. Qızıl daşı[1] beşyüz misqaldır, Kabil daşı ilə bir sir edir. Gümüş daşı iki yüz əlli misqaldır və Kabil ölçüsüylə yarım sir edir.

Xoca Mir Sultana, oğullarına və digər elçilərə də altın və gümüşdən ehsanlar verildi. Yadigar Nasirə kəmərli bir xəncər ehsan edildi. Mir Mə-

[1] *Daş:* qiymətli şeyləri çəkməkdə istifadə edilən bir ağırlıq ölçüsü.

həmməd Calebana Qanq çayında körpü tikdiyi üçün uyğun bir ehsan verilmişdi. Bu Məhəmməd ilə tüfənfəndazlardan Pəhlivan Hacı Məhəmməd, Pəhlivan Bəhlul və Vəli Parsçıya da birər xəncər ehsan edildi. Ustad Əliqulunin oğluna da bir xəncər ehsan edildi. Seyid Davud Gərmsiriyə altın və gümüş ehsan edildi. Qızım Məsumə ilə oğlum Hindalın adamlarına da düyməli yeləklər və qumaş xələtlər ehsan edildi. Əndicandan və bizim vilayətsiz və vətənsiz dolaşdığımız yerlərdən, Suh və Hüşyardan gələnlərə də yeləklər, qumaş xələtlər, altın, gümüş və hər cür əşya ehsan edildi. Qurban ilə Şeyxinin adamlarına və Kahmərdin **(353 a)** rəiyyətlərinə də yenə bu tərzdə ehsanlar verildi.

Ziyafətdən sonra hind hoqqabazlarının gəlib oyunlarını göstərmələrini əmr etdim. Bunlar da gəlib hünərlərini göstərdilər. Hindistan hoqqabazları bizim tərəflərin hoqqabazlarında görünməyən bəzi hünərləri də göstərirlər. Bunların bir neçəsi budur: yeddi xalqadan birini alnına, ikisini dizlərinə yerləşdirib ikisini əl barmaqları, ikisini də ayaq barmaqlarıyla sürətli və durmadan döndərirlər. Bir də tovuz yürüyüşü kimi, bir əlini yerə dayayıb digər əli və iki ayağıyla üç halqayı sürətli və durmadan döndərirlər.

Bir də bizim tərəflərın hoqqabazlan iki ağacı ayaqlarına bağlayaraq kəndirbaz ayaqlığı düzəldib gəzirlər, Hindistan hoqqabazları isə bir ağacla ayaqlıq düzəldib bunu ayaqlarına bağlamadan yeriyirlər.

Bir də bizim tərəflərdə iki kəndirbaz bir-birinə tutunaraq iki mayallaq vururlar, hind kəndirbazları isə bir-birinə tutunaraq üç-dörd dəfə mayallaq vururlar.

Bir də bir kəndirbaz altı-yeddi kari uzunluğunda sırığın bir ucunu belinə dayayır, digər biri isə sırığa çıxıb **(353 b)** sırıq üstündə oyunlar göstərir.

Bir də kiçık bir kəndirbaz böyük bir kəndirbazın başına çıxıb hərəkət etmədən durur. Aşağıdakı cambaz sürətlə sağa-sola yürüyüb hünərlərini göstərərkən bu kiçık də o onun başında dimdik və hərəkətsiz duraraq, öz hünərlərini göstərir.

Bundan başqa, bir çox rəqqasələr də gəlib rəqs etdilər. Axşama doğru altın, gümüş və misdən bir çox para saçıldı. Böyük bir gurultu və izdiham oldu.

Axşam ilə yatsı arasında beş-altı yaxın dostu yanıma alıb oturtdum. Bir pəhərdən artıq oturduq. Ertəsi sabah ikinci pəhərdə gəmiyə minib Həşt-Behiştə gəldik.

Səfər hazırlığını tamamlamış olan Əsgəri bazar ertəsi günü gəlib hamamda izin alaraq şərqə doğru hərəkət etdi.

Çərşənbə axşamı günü Dulpurda tikilməsini əmr etdiyim hovuz və quyunu görməyə getdim. Bir pəhər və bir geridə bağdan atlanaraq gecənin ilk pasından beş geri keçəndə Dulpur bağına vardıq.

Cümə axşamı günü, ayın on birində [=24 dekabr] daş quyu, iyirmi altı

daş arx, daş sütun və yekparə qayadan qazılan arxlar tamamlanaraq, o günün üçüncü pəhərindən etibarən quyudan su çəkilməyə başlandı. Dulpurda çalışmaqda **(354 a)** olan daşçı, dülgər və işçilərə Aqradakı ustalar və işçilərə olduğu kimi ehsanlar verildi.

Quyu suyunun qoxusunun önünə keçmək üçün tədbir olsun deyə on beş gün boyunca gecə-gündüz heç durmadan çarxı döndürərək su çəkmələrini əmr etdik.

Cümə günü ilk pəhərə bir geri qalanda Dulpurdan hərəkət etdik. Günəş hələ batmamışdı ki çaydan keçdik.

## CAMDAKI QIZILBAŞ VƏ ÖZBƏK SAVAŞININ ŞAHİDİNİN SÖYLƏDİKLƏRİ

Çərşənbə axşamı günü, ayın on altısında [=29 dekabr] qızılbaş ilə özbək savaşında olan Div Sultanın adamı gəldi və bu bilgiləri verdi: Cam və Xırgird civarında aşura günü türkmənlər ilə özbəklər arasında səf hərbi olur. Sabahd an günortaya qədər vuruşurlar. Özbəklərin üç yüz min olduğunu söylədi, türkmənlər qırx-əlli min adammış, qaraltısını yüz min təxmin etdi. Lakin özbəklər öz adamlarını yüz beş min olaraq göstərirlər.

Qızılbaşlar rum tərzində arabalar, zərbzən və tüfəngəndazla dəstə-dəstə özlərini örtüb vuruşurlar. İki min araba və altı min tüfəngəndaz var imiş. Şahzadə və Cüha Sultan iyirmi min yaxşı igidlə birlikdə arabaların qurduğu sipərin içində durur, digər bəyləri isə arabaların dışında sağ və sol qolları **(354b)** nizamlayır. Özbəklər gələndə dışandakı adamları məğlub edib vura-vura sürür, arxadan mühasirəyə alıb dəvə və sursatı ələ keçirirlər. Axırda arabaların içindəkilər zənciri açıb dışarı çıxırlar. Burada müdhiş bir savaş olur. Özbəklər üç dəfə dönərək hücum edirlər. Tanrı təalanın inayəti ilə qızılbaşlar özbəkləri məğlub edirlər.

Küçüm xan, Übeyd xan və Əbu Səid Sultan başda olmaq üzrə doqquz sultan əsir düşür. Əbu Səid Sultan həyatda imiş; digər səkkiz sultan ölür. Übeyd Sultanın başını tapa bilmirlər, amma bədənini tapırlar. Özbəkdən əlli min və türkməndən isə iyirmi min adam tələf olur.

Həmin gün on altı günlük müddətlə Cunepura getmiş olan Qiyasəddin Qurçu gəldi. Sultan Cüneyd və adamları Haridə əsgər sövq etmişlər, bu üzdən zamanında yetişə bilməzlərmiş. Sultan Cüneyd ağızdan bunları söyləmiş: şükür ki, tanrı inayəti ilə bu tərəflərdə padşahın iştirakını vacıb qılan bir iş görünmür. Mirzə gəlsə və bu civardakı sultan, xan və əmirlərə Mirzə ilə birlikdə hərəkət etmələri fərman olsa, ümid edilir ki, bütün işlər asanlıqla gerçəkləşəcəkdir. **(355a)**

Gərçi Sultan Cüneyddən belə bir cavab gəldi, lakin kafir Sanka müharibəsindən sonra Molla Məhəmməd Məzhəb də Benqala elçi göndərilmişdi

və bugün-sabah gələcəyini söyləyirdilər. Onun xəbərini də gözlədik.

Cümə günü, ayın on doqquzunda [=l yanvar 1529] məcun yeyib bir neçə yaxın dostla xəlvətxanada otururdum, Molla Məhəmməd Məzhəb, axşam vaxtı, ki şənbə gecəsidir, gəlib mülazimət etdi. O tərəfdəki vəziyyəti bir-bir soruşub öyrəndik: benqallar bizə itaət edir və bizə tərəfdardırlar.

Bazar günü [=3 yanvar] türk və hind əmirlərini xəlvətxanaya çağıraraq danışıb məsləhətləşdik. Bu sözlər ortaya atıldı: benqallara elçi göndərərək onların bizə itaət etdiklərini və tərəfdar olduqlarını öyrəndik. Benqala getmək faydasızdır; çünki oranın civarında əsgərin işinə yarayacaq xəzinə yoxdur. Qərb tərəfində isə bəzi yerlər vardır ki, həm yaxındır, həm də xəzinələri vardır.

Malı vafir, eli kafir, yol yavuq,
Şərq sarı gər iraqdır, ol yavuq.

Axırda buna qərar verildi: mən qərb tərəfinə gedəcəyəm, yolumuz yaxın olduğu üçün bir neçə gün burada qalıb şərq tərəfindən arxayın olduqdan sonra **(355 b)** oraya yola düşəcəyəm.

Qiyasəddin Qurçuya iyirmi gün müddət verərək Qanq çayının digər tərəfindəki bütün sultan, xan və əmirlərin əsgərini ətrafına yığaraq bu asilərin üstünə yürümələrini bildirən fərmanlarla birlikdə təkrar Purab əmirlərinə qasid kimi göndərildi. Bu fərmanları oraya götürəcək, sonra da oradan xəbər alıb vaxtında gəlib bizə yetişəcəkdi.

## BƏLUCLARIN ÜSTÜNƏ YÜRÜŞ

O günlərdə bəluclarm gəlib bəzi yerləri yağmaladıqları haqqında Məhəmmədi Göyəldaşdan ərzi-hal gəldi. Bu işi Çin Teymur Sultana tapşıraraq Sihrind və Samanənin o tərəfində olan Adil Sultan, Sultan Məhəmməd Dulday, Xosrov Göyəldaş, Məhəmməd Əli Cəng-Cəng, Əbdüləziz Miraxur, Seyid Əli, Vəli Qızıl, Qaraca, Həlahil, Aşiq Bəkavul, Şeyx Əli, Kəttə, Gücür xan, Həsən Əli Səvadi kimi komandanların Cin-Teymur Sultanın ətrafında yığılaraq altı aylıq sursatla bəluclarm üstünə yürüməları, bu zaman hamının Cin-Teymur Sultanın bütün əmirlərinə tabe olması haqqında fərmanları götürməklə də Əbdülqaffar Tavaçıya həvalə olundu.

Verilən qərara görə, o, bu fərmanları öncə Çin Teymur Sultana götürəcək və ondan sonra adı çəkilən bəylərə **(356 a)** göstərəcəkdi. Bunların hamısının əsgərləri ilə birlikdə Çin Teymur Sultan tərəfindən təyin olunacaq toplanma yerinə gəlmələrini təmin edəcəkdi. Əbdülqaffar özü də səfərdə onlarla birlikdə olacaq və hər hansı bir adamda süstlük və səhlənkarlıq görsə bizə bildirəcəkdi, qüsur göstərənlər dərəcə və rütbələri alınaraq özləri vilayət və pərgənələrindən uzaqlaşdırılacaqdı.

Bu fərmanları verib ağızdan söylənəcək sözləri də söyləyərək Əbdül-

qaffarı yola saldıq.

Bazar gecəsi, ayın iyirmi səkkizində [=8 yanvar] saat üç pəhər və altı geri olanda Cundan keçərək Dulpurdakı Bağİ-Nilüfərə hərəkət etdik. Bazar günü, üçüncü pəhərə doğru bağa gəldik. Bağın ətrafında və civarında özlərinə bina və bağlar saldırmaları üçün bəy və elçilərə yer və yurd təyin edildi.

Cümə axşamı günü cəmadiyüləvvəl ayının üçündə [=14 yanvar] bağın cənub-qərb tərəfində hamam üçün bir yer seçdik. Hamam tikiləcək yeri düzəltdtilər. Bu düzəldilmiş yerdə hamamın təməlini qoyduqdan sonra hamamın inşa edilməsini və bir otağında bir hövzi-kəbir tikilməsini əmr etdim.

O gün Xəlifə Aqradan Qazı Ciya ilə Bir-Sing Divin ərzi-hallarını **(356 b)** göndərmişdi: Beharı İskəndərin oğlu Mahmud zəbt etmişdi. Bu xəbər gəlincə qoşun çəkmək niyyətilə ertəsi cümə günü, altıncı geridə Bağı- Nilufərdən atlanaraq axşam üstü Aqraya gəldik. Məhəmməd Zaman Mirzə də Dulpura gedirmiş, yolda bizə rast gəldi. Cin Teymur Sultan da o gün Agraya gəlmişdi.

Şənbə günü, bəylər məsləhətə dəvət edildi və cümə axşamı günü, ayın onunda [=21 yanvar] Puraba doğru hərəkətə keçilməsinə qərar verildi.

Həmin şənbə günü Kabildən məktub və xəbər gəldi: Hümayun o tərəfdəki əsgəri yığıb Sultan Veysi də yanına alaraq qırx-əlli minə yaxın adamla Səmərqəndin üzərinə hərəkətə keçmişdi. Termizdən yürüyüb Qabadiyanı alan Tursun Məhəmməd Sultan kömək istəmişdi. Hümayun da Tülək Göyəldaş ilə Mir Hurdu izdihamlı bir qüvvə və mövcud moğollarla birlikdə Tursun Sultana yardıma göndərmiş, sonra, özü də arxasından hərəkət etmişdi.

## BABUR ŞƏRQ SƏFƏRİNƏ HAZIRLAŞIR

Cümə axşamı günü, cəmadiyüləvvəl ayının onunda [=21 yanvar] üçüncü geridən sonra Puraba getmək üzərə yola çıxıb Cəlisir kəndindən bir az yuxarıda **(357a)** Cundan gəmiylə keçərək Bağı-Zərəfşana gəldim.

Tuğ, nağara, axır və bütün əsgərin bağın qarşısına, suyun digər tərəfinə enmələri və hüzura çıxacaq adamların suyu gəmiylə keçərək gəlmələri əmr edildi.

Şənbə günü benqal elçisi İsmayıl Mita benqalların hədiyyələrini gətirib Hindistan tərzində mülazimət etdi. Bir ox atımı yerə qədər gəlib sayğılarını ərz etdikdən sonra geri döndü. Sir-muyinə dedikləri xələti geydirib gətirdilər. Bizim tərzdə üç dəfə yükünərək gəlib Nüsrət şahın ərzi-halını verdi və gətirdiyi hədiyyələri təqdim edib geri qayıtdı.

Bazar ertəsi günü Xoca Əbdülhaq gəldi, gəmiylə sudan keçərək Xocanın çadırına gedib mülazimət etdim. Çərşənbə axşamı günü də Həsən Çələbi gəlib mülazimət etdi.

Əsgərin hazırlıqlarını tamamlamaq üzrə bir neçə gün çarbağda qaldıq.

Cümə axşamı günü, ayın on yeddisində [=27 yanvar] üçüncü geridən sonra oradan qalxıb atlandıq. Mən gəmiylə hərəkət etdim. Aqradan yeddi küruh məsafədə yerləşən Ənvar kəndinə endik.

Bazar günü özbək elçilərinə qayıtmaları üçün izin verdim. Küçüm xanın elçisi Əmin **(357 b)** Mirzəyə kəmərli bir xəncər, altın dibalı bir yelək və yetmiş min təngə ehsan edildi. Əbu Səid Sultanın adamı Molla Tağayiyə və Mehriban xanım ilə oğlu Polad Sultanın adamlarına düyməli yeləklər və qumaş xələtlər geydirildi. Bunlara da vəziyyətlərinə görə pul ehsan olundu.

Ertəsi gün, Xoca Əbdülhaqın Aqrada qalması, özbək xan və sultanlarının göndərdiyi Xoca Yəhyanın nəvəsi Xoca Kəlanın isə Səmərqəndə getməsi üçün izin verildi.

Hümayunun oğlunun doğulmasını və Kamranın evlənməsini təbrik etmək üçün on min şahruxi hədiyyə ilə birlikdə Mirzə Təbrizi və Mirzə bəy Tağayi göndərildi. Hər iki Mirzəyə də öz geydiyim paltar və bağladığım kəmər göndərildi. Hindu Molla Behişti vasitəsilə dəyərli daşlarla işlənmiş kəmərli bir xəncər, yenə dəyərli daşlarla işlənmiş davat, sədəflə işlənmiş bir qutu, öz geydiyim qısa bir paltar, qurşaq, Baburi xəttinin müfrədatı və bu yazıyla yazılmış qitələr göndərildi. Hümayuna Hindistana gələndən bəri yazdığım şeirlər və tərcümələr göndərildi. Hindal ilə Xoca Kəlana da tərcümələr və şeirlər göndərildi. Kamrana da Mirzə bəy Tağayi vasitəsilə tərcümə, Hindistana gələndən bəri söylənən şeirlər və Baburi xəttilə yazılan məktub örnəkləri göndərildi.

Çərşənbə axşamı günü Kabilə gedəcək adamlara məktublar yazılaraq izin verildikdən sonra Molla Qasım, Ustad Şah Məhəmməd Səngtraş, Mirək, Mir Qiyas, **(358 a)** Mir Səngtraş və Şah Baba Bildara Aqra və Dulpurda tikiləcək binalara dair izahatlar verilərək bu işlər onlara tapşırıldı və getmələrinə izin verildi.

İlk pəhər yaxınlaşmışdı ki, Ənvardan atlandıq. Günorta sonuna doğru Çəndvarın bir küruhunda yerləşən Əbapur adlı kəndə endik.

Cümə axşamı axşamı Əbdülmülük Qurçunu Həsən Çələbiylə birlikdə şahın [Şahzadə Təhmasib] yanına, [İbrahim] Çapıq isə özbək elçiləri ilə birlikdə xanların və sultanların yanlarına göndərildi. Gecənin bitməsinə dörd geri qala Əbapurdan qalxıb dan ağararkən gəlib Çəndvar qarşısından gəmiyə mindim. Axşam üstü Rabiri önündə gəmidən çıxıb ordugaha gəldim. Ordu Fəthpura enmişdi.

Fəthpurda bir gün qalıb şənbə günü səhər vaxtı abdəst alıb atlanaraq sabah namazını Rabirinin yaxınında camaatlə qıldıq. Mövlana Mahmud Fərabi imamdı. Günəş doğarkən Rabirinin böyük dirsəyinin aşağısından gəmiyə mindik. O gün tərkib xəttilə yazmaq istədiyim tərcümə üçün on bir sətrlik bir mistar cızdım. O gün vəlilərin sözlərindən könlümə bir ilham doldu.

Rabiri pərgənələrindən olan Cakin adlı pərgənənin qarşısında gəmiləri

sahilə çəkib o axşam gəmidə qaldıq. Oradan da sabahdan bir az əvvəl **(358 b)** gəmiləri hərəkətə keçirib bu arada sabah namazını qıldıq.

Mən gəmidə ikən Sultan Məhəmməd Bəxşi yanıma Xoca Kəlanın adamı olan Şəmsəddin Məhəmmədi gətirdi. Məktubdan və sözlərindən Kabildəki vəziyyəti tam olaraq öyrəndim. Mehdi Xoca da mən gəmidə ikən gəldi.

Günortadan bir az əvvəl Ətavənin önündəki çayın digər tərəfində olan bağa çıxaraq Cunda qüsl edib günorta namazını qıldım. Namaz qılınan yerdən bir az Ətavə tərəfinə gələrək həmin bağın ağaclarının kölgəsində çaya baxan bir təpə üstündə oturub igidlərin çalıb-oxumasını dinlədik. Mehdi Xocanın ikram etdiyi yeməyi burada yedik. Axşam üstü çayı keçib yatsı vaxtı ordugaha gəldim.

Əsgərin yığılması və Şəmsəddin Məhəmməd vasitəsilə Kabildəkilərə məktublar yazılması üçün o yurdda iki-üç gün qaldıq.

Çərşənbə günü, cəmadiyüləvvəl ayının sonuncu günü [=9 fevral] Ətavədən hərəkət edib səkkiz küruh getdikdən sonra Muri və Edusəyə endik.

Kabilə gedəcək məktubların qalanlarından bəziləri orada yazıldı. Hümayuna göndərilən məktubun məzmunu bu idi: əgər indilik uğraşacaq bir iş yoxsa, oğurluğun və çapulçuluğun qarşısı alınmalı, heç kimin asayişi pozmasına yol verilməməli, **(359 a)** Kabil vilayətini xassə mülkünə daxil etdiyim üçün uşaqlardan heç kim ona tamah salmamalıdır. Sonra Hindalı da çağırmışdım. Bundan başqa, Kamranın şahzadə ilə yaxşı münasibətlər qurmağa çalışması, Multan vilayətinin ona ehsan edildiyi, Kabil vilayətinin xassə mülkü elan oldunğu, ailəmlə saray ağırlıqlarının buraya gəlməsi yazılmışdı.

## XOCA KƏLANA MƏKTUB

Bəzi keyfiyyətlər isə Xoca Kəlana yazılan məktubdan bəlli olacağı üçün o məktubun bir surətini olduğu kimi burada verirəm:

«Xoca Kəlana salam dedikdən sonra söz budur: Şəmsəddin Məhəmməd biz Ətavədə ikən gəldi. Vəziyyəti öyrəndim. O tərəflərə getmək arzusu sonsuzdur. Hindistan işləri də yoluna girməkdədir. Ulu tanrıdan diləyirəm ki, buranın işi tanrı təalanın inayətilə tezliklə sona çatsın. Bu iş bitdikdən sonra Allah nəsib etsə dərhal hərəkət edəcəyim. O vilayətlərin gözəlliyini insan necə unuda bilər? Xüsusilə də belə tövbəli olunca, qovun və üzüm kimi məşru zövqləri insan ağlından necə çıxara bilər? Bugünlərdə bir qovun gətirmişdilər, kəsib yeyəndə mənə çox təsir etdi. Az qala ağlayacaqdım.

Kabilin heç cür zəbt və rəbt altına alına bilmədiyi **(359 b)** yazılmışdı. Axırda könül bunda qərar buldu: əgər bir vilayətdə yeddi-səkkiz hakim olsa, ora necə itaətkar və möhkəm olar? Buna görə də böyük bacımı və hərəmləri Hindistana çağırdım.

Kabilin bütün vilayət və qəryələrini xassə mülkü elədim. Hümayun ilə

Kamrana da bu xüsusu izah edərək yazdım. Yaxşı bir adam o məktubları mirzələrə götürsün. Bundan əvvəl də bu xüsusa dair mirzələrə məktub yazıb göndərmişdim. Hər halda məlum olmuşdur. İndi o vilayətin idarəsı və abadlığı heç bir bəhanə və maneə qalmadı. Bundan sonra, əgər kurqan möhkəm və xalq razı olmasa, azuqə tapılmasa, ya da xəzinə dolmasa, bu vəziyyətin idarə edənin iqtidarsızlığı üzündən olduğu düşünüləcəkdir. Gərəkli olan bəzi işlər yazılacaqdır. Bəzisi üçün fərman da getmişdir. Bu işlərdən artan para, xəzinəyə yatırılsın.

Gərəkli olan işlər bunlardır: öncə kurqanın təmiri, azuqə, gələn-gedən elçilərin məsrəfləri, caminin tikilməsi üçün pulu maldan alaraq sərf etsinlər. Karvansara və hamamların təmiri, ərkdə Ustad Həsən Əlinin bişmiş kərpiclə tikməyə başlayıb yarımçıq qalan binanın tamamlanması işi **(360 a)** onun özü ilə danışılıb məsləhətləşərək uyğun bir plan içərisində davam etdirilsin. Ustad Həsən Əlinin çəkdiyi əski layihə uyğunsa, o şəkildə tamamlansın, yoxsa fikir birliyiylə gözəl bir layihə üzrə tikilsin. Elə ki, onun döşəməsi divanxana döşəməsi ilə bir səviyyədə olsun.

Xurd-Kabil bəndi boğazın Xurd-Kabil tərəfinə çıxdığı yerdə Büthaq çayına bağlanmalıdır. Qəznə bəndini təmir edin. Baği-Xiıyabana gəlincə, bu bağın suyu azdır, buraya da bir dəyirman işlədə biləcək qədər suyun tapılıb gətirilməsi lazımdır.

Xoca-Bəstənin cənub-qərb tərəfində Tutum-Dərə çayını bir təpə üstünə gətirtərək oraya hovuz tikib fidanlar əkdirmişdim. Güzərgahın qarşısında yerləşdiyi, gözəl və geniş bir mənzərəsi olduğu üçün oraya Nəzərgah adı verilmişdi. Oraya da gözəl fidanlar əkmək və plan daxilində çəmənliklər yaradıb ətrafına gözəl rəngli, gözəl rayihəli gül və reyhanlar əkmək lazımdır.

Seyid Qasım da köməkçi dəstənin başçısı təyin edildi.

Tüfəngəndazlarla Ustad Məhəmməd Əmin Cəbəçinin əhvalından qafil olmayın.

Bu məktub gələn kimi, dərhal böyük bacımı və hərəmləri yola çıxarıb Nilaba qədər **(360 b)** qılavuzluq edin. Bu məktub gələn kimi, ən gec bir həftə sonra mütləq yola çıxsınlar. Yoxsa Hindistandan gedən əsgər dar yerdə sıxıntı çəkər, vilayət də xarab olar.

Sonra, Abdullaha [Kitabdar] yazılan məktubda tövbə işindəki uğurlar haqqında çox mübaliğəyə yol verilmişdi. Bu rübai buna bir az engəl oldu.

Mey tərkini qılalı pərişandır mən,
Bilmən qılar işimiyü heyrandır mən,
El bütün peşiman olub tövbə qılar,
Min tövbə qılıb mənü peşimandır mən.

Bənnainin bir nüktəsi xatırimə gəldi. Bir gün Bənnai Əlişir bəyin [Nəvai] hüzurunda bir nüktə edir. Əlişir bəy düyməli bir yelək geyibşmiş. Bu üzdən belə deyir: «Nəğz zərafəti kərdi, çəkmənra midadəm, vəli tügməha

nəmemand və mane əst» (*Gözəl bir nüktə etdin. Sənə yeləyimi verərdim, amma düymələri buraxmır və mane olur).* Bənnai isə belə deyir: «Tügməha çi mane əst, badigəha mane əst» (*düymələr mane deyil, ilgəklər manedir).*

Vəl üxdətü əlar-ravi (Günahı söyləyənin boynuna). Belə zarafatı məzur görün və tanrı xatirinə, inciməyin.

Sonra, o rübaini keçən il söyləmişdim. Gerçəkdən də bu ötən iki il şərab məclisinə duyduğum arzu və həsrət sonsuz idi. O dərəcədə ki, şəraba duyduğum həsrətdən bəzən ağlamaq həddinə gəlirdim. Bu il, əlhəmdülillah, o sıxıntı könlümdən tamamilə silindi. Hər halda tərcüməni nəzm etməyimin **(361 a)** isabəti və bərəkətindəndir.

Siz də tövbə edin. Söhbət və şərab həmsöhbət və həmbadə ilə xoşdur ki, söhbət edəsiniz və şərab içəsiniz. Əgər həmsöhbət və həmbadə Şir Əhmədlə Heydərqulu isə bu tövbə o qədər da ağır olmayacaq. Arzuməndliklə salam.

Cümə axşamı günü, cəmadiyülaxır ayının ilk günündə [=10 fevral] yazıldı».

Bu nəsihətamiz sözləri yazdığım zaman mənə fövqəladə təsir etdi. Bu məktubları Şəmsəddin Məhəmmədə təslim edib ağızdan söylənəcək sözləri də söylədikdən sonra cümə gecəsi getməsinə izin verdim.

Cümə günü səkkiz küruh qədər gedib Cüvaməndnaya endik. Kitin-Qara Sultan bir adamını elçi olaraq gələn Kəmaləddin Qıyaq adlı nökərin yanına göndərmiş, sərhəd bəylərinin necə yaşayıb nələr etdikləri haqqında, oğru və quldurlardan şikayət edən bəzi şeylər yazmışdı. Qıyaq da həmin adamı buraya göndərmişdi. Qıyağa gərəkli izin verib sərhəd bəylərinə oğru və quldurları ram etmək, yaxşı yaşamaq və hərəkət etmək barədə fərmanlar göndərdim. Bu fərmanları Kitin-Qara Sultandan gələn adama təslim etdikdən sonra biz bu yurdda ikən onun getməsinə izin verdik.

Həsən Çələbidən Şahqulu adında bir adam gəlib [özbək-qızılbaş] savaşı haqqındakı keyfiyyətini ərz etmişdi. **(361 b)** Şahqulu vasitəsilə şaha [şahzadə Təhmasib] məktub yazaraq Həsən Çələbinin gecikməsini üzrlü sayıb cümə günü, ayın ikisində [=11 fevral] getməsinə izin verildi.

Şənbə günü səkkiz küruh yürüyüb yenə Kalpi pərgənələrindən olan Kəkura və Çeçavəliyə endik.

Bazar günü, ayın dördündə [=13 fevral] doqquz küruh gedib Kalpi pərgənələrindən olan Didəpur adlı pərgənədə başımı qırxdlm. İki aydan bəri başımı qırxmamışdım. Səngər çayında qüsl etdim.

Bazar ertəsi günü on dörd küruh gedib Kalpi pərgənələrindən Çərkədəyə endik.

Çərşənbə axşamı günü, ayın altısında Qaraçanın hindistanlı bir köləsi Mahım bəyimin Qaraçaya yazdığı fərmanı gətirdi. Mahım gəlirmiş. Mənim əvvəlcə öz əlimlə yazdığım üslubda pərvanə yazıb Lahor, Bxirə və o civar-

dan keçərkən qılavuz istəmişdi. Bu fərmanı cəmadiyüləvvəl ayının yeddisində [=17 yanvar] Kabildən yazmışdır.

Çərşənbə günü yeddi küruh gedilərək Adəmpur pərgənəsinə endik. O gün, dan ağarmadan tək başıma alanıb günorta üstü Cun çayına vardım. Cun sahilindən aşağıya doğru getdim. Adəmpur qarşısına gələndə bir adada ordugahın yaxınlığında çadırlar qurduraraq məcun yedim.

O gün **(362 a)** Sadiq ilə Külalı güreşdirdik. Külal iddiayla gəlmiş və Aqrada güləşmək üçün yorğunluğunu göstərərək iyirmi gün vaxt istəmişdi. Artıq qırx-əlli gün keçmiş olduğu üçün güləşməyə məcbur oldu. Sadiq yaxşı güləşdi və onu çox asanca yerə sərdi. Sadiqə on min təngə, yəhərli bir at, bir dəst paltar və düyməli bir yelək ehsan edildi. Kəlali isə məğlub olmasına baxmayaraq bir dəst paltaryla üç min təngə hədiyyə aldı.

Arabaları və topları gəmilərdən çıxarmağı əmr etdim. Yer düzəldərək, yol çəkərək arabaları və topları çıxarana qədər bu yurdda üç-dörd gün qaldıq.

Bazar ertəsi günü, ayın on ikisində [=21 fevral] on iki küruh gedib Kürrəyə endik. O gün təxti-rəvanla getdim. Kürrədən on iki küruh gedib Kərrə pərgənələrindən Küryəyə endik. Küryədən də səkkiz küruh yürüyərək Saray-Məndaya endik.

Buraya endiyimiz yatsı vaxtında Sultan Cəlaləddin gəlib mülazimət etdi. İki kiçicik oğlunu da özü ilə birlikdə gətirmişdi.

Şənbə günü, ayın on yeddisində [=26 fevral] səkkiz küruh gedib Kərrə pərgənəsindən Qanq sahilində Düydüyüyə endik. Məhəmməd Sultan **(362 b)** Mirzə, Qasım Hüseyn Sultan, Bixub Sultan və Turdukə biz orada ikən gəldilər.

Bazar ertəsi günü, Əsgəri də bu yurdda ikən gəlib mülazimət etdi. Bu gələnlərin hamısı Qanqın şərq tərəfindən gəlmişdilər. Əsgərinin adamlarıyla birlikdə Qanqın qarşı sahilindən irəliləməsi və ordu harada güşərgə salsa, onların da tam qarşı tərəfdə düşərgə salmaları əmr edildi.

Biz o civarda ikən irəlidən bir-biri ardına xəbərlər gəlirdi: Sultan Mahmudun yanında yüz min əfqan toplaşmışdı. Şeyx Bəyazid ilə Bibəni bir çox əsgərlə birlikdə Sərvar tərəfinə göndərib özü və Fəth xan Sərvani də Qanq sahilini təqib edərək Çünar üzərinə gəlirmiş. Keçən il bir çox pərgənə verərək bu civarda qoyduğumuz Şir xan Sur da əfqanlara qoşulmuşdu. Şir xan ilə digər bir neçə əmiri çayın qarşı tərəfinə keçmişlər. Sultan Cəlaləddinin adamları Benaresi müdafiə etməyərək qaçıb çıxmışlar. Benares kurqanında qüvvə qoyaraq Qanq sahilinə gəlib vuruşacaqlarını söyləyirmişlər.

Düydüyüdən qalxıb altı küruh irəlilədikdən sonra Kərrədən üç-dörd küruh məsafədə yrləşən Küsara endik. Mən gəmiylə gəldim. Sultan **(363 a)** Cəlaləddinin ziyafəti ilə əlaqədar iki-üç gün bu yurdda qaldıq.

Cümə günü Kərrə qalasının içində Sultan Cəlaləddinin evlərinə endik. Ev sahibi sifəti ilə bizə yemək və təam ikram etdi. Yeməkdən sonra özünə

və uşaqlarına tikışsiz libaslar geydirildi. Arzusuna uyğun olaraq böyük oğluna Sultan Mahmud ünvanı verildi.

Kərrədən hərəkət edərək bir küruh qədər irəlilədikdən sonra Qanq sahilinə endik. Orada ikən Mahım bəyim tərəfindən gəlmiş olan Şəhrək bəyə o gün məktub verərək getməsinə izin verdim. Xoca Yəhyanın nəvəsi Xoca Kəlan isə məndən yazmaqda olduğum *Vəqayeni* istəmişdi. Surətini çıxartdırmışdım, onu da Şəhrək vasitəsilə göndərdim.

Şənbə günü qalxıb dörd küruh gedərək dincəldik. Mən yenə gəmiylə getdim. Enəcək yer yaxın imiş, erkən gəldik. Bir müddət sonra gəminin içində məcun yedik. Xoca Əbdüşşəhid Nur bəyin çadırındaymış, dəvət etdik. Molla Mahmudu da Molla Əlixanın çadırından çağırdıq. Bir müddət oturduqdan sonra gəmi ilə qarşı tərəfə keçib güləşçiləri gürəşdirdik. Dost Yasinxeyrə pəhlivan **(363 b)** Sadiqlə deyil, digərləri ilə güləşməsi əmr edildi. Qaydaya zidd olmasına baxmayaraq, onun daha qüvvətlilərlə güləşməsi əmr edildi. Səkkiz adamla yaxşı güləşdi.

İkindi çağı Sultan Məhəmməd Bəxşi qayıqla o tərəfdən gəldi və asilərin Sultan Mahmud dediyi Sultan İskəndər oğlu Mahmud xanın məğlubiyyət xəbərini gətirdi. Günorta üstü buradan gedən casus da asilərin məğlubiyyət xəbərini gətirdi. Günorta ilə ikindi arasında gələn Tac xan Sarənghaninin ərzi-halı də casusun xəbərinə uyğundu.

Sultan Məhəmməd gəlib təfsilatı nəql etdi. Düşmən gəlib Çünarı mühasirəyə almış, bir az savaşmış, lakin bizim gəldiyimiz dəqiqləşən kimi oradan getmişdir. Benaresə keçən əfqanlar da təlaşla geri dönüb suyu keçəndə iki gəmi batmış və xeyli adamları boğulmuşdur.

Ertəsi gün altı küruh yürüyərək Piyaq pərgənələrindən Siravəliyə gəldik. Mən gəmiylə gəldim. Çin Teymur Sultan ilə Toxta Buğa Sultan yarı yolda hüzura qəbul edilmək üçün gözləmişdilər. Sultanları da gəmiyə dəvət etdim. Toxta Buğa Sultan yada daşı ilə sehir etmişdi. Şiddətli bir külək qopub yağmur yağmağa başladı. Gözəl bir hava oldu. Bu hava məcun yeməmizə səbəb oldu. Keçən gün məcun yediyimizə baxmayaraq bugün də yedik. Yurda gedib ertəsi gün də orada qaldıq.

Çərşənbə axşamı günü təkrar atlandıq. Ordugahın qarşısında yaşıl və böyük bir ada vardı. Gəmiylə oraya keçib adayı gəzdikdən sonra ilk pəhərdə təkrar gəmiyə girdim.

At üzərində çay kənarında gedərkən bir qayanın üstündən keçdim. At çatlamış qayanın üstünə çıxanda qaya uçdu. Mən dərhal sıçrayaraq özümü kənara atdım. At isə uçmadı. Atın üzərində qalmış olsaydım, çox ehtimal ki, atla birlikdə yuvarlanacaqdıq.

O gün Qanq çayını qulac ataraq keçdim. Hər qulacı saydım, otuz üç qulacla keçdim və orada dincəlmədən geri üzərək təkrar bu tərəfə keçdim. Bütün çaylari üzərək keçmişdim, bircə Qanq çayı qalmışdı.

Axşam üstü Qanq çayının Cun çayı ilə birləşdiyi yerə qədər gedib Piyaq tərəfindən gəmini çəkdirərək ilk pəhərin dördüncü gerisində ordugaha gəldim.

Çərşənbə günü, ikinci pəhərdən etibarən əsgər Cun çayından keçməyə başladı. Dörd yüz iyirmi gəmi vardı.

Cümə günü, rəcəb ayının ilk günü [=11 mart] suyu keçdim.

Bazar ertəsi günü, ayın dördündə [=14 mart] Behara getmək niyyətilə Cun sahilindən hərəkət etdik və beş küruh gedib Ləvayinə endik. Mən gəmiylə getdim. O günə qədər əsgərlər hələ sudan keçirdi. Adəmpurda gəmilərdən çıxarılmış olan zərbzənli arabaları Piyaqda təkrar gəmilərə qoyub gəmiylə gətirmələri əmr edildi.

Endiyimiz yurdda güləşçiləri gürəşdirdik. Pəhlivan Lahori Kəşdiban ilə Dost Yasinxeyr güləşdilər. Xeyli mücadilədən sonra Dost qələbə qazandı. Hərəsinə bir dəst paltar ehsan edildi.

İrəlidə bataklıq və çamurlı pis bir çay varmdı, ona Tus çayı deyirdilər. Keçid aramaq və yol tapmaq üçün burada iki gün qaldıq. Bir az yuxarıda at və dəvələr üçün bir keçid tapıldı. Yüklü arabalar o keçidin uyğun olmayan daşları üzündən keçə bilməzmiş. Yüklü arabaları da **(364 a)** oradan keçirməyi əmr etdim.

Cümə axşamı günü oradan hərəkət edərək Tus çayının birləşdiyi yerə qədər gəmiylə gəldim. Suyun birləşdiyi yerdə gəmidən çıxıb Tus çayından yuxarıya doğru gedərək ikindi üstü suyu keçib enmiş olan ordugaha gəldim. O gün altı küruh yürüdük. Ertəsi gün orada qaldıq.

Şənbə günü on iki küruh yürüdükdən sonra kəndin yuxarı tərəfinə endik. Oradan da yeddi küruh gedərək Nanupura endik. Biz bu yurdda ikən Çünardan oğullarıyla birlikdə Tac xan gəlib mülazimət etdi. O günlərdə Məhəmməd Bəxşinın ərzi-halı də gəldi: ailə və saray ağırlıqları Kabildən dəqiq olaraq gəlirmiş.

Çərşənbə günü oradan qalxıb Çünar kurqanını gəzdikdən sonra Çünardan bir küruh qədər keçərək endik.

Piyaqdan hərəkət etdiyimiz günlərdə bədənimdə qan çibanı çıxmışdı. Bu yurdda ikən Rumdan gələn bir səyyah yeni kəşf edilən bir tədavi tətbiq etdi. Qarabibəri gil qazanda qaynatdı və yaranı onun isti buxarına tutdum. Buxar azalınca da isti su ilə yudum. Təqribən iki saata qədər dindi.

Yenə biz bu yurdda ikən bir nəfər ordugahın yanındakı adada aslan və kərgədan gördüyünü söylədi. Sabah **(364 b)** o adayı mühasirə etdik. Fillər də gətirilmişdi. Aslan və kərgədan çıxmadı, çıxa-çıxa bir çöl camışı çıxdı.

O gün şiddətli rüzgar qopdu və toz-torpaq çox iztirab verdi. Gəmiyə minərək ordugaha gəldim.

Ordu Benaresdən iki küruh daha yuxarıya enmişdi. Çünar civarındakı cəngəlliklərdə çox fil varmış. Oraya gedib fil ovlamaq niyyətində idim. Tac

xan mənə Mahmud xanın [Ludi] Sun çayının yanında olduğu xəbərini gətirdi. Bəylər dəvət edildi və düşmən üzərinə sürətlə yürümək barədə danışıb məsləhət etdik. Axırda uzun mənzillə və gecikmədən yürümək qərara alındı. Oradan qalxıb doqquz küruh gedərək Bəlvə keçidinə endik.

Burada bazar ertəsi günü axşam, ayın on səkkizində [=28 martl Tahir, Aqraya göndərildi və Kabildən gəlməkdə olanlara xərclik kimi ehsan edilən pulların baratını götürdü.

O gün gəmiylə gəldim. Sabahdan bir az öncə gəmiyə minmişdim. Guy çayının birləşdiyi Cunpur çayına qədər və oradan da Guy çayının bir az yuxarısına gedərək təkrar döndüm. Daracıq bir çay olmasına baxmayaraq **(365 a)** keçidi yoxdu. O tərəfdəki əsgər gəmi, sal və atla üzərək keçirdi.

Cunpur çayının birləşdiyi yerdən bir küruh daha aşağıya gedib keçən il Cunpura getdiyimiz zaman qaldığımız yurdu gəzdim. Çayın yuxarısından səmt küləyi əsdi. Benqal gəmisinin yelkənini açıb böyük gəmini ona bağladılar və xeyli sürətlə gəldi. Benaresdən bir küruh daha yuxarıya enmiş olan ordugahdan buraya günün iki gerisi qalanda gəldik. Heç bir yerdə durmadan arxamızdan gələn gəmilərin ən sürətlisi isə yatsı vaxtında gəldi.

Moğol bəyə Çünardan başlayaraq hər yürüşdə ölçü ipiylə doğru yolu, Lütfi bəyə isə gəmiyə minəndə çay sahilini ölçməsi əmr edilmişdi. Doğru yol on bir, su sahili də on səkkiz küruh imiş.

Ertəsi gün o yurdda qaldıq. Çərşənbə günü də gəmi ilə Qazipurdan bir küruh daha aşağıya endik. Cümə axşamı günü biz o yurdda ikən Mahmud xan Nuhani gəlib mülazimət etdi. O gün Behar xan Beharinin oğlu Cəlal xan, Nasir xan oğlu Fərid xan, Şir xan Sur, Adil xan Sur və digər bir neçə əfqan əmirinin ərzi-halları **(365 b)** gəldi.

Eyni gün Əbdüləziz Miraxurun da ərzi-halı gəldi. Lahordan cəmadiyüləvvəl ayının iyirmisində [=29 fevral] yazılmışdı. Bu ərzi-hal yazıldığı gün Kalpi civarından Qaraçanın göndərdiyi hindistanlı bir nökəri də Lahora varmışdı. Əbdüləzizin ərzi-halında bunlar yazılmışdı: Əbdüləziz və digər təyin edilənlər cəmadiyülaxır ayının doqquzunda [=18 fevral] Nilabda ailəni qarşılamağa gedirlər. Əbdüləziz Çanaba qədər birlikdə gəlib oradan ayrılaraq bir az öncə Lahora getmiş və bu ərzi-halı göndərmişdi.

Cümə günü hərəkət etdik. Mən yenə gəmiylə gedib Çüsənin qarşısında keçən il günəşin tutulduğu və oruclu olduğumuz yurdu gəzdikdən sonra təkrar gəmiyə mindim. Məhəmməd Zaman Mirzə də gəmiylə gəldi. Mirzənin təşviqi ilə məcun yedik.

Ordu Kərmnas çayının sahilinə enmişdi. Hindular bu Kərmnas çayından çox çəkinirdilər, ona görə də bunlar bu sudan keçməyərək gəmiyə minib bu suyun qarşısındakı Qanq çayından keçdilər, etiqadlarına görə, bu su insana dəysə, onun ibadəti batil olurmuş. Bu adın verilməsinin səbəbini də buna uyğun şəkildə açıqladılar.

Kərmnas çayının bir az yuxarı tərəfinə gedib təkrar döndükdən sonra Qanqın **(366 a)** şimal tərəfinə keçdik və suyun sahilində gəmiləri durdurduq. İgidlər bir az əyləndilər və güləşdilər. Saki Möhsün dörd-beş adamla güləşə biləcəyini iddia etdi. Bir adamla güləşdi, az qala yıxılırdı, ikincisi Şadiyandı və Möhsünü yıxdı. Məhcub və mütəəssir oldu. Pəhlivanlar gəlib güləşdilər.

Şənbə günü Kərmnas çayının keçidini aramaq üzrə adam göndərildiyi üçün ilk pəhərə doğru hərəkət etdik. Mən ata minib keçidə doğru bir küruh qədər çayın yuxarı tərəfinə getdim. Keçid uzaq olduğu üçün təkrar geri dönərək gəmiylə endiyimiz yerə gəldim.

Ordu Çusədən bir küruh daha irəlidə düşərgə salmışdı. O gün təkrar qarabibər dərmanı düzəltdim. Bir az isti oldu, bədənim qabardı və çox iztirab çəkdim. İrəlidə bataqlı kiçık bir çay vardı; yol salmaq üçün ertəsi gün də orada qaldıq.

Bazar axşamı Əbdüləziz tərəfindən gələn hindistanlı piyadanın gətirdiyi məktuba cavab yazıb göndərdim. Bazar ertəsi sabahı gəmiylə gəldim. Külək üzündən gəmiləri çəkərək gətirdilər. Keçən il uzun müddət qaldığımız Bəksər önündəki yurdun qarşısına gəlib **(366 b)** suyu keçərək buranı gəzdim.

Çay sahilinə enmək üçün pillələr düzəldilmişdi, qırxdan artıq, əllidən az olardı. Yalnız üstdəki pillə qalmış, digər pillələri su yuyub aparmışdı.

Gəmiyə minib məcun yedik. Ordugahın bir az yuxarısında bir adada gəmini dayandıraraq pəhlivanları gürəşdirdik. Yatsı vaxtı ordugaha gəldik. Keçən il ordunun endiyi bu yurdda Qanq çayını özüm üzərək keçmişdim. Bəziləri at, bəziləri da dəvə üstündə olduqları halda buraya gələrək gəzmişdik. O gün tiryək qəbul etmişdim.

Çərşənbə axşamı günü Kərimverdi, Məhəmməd Əli Heydər Riqabdar və Baba Şeyx iki yüzə qədər yaxşı igidlə birlikdə düşmənlərdən xəbər bilmək üçün göndərildilər.

Buradan Benqal elçisinə bəhs edilmiş üç maddəni ərz etməsi əmr edildi.

Çərşənbə günü Yunus Əli Behara dair müsbət bəzi şeylər öyrənmək üçün Behardakı Məhəmməd Zaman Mirzənin yanına göndərildi. Bir az süst cavab gətirdi. Behar şeyxzadələrinin adamı ərzi-halla birlikdə Beharı buraxıb çıxdıqları xəbərini gətirmişdi.

Cümə axşamı günü Turdu Məhəmmədlə Məhəmməd Əli Cəng-Cəngə türk və hind əmirlərindən və oxçularından iki minə yaxın adam verildi. Behar əhalisinə **(367a)** vəd fərmanları yazılıb getmələrinə izin verildi. Xoca Mürşid İraqini də Behar sərkarına divan təyin edib Turdu Məhəmməd ilə birlikdə göndərdik. Ertəsi gün də Məhəmməd Zaman Mirzə Behara getməyi qəbul edərək Şeyx Zeyn və Yunus Əli vasitəsilə bəzi şeylər ərz edib kömək üçün bir dəstə adam istəmişdi. Bəzi igidləri Məhəmməd Zaman Mirzəyə

köməkçi təyin edib bəzilərini da xidmətinə verdik.

Şaban ayının birinci şənbə günü [=9 aprel] üç-dörd gündür oturduğumuz bu yurddan hərəkət etdik. Mən o gün ata minib Bucpur ilə Bihiyəni gəzdikdən sonra ordugaha döndüm.

Xəbər bilmək üçün Məhəmməd Əlinin komandanlığında göndərilənlər bir dəstə kafiri məğlub edib Sultan Mahmudun [Ludi] oturduğu yerə varırlar. Sultan Mahmudun iki minə yaxın adamı varmış, bizim avanqardın xəbərini alınca vahiməyə düşmüş və iki filini öldürüb getmişdir. Bir filini də önçüləri ilə qoyubmuş. Bu igidlərdən iyirmiyə yaxın adam önçülərə yetişir, onlar da müqavimət göstərmədən qaçırlar. Bizimkilər bir neçə adamı öldürdükdən sonra birinin başını kəsib, bir-iki adamı da diri olaraq yaxalayıb gətirdilər.

Ertəsi gün hərəkət edib gəmiylə getdim. Bu arada Məhəmməd Zaman Mirzə də çaydan keçdi. Mirzənin keçməsini gözləmək üçün iki-üç gün **(367 b)** orada qaldıq. Çərşənbə axşamı günü, ayın dördündə, Məhəmməd Zaman Mirzəyə bir dəst xas paltar, kəmərli bir qılınc, cins bir at və şəmsiyyə [çətir] inayət edərək Behar vilayətini ehsan etdim. Behar sərkarından bir kürur iyirmi beş lek xassə mülkü elan edildi, divanlığı da Xoca Mürşid İraqinin öhdəsinə verildi.

Cümə axşamı günü o yurddan gəmiylə hərəkət etdim. Mən gəlincə bütün gəmiləri dayandırdım. Sonra onları üzdürərək səf halında bir-birinə bağlamalarını əmr etdim. Bütün gəmilər yığılmamış olduğu halda çayın genişliyindən çox artıq idi. Bəzi yerin dayaz, bəzisinin dərin, bəzi yerin axıntılı və bəzi yerin də sakit olması üzündən bu şəkildə çox gedilə bilmədi.

Gəmilərin səfində bir timsah görünür. Bir balıq timsahdan qorxaraq elə hündürə sıçrayır ki, bir gəminin içinə düşür, tutub gətirdilər.

Yurda gəldiyim zaman gəmilərə ad qoydum. Aqrada Sanka savaşından bir az öncə tamamlanmış olan əski əməkdar böyük gəmiyə *Asayiş* adı verildi. Bu il səfərə çıxmadan bir az əvvəl **(368 a)** Arayiş xan bir gəmi düzəltdirib hədiyyə etmişdi. Bu dəfə ona da bir talvar düzəltdirdim və bu gəmiyə *Arayiş* adı verildi. Sultan Cəlaləddin də hədiyyə etdiyi gəmiyə bir az böyük bir talvar düzəltdirmişdi, onun üzərinə bir talar da düzəldilməsi əmr edildi. Bu gəmiyə *Güncayiş* adı verildi. Bir də ön qismi qıvrıq kiçık bir qayıq vardı və hər cür iş üçün o göndərilirdi, bu qayığa da *Fərmayiş* adı verildi.

Ertəsi sabah cümə günü hərəkət etmədik. Məhəmməd Zaman Mirzə Behara getmək niyyətilə hazırlığını bitirərək ordudan bir-iki küruh aralıda düşərgə salmışdı. O gün gəlib izin aldı.

Benqal əsgərindən iki casus gəlib Məxdum Aləm komandanlığındakı benqaların Qanq çayının sahilini iyirmi dörd hissəyə bölərək sipər qazmaqda olduqlarını, Sultan Məhəmməd komandanlığında olan və ailələrini və köçlərini keçirmək istəyən əfqanları keçməyə qoymayaraq özlərinə qatdıqlarını söylədilər. Bu xəbəri alınca savaş ehtimali olduğu üçün Məhəmməd Za-

man Mirzənin getməsinə engəl olduq. Şah İskəndər üç-dörd yüz adamla birlikdə Behara göndərdik.

Şənbə günü Dudunun və onun oğlu **(368 b)** Cəlal xan Behar xanın adamı gəldi. Benqallar bunları göz bəbəkləri kimi qoruyurlarmış. Mənə qatılmaq üçün benqallarla vuruşub zorla ayrılaraq suyu keçmiş və Behar civarına gəlmişlər. Mülazimət üçün gəlirlərmış.

Həmin gün benqal elçisi İsmayıl Mitaya belə bir əmr verildi: əvvəlcə göndərdiyimiz üç maddənin cavabı gecikir. Onlara yazın ki, əgər səmimi bir şəkildə anlaşmaq istəyirlərsə, bizə tez cavab versinlər.

Bazar günü axşam üstü Turdu Məhəmməd ilə Cəng-Cəngin bir adamı gəldi. Bunların önçüləri çərşənbə günü, şaban ayının beşində [=13 aprel] sabah tezdən bu tərəfdən yaxınlaşınca, Behar şikdarı da digər qapıdan çıxıb qaçmışdı.

Bazar günü o yurddan qalxıb Ari pərgənəsinə endik. Burada ikən Xarid əsgərinin yüz-yüz əlli gəmiylə gəlib Saru ilə Qanqın birləşdiyi yerə, Saru çayının digər sahilinə yerləşdiyi xəbəri çatdı.. Benqallar ilə sülhə bənzər bir şey bağlanmış olduğu için belə işlərdə daima uğurlu sayıldığı üçün sülh yolu tərcih edilmişdir. Ədəbsizlik edərək gəlib yolumun üstündə yerləşmiş olmalarına baxmayaraq əski qaydaya uyaraq və əvvəlki üç sözü söyləyərək Molla Məhəmməd Məzhəb ilə birlikdə benqal elçisi İsmayıl Mitanın **(369 a)** getməsinə izin verilməsi qərarlaşdırıldı.

Bazar ertəsi günü benqal elçisi mülazimətə gəlmişdi, getməsinə izin verildiyi söylətdirildi və deyildi ki: düşməni dəf etmək üzrə oraya-buraya hərəkət etməkdəyik. Sizlərə aid yer və suya zərər və ziyan dəyməyəcəkdir, necə ki üç şərtin biri də bu idi: Xarid əsgərinə söylə, yolumuzdan çəkilib Xaridə gəlsin. Türkdən bir neçə adamı ona verək. Xarid əhalisinə vədlərdə bulunaraq onları yerlərinə götürsünlər. Keçid üzərindən getməz və bu qəribə iddiadan vaz keçməzlərsə başlarına gələcək hər yamanlığı və önlərinə çıxacaq hər bəlanı özlərindən və sözlərindən bilsinlər.

Çərşənbə günü, adət olduğu üzrə, benqal elçisi İsmayıl Mitaya bir xələt geydirilərək ehsanlarla getməsinə izin verildi.

Cümə axşamı günü Şeyx Camal da vəd fərmanları və inayət sözləri ilə Dudu ilə oğlu Cəlal xanın yanına göndərildi. O gün Mahım bəyimin adamı gəldi, o, Baği-Səfanın digər tərəfindən məktublar gətirdi.

Şənbə günü İraq elçisi Murad Qurçu Qacarı qəbul etdim.

Bazar günü, adət olduğu üzrə, Molla Məhəmməd Məzhəbə hədiyyələr təqdim edilərək getməsinə izin verildi.

Bazar ertəsi günü Xəlifə **(369 b)** ilə bəzi bəylər çayın keçilə biləcək yerini təsbit etməyə göndərildi. Çərşənbə günü Xəlifə iki suyun arasındakı bölgəni tədqiq etməsi üçün təkrar göndərildi.

Cənub tərəfdə Ari pərgənəsinin yaxınlığında yerləşən nilufər çiçəkli-

yini gəzməyə getdim. Gəzinti əsnasında Şeyx Gürən nilufərin təzə toxumlarından gətirdi. Fıstığa çox bənzəyir və olduqca gözəl bir şeydir. Onun çiçəyinə, yəni nilufərə hindistanlılar *kəvəl-kəkri,* toxumuna isə *dudə* deyirlər.

Sunun oradan yaxın olduğunu söylədilər, gedib seyr etdik. Sun çayının aşağı tərəfində çoxlu ağac gördüm. Oranın Münir olduğunu və Şeyx Şərafəddin Münirinin atası Şeyx Yəhyanın məzarının orada olduğunu söylədilər. Bu qədər yaxınına gəlmiş olduğumuz üçün Sunu keçərək, Sundan aşağı iki-üç küruh gedib Müniri seyr etdik və bağlarının arasından keçib məzarı ziyarət etdikdən sonra Sun sahilinə gəlib qüsl etdik və günorta namazını da bir az erkən qılıb ordugaha doğru hərəkət etdik.

Atlar kök olduğu üçün bir neçə at geridə qaldı, bir neçə at isə yorulmuşdu. Bir neçə adamı orada qoyub xəstələnən atları yığaraq su və yem verib yavaş-yavaş gətirmələrini əmr etdim. Əks təqdirdə, bir çox at tələf olardı.

Münirdən dönərkən, bir adama Sunun sahilindən ordugaha qədər atının hər addımını saymasını tapşırdım. İyirmi üç min yüz **(370 a)** addım saymış ki, bu da qırx altı min iki yüz qədəm, yaxud on bir yarım küruh edir. Münirdən Suna da yarım küruh qədər olar. Dönüşdə beləcə on iki küruh qət etmiş olduq. Gedərkən hər tərəf seyr edilərək gedildiyi üçün on beş-on altı küruh qədər olmuşdur. Bu surətlə o gün otuz küruha yaxın gəzdik. Gecənin ilk pəhərindən altı geri keçəndə ordugaha gəldik.

Ertəsi cümə axşamı günü Cunpurdan Sultan Cüneyd Barlas ilə Cunpurdakı igidlər gəldilər. Gecikdikləri üçün onları bir az danlayaraq görüşmədim. Qazı Ciyayı çağırıb söhbət etdim.

## SAVAŞ PLANLARI

O gün türk və hind əmirləri məşvərətə çağrılaraq suyu necə keçmək haqqında danışdıq və buna qərar verdik: «Qanq ilə Saru çayının aralığındakı yüksək bir yerdə Ustad Əliqulu top-frəngi qurub, bir çox zərbzən və tüfəngəndazla oradan savaşacaq. İki çayın birləşdiyi yerdən bir az aşağıda yerləşən adada benqalların bir fili və bir çox gəmisi vardı, onun qarşısında Qanq çayının Behar tərəfində də Mustafa ləvazaimatını hazırlayıb tamamlayaraq savaşa girəcək, bir çox tüfəngəndaz da onunla birlikdə olacaq. Məhəmməd Zaman Mirzə və yanındakılar da Mustafanın arxasında olub ona kömək edəcəklər. Ustad Əliqulu ilə Mustafanın əmrinə zərbzən atıb, **(370 b)** top qurmaq üçün yer hazırlamaq üzrə bir çox istehkamçı, işçi və çavuş verildi. Silah-sursatı toplayıb hazırlamaqla məşğul oldular.

Sultanlar, əmirlər və xanlar sürətlə yürüyüb Həldi keçidindən Sarunu keçərək hazırlıqlı olacaq və bəlli bir zamanda o tərəfdən düşmənin üzərinə yürüyəcəkdilər.

Bu zaman Sultan Cüneyd ilə Qazı Ciya səkkiz küruh yuxarıda daha

bir keçidin olduğunu bildirdilər. Gəmicilərdən bir-ikisinə Sultan Cüneyd, Mahmud xan və Qazı Ciyanm adamlarıyla birlikdə gedib keçidi araşdırmaları, əgər keçid tapılrsa, o keçiddən keçmələri əmr edildi. Benqalların Həldi keçidinə də adam təyin etmək təklif olundu. Mahmud xan Nuhaninin Sikəndər-purdakı şikdarının ərzi-halı gəldi: Həldi keçidində əlli qədər gəmi toplayıb gəmiçilər tutduğunu, lakin gəmiçilərin benqalların gələcəyi xəbərindən fövqəladə qorxduqlarını bildirirdi.

Saru çayından keçid axtarmağa vaxt qalmadığı üçün keçid aramağa gedən adamları gözləmədən şənbə günü bəyləri məşvərətə çağırıb belə dedim: «Saru çayının keçidləri Sikəndərpur Çetürmükdən Ud və Behrayicə qədər hər yerdə vardır. Beləcə oturmaqdansa, iri bir hərbi hissə ayıraq və bu hissə **(371 a)** Heldi keçidindən gəmilərlə keçərək düşmən üstünə yürüsün. Bunlar yetişincəyə qədər Ustad Əliqulu ilə Mustafa top-tüfəng, zərbzən və frəngiylə savaşaraq düşmənin başını qatsın. Bu arada biz də Qanq çayını keçərək Ustad Əliquluya köməkçilər verib hazırlıqlı olaq. Keçiddən keçən hissə yaxınlaşanda biz də buradan savaşa qoşularaq. Məhəmməd Zaman Mirzə və o tərəfə təyin olunanlar isə Qanq çayının Behar tərəfində Mustafanın yanında savaşsınlar».

Buna qərar verib Qanqın şimalındakı əsgəri dörd qitəyə ayrılaraq Əsgərinin komandanlığında Heldi keçidinə göndərdik: bir qitə Əsgərinin komandanlığında olub onun öz nökərlərindən ibarətdi, bir qitə Sultan Cəlaləddin Şərqi, bir qitə özbək sultanlarından Qasım Hüseyn Sultan, Bixub Sultan, Tan-Atmış Sultan, Mahmud xan Nuhani Qazipuri, Kuki Baba-Qaşqa, Tolmuş Özbək, Qurban Çərxi və Hüseyn xanın [Dəryaxani] idarəsində olan dəryaxanilərdən, bir qitə də Musa Sultan [Məruf Fərmüli], Sultan Cüneyd və təxminən iyirmi min qədər Cunpur adamından ibarət idi.

Həmin bazar gecəsi **(371 b)** əsgəri sövq etmək üçün çavuşlar təyin edildi. Bazar sabahı da əsgər Qanqdan keçməyə başladı. Mən ilk pasta gəmiylə çayı keçdim. Üç pəhər olanda iss keçid aramağa gedən adamlar geri gəldilər, keçid tapa bilməmişdilər. Gəmilərə və qitələrə yolda rast gəlmişlər.

Çərşənbə axşamı günü suyu keçdiyimiz yerdən qalxıb savaş meydanı olan suların birləşdiyi yerə bir küruh qala düşərgə qurduq. Özüm gedib Ustad Əliqulunun firəngi və zərbzən atmasını seyr etdim. O gün Ustad Əliqulu firəngi daşıyla iki gəmini vurub batırdı. Digər tərəfdən Mustafa da firəngi daşıyla iki gəmini vurub suya qərq etdi. Böyük topu savaş səfinə götürüb yerini düzəltmək üçün Molla Qulam ilə çavuş, yasavul və seçmə igidlərdən bir dəstəni ona köməkçi olaraq verdikdən sonra dönüb ordugahın qarşısında bir adada məcun yedik. Məcun yedikdən sonra gəmini çadıra yaxınlaşdıraraq gəmidə uyudum.

O axşam qəribə bir hadisə oldu. Gecənin üçüncü pasına yaxın gəmidə savaş nərələri atıldı, gurultu çıxdı. Çöhrələrdən hər kəs gəminin bir ağacını

alıb bir-birinə «Vur! vur!» deyə bağrışırdu. *Fərmayiş* gəmisi mənim uyuduğum *Asayiş* gəmisinin yanındaydı. **(372 a)** Mühafizlərdən biri də orada idi. Yuxudan gözünü açıb baxanda bir adamın *Asayiş* gəmisinə dırmanaraq çıxmağa təşəbbüs etdiyini görür və özünü onun üzərinə atır. Suya dalıb təkrar çıxdıqlarında adam mühafizin başına qılıncla vurur və bir az yaralayır. Sonra özü suya doğru qaçır. Gurultu bu üzdən qopmuşdu. Münirdən gəldiyimiz gecə də bir-iki mühafiz gəminin yaxınlığıında bir neçə hindi qovaraq bir-iki qılınc və bir xəncərlərini gətirmişdilər. Tanrı təala saxladı.

Əgər tiği-aləm becünbəd zi ca,
Nəbürrəd rəgi tu nəxahəd xuda.
*Qılınc dünyanı yerindən oynada bilsə də,*
*Allahın izni olmadan, bir damar belə kəsməz.*

Ertəsi çərşənbə günü *Güncayiş* gəmisinə minib daş atılan yerin bir az yaxınına getdim və hər gəmiyə ayrı-ayrı vəzifələr müəyyən etdim.

Uğanverdi Moğolun komandanlığında minə yaxın igid hər hansı bir şəkildə suyu keçmək üçün iki-üç küruh daha yuxarıya göndərilmişdi. Bunlar gedərkən Əsgərinin ordugahının qarşısındakı benqallar iyirmi-otuza qədər gəmiylə suyu keçərək izdihamlı bir piyada qrupu halında hücum etmək istəyirlər. Bunlar da onların üzərinə atla saldırıb qaçırır, bir neçəsini yaxalayıb başlarını kəsir, bir çoxunu da oxla vurur, yeddi-səkkiz gəmini ələ keçirirlər.

Həmin gün benqallar Məhəmməd Zaman Mirzə olan tərəfdən də bir neçə gəmiylə suyu keçərək **(372b)** savaşmaq istəyirlər. Mirzə də öz tərəfindən sıxışdıraraq benqalları qaçırır və üç gəminin adamları suda boğulur. Bir gəmini ələ keçirib mənim hüzuruma gətirdi. Orada Baba Çöhrə yaxşı vuruşub şücaət göstərir.

Onların ələ keçirdiyi yeddi-səkkiz gəmini gecə qaranlıqda yuxarı çəkib daha öncə keçmələrinə qərar verilmiş olan Məhəmməd Sultan, Yekə Xoca, Yunus Əli, Uğanverdi ilə adamlarının bu gəmilərlə keçmələri haqqında Uğanverdiyə əmrlər verdim.

O gün Əsgəridən bir adam gəlib hamısının suyu keçdiklərini və ertəsi günü sabah tezdən -ki cümə axşamı günü olur- düşmənin üzərinə gedəcəklərini bildirdi. Bu keçənlərin də Əsgəriyə qoşularaq düşmən üzərinə yürümələri əmr edildi.

Günorta üstü Ustadın yanından bir adam gəlib daşın hazır olduğunu bildirdi. O daşı atmasını və mən gəlincəyə qədər bir daş daha hazırlamasını əmr etdim. İkindi üstü kiçık benqal qayığına minib topların yerləşdirildiyi yerə getdim. Ustad Əliqulu böyük bir daş və bir neçə firəngi atdı.

Benqallar atəş atmaqla məşhurdu. Bu dəfə yaxşı təcrübə etdik: onlar bir yeri nişan alıb atmır, rastgələ atırlar.

İkindi çağı Saru çayıyla onların qarşılarından bir neçə gəmini çəkib

keçirmələrini əmr etdim. Gəmini çəkən adamlar heç çəkinmədən **(373 a)** və saxlanmadan bir neçə gəmini çəkib keçirdilər. İsən Teymur Sultan, Toxta Buğa Sultan, Baba Sultan, Arayiş xan və Şeyx Gürənə gəmilərin keçdiyi yerdə qalaraq gəmini qorumalarını əmr etdim.

Oradan dönüb ilk pasda ordugaha gəldim. Gecə yarısına yaxın bir saatda yuxarıya çəkilən gəmilərdən «Qitələr daha irəliyə getdilər. Gəmini çəkirdik ki, benqallar gəmilərin bizim tərəfimızdən çəkildiyini duyaraq savaşmağa girişdilər. Bir gəmiçinin ayağına daş dəydi, ayağı qırıldı, keçə bilmədik» xəbəri gəldi.

Cümə axşamı sabahı sipərdəkilərdən də «Yuxarıdakıların hamısı gəldi. Düşmənin atlıları atlara minərək bizim gəlməkdə olan qitələrimizə qarşı hərəkətə keçdilər» xəbəri gəldi. Dərhal ata minərək axşamüstü suyun bu tərəfinə keçirdiyimiz gəmilərə gəldim. Məhəmməd Sultan Mirzə komandanlığında suyu keçmələri qərarlaşdırılan birliklərə dərhal suyu keçib Əsgəriyə qoşulmaları üçün adam yolladım. İsən Teymur Sultan ilə Toxta Buğa Sultan bu gəmilərdə idi, keçməyə başlamalarını əmr etdim. Baba Sultan isə təyin edildiyi yerə hələ gəlməmişdi.

İsən Teymur Sultan dərhal bir gəmiyə minib otuza qırx qədər adamıyla birlikdə atlarını **(373 b)** gəminin yanında yedəkdə tutaraq keçdi. Bunların arxasından təkrar bir gəmi yola çıxdı. Bunların keçdiklərini görən benqallardan izdihamlı bir piyada taqımı üstlərinə yürüdü. İsən Teymur Sultanın yeddi-səkkiz adamı atlara minərək bu piyadaların qarşısına gedib Sultan ata minincəyə qədər qılınc-qılınca savaşaraq piyadaları başqa tərəfə çəkdi. İsən Teymur Sultan da ata mindi. İkinci gəmi də keçdi. Otuz-otuz beş atlı adamla izdihamlı piyadalara qarşı mücadilə edərək onları tamamən məğlub etdi. Çox yaxşı iş gördü. İlk öncə çevik və qətiyyətli davranaraq hər kəsdən öncə keçdi, sonra da izdihamlı piyadaların üstünə az adamla yaxşı yürüyüb onları məğlubiyyətə uğratdı.

Toxta Buğa Sultan da keçdi və digərləri də arxa-arxaya keçməyə başladı. Lahorlu və hindistanlılar öz üsullarına görə, kimisi dəstəklə, kimisi də qamış dəmətiylə keçməyə başladılar.

Bunu görən sipər qarşısındakı izdihamlı benqal gəmiləri də suyun aşağısına doğru qaçmağa başladı. Dərviş Məhəmməd Sarban, Dost eşik-ağa və digər bəzi igidlər sipərin qarşısından keçdilər. Sultanlara adam göndərərək keçənləri yığıb o tərəfdəki qitəyə yaxınlaşınca yanlardan yürüyüb düşmənə **(374 a)** hücum etmələrini söylədim. Sultanlar da keçənləri özlərinə qataraq düşmən tərəfinə üç-dörd topa halında hərəkət etdilər.

Bunlar yaxınlaşınca düşmən piyadaları qabağa keçirib səfini pozmadan yürüməyə başladı. Əsgəriylə birlikdə yürümələri qərarlaşdırılan qitədən olan Kuki adamlarıyla birlikdə gəlib yetişdi. O tərəfdən Kuki, bu tərəfdən də sultanlar yetişərək hücum edir və düşməni vurub pozurlar.

Kukinin adamları Bəsənt Rav adlı mötəbər bir kafiri ələ keçirib başını kəsirlər. Bəsənt Ravın on-on beş adamı bunların üzərinə atılır və onları da kəsirlər.

Toxta Buğa Sultan isə düşmənin ön tərəfindən gedib qılınc çəkərək yaxşı vuruşur. Moğol Əbdülvəhhab ilə kiçık qardaşı də düşmənlə qılınc qılınca gəlirlər. Moğol suyu bilmədiyi halda özü zirehli və atı yedəkdə olaraq keçir.

Mənim gəmilərim geridəydi. Gəmilərə adam göndərdim. *Fərmayiş* gəmisi bir az irəli gəldi. *Fərmayiş* gəmisinə minib suyu keçərək benqalların düşərgəsini gəzdikdən sonra, *Güncayiş* gəmisinə minib çayın yuxarı qismi haqqında bilgi aldım.

Mir Məhəmməd Caleban Saru çayının bir az yuxarısının keçmək üçün daha yaxşı olduğunu bildirdi. Onun söylədiyi yerdən əsgərin keçməyə başlaması əmr edildi. Məhəmməd Sultan Mirzə komandanlığında olanlara keçmə **(374 b)** əmri verilmişdi. Suyu keçərkən Yekə Xocanın gəmisi batdı və özü də Allahın rəhmətinə qovuşdu. Adamlarını və vilayətini kiçık qardaşı Qasım Xocaya ehsan etdim.

Günorta üstü qüsl əsnasında sultanlar gəldi. Özlərini yaxşı qarşılayıb təvəccühüm barədə ümid verdim. Əsgəri də o sırada gəldi. Bu, Əsgərinin savaş meydanında ilk işi idi. Uğurlu oldu. O axşam ordugah hələ təzə yerə nəql edilməmiş olduğu üçün bir adada *Güncayiş* gəmisində uyudum.

Cümə günü Saru çayının şimalında Xaride tabe olan Nirhün pərgənəsinin Kündbə adlı kəndinə endik. Bazar günü isə Kuki adamlarıyla birlikdə xəbər bilmək üçün Hacipura göndərildi.

Keçən il gələndə böyük etibar göstərərək Sarən vilayətini vermiş olduğumuz Şah Məhəmməd Məruf bir neçə yaxşı hərəkətdə bulundu. Öz atasıyla iki dəfə çarpışaraq onu məğlub və əsir etmişdi. Sultan Mahmud [Ludi] xainlik edərək Beharı zəbt edəndə Bibən ilə Şeyx Bəyazid üzərinə yürüyüncə məcburən onlara qoşulmuşdu. O günlərdə də neçə dəfə ərzi-halı gəlmişdi. Xalq arasında onun haqqında qarışıq sözlər söylənirdi. Əsgəri Heldi keçidindən keçər-keçməz, adamlarıyla birlikdə gəlib Əsgərini **(375a)** gördü və onunla birlikdə benqalların üstünə yürüdü. Bu yurdda ikən də gəlib bizə mülazimət etdi.

O günlərdə Şeyx Bəyazid ilə Bibəndən arxa-arxaya xəbərlər gəlird: onlar Saru çayını keçmək niyyətində imişlər.

Bu zaman Sənbəldən qəribə bir xəbər gəldi. Əli Yusif [Riqabdar] Sənbəldə qalıb, oranı yaxşıca ələ keçirib nizama salmışdı. Özü və yaxın adamı olan bir təbib eyni gündə Allahın rəhmətinə qovuşmuşlar. Sənbəlin zəbt və rəbti üçün Abdullahın [Kitabdar] oraya getməsinə qərar verildi. Cümə günü, ramazan ayının beşində [=13 may] Sənbələ getməsi üçün Abdullaha izin verildi.

O günlərdə Çin Teymur Sultanın ərzi-halı gəlmişdi. Kabildən mənim ailə üzülərimlə gələn bəylər ona qoşula bilməmişlər. Məhəmmədi və digər bəziləri onunla birlikdə yüz küruh qədər məsafəni aşıb bəlucları tamamən məğlub etmişlər. Abdullah [Kitabdar] vasitəsilə Cin-Teymur Sultan, Sultan Məhəmməd Dulday, Məhəmmədi və orada olan digər bəylərə fərmanlar göndərərək onların da Cin-Teymur Sultan ilə birlikdə Aqrada toplaşmaları, hazırlıqlı olmaları və düşmənlər hansı tərəfə getsələr, oraya hərəkət etmələri əmr edildi.

Bazar ertəsi günü, ayın səkkizində [=l6 may] yanına Şeyx Camaliyi göndərdiyimiz Dərya xanın **(375 b)** nəvəsi Cəlal xan bütün mötəbər əmirləri ilə birlikdə gəlib mülazimət etdi. Bir müddət əvvəl qulluğunu göstərmək üzrə Yəhya Nuhani də kiçık qardaşını göndərmiş və məndən fərman almışdı, o da həmin gün gəlib mülazimət etdi.

Yeddi-səkkiz min nuhani və əfqan bəzi ümidlərlə gəlmiş olduqları üçün onların ümidlərini qırmayaraq Behardan bir kürur xassə mülkü edib bundan əlli lek də Mahmud xan Nuhaniyə ehsan etdim. Qalan qismi Cəlal xana verildi, o da bağlılığının işarəsi olaraq bir kürur verməyi qəbul etdi. Bu pulun yığımı üçün Molla Qulam yasavul göndərildi. Məhəmməd Zaman Mirzəyə Cunepur vilayəti verildi.

## NÜSRƏT ŞAH İLƏ SÜLH BAĞLANMASI

Cümə axşamı günü, Xəlifənin [Nizaməddin Əli Barlas] Qulam Əli adlı adamı yanıma gəldi. O, İsmayıl Mitadan bir az əvvvəl şahzadə Müngirin Əbülfəth adlı adamıyla birlikdə haqqında danışılan üç şərtı götürmüşdü. Qulam Əli bu Əbülfəth ilə birlikdə şahzadə Müngir ilə vəzir Həsən xan Ləngərin Xəlifəyə yazmış olduqları məktubları da gətirdi. O, üç şərti kabul edib Nüsrət şah işini öz üzərinə alaraq sülh təklifində bulunurdu. Bu səfər asi əfqanlarm dəf edilməsi üçün gerçəkləşmişdi. Bu asilərin bəziləri başlarını alıb getdilər, bəziləri də gəlib xidmətkarlıq və qulluğu **(376 a)** qəbul etdilər. Qalan önəmsiz bir qismi isə benqalın köməkçiləri idi. Onları da benqallar öz öhdələrinə aldılar.

Yağmur mövsümü də yaxınlaşmışdı. Onun üçün biz də onun qarşılığında bəhs edilən şərtlər daxilində sülhü qəbul etdiyimizi bildirdik.

Şənbə günü İsmayıl Cilvani, Adil xan Nuhani və Övliya xan İşraqi beş-altı əmirlə birlikdə gəlib mülazimət etdilər.

Yenə həmin gün İsən Teymur Sultan ilə Toxta Buğa Sultana mükafat olaraq kəmərli qılınc, kəmərli xəncər, zirehli paltar, xələtlər və cins atlar, İsən Teymur Sultana Narnul pərgənəsindən otuz altı lek, Toxta Buğa Sultana isə Şəmsabad pərgənəsindən otuz lek ehsan edilərək yükündürüldülər.

Bazar ertəsi günü, ayın on beşində [=23 may] Behar və benqal tərəfini

təskin etdikdən sonra Saru çayının sahilində yerləşən Kündbə civarındakı yurddan haramxor Bibən ilə Şeyx Bəyazidi dəf etmək niyyətilə əzm-cəzm edib yürüdük. Arada iki dəfə dincəldikdən sonra çərşənbə günü Sikəndərpurun Çetürmük Çuparə adlı keçidi üzərinə endik. Əsgər də o gündən etibarən keçməyə başladı.

Bu alçaqların Saru ilə Gəgərdən keçib Leknuya doğru hərəkət etdikləri haqqında arxa-arxaya xəbərlər gəlməyə başladı. Bunların irəliləmələrini əngəlləmək üçün türk və hind əmirlərindən Sultan Cəlaləddin Şərqi, Əli xan Fərmüli, Turdukə və Nizam xan Biyani, Tolmuş Özbək, Qurban Çərxi və Hüseyn xan **(376 b)** Dəryaxani komandanlığında olan qüvvələr təyin edilərək cümə axşamı axşamı yola düşmələri üçün onlara izin verildi.

## BİR MÖVSÜM YAĞMURU FIRTINASI

O axşam təravihdən sonra bir pas və beş geri olmuşdu. Mövsüm yağmuru buludları boşanıb bir anda elə bir tufan oldu, elə müdhiş bir fırtına qopdu ki, hardasa yıxılmayan heç çadır qalmadı.

Mən çadır içində yazı yazırdım, kağızlarımı və kitablarımı ylğmağa vaxt qalmadı, çadır üst qismiylə birlikdə başıma uçdu. Çadırın pəncərəsi parça-parça oldu, tanrı qorudu, heç bir zərəri toxunmadı. İslanan yazı və kitablar çətinliklə yığıla bildi. Bunları qırmızı xalçanın içinə qoyub dürdük, stolun altına qoyaraq üstünü kilimlə örttük.

İki geri sonra yağmur dindi. Yataq çadırını qurdurub şam gətirtdim və çətinliklə od qalayaraq sabaha qədər uyumadan kağızları və kitabları qurutmaqla uğraşdım.

Cümə axşamı günü çayı keçdim. Cümə günü ata minərək Harid və Sikəndərpuru gəzdik. O gün Abdullah [Kitabdar] ilə Baqi mənə Leknurun düşmən tərəfindən zəbt edildiyini yazmışdılar. Şənbə günü gedib Baqiyə [Şiğavul] qatılmaq üzərə Kuki adamlarıyla birlikdə öndən göndərildi.

Bazar günü Baqiyə qoşulub mən yetişincəyə qədər əllərindən gələni əsirgəməmələri üçün Sultan Cüneyd Barlas ilə Həsən Xəlifəyə və **(377 a)** Molla Apağın camaati ilə Mömin Atəkənin böyük və kiçık qardaşlarına izin verildi. O gün ikindi üstü Şah Məhəmməd Mərufa xassə xələt və cins bir at ehsan edilib getməsinə izin verildi. Ona keçən ilki üsula uyğun olaraq Sarəni təxsisat və Kündləyi də oxçulara maaş olaraq ehsan etdik.

Yenə o gün İsmayıl Cilvaniyə Sərvardan yetmiş iki lek təxsisat, xassə xələt və cins bir at ehsan edilərək getməsnə izin verildi. Adil xan Nuhani başda olmaq üzrə onunla birlikdə gələnlərə də Sərvardan təxsisatlar təyin edilib getmələrinə izin verildi. Hər birinin bir kiçık qardaşının və ya oğlunun Aqrada daimi mülazimətdə bulunmasına qərar verildi.

*Güncayiş* və *Arayiş* gəmiləri ilə birlikdə yeni ələ keçən benqal gəmilə-

rindən seçilmiş olan iki gəmini Tirmühani yoluyla Qazipura, *Asayiş* ilə *Fərmayiş* gəmilərini də Sarunun yuxarısına doğru orduyla birlikdə götürmək işi benqallar tapşırıldı.

Behar ilə Sərvar tərəfini sakitləşdirdikdən sonra bazar ertəsi günü Çetürmukün Çupara keçidindən Saru sahilini təqib edərək Ud tərəfinə doğru hərəkət edildi. On küruh məsafə gedib Fəthpura tabe olan və Kilirə deyilən **(377 b)** bir kəndin yanında Saru sahilinə endik. Erkən hərəkət edənlər yolu çaşaraq Fəthpurun böyük gölünə varmışlar. Yaxındakı əsgərləri geri qaytarmaq üçün bir neçə adam göndərildi. Göl sahilində dincəldikdən sonra oraya enmiş olan əsgərləri ertəsi gün ordugaha gətirməsi üçün Kiçık Xocaya məktub göndərildi.

Ertəsi gün oradan qalxıb yarı yoldan *Asayiş* gəmisinə mindim və yuxarıdakı yurda qədər gəmini çəkdirərək gəldim. Yolda Xəlifə mənim, yanıma Baqinin yanından gələn Şah Məhəmməd Divanənin oğlunu gətirdi. Leknu xəbərini dəqiqləşdirdim: şənbə günü, ramazan ayının on üçündə [=23 may] düşmən hücum edir, lakin heç bir şey edə bilmir. Savaş zamanı bir araya yığılmış olan quru otlar və qamış od tutur. Kurqanın içi təndir kimi qızır. Divar üzərində yürümək mümkün olmur və beləcə düşmən kurqanı ələ keçirir. Amma iki-üç gün sonra bizim geri qayıtdığımızı xəbər alınca çəkilərək Delmut tərəfinə doğru hərəkət edir.

O gün də on küruh qədər yol alıb Sikri pərgənəsinin Cəlisir adlı kəndinin yanına, Saru sahilinə endik.

Çərşənbə günü heyvanların dincəlməsi üçün o yurdda qaldıq. Bəziləri Şeyx Bəyazid ilə Bibənin Qanqdan keçərək **(378 a)** Çünar və Cun civarından irəliləyərək özlərini sipahilərinə doğru çatdırmaq niyyətində olduqlarını söylədilər. Bəyləri çağırdım və onlarla danışıb məsləhətləşərək Gunepur vilayəti qarşılığında Çünar və digər bəzi pərgənələri almış olan Məhəmməd Zaman Mirzə ilə Sultan Cüneyd Barlasın Mahmud xan Nuhani, Qazı Ciya və Tac xan Sarənghani ilə birlikdə gedib Çünarda düşmənlərin yolunu kəsmələrinə qərar verildi.

Cümə axşamı günü erkəndən qalxıb Saru çayından ayrılaraq on bir küruh irəliləyib Persərudan keçdik və eyni çayın sahilində düşərgə saldıq. Bəyləri dəvət edib məsləhətləşdikdən sonra İsən Teymur Sultan, Məhəmməd Sultan Mirzə, Toxta Buğa Sultan, Qasım Hüseyn Sultan, Bixub Sultan, Müzəffər Hüseyn Sultan, Qasım Xoca, Cəfər Xoca, Zahid Xoca, Can bəy [Can Məhəmməd] və Əsgərinin adamlarıyla birlikdə Kiçık Xoca, hind əmirlərindən [Cəlal xan Cighetin oğlu] Aləm xan Kalpi, Məlikdad Kərrani və Ravuy Sərvani komandanlığındakılar ordunun ana qismindən ayrılaraq Bəyazid ilə Bibənin arxasından Dəlmut tərəfinə sürətlə yürümələri üçün tapşırıq aldılar.

Bu Persəruda abdəst alırdım ki, şam ışığına çoxlu balıq toplanaraq su

üstünə çıxdı. Mən və yanımdakılar əllə xeyli balıq tutduq.

Cümə günü Persərunun qollarından birinin basma endik. Çox kiçık bir çaydı. Əsgərlərin gedib gəlməsindən bulanmaması üçün üst tərəfində **(378 b)** hövzi-kəbirlik bir yerini abdəst üçün düzəltdirdim. Ayın iyirmi yeddinci gecəsini [=3 iyun] bu yurdda keçirdik. Ertəsi gün buradan qalxıb Tus çayını keçərək endik. Bazar günü də bu çayın sahilinə endik.

Bazar ertəsi günü, ayın iyirmi doqquzunda da [=6 iyun] bu Tus çayının sahilində güşərgə saldıq. O axşam havanın o qədər açıq olmamasına baxmayaraq bir neçə adam ay gördülər və qazı önündə şəhadət etdilər. Ay başı sabit oldu. Çərşənbə axşamı gününün sabahı bayram namazını qılıb hərəkət etdik. On küruh gedib Tayikdən bir küruh uzaqlıqda Guy çayının sahilinə endik. Günortaya yaxın məcun yedik. Şeyx Zeyn, Molla Şəhab və Xandəmirə yalnızca bu beyti göndərib çağırdıq:

Şeyx, Molla Şəhabü Xandəmir,
Gəlin üç-üç, iki-iki, bir-bir..

Dərviş Məhəmməd [Sarban], Yunus Əli və Abdullah [Kitabdar] da orada idilər. İkindi üstü güləşçilər güləşdilər.

Çərşənbə günü də o yurdda qaldıq. Çeşdə yaxın bir vaxtda məcun yedik. Tac xanı Çünardan çıxarmaq üçün getmiş olan Məlik Şərq o gün gəldi. O gün də pəhlivanlar güləşdilər. Daha öncə gəlmiş olan Udi Pəhlivan o günlərdə gələn **(379 a)** bir hind pəhlivanı ilə güləşərək onu yıxdı. Yəhya Nuhaniyə Sərvardan təxsisat olaraq on beş leklik yer verilib bir dəst libas geydirilərək getməsinə izin verildi.

Ertəsi gün on bir küruh gedib Guy çayını keçərək o çayın sahilinə endik. İlqar gedən sultan və bəylərin Dəlmuta çatdıqları, lakin Qanq çayını hələ keçmədikləri xəbəri alındı. Buna əsəbiləşdim; Qanq çayını dərhal keçib düşməni təqib etmələri və Cundan da keçərək Aləm xanı [Cəlal xan Cighet] özlərinə qoşub sürətlə asilərə hücum etmələri üçün fərmanlar göndərildi.

Guydan qalxdıq və arada bir dəfə dincəldikdən sonra Dəlmuta gəldik. Həmin gün əsgərin böyük bir qismi Qanq üzərindəki keçiddən keçdi. Ordu keçdikdən sonra keçiddən aşağıda yerləşən adada məcun yedik.

Suyu keçərək endiyimiz yurdda əsgərin gecikənləri üzündən bir gün qaldıq. O gün əsgəriylə birlikdə Baqi Daşkəndi də gəlib mülazimət etdi.

Qanq çayından hərəkət etdik və arada bir dəfə dincəldikdən sonra Güvarənin yanında Erind çayının sahilinə endik. Dəlmutdan Güvarəyə qədər iyirmi iki küruh tutdu. Cümə axşamı günü də o yurddan qalxıb Adəmpur pərgənəsinin önünə endik.

Müxalifləri təqib məqsədilə çayı keçə bilmək üçün **(379 b)** mövcud gəmiləri gətirmək üzrə gəmicilərdən bir-ikisi daha öncədən Kalpiyə göndərilmişdi. Orada dincəldiyimiz axşam bir neçə gəmi gəldi. Çayda keçid də tapıldı. Yurd tozlu olduğu üçün mən adada oturdum. Orada olduğumuz bir

neçə gün boyunca mən adada qaldım.

Müxaliflər haqqında dəqiq bir məlumat alına bilmədiyi üçün Baqi Şiğavul Uddakı igidlərlə birlikdə sudan keçirilərək düşməndan xəbər tutmaq üçün göndərildi. Ertəsi cümə günü ikindi üstü Baqi bəyin nökəri gəldi. Şeyx Bəyazid ilə Bibənin önçülərini məğlub edərək Mübarək xan Cilvani adlı yaxşı bir adamıyla digər bir neçə adamını öldürüb bir neçə baş və bir əsir göndərmişdi. Sabah olanda isə Baqi [Şiğavul] ilə birlikdə gedən Şah Hüseyn Bəxşi gəldi, düşmənin önçüsünün yenildiyini və oradakı xəbərləri müfəssəl bir şəkildə anlatdı. O gecə, yəni bazar gecəsi ayın on üçündə Cun çayı yüksəldi, sabah bu adanı tamamilə su basdı. Bir ox atımı daha aşağıda yerləşən başqa bir adaya gedərək çadır qurdurub oturdum.

Bazar ertəsi günü Cəlal Daşkəndi ilqar gedən sultan və bəylərin yanından gəldi. Şeyx Bəyazid ilə Bibən ilqar xəbərini alınca Məxubə pərgənəsindən qaçmışlar. **(380 a)**

Yağmur mövsümü yaxınlaşmışdı. Beş-altı ay boyunca fasiləsiz səfərde olan əsgər və heyvanlar da yorulmuşdular. Onun üçün ilqar gedən sultan və bəylərə Aqra və civarından təzə və qüvvətli ilqar gəlincəyə qədər olduqları yerdə qalmaları əmr edildi. O gün ikindi üstü Baqi Şiğavul ilə ud əsgərinə getmək üçün izin verildi. Əsgərin dönüb Saru çayından keçdiyi zaman gəlmiş olan Musa Məruf Fərmüliyə də təxsisat üçün Əmərxardan otuz leklik pərgənə təyin edilib bir dəst xassə paltar və yəhərli bir at ehsan edilərək Əmərxara getməsinə izin verildi.

## AQRAYA QAYIDIŞ

Bu tərəflərdəki əndişə ortadan qalxınca çərşənbə axşamı gecəsi üç pas bir geri sonra sürətlə Aqraya hərəkət etdik. Ertəsi gün on altı küruh yol gəlib çeştə yaxın bir vaxtda Kalpiyə tabe olan Bələdər deyilən pərgənədə yemək yeyib atlara da arpa verdikdən sonra axşam üstü oradan hərəkət etdik. O gecə on üç küruh yol yürüyüb üçüncü pasta Kalpi pərgənələrindən Sugendpurda Bahadır xan Sərvaninin məzarının yanında uyuduqdan sonra sabah namazını qılıb oradan təkrar atlandıq. On altı küruh gedib günortaya doğru Ətavəyə gəldik. Mehdi Xoca qarşılamağa çıxdı. Gecənin ilk pasında oradan hərəkət etdik və yolda bir az uyuduqdan sonra on altı küruh **(380 b)** yol alıb Rabirinin Fəthpuruna endik. Günorta namazından bir az əvvəl Fəthpurdan hərəkət edərək on yeddi küruh yol alıb gecənin ikinci pasında Aqranın Həşt-Behişt bağına endik.

Ertəsi cümə günü, Məhəmməd Bəxşi ilə digər bəziləri gəlib mülazimət etdilər. Günortaya yaxın Cundan keçib Xoca Əbdülhaqa mülazimət etdikdən sonra qalaya gedib xalalarımı gördüm.

Bəlxli bir bostancını qovun əkməsi üçün burada qoymuşduq. Bir neçə

qovunu qoruyub saxlamışdı, gətirdi. Olduqca yaxşı qovunlardı. Həşt-Behişt bağında bir-iki üzüm meynəsi əkdirmişdim. Onun da gözəl üzümləri olmuşdu. Şeyx Gürən də bir səbət üzüm göndərmişdi, pis deyildi. Hindistanda qovun və üzümün bu qədər yetişməsi məni çox sevindirdi.

Bazar gecəsi iki pas olmuşdu ki, [Hümayunun anası] Mahım bəyim gəldi. Biz cəmadiyüləvvəl ayının onunda [=21 yanvar] səfərə çıxmışdıq. Qəribə bir təsadüf əsəri o da eyni gündə Kabildən hərəkət etmişdi.

Cümə axşamı günü, zülqədə ayının ilk günündə [=7 iyul] böyük divanxanada bir divan toplantısında ikən Hümayun ilə Mahımın hədiyyələrini gətirdilər. O gün Məğfur Divanın bir adamına bu məqsəd üçün tutulmuş yüz əlli adam verilərək qovun, üzüm **(381 a)** və meyvə gətirmək üzərə Kabilə göndərildi.

Şənbə günü, ayın üçündə, mühafiz olaraq Kabildən gələn və Əli Yusifin [Riqabdar] ölümü dolayısıyla Sənbələ göndərilmiş olan Hindu bəy [Koçin] gəlib mülazimət etdi. Hüsaməddin Əli Xəlifə də eyni gün Əlvardan gəlib mülazimət etdi. Ertəsi gün də Əli Yusifin ölümü dolayısıyla Sənbələ göndərilmiş olan Abdullah [Kitabdar] Tirmühanidən gəldi.

## LAHORDAKI İTAƏTSİZLİK HADİSƏLƏRİ

Şeyx Şərif Qarabağinin Əbdüləzizin [Miraxur] təşviqi ilə və ya ona bağlılığından edilməyən zülm və olmayan zalımlıqları bizim etdiyimizz iftirasında bulunaraq sənədlər tərtib ediib Lahor mollalarının adlarını da zorla yazdırıb surətlərini digər şəhərlərə göndərərək oralarda da bir hərəkət oyandırmaq niyyətində olduğu və Əbdüləzizin də bir neçə əmrə itaət etməyərək hər cür nalayiq sözlər söyləyib hərəkətlərdə bulunduğu Kabildən gələnlərdən eşidilmişdi.

Bu üzdən bazar günü, ayın on birində [=17 iyul] Şeyx Şərif ilə Əbdüləzizi və Lahorun mollalaryla irəli gələnlərini hüzura gətirməsi üçün Qənbər Əli Lahora göndərildi.

Cümə axşamı günü, ayın on beşində [=21 iyul] Ticarədən Çin Teymur Sultan gəlib mülazimət etdi. O gün pəhlivan Sadiq ilə böyük Udi pəhlivan **(381 b)** güləşdilər. Sadiq Udini yarı yarıya yıxdı, amma çox zəhmət çəkdi.

Bazar ertəsi günü, ayın on doqquzunda [=25 iyul] qızılbaş elçisi Murad Qurçu Qacara dəyərli daşlarla işlənmiş kəmərli bir xəncər və münasib bir xələt geydirilərək iki lek təngə ehsan edilib getməsnə izin verildi.

## GÜVALYARDA DÜŞMƏNÇİLİK FİTNƏSİ

O günlərdə Güvalyardan Seyid Məşhədi gəlib Rəhimdadın düşmənlik fitnəsini ərz etdi. Xəlifənin nökəri Şah Məhəmməd Möhürdar bir çox nə-

sihətli sözlər yazılaraq onun yanına göndərildi. Getdi və bir neçə gün sonra Rəhimdadın oğlunu da özü ilə gətirərək gətirərək döndü. Gərçi oğlu gəlmişdi, lakin özünün gəlməyə niyyəti yoxdu.

Onun qorxusunu rəf etmək üçün çərşənbə axşamı günü, zilhiccə ayının beşində [=11 avqust] Nur bəy Güvalyara göndərildi. Bir neçə gün sonra Nur bəy gəlib Rəhimdadın istəklərini ərz etdi. İstədiyi tərzdə fərmanlar hazırlayıb göndərmək üzərəykən bir adamı gəlib «Məni oğlunu qaçırmaq üçün göndərdi, gəlmək niyyətində deyildir» deyə ərz etdi.

Bu xəbər gəlincə biz dərhal Güvalyar üzərinə hərəkət etmək istədik. Amma Xəlifə «Mən də bir dəfə nəsihətamiz bir məktub yazıb göndərim, bəlkə yola gələr» deyə ərz etdi. Bu iş üçün Şəhabəddin Xosrov göndərildi.

Cümə axşamı günü, ayın on yeddisində [=13 avqust] **(382 a)** Mehdi Xoca Ətavədən gəldi. Bayram günü Hindu bəyə bir dəst xassə libas, qiymətli daşlarla işlənmiş kəmərli bir qılınc və cins bir at ehsan edildi. Türkmənlər arasında Çağatay deyə məşhur olan Həsən Əliyə bir dəst paltar, qiymətli daşlarla işlənmiş kəmərli bir xəncər və yeddi leklik pərgənə ehsan edildi.

Çərşənbə axşamı günü, məhərrəm ayının üçündə [=3 sentyabr] Şəhabəddin Xosrov ilə birlikdə Şeyx Məhəmməd Qövs Rəhimdada şəfaət diləyi ilə Güvalyardan gəldi. Dərviş və əziz bir adam olduğundan onun xətrinə Rəhimdadın günahını bağışlayıb Şeyx Gürən ilə Nur bəyi Güvalyara göndərdim ki, Güvəlyarı bunlara tapşırıb... [1].

## MƏTNƏ EDİLƏN ƏLAVƏLƏR

[1] Baburun xatirələri 936-cı il məhərrəm ayının 3-də (3 sentyabr 1529) kəsilir. Ondan sonra yaşadığı on beş ay yarım boyunca ya bir şey yazmamış, ya da yazdıqları itmişdir. Babur 937-ci ilin 5 cümadüyüləvvəl günü (25 dekabr 1530) vəfat etmişdir.

Bədəxşanda olan Məhəmməd Hümayunu [Baburun oğlu] bir ildən bəri görməmişdik. Bizim üçün darıxdığına görə Bədəxşanı qaynatası Süleyman Mirzəyə tapşırıb bir gün Kabilə gəlir. Kamran Mirzə də Qəndəhardan Kabilə gəlmişmiş. Bayram meydanında görüşüb heyrətlə bu gedişin səbəbini soruşmuş. Məhəmməd Hümayun da bizim üçün darıxdığını söyləyərək Hindal Mirzəni Kabildən Bədəxşana göndərdikdən sonra dərhal bizə doğru hərəkət edir. Bir neçə gün sonra xilafət mərkəzi olan Aqraya gəlib anası ilə onun haqqında danışıb oturarkən içəri girdi. Könüllər çiçək kimi açılaraq gözlər işiq kimi parladı. Hər gün ziyafət verilirdi, lakin onun şərəfinə xüsusi olaraq böyük bir ziyafət verib əyləncələr tərtib etdik. Uzun zaman birlikdə olaraq səmimi ünsiyyət qurduq. Həqiqətən, söhbətdə misilsizdi, mükəmməl bir insan idi.

Məhəmməd Hümayunun Bədəxşandan gəldiyi zaman Kaşğar xanlarından olub bizə də qohumluğu çatan Sultan Səid xan [oğlu] Reşid xanı Yarkənddə qoyub boş bir xəyalla Bədəxşan tərəfinə hərəkət etmişdi. Lakin o Bədəxşana varmadan az əvvəl Hindal Mirzə gedib Qaleyi-Zəfərə girmişdi. Sultan Səid xan da üç ay mühasirədən sonra heç bir şey edə bilmədən geri qayıtmışdı.

Bizə isə kaşğarlıların gəlib Bədəxşanı aldıqları şəklində xəbər gəlmişdi. Biz də Xoca Xəlifəyə Bədəxşana gedib nə etmək lazımsa elə də etməsini əmr etdik. Amma o, düşüncəsizliyindən bunu qəbul etmədi. Məhəmməd Hümayuna «Sənin getmən necə olar?» dedik. O da «Əmrə çarə yoxdur, lakin öz arzumla hüzurdan ayrılmamağa söz verdim» deyə cavab verdi. Onun üçün Süleyman Mirzənin Bədəxşana getməsinə izin verildi.

Sultan Səidə də «Bizim sizdə bu qədər haqqımız olmasına baxmayaraq sizin belə iş görməyiniz bizə qəribə gəldi. İndilik Hindal Mirzəni yanımıza çağıraraq [Hümayunun qaynatası] Mirzə Süleymanı göndərdik. Haqqıma riayət edərək Bədəxşanı bizim oğlumuz Mirzəyə təslim etsəniz, yaxşı; yoxsa bizim günahı üzərimizdən atıb mirası varisinə təslim edəcəyimizi bilsinlər» deyə yazdıq.

Mirzə Süleyman hələ Kabilə varmadan düşmən Bədəxşandan əl çəkib sükunət təsis etmiş, Mirzə Süleyman Bədəxşana vardıqdan sonra da Hindal Mirzə şəhəri ona təslim edib Hindistana hərəkət etdi.

Məhəmməd Hümayuna qərargahı olan Sənbələ getməsinə izin verildi. Altı ay qədər orada oldu. Belə görünür ki, oranın suyu və havası ona düşmədi. Qızdırmaya tutulurmuş. Get-gedə bu, uzun çəkməyə başlayır. Bunu duyunca mahir təbiblərə göstərib xəstəliyini tədavi etmək üzrə onu əvvəlcə Dehliyə və oradan da gəmiylə buraya gətirmələrini əmr etdim. Çay yoluyla bir neçə gündə gətirdilər.

Təbiblərin bütün tədavilərinə baxmayaraq yaxşılaşmadı. Böyük bir

adam olan Mir Əbülqasım «Belə xəstəliklərin əlacı budur: tanrı təalanın səhhət verməsi üçün yaxşı şeylərdən birini nəzir demək lazımdır» deyə söylədi. «Məhəmməd Hümayunun məndən başqa daha yaxşı bir şeyi yoxdur; mən özümü nəzir edim, Allah qəbul etsin», deyə ağlıma gəldi.

Xoca Xəlifə və digər yaxınlar «Məhəmməd Hümayun necə olsa yaxşılaşar, siz bu sözü nə üçün ağzınıza alırsınız. Bunu etməkdə məqsəd dünya malından yaxşı bir şeyi nəzir etməkdir. Məsələn, İbrahim savaşında ələ keçən və Məhəmməd Hümayuna ehsan etdiyiniz almazı nəzir etmək lazımdır» deyə danışdılar.

«Onun əvəzində dünya malı nədir ki? Onun vəziyyəti pis olduğu üçün mən də özümü ona fəda edirəm. İş o dərəcə vahiməlidir ki, mən onun halsızlığına dözə bilmirəm» dedim. O vəziyyətdə gedib üç dəfə baş ucunda dolanaraq «Nə dərdin varsa, mən öz üzərimə aldım» dedim.

Bundan sonra mən ağırlaşdım, o, yüngülləşdi. O sağalıb qalxdı, mən isə xəstə olub yıxıldım.

Dövlətin irəli gələnlərini və məmləkət ərkanını çağırıb biət əllərini Hümayunun əllərinə verib onu yerimə və vəliəhdliyə təyin etdim, taxtı ona təslim etdim. Xoca Xəlifə, Qənbər Əli bəy, Turdu bəy, Hindu bəy və bu qərarda hazır olan digər kimsələrin hamısı də qəbul edib bağlandılar.

Doqquz yüz otuz yeddinci ildə, cəmadiyüləvvəl ayının altısında, padşah öz əliylə tikdiyi çarbağda bu vəfasız aləmlə vidalaşdı. Tarix, mərsiyə, qəsidə və tərkiblər söyləyən böyük müasirlər arasından Mövlana Şəhab Müəmmai bu misranı tarix düşürdü:

Hümayun bud varisi-mülkiyu
*Hümayun məmləkətinin varisi oldu.*

O qabiliyyətli padşahın məziyyətlərini söyləməklə və yazmaqla bitirmək mümkün deyil. Lakin qısaca budur. Bu səkkiz əsl sifət onun şəxsiinə xasdı: 1. Yüksək mühakimə. 2. Müstəsna himmət. 3. Vilayət almaq. 4. İdarə etmək. 5. Abadlıq. 6. Tanrı təala bəndələrinə rifah istəyi. 7. Əsgərin könlünü qazanmaq. 8. Ədalətli olmaq.

Fəzilət babında əskiyi yoxdu. Türkcə və farsca nəzm və nəsir söyləməkdə misilsizdi. Bilxassə türkcə divanında təzə məzmunlar tapıb söyləmişdir. Bir də *Mübin* adında bir məsnəvi kitabı vardır, dil bilən oxumuş xalq arasında onun qədər lətifi yoxdur. Xoca Əhrarın tərtib etdiyi *Validəyyə* adlı bir risaləni bu padşah nəzmlə çevirmişdir. *Baburiyə* dedikləri bu kitabı türkcə bilməyənlərə asan olması üçün Bayram xanın oğlu Mirzə xana türkcədən farscaya tərcümə etməsini əmr etdi.

O padşah musiqi elmindən də anlardı. Bu rübaini farsca söyləmişdir:

Dərvişanra əgər nə əz xoy-e-şanəm,
Leyk əz dilü can müqtəd işanəm,
Dur əst miquy şahi əz dərvişi,

Şahəm, vəli bəndeyi dərvişanəm.

*Dərvişlərlə bir qohumluğum olmasa da*
*Onlara can və könüldən bağlıyam,*
*Sahlıqla dərvişlik bir-birindən uzaq deyil,*
*Mən şaham, lakin dərvişlərin bəndəsiyəm.*

Farsca bu mətləni söyləmişdir:

Həlak mikondəm firqət tu danistəm,
Və gər nə rəftən əz in şəhr sitvanistəm
*Bilirəm, səndən ayrılmaq məni həlak edir,*
*Elə olmasaydı, bu şəhərdən gedə bilərdim.*

Bu mətlə də onundur:

Ta bə zülfi siyahəş dil bəstəm,
Əz pərişani-ye aləm bəstəm.
*Sənin qara zülfünə könül bağlayandan bəri*
*Cahanın pərişanlığından qurtuldum.*

O padşahın əruz və qafiyə barədə də risalələri vardır. Bunlardan biri *Müfəssəl* adında və bu elmin açıqlanması haqqındadır və fövqəladə də yaxşı tərtib edilmişdir.

Tanrə təala o padşaha dörd oğul və üç qız ehsan etmişdi. Oğulları Məhəmməd Hümayun padşah, Kamran Mirzə, Əsgəri Mirzə və Hindal Mirzədir, qızları isə Gülrəng bəyim, Gülçöhrə bəyim və Gülbədən bəyimdir. Bu üç qız eyni anadandır.

Bu padşahın heç bir söhbətinin dışında buraxmadığı bir neçə təbiət əhli bunlardır:

Əbülbəqa elmi-hikmət [fəlsəfə ilə əlaqəli mövzuları tədqiq edən elm] babında misilsizdi. Şeyx Zeyn Sədr isə Zeynəddin Hafinin nəvəsiydi, işlək bir zəkası vardı, nəzm və nəsrdə qabiliyyətli idi, Hümayun padşah zamanında əmir də olmuşdu. Şeyx Əbülvahid Fariği Şeyx Zeyn Hafinin əmisidır, zövq sahibiydi, şeir də söyləyirdi.

Sultan Məhəmməd Kosa Mir Əli Şirin müsahiblərindəndi və padşah məclisində etibar görərək yüksəlmişdi.

Mövlana Şəhab Müəmmai isə Fəqiri təxəllüsünü işlədirdi, fəzl və şeirdən nəsibi vardı.

Mövlana Yusif təbibdi və Xorasandan çağırmışdı, nəbzə baxmaq və təşhis qoymaq onun işiydi.

Sürx Vidal türkcə və farsca nəzm söyləyirdi.

Molla Bəqai də çox qabiliyyətli idi, *Məxzən ül-əsrar* vəznində padşah adına bir məsnəvi söyləmişdi.

Xoca Nizaməddin Əli Xəlifənin xidmət, səmimiyyət və vəzirlikdə ağıl və tədbiri vardı, padşahın hüzurunda hörmət və etibarı o qədər böyük idi ki,

sözü əksərən qəbul edilirdi. Tibdən də başı çıxırdı.

Mir Dərviş Məhəmməd Sarban Xoca Əhrarın yaxşı müridlərindəndi. Xoşsöhbət bir adamdı və fəzilətindən dolayı hüzurda yaxınlıq və etibar qazanmışdı.

Xandəmir tarixçi və mümtaz bir adamdı, əsərləri xalq arasında məşhurdur. *Həbib üs-siyər, Xülasət ül-əxbar, Düstur ül-ənvar* və digər əsərləri vardır.

Xoca Kəlan bəy əmirlərindəndi və padşahın özəl xidmətində çalışırdı, fəziləti və yüksək qabiliyyətilə tanınmışdı.

Onun kiçık qardaşı Kiçık Xoca da möhürdar və yaxın adamlarındandı, o da padşahın özəl xidmətində idi.

Sultan Məhəmməd Dulday böyük əmirlərindən idi, xoştəbiət bir adam idi.

Vallahü bikülli şeyin alim.

## QEYDLƏR VƏ İZAHLAR

Bu qeydlər və izahlar «Baburnamə»nin türkcə, özbəkcə və rusca nəşrlərində verilən izahlar və bəzi məlumat-soraq mənbələri əsasında tərtib edilmişdir. Biz tərcümə boyu mətnaltı haşiyədə bəzi terminlərin mənası açıqlamış, şəxslər, coğrafi məntəqələr və s. haqqında kiçik bilgilər vermişdik. Lakin ana mətni bu cür bilgilərlə çox yükləməməyə çalışdıq. Ona görə də burada bəzi ifadə və terminlərin geniş şəkildə açıqlanmasını münasib gördük.

Kitabın türkcə tərcüməsinin sonunda verilən və Timur Gürkan tərəfindən hazırlanan *Notlar* həddindən artıq geniş və əhatəlidir. Baburda işlənmiş bu və ya digər terminin izahı zamanı *Orxon-Yenisey* abidələrini, *Kitabi-Dədə Qorqud* və *Manas* dastanlarını çıxmaq şərtilə *Divanü lüğat-it-türk, Qutadğu bilig, Turfan mətnləri, Kodeks Kumanikus* kimi əski türk yazılı mətnlərindən, habelə Şəmsəddin Saminin *Qamusi-türki,* Şeyx Süleyman Əfəndi Buxarinin *Lüğati-çağatayi və türki osmani,* V.V.Radlovun *Versuch eines Wörterbuches der Türk Dialecte* lüğətlərindən, eləcə də ibn Mühənnanın və Əbu Həyyanın, K.K.Yudaxinin, P.de Kurteylin, N.Poppenin, Y.T.Zenkerin, S.L.Kingin lüğətlərindən və s. və i.a. mənbələrdən istifadə etmişdir.

*Baburnamə*nin rusca nəşrinə M.Salyenin və D.Voronovskinin əlavə etdikləri *Qeydlər* qismində izaha ehtiyac duyulan açıqlamalar həm fəsillərin sonunda, həm də kitabın axırında eyni şəkildə verilmişdir. Biz isə bəzi qeydləri hər səhifədə mətnaltı haşiyədə qısa, axırda isə daha geniş şəkildə verməyi qərara aldıq. Biz buraya özəlliklə Hindistana xas olan heyvan, quş, bitki və gül adlarının hamısını daxil etmədik, çünli Babur özü onları təsvir və izah etmişdir.

Təbii ki, bu qeydlər və izahlar mükəmməllikdən uzaq və iddiasızdır. Çünki bundan 500 il əvvəl çağatay türkcəsində hərbi, siyasi, ictimai, iqtisadi, ərazi-inzibati, mədəni sahələrdə işlənmiş bir çox terminin müasir dildə qarşılığını tapmaq çətin, bəzən isə qeyri-mümkündür. Lakin Baburun işlətmiş olduğu ifadə və terimlərin heç olmazsa qismən anlaşılması üçün bu qeydlər və izahlar vacibdir. Oxucularımızın əfvinə sığınırıq.

*Abdullah Hatifi*: Əbdürrəhman Caminin qohumu, vəfatı: 927=1521-cu il.

*Ağ axça:* gümüş pul, sikkə. Bax: *təngə* və *yarmaq.*

*Ağa, ağaça/ağaçə:* yaşça böyük deməkdir. Sonralar siyasi məna qazanaraq titula çevrilmiş, hər hansı bir quruma rəhbərlik edən şəxsin ünvanı olmuşdur. Məs.: Süleyman ağa (İraq elçisi), Hüseyn ağa (Sistan elçisi). Bu təbir eyni zamanda nüfuzlu kişilərin adı və ya adının tərkib hissəsi kimi müşahidə edilir. Məs.: Ağa Hüseyn. Qadınlarda isə sadə xalqdan olan, ailə qurmaq yolu ilə ali zümrəyə girmiş olan xanımlar üçün işlənir. Məs.: Ağa bəyim, Ümid ağaçə, Minqli Bi ağaça və s.

*Ağac* (orijinalda: yığac): Baburun ağac ilə göstərdiyi məsafə bugünkü öl-

çülərə görə 4-8 ingilis mili arasında dəyişir. Orta qiyməti 6 km-dir.

*Ağırlıq ölçüləri:* (Hindistanda):

8 reti = 1 maşə, təxminən 0,2 qram.
4 maşə = 1 tank = 32 reti, təxminən 0,8 qram.
5 maşə = 1 misqal = 40 reti, təxminən. 4,1 qram.
12 maşə = 1 tülə = 96 reti, təxminən 10,2 qram.
14 tülə = 1 sər, təxminən 143,5 qram.
40 sər = 1 batman, təxminən 5,74 kiloqram.
12 batman = 1 mani, təxminən 73 кг.
100 mani = 1 minasə, təxminən 729,8 кг.

*Axtaçı:* hökmdarın atlarıyla məşğul olanlar mehtər, veterinar.

*Aqan:* Hindistanda qış fəslinin ilk ayının adı. Bax: *ay.*

*Aqra zəlzələsi:* 911-ci il səfər ayının 3-də (15 iyul 1505-ci ildə) baş vermişdir.

*Almaz:* 787 karatlıq məşhur almaz. Cilalandıqdan sonra 280 karat olmuşdur. Babur həmin almazı Hümayuna bağışlamışdır.

*Amu-Dərya:* orta Asiyanın iki əsas çayından (digəri Sır-Dərya) biri. *Barlas*: Əmir Teymurun mənsub olduğu türk boyu..

*Arça:* şam və ardıc kimi izah edilir, bizcə, arçan ağacıdır.

*Ardçı:* bax: *çağdavul.*

*Arğamcı/urğamçı:* məsafə (hündürlük) ölçüsü. 70-90 sanntimetrdir. Bəzi mütəxəssislərin fikrincə, 7-8 gəz*,* yaxud 20 zira uzunluğundadır [zira: dirsəkdən orta barmaq ucuna qədər olan bir uzunluq ölçüsü].

*Arğun*: türk boyu.

*Arxarqulça:* qızılkeyik. Geyikin bir növü.

*Arpa:* bax: *cev.*

*Asəfi:* bu təxəllüsü vəzir oğlu olduğu üçün qəbul etmişdir. Burada şairin öz atası deyil, Süleyman şahın əfsanəvi vəziri Asəf nəzərdə tutulur.

*Aşçı/aşpaz:* bax: *bavurçu.*

*Aşçılıq/bavurçuluq:* hökmdar sarayında mətbəxdə çalışanlara məxsus rütbə. Bəkavulluqdan [yeməklərə nəzarət edən şəxsin ünvanı] aşağı dərəcədə bir rütbə.

*Ata-bəy:* bax: *atəkə, bəy-atakə***.**

*Atakə:* əslində *ata* və *əkə* «böyük qardaş» sözlərindən ibarət bir sözdür. Gənc şahzadələrin tərbiyə edilməsi və onlar üçün ayrılmış vilayətlərin idarəsi ilə məşğul olan şəxsin titulu. Bizdəki atabəy və lələ tituluna uyğundur.

*Ay-balta:* təbərzin, kəsən tərəfi, yəni ağzı aypara şəklində olduğu üçün belə adlanır.

*Ayı(ğ) otu:* ayı otu; Fərqanədə mehr-giyah otuna verilən ad.

*Aylar və fəsillər:* Hindistandakı aylar və fəsillər bunlardır:

Yay fəsli ayları:

Çitar – hut [balıq bürcü] – 21 fevraldan başlanır.
Bisaq – həməl [qoç bürcü] – 22 martdan başlanır.
Çit – səvr [buğa bürcü] – 22 apreldən başlanır, şiddətli isti olur.
Əsar – cövza [ekizlər bürcü]–22 maydan başlanır, şiddətli isti olur.
Yağmur fəsli ayları:
Savən – sərətan [xərcəng] – 22 iyundan başlanır, şiddətli yağış yağır.
Badun – əsəd [şir bürcü] – 24 iyuldan başlanır, şiddətli yağış yağır.
Küvar – sünbülə [başaq, qız bürcü] – 24 avqustdan başlanır.
Katik – mizan [tərəzi bürcü] – 24 senytabrdan başlanır.
Qış fəsli ayları: Aqan – əqrəb bürcü – 24 oktyabrdan başlanır.
Pus–qövs [yay, oxatan]–23 noyabrdan başlanır, şiddətli soyuq olur.
Maq – cədi [oğlaq] – 23 dekabrdan başlanır, şiddətli soyuq olur.
Fagün – dəlv [dolça bürcü] – 22 yanvardan başlanır.

*Aymaq:* xalq, uruğ, boy, qəbilə, tayfa, el-oba; bəzi məqamlarda: başqa soydan olan, yad adam.

*Baburi xətti:* Baburun özü tərəfindən 910-cu ildə (1504/5) Kabildə icad edilən, hərflərin ayrı-ayrı yazılış şəkilləri və qaydaları olan bir əlifbadır. Türkcənin fonetikasına daha uyğun olan bu əlifba ilə Babur Quran yazdırmışdır.

*Badrəng:* Kabildə yetişən, formaca limona bənzəyən bir meyvə. Böyük bir xiyar növünə də badrəng deyilir.

*Bağlan qaz:* vəhşi qaz, qarabataq quşu.

*Bağrıqara:* quşun rənginə görə verilən bir sifətdir, sonra quşun adı yerinə keçmişdir.

*Bahadırlıq ülüşü, culdu:* savaşda göstərilən şücaətə görə hökmdarın hüzurunda verilən maddi mükafat üçün işlənən termin.

*Balqabaq/balqabaq meydanı:* təlim atışları üçün hədəf olaraq balqabağa ox atılan meydan olmalıdır. İstanbulda da "Ox meydanı" adlı bir meydan mövcuddur.

*Bamyan*: bu vadidən başlayan aşırımlar Hinduquş üzərindən keçir. Hindistanı işğal edən hər fateh buradan keçmişdir.

*Baranğar:* döyüş səfində olan ordunun sağ qolu.

*Barin*: türk boyu.

*Batman:* türklərdə və qonşu xalqlarda ağırlıq ölçüsü, 1 batman = 40 sir.

*Bavurçu:* aşçı, aşpaz. Hökmdar sarayında mətbəxdə çalışan bəkavuldan aşağı dərəcədə bir rütbə.

*Bazaraq:* bir aşırım adı. Hündürlüyü 5.300 metrdir.

*Bədəxşan*: Amu-Dəryanın yuxarı axarında, onun Pənc, Göyçə və Bədəxşan adlı qolları üzərində yerləşən vilayət. Qunduz, Kaşğar və Kafiristanla həmsərhəddir.XVI əsrə qədər özlərini Makedoniyalı İskəndərin soyuna bağlayan yerli şahlar tərəfindən idarə olunmuşdur.

*Bədrəddin Həlai:* şair, vəfatı: 939 = 1532-ci il.

*Bəgi:* əsasən özbək mənşəli qadınlara məxsus bir ünvan. Məs.: Bəgi Sultan ağaçə, Zöhrə Bəgi ağa.

*Bəhmənilər xanədanı:* bu xanədan Dəkkən bölgəsində 1347-1527-ci illərdə hökmdarlıq etmişdir.

*Bəxşi:* katib; uygur hərfləri ilə yaza bilən, bu yazının işləndiyi dilləri bilən məmur; yazıçı; həkim, türkəçarəçi, cərrah; şaman; din xadimi; aşıq, şair, çalğıçı.

*Bəkavul:* yemək dadan, dequstator, çeşnigir. Xassə bəkavul dərəsəsi bəkavuldan, bəkavul isə bavurçudan daha yüksəkdir. Bu həm də şəxs adı kimi işlənmişdir: Aşiq Bəkavul, Hacı Pir Bəkavul, Qul-Bəyazid Bəkavul.

*Bəlx*: Əfqanıstanda eyniadlı çayın yanında yerləşən şəhər. Qədimdə onun yerində Baktriananın paytaxti Baktra şəhəri olmuşdur.

*Bəluclar*: İran dilləri qrupunda danışan təqribən 30 milyonluq bir xalq. İran, Əfqanıstan və Pakistanda yaşayırlar.

*Bəy:* türk dövlətçilik ənənəsində və hərbi təşkilatda əskidən bəri yüksək vəzifə, səlahiyyət və məsuluyyət sahibi şəxslərin ünvanı. Baburda həmin zümrəyə daxil olanlar bunlardır: içki, içki bəy, böyük bəy, habelə bəy-atəkə, sahib ixtiyar, eşik ağa.

*Bəy-atəkə:* bax: *atəkə.*

*Bəyim:* hökmdar ailəsinə mənsub qadınların ünvanı.

*Bi (<bəy<bəg):* ailə qurma yoluyla ali zümrəyə girən özbək qadınların daşıdığı ünvan. Məs.: Sultan Hüseyn Mirzənin özbək cariyəsi Minqli Bi ağaçə. Kişilərdə də müşahidə olunur: Kibək Binin oğlu Qənbər Bi.

*Bicangər racəliyi:* Dəkkəndə 1336-cı ildə qurulmuşdur və bu sülalədən gələn racələr 1565-ci qədər, yəni güclərini birləşdirən digər Dəkkən racələri tərəfindən yenilib Bicangər şəhəri yıxılanadək hökm sürmüşlər.

*Bikə:* Baburda ad olaraq (məs.: Bikə Bəyim, Bikə Sultan bəyim) işləndiyi də müşahidə olunur.

*Bikramacit (Vikramaditya) Hindu:* ulduz kataloqu tərtib etmişdir. Lakin Nəsirəddin Tusinin və əl-Xarəzminin kataloqları qədər dəqiq deyil.

*Bisak:* Hindistanda yay fəslinin ikinci ayının adı.

*Bismillah:* Quranın, hər əsərin və işin başlandığı söz.

*Boy:* savaş nizamına girən ordunun mərkəzindəki özəl bir bölüyün adı.

*Boza:* bir türk içkisi; pivə (?).

*Budvar:* çərşənbə; Hindistanda həftənin günlərindən birinin adı.

*Buğu:* geyik. Baburda bəzən buğu-maral şəklində birlikdə və tək bir ad kimi keçir, lakin bu iki təbirlə geyiyin erkəyi və dişisi nəzərdə tutulur.

*Cavanğar:* savaş nizamına girən ordunun sol qolu.

*Cev:* arpa, taxıl; uzunluq ölçüsü. 6 cev (arpa) = 1 əlik (barmaq).

*Cikə:* nə olduğu tam olaraq anlaşılmayan bir bitki.

*Civə:*ondan hazırlanan dərmanlar Şərqdə çox məşhur olmuşdur.

*Çağdavul:* hərəkət halındakı ordunun arxa qolu.

*Çahargah nəqşi:* musiqi əsərinin növü.

*Çakər:* bax: *nökər* .

*Çarbağ:* çahar bağ, dörd bağça. Bu sözlə bir qismi park, bir qismi üzümlük, bir qismi meyvə ağacı, bir qismi də bostan olan hovuzlu bağlar nəzərdə tutulur. Babur öz hakimiyyəti dövründə çoxlu bağ saldırmışdır.

*Çar-piç/dəstar-piç:*çalma sararkən parçanın dolaşma, bükülmə və ya qıvrılmalarına görə işlənilmiş terminlər olmalıdır.

*Çeşnigir:* bax: *bəkavul.*

*Çəng*: musiqi aləti.

*Çərgə:* dərəcə deməkdir.

*Çərik:* ordu, qoşun.

*Çərşənbehi:* sevimli qadın, cariyə, gözdə, favori qadın.

*Çikin-tala otu:* ot, yem, yaşıl ot.

*Çil sütun:* qırx sütun.

*Çilgüzə:* bir fıstıq növü.

*Çin Teymur Sultan ibn Əhməd xan:* dayısı oğlu olsa da, Babur ona "qardaş" deyirdi, çünki hər ikisi Yunus xanın törəməsi idi. Çin Teymur xan 936 = 1530-cu ildə ölmüşdür.

*Çirçik* (Çir, Paraq): Sır-Dəryanın sağ qolu. Daşkənd (əski adları: Şaş, Çaç) Çirçik vadisində yerləşir.

*Çit:* Hindistanda yay fəslinin üçüncü ayının adı.

*Çitar:* Hindistanda yay fəslinin ilk ayının adı.

*Çöhrə:* üz, gözəl üz; oğlan.

*Damğa:* möhür; vergi rüsumu; nişan.

*Daruğa:* darğa; qalabəyi, hərbi qarnizon rəisi, vali, qubertator, xişnə.

*Daş:* qiymətli şeyləri çəkməkdə istifadə edilən bir ağırlıq ölçüsü.

*Daşkənd:* 2.500 illik tarixi olan bir şəhər. XV əsrdə Baburun ana babası Yunus xanın hakimiyyəti altında idi.

*Dəbusi*: qədim bir qala. Xarabalıqları Səmərqənd yaxınlığındadır.

*Dəstar-piç:* çalma sarıyan çalmaçı, sarıqçı, çalmaçı, əmmaməçi.

*Dəstur*: vəzir, məsləhətçi.

*Dəyirman suyu:* axan suların miqdarını ölçmək üçün işlənən bir təbir.

*Dəyirman suyu:* axar suların miqdarını ifadə edən bir tabir.

*Dirhəm*: gümüş sikkə. Dinarın 1/20-nə bərabər oımuşdur.

*Divan:* dövlət dəftərxanası, ali hökumət orqanı və ayrı-ayrı idarələr; rəsmi qəbul; ən yüksək mülki amir, yəni sahib-divan; qəzəl toplusu.

*Dizək/Çizək:* Səmərqənd vilayətində yaşayış məskəni.

*Ehram*: zəvvarların geydikləri xüsusi paltar.

*Eşik ağa:* vəzifəsi dəqiq bilinməyən ünvan. Teymurilər sarayında mühüm bir məmuriyyət. Ehtimal ki, təşrifatçı, hacib, seremonmeyster, kamergerdir.

*Eşik ixtiyarı:* səlahiyyət dairəsi dəqiq bilinməyən bir ünvan. Saraydan k-ənardakı bütün işlərə baxan adamın ünvanı olmalıdır.

*Eşşək yükü*: mətndə *xarvar* və ya *xərvar* olaraq keçən bu ağırlıq ölçüsünün dəyəri dəqiq müəyyən deyil. 80 kilo ilə 300 kilo arasında dəyişir. Xalvar sözü də bu sözdən olmalıdır.

*Eytvar:* bazar günü; Hindistanda həftənin günlərindən birinin adı.

*Əbülqasım Babur:* Baysunqur Mirzənin oğlu, Şahruxun nəvəsi. Vəfatı: 861 = 1459-cu il.

*Ədədlər/saylar:* Hindistanda:

1 lek = 100.000.
100 lek = 1 kürur və ya 10.000.000.
100 kürur = 1 ərb və ya 1.000.000.000.
100 ərb = 1 kərb və ya 100.000.000.000.
100 kərb = 1 nil və ya 100.000.000.000.000.
100 nil = 1 pədəm və ya 100.000.000.000.000.000.
100 pədəm = 1 sanq və ya 100.000.000.000.000.000.000.

*Əfqanlar*: adları ilk dəfə XI əsr tarixçisi Məhəmməd Ütbinin “Tarixi-Ütbi” əsərində çəkilir. Əsər Mahmud Qəznəviyə ithaf edilmişdir.

*Əhməd xan:* Baburun “Kiçik xan”, “Alaca xan” adlandırdığı dayısı. 909-cu ildə (1505) Kaşğarda ölmüşdür.

*Əkə*: böyük qardaş və ya bacı.

*Əlik:* barmaq; yan-yana düzülmüş altı arpa boyunda uzunluq ölçüsü.

*Əməl*: musiqi əsəri növü.

*Əmlük:* Kabilin bir bölgəsində olub digər yerlərdə olmayan bir meyvə. Türklər ona "qara yemiş" deyirlər.

*Əndəxud*: Şimali Əfqanıstanda şəhər. İndi xarabalıqları qalır.

*Əndican:* Özbəkistanda vilayət mərkəzi. IX əsrdən bilinir.

*Ərb:* Hindistanda işlənən bir say. l ərb = 100 kürur. Bax: *lek.*

*Ərəfə*: zilhiccə ayının 9-u. Zəvvarların Ərəfat dağına gəldikləri gün.

*Ərk:* qala, içqla, bürc, daxili qala, qala içində qala. Ətrafı divarlarla əhatə olunan, əksərən yüksəkdə və divarla təkrar hörülmüş qala. Hökmdarın və ya həmin yerin ən böyük amirinin sarayı və mühafizlərinin olduğu məkan.

*Əsar:* Hindistanda yay fəslinin sonuncu ayı. Bax: *ay*.

*Əsəs*: gecə qarovulu.

*Əshabi-fil:* fil sahibləri. Həbəşistan kralı Nəcaşi Əshamə tərəfindən Yəmənə hökmdar təyin edilən Əbrəhə bin Səbbah ül-Əşrəm və ordusu fil sahibləridir. Ziyarətçiləri Kəbə yerinə öz bölgəsinə çəkmək istəyən Əbrəhə Sənada Qülleys deyilən bir kilsə tikdirir. Kinanə qəbiləsindən bir adam isə bir gecə bu kilisəyə təcavüz və həqarətdə bulunur. Bundan qəzəblənən Əb-

rəhə Kəbəni yıxmağa and içir və ordusuyla birlikdə Məkkəyə gəlir. Yanında ən qüvvətlisi Mahmud adını daşıyan bir sürü fil varmış. Əbrəhə bu fillərlə Kəbəyə doğru getmək istədikdə heyvanlar diz çöküb hərəkətsiz qalır, başqa səmtlərə yönəldildikdə isə qaçaraq gedirdilər. Allah Əbrəhənin ordusunun və fillərinin təpəsinə sürülərlə quşlar göndərib hamısını öldürdü. Hz. Məhəmməd bu hadisənin baş verdiyi il içində doğulduğu üçün bu ilə "fil ili" adı verilmişdir.

*Əşəreyi-mübəşşirə:* cənnətlik olduqlan sağlıqlarında özlərinə peyğəmbərimiz tərəfindən müjdələnən on adam: hz. Əbubəkr, hz. Ömər, hz. Osman, hz. Əli, hz. Talha, hz. Zübeyr, Əbdürrəhman bin Övf, Əbu Übeydə bin Cərrah, Səid bin Zeyd, Səd bin Əbu Vəqqas.

*Əşrəfi:* altın sikkələrə verilən ümumi ad.

*Əvrad:* vird sözünün cəmidir, oxunması adət halına gələn dualar.

*Fagün***:** Hindistanda qış mövsümünün dördüncü ayı.

*Fatihə*: Quranın ilk surəsi, yeddi ayədən ibarətdir.

*Fülus:* mis pul, bir təngənin dörddə biri. Maaşlar və bəxşişlər fülusla ifadə edilirdi.

*Geri:* hindcə: *ghari.* Hindistanda zaman ölçüsü.

*Geriyal:* müəyyən fasilələrlə bürünc bir lövhəyə vurmaqla saatın bildirilməsi. Bu işlə xüsusi bir kasta məşğul olurmuş.

*Gəmilərin adları:* Baburun öz gəmilərinə verdiyi adlar bunlardır:

Asayiş – rahatlıq, sakitlik.
Arayiş – bəzək.
Gündəiş – tutumluluq.
Fərmayiş – əmr, fərman.

*Gicək*: simli musiqi aləti, skripkanın bir növü.

*Gili-məxdum:* zəhərlənməyə qarşı dərman kimi işlənən bir cür torpaq.

*Göy saray*: Səmərqəndin ən məşhur saraylarından biri.

*Göyəldaş:* süd qardaşı, süd bacısı. Bəzi alimlərin fikrincə, könüldaş sözündən yaranmışdır.

*Gümüş çəki daşı:* = 250 misqal = 0,5 sir = təxminən 10,25 kiloqram.

*Gürgən cədvəli:* 847-ci ildə (=1444) Uluğ bəyin rəhbərliyi altında Rumi Qazızadə, Qiyasəddin Cəmşid və Əli Quşçunun iştirakı ilə tərtib edilmişdir. Uluğ bəyin şərəfinə onun titulu ilə (Gürgən) adlandırılmışdır.

*Havaq*: bir aşırım. Hündürlüyü 3.800 metrdir.

*Herat*: Heri-rud çayının sahilində yerləşən qədim şəhər. Teymurilər dövründə böyük mədəniyyət mərkəzi olmuşdur.

*Heydər Mirzə*: Məhəmməd Heydər Mirzə Gürgan Duğlat (vəfatı: 958 = 1551). «Tarixi-Rəşidi» adlı xatirə kitabının müəllifi, Baburun silahdaşı və xalası oğludur.

*Heyət/elmi-heyət/nücum:* astronomiya deməkdir.

*Həbəş padşah:* əsl adı Şəmsəddin Müzəffərdir. 1494-97-ci illərdə padşah olmuşdur.

*Həftənin günləri*: Hindistanda bunlardır:

Şənbə = saniçer.
Bazar = eytvar.
Bazar ertəsi = somvar.
Çərşənbə axşamı = manqalvar.
Çərşənbə = budvar.
Cümə axşamı = prispatvar.
Cümə = sükrvarə

*Hənəfilik*: islamın dörd qolundan biri. Əsası Əbu Hənifə (vəfatı: 150= 767-ci il) tərəfindən qoyulmuşdur.

*Hidayə:* islam fiqhinin hənəfi qolu üzrə klassik məcmuə. Onu Bürhanəddin Əli ibn Əbubəkr əl-Fərqani əl-Mərginani əl-Riştani (vəfatı: 593 = 1197) tərtib etmişdir.

*Hindal*: Baburun oğlu, 925-ci ildə (=1519) anadan olmuş, 958-ci ildə (= 1551) ölmüşdür.

*Hinduquş*: Himalayın qolları.

*Hövzü-kəbir:* çarbağ içində tikilən hovuz.

*Huna:* bir geyik növü, dişisinə ceyran, erkəyinə huna deyilir.

*Hülakü xan:*(654-668=1256-1265).Hülakülər adlanan sülalənin banisi.

*Hüma:* Hümayun, Feniks, əfsanəvi quş. İnama görə, onun qanadlarının kölgəsi kimin üstünə düşsə, o, xoşbəxt olarmış.

*Hürmüz:* İranın cənubunda kiçik bir ada.

*Xalçı/xilçi*: 839-cu ildən (=1435) Malvidə hökm sürmüş bir sülalə.

*Xandəmir Qiyasəddin ibn Hümaməddin:* tarixçi. Vəfatı: 942 = 1535-ci il.

*Xanım:* Baburun ana tərəfdən qohumları olan, Kaşğar və Moğolistan hökmdarları ailəsinə mənsub qadınlar üçün işlənir.

*Xas(sə):* hökmdara aid olan şey. Məs.: xas, xassə libas. Dövlətə, xəzinəyə aid olan şey. Məs.: xassə mülk. Bu mülk hökmdara, şahzadələrə və ya başqa heç bir şəxsə verilə bilməzdi.

*Xassə bəkavul:* hökmdarın şəxsi aşpazı. Bax: *bəkavul.*

*Xassə tabın:* qvardiya alayı. Bax: *tabın.*

*Xeybər dağları:* Makedoniyalı İskəndər, Mahmud Qəznəvi, Əmir Teymur və Babur Hindistanı işğal etmək buradan keçmişlər.

*Xəmsə:* beş poemadan ibarət ədəbi əsər. Ən məşhurları Nizamı, Əmir Xosrov Dəhləvi (XIV əsr) və Nəvai (XV əsr) tərəfindən yazılmışdır.

*Xəzərilər:* mənşəcə monqol olan, tacikcə danışan Əfqanıstan əhalisi. Adları Xəzər sözündən deyil, farsca həzar (min) sözündəndir.

*Xoca Xosrov*: məşhur şair Əmir Xosrov Dəhləvi. Vəfatı: 725=1325.

*Xoca Übeydüllah Əhrar:* məşhur sufi. Vəfatı: 895 = 1498-ci il.

*Xocənd*: keçmiş Stalinabad, daha sonra Leninabad şəhəri. Xoca Bakırqan çayının Sır-Dəryaya qarışdığı yerdə yerləşir. Fərqanə vadisinə açılan qapı kimi Orta Asiya iqtisadiyyatında mühüm rol oynamışdır.

*Xorasan*: sərhədləri dəqiq bilinməyən coğrafi məkan. Müxtəlif dövrlərdə Xorasana Herat vilayəti və qonşu ərazilər daxil olmuşdur. Hazırda İranın bir vilayətidir, mərkəzi Məşhəd şəhəridir.

*Xotən*: Uyğuristanın Tarım bölgəsində şəhər və vahə.

*Xuttalan:* Pənc ilə Vəxş arasında vilayət. Taciksitanın ərazisindədir.

*İçki:* içə aid, içdə olan, səmimi. Hökmdarın şəxsi tapşırıqlar məmuru.

*İddət müddəti:* keçmişdə ərindən ayrılan qadının təkrar ərə getməsi üçün keçməsi lazım olan zəruri müddət, yəni üç dəfə aybaşı keçirib təmizlənənə qədər keçəcək müddət (ərindən boşansa - 100 gün, əri ölsə - 130 gün).

*İgid:* hökmdarın və ya bəyin yanında və şəxsi xidmətləri məmuru; döyüşçü.

*İki namaz arası:* günorta namazı ilə ikindi namazı arası.

*İqlim:* Ptolomeyin coğrafiyasına görə, dünya cənubdan şimala doğru yeddi iqlimə ayrılır və üçüncüdən beşinciyə qədər olan iqlimlər yaşamağa əlverişlidir.

*İlbasun:* bu söz yırtıcı quşlar və sərçə kimi kiçik quşlar xaricində bütün ovlanan quşlara verilən ümumi addır.

*İlqar:* çox sürətlə hərəkət edən yüngül silahlı böyük, yaxud kiçik hərbi dəstə, bölük və ya hissə.

*İrəvül:* önçü, önçü bölüyü, önçü qolu, irəli qol; döyüş nizamına girmiş ordunun ən öndəki qismi.

*İskəndər Feyləkus oğlu:* Makedoniyalı İskəndərin Şərqdəki adı.

*Kafiristan:* indiki Nuristan. Bir vaxtlar əhalisi kafir olmuşdur.

*Kari:* altı tutam uzunluğunda bir uzunluq ölçüsü.

*Karşi:* (əski Nəxbəş, Nəsəf) Özbəkistanda vilayət mərkəzi.

*Karvan:* ümumi qaydaya görə, 7 dəvə bir karvan sayılır.

*Kaşğar*: qədimdən bəri Orta Asiya, Əfqanıstan və Hindistanla Uzaq Şərq arasında ticarətin, mədəni əlaqələrin inkişafında mühüm rol oynayan uyğur şəhəri. İndi Sincan-Uyğur Muxtar Rayonunun paytaxtıdır.

*Katik:* Hindistanda yağmur fəslinin son ayının adı.

*Keş*: Özbəkistanın Qaşqa-Dəyra vilayətində şəhər. Əmir Teymurun vətəni. Bəlxlə Səmərqənd arasında mühüm ticarət mərkəzi olmuşdur.

*Keyik/geyik:* geyik, maral. Ağ geyik, ala geyik, qara geyik, qızıl geyik növləri var. Ahu, antilop, sığın və maraldır.

*Kəmaləddin Behzad:* XVI əsrin məşhur miniatürçü rəssamı, Herat miniatür məktəbinin banisi. Vəfatı: 943 = 1537-ci il.

*Kəmali:* məcuna bənzəyən ləzzətli, nəşə verən narkotik bir maddə.

*Kərb:* Hindistanda işlənən bir say. l kərb = 100 ərb.

*Kibək:* mis sikkə; ruscadakı kopek, kopeyka bu sözdən ola bilər.

*Kim:* bəzi yerlərdə boza mayası kimi işlənən bir meyvə.

*Koçin:* Teymur zamanında xanədanı qoruyan saray qvardiyasına verilən addır. Bu ad zamanla atadan oğula keçmişdir. Koçinlər hər hansı bir bölgəyə deyil, hökmdara bağlı idilər.

*Köç:* köç, köç-külfət; dağa-arana və ya başqa yerə köçən ailə üzvləri.

*Kuxaq*: Zərəfşan çayının əski adı.

*Kurqan:* əslində, qorurğan, qorğan, yəni içinə girən adamın qorunduğu yer, qala, istehkam deməkdir.

*Kutas:* bir dağ öküzü növü.

*Küruh:* Hindistanda 4.000 qədəm (= 1 mil) uzunluğundakı məsafə ölçüsü.

*Kürur:* Hindistanda işlənən bir say. 1 kürur = 100 lek. Bax: *lek.*

*Kütub:* sufilərin işlətdiyi bir təsəvvüf deyimi olub mənəvi dərəcələrin yeddincisi və ən yüksəyidir. Hər dövrdə tanrı tərəfindən təsəvvüf qüdrəti verilmiş bir kütub olur.

*Kütval:* qalabəyi, qarnizon rəisi, dizdar.

*Küvar:* Hindistanda yağmur fəslinin üçüncü ayının adı.

*Qanun:* 36 simli kanon və ya ərğanun.

*Qaravul:* gözətçi, keşikçi; kəşfiyyat qolu; avanqard.

*Qarış:* gərilmiş halda baş barmağın ucundan çəçələ barmağın ucuna qədər olan bir uzunluq ölçüsü.

*Qazax:* igid, cəsur adam, döyüşçü.

*Qazaxlıq:* köçərilik; əldə vilayət və hakimiyyət olmayan dövr.

*Qazi:* O dövrdə müsəlman olmayan şəxslərin idarə etdiyi torpaqlara hərbi səfərlərdə iştirak edən hökmdarlara "qazi" ünvanı verilirdi.

*Qədəmgah*: Xızırın ayaq izi.

*Qəndahar*: Əfqanıstanda şəhər və vilayət. Əfqanıstan dövlətinin ilk paytaxtı (1747). Hazırda vilayət mərkəzi.

*Qəsideyi-bürdə* (Xirqə haqqında qəsidə) : VII əsri şairi Kəəb bin Zübeyr tərəfindən hz. Məhəmmədin şərəfinə yazılmış bir əsərdir.

*Qəznə:* Kabildən 135 km cənub-qərbdə yerləşir. Onun yaxınlığında qəznəvilərin paytaxtı tarixi Qəznənin xarabalıqları var.

*Qılquyruq:* çox incə quyruqlu bir cins ördək, çöl toyuğu, qır kəkliyi, fazan. Quşun bir qədər də poetikləşmiş adı.

*Qımız/kımız:* qısraq südünü xüsusi qaydada mayalandıraraq hazırlanan ənənəvi türk içkisi.

*Qızıl çəki daşı:* = 500 misqal = 1 sir = təxminən 20,5 kiloqram.

*Qızıl söyüd:* bax: *tubulğu.*

*Qol:* savaş nizamına girmiş ordunun mərkəzinə verilən ad.

*Qövs:*oxatan bürcü; yay.

*Qunduz*: Qunduz (Sürxab) çayının sağ sahilində şəhər.

*Qurçu, qurbəyi:* hərbi bir rütbə, cəbbəxana rəisi. Qur «silah» deməkdir.

*Qurilər:* Əfqanistanda hökm sürən Quri xanədandan olan Sultan Şəhabəddin Quri qəznəvilərin son hökmdarı Xosrov Məliki yenərək 1187-ci ildə bu xanədana son vermiş və Hindistan içlərinə səfərlər edərək burada qurilərin hakimiyyətini qurmuşdur. Onun xanədanı Şimali Hindistanda 1206-cı ilədək hakimiyyət sürmüşlər.

*Quşbəyi:* quşçubaşı, hökmdarın ov və ev quşlarına, göyərçinlərinə baxan məmur.

*Quşçu:* quş ovlamağa, habelə göyərçin və xoruz saxlamağa çox maraq duyan adam, quşbaz.

*Qüsəm ibn Abbas:* hz. Peyğəmbərin əmisi oğlu. 56=676-cı ildə Səmərqənddə öldürüldüyü güman olunur. Şahi-Zindədə dəfn edilmişdir.

*Lek:* Hindistanda işlənən, 100.000 rəqəmini ifadə edən bir say.

*Luli*: qaraçı.

*Lüng:* Hindistanda qadınların paltar yerinə istifadə etdikləri uzun bir parçanın adı; sari.

*Lüngutə:* Hindistanlı kişilərin paltar yerinə bellərinə bağladıqları bez parçasının adı.

*Maq:* Hindistanda qış fəslinin üçüncü ayına verilən ad.

*Mani:* Hindistanda işlənən bir ağırlıq ölçüsü. 100 mani = 1 minasə.

*Manqıt*: noqaylarla qohum olan türk boyu.

*Marağa*: Urmiya gölündən 35 km şərqdə yerləşən şəhər. Marağa rəsədxanası burada tikilmişdir.

*Maşə:* Hindistanda işlənən bir ağırlıq ölçüsü. 5 maşə = 1 misqal = 40 reti.

*Mavəraünnəhr:* Amu-Dərya ilə Sır-Dərya arasında yerləşən ərazinin tarixi adı. Ərəbcə “(Ceyhun) çayının arxasındakı ərazi” deməkdir.

*Meymənə:* (ərəbcə) ordunun sağ qolu.

*Meysərə:* (ərəbcə) ordunun sol qolu.

*Məcun*: bədəni möhkəmləndirən dərman qarışığı, konfortativ.

*Məhəmməd Salih:* şair, “Şeybaninamə” əsərinin müəllifi.

*Məhəmməd Şeybani xan:* Baburun əsas düşmənlərindən biri. 906-cı ildə Baburu Mavəraünnəhrdən tamamilə sıxışdırıb çıxarmışdır. Hakimiyyət dövrü: 906-915 = 1500-1510-cu illər.

*Məhfə:* dəvə, fil kimi heyvanların belinə qoyulan, içində iki adamın qarşılıqlı olaraq üzbəüz otura biləcəyi şəkildə düzəldilmiş səbət.

*Məmun cədvəli:* Klavdi Ptolomeyin (ərəbcə adı: Bitlimus) “Almagest” əsəri əsasında dahi türk astronomu Məhəmməd Musa əl-Xarəzminin xəlifə Məmun (198-218 = 813-833) üçün yenidən işlədiyi və təkmilləşdirdiyi ulduz kataloqu.

*Məngəlvar:* çərşənbə axşamı; Hindistanda işlənən gün adlarından biri.

*Mərv*: Orta Asiyadakı ən qədim şəhərlərdən biri. Margiana vilayətinin mərkəzi. Müasir Marı şəhərindən 30 km uzaqda xarabalıqları qalır.

*Mianqal:* Zərəfşanın qolları olan Ağ dərya ilə Qara dəryanın yaratdığı ada. Uzunluğu təxminən 100 km-dir.

*Mil:* 4.000 qədəm uzunluğunda bir məsafə ölçüsü.

*Minasə:* Hindistanda işlənən ağırlıq ölçüsü. l minasə = 100 mani.

*Minbəyi:* minbaşı; müasir mayor rütbəsi.

*Mir Əlişir Nəvai*: dahi özbək şairi (9.02.1441 – 3.01.1501).

*Mir Seyid Əli Həmədani:* sufizmin məşhur nəzəriyyəçisi. Vəfatı: 786 = 1384-cü il.

*Miraxur*: mehtərbaşı.

*Miri-şikar*: ovçuluq sahəsinə baxan saray məmuru, yegermeyster.

*Mirzə:* (<əmirzadə) Baburda Əmir Teymurun oğlu Miranşahın soyundan olan və Baburun babası Əbu Səidi də əhatə edən mirzələr. Sultan Hüseyn Mirzə isə Mirahşahın böyük qardaşı Ömər Şeyxin soyundandır.

*Misqal:* Hindistanda işlənən ağırlıq ölçüsü, təxminən 4,1 qram = 5 maşə = 40 reti.

*Moğolistan*: orta əsrlər Şərq tarixçilərinə görə, Türküstanın şimal-şərq hissəsində əsasən moğollarla/monqollarla məskun olan coğrafi məkan.

*Molla Cami:* Nurəddin Əbdürrəhman Cami (817-898=1414-1492). Herat ətrafındakı Camda doğulmuş və Heratda vəfat etmiş böyük şair.

*Möhür, damğa, nişan:* yazılan rəsmi məktubların başqaları tərəfindən açılmaması üçün qoyulan işarəyə deyilir.

*Möhürdar:* hökmdarın möhürünü saxlayan yüksək rütbəli məmur. Yazılan şəxsi və ya rəsmi məktublara möhür vururdu.

*Mübəyyin:* Baburun hüquqi səciyyə daşıyan, iqtisadiyyat və vergi siyasəti haqqında nəzmlə yazılmış əsəri.

*Müctəhid*: islam fiqhinin bilicisi, fiqhin mürəkkəb məsələlərini izah etməyə haqqı olan alim.

*Müçə:* rütbə deməkdir.

*Müəmmai*: müəmma deyən.

*Mühafiz:* qoruyan, qoruyucu, cangüdən. Bax: *tünqatar.*

*Möhtəsib:* o dövrün əxlaq polisi, yaxud bələdiyyə işlərinə baxan məmur. O, köməkçiləri ilə birlikdə küçədə-bazarda gəzərək tacirlərin alıcıları aldatmamasına diqqət edir, özünü yaxşı aparmayan adamları yerindəcə şallaqla cəzalandırırdı.

*Mülazimət*: bir neçə mənası var: yavər, xidmət etmək, müşayiət etmək, məiyyətdə olmaq deməkdir. Mülazim isə əski dönəmdə hərbi rütbə olub leytenant deməkdir.

*Mürği-cəngəl:* Ləmqanatda olan, qarğa ilə saxsağana bənzər bir quş.

*Mürid*: sufi dərviş təkkəsinə daxil olmağa hazırlaşan gənc, mürşidin (pir, şeyx) ardıcılı.

*Nağara:* ənənəvi olaraq hökmdarın qapısı önündə hər alacaqaranlıq və şəfəq vaxtında çalınan davul.

*Namazgah:* əskidən şəhər kənarında düzəldilən və xalqın toplu halda namaz qıla bildiyi açıq bir meydan.

*Naşpati:* Əndicanda yetişən və ən gözəl olduğu söylənən qovun və ya armud növü.

*Navək:* bir silah adı.

*Nəcmi-Sani:* 1512-ci ildə Babura köməyə gələn səfəvi qoşunlarının sərkərdəsi Nəcməddin Yarəhmədin ləqəbidir.

*Nəqş*: musuqi əsəri növü.

*Nəmənqan*: Sır-Dəryanın sağ sahilində şəhər; indi vilayət mərkəzi.

*Nəsirəddin Tusi*: məşhur alim və astronom. "Zici-Elxani" cədvəlini tərtib edərək elxani hökmdarı Hülaküyə ithaf etmişdir. Evklidin "Başlanğıc" və Ptolomeyin "Almagest" əsərlərini farscaya çevirmişdir.

*Nəstəliq*: xətt növü.

*Nil:* Hindistanda işlənən saylardan biri. l nil = 100 kərb.

*Nökər:* birinin əmri altına girərək onun xidmətində və məiyyətində olan, sıravi əsgərdən başlayaraq bəyə qədər müxtəlif dərəcəli hərbi və mülki adamlar üçün işlənən ümumi termin.

*Nüsrət şah ibn Əlaəddin ibn Hüseyn:* 899-cu ildən (=1493) Benqaliyada hökm sürmüş hakim.

*Ox atımı:* məsafə ölçüsü üçün işlənən bir termin.

*Osman*: üçüncü islam xəlifəsi (23 - 35 = 644 - 656).

*Oş*: Orta Asiyadan Çinə və Hindistana gedən ticarət yolu üzərində mühüm şəhər. Altay dağlarının cənub qolları üzərində, Akbura çayının sağ və sol sahilində yerləşir. Hazırda Qırğızıstanın vilayət mərkəzidir.

*Otrar* (Yengi): Arıs çayının Sır-Dəryaya qarışdığı yerdə salınmış qədim Orta Asiya şəhərlərindən biri. Hazırda xarabalıqları qalır.

*Örçin:* Kaşğar və Əndicanda ərazi-inzibati bölgü vahidi. Səmərqənd və Buxarada tümən, Hindistanda pərgənə olduğu kimi.

*Panipat*: Pəncabda bir şəhər. Panipat müharibəsi burada olmuşdur.

*Pas:* günün səkkizdə birinə və ya üç saata bərabər olan zaman ölçüsü. Hindistanda buna *pəhər* deyilir.

*Pədəm:* Hindistanda işlənən say. l pədəm = 100 nil.

*Pəhər:* Hindistanda günün səkkizdə birinə (üç saat) verilən ad; gecə və gündüzün hər birinin dörddə biri, yəni üç saat.

*Pəl:* Hindistanda bir zaman vahidi, gerinin altmışda birinə, yəni 24 saniyəyə verilən ad.

*Pəncgah nəqşi:* musiqi əsərinin növü.

*Pərgənə:* Hindistanda böyük əyayətlərə tabe olan kiçık vilayətlərə verilən ad; tümən.

*Pərvançı:* hökmdarın əmr və fərmanlarını yazan və bildirən məmur.

*Pişrov*: prelüdiya.

*Piyazi:* bir silah növü.

*Prispatvar:* Hindistanda cümə axşamı gününə verilən ad.

*Puli-Malan:* Malan çayı üzərində körpü. Malan Heri-rud çayının əski adıdır, Herat bu çayın yanında yerləşir.

*Purabi:* 796-cı ildən (=1394) Canpurda hökm sürmüş bir sülalə.

*Pus:* Hindistanda qış fəslinin ikinci ayı.

*Racə:* sanskritcə «knyaz» deməkdir, Hindistanda yerli bəylərin ünvanı.

*Rafizi:* şiə deməkdir.

*Radəndaz:* yüksək nəslə nərə cəkib düşməni vahiməyə salan dəstə.

*Ramazan*: müsəlman hicri-qəməri təqviminin 9-cu ayı.

*Rana Sanka:* tam adı Rana Sanqram Sinqh. Baburun Hindistandakı ən güclü rəqibi. Onun haqqında yazmışlar: «Rana orta boylu, böyük fizki qüvvəyə malik, təndürüst, qeyri-adi dərəcədə iri gözləri olan bir adam idi... O, ölümündən əvvəl döyüşçüdən daha çox müqəvvaya bənzəyirdi. Qardaşı ilə dalaşanda bir gözünü, dehlili ludilərlə vuruşanda isə bir qolunu itirmişdi, Yeriyəndə axsayırdı, çünki başqa bir döyüşdə top gülləsi ayağını qırmışdı. Bədəninin müxtəlif yerlərində 80-ə yaxın qılınc və nizə yarası vardı”.

*Rana:* Hindistanda yerli hökmdarların ünvanı.

*Ray:* Bxirə ilə Sind çayı arasındakı dağlarda yaşayan cud qəbiləsinin rəisinə verilən ünvan.

*Reti:* Hindistanda işlənən bir ağırlıq ölçüsü vahidi. 1 reti = 8 düyü dənəsi = 64 xardal dənəsi = 512 xaşxaş toxumu ağırlığındadır.

*Riqabdar*: üzəngibaşı, bir vəzifə adı.

*Rum:* orta əsrlərdə Bizansın, ondan sonra Osmanlının rəmzi adı.

*Rübab:* üçsimli musiqi aləti.

*Saçıq:* hədiyyə saçma; bəxşiş vermə; comərdlik.

*Sahibi-ixtiyar:* bax: *eşik ixtiyarı.*

*Saqqal buraxmaq:* kafirlərə qarşı səfərə çıxanda qələbəyə qədər saç və ya saqqalın kəsilməyəcəyi barədə içilən and.

*Samançı*: sarayda hökmdarın şəxsi əşyalarına cavabdeh şəxs.

*Sanduvaç:* bülbül, yaxud kanarya növündən bir quş.

*Sanigər:* Hindistanda həftənin günlərindən birinə verilən ad, şənbə.

*Sanq:* Hindistanda işlənən say. l sanq = 100 pədəm.

*Sart:* türklər və moğollar tərəfindən bəzi gövmlərin ortaq adı olaraq işlədilən termin. Sart adı Türküstanda moğol hakimiyyəti zamanı türk olmayan qövmlər üçün işlənmişdir. Buxara və Xokandda şəhərli və əkinçi xalqın dışındaki köçəri qırğızlara da sart deyilirdi. Qazaxlar isə türkcə və ya farsca

danışmalarına baxmadan oturaq əhaliyə sart deyirdilər. Rəsmi yazı dilində taciklər dışındakı türkləşmiş xalq bu adla anılırdı.

*Savən:* Hindistanda yağmur fəslinin ilk ayı.

*Sayram*: Arıs çayı hövzəsində yerləşən məntəqənin sonrakı adı. Yaxınlığında qədim İsficabın xarabalıqları yerləşir.

*Seva-lek-petpet:* 125.000 dağ; Hindistanda Kəşmirin cənubunda yerləşən bir dağ adı. Babur bu adın *seva* «dörddə bir» + *lek* «yüz min» + *perpet* «dağ» sözlərinin birləşməsindən meydana gəldiyini bildirir.

*Seyhun*: Sır-Dərya çayının orta əsrlər dövründəki adı.

*Seyidlər sülaləsi:* bu sülalədən olan Sultan Əlaəddin [Ludi] 1446-51-ci illər, Bəhlul Ludi 1451-89-cu illər, oğlu Sultan İskəndər isə 1489-1517-ci illər arasında hökm sürmüşdür.

*Seyidlər*: özlərini peyğəmbərə qohum sayan zümrə.

*Səbuhi:* sərxoşluğun axşamdan qalma halını ötürmək üçün səhər vaxtı içki içmək.

*Səbuktəkin Qəznəvi:* 366-387 = 977-997-ci illərdə hökm sürmüşdür.

*Səədəddin Məsud ibn Əhməd Təftəzani:* məşhur alim, filosof (710-cu ildə Səmərqənddə vəfat etmişdir).

*Səhih Buxari*: Əbu Abdullah Məhəmməd əl-Buxarinin tərtib etdiyi hədislər toplusu. İslam aləmində ən səhih toplu sayılır.

*Səmərqənd kağızı:* Orta Şərqdə ən keyfiyyətli kağız. Bu kağıza yazılan əlyazmalar bu gün də öz keyfiyyəti və möhkəmliyi ilə seçilir.

*Səmərqənd*: Orta Asiyanın ən qədim şəhərlərindən biridir, Əmir Teymurun və varislərinin paytaxtı olmuşdur.

*Səmizkənd*: hərfən: «Kök şəhər».

*Sipahi* və *sipahilik:* atlı əsgər və bu hərbi qrupa mənsub olanlar və onların gördükləri işi ifadə etmək üçün işlənən termin.

*Sir/sər:* bir ağırlıq ölçüsü. 14 tülə = 1 sir və 40 sir = 1 batman.

*Siyaq elmi:* maliyyə-hesab işləri.

*Somvar:* bazar ertəsi; Hindistanda həftə günlərindən birinin adı.

*Sona:* erkək çöl ördəyi, dişisinə *bürçin* deyilir.

*Sufi:* islamda mistik təlimin ardıcılı.

*Sux:* Özbəkistanın Fərqanə vilayətində Sux çayının sahilində yerləşən yaşayış məntəqəsi.

*Sultan:* kişilərdə əsasən adın əvvəlində (Sultan Mahmud Qəznəvi, Sultan Hüseyn Mirzə), özbək, qazax və moğol şahzadələrində adın sonunda (Qasım Sultan, Boran Sultan, Ədik Sultan, Çin Teymur Sultan) işlənir. Baburda adın əvvəlində və sonunda gəlmək üzrə hökmdarın qızları üçün də işlənmişdir: Sultan Nigar xanım, Fatma Sultan, Payəndə Sultan bəyim.

*Sultan Əlaəddin:* 1497-1519-cu, oğlu Sultan Nüsrət şah isə 1519-32-ci illər arasında hökmdar olmuşdur.

*Sultan Əli Məşhədi:* XV əsrin məşhur xəttatı, Nəvainin müasiri.

*Sultan Hüseyn*: Cunpurdakı Şərqi sultanlarının sonuncusudur, 1458-79-cu illər arasında hökm sürmüşdür.

*Sultan Mahmud Qəznəvi:* 388-421 = 988-1030. Hindistana 17 dəfə yürüş etmişdir. Qəznəvi türk dövləti 963-1187-ci illər arasında mövcud olmuşdur.

*Sultan Müzəffər:* 1512-26-cı illər arasında hökmdarlıq etmişdir.

*Sultan Şəmsəddin Eltutmuş:* 607-633-cü illərdə (=1210-1236) Dehlidə sultan olmuşdur.

*Sultanın məqbərəsi*: Sultan Mahmud Qəznəvinin rövzə adlanan məqbərəsi nəzərdə tutulur.

*Süheyl*: Kil ulduz topasının alfa ulduzu, Siriusdan sonra ən parlaq ulduz. Onu görmək uğur sayılır.

*Süleyman şah ibn Əli ibn Sultan Mahmud inb Əbu Səid Bədəxşani:* Babur ona "oğlum" deyirdi, çünki Sultan Əbu Səid hər ikisinin babalarından idi. Şüleyman şah 920=1514-cü ildə doğulmuş, 997=1589-cu ildə ölmüşdür.

*Şah İsmayıl Xətai*: Səfəvi sülaləsinin banisi, böyük şair-hökmdar.

*Şahi-səadətmənd:* əbcəd hesabı ilə 934 = 1528-cu il edir.

*Şahruxi:* qızıl pul. 1 şahruxi 4,5 altın quruşdan bir az artıqdır.

*Şahruxiyyə:* əskidən Finakət və ya Bənəkət adlanan bu şəhər monqol hücumu zamanı xarabaya çevrilmişdi. Əmir Teymur onu bərpa etdirərək oğlu Şahruxun şərəfinə Şahruxiyyə adlandırmışdı. Hazırda xarabalıqları qalır.

*Şahzadə:* Baburun yaxın dostu, əvvəllər şahzadə, sonra şah olan I Təhmasib (930-984 = 1524-1576).

*Şeri:* Hindistanda uzunluq ölçüsü. 1 şeri = 2 mil.

*Şeyx Yəhya*: Şeyx Şərafəddin Münirinin oğlu, çiştiyyə sufi təkkəsinin başçısı. Vəfatı: 782 = 1381-ci il.

*Şəhabəddin Quri:* 569-602 = 1173-1205. Qəznə ilə Herat arasındakı vilayətlərdə hakim olmuşdur.

*Şibaq/göy şibaq:* qulan otu ilə birlikdə suya töküləndə balıqları səsəm edən ot. Balıq ovunda istifadə edilmişdir.

*Şibertu:* bir aşırım. Hündürlüyü 3.200 metrdir.

*Şiğaul*: səfirlərin hökmdarla görüşünü təşkil edən seremonmeyster.

*Şikdar:* hərbi və mülki bir vəzifədir. İslam ölkələrində şikdar əvəzinə daha çox təhsildar, yəni vergiyığan termini işlənmişdir.

*Şiraz*: Səmərqəndin bir tüməni.

*Tabın:* bölük. Savaş nizamındakı ordunun mərkəzinə *(qol)* daxil olan və hökmdarın yanında yer alan bir bölüyün adı.

*Tanıman/tanımal:* hökmdar və ya idarə amirinin yanında öz qəbiləsini təmsil edən və qəbiləsinə ait xüsuslarda məsləhətçi olan adam.

*Tank*: 799-cu ildən (=1396) Qucaratda hökm sürmüş bir sülalə.

*Tank:* Hindistanda işlənən bir ağırlıq ölçüsü. l tank = 4 maşə = 32 reti.

*Tarxan:* iki sözdən ibarətdir: tar = hədiyyə və xan. Tarxanlar bəy və tacir olmaqla iki zümrədən ibarət idi. Tacir tarxanlar vergilərdən azad edilir, bəy tarxanlarlar isə savaşda qazandıqları qəniməti heç kimlə, o cümlədən hökmdarla da paylaşmırdılar.

*Tarix*: hər hansı hadisənin baş vermə vaxtını poetik şəkildə qeydə alan xronoqram. Tarix sözlərdəki hərflərin əbcəd hesabı ilə qiymətlərinin cəmindən ibarət olurdu.

*Tarnov:* arx, kanal, su yolu, nov, novça.

*Tavaçı:* yüksək saray mənsubu; hərbi komissar, ordunun boy artımı ilə, canilərin edamı ilə və s. məşğul olurdu.

*Təbəqəti-Nəsiri*: Osman ibn Siracəddin əl-Cüzcaninin 658-ci (=1260) ildə yazdığı və Dehli sultanı I Nəsirəddin Mahmuda ithaf etdiyi ümumi tarix kitabı. Adı da buradan gəlir.

*Təqti:* mənzuməni vəzn parçalarına görə ayırıb aralıqlı oxuma.

*Tənab:* quş ovlamaq üçün işlənən ip; ölçü ipi. 1 tənab = 40 qədəm və 100 tənab = 100 küruh uzunluğunda bir məsafə ölçüsü..

*Tənab:* məsafə ölçüsü; təxminən 24 metr.

*Təngə:* ağ gümüş sikkə, gerçək dəyəri bu gün dəqiq bilinməyən bir pul vahidi.

*Təvarid*: iki şairin bir-birindən xəbərsiz eyni misra və ya beyti söyləməsi.

*Toqqay:* çayın qıvrılması nəticəsində yaranan çıxıntıya verilən ad.

*Toy:* ziyafət, məclis; toy-düyün.

*Törə* (< *törü):* törə, qanun, qayda, gələnək, görənək, el adəti.

*Tubulğu:* qızıl söyüd; Fərqanə dağlarında yetişən, qabığı qırmızı tamarisk ağacıdır. Əsa, qamçı sapı, quş qəfəsi və ox düzəltmək üçün işlənmişdir.

*Tuğ:* bayraq, sancaq.

*Tuğçu:* bayraqdar, ələmdar.

*Tuğra*: hökmdarın gerbi.

*Tul:* bir aşırım. Hündürlüyü 4.000 metrdir.

*Tulğama:* türk savaş taktikası. Düşməni döyüş zamanı sağdan və soldan mühasirəyə almaq, mərkəzdən vurub məhv eləmək.

*Tutam:* dörd əlik (barmaq) enində bir uzunluq ölçüsü.

*Tülə:* Hindistanda işlənən bir ağırlıq ölçüsü. l tülə = 12 maşə.

*Tümən:* on min; pul, dinar. *Kibəki* isə Mavəraünnəhr bölgəsində 1308-26-cı illər arasında hökm sürən Kibək xan tərəfindən qoyulmuş bir dinar standartıdır. Başqa bir mənası isə on min əsgər və ya on min dinar vergi verən qəza (rayon), bölgə deməkdir.

*Tünqatar:* keşikçi, gözətçi, qarovul; xaqanın cangüdəni, özəl mühafizi. Tünqatar sözü gecəni (tünü) gündüzə qatar, heç uyumaz mənasındadır.

*Türküstan:* Orta və Mərkəzi Asiyada yerləşən, Xəzər dənizindən Monqolustana, Aral dənizindən Şimali Əfqanıstana qədər uzanan, təqribən 3 mil-

yon kv km-lik ərazini əhatə edən tarixi-coğrafi termin; Sır-Dəryanın sağ sahilində yerləşən şəhərin adı (Qazaxıstan).

*Uluğ bəyin rəsədxanası:* 1434-cü ildə Uluğ bəy tərəfindən tikilmişdir.

*Ulus:* yer, məmləkət, diyar; el-oba, xalq; dövlət (Çağatay ulusu).

*Ura-Təpə*: hazırda Tacikistanın Xocənd vilayətində rayon mərkəzidir.

*Uruq/uruğ:* ailə üzvləri; tayfa; saray müxəlləfatı.

*Uyğur*: Şərqi Türküstanda (Uyğuristan) qədim türk xalqı.

*Uzaqlıq və məsafə ölçüləri:* Hindistanda:

1 mil = 4.000 qədəm.
1 qədəm = 1,5 kari = təxminən 90 sm.
1 kari = 6 tutam = təxminən 60 sm.
1 tutam = 4 əlik (barmaq) = təxminən 10 sm.
1 əlik = 6 arpa boyu = təxminən 2,5 sm.
1 arpa boyu = təxminən 4 mm.
1 tənab = 40 kari = təxminən 24 metr.
1 kari = təxminən 60 sm.

*Özgənd:* X əsrdə bir ara Qaraxanilərin paytaxtı olmuşdur. İndi Qırğızıstanın Oş vilayətində rayon mərkəzidir.

*Üstürlab:* ulduzların dünyaya görə yüksəkliyini tapmaqda işlədilən bir astronomiya aləti, astrolyabiya.

*Varuh*: Tacikistanın Xocənd vilayətində İsfəra çayının sahilində yaşayış məntəqəsi.

*Vayin*: yer altında mərtəbələri, otaqları olan xüsusi quyu.

*Vird:* müəyyən zamanlarda oxunması adət olan *Quran* cüzləri, duaları.

*Yadaçılıq:* yağış, qar yağdırmaq, külək qoparmaq üçün yada daşından istifadə edilməsi. Mahmud Kaşğari bu barədə geniş məlumat vermişdir.

*Yaqub Osman əl-Qəznəvi əl-Çərxi:* məşhur sufi, Xoca Əhrarın müəllimi. Vəfatı: 851 = 1447-ci il.

*Yam*: Səmərqənd vilayətində yaşayış məntəqəsi.

*Yam*: poçt atı.

*Yamçı:* poçtalyon, qasid, çapar.

*Yarmaq:* pul.

*Yasal:* səf, savaş səfi, döyüş nizamı. Türk ordusunda əskidən bəri olduğu kimi, Babur zamanında da savaş nizamı belə idi:

İrəvül (irəli qol, önçü qol).
Cavanğar(sol qol).
Baranğar (sağ qol).
Qol (mərkəz).
Çağavul (geri qol, ardçı qol).

Babur savaşların birində cavanğarı və baranğarı öz aralarında sol və sağ qollar olmaqla daha iki yerə bölmüş, mərkəzə də bir xassə tabın yerləşdir-

məklə türk döyüş sənətinə yenilik gətirmişdir.

*Yasavul:* yasaqçı, mühafizə məmuru, səflərin nizamını təmin edən zabit.

*Yengə*: böyük qardaşın və ya əminin arvadı.

*Yəbrüh üs-sənəm:* insan kökü adlanan bir bitki, adamotu, qanqurudan.

*Yəxni*: kabab.

*Yurd*: köçərilərin düşdükləri yer; hökmdar düşərgəsi, ordugah.

*Yükündürmək:* Baburda hökümdarın oğullarına və ya bəylərinə hər hansı bir rütbə və ya mövqe verərkən keçirilən bir törəni göstərir. Digər bir mənası hökmdar önündə sayğı ilə diz çökməkdir.

*Yüz atlı(ğ):* yüzbaşı; bugünkü kapitan rütbəsinə uyğundur.

*Zəfərnamə:* Baburun qələbələri haqqında Şeyx Zeyn tərəfindən qələmə alınan zəfər məktubları.

*Zəfərnamə:* Teymurun tarixçisi Şərafəddin əl-Yəzdinin 882=1419-cu ildə yazdığı məşhur əsər. Burada Əmir Teymurun zəfərlərindən danışılır.

*Zəmbərək:* holuqlu taxtaya bağlı qurma yaydan və dörd guşəli, baş barmaq qalınlığında, ucu dəmirli, arxasında düz uçmağı təmin edən lələyi olan oxdan meydana gələn atəşsiz silah növü. Əsgərin zirehlərini dələcək gücdədir.

*Zic:* yaxud *zeyr:* əskidən ulduzların yerlərini və hərəkətlərini göstərmək üçün hazırlanmış cədvəl, ulduz kataloqu.

*Zünnar*: müsəlman ölkələrində xristianların bellərinə bağladıqları xüsusi rəngdə qurşaq.

**R a m i z ƏSKƏR**



10 yanvar 1954-cü ildə Amasiya rayonunun Qaraçanta kəndində müəllim ailəsində doğulmuşdur. M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin jurnalistika fakültəsini bitirmişdir (1978).

Azərbaycan radiosunda redaktor (1978-83), Azərbaycan, türk, ərəb, fars, ingilis, fransız və alman dillərində çıxan «Azərbaycan bugün» jurnalının baş redaktoru (1983–84), kiril, latın və ərəb

əlifbaları ilə nəşr olunan «Odlar yurdu» qəzetinin baş redaktoru (1984-91), «Hürriyet» qəzetinin (İstanbul) Azərbaycan üzrə xüsusi müxbiri (1991-93), Xarici Turizm Şurasının idarə rəisi (1993-94), «XXI əsr» qəzetinin baş redaktoru (1994–96), «Yeni Forum» jurnalının (Ankara) Bakı təmsilçisi (1993-97) olmuşdur. 1997-ci ildən Azərbaycan Jurnalistlər Birliyinin baş katibidir. Bakı Dövlət Universitetinin bədii tərcümə elmi-tədqiqat laboratoriyasının müdiri, Azərbaycan Milli Elmlər Akademiyası Folklor İnstitutunun baş elmi işçisidir. Filologiya elmləri doktorudur.

Azərbaycanın «Qızıl qələm», «Həsən bəy Zərdabi», «Humay», Küveytin «İslama xidmət», Türkiyənin «Yeni Orhun» və «Türk dünyasına xidmət», TürkSOY-un "Özəl ödül", Türkmənistanın «Altın əsr» mükafatları laureatıdır. Azərbaycan Yazıçılar və Jurnalistlər Birliklərinin, Beynəlxalq Mətbuat İnstitutunun (İPİ, Vyana) üzvü, Beynəlxalq Jurnalistlər Birlikləri Konfederasiyası (Moskva) və Avrasiya Jurnalistlər Konfederasiyası (Ankara) idarə heyətlərinin üzvüdür. Azərbaycanın əməkdar jurnalistidir. Türkologiya, ədəbiyyat, tarix və jurnalistikaya dair kitablar yazmış, türk, rus, özbək, uyğur, türkmən, tatar, qaqauz dillərindən tərcümələr etmişdir. Bu sahədəki fəaliyyətinə görə Avrasiya Tərcüməçilər Birliyinin (Ankara) sədri seçilmişdir (2010).

Monoqrafiyaları:

1. İqlimdən-iqlimə, təqvimdən-təqvimə. Bakı, İşıq, 1987, 104 s.
2. Qutadğu bilig. Bakı, Elm, 2003, 320 s.
3. Mahmud Kaşğari və onun «Divanü lüğat-it-türk» əsəri. Bakı, MBM, 2008, 432 s.
4. Mahmud Kaşğarinin 1000 illik yubileyinə 1000 biblioqrafik göstərici. Bakı, MBM, 2008, 96 s.
5. Mahmud Kaşğarinin «Divanü lüğati-it-türk əsəri üzrə biblioqrafik və qrammatik göstərici. Bakı, MBM,2008,192 s.
6. Mahmud Kaşğari və onun «Divanü lüğat-it-türk» əsəri. Bakı, MBM, 2009, 532 s.
7. Mahmud Kaşğarinin «Divanü lüğat-it-türk» əsərinin tədrisi. Bakı, MBM, 2011, 112 s.

Nəşr olunmuş tərcümə kitabları:

1. Azərbaycan Masalları. Bakı, Yazıçı, 1982, 196 s.
2. M.B.Məmmədzadə. Milli Azərbaycan hərəkatı. Bakı, Nicat, 1991, 248 s.
3. Faruq Sümər. Oğuzlar. Bakı, Yazıçı, 1992, 432 s.
4. Yusif Balasağunlu. Qutadğu bilig. Bakı, Azərnəşr, 1994, 492 s.
5. Murad Tağı. Həyatım. Bakı, Oka Ofset, 1998, 92 s.
6. Erik Fichtelius. Jurnalistikanın on qızıl qaydası. Bakı, AJB, 2002, 192 s.
7. Bahəddin Ögəl. Türk mifologiyası. Bakı, Səda, 2004, I cild, 626 s.
8. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, I cild, 512 s.
9. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, II cild, 400 s.
10. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, III cild, 400 s.
11. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, IV cild, 752 s.

12. N.Ozerov. İlham Əliyev: Mən Azərbaycanıma inanıram. Bakı, Azərnəşr, 2007, 376 s.
13. Махмуд Кашгарский. Дивану лугат ит-тюрк. Баку, МБМ, 2009, I том, 512 с.
14. Махмуд Кашгарский. Дивану лугат ит-тюрк. Баку, МБМ, 2009, II том, 400 с.
15. Махмуд Кашгарский. Дивану лугат ит-тюрк. Баку, МБМ, 2009, III том, 492 с.
16. Oraz Yağmur. Qarabağlı ananın ağısı. Bakı, MBM, 2009, 84 s.
17. XX əsr özbək şeiri antologiyası. Bakı, MBM, 2009, 96 s.
18. Molla Nəfəs. Bu məkana gəlmişəm. Bakı, MBM, 2010, 160 s.
19. Molla Nəfəs. Seçilmiş əsərləri. Bakı, MBM, 2010, 240 s.
20. Todur Zanet. Ana dilim. Bakı, MBM, 2010, 104 s.
21. Məxdumqulu Fəraqi. Seçilmiş əsərləri. Bakı, MBM, 2010, 448 s.
22. Türk ədəbiyyati tarixi. Bakı, MBM, 2010, I cild, 602 s.
23. Türk ədəbiyyati tarixi. Bakı, MBM, 2010, II cild, 658 s.
24. Nurməhəmməd Əndəlib. Şeirlər, poemalar, dastanlar. Bakı, MBM, 2011, 292 s.
25. Zəhirəddin Məhəmməd Babur. Seçilmiş əsərləri. Bakı, MBM, 2011, 328 s.
26. Sultan Hüseyn Bayqara. Divan. Bakı, MBM, 2011, 248 s.
27. Abdulla Tukay. Millətim. Bakı, MBM, 2011, 268 s.
28. Mehri Xatun. Divan. Bakı, MBM, 2011, 368 s.

Türkcə, rusca, almanca və ermənicə bilir.

E-mail: ramizasker@yahoo.com

## İ ç i n d ə k i l ə r:

# TürkSoy kitabxanası seriyası-12

Azərbaycn Milli Elmlər Akademiyası
Folklor İnstitutu
Elmi Şurasının qərarı ilə çap olunur

Çağatayca, türkcə və rusca
nəşrlərindən çevirən,
ön sözün, qeydlərin və izahların müəllifi:
**Ramiz ƏSKƏR**

Redaktoru:
**Prof. Dr. Hüseyn İSMAYILOV**

**Zəhirəddin Məhəmməd BABUR. BABURNAMƏ.
Bakı, Nurlan, 2011, 424 s.**

